# Ziya Bünyadov

## .1.

## əl-Fatihə (Kitabı açan) surəsi

**(Məkkədə nazil olmuşdur, 7 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Mərhəmətli , rəhmli Allahın adı ilə!
2. Həmd (şükür və tərif) olsun Allaha (və ya: Həmd məxsusdur Allaha) – aləmlərin Rəbbinə,
3. (Bu dünyada hamıya) mərhəmətli , (axirətdə isə ancaq möminlərə) rəhmli olana,
4. Haqq-hesab (qiyamət) gününün sahibinə!
5. Biz yalnız Sənə ibadət edirik və yalnız Səndən kömək diləyirik!
6. Bizi doğru (düz) yola yönəlt!
7. Nemət verdiyin kəslərin yoluna! Qəzəbə düçar olmuşların və (haqdan) azmışların (yoluna) yox!

## .2.

## əl-Bəqərə (İnək) surəsi

**(Mədinədə nazil olmuşdur, 286 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Əlif, Lam, Mim.
2. Bu, (Allah tərəfindən nazil edilməsinə, haqdan gəlməsinə) heç bir şəkk-şübhə olmayan, müttəqilərə (Allahdan qorxanlara, pis əməllərdən çəkinənlərə) doğru yol göstərən Kitabdır.

3. O kəslər ki, qeybə (Allaha, mələklərə, qiyamətə, qəza və qədərə) inanır, (lazımınca) namaz qılır və onlara verdiyimiz ruzidən (ailələrinə, qohum-qonşularına və digər haqq sahiblərinə) sərf edirlər.

4. O kəslər ki, sənə göndərilənə (Qurana) və səndən əvvəl göndərilənlərə (Tövrat, İncil, Zəbur və s.) iman gətirir və axirətə də şəksiz inanırlar,

5. Məhz onlar öz Rəbbi tərəfindən (göstərilmiş) doğru yoldadırlar. Nicat tapanlar (axirət əzabından qurtarıb Cənnətə qovuşanlar) da onlardır.

6. (Ya Rəsulum!) Həqiqətən, kafirləri əzabla qorxutsan da, qorxutmasan da, onlar üçün birdir, iman gətirməzlər.

7. Allah onların ürəyinə və qulağına möhür vurmuşdur. Gözlərində də pərdə vardır. Onları böyük bir əzab gözləyir!

8. İnsanlar içərisində elələri də vardır ki, iman gətirmədikləri halda: “Biz Allaha və qiyamət gününə iman gətirdik“, -deyirlər.

9. Onlar elə güman edirlər ki, (qəlblərində olan küfrü gizlətməklə) Allahı və möminləri aldadırlar. Bilmirlər ki, əslində ancaq özlərini aldadırlar.

10. Onlar ürəyində mərəz (nifaq və həsəd mərəzi) var. Allah onların (şəkk, kin və nifaq) mərəzini daha da artırar. Yalan dedikləri üçün onlar şiddətli bir əzaba düçar olacaqlar!

11. Onlara : “Yer üzündə (küfr və günah işlədərək, möminləri aldadaraq) fəsad törətməyin!” -dedikdə: “Bizim işimiz ancaq yaxşılıq etməkdir”, -deyə cavab verirlər.

12. Bilin ki, onlar fəsad törədəndirlər, lakin (bunu) dərk etmirlər.

13. Onlara: ”Başqaları (mühacir və ənsar) iman gətirdikləri kimi siz də iman gətirin!” –deyildiyi zaman (öz aralarında): “Biz də səfehlər (ağılsızlar) kimi iman gətirək?” -deyə cavab verirlər. (Ey möminlər!) Agah olun ki, səfeh onların özləridir, lakin (bunu) bilmirlər.

14. Onlar möminlərlə qarşılaşdıqları zaman: “Biz də (sizin kimi) iman gətirdik”, -deyirlər. Halbuki öz şeytanları ilə (onları aldadan dostları ilə) təkbətək qalanda: “Biz də sizinləyik, biz ancaq (möminlərə) istehza edirik”, -deyirlər.

15. (Belə əməllərin müqabilində) Allah da onlara (dünya və axirətdə) istehza edər və (dünyada) onlara o qədər möhlət verər ki, öz zəlalətləri içində şaşqın (və sərgərdan) qalarlar. (Və ya: Allah da onlara istehza edər və onları öz zəlalətləri, tüğyanları içində saxlayar).

16. Onlar doğru yol əvəzində əyri yolu satın almış kəslərdir. Onların alveri xeyir gətirmədi və haqq yolu da tapmadılar.

17. Onların (münafiqlərin) halı (qaranlıq gecədə) od yandıran şəxsin halına bənzər. Od (yanıb) ətrafındakıları işıqlandırdığı zaman Allah onların işığını keçirər və özlərini zülmət içərisində qoyar, (artıq heç nə) görməzlər.

18. Onlar kar, lal və kordurlar (haqqı eşitməz, danışmaz və görməzlər). Buna görə də (öz pis adətlərindən, yaramaz əməllərindən) dönməzlər.

19. Yaxud (o münafiqlər) qaranlıqlarda göy gurultusu və şimşəklə səmadan şiddətlə yağan yağışa düşmüş kimsələrə bənzərlər ki, ildırımın səsindən ölmək qorxusu ilə barmaqlarını qulaqlarına tıxayarlar. Halbuki Allah kafirləri (Öz elmi, qüdrəti ilə) ehtiva edəndir (Onun əlindən əsla qaçıb qurtara bilməzlər).

20. İldırımın çaxması az qalır ki, onların gözlərinin işığını alsın (onları kor etsin). (Şimşək) onlara işıq verdiyi zaman (onun şüası ilə) yeriyirlər, üzərlərinə qaranlıq çökdükdə isə (olduqları yerdə) dayanıb dururlar. Əgər Allah istəsəydi, onların qulaqlarını və gözlərini əllərindən alardı. Həqiqətən, Allah hər şeyə qadirdir.

21. Ey insanlar! Sizi və sizdən əvvəlkiləri yaratmış Rəbbinizə ibadət edin ki, müttəqi olasınız! (Allahdan qorxub pis əməllərdən çəkinəsiniz!)

22. O Allah ki, sizin üçün yer üzünü döşədi, göyü isə tavan yaratdı, göydən yağmur endirdi və onun vasitəsilə sizin üçün müxtəlif meyvələrdən ruzilər yetişdirdi. İndi siz də Allaha (Onun heç bir oxşarı və bənzəri olmadığını) bilə-bilə şəriklər qoşmayın!

23. Əgər bəndəmizə (Muhəmmədə) nazil etdiyimizə (Qurana) şəkkiniz varsa, siz də (fəsahətdə və bəlağətdə) ona bənzər bir surə gətirin və əgər ("bu, bəşər kəlamıdır" sözünü) doğru deyirsinizsə, onda Allahdan savayı (bütün) şahidlərinizi (bütlərinizi, şair və alimlərinizi bu işdəköməyə) çağırın!

24. Madam ki, belə bir işi bacarmırsınız, heç bacara da bilməzsiniz, o halda kafirlər üçün hazırlanmış, yanacağı (günahkar) insanlardan və kibrit daşlarından ibarət olan oddan (Cəhənnəmdən) həzər edin!

25. (Ya Peyğəmbər!) İman gətirən və yaxşı işlər görən kimsələrə müjdə ver: onlar üçün (ağacları) altından çaylar axan cənnətlər (bağlar) vardır. (O cənnətlərin) meyvələrindən bir ruzi yedikləri zaman: "Bu bizim əvvəlcə (dünya evində) yediyimiz ruzidir", - deyəcəklər. Əslində isə bu (ruzi, meyvələr) onlara (dünyadakılara zahirən) bənzər olaraq verilmişdir. Onlardan ötrü orada (hər cəhətdən) pak (olan) zövcələr də var. Onlar (möminlər) orada əbədi qalacaqlar.

26. Əlbəttə, Allah (Quranda) ağcaqanadı və ya ondan daha böyüyünü misal gətirməkdən çəkinməz. İman gətirənlər bunun öz Rəbbi tərəfindən bir həqiqət olduğunu bilirlər, kafirlər isə: "Allah bu məsəllə nə demək istəyir?" -deyirlər. Allah bununla (bu məsəllə) bir çoxlarını zəlalətə salır, bir çoxlarını isə doğru yola yönəldir. Allah yalnız fasiqləri zəlalətə düçar edir.

27. O kəslər ki, Allahla (Ona iman gətirmək və itaət etmək barəsində) əhd bağladıqdan sonra onu pozur, Allahın birləşdirilməsini buyurduğu şeyləri parçalayır (möminlərlə dostluğu, qohum-əqrəba ilə əlaqələri kəsir) və yer üzündə fitnə-fəsad törədirlər. Məhz beləlləri (dünyada və axirətdə) ziyana uğrayanlardır!

28. Allahı necə inkar edirsiniz ki, siz ölü idiniz, O sizi diriltdi. O sizi (əcəliniz gəldikcə) yenə öldürəcək, sonra (qiyamətdə) yenə də dirildəcək və daha sonra siz (əməllərinizin haqq-hesabı çəkilmək üçün) Ona tərəf (Onun hüzuruna) qaytarılacaqsınız.

29. Yer üzündə nə varsa, hamısını sizin üçün yaradan, sonra səmaya üz tutaraq onu yeddi qat göy halında düzəldib nizama salan Odur (Allahdır)! O, hər şeyi biləndir!

30. (Ya Rəsulum!) Sənin Rəbbin mələklərə: "Mən yer üzündə bir xəlifə (canişin) yaradacağam", - dedikdə (mələklər): "Biz Sənə şükür etdiyimiz, şəninə təriflər dediyimiz və Səni müqəddəs tutduğumuz halda, Sən orada (yer üzündə) fəsad törədəcək və qan tökəcək bir kəsmi yaratmaq istəyirsən?"- söylədilər. (Allah onlara: ) " Mən bildiyim şeyi siz bilmirsiniz!" – buyurdu.

31. (Allah Adəmi yaratdıqdan sonra) Adəmə bütün şeylərin adlarını (isimlərini) öyrətdi. Sonra onları (həmin şeyləri) mələklərə göstərərək: "(İddianızda) doğrusunuzsa, bunların adlarını Mənə bildirin!"- dedi.

32. Onlar: “Sən paksan, müqəddəssən! (Bütün eyib və nöqsanlardan kənarsan!) Sənin bizə öyrətdiklərindən başqa biz heç bir şey bilmirik. (Hər şeyi) bilən Sən, hikmət sahibi Sənsən”, - dedilər.

33. (Sonra) O: “Ey Adəm, bunların (kainatda mövcud olan əşyanın) adlarını onlara bildir!”- dedi. (Adəm) onlara (mələklərə) bunların adlarını xəbər verdikdə (Allah): “Mən sizə, göylərin və yerin gözə görünməyən sirlərini və sizin gizlində - aşkarda nə etdiyinizi bilirəm, söyləmədimmi?” – buyurdu.

34. (Ya Peyğəmbər!) Biz mələklərə: “Adəmə səcdə edin! – dedikdə İblisdən başqa (hamısı) səcdə etdi. (Yalnız) o, lovğalanaraq (səcdə etməkdən) imtina etdi və kafirlərdən oldu.

35. (Sonra) Biz (Adəmə) dedik: “Ey Adəm, sən zövcənlə (Həvva ilə) Cənnətdə qal və hər ikiniz oradakı meyvələrdən, istədiyiniz kimi, bol-bol yeyin, yalnız bu ağaca (buğdaya) yaxın gəlməyin! Yoxsa (özünüzə) zülm edənlərdən olarsınız”.

36. (Lakin) Şeytan onları azdırıb (buğdadan yedizdirməklə nemətlər içində) olduqları yerdən uzaqlaşdırdı. Biz də (Adəmə, Həvvaya və Şeytana): “Bir-birinizə düşmən kəsilərək (buradan kənar olub yer üzünə) enin! Yerdə sizin üçün müəyyən vaxta qədər (ömrünüzün axırınadək) sığınacaq və yaşayış (dolanacaq) vasitələri var”, -dedik.

37. (Nəhayət) Adəm rəbbindən (bəzi xüsusi) kəlmələr öyrənərək (Həvva ilə birlikdə o kəlmələr vasitəsilə) tövbə etdi. Doğrudan da, O (Allah) tövbələri qəbul edəndir, mərhəmətlidir.

38. Biz (onlara) dedik: “Hamınız buradan (yer üzünə) enin! Mənim tərəfimdən sizə bir hidayət (peyğəmbər və Kitab) gəldiyi zaman Mənim hidayətimə tabe olanlara (axirət əzabından) heç bir qorxu yoxdur və onlar (qiyamətdə) qəmgin olmazlar”.

39. Kafir olaraq ayələrimizi təkzib edənlər isə cəhənnəmlikdirlər, onlar orada (atəş içində) əbədi qalacaqlar.

40. Ey İsrail oğulları! Sizə bəxş etdiyim nemətimi xatırlayın, (Tövratda axirüzzəman peyğəmbər barəsindəki) buyurduğumu yerinə yetirin ki, Mən də sizinlə (sizi Cənnətə varid etmək barəsində) olan əhdə vəfa edim. Yalnız Məndən qorxun!

41. Sizin əlinizdəkini (Tövratı) təsdiqləyici kimi göndərdiyimə (Qurana) iman gətirin! Onu inkar edənlərin əvvəlincisi siz olmayın! Mənim ayələrimi (Tövratdakı hökmlərimi) ucuz qiymətə (dəyərsiz dünya malına) satmayın və ancaq Məndən qorxun!

42. Siz bilə-bilə haqqı batillə qarışdırmayın, haqqı gizlətməyin!

43. (Müsəlmanların namazı kimi) namaz qılın, zəkat verin və rüku edənlərlə birlikdə rüku edin!

44. Siz insanlara yaxşı işlər görmələrini əmr etdiyiniz halda, özünüzü unudursunuz? Halbuki özünüz kitab (Tövrat) oxuyursunuz. Məgər (çirkin əməllərinizi) başa düşmürsünüz?

45. (Müsibət vaxtında) səbr etmək və namaz qılmaqla (Allahdan) kömək diləyin! Bu, ağır iş olsa da, (Allaha) itaət edənlər üçün ağır deyildir.

46. Belə kimsələr Rəbbinin mərhəmətinə qovuşacaqlarını və axırda Onun hüzuruna qayıdacaqlarını bilirlər.

47. Ey İsrail övladı! Sizə bəxş etdiyim nemətimi və sizi (vaxtilə əcdadınızı) bütün aləmlərdən (başqa insanlardan) üstün tutduğumu yadınıza salın!

48. Qorxun o gündən ki, (Allahın izni və köməyi olmayınca) heç kəs heç kəsin karına gələ bilməsin (heç kəs heç kəsə öz əməlindən bir şey verə bilməsin), heç kəsdən şəfaət (bu və ya digər şəxsin

günahlarının bağışlanması barəsində xahiş, iltimas) qəbul olunmasın, heç kəsdən (günahlarının təmizlənib əzabdan xilas olması üçün) fidyə (əvəz) alınmasın və onlara (günahkarlara) heç bir kömək göstərilə bilməsin!

49. (Ey İsrail oğulları! Yadınıza gətirin o vaxtı ki) Firon əhli sizə (babalarınıza) ən ağır işgəncələr verdikləri, oğlan uşaqlarınızı boğazlayıb, qadınlarınızı (kəniz etmək məqsədilə) sağ buraxdıqları zaman Biz sizi onların əlindən xilas etdik. Bunlarda (sizdən ötrü) Rəbbiniz tərəfindən böyük bir imtahan var idi.

50. (Yadınıza salın ki) Biz sizdən ötrü dənizi yarıb sizə nicat verdik və Fironun adamlarını siz baxa-baxa suda qərq etdik.

51. (Bir daha) xatirənizə gətirin ki, Biz Musaya (Tur dağında vəhy üçün) qırx gecəlik vədə vermişdik. (O, Tur dağına gedəndən) sonra siz buzovu özünüzə (tanrı) qəbul etdiniz və (bu hərəkətinizlə Alladan başqasına ibadət etməklə) zalım oldunuz (özünüzə zülm etdiniz).

52. Sonra da (tövbə etdiyinizə görə) sizi əfv etdik ki, bəlkə, şükür edəsiniz.

53. (Yadınıza salın!) Biz Musaya kitab (Tövrat) və (haqq ilə batili bir-birindən fərqləndirən) Furqan verdik ki, bəlkə, siz doğru yola yönələsiniz.

54. O vaxtı da xatırlayın ki, Musa öz qövmünə: “Ey qövmüm, siz buzova sitayiş etməklə, həqiqətən, özünüzə zülm etdiniz. Buna görə də yaradanınıza tərəf üz tutaraq tövbə edin, özünüzü (buzovu tanrı bilən adamlarınızı) öldürün! Belə etməniz yaradanınızın yanında sizin üçün xeyirlidir! “- demişdi və Allah da tövbənizi qəbul etmişdi. Əlbəttə, O, tövbələri qəbul edəndir, bağışlayandır.

55. (Və yadınıza salın ki) siz: “Ya Musa, Allahı aşkar surətdə görməyincə, heç vaxt sənə inanmayacağıq”,- dediyiniz zaman gözünüz görə-görə sizi ildırım vurmuşdu.

56. Bəlkə, şükür edəsiniz deyə, biz sizi ölümünüzdən sonra yenidən diriltdik.

57. (Yadınıza salın ki, Tih səhrasında yaşadığınız zaman) üstünüzə buludla kölgə saldıq və: “Ruzi olaraq verdiyimiz halal şeylərdən yeyin!” (deyərək) sizə qüdrət halvası və bildirçin göndərdik. Onlar (əcdadınız) isə (itaətdən boyun qaçırmaqla) Bizə deyil, ancaq özlərinə zülm etmiş oldular.

58. Xatırlayın ki, (Tih səhrasından çıxandan sonra ) sizə: “Bu kəndə girin, bəyəndiyiniz yerdə, istədiyiniz şeyləri rahatlıqla yeyin və buranın qapısından (Allaha) səcdə edən halda “hittə!” (“bizi bağışla!”) söyləyərək daxil olun, Biz də günahlarınızı bağışlarıq. Biz yaxşı əməl edənlərin savabını (mükafatını) artıracağıq”, -demişdik.

59. (Özlərinə) zülm edənlər onlara deyilən (əmr olunan) sözü başqası ilə dəyişdirdilər (“bizi bağışla” mənasında işlədilən “hittə” sözünə gülərək onu “buğda” mənasında olan “hintə” sözü ilə əvəz etdilər). Biz də o zalımlara etdikləri haqsızlığa görə göydən şiddətli əzab göndərdik.

60. Yadınıza salın ki, Musa öz qövmü üçün su istədikdə, Biz ona: “Əsanı daşa vur!” –dedik. (O, əsanı daşa vuran kimi) ondan (daşdan) on iki çeşmə fışqırdı, hər kəs öz çeşməsini tanıdı. (Sonra onlara: ) “Allahın verdiyi ruzidən yeyin-için, fəqət yer üzündə öz həddinizi aşaraq fəsad törətməyin!” (söylədik).

61. Xatırlayın ki, siz (müəyyən müddət səhrada qalmalı olduğunuz zaman): “Ya Musa! Biz (hər gün yediyimiz) eyni təama (qüdrət halvasından və bildirçin ətindən ibarət olan yeməyə) heç vaxt

dözməyəcəyik! Rəbbinə dua et ki, bizim üçün torpağın bitirdiyi şeylərdən tərəvəzindən, sarımsağından, mərciməyindən və soğanından yetirsin! – dediniz. (Musa da cavabında : ) “Siz xeyirli olan şeyləri bu cür alçaq şeylərlə dəyişdirmək istəyirsiniz? (O halda) şəhərlərdən birinə gedin, istədiyinizi orada taparsınız!” – demişdi. Onlara zəlillik, miskinlik damğası vuruldu və Allahın qəzəbinə düçar oldular. Bu (cəza) onların Allahın ayələrini inkar etdiklərinə və (Zəkəriyya, Yəhya və Şüeyb kimi) peyğəmbərləri haqsız yerə öldürdüklərinə görə idi. Bu onların (Allaha) asi olduqlarına və həddi aşdıqlarına (Allahın əmrlərini pozduqlarına) görə idi.

62. İman gətirənlərdən (müsəlmanlardan), musavi (yəhudi), isəvi (xristian) və sabiilərdən Allaha, axirət gününə (sədaqətlə) inanıb yaxşı iş görənlərin mükafatları Rəbbinin yanındadır. (Qiyamət günü) onların nə bir qorxusu olar, nə də onlar bir qəm-qüssə görərlər.

63. (Ey İsrail oğulları!) Sizdən əhd-peyman aldığımızı və Tur dağını başınızın üzərinə qaldırdığımızı xatırlayın! (Biz: ) “Sizə göndərdiyimizi (Tövratı) möhkəm tutun, içindəkiləri unutmayın ki, bəlkə, pis əməllərdən çəkinəsiniz” - (deyə əmr etmişdik).

64. Bundan sonra siz (əhdinizdən) döndünüz (əvvəlcə əməl etdiyiniz Tövrata sonra əməl etmədiniz). Əgər sizə Allahın yazığı və rəhmi gəlməsəydi (tövbə etmək üçün möhlət verilməsəydi), əlbəttə, (böyük) zərər çəkənlərdən olardınız.

65. Həqiqətdə siz bilirsiniz ki, içərinizdən bəzi kəslər şənbə günü (Davud zamanında şənbə günü balıq ovunun qadağan edilməsi) haqqında olan əmrdən kənara çıxdılar. Biz də onlara: “(Zəlil və) həqir meymunlar olun!” – dedik.

66. Biz bunu onlarla bir dövrdə yaşayanlar və sonradan gələnlər üçün ibrət və müttəqilərdən ötrü nəsihət olsun deyə etdik.

67. Yadınıza gətirin o vaxtı ki, Musa öz qövmünə: “Allah sizə bir inək kəsmənizi əmr edir!” – dedi. Onlar isə: “Bizi məsxərəyəmi qoyursan?” – dedilər”. (Musa da: ) Allah Özü məni cahil olmaqdan saxlasın!” – dedi.

68. Onlar dedilər: “Bizdən ötrü Rəbbini çağırıb (Rəbbinə dua edib) soruş ki, o (inək) nə cür olmalıdır?” (Musa: ) “Allah o inəyin nə çox qoca, nə də çox cavan deyil, bunların ikisinin arasında (düyə) olduğunu buyurur. Sizə əmr olunan şeyi yerinə yetirin!” –dedi.

69. Onlar dedilər: “Bizdən ötrü Rəbbini çağırıb soruş, qoy onun rəngini də bizə bildirsin”. O da cavabında: “(Allah) onun tünd sarı rəngli və görənlərə xoş gələn (bir inək) olduğunu buyurur”, dedi.

70. Onlar (yenə) söylədilər: “Bizim üçün Rəbbinə dua et ki, onun əsl sifətini bizə bildirsin, çünki biz (ümumiyyətlə) inəkləri bir-birinə bənzədirik. Əgər Allah istəsə (biz kəsilməsi əmr edilən o inəyi tapar və bu məsələ barəsində), əlbəttə, düz yolda olarıq”.

71. (Musa) dedi: “(Rəbbiniz) buyurur ki, o (heç kəsə) ram olmayıb boyunduruq götürməyən, tarla sürməyən, əkin suvarmayan, eyibsiz-qüsursuz və ləkəsiz (sapsarı) bir inəkdir”. (Bu zaman) onlar: “İndi işi həqiqətə gətirib çıxartdın”, -dedilər və onu (inəyi tapıb) kəsdilər. Amma az qalmışdı ki, bu işi yerinə yetirməsinlər.

72. Yadınıza salın ki, siz o zaman bir nəfəri öldürüb (özünüzü təmizə çıxarmaq məqsədilə), onun (qatili) barəsində mübahisə edirdiniz. Halbuki Allah gizlətdiyinizi zahirə çıxarandır!

73. Belə olduqda Biz: “(Kəsilmiş inəyin) bir parçasını ona (qatili bilinməyən ölüyə) vurun!” – dedik. (Onlar da vurdular və ölü dirildi). Allah (bütün) ölüləri bu qaydada dirildər və sizə Öz möcüzələrini göstərər ki, ağla gəlib (bunu) dərk edəsiniz.

74. Bundan (bu əhvalatdan) sonra qəlbləriniz yenə sərtləşərək daş kimi, bəlkə, daha da qatı oldu. Həqiqətən, bəzi daşların içərisindən nəhrlər axar, bəzisi yarılıb içindən su fışqırar və bəzisi də Allahın qorxusundan (uca yerlərdən, dağdan) yuvarlanıb düşər. Allah sizin etdiklərinizdən, əlbəttə, qafil deyildir!

75. (Ey möminlər!) İndi onların (yəhudilərin) sizə inanacaqlarına ümidmi edirsiniz? Halbuki (Musa dövründə) onların içərisində elələri vardır ki, Allahın kəlamını (Tövratı) dinləyib anladıqdan sonra, onu bilə-bilə təhrif edirlər.

76. (Bu münafiqlər) iman gətirənlərlə görüşdükləri zaman: “İman gətirdik”,- deyirlər. Xəlvətdə olduqları vaxtda isə biri digərinə: “Allahın (Tövratda) sizə bildirdiyi şeyi (müsəlmanlara) xəbər verirsiniz ki, Rəbbinizin yanında onları sizə qarşı dəlil gətirsinlər? (Bunu) dərk etmirsinizmi ?” – söyləyirlər.

77. Məgər onlar bilmirlərmi ki, Allah onların gizlində də, aşkarda da nə etdiklərini bilir?!

78. Onların (yəhudilərdən) bəziləri də avamdırlar (bisavaddırlar), kitabı (Tövratı) bilməzlər. Uyduqları yalnız (bir sıra) boş arzulardır (xam xəyallardır). Onlar ancaq zənnə qapılırlar.

79. Vay o kəslərin halına ki, öz əlləri ilə (istədikləri kimi) kitab (Tövrat) yazıb, sonra (onun müqabilində) bir az pul almaqdan ötrü: “Bu, Allah tərəfindəndir!” - deyirlər. Öz əlləri ilə (təhrif olunmuş kitab) yazdıqlarına görə vay onların halına! Qazandıqları şey üçün vay onların halına!

80. Onlar (yəhudilər): “Cəhənnəm odu bizə bir neçə gündən artıq əzab verməz” –deyərlər. (Ya Rəsulum!) Onlara söylə: “Siz Allahdan belə bir vəd almısınızmı? (Əgər belədirsə) Allah heç vaxt Öz əhdindən dönməz. Yoxsa Allaha qarşı bilmədiyinizi söyləyirsiniz?”

81. Bəli, günah qazanan və qazandığı günahlara əhatə olunan şəxslər cəhənnəmlikdirlər və orada həmişəlik qalacaqlar.

82. İman gətirənlər və yaxşı işlər görənlər isə behiştlikdirlər və orada əbədi olacaqlar.

83. Yadınıza gətirin ki, Biz bir zaman İsrail oğullarından: "Allahdan qeyrisinə ibadət etməyin, valideynlərinizə, yaxın qohumlarınıza, yetimlərə, yoxsullara ehsan (yaxşılıq, kömək) edin, insanlarla xoş danışın, namaz qılın, zəkat verin!" – deyə əhd-peyman aldıq. Sonra, az bir qisminiz müstəsna olmaqla, əhdinizdən döndünüz, çünki siz (İsrail övladı haqdan) üz döndərənsiniz.

84. Xatırlayın ki, yenə bir zaman sizinlə: "Bir-birinizin qanını tökməyin, bir-birinizi yurdunuzdan çıxarmayın!" – deyə razılığa gəldik. Sonra siz (həmin əhd-peymana) şahid olub (onu) təsdiq etdiniz.

85. (Ey yəhudilər!) Siz elə adamlarsınız ki, (bu əhddən) sonra yenə bir-birinizi öldürür, özünüzdən olan bir dəstəyə (tayfaya) zülm və düşmənçilik etmək üçün köməkləşib, onları öz yurdlarından kənar edirsiniz. Onlar (özünüzdən olanlar başqalarına) əsir düşüb yanınıza gəlsələr, fidyə verib azad edirsiniz. Halbuki onları (öz yurdlarından) çıxartmaq sizə haram edilmişdi. Aya, siz kitabın (Tövratın) bir hissəsinə inanıb, digər qismini inkar edirsiniz? Sizlərdən bu cür işlər görənlərin cəzası dünyada yalnız rüsvay olmaq, qiyamətdə isə ən şiddətli əzaba düçar olmaqdır. Allah etdiklərinizin heç birindən qafil deyildir.

86. Onlar (yəhudilər) axirəti dünya həyatına satan kimsələrdir. Buna görə də onların nə əzabı yüngülləşər, nə də onlara kömək olunar.

87. (Ey İsrail övladı!) Biz Musaya kitab (Tövrat) verdik, ondan sonra da bir-birinin ardınca peyğəmbərlər göndərdik. Məryəm oğlu

İsaya aşkar möcüzələr (dəlillər) bəxş etdik və onu müqəddəs ruhla (Cəbraillə və ya ismi-əzəmlə) qüvvətləndirdik. Hər dəfə sizə ürəyinizə yatmayan bir şey (əmr, buyuruq) gətirən peyğəmbərə təkəbbür göstərmirdinizmi? Məhz buna görə də onların bir qismini təkzib etdiniz, bir qismini isə öldürdünüz (Zəkəriyya və ya Yəhya kimi).

88. (Yəhudilər Quranı anlamaq və qəbul etmək barəsində) dedilər: "Bizim qəlblərimiz örtülüdür (pərdəlidir)". (Lakin bu heç də belə deyildir). Əksinə, Allah onlara küfrlərinə görə lənət eləmişdir. Buna görə də onların ancaq az bir hissəsi (İbn Səlam və yoldaşları kimi) iman gətirər.

89. Onlara Allah tərəfindən əllərindəkini (Tövratı) təsdiq edən bir kitab (Quran) göndərildiyi zaman (onu qəbul etmədilər). Halbuki əvvəlcə (Muhəmməddən qabaq) kafirlərə (ərəb müşriklərinə) qələbə çalmaq üçün ("Tövratda adı çəkilən axirüzzəman peyğəmbər gəlib bizə yardım edəydi!" - deyə Allaha) yalvarırdılar. Bildikləri (peyğəmbər) gəldikdə isə, (paxıllıq edib) ona inanmadılar. Allah kafirlərə lənət eləsin!

90. Allahın Öz qullarından istədiyi şəxsə lütf etməsinə (peyğəmbərlik verməsinə) həsəd aparmaq, Onun göndərdiyini (Quranı) inkar etməklə (yəhudilərin) vicdanlarını satmaları nə qədər də pisdir! Bununla onlar (özlərinə qarşı) Allahın qəzəbi üstünə bir qəzəb də artırdılar. Kafirləri zəliledici əzab gözləyir!

91. Onlara: "Allahın nazil etdiklərinə (İncilə və Qurana) inanın!" – deyildikdə, onlar: "Biz özümüzə göndərilənə (Tövrata) inanırıq", - deyərək, ondan başqasını (sonrakını) inkar edirlər. Halbuki o (sonra göndərilən Quran) onların əllərində olanı (Tövratı) təsdiq edən bir həqiqətdir. (Ya Rəsulum!) Onlara söylə: "Əgər siz inanan

kəslərsinizsə, bəs nə üçün əvvəllər Allahın peyğəmbərlərini öldürürdünüz?”

92. Musa sizə açıq-aydın dəlillər (möcüzələr) gətirmişdi. Siz isə onun ardınca (Musa Tur dağına getdikdən sonra) buzova sitayiş edərək (özünüzə) zülm etdiniz.

93. Yadınıza salın o vaxtı ki, Biz sizdən əhd alıb, Tur dağını başınızın üstünə qaldırmış və: “Sizə verdiyimizdən (Tövratdan) möhkəm yapışın, (oradakı hökmləri) eşidin!” (demişdik). Onlar (sizin ata-babalarınız) isə: “Eşitdik və (o hökmlərə) qarşı çıxdıq (əməl etmədik)!” – dedilər. Çünki küfrləri üzündən buzovun məhəbbəti qəlblərini bürümüşdü. (Ya Rəsulum!) Onlara de: “Əgər iman gətirmisinizsə, imanınızın sizə belə əmr etməsi necə də pisdir!”

94. (Ya Rəsulum!) Sən onlara (yəhudilərə) de. ”Əgər (sizin iddianıza görə) Allah yanında axirət evi (Cənnət) başqa insanlara deyil, yalnız sizə məxsusdursa və əgər siz (bunu) doğru deyirsinizsə, onda (Allahdan) ölüm istəyin!” (Çünki Cənnətin yalnız özünə aid olduğunu iddia edən kimsə ona qovuşmağa səbəb olan ölümü mütləq arzulayar).

95. (Əlbəttə) onlar öz əməllərini bildiklərinə görə ölümü əsla istəməzlər. Allah zalımları tanıyandır!

96. Sən onları (yəhudiləri) bütün insanlardan, hətta müşriklərdən də daha artıq yaşamağa həris görərsən. Onlardan hər biri istər ki, min il yaşasın, halbuki (uzun ömür etmək) onların heç birini axirət əzabından uzaqlaşdırmaz. Allah onların nə etdiklərini görəndir!

97. (Ya Rəsulum!) Cəbrailə düşmən olan kimsəyə de ki, onu (Quranı) özündən əvvəlkiləri (Tövratı və İncili) təsdiqləyici, möminlər üçün isə hidayət və müjdəçi olaraq Allahın izni ilə sənin qəlbinə o nazil etmişdir.

98. Hər kim Allaha, onun mələklərinə və peyğəmbərlərinə, Cəbrailə və Mikailə düşməndirsə, şübhəsiz, Allah da (belə) kafirlərə düşməndir.

99. (Ya Rəsulum!) Biz sənə (ehkamı bildirən, halal və haramı ayıran) açıq-aydın dəlillər göndərdik, onları yalnız fasiqlər inkar edərlər.

100. (Yəhudilər) hər dəfə əhd bağladıqları zaman onların bir qismi onu pozmadımı?! Onların, bəlkə də, çoxu (Tövrata) inanmır.

101. Allah tərəfindən onlara əllərindəkini (Tövratı) təsdiq edən bir peyğəmbər gəldikdə kitab verilənlərdən (yəhudilərdən) bir qismi (Tövratda Muhəmməd əleyhissəlamın həqiqi peyğəmbər olduğu barədə deyilənləri) guya bilmirmiş kimi, Allahın kitabına arxa çevirdi.

102. (Yəhudilər) Süleymanın səltənətinə (şahlığına) dair şeytanların oxuduqlarına (sehr kitablara) uydular. Süleyman (bu kitablara uymadığı üçün) kafir olmadı, lakin şeytanlar (bildikləri) sehri və Babildə Harut və Marut adlı iki mələyə nazil olanları xalqa öyrədərək kafir oldular. Halbuki (o iki mələk): “Biz (Allah tərəfindən göndərilmiş) imtahanıq (sınağıq), sən gəl kafir olma!” – deməmiş heç kəsə sehr öyrətmirdilər. (Bununla belə yəhudilər) yenə də ər-arvad arasına nifaq salan işləri onlardan öyrənirdilər. Lakin onlar (sehrbazlar) Allahın izni olmadan heç kəsə zərər verə bilməzlər. Onlar (yəhudilər) ancaq özlərinə faydası olmayan, zərər verən şeyləri öyrənirdilər. Həqiqətən, onlar (yəhudilər) belə şeyləri satın alanların (Allahın kitabını şeytan əməlləri ilə mübadilə edənlərin) axirətdə payı olmadığını yaxşı bilirlər. Kaş ki, onlar özlərini nə qədər yaramaz bir şeyə satdıqlarını biləydilər!

103. Əgər onlar (Qurana və Peyğəmbərə) iman gətirib pis əməllərdən (sehrə uymaqdan) çəkinsəydilər, Allah tərəfindən əldə etdikləri savab daha xeyirli olardı. Kaş ki, bunu dərk edəydilər.

104. Ey iman gətirənlər! “Raina” deməyin (bu söz ərəb dilində “bizi qoru”, “bizdə gözün olsun”, “bizə bax”, “bizi gözlə”, “bizə qayğı və ehtiram göstər”, mənalarında işləndiyi halda, ibrani dilində yuxarıdakı mənalarla yanaşı, “bizə çobanlıq et”, “bizim çobanımız”; “ay səfeh” mənalarında da işlədilir. Yəhudilər həmin sözdən Peyğəmbərə qarşı bir istehza vasitəsi kimi istifadə edirdilər), “unzurna” söyləyin! (Allahın hökmünü) eşidin! Kafirləri şiddətli əzab gözləyir.

105. (Ey möminlər!) Nə əhli-kitabdan olan kafirlər, nə də müşriklər sizə Rəbbiniz tərəfindən heç bir xeyir göndərilməsini istəməzlər. Halbuki Allah Öz mərhəmətini istədiyi kimsəyə məxsus (bəxş) edər. Allah böyük mərhəmət (nemət) sahibidir!

106. Biz (zaman, məkan və şəraitin tələbinə görə) hər hansı bir ayəni (ayənin hökmünü) ləğv edir və ya onu unutdururuqsa, ondan daha yaxşısını, yaxud ona bənzərini gətiririk. Allahın hər şeyə qadir olmasını bilmirsənmi?!

107. Məgər sən bilmirsən ki, göylərin və yerin səltənəti (hökmranlığı) ancaq Allaha məxsusdur və sizin Allahdan başqa bir dostunuz və yardımçınız yoxdur?!

108. (Ey Məkkə əhli!) Yoxsa siz də bundan əvvəl Musa sorğu-suala çəkildiyi kimi Peyğəmbərinizi (Muhəmmədi) sorğu-suala çəkmək istəyirsiniz? İmanı küfrə dəyişən kəs, həqiqətən, doğru yoldan azmışdır.

109. (Ey möminlər!) Kitab əhlindən bir çoxu həqiqət onlara bəlli olduqdan sonra belə, təbiətlərindəki həsəd (paxıllıq) üzündən sizi,

iman gətirmiş olduğunuz halda, yenidən küfrə sövq etmək istərlər. Allahın əmri gəlincəyə qədər (hələlik) həmin şəxsləri əfv edin və onları qınamayın (onlardan üz çevirməyin). Şübhəsiz ki, Allah hər şeyə qadirdir!

110. Namaz qılın, zəkat verin! Özünüzdən ötrü (əvvəlcə) etdiyiniz xeyri (yaxşı əməllərin əvəzini) Allah yanında taparsınız. Həqiqətən, Allah nə etdiklərinizi görəndir!

111. (Yəhudilər və xaçpərəstlər) dedilər: "Cənnətə yəhudilərdən və xaçpərəstlərdən başqası girməyəcək!" Bu, ancaq onların xülyalarıdır. (Ya Rəsulum!) Onlara söylə: "Əgər (bu sözü) doğru deyirsinizsə, dəlilinizi gətirin!"

112. (Xeyr, onların dediyi kimi deyil) əksinə, yaxşı işlər görüb özlərini Allaha təslim edənlərin Rəbbi yanında mükafatı (əvəzi) vardır. Onların (axirətdə) heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər.

113. Yəhudilər dedilər: "Xaçpərəstlər (dində düzgün və mötəbər) bir şeyə istinad etmirlər". Xaçpərəstlər də: "Yəhudilər (dində düzgün və mötəbər) bir şeyə istinad etmirlər ", -söylədilər. Halbuki onların hər ikisi kitab (Tövrat və İncil) oxuyur. (Kitab əhli olmayan və yazıb-oxumaq) bilməyənlər də onlar kimi danışdılar. Allah onların aralarındakı bu ixtilafın hökmünü qiyamət günü verəcəkdir!

114. Allahın məscidlərində Onun (Allahın) adının çəkilməsinə maneçilik törədənlərdən və onların xarab edilməsinə (dağılmasına) çalışanlardan daha zalım kim ola bilər? Halbuki onlar oraya (məscidlərə) ancaq qorxa-qorxa girməli idilər. Onları dünyada rüsvayçılıq, axirətdə isə böyük əzab gözləyir!

115. Şərq də, Qərb də Allahındır: hansı tərəfə yönəlsəniz (üz tutsanız) Allah oradadır. Şübhəsiz ki, Allah (öz mərhəməti ilə) genişdir, (O, hər şeyi) biləndir!

116. (Yəhudilər, xaçpərəstlər və müşriklər) dedilər: "Allah (Özü üçün) övlad götürmüşdür". Allah pak və müqəddəsdir (bu sözlərin Ona heç bir aidiyyəti yoxdur. O, bütün eyib və nöqsanlardan xalidir). Bəli, göylərdə və yerdə nə varsa, hamısı Ona məxsusdur, hamısı Onun itaətindədir!

117. Göyləri və yeri icad edən (yoxdan yaradan) Odur. Bir işin yaranmasını istədiyi zaman, ona (o işə) yalnız: "Ol !" –deyər, o da (fövrən) olar.

118. (Müşriklərdən olan) cahillər dedilər: "Nə olaydı ki, Allah bizimlə də danışaydı, bizə də bir ayə gələydi!" Onlardan əvvəl gələnlər (yəhudilər və xaçpərəstlər) də buna bənzər sözlər demişdilər. Onların qəlbləri biri-birinə bənzəyir. Biz tam yəqinliklə iman gətirənlərə ayələrimizi (dəlillərimizi) açıqcasına göstərdik.

119. (Ya Rəsulum!) Biz səni (möminlərə) haqq ilə (Quranla) müjdə verməyə və (kafirləri) qorxutmağa göndərdik. Cəhənnəm əhli barəsində isə sən sorğu-suala tutulmayacaqsan.

120. (Ya Rəsulum!) Sən yəhudi və xaçpərəstlərin millətlərinə (dinlərinə) tabe olmayınca onlar səndən qətiyyən razı qalmayacaqdır. (Onlara) de: "Düzgün yol yalnız Allahın göstərdiyi yoldur!" Əgər sənə gələn elmdən (vəhydən) sonra onların (nəfslərindən gələn) istəklərinə uysan, o zaman səni Allahdan (Allahın əzabından) qoruyacaq nə bir dost, nə də bir köməkçi tapılar.

121. Verdiyimiz kitabı layiqincə (təhrif etmədən) oxuyanlar həmin kitaba iman gətirənlərdir, onu inkar edənlər (dəyişdirənlər) isə (dünyada və axirətdə) özlərinə zərər yetirənlərdir.

122. Ey İsrail övladı! Sizə verdiyim nemətimi və sizi (əcdadınızı) aləmlər üzərinə (bütün ümmətlərə) üstün etdiyimi xatırlayın!

123. Qorxun elə bir gündən ki, (o gün) heç kəs heç kəsin işinə yarıya bilməz (heç kəs heç kəs üçün bir şey ödəyə bilməz), heç kəsdən (gördüyü pis işlər müqabilində) əvəz (fidyə) qəbul edilməz, heç kəsin şəfaəti fayda verməz və (Allahın əzabından xilas olmaqda) onlara (günahkarlara) heç bir kömək də göstərilməz!

124. (Ya Rəsulum!) Yadına sal ki, İbrahimi öz Rəbbi bir neçə sözlə (bəzi əmrləri ilə) imtahana çəkdiyi zaman o, (Allahın əmrlərini) tamamilə yerinə yetirdi. (Belə olduqda Allah ona: ) "Səni insanlara imam (dini rəhbər, başçı) təyin edəcəyəm", -dedi. (İbrahim isə: ) "Nəslimdən necə?" – deyə soruşdu. (Allah onun cavabında: ) "(Sənin nəslindən olan) zalımlar mənim əhdimə (imamlığıma) nail olmazlar", -buyurdu.

125. (Ya Rəsulum!) Yadına sal ki, Biz evi (Kəbəni) insanlar üçün savab (ziyarətgah) və əmin-amanlıq yeri etdik. (Ey möminlər! Sizə də: ) "İbrahimin durduğu yeri (özünüzə) namazgah edin!" - (dedik). İbrahimə və İsmailə də: "Evimi (Kəbəni) təvaf edənlər, orada qalıb həmişə ibadətdə olanlar, rüku və səcdə ilə namaz qılanlar üçün (bütlərdən) təmizləyin! – deyə tövsiyə etdik.

126. Yadına sal ki, İbrahim ; "Ey Rəbbim, buranı bəladan asudə (uzaq) bir şəhər et, əhalisinin Allaha və axirət gününə inananlarına cürbəcür meyvələrdən ruzi ver!"- deyə dua etdikdə, O (Allah) : "Kafir olanlara da bir qədər (ömürləri boyu) ruzi verərəm, lakin sonra da cəhənnəm əzabına düçar edərəm. Amma ora (Cəhənnəm) nə fəna bir yerdir!" – deyə buyurdu.

127. Onu da yadına sal ki, İbrahim və İsmail evin (Kəbənin) bünövrəsini ucaltdıqları zaman: "Ey Rəbbimiz! (Bu xeyirli işi)

bizdən qəbul et, Sən, doğrudan da, (hər şeyi) eşidənsən, biləns ən!” – deyə dua etdilər.

128. (İbrahim və İsmail dedilər: ) “Ey Rəbbimiz! Bizim hər ikimizi Sənə itaətkar (müsəlman), nəslimizdən yetişənləri Sənə təslim olan ümmət (müsəlman) et, bizə (həcc) əməllərimizi (ibadət qaydalarımızı) göstər, tövbəmizi qəbul et! Həqiqətən, Sən tövbələri qəbul edənsən, mərhəmətlisən!”

129. (Onlar yenə dedilər: ) “Ey Rəbbimiz! Onların (nəslimizin) içərisindən özlərinə elə bir peyğəmbər göndər ki, Sənin ayələrini (hökmlərini) onlara oxusun, (Sən göndərən) Kitabı (Quranı) və (oradakı) hikməti onlara öyrətsin, onları (günahlardan) təmizləsin! Həqiqətən, Sən yenilməz qüvvət, hikmət sahibisən”.

130. (Ya Rəsulum!) Özünü səfehliyə qoyanlardan başqa kim İbrahimin dinindən üz çevirər? Həqiqətən, Biz onu dünyada (peyğəmbərlik və Kəbəni təmir etmə üçün) seçdik. Şübhə yoxdur ki, o, axirətdə də əməlisaleh olanlardandır.

131. Rəbbi İbrahimə : “(Əmrimə) təslim ol!” – dedikdə, o: “Aləmlərin Rəbbinə təslim oldum (müsəlman oldum)!” – deyə cavab vermişdi.

132. İbrahim və (sonra da) Yəqub bunu (müsəlman olmağı) öz oğlanlarına vəsiyyət edib (hər biri dedi) : “Ey oğlanlarım, həqiqətən, Allah sizin üçün (belə bir) din (islam dini) seçdi, siz də ancaq müsəlman olaraq ölməlisiniz!”

133. (Ey yəhudilər!) Yoxsa Yəqubun ölümü yetişdikdə siz onun yanında idiniz?! O: “Məndən sonra nəyə ibadət edəcəksiniz?” – deyə oğlanlarından soruşduğu zaman, onlar: “Sənin Allahına və ataların – İbrahimin, İsmailin və İshaqın Allahı olan tək Allaha təslim olacağıq (Ona ibadət edəcəyik)!”- dedilər.

134. Onlar (İbrahim, Yəqub və onlara tabe olanlar) bir camaat idilər ki, keçib getdilər. Onların etdikləri əməllər özlərinə, sizin etdiyiniz əməllər isə sizə aiddir. Onların əməlləri barəsində sizdən sorğu-sual olunmaz.

135. (Yəhudilər və xaçpərəstlər müsəlmanlara: ) “Doğru yolu tapmaq üçün yəhudi, yaxud da xaçpərəst olun!” - deyirlər. (Ya Rəsulum!) Sən de: “Biz batildən haqqa tapınan (haqq yolda olan) İbrahim dinindəyik, çünki o, Allaha şərik qoşanlardan deyildi.

136. (Ey möminlər, yəhudi və xaçpərəstlərin sizi öz dinlərinə dəvət etmələrinə cavab olaraq) belə deyin: “Biz Allaha, bizə nazil olana (Qurana), İbrahimə, İsmailə, İshaqa, Yəquba və onun övladına (əl-əsbat) göndərilənlərə, Musaya və İsaya verilənlərə, Rəbbi tərəfindən (bütün) peyğəmbərlərə verilən şeylərə (möcüzələrə) inanmışıq. Onlardan heç birini digərindən ayırmırıq. Biz ancaq Allaha boyun əyən müsəlmanlarıq!”

137. (Ey möminlər!) Əgər onlar da siz inandığınız kimi (Allaha) inanırlarsa, şübhəsiz ki, doğru yolu taparlar. Yox, əgər (imandan) üz döndərərlərsə, (sizə qarşı) ədavət bəsləmiş olarlar. (Ya Rəsulum! Belə olduqda sən onların düşmənçiliyindən qorxma!) Allah sənə (tezliklə sənin intiqamını) onlardan (almağa) kifayət edər. O, (hər şeyi) eşidəndir, biləndir.

138. (Ey möminlər, deyin: ) “(Biz) Allahın dinini (rəngini qəbul etdik). (Dini) Allahın dinindən daha gözəl olan kimdir?! Biz ancaq Ona ibadət edənlərik”.

139. (Ya Rəsulum! Kitab əhlinə de: ) “Siz Allah barəsində bizimlə mübahisəmi edirsiniz? Halbuki O həm bizim, həm də sizin Rəbbinizdir. Bizim əməllərimiz bizə, sizin əməlləriniz isə sizə aiddir. Ona sadiq olan bizik!”

140. Yoxsa siz İbrahimin, İshaqın, Yəqubun və onun övladının (nəslinin) yəhudi və ya xaçpərəst olduqlarını iddia edirsiniz? Allah sizin nə etdiklərinizdən xəbərsiz deyildir.

141. Onlar (İbrahim, Yəqub və övladı) bir ümmət (camaat) idilər ki, keçib getdilər, onların qazandıqları (əməllər) özlərinə, sizinki isə özünüzə aiddir. Onların əməlləri haqda sizdən sorğu-sual olunmaz.

142. (Mədinədəki yəhudi və münafiqlərdən) ağılsız adamlar deyəcəklər: "(Müsəlmanları əvvəlcə) üz tutduqları qiblədən (Beytülmüqəddəsdən) döndərən nədir?" (Ya Rəsulum! Onların cavabında) de: "Şərq də, Qərb də Allahındır. O, istədiyi şəxsi doğru yola yönəldər".

143. (Ey müsəlmanlar!) Beləliklə də, sizi (ədalətli və seçilmiş) bir ümmət etdik ki, insanların əməllərinə (qiyamətdə) şahid olasınız, Peyğəmbər də (Muhəmməd əleyhisəllam da) sizə şahid olsun. (Ya Rəsulum!) İndi yönəldiyin qibləni (Kəbəni) yalnız Peyğəmbərə tabe olanlarla ondan üz çevirənləri bir-birindən ayırd etmək üçün (qiblə) təyin etdik. Bu, (qibləni Beytülmüqəddəsdən Kəbəyə tərəf çevirmək) ağır görünsə də, ancaq Allahın doğru yola yönəltdiyi şəxslər üçün ağır deyildir. Allah sizin imanınızı (bundan əvvəl Beytülmüqəddəsə üz tutaraq qıldığınız namazlarınızı) əvəzsiz buraxmaz. Allah insanlara qarşı, əlbəttə, mehribandır, mərhəmətlidir.

144. (Ya Rəsulum!) Biz sənin üzünün göyə tərəf çevrildiyini görürük, ona görə də səni razı olduğun qibləyə tərəf döndərəcəyik. İndi üzünü Məscidülhərama tərəf çevir! (Ey müsəlmanlar!) Harada olsanız (namaz vaxtı) üzünüzü oraya döndərin! Kitab verilmişlər bunun öz Rəbbi tərəfindən bir həqiqət olduğunu yaxşı bilirlər. Allah onların əməllərindən xəbərsiz deyildir.

145. (Ya Rəsulum!) Sən kitab əhlinə hər cür dəlil gətirsən də, onlar sənin qiblənə tabe olmazlar. Sən də onların qibləsinə tabe olan

deyilsən. Hətta onlar özləri də bir-birinin qibləsinə üz tutmazlar. Əgər sənə gələn bu qədər elmdən sonra onların istədiyinə uysan, o zaman sən də, şübhəsiz ki, zalımlardan sayılarsan!

146. Kitab (Tövrat və İncil) verdiyimiz şəxslər onu (Muhəmmədi) öz oğullarını tanıdıqları kimi tanıyırlar. (Buna baxmayaraq) onların bir qismi, şübhəsiz ki, həqiqəti bilə-bilə gizlədir.

147. (Ya Rəsulum!) Haqq sənin Rəbbindədir, buna heç vaxt şübhə edənlərdən olma!

148. Hər kəsin (hər ümmətin) üz tutduğu bir qibləsi vardır. (Ey müsəlmanlar!) Yaxşı işlər görməkdə bir-birinizi ötməyə çalışın! Harada olursunuzsa olun, Allah sizi (qiyamətdə) bir yerə toplayacaqdır. Həqiqətən, Allah hər şeyə qadirdir!

149. (Ya Rəsulum!) Hər hansı bir yerə getdikdə, (namaz vaxtı) üzünü Məscidülhərama (Kəbəyə) tərəf çevir! Çünki Rəbbin tərəfindən göstərilən bu qiblə haqdır. Allah gördüyünüz işlərdən xəbərsiz deyildir.

150. (Ya Rəsulum!) Haradan (səfərə) çıxsan, (namaz vaxtı) üzünü Məscidülhərama tərəf çevir! (Ey müsəlmanlar!) Harada olsanız, üzünüzü o tərəfə döndərin ki, (özlərinə) zülm edənlərdən başqaları sizə irad tutmasınlar. Siz onlardan deyil, Məndən qorxun; Mən də sizə olan nemətimi tamamlayım (artırım) ki, siz haqq yolu tapasınız.

151. Həmçinin (nemətimizi tamamlamaq məqsədilə) sizə ayələrimizi oxumaq, sizi (günahlardan) təmizləmək, Kitabı (Quranı), hikməti (şəriəti, halalla haramı) və bilmədiklərinizi öyrətmək üçün sizə öz içərinizdən bir peyğəmbər göndərdik.

152. Belə olduqda siz (itaətlə) Məni xatırlayın ki, Mən də sizi yada salım! Mənə şükür edin, Məni danmayın!

153. Ey iman gətirənlər! Səbir və dua ilə (namazla Allahdan) kömək diləyin. Çünki Allah səbr edənlərlədir (onların dostudur).

154. Allah yolunda öldürülənlərə (şəhid olanlara) “ölü” deməyin. Əksinə, onlar (Allah dərgahında) diridirlər, lakin siz bunu dərk etmirsiniz.

155. Əlbəttə, Biz sizi bir az qorxu, bir az aclıq, bir az da mal, can (övlad) və məhsul qıtlığı ilə imtahan edərik. (Ya Rəsulum! Belə imtahanlara) səbr edən şəxslərə müjdə ver!

156. O kəslər ki, başlarına bir müsibət gəldiyi zaman: “Biz Allahınıq (Allahın bəndələriyik) və (öləndən sonra) Ona tərəf (Onun dərgahına) qayıdacağıq!” deyirlər.

157. Onları Rəbbi tərəfindən bağışlanmaq və rəhmət (Cənnət) gözləyir. Onlar doğru yolda olanlardır!

158. (Ey möminlər!) Həqiqətən, Səfa və Mərvə Allahın əlamətlərindəndir (ibadət nişanələrindəndir). Evi (Kəbəni) həcc və ya ümrə yolu ilə (qaydası ilə) ziyarət edən şəxsin bunları təvaf etməsində (ətrafına dolanmasında) heç bir günah yoxdur. Hər kəs (vacibdən əlavə) könüllü olaraq yaxşı bir iş görərsə, Allah (onun etdiyi yaxşı işdən) razı qalandır (əvəzini verəndir), (onu) biləndir.

159. Kitabda (Tövratda) insanlara aşkar etdiyimiz dəlillərdən sonra göndərdiyimiz nişanələri və doğru yol göstərən ayələrimizi gizlədən kimsələr Allahın lənətinə düçar olar və bütün lənət edə bilənlər də onlara lənət oxuyar.

160. Mən ancaq tövbə edənləri, yaxşı işlər görənləri və (Tövratda buyurduqlarımı) bəlli edənləri əfv edərəm. Mən tövbələri qəbul edənəm, mərhəmətliyəm!

161. Kafir olanlara və kafir olaraq ölənlərə Allahın, mələklərin və bütün insanların lənəti olsun!

162. Onlar həmişəlik lənət içərisində qalarlar. (Qiyamətdə) onların əzabı əskilməz və üzlərinə də baxılmaz (üzrləri qəbul olunmaz).

163. Sizin tanrınız bir olan Allahdır, Ondan başqa tanrı yoxdur. O, rəhmlidir, mərhəmətlidir.

164. Həqiqətən, göylərin və yerin yaradılmasında, gecə ilə gündüzün bir-birini əvəz etməsində, içərisində insanlar üçün mənfəətli şeylər olan gəmilərin dənizlərdə üzməsində, quruyan yer üzünü Allahın göydən yağmur yağdıraraq yenidən diriltməsində, cins-cins heyvanları onun hər tərəfə yaymasında, göylə yer arasında ram edilmiş küləyin və buludların bir səmtdən başqa səmtə döndərilməsində, (Allahın hikmət və qüdrətinə dəlalət edən) əlamətlər vardır.

165. İnsanların içərisində Allahdan qeyrilərini (Allaha) şərik qoşub, onları Allahı sevən kimi sevənlər də vardır. Halbuki iman gətirənlərin Allaha məhəbbəti daha qüvvətlidir. Əgər (özlərinə) zülm edənlərin vaxtında görəcəkləri əzabdan xəbərləri olsaydı, onlar bütün (qüvvət və) qüdrətin Allaha məxsus olduğunu və Allahın əzabının şiddətli olacağını bilərdilər.

166. O zaman tabe olunmuşlar (bütpərəstlərin rəisləri) tabe olanlardan (bütpərəstlərdən) uzaqlaşacaq, (onların hamısı qiyamətdəki) əzabı görəcək və aralarındakı rabitə qırılacaqdır.

167. O zaman (bütpərəstlərə) tabe olanlar: “Əgər bir də (dünyaya) qayıda bilsəydik, onlar bizdən uzaqlaşdıqları kimi biz də onlardan uzaqlaşardıq”, - deyərlər. Beləcə (qiyamətdə) Allah onların əməllərinin yalnız həsrətdən (peşmançılıqdan) ibarət olduğunu göstərər və onlar cəhənnəm odundan çıxa bilməzlər.

168. Ey insanlar! Yer üzündəki qidaların təmiz, halal olanlarını yeyin, Şeytanın izi ilə getməyin! Həqiqətən, o (Şeytan) sizinlə açıq-açığına düşməndir.

169. O sizə ancaq pis və murdar (həyasız) işlər görməyi və Allaha qarşı bilmədiklərinizi deməyi əmr edər.

170. Onlara (bütpərəstlərə) : "Allahın göndərdiyinə (Qurana) tabe olun!" –deyildiyi zaman, onlar: "Biz ancaq atalarımızın getdiyi yolla gedəcəyik!" –deyirlər. Bəs ataları bir şey anlamayıb doğru yolda deyildilərsə necə? (Yenədəmi onlara tabe olacaqlar?)

171. Kafirlər səda və nidadan (çığırtı və bağırtıdan) başqa bir şey anlamayanlara (heyvanlara) bənzərlər. Onlar kar, lal və kordurlar. Buna görə də haqqı dərk etməzlər.

172. Ey iman gətirənlər! Sizə verdiyimiz ruzilərin (təmiz və) halalından yeyin! Əgər Allaha ibadət edirsinizsə, (bu nemətlərə görə) Ona şükür edin!

173. O (Allah) sizə ölmüş heyvanı, (axar) qanı, donuz ətini və Allahdan başqasının adı ilə (bütlərin və s. adı ilə) kəsilənləri (yeməyi) qəti haram etmişdir. Lakin naəlac qaldıqda (başqasının malını) zorla mənimsəmədən və həddi aşmadan (zəruri ehtiyacı ödəyənə qədər) bunlardan yeməyə məcbur olan kimsənin heç bir günahı yoxdur. Allah bağışlayandır, mərhəmətlidir!

174. Allahın nazil etdiyi kitabda (Tövratda və İncildə) olanları (peyğəmbərin vəsfini) gizlədənlərin və onun müqabilində bir az para alanların yedikləri qarınlarında ancaq oda dönəcəkdir. Qiyamət günü Allah onlarla danışmaz, (onları) təmizə çıxarmaz. Onları şiddətli əzab gözləyir!

175. Onlar doğru yol əvəzinə zəlalət yolunu, bağışlanmaq əvəzinə əzabı satın almış kəslərdir. Onlar cəhənnəm oduna necə də səbirlidirlər!

176. Bu (əzab) ondan ötrüdür ki, Allah kitabı (Tövratı, İncili və ya Quranı) haqq olaraq göndərmişdir. Lakin kitab barəsində müxtəlif rəydə olanlar (onun hökmlərinin bəzisini qəbul, bəzisini rədd edənlər, bəzisini gizlədənlər, bəzisini isə təhrif edib dəyişdirənlər), şübhəsiz ki, (həqiqətdən) uzaq bir nifaq içərisindədirlər.

177. Yaxşı əməl heç də (ibadət vaxtı) üzünü günçıxana və günbatana tərəf çevirməkdən ibarət deyildir. Yaxşı əməl sahibi əslində Allaha, axirət gününə, mələklərə, kitaba (Allahın nazil etdiyi bütün ilahi kitablara) və peyğəmbərlərə inanan, (Allaha) məhəbbəti yolunda (və ya mal-dövlətini çox sevməsinə baxmayaraq) malını (kasıb) qohum-əqrəbaya, yetimlərə, yoxsullara, (pulu qurtarıb yolda qalan) müsafirə (yolçulara), dilənçilərə və qulların azad olunmasına sərf edən, namaz qılıb zəkat verən kimsələr, eləcə də əhd edəndə əhdinə sadiq olanlar, dar ayaqda, çətinlikdə (ehtiyac, yaxud xəstəlik üz verdikdə) və cihad zamanı (məşəqqətlərə) səbr edənlərdir. (İmanlarında, sözlərində və əməllərində) doğru olanlardır. Müttəqi olanlar da onlardır!

178. Ey iman gətirənlər! (Qəsdən) öldürülən şəxsdən sizin üçün qisas almaq hökmü qərara alındı (vacib oldu). Azad şəxsi azad şəxsin, qulu qulun, qadını qadının əvəzində (öldürə bilərsiniz). (Öldürülən şəxsin) qardaşı (varisi) tərəfindən (müəyyən bir şey, qanbahası müqabilində) bağışlanmış (qatil) ilə adətə görə (yaxşı) rəftar edilməlidir. Bağışlanmış (qatil də) yaxşılıqla (qan sahiblərinə) “diyə” (qanbahası) verməlidir. Bu, (qisası qanbahası ilə əvəz etmək hökmü) Rəbbiniz tərəfindən sizin üçün bir yüngüllük və mərhəmətdir. Bundan (diyə müqabilində bağışlamaqdan) sonra təcavüzkarlıq edən (qatili öldürən və ya onun qohum-qardaşı ilə düşmənçilik edən) kimsəni (qiyamətdə) şiddətli əzab gözləyir!

179. Ey ağıl sahibləri, bu qisas (qisas hökmü) sizin üçün həyat deməkdir. Ola bilsin ki, (bununla) pis əməldən (qətldən) çəkinəsiniz.

180. Sizin hər birinizi ölüm haqlayan zaman qoyub gedəcəyiniz maldan valideynlərinizə, yaxın qohumlarınıza verilməsi üçün ədalət üzrə (malın üçdə birindən çox olmamaq şərtilə) vəsiyyət etməyiniz zəruridir. Müttəqilərə (bu) vacibdir.

181. (Ölənin vəsiyyətini) eşitdikdən sonra onu dəyişənlər günah sahibi olarlar. Şübhəsiz ki, Allah (hər şeyi) eşidəndir, biləndir.

182. Hər kəs vəsiyyət edənin (öz vəsiyyətilə) səhv etməsindən və ya günaha batmasından ehtiyat edib (ədalət naminə vəsiyyətdə dəyişiklik edərək) varislərin arasını düzəltsə, ona heç bir günah yazılmaz. Allah bağışlayandır, rəhm edəndir!

183. Ey iman gətirənlər! Oruc tutmaq sizdən əvvəlki ümmətlərə vacib edildiyi kimi, sizə də vacib edildi ki, (bunun vasitəsilə) siz pis əməllərdən çəkinəsiniz!

184. (Oruc tutmaq) sayı müəyyən olan (bir ay) günlərdir. (Bu günlərdə) sizdən xəstə və ya səfərdə olanlar tutmadığı günlər qədər başqa günlərdə oruc tutmalıdırlar. Oruc tutmağa taqəti olmayanlar isə (hər günün əvəzində) bir yoxsulu doyduracaq qədər fidyə verməlidirlər. Hər kəs könüllü xeyir iş görərsə (həm oruc tutub, həm də fidyə verərsə), bu onun üçün daha yaxşı olar. Bilsəniz oruc tutmaq sizin üçün nə qədər xeyirlidir!

185. İnsanlara doğru yolu göstərən, bu yolu açıq dəlilləri ilə aydınlaşdıran və (haqqı batildən) ayıran (Quran) ramazan ayında nazil edilmişdir. Aya (ramazan ayına) yetişən şəxslər (bu ayı) oruc tutmalıdırlar; xəstə və ya səfərdə olanlar isə tutmadığı günlərin sayı qədər başqa günlərdə tutsunlar. Allah sizin üçün ağırlıq deyil, yüngüllük istər ki, fövtə gedən günlərin orucunu tamamlayasınız və

sizi düz yola yönəltməsinə görə Ona (“Allahu əkbər” deməklə) təzim və şükür edəsiniz.

186. (Ya Rəsulum!) Bəndələrim Məni səndən soruşduqda söylə ki, Mən (onlara) yaxınam. Dua edib Məni çağıranın duasını qəbul edərəm. Gərək onlar da Mənim çağırışımı qəbul edib Mənə iman gətirsinlər. Bununla da, ola bilsin ki, doğru yola yetişsinlər.

187. Oruc gecəsi qadınlarınıza yaxınlaşmaq sizə halal edildi. Onlar sizin, siz də onların libasısınız. (Bir-birinizə həddindən artıq yaxınsınız). Allah sizin özünüzə pislik (xəyanət) etdiyinizi (yaxud nəfsinizə qarşı zəiflik göstərəcəyinizi) bilib tövbələrinizi qəbul edərək sizi bağışladı; artıq siz onlara yaxınlaşın, Allahın sizə halal etdiyini onlardan istəyin; sübh açılınca, ağ sap qara sapdan fərqləənincəyə qədər yeyib için; sonra gecəyə qədər orucunuzu tamamlayın; məscidlərdə ibadətdə (etikafda) olduğunuz zaman onlarla (qadınlarınızla) yaxınlıq etməyin. Bunlar (bu hökmlər) Allahın hədləridir, bunları aşmayın! Allah (insanlara) hökmlərini bu cür bildirir ki, bəlkə, müttəqi olsunlar!

188. Bir-birinizin mallarını haqqınız olmadığı halda yeməyin. Xalqın malının bir qismini (onun sizə haram olduğunu) bilə-bilə günah yolu ilə yeməyiniz üçün onu (malınızı) hakimlərə (rüşvət) verməyin!

189. (Ya Rəsulum!) Yeni doğan aylar (hilal) barəsində səndən sual edildikdə, söylə ki, bunlar insanların istifadəsi və həcc üçün vaxt ölçüləridir. Evlərinizə (Cahiliyyət dövründə olduğu kimi) arxa tərəfdən girməniz yaxşı iş deyildir. Yaxşı iş (pis əməllərdən) çəkinən kimsənin əməlidir. Evlərə qapılarından daxil olun və Allahdan qorxun ki, nicat tapasınız!

190. (Ey möminlər!) Sizinlə vuruşanlarla siz də Allah yolunda vuruşun, lakin həddən kənara çıxmayın. Allah həddi aşanları sevməz!

191. Onları (Məkkə müşriklərini) harada görsəniz öldürün. Sizi çıxartdıqları yerdən (Məkkədən) siz də onları çıxardın. Fitnə (müşriklərin fitnəsi) qətldən daha şiddətlidir. Onlar sizinlə Məscidülhəram yanında vuruşmayınca, siz də onlarla orada vuruşmayın! Əgər (orada) sizinlə vuruşsalar, siz də onları öldürün. Kafirlərin cəzası ancaq budur!

192. Əgər onlar (vuruşdan və Allaha şərik qoşmaqdan) vaz keçərlərsə, şübhəsiz, Allah bağışlayandır, rəhm edəndir!

193. Fitnə (müşriklərin fitnəsi) aradan qalxana qədər və din (ibadət) ancaq Allaha məxsus edilənədək onlarla vuruşun; əgər onlar (bu cür hərəkətlərə) son qoyarlarsa (siz də onlarla vuruşmaqdan vaz keçin!), çünki düşmənçilik ancaq zülm edənlərə qarşı olur.

194. (Döyüş) haram olan ay [hicrətin 7-ci ilinin zülqə də ayı) (döyüş)] haram olan ay (hicrətin 6-cı ilinin zülqədə ayı) müqabilindədir. Hörmətlər qarşılıqlıdır. Sizə qarşı həddini aşanlara siz də həmin ölçüdə həddi aşın (cavab verin).Allahdan qorxun (qədərindən artıq əvəz çıxmayın) və bilin ki, Allah müttəqilərlədir.

195. (Malınızı) Allah yolunda xərcləyin. Öz əlinizlə özünüzü təhlükəyə atmayın, yaxşılıq edin! Allah yaxşılıq (ehsan) edənləri sevir.

196. Allahdan ötrü həcc və ümrə (kiçik həcc) əməllərini tam yerinə yetirin, əgər arada sizə maneçilik olarsa, (sizə) müyəssər olan bir qurbanlıq göndərin, qurbanlıq öz yerinə (Minaya) çatıncaya qədər başınızı qırxdırmayın. Əgər (ehramda ikən, ziyarət zamanı) sizdən xəstələnən və yaxud baş ağrısına tutulub əziyyət çəkən olarsa, belə şəxs (başını qırxdırmağın əvəzində) fidyə olaraq (üç gün) oruc tutmalı və ya sədəqə verməli, yaxud da bir qurban kəsməlidir. (Maneçiliyin aradan qalxmasına) əmin olduqda isə həcc vaxtına qədər ümrə ziyarətindən istifadə edən şəxs müyəssər etdiyi bir

heyvan kəsməlidir. Qurbanlıq tapmayanlar bunun əvəzində həcc ziyarəti günlərində üç gün və (vətəninə) qayıdandan sonra yeddi gün oruc tutmalıdırlar ki, bu da tam on gün edir. Bu (ümrə ziyarəti) ailəsi Məscidülhəramda (Məkkədə və ətrafında) sakin olmayanlara aiddir. Allahdan qorxun və bilin ki, Allahın əzabı şiddətlidir.

197. Həcc (mövsümü) məlum olan aylardır (şəvval, zülqədə ayları və zülhiccənin birinci on günü). (Həmin aylarda) həcc ziyarəti vacib olan (həcci özünə vacib bilən) şəxsə həcdə olarkən (qadınla) yaxınlıq, söyüş söyüb pis sözlər danışmaq, dava-dalaş etmək yaramaz. Allah gördüyünüz hər bir yaxşı işi bilir. (Həcc və ya axirət üçün) tədarük görün. Ən yaxşı tədarük (azuqə) isə təqvadır (pis əməllərdən çəkinməkdir). Ey ağıl sahibləri, Məndən qorxun!

198. (Həcc mövsümündə) Rəbbinizdən (ticarətlə) ruzi diləməniz sizin üçün günah deyildir. Ərəfatdan qayıdarkən Məşərülhəramda Allahı xatırlayın. Sizi doğru yola yönəltdiyi üçün Onu yada salın (Ona dua edin), çünki siz bundan əvvəl (doğru yolu) azanlardan idiniz!

199. Sonra camaatın döndüyü yerdən siz də dönün! Allahdan bağışlanmaq diləyin, şübhəsiz ki, Allah bağışlayandır, rəhm edəndir!

200. Həcc mərasimini tamamlayıb qurtardıqda (keçmişdə) ata-babalarınızı yada saldığınız kimi, ondan da artıq Allahı yad edin! İnsanların bəzisi: “Ey Rəbbimiz, bizə nə verəcəksənsə, elə bu dünyada ver!” – deyirlər. Belə şəxslərin axirətdə heç bir payı yoxdur!

201. Bəziləri isə: “Ey Rəbbimiz, bizə dünyada da, axirətdə də gözəl nemətlər ver, bizi cəhənnəm əzabından qoru!” deyirlər.

202. Belə şəxslərin qazandıqlarına (qazandıqları əməllərinə) görə (axirətdə) mükafat gözləyir. Allah tezliklə haqq-hesab çəkəndir!

203. (Ey hacılar!) Sayı bəlli olan günlərdə (Mina dağında) Allahı yada salın (təkbirlə zikr edin). Tələsərək iki gündə (zülhiccənin on

birinci və on ikinci günlərində Minadan Məkkəyə) qayıdana heç bir günah gəlməz. Eləcə də yubanana (zülhiccənin on üçüncü günü Minada qalana) heç bir günah tutulmaz. Bu (günah tutulmaması), müttəqilərə aiddir. Allahdan qorxun və Onun yanında (hüzurunda) toplanacağınızı bilin!

204. (Ya Rəsulum!) İnsanların eləsi vardır ki, onun dünya həyatı haqqındakı sözləri sənin xoşuna gələr. O, qəlbində olana da (dili ilə ürəyinin bir olmasına) Allahı şahid göstərər. Halbuki, o, düşmənlərin ən qəddarıdır.

205. (O şəxs səndən) ayrılan kimi yer üzündə fitnə-fəsad törətməyə, əkini və nəsli (islam cəmiyyətini) məhv etməyə çalışar. Halbuki, Allah fitnə-fəsadı sevməz!

206. Ona: “Allahdan qorx!” – deyildiyi zaman lovğalıq onu günah törətməyə vadar edər. Beləsinə cəhənnəm kifayətdir. Ora nə pis məskəndir!

207. İnsanların eləsi də vardır ki, Allahın razılığını qazanmaq yolunda (Allah rizası üçün) öz canını fəda edər. Allah öz bəndələrinə qarşı çox mehribandır!

208. Ey iman gətirənlər! Hamınız bir yerdə sülhə (islama) gəlin! Şeytanın yolu ilə getməyin, çünki o sizin açıq düşməninizdir!

209. Əgər bu qədər aşkar dəlil (ayələr) gəldikdən sonra siz yenə də doğru yoldan azarsınızsa, o zaman bilin ki, Allah da qüvvət, hikmət sahibidir!

210. Yoxsa onlar Allahın (qəzəbinin) bulud kölgələri içində mələklərlə (əzab mələkləri ilə) gəlməsini və işin tamam olmasını (özlərinin məhv edilməsini) gözləyirlər? Şübhəsiz ki, (bütün) işlər (axırda) Allaha qayıdacaqdır.

211. (Ya Rəsulum!) İsrail övladından xəbər al ki, Biz onlara (Musa peyğəmbər vasitəsilə) nə qədər açıq dəlillər göndərdik! Allahın nemətinə nail olandan sonra onu dəyişdirənlərə Allah şiddətli əzab verəcəkdir!

212. Dünya həyatı kafirlər üçün zinətlənmişdir. Onlar (bununla da) iman gətirənlərə istehza edərlər. Halbuki, müttəqilər qiyamət günündə onlardan üstündürlər. Allah istədiyi kəsə saysız-hesabsız ruzi verər.

213. İnsanlar tək bir ümmət idi. Allah onlara müjdə verən və xəbərdarlıq edən (əzabla qorxudan) peyğəmbərlər göndərdi, insanlar arasındakı ixtilafları ayırd etmək üçün O, peyğəmbərlərlə birlikdə haqq olan kitab nazil etdi. Halbuki özlərinə aşkar dəlillər gəldikdən sonra aralarındakı kin (və həsəd) üzündən (dində) ixtilafda bulunanlar kitab əhlindən başqası deyildir. Onların ixtilafda olduqları həqiqətə Onun izni (idarəsi) ilə iman gətirənləri isə Allah doğru yola yönəltdi. Allah istədiyini düz yola istiqamətləndirər.

214. (Ey möminlər!) Sizdən əvvəlkilərin başına gələnlər sizin başınıza gəlməmiş behiştə daxil olacağınızımı güman edirsiniz? Onları (şiddətli) fəlakət və sıxıntı elə bürümüş, elə sarsılmışdılar ki, hətta Peyğəmbər və iman gətirənlər birlikdə: "Allahın köməyi nə vaxt gələcək?" – demişdilər. Bilin ki, Allahın köməyi (sizə) yaxındır!

215. (Ya Rəsulum!) Səndən (Allah yolunda) nə verəcəkləri haqqında soruşanlara söylə: "(Malınızdan) verəcəyiniz şey ata-anaya, (yoxsul) qohumlara, yetimlərə, miskinlərə və (pulu qurtaran) müsafirə (yolçulara) məxsusdur". Şübhəsiz ki, Allah etdiyiniz xeyirli işi biləndir.

216. (Allahın düşmənlərinə qarşı) döyüş (cihad) xoşunuza gəlmədiyi halda, sizə vacib edildi. Bəzən xoşlamadığınız bir şey sizin üçün

xeyirli, bəzən də xoşladığınız bir şey sizin üçün zərərli ola bilər.(Onu) Allah bilir, siz bilməzsiniz.

217. (Ya Rəsulum!) Haram olan ayda döyüş haqqında səndən soruşanlara söylə: “O ayda döyüşmək böyük günahdır, lakin Allah yolunu (insanların üzünə) qapamaq, onu inkar etmək, Məscidülhərama girməyə mane olmaq və oradakıları kənara çıxarmaq Allah yanında daha böyük günahdır. (Din naminə) fitnə salmaq isə (həmin ayda) vuruşmaqdan daha betərdir”! (Ey möminlər!) Onlar (Məkkə müşrikləri) əgər bacarsalar, sizi dininizdən döndərincəyə qədər sizinlə vuruşmaqda davam edəcəklər. Sizdən hər kəs öz dinindən dönüb kafir olaraq ölərsə, belə kimsələrin bütün əməlləri (vaxtilə gördüyü yaxşı işləri) dünya və axirətdə heçə gedər. Onlar cəhənnəmlikdirlər və orada əbədi qalacaqlar!

218. Həqiqətən, Allaha iman gətirənlər, (Məkkədən Mədinəyə) köçüb gələn və Allah yolunda cihad edən kimsələr Allahın mərhəmətinə ümidvardırlar. Allah bağışlayandır, rəhm edəndir!

219. (Ya Rəsulum!) Səndən içki və qumar (meysir) haqqında sual edənlərə söylə: “Onlarda həm böyük günah, həm də insanlar üçün mənfəət (dünya mənfəəti) vardır. Lakin günahları mənfəətlərindən daha böyükdür”! (Allah yolunda) nəyi paylamalı olduqlarını soruşanlara isə de: “Ehtiyacınızdan artıq qalanını (möhtaclara paylayın)!” Allah sizə Öz ayələrini bu cür bildirir ki, bəlkə, fikirləşəsiniz.

220. Dünya və axirət (işləri) barəsində. (Ya Rəsulum!) Səndən yetimlər haqqında sual edənlərə söylə: “Onlar üçün (onların malını qorumaq və güzəranlarını) yaxşılaşdırmaq xeyirlidir (nəcib əməldir). Əgər onlarla birlikdə yaşayırsınızsa, onlar sizin qardaşlarınızdır”. Allah islah (yaxşılıq) edənləri də, fəsad salanları da tanıyır. Əgər

Allah istəsəydi, sizi, əlbəttə, əziyyətə salardı. Həqiqətən, Allah yenilməz qüvvət, hikmət sahibidir!

221. Allaha şərik qərar verən (Onu inkar edən) qadınlar imana gəlməyincə onlarla evlənməyin! Əlbəttə, Allaha iman gətirmiş bir cariyə, gözəlliyinə heyran olduğunuz bir müşrik bir qadından daha yaxşıdır. Həmçinin müşrik kişilər Allaha iman gətirməyənə qədər mömin qadınları (onlara) arvadlığa verməyin! Əlbəttə, Allaha iman gətirən bir kölə camalına məftun olduğunuz müşrik bir kişidən daha xeyirlidir. Onlar (müşrik qadınlar və kişilər) sizi Cəhənnəmə çağırdıqları halda, Allah sizi Öz izni ilə Cənnətə, məğfirətə (bağışlanmağa) çağırır və yaxşı düşünüb ibrət almaları üçün insanlara hökmlərini aydınlaşdırır.

222. (Ya Rəsulum!) Səndən heyz (aybaşı) barəsində sual edənlərə söylə: "Heyz əziyyətli bir haldır. Heyz zamanı qadınlardan kənar olun, (heyzdən) təmizlənməyənə qədər onlarla yaxınlıq etməyin, təmizləndikdən sonra isə Allahın sizə əmr etdiyi yerdən (buyurduğu qayda üzrə) onlara yaxınlaşın!" Allah (günahından) tövbə edənləri, (təmiz və) pak olanları sevər!

223. (Ey möminlər!) Qadınlarınız sizin (övlad əkdiyiniz) tarlanızdır. İstədiyiniz vaxtda öz tarlanıza gəlin! Özünüz üçün qabaqcadan (yaxşı əməllər) hazırlayın! Allahdan qorxun və (qiyamət günü) Onun hüzuruna gedəcəyinizi bilin! (Ya Rəsulum!) İman gətirənlərə (Cənnətlə) müjdə ver!

224. Yaxşılıq etmək, pis əməllərdən çəkinmək və insanlar arasında sülh yaratmaq barəsindəki andlarınıza Allahı (Allahın adını) hədəf (dəstavüz) etməyin! Allah eşidəndir, biləndir!

225. Allah, bilmədən (səhvən) içdiyiniz andlara görə sizi cəzalandırmaz, lakin qəlblərinizin kəsb etdiyi şeylərə (yalandan və ya

qəsdən içib yerinə yetirmədiyiniz andlara, pis niyyətlərə) görə sizi cəzalandıracaqdır. Allah bağışlayandır, həlimdir!

226. Övrətlərinə yaxınlaşmamağı and içən kimsələr üçün dörd ay gözləmə müddəti vardır, əgər bu müddət içərisində andlarından dönsələr, Allah (onları kəffarə vermək şərtilə) bağışlayandır, rəhm edəndir.

227. Əgər talaq vermək (boşamaq) istəsələr, şübhəsiz ki, Allah (onların niyyətlərini) eşidəndir, biləndir.

228. Boşanan qadınlar üç dəfə (heyz görüb təmizlənincəyə qədər başqa ərə getməyib) gözləməlidirlər. Əgər (o qadınlar) Allaha və qiyamət gününə inanıblarsa, Allahın onların bətnlərində yaratdığını (uşağı) gizlətmək onlara halal olmaz. (Bu gözləmə müddəti içərisində) ərləri barışmaq istərlərsə, onları geri almağa (hər kəsdən) daha çox haqlıdırlar. (Kişilərin qadınlar) üzərində şəriətə görə hüquqları olduğu kimi, (qadınların da) onlar (kişilər) üzərində hüquqları vardır. Ancaq kişilər (daha artıq əziyyətə qatlandıqları üçün) onlardan bir dərəcə üstündürlər. Allah yenilməz qüvvət, hikmət sahibidir.

229. (Rici) talaq vermə (boşama) iki dəfə mümkündür, ondan sonra yaxşı dolanmaq (qadını yaxşı saxlamaq), ya da xoşluqla ayrılmaq (buraxmaq) gərəkdir. (Ey kişilər!) Onlara (qadınlarınıza) verdiyinizdən (kəbin haqqından, mehrdən) bir şey tələb etməniz sizə halal olmaz. Bu yalnız kişi ilə qadının Allahın (ər-arvadlıq) haqqındakı hökmlərini yerinə yetirə bilməyəcəklərindən qorxduqları zaman mümkündür. (Ey şəriət hakimləri!) Əgər onların (ər-arvadın) Allahın hökmlərini yerinə yetirməyəcəklərindən siz də qorxsanız, arvadın (kəbin haqqından) ərinə bir şey verməsində heç biri üçün günah yoxdur. Bunlar Allahın hədləridir (hökmləridir). Onlardan

kənara çıxmayın. Allahın hədlərindən kənara çıxanlar, əlbəttə, zalımlardır.

230. Əgər (kişi) övrətini yenə də (üçüncü dəfə) boşarsa, o zaman (qadın) başqa bir ərə getməmiş ona (əvvəlki ərinə) halal olmaz. (İkinci əri) onu boşadıqdan sonra Allahın (ər-arvadlıq haqqındakı) hədlərinə (hökmlərinə) riayət edəcəklərinə inamları olduqları təqdirdə, (həmin qadının əvvəlinci əri ilə) təkrar evlənməsində günah yoxdur. Bunlar anlayan bir qövm üçün Allahın bəyan etdiyi hədləridir (hökmləridir).

231. Qadınlarınızı (rici talaqla) boşadığınız və onların gözləmə müddəti başa çatdığı zaman onları ya xoşluqla saxlayın, ya da xoşluqla buraxın. (Əziyyət və) zərər vermək məqsədilə haqlarına təcavüz edib onları saxlamayın! Hər kəs bunu etsə, şübhəsiz ki, özünə zülm etmiş olar. Allahın ayələri (hökmləri) ilə oynamayın (onlara istehza etməyin). Allahın sizə verdiyi nemətləri, öyüd-nəsihət üçün göndərdiyi Kitabı (Quranı) və hikməti xatırlayın! Allahdan qorxun və Allahın, həqiqətən, hər şeyi bildiyini anlayın!

232. Boşanmış qadınların gözləmə müddətləri bitərkən aralarında barışıq və yaxşılıqla yaşamağa razılıq olduğu zaman onların təkrar öz ərlərinə nikah edilməsinə mane olmayın! Bu sizin Allaha və axirət gününə inananlarınıza verilən bir nəsihətdir. Bu (şəri baxımdan) sizin üçün daha təmiz (faydalı) və daha pakdır. Allah (sizin mənfəətinizi) bilir, siz bilməzsiniz!

233. Analar (istər boşanmış, istərsə də boşanmamış olsun) uşaqlarını əmizdirmə müddətini tamamlatmaq istəyən (atalar) üçün tam iki il əmizdirsinlər. Anaların yeməyi və geyimi öz qüvvəsi dairəsində (uşağın) atasının üzərinə düşür. Heç kəs gücü çatdığından artıq yüklənməz. Nə bir ana, nə də bir ata uşağına görə zərər çəkməsin! (Ata öləndən sonra) bu vəzifə həmin qaydada varisin üzərinə düşür.

Əgər ata və ana öz aralarında məsləhətləşib, uşağı (iki ildən tez) süddən kəsmək qərarına gəlsələr, ikisinə də heç bir günah olmaz. Əgər siz uşağınızı başqasına (süd anasına) əmizdirmək istəyirsinizsə, onun zəhmət haqqını müəyyən olunmuş qayda üzrə (şəriətə müvafiq) ödəsəniz, yenə də sizə günah sayılmaz. Allahdan qorxun və bilin ki, Allah, həqiqətən, sizin nə etdiklərinizi görəndir!

234. Sizdən ölənlərin qoyub getdiyi qadınlar dörd ay on gün (başqa ərə getməyib) özlərini gözləməlidirlər. Bu müddət tamam olduqda, artıq onların öz barələrində şəriətə müvafiq surətdə etdikləri işdən sizə heç bir günah gəlməz. Allah etdiklərinizin hamısından xəbərdardır!

235. (Bu müddəti gözləyən) qadınlara elçi göndərmək (onlarla evlənmək) istədiyinizi (rəmz və) işarə ilə bildirməkdən və ya belə bir istəyi ürəyinizdə gizlətməkdən sizə heç bir günah gəlməz. Allah sizin onları xatırlayacağınızı bilir. Lakin (gözləmə müddətində) onlarla gizlində vədələşməyin, onlara şəriətə müvafiq söz deyin! Gözləmə vaxtları bitməyincəyə qədər onlarla nikah etmək fikrində olmayın! Bilin ki, Allah sizin qəlbinizdə olanı bilir. Ondan (Allahdan) qorxun, Allahın bağışlayan, həlim olduğunu bilin!

236. Yaxınlıq etmədiyiniz (toxunmadığınız) və mehrini (kəbin haqqını, başlığını) təyin etmədiyiniz qadınları boşamaq sizə günah sayılmaz. Qəbul olunmuş qayda üzrə, varlı öz imkanı daxilində, kasıb da gücü çatdığı qədər, yaxşılıq (ehsan) edənlərə layiq şəkildə onlara bir şey (mütə) versin!

237. Kəbin haqlarını təyin etmiş olduğunuz qadınları yaxınlıq etmədən əvvəl boşayarsınızsa, təyin olunmuş kəbin haqqının yarısını onlara verməlisiniz! Bununla belə, onlar (qadınlar) bunu (ərlərinə), yaxud əlində nikah müqaviləsi olanlar (ərlər) kəbin haqqının hamısını qadınlara bağışlaya bilərlər. (Ey kişilər!) Sizin

bağışlamağınız (güzəştə getməyiniz) müttəqiliyə daha yaxındır. Bir-birinizə yaxşılıq etməyi unutmayın! Şübhəsiz ki, Allah sizin etdiklərinizi görəndir.

238. (Fərz, vacib) namazlara, (xüsusilə) orta namaza (günortadan sonrakı əsr namazına, ikindi namazına) riayət (əməl) edin və Allaha itaət üçün ayağa qalxın (namaza durun).

239. Əgər (düşməndən və yırtıcı heyvandan) qorxsanız, (namazınızı) piyada gedə-gedə və ya minik üstə (qılın). (Təhlükədən sovuşmağınıza) əmin olduqda isə Allahı, bilmədiyiniz şeyləri (namazı, duanı) sizə (Peyğəmbər və Quran vasitəsilə) nə cür öyrədibsə, o cür anın (zikr edin, namaz qılın)!

240. Sizlərdən vəfat edib özlərindən sonra arvadlarını qoyub gedən şəxslər həmin qadınlara öz evindən çıxarılmamaq şərtilə, bir il müddətində baxılmasını (vərəsələrinə) vəsiyyət etməlidirlər. Əgər onlar (öz arzuları ilə) çıxıb gedərlərsə, o zaman onların qəbul olunmuş qayda üzrə (şəriətə müvafiq) öz barələrində görəcəkləri işlər üçün siz günahkar deyilsiniz. Allah yenilməz qüvvət, hikmət sahibidir!

241. Boşanan qadınları qəbul olunmuş tərzdə (şəriətə müvafiq) faydalandırmaq müttəqilərin vəzifəsidir.

242. Allah sizə Öz ayələrini, (hökmlərini) bu qaydada aydınlaşdırır ki, düşünüb anlayasınız (əqlinizə batsın).

243. (Ya Rəsulum!) Minlərlə adamın (taundan) ölüm qorxusu ilə öz yurdlarını tərk edib getdiklərini görmədinmi? Allah onlara: “Ölün!” – dedi və sonra da (yenidən) diriltdi. Həqiqətən, Allah insanlara lütf edəndir, lakin insanların bir çoxu şükür etməzlər!

244. Allah yolunda vuruşun və bilin ki, Allah eşidəndir, biləndir!

245. Allah yolunda (könül xoşluğu ilə halal maldan) yaxşı borc verən kimdir ki, (Allah da) onun mükafatını (əvəzini) qat-qat artırsın?! Allah (kimisini) sıxıntıya salar (ruzisini azaldar), (kimisinin də) ürəyini açar (bol ruzi verər). Siz (dünyada gördüyünüz işlərin əvəzini almaq üçün) Onun hüzuruna qaytarılacaqsınız.

246. (Ya Rəsulum!) Musadan sonra bir dəstə (tanınmış) İsrail övladının başına gələnləri görmədinmi? Onlar öz peyğəmbərinə: "Bizə bir hökmdar göndər ki, (onun köməyi ilə) Allah yolunda (zülmkarlarla) vuruşaq!" - dedilər. O da (onlara): "Sizə vuruşma əmri olduqda, bəlkə, vuruşmadınız?" – söylədi. Onlar cavabında dedilər: "Allah yolunda nə üçün vuruşmayaq ki, yurdumuzdan çıxarıldıq, övladlarımızdan ayrıldıq". Lakin onlara vuruşmaq vacib olduğu vaxt, içərilərindən az bir qismi müstəsna olmaqla, (hamısı döyüşdən) üz çevirdilər. Allah (özlərinə) zülm edənləri tanıyır!

247. (İsrail övladının) peyğəmbəri onlara dedi: "Allah Talutu sizə padşah göndərdi". Onlar isə: "Biz hökmdarlığa daha layiq ikən və ona var-dövlət verilmədiyi halda, o, necə bizə padşah ola bilər?" – deyə cavab verdilər. (Peyğəmbər onlara) dedi: "Allah sizdən ötrü onu (bəyənib) seçmiş, elm və bədəncə (qüvvəcə) ona üstünlük vermişdir. Allah Öz mülkünü (səltənətini) istədiyinə verər. Allah (Öz lütfü və kərəmi ilə) genişdir, (Allah hər şeyi) biləndir!"

248. (İsrail övladının) peyğəmbəri onlara dedi: "(Talutun) padşahlıq əlaməti (Musaya verilən) sandığın sizə gəlməsidir. Onun içində (sizin üçün) Rəbbinizdən bir arxayınlıq, rahatlıq (mənəvi bir qüvvə, səbat), həmçinin Musa və Harun nəslindən qalan şeylər (Musanın əsası, Tövratın bəzi lövhələri, bir az qüdrət halvası və s.) vardır. Onu mələklər gətirəcək. Əgər siz möminsinizsə, onda sizin üçün (peyğəmbərin verdiyi xəbərin doğruluğunu təsbit edən) qəti dəlil vardır".

249. Talut qoşunu ilə (öz yurdundan, Qüdsdən) ayrıldığı zaman (əsgərlərinə) dedi: “Allah sizi (axar) bir çay vasitəsilə imtahan edəcək. Kim onun suyundan içsə, o məndən (mənə tabe olanlardan) deyildir. Kim ondan dadmasa, dadsa da, bir ovucdan artıq içməsə, o məndəndir”! Lakin onların az bir qismi müstəsna olmaqla, (hamısı) o sudan içdi. O (Talut) və onunla birlikdə olan möminlər (çayı) keçdikdən sonra (düşmən qoşununu görüb) dedilər: “Bu gün bizim Calut (düşmən tərəfin hökmdarı) və onun qoşunu ilə vuruşmağa taqətimiz yoxdur”! (İçərilərindən) Allahın rəhmətinə qovuşacaqlarına (Allahın dərgahına qayıdacaqlarına) inanalar isə dedilər: “Neçə dəfə olub ki, az bir dəstə Allahın izni (iradəsi) ilə çox bir dəstəyə qalib gəlib! Allah səbr edənlərlədir!”

250. Onlar Calut və əsgərləri ilə qarşılaşdıqları zaman dedilər: “Ey Rəbbimiz, bizə bollu səbr və dizimizə (ayaqlarımıza) qüvvət ver! Bizə kafir qövm üzərində qələbə qazandır!”

251. Nəhayət, onlar Allahın izni (iradəsi və köməyi) ilə Calutu və qoşununu məğlub etdilər. Davud Calutu öldürdü. Allah Davuda həm hökmranlıq, həm də hikmət (peyğəmbərlik) verdi və ona istədiyini (zireh düzəltmək, quşların dilini bilmək, gözəl səslə oxumaq) öyrətdi. Əgər Allah insanların bir qismini, digər bir qismi ilə dəf etməsə idi, yer üzü fitnə-fəsada uğrayardı. Lakin Allah bütün aləmlərə qarşı lütfkardır.

252. (Ya Rəsulum!) Bunlar (bu söylənilənlər) Allahın ayələridir (qüdrət nişanələridir) ki, onları sənə doğru-düzgün bildiririk. Sən, həqiqətən, (Allah tərəfindən seçilərək insanlara) göndərilən (mürsəl) peyğəmbərlərdənsən.

253. (Ya Rəsulum!) Bu peyğəmbərlərin bəzisini digərindən üstün etdik. Allah bunlardan bəzisi ilə danışmış, bəzisinin isə dərəcələrini yüksəltmişdir. Məryəm oğlu İsaya açıq möcüzələr verdik və onu

müqəddəs ruhla (Cəbraillə) qüvvətləndirdik. Əgər Allah istəsəydi, bu peyğəmbərlərin ardınca gələn insanlar onlara göndərilən aşkar dəlillərdən sonra bir-biriləri ilə vuruşmazdılar. Fəqət (bununla belə yenə də) ixtilafa düşdülər. Onlarda bəziləri (Allaha) iman gətirdilər, bəziləri isə kafir oldular. Əgər Allah istəsə idi, onlar bir-biriləri ilə vuruşmazdılar. Lakin Allah Öz istədiyini edər!

254. Ey iman gətirənlər! Alış-verişin, dostluğun və şəfaətin mümkün olmayacağı gün (qiyamət günü) gəlməmişdən əvvəl sizə verdiyimiz ruzidən paylayın! Kafirlər (bunu inkar edənlər) isə (özlərinə) zülm edənlərdir!

255. Allah başqa heç bir tanrı yoxdur. (Zatı və kamal sifətləri ilə hər şeyə qadir olub bütün kainatı yaradan və idarə edən, bəndələrini dolandıran və onların işlərini yoluna qoyan) əbədi, əzəli varlıq Odur. O nə mürgü, nə də yuxu bilər. Göylərdə və yerdə nə varsa (hamısı) Onundur. Allahın izni olmadan (qiyamətdə) Onun yanında (hüzurunda) kim şəfaət (bu və ya digər şəxsin günahlarının bağışlanmasını xahiş) edə bilər? O, bütün yaranmışların keçmişini və gələcəyini (bütün olmuş və olacaq şeyləri) bilir. Onlar (yaranmışlar) Allahın elmindən Onun Özünün istədiyindən başqa heç bir şey qavraya bilməzlər. Onun kürsünü (elmi, qüdrət və səltənəti) göyləri və yeri əhatə etmişdir. Bunları mühafizə etmək Onun üçün heç də çətin deyildir. Ən uca, ən böyük varlıq da Odur!

256. Dində məcburiyyət (zorakılıq) yoxdur. Artıq doğruluq (iman) azğınlıqdan (küfrdən) ayırd edildi. Hər kəs Taqutu (Şeytanı və ya bütləri) inkar edib Allaha iman gətirsə, o, artıq (qırılmaq bilməyən) ən möhkəm bir ipdən (dəstəkdən) yapışmış olur. Allah (hər şeyi olduğu kimi) eşidəndir, biləndir!

257. Allah (Ona) iman gətirənlərin dostudur, onları zülmətdən çıxarıb işığa tərəf yönəldər. Kafirlərin dostu isə Taqutdur (şeytanlardır).

Onları (kafirləri) nurdan ayırıb zülmətə salarlar. Onlar cəhənnəmlikdirlər və orada həmişəlik qalacaqlar!

258. (Ya Rəsulum!) Allahın verdiyi hökmranlıq üzündən (azğınlaşaraq) İbrahim ilə Rəbbi barəsində mübahisə aparan şəxsi (Nəmrudu) görmədinmi? (Və ya əhvalatını bilmirsən?) İbrahim: "Mənim tanrım həm dirildir, həm də öldürür", - dediyi zaman, o (Nəmrud): "Mən də həm dirildir, həm də öldürürəm", - demişdi. İbrahim ona: "Allah Günəşi şərqdən doğdurur, bacarırsansa, sən onu qərbdən doğdur!" – dedikdə, o kafir donub qalmışdı. Həqiqətən, Allah (özünə) zülm edənləri düz yola yönəltməz!

259. Yaxud (Ya Rəsulum! Damları çökmüş, divarları) uçulmuş bir kəndin yanından keçən kimsənin əhvalatını bilirsən? O kimsə: "Əcaba, Allah bu kəndi ölümündən sonra necə dirildəcək?" – demişdi. Belə olduqda, Allah onu yüz il ölü halında saxladı, sonra dirildərək ondan: "Nə qədər yatmısan?" – deyə soruşdu. O da: "Bir gün, bəlkə, bir gündən daha az" – deyə cavab verdi. Allah ona: "Bəlkə, yüz il yatmısan, yediyin yeməyə, içdiyin suya bax, hələ də xarab olmayıb. Bir də uzunqulağına bax! Səni insanlar üçün bir ibrət dərsi olmaqdan ötrü belə etdik. İndi (uzunqulağının) sümüklərinə bax, gör necə onları bir-biri ilə birləşdirir, sonra da onların üzərini ətlə örtürük?" – deyə buyurdu. O kimsəyə bunlar aydın olduqda: "Artıq bildim ki, Allah hər şeyə qadirdir!" – dedi.

260. (Ya Rəsulum!) Xatırla ki, İbrahim: "Ey Rəbbim, ölüləri nə cür diriltdiyini mənə göstər!" – dedikdə (Allah) : "Məgər (ölüləri diriltməyimə) inanmırsan?" –buyurmuşdu. (İbrahim: ) "Bəli, inanıram, lakin ürəyim sakit (xatircəm) olmaq üçün (soruşdum)", - deyə cavab vermişdi. (Bu zaman Allah ona) buyurmuşdu: "Dörd cür (cins) quş götürüb (səhv salmamaq üçün) onlara diqqətlə bax, (onları parçalayaraq bir-birinə qatandan) sonra hər dağın başına onlardan bir

parça at, sonra onları çağır, tez yanına gələcəklər. Bil ki, Allah yenilməz qüvvət, hikmət sahibidir!”

261. Mallarını Allah yolunda sərf edənlərin halı yeddi sünbül verən bir toxuma bənzər ki, bu sünbüllərin hər birində yüz ədəd dən vardır. Allah istədiyi kimsə üçün bunu qat-qat artırır. Allah (lütfü ilə) genişdir.

262. Heç bir kəsə minnət qoymadan, əziyyət vermədən mallarını Allah yolunda sərf edənlərin Rəbbi yanında mükafatları vardır. Onların (axirətdə) heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər.

263. Xoş bir söz və günahları bağışlamaq əziyyətlə (minnətlə) verilən sədəqədən daha yaxşıdır. Allah ehtiyacsızdır, həlimdir!

264. Ey iman gətirənlər! Sədəqələrinizi malını riyakarlıqla (özünü xalqa göstərmək üçün) sərf edən, Allaha və axirət gününə inanmayan şəxs kimi, minnət qoymaq və əziyyət verməklə puça çıxarmayın. Belə şəxslərin halı, üzərində bir az torpaq olan qayaya bənzər ki, şiddətli bir yağış o torpağı (yuyub) aparar və qayanı çılpaq bir daş halına salar. Onlar qazandıqlarından bir şeyə qadir (nail) olmazlar. Şübhəsiz ki, Allah kafirləri haqq yoluna yönəltməz!

265. Mallarını Allahın razılığını qazanmaq və nəfslərini (imanlarını) sabitqədəm etmək yolunda sərf edənlər uca təpənin üstündə olan bir bağa bənzərlər ki, ora düşən bol yağış onun meyvələrini ikiqat artırar. Əgər bol yağış yağmasa, az bir şəbnəm (şeh də ona kifayət edər). Həqiqətən, Allah nə etdiyinizi (bütün əməllərinizi) görəndir!

266. Məgər sizdən biriniz istərmi ki, içində xurma ağacları, üzümlüklər, (ağacları) altından arxlar axan və cürbəcür meyvələr olan bir bağçası olsun, (sonra) zəif (iş bacarığı olmayan, himayəyə möhtac) uşaqları olduğu halda ona qocalıq üz versin, həmin vaxtda

da ora odlu bir qasırğa düşsün və o bağ yanıb tələf olsun? Allah ayələri sizin üçün bu cür aydınlaşdırır ki, düşünəsiniz.

267. Ey iman gətirənlər! Qazandığınız və sizin üçün torpaqdan yetişdirdiyimiz şeylərin (ən pak, halal və) yaxşılarından (Allah yolunda) sərf edin! Ancaq göz yumaraq aldığınız pis, yaramaz şeylərdən vermək fikrində olmayın! Bilin ki, Allahın heç bir şeyə ehtiyacı yoxdur. (O, hər cür) şükrə (tərifə) layiqdir!

268. Şeytan sizi yoxsulluqla qorxudaraq alçaq işlərə sövq edər, Allah isə (əksinə) sizə bağışlanmaq və bərəkət vədəsi verər. Allah (mərhəməti ilə) genişdir. (Allah hər şeyi) biləndir.

269. Allah istədiyi şəxsə hikmət (elm, mərifət, müdriklik) bəxş edər. Kimə hikmət bəxş edilmişsə, ona çoxlu xeyir (əbədi səadət) verilmişdir. Bunu ancaq ağıllı adamlar dərk edərlər!

270. (Allah yolunda) xərclədiyiniz və nəzir etdiyiniz hər hansı şeyi, şübhəsiz ki, Allah bilir, lakin (xəsislik göstərib özlərinə) zülm edənlərin (qiyamət günü) heç bir köməkçisi olmaz!

271. Yoxsullara aşkarda sədəqə verməyiniz yaxşıdır, lakin onu gizlində versəniz daha yaxşı olar. Bu, günahlarınızın bir qismini örtər. Allah tutduğunuz hər bir işdən xəbərdardır!

272. (Ya Rəsulum!) İnsanları doğru yola yönəltmək sənin borcun deyildir. (Sənin vəzifən ancaq onları haqq yola dəvət etməkdir). Allah kimi istərsə, onu doğru yola yönəldər. Malınızdan sərf etdiyiniz hər hansı bir şeyin (mənfəəti) ancaq özünüz üçündür. Siz onu yalnız Allahın razılığını qazanmaq üçün verirsiniz. Malınızdan verdiyiniz hər hansı bir şeyin əvəzi tamamilə sizə ödəniləcəkdir. Sizə əsla zülm edilməz!

273. (Sədəqə) Allah yolunda canından keçərək (dolanmaq, ruzi kəsb etmək üçün) yer üzündə hərəkət edə bilməyən (və ya buna imkanı

olmayan) yoxsullar üçündür. Belə şəxslər həyalı olub dilənçilikdən çəkindiklərinə görə nadanlar onları dövlətli hesab edirlər. (Ya Rəsulum!) Sən isə onları üzlərindən tanıyırsan. Onlar heç kəsdən israrla bir şey istəməzlər. Sizin mallarınızdan (bunlara) nə verdiyinizi, şübhəsiz ki, Allah bilir!

274. Mallarını gecə və gündüz, gizli və aşkar (yoxsullara) sərf edənlərin Rəbbi yanında böyük mükafatları vardır. Onların (axirətdə) heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər.

275. Sələm (müamilə, faiz) yeyənlər (qiyamət günü) qəbirlərindən ancaq Şeytan toxunmuş (cin vurmuş dəli) kimi qalxarlar. Bunların belə olmaları: “Alış-veriş də sələm kimi bir şeydir!” – dedikləri üzündəndir. Halbuki, Allah alış-verişi halal, sələm (faiz) almağı isə haram (qadağan) etmişdir. İndi hər kəs Rəbbi tərəfindən gələn nəsihəti qəbul etməklə (bu işə) son qoyarsa, keçmişdə aldığı (sələmlər) onundur (ona bağışlanar). Onun işi Allaha aiddir. Amma (yenidən sələmçiliyə) qayıdanlar cəhənnəmlikdirlər və orada həmişəlik qalacaqlar!

276. Allah sələmi (sələmlə qazanılan malın bərəkətini) məhv edər, sədəqələri (sədəqəsi verilmiş malın bərəkətini) isə artırar. Allah kafiri, günahkarı sevməz!

277. İman gətirən, xeyirli işlər görən, namaz qılan, zəkat verən şəxslərin Rəbbi yanında mükafatları vardır. Onların (axirətdə) heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər!

278. Ey möminlər! Əgər, doğrudan da, iman gətirmişsinizsə, Allahdan qorxub sələmdən qalan məbləğdən (faizdən) vaz keçin! (Onu borclulardan almayın!)

279. Əgər belə etməsəniz, o zaman Allaha və Onun peyğəmbərinə qarşı müharibəyə girişdiyinizi bilin! Yox, əgər tövbə etsəniz,

sərmayəniz (mayanız) sizindir. Beləliklə, nə siz zülm edərsiniz, nə də sizə zülm olunar!

280. Əgər sizə borclu olan şəxs çətin vəziyyətdə olarsa, ona vəziyyəti yaxşılaşıncaya qədər möhlət verin! Əgər bilmək istəyirsinizsə, (borcu) ona sədəqə olaraq bağışlamağınız daha yaxşıdır!

281. Allaha tərəf qaytarılacağınız gündən qorxun! (O gün) hər kəsə gördüyü əməlin əvəzi veriləcək və (haqsız yerə) zülm olunmayacaqdır!

282. Ey iman gətirənlər! Müəyyən müddətə bir-birinə borc verib aldıqda, onu yazın! Bunu (bu sənədi) aranızda bir nəfər katib ədalətlə yazsın! Katib gərək Allahın öyrətdiyi kimi yazmaqdan boyun qaçırmasın, yazsın! Borclu olan şəxs borcunu söyləyərək (deyə-deyə) yazdırsın və Rəbbi olan Allahdan qorxaraq ondan (borcdan) bir şey əskiltməsin. Əgər borclu ağılsız və zəifdirsə (qoca və ya uşaqdırsa), yaxud söyləməyə qadir deyilsə, o zaman gərək onun (əvəzinə) vəkili ədalətlə deyib (borcu) yazdırsın. Öz adamlarınızdan iki kişini də şahid tutun! Əgər iki kişi olmazsa, razı olduğunuz bir kişi ilə iki qadının şəhadəti kifayətdir. Əgər (qadınlardan) biri (şəhadəti) unudarsa, o birisi onun yadına salsın. Şahidlər (bu işə) dəvət olunduqları zaman boyun qaçırmasınlar. Az və ya çox olmasına baxmayaraq, borcu öz vaxtına qədər (nə müddətə verilmiş olduğunu) yazmağa ərinməyin! Sizin bu işiniz Allah yanında daha ədalətli, şahidlik üçün daha düzgün və şübhəyə düşməməniz üçün haqqa daha yaxındır. Lakin aranızda həmişə dövr edən aşkar (nağd) ticarət zamanı onu yazmamağınız sizin üçün günah deyildir. (Hər halda) alış-veriş etdiyiniz vaxt şahid tutun! Ancaq katibə və şahidə zərər yetirilməsin. Əgər zərər yetirsəniz, əlbəttə, bu sizin üçün pis işdir. Allahdan qorxun! Allah (ehtiyacınız olan şeyləri) sizə öyrədir. Allah bütün işləri biləndir!

283. Səfərdə olub katib tapmasanız, girov saxlayın. Əgər bir-birinizə etibar edirsinizsə, etibar olunmuş şəxs əmanəti geri qaytarsın və Rəbbi olan Allahdan qorxsun! Şahidliyi (şahidi olduğunuz şeyi) gizlətməyin! Onu gizlədən şəxsin qəlbi günahkardır. Allah etdiyiniz əməlləri biləndir!

284. Göylərdə və yerdə nə varsa, (hamısı) Allaha məxsusdur. Siz ürəyinizdə olanı zahirə çıxarsanız da, çıxarmasanız da, Allah ona müvafiq sizinlə haqq-hesab çəkər. (Allah) istədiyini bağışlar, istədiyinə də əzab verər. Allah hər şeyə qadirdir!

285. Peyğəmbər Rəbbi tərəfindən ona nazil edilənə (Qurana) inanmış və möminlər də iman gətirmişlər. (Onların) hamısı Allaha, Onun mələklərinə, kitablarına və (bütün) peyğəmbərlərinə iman gətirərək dedilər: “Biz Onun peyğəmbərləri arasında fərq qoymuruq. (Allahın hökmlərini) eşitdik (anladıq) və itaət etdik. Ey Rəbbimiz, bizi bağışla, (axırda) Sənin dərgahına (hüzuruna) qayıdacağıq!”

286. Allah hər kəsi yalnız qüvvəsi yetdiyi qədər yükləyər (bir işə mükəlləf edər). Hər kəsin qazandığı yaxşı əməl də, pis əməl də özünə aiddir. (Möminlər deyirlər: ) “Ey Rəbbimiz, (bəzi tapşırıqlarını) unutduqda və ya yanıldıqda bizi cəzalandırma! Ey Rəbbimiz, bizdən əvvəlkiləri yüklədiyin kimi, bizi ağır yükləmə! Ey Rəbbimiz, gücümüz çatmayan şeyi bizə yükləyib daşıtdırma! Bizi əfv edib bağışla, bizə rəhm et! Sən bizim ixtiyar sahibimizsən (mövlamızsan). Kafirlərə qələbə çalmaqda bizə kömək et!”

## .3.
## Ali-İmran (İmran ailəsi) surəsi

**(Mədinədə nazil olmuşdur, 200 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Əlif, Lam, Mim!

2. Allahdan başqa heç bir tanrı yoxdur. Əzəli, əbədi varlıq Odur.

3. Sənə özündən əvvəlkiləri (səmavi kitabları) təsdiq edən Kitabı (Quranı) haqq olaraq O nazil etdi. Tövratı da, İncili də O endirdi.

4. Daha öncə insanları hidayət etmək üçün. Furqanı da O nazil etdi. Allahın ayələrini inkar edənlər şiddətli əzaba düçar olacaqlar. Allah yenilməz qüvvət, intiqam sahibidir!

5. Yerdə və göylərdə heç bir şey Allahdan gizli qalmaz.

6. Bətnlərdə (anaların bətnində) sizə istədiyi surəti verən Odur! O qüdrət, hikmət sahibindən başqa heç bir tanrı yoxdur!

7. (Ya Rəsulum!) Sənə Kitabı (Quranı) nazil edən Odur. Onun (Kitabın) bir hissəsi (Quranın əslini, əsasını təşkil edən) möhkəm (mənası aydın, hökmü bəlli), digər qismi isə mütəşabih (çətin anlaşılan, dəqiq mənası bilinməyən, məğzi bəlli olmayan) ayələrdir. Ürəklərində əyrilik (şəkk-şübhə) olanlar fitnə-fəsad salmaq və istədikləri kimi məna vermək məqsədilə mütəşabih ayələrə uyarlar (tabe olarlar). Halbuki onların yozumunu (həqiqi mənasını) Allahdan (yaxud Allahdan və elmdə qüvvətli olanlardan) başqa heç kəs bilməz. Elmdə qüvvətli olanlar isə: “ Biz onlara iman gətirdik, onların hamısı Rəbbimizin dərgahındandır”, - deyərlər. Bunları ancaq ağıllı adamlar dərk edərlər.

8. Ey Rəbbimiz! Bizi doğru yola yönəltdikdən sonra ürəklərimizə şəkk-şübhə (azğınlıq, əyrilik) salma! Bizə Öz tərəfindən bir mərhəmət bəxş et, çünki Sən, həqiqətən, (bəndələrinə mərhəmət, nemət) bəxş edənsən!

9. Ey Rəbbimiz! Olacağına şübhə edilməyən bir gündə (qiyamətdə) bütün insanları (bir yerə) toplayan Sənsən. Allah Öz vədəsindən əsla dönməz!

10. Haqqı inkar edənlərin nə malları, nə də övladları onları Allah yanında (axirətdə) heç bir şeydən qurtara bilməz. Əlbəttə, onlar cəhənnəm odunun yanacağıdırlar!

11. Bunların adəti Firon camaatının və onlardan əvvəl gələnlərin adətinə bənzəyir! Onlar Bizim ayələrimizi təkzib etdilər. Allah da onları günahlarına görə cəzalandırdı. Allahın əzabı şiddətlidir!

12. (Ya Rəsulum!) Kafir olanlara de: "Siz (tezliklə) məğlub olacaq və Cəhənnəmə sürüklənəcəksiniz!" (Cəhənnəm) necə də pis yerdir!

13. (Ey Məkkə müşrikləri və yəhudilər!) İki dəstənin (Bədr müharibəsi zamanı) qarşı-qarşıya durması sizin üçün (Peyğəmbərin doğruluğuna) dəlildir. Bunlardan biri Allah yolunda vuruşanlar, digəri isə kafirlər idi. (Möminlər üç yüz on üç nəfər, kafirlər isə təqribən min nəfər idilər). (Möminlər kafirlərin) onlardan ikiqat artıq olduqlarını öz gözləri ilə görürdülər. (Yaxud kafirlər möminləri iki özləri qədər, yəni təxminən iki min nəfər və ya onların olduqlarından iki dəfə artıq, yəni altı yüzdən bir qədər çox görürdülər). Əlbəttə, Allah istədiyinə Öz köməyi ilə qüvvət verər. Şübhəsiz ki, bu (Bədr əhvalatı) bəsirət sahiblərindən (gözüaçıq, ayıq adamlardan) ötrü bir ibrət dərsidir.

14. Qadınlar, uşaqlar, qızıl-gümüş yığınları, yaxşı cins atlar, mal-qara və əkin yerləri kimi nəfsin istədiyi və arzuladığı şeylər insanlara gözəl göstərilmişdir. (Lakin bütün) bunlar dünya həyatının keçici zövqüdür, gözəl dönüş yeri isə Allah yanındadır.

15. (Ya Rəsulum!) Söylə: "Sizə bunlardan (dünya zinətlərindən) daha yaxşısını xəbər verimmi? Allahdan qorxub pis əməllərdən çəkinənlər üçün Rəbbi yanında (ağacları) altından çaylar axan cənnətlər (bağlar) vardır ki, orada əbədi qalacaqlar. Onlardan ötrü orada (hər cür eyibdən) pak olan zövcələr və (ən böyük nemət olan)

Allah rizası (razılığı, hüsn-rəğbəti) vardır. Allah, həqiqətən, bəndələrini görəndir!

16. O bəndələr ki: “Ey Rəbbimiz, biz həqiqətən (Sənə) iman gətirmişik, günahlarımızı bağışlayıb bizi cəhənnəm əzabından qoru!” – deyirlər.

17. Onlar (müsibətlərə) səbr edən, (sözlərində və işlərində) doğru olan, (Allaha) itaət edən, mallarından fəqirlərə verən və sübh vaxtı (Allahdan) bağışlanmaq diləyənlərdir (sübh namazına qalxanlardır).

18. Allah Özündən başqa heç bir tanrı olmadığına şahiddir. Mələklər və elm sahibləri də haqqa-ədalətlə boyun qoyaraq (haqqa tapınaraq) o qüvvət, hikmət sahibindən başqa ibadətə layiq heç bir varlıq olmadığına şəhadət verdilər.

19. Allah yanında (haqq olan) din, əlbəttə, islamdır. Kitab verilmiş şəxslər (yəhudilər və xaçpərəstlər) ancaq (bu dinin həqiqi olduğunu) bildikdən sonra aralarındakı paxıllıq üzündən ixtilafa (ayrılığa) başladılar. Allahın hökmlərini inkar edənlərlə, şübhəsiz ki, Allah tezliklə haqq-hesab çəkəcəkdir.

20. (Ya Rəsulum!) Əgər onlar (yəhudi və xaçpərəstlər) səninlə mübahisə edərlərsə, belə de: “Mən özümü ardımca gələnlərlə birlikdə Allaha təslim etmişəm”. Kitab verilmiş şəxslərə və savadsızlara (ərəb müşriklərinə) de: “Siz də təslim (müsəlman) oldunuzmu?” Əgər təslim olarlarsa (islamı qəbul edərlərsə), doğru yola yönəlmiş olarlar, yox, əgər üz döndərərlərsə, (sənə bir zərər gəlməz), sənin vəzifən ancaq (haqqı) təbliğ etməkdir. Allah, şübhəsiz ki, bəndələrini görəndir!

21. (Ya Rəsulum!) Allahın hökmlərini inkar edənlərə, peyğəmbərləri haqsız yerə öldürənlərə, insanları ədalətə çağıranların canına qəsd edənlərə şiddətli əzab veriləcəyini xəbər ver!

22. O şəxslərin əməlləri dünyada və axirətdə puça çıxacaq və köməkçiləri də olmayacaqdır.

23. Kitabdan (Tövratdan) özlərinə bir pay (qismət) verilmiş kimsələri görmürsənmi? Onlar öz aralarında hökm vermək üçün Allahın kitabına (istinad etməyə) dəvət olunurlar. Sonra onların bir qismi (Tövratın hökmlərindən) üz döndərir. Onlar (həmişə) dönüklük edəndirlər (haqdan üz çevirəndirlər).

24. Bu (dönüklük) onların: "Cəhənnəm odu bizə bir neçə gündən artıq toxunmaz!" –dediklərinə görədir. Onların öz dinləri barəsində düzəltdikləri uydurmalar (iftiralar) aldadıb yoldan çıxartmışdır.

25. Elə isə (vaqe olacağına) şübhə edilməyən bir gündə (qiyamət günündə) onları (bir yerə) topladığımız zaman (onların) halı necə olacaq? (O gün) hər kəsə qazandığının (tutduğu əməllərin) əvəzi ödəniləcək və onlara heç bir haqsızlıq edilməyəcəkdir.

26. (Ya Rəsulum!) De: "Ey mülkün sahibi olan Allah! Sən mülkü istədiyin şəxsə verər, istədiyin şəxsi yüksəldər və istədiyin şəxsi alçaldarsan. Xeyir yalnız Sənin əlindədir. Həqiqətən, Sən hər şeyə qadirsən!

27. Gecəni gündüzə, gündüzü isə gecəyə qatarsan. Ölüdən diri, diridən isə ölü çıxararsan. İstədiyin şəxsə saysız-hesabsız ruzi verərsən".

28. Möminlər möminləri buraxıb kafirləri dost tutmasınlar! Bunu edən (kafirləri özünə dost tutan) kəs Allahdan heç bir şey gözləməsin (onun Allah dərgahında heç bir qədir-qiyməti olmaz). Ancaq onlardan gələ biləcək bir təhlükədən qorxmanız (çəkinməniz) müstəsnadır. Allah sizi Öz əzabından çəkindirir. Axır dönüş Allaha tərəfdir! (Hamı Allahın hüzuruna qayıdacaqdır!)

29. (Ya Rəsulum!) De: “Ürəklərinizdəkini gizli də saxlasanız, aşkara da çıxartsanız (fərqi yoxdur), Allah onu bilir. Çünki O, göylərdə və yerdə nə varsa (hamısını) bilir. Allah hər şeyə qadirdir!

30. O gün (qiyamət günü) hər kəs etdiyi yaxşı və pis əməlləri qarşısında hazır görəcək və günahları ilə özü arasında çox uzaq məsafə olmasını arzulayacaqdır. Allah sizi Öz əzabından çəkindirir, çünki Allah bəndələrə (Öz bəndələrinə) mərhəmətlidir!”

31. (Ya Rəsulum!) De: “Əgər siz Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın. Allah bağışlayandır, mərhəmətlidir!”

32. Söylə: “Allaha və Peyğəmbərə (Onun Peyğəmbərinə) itaət edin! Əgər üz döndərərsinizsə, şübhəsiz ki, Allah da kafirləri (haqdan üz çevirənləri) sevməz!”

33. Allah Adəmi, Nuhu, İbrahim övladını və İmran ailəsini aləmlər (məxluqat, insanlar, bəşər övladı) üzərində seçilmiş (üstün) etdi.

34. Onlar biri digərindən törəmiş bir nəsil idilər. Allah eşidəndir, biləndir!

35. (Ya Rəsulum!) İmranın zövcəsinin (Hənnənin): “Ey Rəbbim, bətnimdəkini Sənə xidmətkar (qul) olmaq üçün nəzir edirəm. (Bu nəziri) məndən qəbul et! Əlbəttə, Sən eşidənsən, bilənsən!” – dediyini xatırla!

36. Onu (bətnindəkini) doğduğu zaman: “Ey Rəbbim! Mən qız doğdum”, - söylədi. Halbuki, Allah onun nə doğduğunu və oğlanın qız kimi olmadığını yaxşı bilirdi. (Hənnə:) “Mən onun adını Məryəm qoydum, onu və onun nəslini məlun (daşqalaq olunmuş) Şeytandan (Şeytanın şərindən) Sənə tapşırıram” (dedi).

37. Belə olduqda, Rəbbi (Məryəmi) yaxşı qəbul etdi, onu gözəl bir fidan kimi böyütdü və Zəkəriyyaya tapşırdı. Zəkəriyya hər dəfə (Məryəmin) ibadət etdiyi mehraba girdikdə, onun yanında bir ruzi olduğunu görərdi. (Zəkəriyya:) "Ya Məryəm, bunlar sənin üçün haradandır?" - dedikdə, o: "Allah tərəfindəndir!" - deyə cavab verərdi. Həqiqətən, Allah istədiyi şəxsə hədsiz ruzi verər!

38. (O zaman) Zəkəriyya Rəbbinə dua edərək dedi: "Ey Rəbbim! Mənə də Öz tərəfindən pak bir övlad bəxş et! Sən, həqiqətən, duaları eşidənsən!"

39. (Zəkəriyya) mehrabda (ibadətgahda) ayaq üstə durub namaz qılarkən mələklər ona müraciət edib dedilər: "Allah sənə Özü tərəfindən gələn kəlməni (İsanı) təsdiq edən, (tayfasını) ağa, nəfsinə hakim və əməlisalehlər zümrəsindən bir peyğəmbər olacaq Yəhyanın (dünyaya gələcəyi) xəbərini müjdə verir".

40. (Zəkəriyya: ) "Ey Rəbbim, üzərimə qocalıq çökdüyü və zövcəm qısır (doğmayan) olduğu halda, mənim necə oğlum ola bilər? " – söylədi. (Allah isə: ) " (Bəli) dediyin kimidir, (lakin) Allah nə istəsə, onu da edər", - deyə buyurdu.

41. (Zəkəriyya: ) "Ey Rəbbim! Mənə (zövcəmin hamilə olduğu vaxtı bilmək üçün) bir nişanə göstər", - dedikdə, (Allah: ) "Sənin nişanən üç günün ərzində adamlarla yalnız işarə ilə (əl, baş və gözlə) danışmaq olacaqdır. O vəziyyətdə belə Rəbbini çox yada sal (zikr et) və səhər-axşam şəninə təriflər deyib şükür et!" buyurdu.

42. (Ya Peyğəmbər!) Xatırla ki, bir zamanlar mələklər belə demişdilər: "Ya Məryəm, həqiqətən, Allah səni seçmiş, (eyiblərdən) təmizləmiş, (cəmi) aləmlərin (bütün dünyanın) qadınlarından üstün tutmuşdur.

43. Ya Məryəm, öz Rəbbinə itaət et, səcdəyə qapan və rüku edənlərlə birlikdə rüku et! (Namaz qılanlarla bir yerdə namaz qıl!)”

44. (Ya Rəsulum!) Bunlar qeyb xəbərlərindəndir ki, vəhy ilə sənə bildiririk. Onlar: “Məryəmi kim öz himayəsinə alacaq?” – deyə, qələmlərini (suya) atdıqları və bir-birilə mübahisə etdikləri zaman sən ki onların yanında deyildin.

45. Mələklər dedilər: “Ya Məryəm! Həqiqətən, Allah Öz tərəfindən bir kəlmə ilə sənə müjdə verir. Onun adı Məryəm oğlu İsa əl-Məsihdir ki, dünyada və axirətdə şanı uca (şərəfli) və (Allaha) yaxın olanlardandır.

46. O, (həm) beşikdə ikən, (həm də) yaşa dolduqdan sonra insanlarla danışacaq və salehlərdən (xeyirli iş görən şəxslərdən) olacaqdır”.

47. (Məryəm: ) “Ey Rəbbim! Mənə bir insan əli toxunmadığı halda necə uşağım ola bilər?” – dedikdə, (Allah) buyurdu: “(Bəli) elədir, (lakin) Allah istədiyini yaradır. O, bir işin əmələ gəlməsini qərara aldıqda, ona ancaq “Ol!” deyər, o da (dərhal) olar.

48. (Allah) ona (İsaya) yazmağı, hikməti, Tövratı və İncili öyrədəcək.

49. Və onu İsrail övladına (yəhudilərə) peyğəmbər göndərəcək. (İsa onlara deyəcək: ) “Mən, həqiqətən, Rəbbinizdən sizə möcüzə gətirmişəm. Sizin üçün palçıqdan quşa bənzər bir surət düzlədib ona üfürərəm, o da Allahın izni ilə quş olar. Anadangəlmə korları, cücam xəstəliyinə tutulanları sağaldar və Allahın izni ilə ölüləri dirildərəm. Mən evlərinizdə yediyiniz və yığıb saxladığınız şeyləri də sizə xəbər verərəm. Əgər möminsinizsə, bunda (söylədiklərimdə peyğəmbər olduğuna) bir dəlil vardır.

50. Məndən əvvəl göndərilmiş Tövratı təsdiq edərək (eyni zamanda orada) sizə haram edilmiş bəzi şeyləri (dəvə əti, qarın və bağırsaq piyi yemək, şənbə günü işləmək və s.) halal etmək üçün gəldim və sizə Rəbbiniz tərəfindən (peyğəmbərliyimin doğru olduğunu sübut edən) bir möcüzə gətirdim. İndi Allahdan qorxun və mənə itaət edin!

51. Şübhə yoxdur ki, Allah mənim də Rəbbim, sizin də Rəbbinizdir. Elə isə Ona ibadət edin! Budur doğru yol!

52. İsa onların (yəhudilərin) küfrünü (inanmadıqlarını) hiss etdikdə: "Allah yolunda kim mənim köməkçim olacaqdır?" - deyə soruşdu. (O zaman) həvarilər dedilər: "Bizik Allahın (Onun dininin) köməkçiləri! Biz Allaha inandıq. Sən də (Allaha) təslim olduğumuza şahid ol!"

53. (Həvarilər dedilər: ) "Ey Rəbbimiz, (bizə) nazil etdiyinə (İncilə) iman gətirdik və peyğəmbərinə (İsaya) tabe olduq. Artıq bizləri (haqqa) şahid olanlarla bir yerdə yaz!"

54. Onlar (İsaya inanmayanlar) hiyləyə əl atdılar. Allah da onların hiyləsinə (İsanı göyə qaldırıb münafiqlərdən birini isə İsa surətində onlara öldürtməklə) əvəz verdi. Allah (bütün) hiyləgərlərdən tədbirlidir (hiyləgərlərə ən yaxşı cəza verəndir).

55. O vaxt Allah buyurdu: "Ya İsa, həqiqətən, Mən sənin ömrünü tamam edib Öz dərgahıma qaldırıram, səni kafirlərdən pak edərəm (tərtəmiz ayıraram). Sənə iman gətirənləri qiyamət gününə qədər kafirlərə qalib edərəm. Sonra isə Mənim hüzuruma qayıdacaqsınız. O zaman ixtilaf etdiyiniz məsələlər barəsində aranızda Mən hökm verəcəyəm!

56. Kafirlərə gəldikdə, onlara dünyada və axirətdə şiddətli əzab verəcəyəm. Onların heç bir köməkçisi olmayacaqdır!"

57. İman gətirib yaxşı işlər görənlərə gəldikdə isə, (Allah) onların mükafatlarını tamamilə verəcəkdir. Allah zülm edənləri sevməz!

58. (Ya Rəsulum!) Bunları ayələrdən və hikmətlə dolu olan zikrdən (Qurandan Cəbrail vasitəsilə) sənə söyləyirik.

59. Allah yanında İsa da (İsanın atasız dünyaya gəlmiş də) Adəm kimidir. Allah onu (Adəmi) torpaqdan yaratdı. Sonra ona: "(Bəşər) ol!" – dedi, o da oldu.

60. (Ya Rəsulum!) Şübhəsiz ki, (bunlar) sənin Rəbbin tərəfindən olan həqiqətdir. Ona görə də şübhə edənlərdən olma!

61. (İsanın Allahın qulu və peyğəmbəri olması barədə) sənə göndərilən elmdən (məlumatdan) sonra buna (İsanın əhvalatına) dair səninlə mübahisə edənlərə de: "Gəlin biz də oğlanlarımızı, siz də oğlanlarınızı; biz də qadınlarımızı, siz də qadınlarınızı; biz də özümüzü, siz də özünüzü (bura) çağıraq! Sonra (Allaha) dua edib yalançılara Allahın lənət etməsini diləyək!"

62. Əlbəttə, doğru olan xəbər budur. Allahdan başqa heç bir tanrı yoxdur. Şübhəsiz ki, Allah yenilməz qüvvət, hikmət sahibidir!

63. Əgər onlar üz döndərərlərsə (qoy döndərsinlər). Əlbəttə ki, Allah fitnə-fəsad törədənləri tanıyandır!

64. (Ya Rəsulum!) Söylə: "Ey kitab əhli, sizinlə bizim aramızda eyni olan (fərqi olmayan) bir kəlməyə tərəf gəlin! ( O kəlmə budur: ) "Allahdan başqasına ibadət etməyək. Ona şərik qoşmayaq və Allahı qoyub bir-birimizi (özümüzə) Rəbb qəbul etməyək!" Əgər onlar yenə də üz döndərərlərsə, o zaman (onlara) deyin: "İndi şahid olun ki, biz, həqiqətən, müsəlmanlarıq (Allaha təslim olanlarıq)!"

65. Ey kitab əhli, nə üçün İbrahim barəsində höcətləşirsiniz? Tövrat da, İncil də ancaq ondan sonra nazil edilmişdir, məgər başa düşmürsünüz?

66. Bir baxın, siz o kimsələrsiniz ki, bildiyiniz şeylər barəsində mübahisə edirsiniz (bu aydındır) Bəs bilmədiyiniz şeylər barəsində niyə mübahisəyə girişirsiniz?! Əlbəttə, (həqiqəti) Allah bilir, siz bilməzsiniz!

67. İbrahim nə yəhudi, nə də xaçpərəst idi. O ancaq hənif (batildən haqqa tapınan, haqqa yönəlmiş olan) müsəlman (Allaha təslim olan) idi və (Allaha) şərik qoşanlardan deyildi.

68. Şübhəsiz ki, insanların İbrahimə ən yaxın olanı onun ardınca gedənlər, bu Peyğəmbər (Muhəmməd) və ona iman gətirənlərdir. Allah möminlərin dostudur!

69. Kitab əhlindən bir dəstə sizi yolunuzdan sapdırmağı arzu etdikləri halda, yalnız özlərini düz yoldan sapdırırlar, lakin onlar bunu dərk etmirlər.

70. Ey kitab əhli, Allahın ayələrinə şahid olduğunuz halda nə üçün (onları) inkar edirsiniz?

71. Ey kitab əhli, nə üçün bilə-bilə haqqa yalan donu geyindirir və doğrunu gizlədirsiniz?

72. Kitab əhlindən (yəhudilərdən) bir dəstə (bir-birinə) dedi: “Möminlərə nazil edilənə (Qurana) günün əvvəlində (səhər vaxtı) inanın, həmin günün axırında (axşam vaxtı) isə onu inkar edin! Bəlkə, (möminlər öz dinlərindən) üz döndərsinlər.

73. Sizin dininizə tabe olanlardan başqa heç kəsə inanmayın!” (Ya Rəsulum! Onlara) söylə: “Əlbəttə, doğru yol, Allahın yoludur”. (Yəhudilər öz adamlarına dedilər: ) “Sizə verilən şeyin (Tövratın və

bəzi digər nemətlərin) bənzərinin başqa birisinə (müsəlmanlara) veriləcəyinə, yaxud Rəbbiniz yanında onların sizinlə mübahisə edəcəyinə (inanmayın)!" (Ya Rəsulum!) De: "Həqiqətən, nemət Allahın əlindədir və onu istədiyi şəxsə bəxş edər. Allah (rəhməti ilə) genişdir. (O, hər şeyi) biləndir!"

74. (Allah) Öz nemətini istədiyi şəxsə aid edər. Allah böyük kərəm sahibidir!

75. Kitab əhlindən elə kəslər vardır ki, əgər onlara bir qinar (çoxlu) əmanət verərsənsə, onu tamamilə sənə qaytararlar; elələri də vardır ki, onlara təkcə bir dinar qızıl əmanət versən, başlarının üzərində möhkəm durub tələb etməyincə sənə qaytarmazlar. Bunun səbəbi budur ki, onlar: "Ümmilərə görə (kitab əhli olmayan cahil ərəblərin mallarını mənimsəməyə görə) bizə irad tutulmayacaq", - deyər və bilə-bilə Allaha qarşı yalan söyləyərlər.

76. Xeyr (elə deyildir). Hər kəs öz əhdinə vəfa etsə və pis əməllərdən çəkinsə (əmanətə xəyanət etməsə), şübhəsiz ki, Allah (belə) müttəqiləri sevər.

77. Allah ilə olan əhdlərini və andlarını ucuz bir qiymətə satan şəxslərə axirət nemətlərindən heç bir pay yoxdur. Allah qiyamət günündə onları dindirməz, onlara nəzər salmaz və onları (günahlarından) pak etməz (təmizə çıxarmaz). Onları şiddətli bir əzab gözləyir!

78. (Ey müsəlmanlar!) Onlardan (kitab əhlindən) bir zümrə də vardır ki, siz onların oxuduqlarını (Tövratdan) hesab edəsiniz deyə, kitab oxuyan zaman dillərini (qəsdən) o tərəf-bu tərəfə əyirlər (bükürlər). Halbuki onların bu oxuduqları kitabdan (Tövratdan) deyildir. Onlar isə: "Bunlar Allah tərəfindəndir", -dedilər. Bunlar isə heç də Allah tərəfindən deyildir. Söylədikləri Allah dərgahından

olmadığı halda, “Bu, Allah dərgahındandır”, - deyirlər. Onlar bilə-bilə Allaha qarşı yalan söyləyirlər.

79. Heç bir kəsə yaraşmaz ki, Allah ona kitab, hikmət və peyğəmbərlik bəxş etdikdən sonra o, insanlara: “Allahı buraxıb mənə qul olun!” – desin. Əksinə, o: “Öyrətdiyiniz kitabın və öyrəndiyiniz şeyin sayəsində rəbbani (mükəmməl elm və əməl, gözəl əxlaq və itaət sahibi) olun!” - deyər.

80. O sizə mələkləri və peyğəmbərləri özünüzə Rəbb qəbul etməyi əmr etməz. O sizə müsəlman olduqdan (özünüzü Allaha təslim etdikdən) sonra kafir olmağı heç əmr edərmi?!

81. (Ey kitab əhli!) O vaxtı yadınıza gətirin ki, Allah peyğəmbərlərdən: “Sizə verdiyim kitab və hikmətdən sonra, sizdə olanı təsdiq edən bir peyğəmbər gəldikdə ona mütləq inanıb yardım edəcəksiniz”, - deyə əhd almış və onlara: “Bunu təsdiq edib, ağır olan əhdimi qəbul etdinizmi? – demişdi. Onlar da: “Təsdiq etdik!” – deyə cavab vermişdilər. (Bu zaman) Allah: “Elə isə (bir-birinizə) şahid olun! Mən də sizinlə bərabər şahidlərdənəm”, - deyə buyurmuşdu!

82. Bundan (bu təsdiqdən) sonra üz döndərən kəslər fasiqlərdir (böyük günah sahibləridir).

83. Necə ola bilər ki, onlar (kitab əhli) Allahın dinindən başqa bir din axtarsınlar? Halbuki göylərdə və yerdə olanlar istər-istəməz Ona (Allaha) təslim olmuşlar və Onun hüzuruna qayıdacaqlar.

84. (Ya Rəsulum!) Söylə: “Biz Allaha, bizə nazil olana (Qurana), İbrahimə, İsmailə, İshaqa, Yəquba və onun oğullarına nazil edilənə, Rəbbi tərəfindən Musa, İsa və (sair) peyğəmbərlərə verilənlərə inandıq və onların heç birini bir-birindən ayırmırıq. Biz yalnız Ona (Allaha) təslim oluruq!”

85. Kim islamdan başqa bir din ardınca gedərsə, (o din) heç vaxt ondan qəbul olunmaz və o şəxs axirətdə zərər çəkənlərdən olar!

86. İman gətirdikdən, Rəsulun (Muhəmməd əleyhis-səlatu vəs-səlamın) haqq olduğuna (Allah tərəfindən göndərildiyinə) şəhadət verdikdən və özlərinə aşkar dəlillər gəldikdən sonra kafir olan tayfanı Allah necə doğru yola yönəldər? Allah zalımlar dəstəsini haqq yola yönəltməz!

87. Onların cəzası, həqiqətən, Allahın, mələklərin və bütün insanların lənətinə düçar olmaqdır!

88. Onlar bu lənət içərisində əbədi olaraq qalacaqlar. Əzabları əskilmədiyi kimi, onlara (mərhəmət nəzəri ilə də) baxılmayacaqdır!

89. Yalnız bundan sonra tövbə edərək düzələn şəxslər (bağışlanarlar). Şübhəsiz ki, Allah bağışlayandır, rəhm edəndir!

90. İman gətirəndən sonra kafir olan və küfrlərini daha da artıran şəxslərin tövbələri əsla qəbul olunmaz. (Doğru yoldan) azanlar məhz onlardır!

91. Şübhəsiz ki, kafir olub kafir kimi ölənlərdən hər birinin dünya dolusu qızılı ola və (əzabdan qurtarmaq üçün) onu fidyə verə, yenə də qəbul olunmaz. Onları dəhşətli bir əzab gözləyir. Onlara (cəhənnəm odundan xilas olmaqdan) heç bir kömək edən olmaz!

92. Sevdiyiniz şeylərdən (haqq yolunda) sərf etməyincə savaba çatmarsınız. Şübhəsiz ki, Allah (Onun yolunda) xərclədiyiniz hər bir şeyi biləndir!

93. Tövrat göndərilməmişdən əvvəl İsrailin (Yəqub peyğəmbərin) yalnız özü özünə haram etdiyi şeylərdən başqa bütün təamlar (yeməklər) İsrail övladına halal idi. (Ya Rəsulum! Yəhudilərə) de:

“Əgər doğru danışanlarsınızsa, (düzgün, əsl) Tövratı gətirin və onu oxuyun!”

94. Bundan sonra Allaha qarşı yalan uyduran şəxslər (yalnız özlərinə) zülm edənlərdir!

95. (Ya Rəsulum!) De: “Allah doğru buyurmuşdur. Ona görə də hənif olan İbrahim dininin ardınca gedin, çünki o, (Allaha) şərik qoşanlardan deyildi”

96. Həqiqətən, insanlar üçün ilk bina olunan ev (məbəd) Məkkədəki evdir ki, o, şübhəsiz, bütün aləmlərdən ötrü bərəkət və doğru yol qaynağıdır.

97. Orada aydın nişanələr – İbrahimin məqamı vardır. Ora daxil olan şəxs əmin-amanlıqdadır (təhlükədən kənardır). Onun yoluna (ərzaq, minik, və sağlamlıq baxımından) gücü çatan hər bir kəsin həccə gedib o evi ziyarət etməsi insanların Allah qarşısında borcudur. Kim bunu (bu borcu) inkar edərsə (özünə zülm etmiş olar). Əlbəttə, Allah aləmlərə (heç kəsə) möhtac deyildir!

98. De: “Ey kitab əhli! Allah sizin əməllərinizin şahidi olduğu halda, nə üçün Allahın ayələrini (dəlillərini) inkar edirsiniz?”

99. De: “Ey kitab əhli! Siz (haqqa) şahid olduğunuz halda, nə üçün iman gətirən kimsələri Allahın yolundan geri döndərməyə çalışaraq onlar üçün əyri yol axtarırsınız? Halbuki, Allah sizin etdiklərinizdən qafil deyildir”.

100. Ey möminlər! Əgər siz kitab əhli olanlardan bir dəstəyə (yəhudilərə) uyarsınızsa, onlar sizi iman gətirəndən sonra döndərib kafir edərlər.

101. Sizə Allahın hökmləri oxunduğu və Onun Peyğəmbəri aranızda olduğu halda, siz necə kafir ola bilərsiniz? Allaha (Onun dininə) sığınan şəxs, şübhəsiz ki, doğru yola yönəldilmişdir.

102. Ey iman gətirənlər! Allahdan layiqincə qorxun. Yalnız müsəlman olduğunuz halda (müsəlman kimi) ölün!

103. Hamılıqla Allahın ipinə (dininə, Qurana) möhkəm sarılın və (firqələrə bölünüb bir-birinizdən) ayrılmayın! Allahın sizə verdiyi nemətini xatırlayın ki, siz bir-birinizə düşmən ikən. O sizin qəlblərinizi (islam ilə) birləşdirdi və Onun neməti sayəsində bir-birinizlə qardaş oldunuz. Siz oddan olan bir uçurumun kənarında ikən O sizi oradan xilas etdi. Allah Öz ayələrini sizin üçün bu şəkildə aydınlaşdırır ki, haqq yola yönəlmiş olasınız!

104. (Ey müsəlmanlar!) İçərinizdə (insanları) yaxşılığa çağıran, xeyirli işlər görməyi əmr edən və pis əməlləri qadağan edən bir camaat olsun! Bunlar (bu camaat), həqiqətən nicat tapmış şəxslərdir.

105. (Allahdan tərəfindən) açıq-aydın dəlillər gəldikdən sonra, bir-birindən ayrılan və ixtilaf törədən şəxslər kimi olmayın! Onlar böyük bir əzaba düçar olacaqlar.

106. Bəzi üzlərin ağ, bəzi üzlərin isə qara olacağı gündə (qiyamət günündə), üzü qara olanlara: “İman gətirəndən sonra kafirmi oldunuz? İndi, kafir olduğunuza görə dadın əzabı!” – deyiləcəkdir.

107. Üzü ağ olanlar isə Allahın mərhəməti içərisində olub orada (Cənnətdə) həmişəlik qalacaqlar!

108. Budur Allahın ayələri! Biz onları sənə olduğu kimi oxuyuruq. Allah aləmlərə (bəşər əhlinə) zülm etmək istəməz.

109. Göylərdə və yerdə nə varsa, (hamısı) Allaha məxsusdur. Bütün işlər axırda Allaha qayıdacaqdır!

110. (Ey müsəlmanlar!) Siz insanlar üçün ortaya çıxarılmış ən yaxşı ümmətsiniz (onlara) yaxşı işlər görməyi əmr edir, pis əməlləri qadağan edir və Allaha inanırsınız. Əgər kitab əhli də (sizin kimi) iman gətirsəydi, əlbəttə, onlar üçün yaxşı olardı. Onların da içərisində bəzi iman gətirən şəxslər vardır, lakin çox hissəsi haqq yoldan çıxanlardır.

111. Onlar (yəhudilər) sizə (dil ilə) əziyyət verməkdən başqa bir zərər yetirməzlər. Əgər sizinlə savaşacaq olsalar, dönüb qaçarlar. Sonra isə onlara kömək edən də olmaz.

112. Onlara (yəhudilərə), harada olursa olsunlar, zillət damğası vurulmuşdur. (Onlar bu zillətdən) yalnız Allahdan olan bir ipə və insanlardan olan bir ipə sarınmaqla (islamı qəbul etməklə, yaxud öz dinlərində qalıb müsəlmanlara cizyə verməklə) xilas ola bilərlər. Onlar Allahın qəzəbinə düçar olmuş, onlara miskinlik damğası vurulmuşdur. Bunun səbəbi odur ki, onlar Allahın ayələrini inkar etmiş, peyğəmbərləri haqsız yerə öldürmüşlər. Bunun bir səbəbi də odur ki, onlar Allaha qarşı üsyan etmiş və həddi aşmışlar.

113. Onların hamısı eyni deyil. Kitab əhli içərisində düzgün (sabitqədəm) bir camaat vardır ki, onlar gecə vaxtları səcdə edərək Allahın ayələrini oxuyurlar.

114. Onlar Allaha, axirət gününə inanır, (insanlara) yaxşı işlər görməyi əmr edir, (onları) pis əməllərdən çəkindirir və xeyirli işlər görməyə tələsirlər. Onlar əməlisaleh şəxslərdəndirlər.

115. Onların yaxşılıq naminə etdikləri işlərdən heç biri inkar edilməz (mükafatsız qalmaz). Şübhəsiz ki, Allah müttəqi olanları tanıyır!

116. Əlbəttə, kafir olan şəxslərin nə malları, nə də övladları onları Allahdan (Allahın əzabından) əsla qurtara bilməyəcək. Onlar cəhənnəmlikdirlər və orada əbədi qalacaqlar.

117. Onların bu dünyada sərf etdikləri şey, özünə zülm edən bir qövmün əkinlərini məhv edən soyuq bir küləyə bənzər. Allah onlara zülm etmədi, lakin onlar öz-özlərinə zülm etdilər.

118. Ey iman gətirənlər! Özündən başqasını özünüzə sirdaş (dost) tutmayın. Onlar sizin barənizdə fitnə-fəsad törətməkdən əl çəkməzlər, sizin (zərərə və) əziyyətə düşməyinizi istəyirlər. Həqiqətən, onların sizə qarşı olan ədavəti ağızlarından çıxan sözlərdən aşkar olur. Amma ürəklərində gizlətdikləri (düşmənçilik) isə daha böyükdür. Əgər düşünüb dərk edirsinizsə, (onların sizə bəslədikləri ədavət barəsindəki) ayələri artıq sizə izah etdik.

119. Bəli, siz o kimsələrsiniz ki, onları sevirsiniz, onlar isə sizləri sevməzlər. Siz kitabın hamısına (bütün ilahi kitablara) inanırsınız. Onlar sizinlə görüşdükləri zaman: “Biz də inandıq”, - deyir, xəlvətdə olduqda isə sizə qarşı qəzəblərindən barmaqlarını gəmirirlər. (Ya Rəsulum!) De: “Acığınızdan ölün!” Əlbəttə, Allah ürəklərdə olanları biləndir.

120. Sizə bir mənfəət yetişəndə onlar qəmgin olur, sizə bir zərər toxunanda isə ona sevinirlər. Əgər səbr edib özünüzü qorusanız (Allahdan qorxsanız), onların hiyləsi sizə heç bir zərər yetirməz. Şübhəsiz ki, Allah onların nə etdiklərini biləndir.

121. (Ya Rəsulum!) Sən müharibədən ötrü möminlərə (əlverişli) mövqelər hazırlamaq üçün sübh vaxtı öz ailəndən ayrılıb (Mədinədən Ühüdə) getdiyin vaxtı (yadına sal)! Şübhəsiz ki, Allah (hər şeyi) eşidəndir, biləndir!

122. (O müharibədə) sizin içərinizdən (Sələmə və Harisə oğullarından ibarət) iki dəstə məğlubiyyətdən (uğursuzluqdan) qorxaraq geri çəkilmək fikrinə düşmüşdü. Halbuki, Allah onların yardımçısı idi. Gərək möminlər (hər işdə) Allaha təvəkkül etsinlər!

123. (Ya Rəsulum!) Həqiqətən, siz Bədrdə (düşmənə nisbətən az və) zəif olduğunuz halda, Allah sizə yardım etdi. (Allaha) şükür edən olmaq üçün Allahdan qorxun!

124. O zaman sən möminlərə deyirdin: “Rəbbinizin üç min mələk endirərək imdadınıza yetişməsi sizə kifayət etməzmi?”

125. Bəli, əgər səbr edib (Allahdan) qorxsanız, onlar (Məkkə müşrikləri) qəzəblə üstünüzə gəldikləri zaman Rəbbiniz artıq beş min nişan qoyulmuş mələklə sizə yardım edər.

126. Allah bunu sizin üçün məhz müjdə olaraq və qəlbləriniz rahatlansın deyə etdi. Kömək ancaq yenilməz qüdrət, hikmət sahibi olan Allahdandır ki,

127. O (bununla) kafirlərin bir hissəsini məhv etsin (döyüş meydanında kəsib-doğrasın) və ya onları məğlubiyyətə uğratsın. Belə ki, onlar naümid geri dönsünlər.

128. (Ya Rəsulum!) Bu işdə sənə dəxli olan bir şey yoxdur. (Allah) ya onların tövbələrini qəbul edər, ya da onlara əzab verər, çünki onlar, həqiqətən, zalım kimsələrdir.

129. Göylərdə və yerdə olanlar Allaha məxsusdur. O, istədiyini bağışlar, istədiyinə isə əzab verər. Əlbəttə, Allah bağışlayandır, rəhm edəndir!

130. Ey iman gətirənlər! Sələmi (borc üzərinə qoyduğunuz faizi) qat-qat artırıb yeməyin. Allahdan qorxun ki, bəlkə, nicat tapasınız!

131. Kafirlər üçün hazırlanmış oddan (Cəhənnəmdən) həzər edin!

132. Allaha və peyğəmbərə itaət edin ki, bəlkə, bağışlanmış olasınız!

133. Rəbbinizin məğfirətinə və genişliyi göylərlə yer üzü qədər olan, müttəqilər üçün hazırlanmış Cənnətə tələsin.

134. O müttəqilər ki, bolluqda da, qıtlıqda da (mallarını yoxsullara) xərcləyər, qəzəblərini udar, insanların günahlarından keçərlər. Allah yaxşılıq edənləri sevər.

135. O müttəqilər ki, bir günah iş gördükləri, yaxud özlərinə zülm etdikləri zaman Allahı yada salıb (tövbə edərək) günahlarının bağışlanmasını istəyərlər. Axı günahları Allahdan başqa kim bağışlaya bilər? Və onlar etdiklərini (gördükləri işin pis olduğunu) bildikdə (tövbədən sonra) bir daha ona qayıtmazlar.

136. Onların mükafatı öz Rəbbi tərəfindən bağışlanmaq və (ağacları) altından çaylar axan cənnətlərdir ki, orada əbədi qalacaqlar. Yaxşı işlər görənlərin mükafatı nə gözəldir!

137. (Ey Müsəlmanlar!) Sizdən əvvəl bir çox vaqilər (ibrətli əhvalatlar) olub keçmişdir. İndi yer üzünü dolaşıb haqqı təkzib edənlərin aqibətinin necə olduğunu görün!

138. Bu, (belə əhvalatlar) insanlardan (xalqdan) ötrü (olub keçənlərə dair) bir xəbər, müttəqilərdən ötrü isə hidayət (doğru yola göstəriş) və nəsihətdir.

139. (Ühüd müharibəsində baş vermiş bəzi hadisələrə görə) ruhdan düşməyin və qəmgin olmayın. Halbuki, əgər möminsinizsə, siz (Allah yanında inanmayanlardan) çox yüksəkdə durursunuz!

140. Əgər siz (Ühüd müharibəsində) yara aldınızsa, o biri (kafir) dəstə də (Bədr müharibəsində) o cür yara aldı. Biz bu günləri (bu hadisələri) insanlar arasında növbə ilə dəyişdiririk ki, Allah iman gətirən şəxsləri (başqalarından) ayırd etsin və içərinizdən şəhidlər (şahidlər) seçsin. Allah zülmkarları sevməz!

141. (Bu həm də) Allahın iman gətirənləri (günahlardan) təmizləməsi və kafirləri məhv etməsi üçündür.

142. Yoxsa Allah içərinizdən cihad edənləri (düşmənlə vuruşanları) və (əziyyətə) səbr edənləri bilib (bəlliləşdirib bir-birindən) ayırd etməmişdən qabaq Cənnətə girəcəyinizimi güman edirsiniz?

143. Siz (Bədr vuruşunda) ölümlə qarşılaşmadan əvvəl ölüm (şəhid olmaq) arzulayırdınız. (Ühüd vuruşunda isə) artıq onu gördünüz və durub baxdınız.

144. Muhəmməd ancaq bir peyğəmbərdir. Ondan əvvəl də peyğəmbərlər gəlib-getmişlər. Əgər o, ölsə və ya öldürülsə, siz gerimi dönəcəksiniz? (Dininizdən dönəcək və ya döyüşdən qaçacaqsınız?) Halbuki geri dönən şəxs Allaha heç bir zərər yetirməz. Lakin Allah şükür edənlərə mükafat verər.

145. Allahın izni olmayınca heç kəsə ölüm yoxdur. O, (lövhi-məhfuzda) vaxtı müəyyən edilmiş bir yazıdır. (Cihadda) dünya mənfəəti istəyən şəxsə dünya mənfəətindən, axirət savabı istəyən şəxsə isə axirət savabından verəcək. Şükür edənləri də, əlbəttə, mükafatlandıracağıq!

146. Neçə-neçə peyğəmbər bir yığın allahpərəstlə (Allah adamı ilə) birlikdə (düşmənə qarşı) vuruşmuşlar. Lakin onlar Allah yolunda çəkdikləri müsibətlərə görə nə zəiflik, nə acizlik göstərmiş, nə də (kafirlərə) boyun əymişlər. Allah səbr edənləri sevər!

147. Onların: “Ya Rəbbimiz, günahlarımıza və işlərimizdə həddi aşdığımıza görə bizi bağışla! Qədəmlərimizi möhkəmləndir (düşmən ilə vuruşda dizimizə qüvvət ver) və kafirlərə qələbə çalmaqda bizə kömək et!” – deməkdən başqa sözləri olmamışdır.

148. Nəhayət, Allah onlara həm dünya nemətlərini, həm də ən gözəl axirət nemətini (Cənnəti) verdi. Allah yaxşı iş görənləri sevər!

149. Ey iman gətirənlər! Əgər kafirlərə itaət edəcək olsanız, onlar sizi geri (öz dinlərinə) döndərər və siz də zərər çəkmiş halda geri dönərsiniz.

150. Xeyr, Allah sizin ixtiyar sahibinizdir. O, yardım edənlərin ən yaxşısıdır.

151. Haqqında heç bir dəlil nazil etmədiyi şeyi Allaha şərik qoşduqlarına görə kafirlərin ürəklərinə qorxu salarıq. Onların yeri Cəhənnəmdir. Zülm edənlərin sığınacaqları yer nə pisdir!

152. (Ühüd müharibəsində) siz onları Allahın iznilə əzib-qırdığınız zaman, Allah sizə verdiyi vədinə sadiq çıxdı. Lakin O (Allah) sevdiyiniz şeyi (zəfər və qəniməti) sizə göstərəndən sonra isə zəiflik göstərdiniz və (sizə verilmiş) əmr barəsində bir-birinizlə mübahisə edərək (Peyğəmbərə) qarşı çıxdınız. İçərinizdən bəziləri dünyanı, bəziləri isə axirəti istəyirdi. Əlbəttə, O sizi əfv etdi. Çünki Allah möminlərə qarşı mərhəmətlidir!

153. Siz (düşməndən qaçaraq dağa) qalxdığınız və Peyğəmbər arxa tərəfdən sizi çağırarkən heç kəsə baxmadığınız zaman Allah sizin qəminizin üstünə qəm gətirməklə (məğlubiyyət, Peyğəmbərin qətl edilməsi barəsindəki yanlış xəbərdən doğan əndişə; onun əmrinə tabe olmamaq nəticəsində üz verən peşmançılıqla) cəzalandırdı ki, əlinizdən çıxan şeylərə və uğradığınız fəlakətlərə görə təəssüf etməyəsiniz. Şübhəsiz ki, Allah gördüyünüz işlərdən xəbərdardır!

154. Bu qəm qüssədən sonra Allah sizə rahatlıq üçün xəfif bir uyğu göndərdi. O sizin bir qisminizi bürüdü. O biri qisminiz isə ancaq öz canlarının harayına qalaraq: “Bu işdə bizim üçün bir şey (xeyir) varmı?” – deyə Allaha qarşı haqsız yerə, cahiliyyətə xas olan düşüncələrə qapıldılar. (Ya Rəsulum!) Onlara de: “Əlbəttə, bütün işlər Allaha məxsusdur (Allahın əlindədir)”. Onlar (münafiqlər) sənə açıb bildirmədikləri şeyləri öz ürəklərində gizlədərək: “Əgər bu işdə

bizim üçün bir şey (bir qələbə) olsaydı, elə buradaca öldürülməzdik", - deyirlər. (Ya Rəsulum!) De: "Əgər siz evlərinizdə olsaydınız belə, alınlarına ölüm yazılmış kəslər yenə çıxıb əbədi yatacaqları (öləcəkləri) yerlərə gedərdilər ki, Allah (bununla) sizin ürəklərinizdə olanları (səmimiyyət və ikiüzlülüyü) yoxlayıb aşkara çıxartsın və qəlblərinizdə olanları (niyyətlərinizi) təmizləsin. Allah ürəklərdə olanları biləndir!"

155. (Ühüd müharibəsində) iki ordu qarşılaşdığı gün sizdən üz döndərənləri Şeytan, məhz etdikləri bəzi əməllərlə (Peyğəmbərin əmrinə asi olmaqla) yoldan çıxmağa (büdrəməyə) məcbur etdi. (Tövbə etdikdən sonra) Allah artıq onları bağışladı. Həqiqətən, Allah bağışlayandır, həlimdir!

156. Ey iman gətirənlər! Səfərə və ya müharibəyə getmiş (orada vəfat etmiş və ya öldürülmüş) qardaşları barəsində: "Əgər onlar bizim yanımızda olsaydılar, nə ölər, nə də öldürülərdilər", - deyən kafirlər kimi olmayın! Allah bunu (bu əqidəni) onların ürəklərində bir həsrət (yarası) olsun deyə yaratdı. Halbuki, dirildən də, öldürən də Allahdır. Allah etdiyiniz əməlləri görəndir!

157. Əgər Allah yolunda öldürülər və ya ölərsinizsə, Allahın sizi bağışlaması və rəhm etməsi şübhəsiz ki, (kafirlərin dünyada) topladıqları şeylərdən (sərvətdən) daha xeyirlidir.

158. Ölsəniz də, öldürülsəniz də, (axırda) mütləq Allahın hüzuruna toplanacaqsınız!

159. (Ya Rəsulum!) Allahın mərhəməti səbəbinə sən onlarla (döyüşdən qaçıb sonra yanına qayıdanlarla) yumşaq rəftar etdin. Əgər qaba, sərt ürəkli olsaydın, əlbəttə, onlar sənin ətrafından dağılıb gedərdilər. Artıq sən onları əfv et, onlar üçün (Allahdan) bağışlanmaq dilə, işdə onlarla məsləhətləş, qəti qərara gəldikdə isə Allaha təvəkkül et! Həqiqətən Allah (Ona) təvəkkül edənləri sevər!

160. Əgər Allah sizə yardım edərsə, heç kəs sizə qalib gələ bilməz. Yox, əgər sizi zəlil edərsə, Ondan sonra kim sizə kömək edə bilər? Buna görə də möminlər Allaha təvəkkül etsinlər!

161. Heç bir peyğəmbərə əmanətə xəyanət etmək yaraşmaz. Əmanətə xəyanət edən şəxs, qiyamət günü xəyanət etdiyi şeylə (boynuna yüklənmiş halda) gələr. Sonra isə hər kəsə gördüyü işlərin əvəzi verilər və onlara haqsızlıq edilməz!

162. Allahın rizasını qazanmaq ardınca gedən şəxs, Allahın qəzəbinə düçar olmuş şəxs kimi ola bilərmi? Onun (qəzəbə düçar olanın) yeri Cəhənnəmdir. O yer necə də pisdir!

163. Onların Allah yanında (bir-birindən fərqli) dərəcələri vardır. Allah onların etdiyi işləri görəndir.

164. Allah möminlərə lütf etdi. Çünki onların öz içərisindən özlərinə (Allahın) ayələrini oxuyan, onları (pis əməllərdən) təmizləyən, onlara Kitabı (Quranı) və hikməti öyrədən bir peyğəmbər göndərdi. Halbuki bundan əvvəl onlar açıq-aydın zəlalət içərisində idilər.

165. Siz (Bədr müharibəsində yetmiş nəfəri öldürüb, yetmiş nəfəri əsir alaraq) onları ikiqat müsibətə düçar etdiyiniz halda, (Ühüd müharibəsində) başınıza bir müsibət gəldiyi zaman: "Bu haradan gəldi?" – dediniz. (Ya Rəsulum!) Söylə: "Bu sizin özünüzdəndir". Həqiqətən, Allah hər şeyə qadirdir!

166. (Ühüd müharibəsində) iki ordunun qarşılaşdığı gündə başınıza gələn fəlakət də Allahın iznilə oldu ki, möminləri ayırd etsin.

167. Və münafiqləri onlardan fərqləndirsin. Onlara: "Gəlin Allah yolunda vuruşun, yaxud müdafiədə bulunun! (Düşmənin hücumunu dəf edin!) – deyildi. Onlar: "Əgər biz vuruşa bilsəydik, sizin ardınızca gələrdik" – deyə cavab verdilər. Onlar o gün imandan çox

küfrə yaxınlaşmışdılar, ürəklərində olmayan şeyi dillərilə deyirlər. Halbuki, Allah onların (bütün) gizlətdiklərini çox yaxşı bilir!

168. (Müharibəyə getməyib Mədinədə evlərində) oturan və (müharibəyə getmiş) qardaşları haqqında: "Əgər onlar sözümüzə qulaq assaydılar, öldürülməzdilər", - deyənlərə (Ya Rəsulum!) söylə: "Əgər doğru deyirsinizsə, onda (bacarın) ölümü özünüzdən uzaqlaşdırın!"

169. Allah yolunda öldürülənləri (şəhid olanları) heç də ölü zənn etmə! Əsl həqiqətdə onlar diridirlər. Onlara Rəbbi yanında ruzi (cənnət ruzisi) əta olunur.

170. Onlar Allahın Öz mərhəmətindən onlara bəxş etdiyi nemətə (şəhidlik rütbəsinə) sevinir, arxalarınca gəlib hələ özlərinə çatmamış (şəhidlik səadətinə hələ nail olmamış) kəslərin (axirətdə) heç bir qorxusu olmayacağına və onların qəm-qüssə görməyəcəklərinə görə şadlıq edirlər.

171. Onlar Allahdan gələn nemət və mərhəmətə görə, həm də Allahın möminlərin mükafatını puça çıxarmayacağına görə sevincək olurlar.

172. Yaralandıqdan sonra Allahın və Peyğəmbərin dəvətini qəbul etmiş şəxslərdən yaxşı işlər görüb pis işlərdən çəkinənləri böyük bir mükafat gözləyir!

173. O kəslər ki, xalq onlara: "Camaat (Əbu Süfyan və tərəfdarları) sizə qarşı (qüvvə) toplamışdır, onlardan qorxun!" - dedikdə, (bu söz) onların imanını daha da artırdı və onlar: "Allah bizə bəs edər. O nə gözəl vəkildir!" – deyə cavab verdilər.

174. Sonra da Allahın neməti və lütfü sayəsində özlərinə heç bir əziyyət toxunmadan geri döndülər və Allahın razılığını qazanmış oldular. Həqiqətən, Allah böyük mərhəmət sahibidir.

175. Sizi yalnız o Şeytan öz dostlarından (guya onların çox qüvvətli olmasıyla) qorxudub çəkindirir. Amma siz onlardan qorxmayın! Əgər möminsinizsə, Məndən qorxun!

176. Küfrə can atanlar səni kədərləndirməsin! Əlbəttə, onlar Allaha heç bir zərər yetirə bilməzlər, Allah da istər ki, axirətdə onlara heç bir pay verməsin. Onları böyük bir əzab gözləyir!

177. Həqiqətən, imanı verib, əvəzində küfrü satın alanlar Allaha heç bir zərər verə bilməzlər. Lakin onlar çox acı bir əzaba düçar olacaqlar!

178. Küfr edənlər onlara verdiyimiz möhləti heç də özləri üçün xeyirli sanmasınlar! Bizim onlara verdiyimiz möhlət ancaq günahlarını daha da artırmaları üçündür. Onlar alçaldıcı bir əzab görəcəklər!

179. Allah pisi yaxşıdan (münafiqi mömindən) ayırmaq üçün möminləri sizin (indi) olduğunuz vəziyyətdə qoyan deyildir. Allah sizə qeybi də bildirən deyildir. Lakin, Allah öz peyğəmbərlərindən istədiyi şəxsi seçər (ona qeybdən bəzi şeylər bildirər). Buna görə də Allaha və Onun peyğəmbərlərinə inanın. Əgər inanıb Allahdan qorxsanız, sizi böyük bir mükafat gözləyir!

180. Allah tərəfindən bəxş olunmuş mal-dövləti sərf etməyə xəsislik edənlər heç də bunu özləri üçün xeyirli hesab etməsinlər. Xeyr, bu onlar üçün zərərlidir. Onların xəsislik etdikləri şey qiyamət günü boyunlarına dolanacaqdır. Göylərin və yerin mirası Allaha məxsusdur. Allah hər bir əməlinizdən xəbərdardır!

181. “Allah kasıbdır, biz isə dövlətliyik!” – deyənlərin sözlərini Allah, əlbəttə, eşitdi. (Ya Rəsulum!) Biz onların dediklərini və peyğəmbərləri haqsız yerə öldürdüklərini (mələklər vasitəsilə əməl

dəftərlərinə) yazacaq və (qiyamət günü) onlara: “Dadın atəşin əzabını!” – deyəcəyik.

182. Bu əzab sizin öz əllərinizlə törətdiyiniz əməllərə görədir, yoxsa Allah bəndələrinə əsla zülm edən deyildir!

183. “Allah (Tövratda) bizə əmr etmişdir ki, onun yandıracağı (yeyəcəyi) bir qurban gətirməyincə heç bir peyğəmbərə inanmayaq!” – deyənlərə belə cavab ver: “Məndən əvvəl də sizə peyğəmbərlər açıq-aşkar möcüzələr və dediklərinizi (dediyiniz qurbanları) gətirmişdilər. Əgər doğru danışırsınızsa, bəs nə üçün onları öldürdünüz?”

184. (Ya Rəsulum!) Əgər onlar səni yalançı sayarlarsa (heç də qəmgin olma)! Çünki səndən əvvəl açıq möcüzələr, səhifələr və nur saçan kitab gətirmiş peyğəmbərləri də yalançı saymışdılar.

185. Hər bir kəs (canlı) ölümü dadacaqdır. Şübhəsiz ki, mükafatlarınız qiyamət günü tamamilə veriləcəkdir. Oddan (Cəhənnəmdən) uzaqlaşdırılıb, Cənnətə daxil edilən kimsə muradına çatacaqdır. Dünya həyatı isə aldadıcı həzdən (əyləncədən) başqa bir şey deyildir.

186. Əlbəttə, siz malınız və canınızla imtahan ediləcəksiniz. Sizdən əvvəl kitab verilmiş kimsələrdən və (Allaha) şərik qoşanlardan bir çox əziyyətli sözlər eşidəcəksiniz. Əgər səbr edib Allahdan qorxsanız, əlbəttə, bu, məqsədə müvafiq (dəyərli) işlərdəndir.

187. (Ya Rəsulum!) Allah kitab əhlindən: “Siz onu (kitabda olanları) gizlətməyib, insanlar üçün aydınlaşdırmalısınız!” – deyə əhd aldığı zaman onlar bu əhdə arxa çevirdilər və onu az bir qiymətə satdılar. Onların bu alış-verişi necə də pisdir!

188. (Ya Rəsulum!) Etdikləri əməllərə görə sevinən və görmədikləri işlərə görə tərif olunmağı sevən kimsələrin əzabdan xilas olacaqlarını güman etmə. Onları şiddətli bir əzab gözləyir!

189. Göylərin və yerin hökmü Allaha məxsusdur. Allah hər şeyə qadirdir!

190. Həqiqətən, göylərin və yerin yaradılmasında, gecə ilə gündüzün bir-birini əvəz etməsində (bir-birinin ardınca gəlib-getməsində) ağıl sahibləri üçün (Allahın varlığını, qüdrətini, kamalını və əzəmətini sübut edən açıq) dəlillər vardır.

191. O kəslər ki, ayaq üstə olanda da, oturanda da, uzananda da Allahı xatırlar, göylərin və yerin yaradılması haqqında düşünər (və deyərlər): "Ey Rəbbimiz! Sən bunları boş yerə yaratmamısan! Sən pak və müqəddəssən! Bizi cəhənnəm odunun əzabından (Özün) qoru!

192. Ey Rəbbimiz! Sən cəhənnəm oduna atdığın şəxsi, əlbəttə, rüsvay edərsən və zalımlara kömək edən olmaz!

193. Ey Rəbbimiz! Həqiqətən, biz: "Rəbbinizə inanın!" – deyə imana tərəf çağıran bir kimsənin çağırışını eşidib Sənə iman gətirdik. Ey Rəbbimiz! İndi günahlarımızı bizə bağışla, təqsirlərimizdən keç (böyük günahlarımızı bağışla, kiçik günahlarımızın üstünü ört) və canımızı yaxşı əməl sahibləri ilə bir yerdə al !

194. Ey Rəbbimiz! Öz peyğəmbərlərin vasitəsilə bizə vəd etdiklərini ver və qiyamət günündə bizi rüsvay etmə! Əlbəttə, Sən Öz vədinə xilaf çıxmazsan!"

195. Rəbbi də onların dualarını qəbul edərək cavab verdi: "İstər kişi, istərsə də qadın olsun, Mən heç birinizin əməlini puça çıxarmaram. Siz (hamınız) bir-birinizdənsiniz (dində kişi, qadın eynidir). Hicrət edənlərin (Məkkədən Mədinəyə öz dinini qorumaq məqsədilə köçənlərin), öz yurdlarından çıxarılanların, Mənim yolumda əziyyətə

düçar olanların, vuruşanların və öldürülənlərin günahlarının üstünü Allahdan bir mükafat olaraq, əlbəttə, örtəcək və onları (ağacları) altından çaylar axan cənnətlərə daxil edəcəyəm. Ən yaxşı mükafat Allah yanındadır!”

196. (Ya Rəsulum!) küfr edənlərin diyar-diyar gəzib dolaşması (ticarətdən, əkinçilikdən mənfəət əldə edərək xoş güzəran keçirməsi) səni aldatmasın!

197. Bu, (axirət nemətləri ilə müqayisədə) azacıq bir mənfəətdir. Sonra isə onların məskəni Cəhənnəmdir. Ora necə də pis yataqdır!

198. Lakin öz Rəbbindən qorxanları (ağacları) altından çaylar axan cənnətlər gözləyir ki, onlar orada Allah qonağı kimi həmişəlik qalacaqlar. Allah yanında olan nemətlər yaxşı əməl sahibləri üçün daha xeyirlidir.

199. Həqiqətən, kitab əhli içərisində elələri də vardır ki, onlar Allaha, həm sizə, həm də özlərinə nazil olanlara (Qurana, Tövrata və İncilə) inanır, Allaha boyun əyərək Allahın ayələrini ucuz qiymətə satmırlar. Onların Rəbbi yanında mükafatları vardır. Şübhəsiz ki, Allah tezliklə haqq-hesab çəkəndir.

200. Ey iman gətirənlər! (Dində vacib olan hökmləri yerinə yetirməyin zəhmətinə, düçar olduğunuz bəlalara) səbr edin, (Allahın düşmənlərinə qələbə çalmaq uğrundakı müharibə və döyüşlərdə sizə üz verən müsibət və çətinliklərə) dözün, (sərhəd boyu növbədə durub cihada) hazır olun və Allahdan qorxun ki, bəlkə, nicat tapasınız!

## .4.
## ən-Nisa (Qadınlar) surəsi

**(Mədinədə nazil olmuşdur, 176 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Ey insanlar! Sizi tək bir şəxsdən (Adəmdən) xəlq edən, ondan zövcəsini (Həvvanı) yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun! (Adı ilə) bir-birinizdən (cürbəcür şeylər) istədiyiniz Allahdan, həmçinin qohumluq əlaqələrini kəsməkdən həzər edin! Şübhəsiz ki, Allah sizin üzərinizdə gözətçidir!

2. Yetimlərin mallarını (həddi-buluğa çatdıqda) özlərinə verin və pisi (haramı) yaxşı ilə (halalla) dəyişdirməyin! (Yetimlərin malı sizə haram, öz malınız isə halal olduğu halda, onları bir-birilə dəyişməyin!) Onların mallarını öz mallarınıza qatıb yeməyin! Həqiqətən, bu, böyük günahdır.

3. Əgər yetim qızlarla (evlənəcəyiniz təqdirdə) ədalətlə rəftar edə bilməyəcəyinizdən qorxarsınızsa, o zaman sizə halal olan (bəyəndiyiniz) başqa qadınlardan iki, üç və dörd nəfərlə nikah bağlayın! Əgər (onlarla da) ədalətlə dolanmağa əmin deyilsinizsə, o halda təkcə bir nəfər (azad) qadın və ya sahib olduğunuz kənizlə evlənin (yaxud: o halda təkcə bir nəfər azad qadınla evlənin və ya əlinizin altında olan kənizlərlə kifayətlənin). Bu, ədalətli olmağa (ədalətdən kənara çıxmamağa) daha yaxındır.

4. Qadınlarınızın mehrlərini könül xoşluğuyla verin! Əgər onlar qəlbən, öz razılıqları ilə bundan sizə bir şey bağışlasalar, onu halal olaraq, nuşcanlıqla yeyin!

5. Allahın sizə dolanmaq ünün bəxş etdiyi malları (və ya Allahın sizi üzərində qəyyum təyin etdiyi yetim malını) səfehlərə (ağılsızların əlinə) verməyin. Onları həmin maldan yedirdib geyindirin və özlərinə xoş sözlər deyin.

6. Yetimləri nikah yaşına çatıncaya qədər sınayın. Əgər ağla dolduqlarını (həddi-buluğa çatdıqlarını) hiss etsəniz, mallarını özlərinə qaytarın. Böyüyəcəklər (böyüyən kimi mallarına sahib

olacaqlar) deyə, o malları israf edib tələm-tələsik yeməyin. Zəngin olan (qəyyum) o mala toxunmasın, kasıb isə qəbul olunmuş qayda üzrə (ehtiyacı olduğu qədər, çəkdiyi zəhmətin əvəzi miqdarında) yesin. Yetimlərin mallarını özlərinə qaytardığınız zaman yanlarında şahid tutun! Haqq-hesab çəkməyə Allah kifayət edər!

7. Ata, ana və qohumların (vəfat etdikdə) qoyub getdikləri maldan kişilərə və qadınlara pay düşür. Həmin malın azından da, çoxundan da (bunlara veriləcək) hissə müəyyən edilmişdir.

8. Malın (vərəsələr arasında) bölünməsi zamanı varis olmayan qohumlar, yetimlər və yoxsullar da orada iştirak edərlərsə, onlara da o maldan bir şey verin və gözəl sözlərlə könüllərini alın!

9. Özlərindən sonra (aciz və zəif) övladlar qoyub gedəsi olan şəxslər, onlardan ötəri necə qorxurlarsa, (yetimlərdən ötrü də) o cür qorxsunlar! Və buna görə də onlar Allahın qəzəbindən çəkinərək sözün doğrusunu danışsınlar!

10. Həqiqətən, yetimlərin mallarını haqsızlıqla yeyənlərin yedikləri qarınlarında oda çevriləcək və onlar (qiyamətdə) alovlu Cəhənnəmə girəcəklər.

11. Allah övladlarınız haqqında sizə tövsiyə buyurur ki, oğula iki qız hissəsi qədər pay düşür. Əgər (ölən şəxsin) qızlarının sayı ikidən artıqdırsa, mirasın üçdə iki hissəsi onlara çatır. Əgər təkcə bir nəfər qızdırsa, mirasın yarısı onundur. Övladı olduğu təqdirdə vəfat edənin ata və anasının hər birinə mirasın altıda bir hissəsi verilir. Əgər onun övladı olmayıb, varisi yalnız ata və anadan ibarətdirsə, (malın) üçdə bir hissəsi anaya aiddir. (Qalan hissə tamamilə ataya çatır). Əgər ölmüş şəxsin qardaşları və bacıları varsa, ananın hissəsi altıda birdir. (Yerdə qalan hissəsi yenə atanın payına düşür). Bu bölgü ölən şəxsin vəsiyyəti yerinə yetirildikdən və ya borcu ödənildikdən sonra aparılır. Valideynlərinizdən və övladlarınızdan hansı birinin (xeyir və)

mənfəət cəhətdən sizə daha yaxın olduğunu bilmədiyiniz üçün bu (bölgü) Allah tərəfindən müəyyən edilmişdir. Həqiqətən, Allah (hər şeyi) biləndir, hikmət sahibidir!

12. (Ey kişilər!) Əgər (vəfat etmiş) arvadlarınızın uşağı yoxdursa, onların vəsiyyəti yerinə yetirildikdən və ya borcu ödənildikdən sonra qoyub getdikləri malın yarısı sizindir. Onların övladları olduqda isə mirasın dörddə biri sizə çatır. Əgər sizin uşağınız yoxdursa, vəsiyyətiniz yerinə yetirildikdən və ya borcunuz ödənildikdən sonra qoyub getdiyiniz malın dörddə biri arvadlarınızın payına düşür. Övladlarınız olduqda isə mirasın səkkizdə biri onlara çatır. Əgər (vəfat etmiş) kişi və qadının (ata-anası və övladı olmayıb) eyni anadan tək bir qardaşı və ya bir bacısı varsa, onların hər birinə mirasın altıda biri düşür. Onların sayı birdən artıq olduqda isə hamısı həmin malın üçdə birinə şərikdir. Bu, (vərəsələrə) zərər toxunmadığı halda edilən vəsiyyətin yerinə yetirilməsindən və ya borcun ödənilməsindən sonra icra olunur. (Bütün bunlar) Allah tərəfindən (bəndələrə) tövsiyə olunmuşdur. Allah (hər şeyi) biləndir, həlimdir!

13. Bunlar Allahın hədləridir (hökmləridir). Hər kəs Allaha və Peyğəmbərinə itaət edərsə, Allah onu (ağacları) altından çaylar axan cənnətlərə əbədi olaraq daxil edər ki, bu da (möminlər üçün) böyük qurtuluşdur (uğurdur)!

14. Hər kəs Allaha və Peyğəmbərinə itaət etməyib Onun hədlərini aşarsa, (Allah da) onu həmişəlik Cəhənnəmə daxil edər. Onu rüsvayedici əzab gözləyir.

15. Qadınlarınızdan zina edənlərə qarşı öz aranızdan (möminlərdən) dörd şahid tutun! Əgər onlar (bu işə) şəhadət verərlərsə, həmin qadınları ölənə qədər, yaxud Allah onlar üçün bir yol açanadək evlərdə həbs edin!

16. İçərinizdən belə qəbih iş görənlərin hər ikisinə əziyyət verin. Əgər tövbə edib özlərini düzəltsələr, onları incitməkdən vaz keçin! Əlbəttə, Allah tövbələri qəbul edəndir, (bəndələrini) bağışlayandır!

17. Allah yanında yalnız o kəslərin tövbəsi qəbul olunar ki, onlar nadanlıq ucundan pis bir iş gördükdən sonra dərhal tövbə edərlər. Allah belələrinin tövbəsini qəbul edir! Həqiqətən, Allah (hər şeyi) biləndir, hikmət sahibidir!

18. Günah işlər görməkdə davam edərək ölüm yetişən anda: “Mən indi tövbə etdim” –deyənlərin və kafir olaraq ölənlərin tövbəsi qəbul olunmaz. Biz onlar üçün şiddətli bir əzab hazırlamışıq!

19. Ey iman gətirənlər! Qadınlara zorla varis çıxmaq sizə halal deyildir! (Qadınlar) açıq-aşkar pis bir iş görməyincə, özlərinə verdiyiniz şeylərin (mehrin) bir hissəsini geri qaytarmaq məqsədilə onlara əziyyət verməyin. Onlarla gözəl (Allahın buyurduğu kimi) rəftar edin. Əgər onlara nifrət etsəniz (dözün). Ola bilsin ki, sizdə nifrət doğuran hər hansı bir şeydə Allah (sizdən ötrü) çoxlu xeyir nəzərdə tutmuş olsun.

20. Əgər bir arvadın yerinə başqa bir arvad almaq istəsəniz, onlardan birinə (birinciyə) çoxlu mal vermiş olsanız da, ondan heç bir şey geri almayın! Məgər bu malı böhtan atmaq və aşkar bir günah iş görməklə gerimi alacaqsınız?!

21. Siz onu necə geri ala bilərsiniz ki, (vaxtilə) bir-birinizlə yaxınlıq etmişdiniz və onlar (qadınlarınız) sizdən möhkəm əhd-peyman almışdılar.

22. Atalarınızın evlənmiş olduğu qadınlarla evlənməyin! Yalnız keçmişdə (Cahiliyyət dövründə) olan bu cür işlər müstəsnadır. Əlbəttə, bu çox çirkin, iyrənc işdir və (Allahın qəzəbinə səbəb olan) pis bir yoldur!

23. Sizə analarınız, qızlarınız, bacılarınız, bibiləriniz, xalalarınız, qardaş və bacılarınızın qızları, süd analarınız, süd bacılarınız, arvadlarınızın anaları və yaxınlıq etdiyiniz qadınlarınızın himayənizdə olan qızları (ögey qızlarınız) ilə evlənmək haram edildi. Cinsi əlaqədə olmadığınız qadınlarınızın qızları ilə evlənmək isə sizin üçün günah deyildir. Öz belinizdən gələn oğullarınızın arvadları ilə evlənmək və iki bacını birlikdə almaq da sizə haramdır. Yalnız keçmişdə (Cahiliyyət dövründə) olan bu cür işlər müstəsnadır. Həqiqətən, Allah bağışlayandır, rəhm edəndir!

24. (Cihad vaxtı əsir olaraq) sahib olduğunuz (cariyələr) müstəsna olmaqla, ərli qadınları almaq Allahın yazısı (hökmü) ilə sizə (haram edildi). Bunlardan başqaları isə namusla (iffətlə), zinakarlığa yol vermədən, mallarınızı sərf edərək evlənmək üçün sizə halal edildi. İstifadə (mütə) etdiyiniz qadınların mehrlərini lazımi qaydada verin! Mehr müəyyən edildikdən sonra aranızda razılaşdığınız şeydən ötrü sizə heç bir günah yazılmaz. Həqiqətən, Allah (hər şeyi) biləndir, hikmət sahibidir!

25. İçinizdən azad mömin qadınlarla evlənməyə maddi imkanı olmayanlar sahib olduğunuz (əllərinizin altında olan) mömin (cavan, iffətli) cariyələrdən (kənizlərdən) alsınlar. Allah sizin imanınızı (əqidənizi) daha yaxşı bilir. Hamınız bir-birinizdənsiniz. (Azad kişi və qul, azad qadın və cariyə hamısı Adəm nəslindəndir. Onlar hamısı Allah bəndələri olduqları üçün yaradılış etiqad baxımından aralarında vəhdət, birlik mövcuddur. Buna görə də cariyələrə həqarətlə baxmayın). İffətini qoruyub saxlayan, zinakarlıq etməyən və aşnası olmayan cariyələrlə sahiblərindən icazə alıb evlənin və onların mehrlərini qəbul olunmuş qaydada verin! Əgər onlar (ərə getdikdən sonra) zina edərlərsə, cəzaları azad qadınlara verilən əzabın yarısı qədərdir. Bu (kənizlərlə evlənmək), (ehtiras, şəhvət üzündən) zina

etməkdən qorxanlarınız üçündür. Əgər səbr edərsinizsə, sizin üçün daha yaxşı olar. Həqiqətən, Allah bağışlayandır, rəhm edəndir!

26. Allah sizə (bilmədiklərinizi) bildirmək, sizdən əvvəlkilərin getdiyi yolları sizə göstərmək və tövbələrinizi qəbul etmək istər. Allah (hər şeyi) biləndir, hikmət sahibidir!

27. Allah sizin tövbələrinizi qəbul etmək istəyir. Öz nəfsinə uyanlar isə sizi böyük bir əyriliklə (düz yoldan) sapdırmaq istəyirlər.

28. Allah istər ki, üzərinizdə olanı (ağırlığı) yüngülləşdirsin, çünki insan (şəhvətini cilovlamaq və itaətin çətinliyinə dözmək baxımından) zəif yaradılmışdır.

29. Ey iman gətirənlər! Qarşılıqlı razılıqla edilən alış-veriş müstəsna olmaqla, bir-birinizin mallarını haqsız bəhanələrlə (haqsız yerə) yeməyin və özünüzü öldürməyin! Həqiqətən, Allah sizə qarşı mərhəmətlidir!

30. Hər kəs təcavüz və zülm etməklə bu işləri görərsə, Biz onu cəhənnəm oduna atırıq. Şübhəsiz ki, bu da Allah üçün çox asandır!

31. Əgər sizə qadağan olunmuş böyük günahlardan çəkinərsinizsə, Biz də sizin qəbahətlərinizin (kiçik günahlarınızın) üstünü örtər və sizi (şərəfli bir mənzilə) çatdırarıq.

32. Allahın (maddi, yaxud mənəvi cəhətdən) birinizi digərindən ütün tutduğu (birinizə digərinizdən artıq verdiyi) şeyi (özünüzə) arzulamayın. Kişilərin öz qazandıqlarından öz payı, qadınların da öz qazandıqlarından öz payı vardır. (Dilədiyiniz şeyi) Allahın lütfündən (mərhəmətindən) istəyin! Şübhəsiz ki, Allah hər şeyi (olduğu kimi) biləndir.

33. Ata-ana və yaxın qohumların qoyub getdikləri maldan hər biri üçün varislər təyin etdik. And içib, əhd-peyman bağladığınız

şəxslərin də paylarını özlərinə verin! Əlbəttə, Allah hər şeyə şahiddir!

34. Kişilər qadınlar üzərində ixtiyar sahibidirlər (onların hamisidirlər). Bu, Allahın onlardan birini digərinə üstün etməsi və (kişilərin) öz mallarından (qadınlar üçün) sərf etməsinə görədir. Əməlisaleh qadınlar (ərlərinə) itaət edib Allahın himayəsi sayəsində gizli şeyləri (ərlərinin sirlərini, mal-dövlətini, namus və şərəfini) qoruyub saxlayırlar. (Ey kişilər!) Özbaşınalıq etmələrindən qorxduğunuz qadınlara nəsihət edin, (yola gəlməzsə) onlardan yatağınızı ayırın və döyün! Sizə itaət etdikdə isə daha onlara (əziyyət vermək üçün) başqa yol axtarmayın. Əlbəttə, Allah ucadır, böyükdür!

35. (Ey möminlər!) Əgər ər-arvad arasında ixtilaf olacağından qorxsanız, o zaman kişinin adamlarından bir nəfər və qadının adamlarından da bir nəfər münsif (vasitəçi) təyin edib (onların yanına) göndərin. Əgər onlar (bu iki vasitəçi ər-arvadı) barışdırmaq istəsələr, Allah da onların köməyi olar. Həqiqətən, Allah (hər şeyi) biləndir, (hər işdən) xəbərdardır!

36. Allaha ibadət edin və Ona heç bir şeyi şərik qoşmayın! Ata-anaya qohum-əqrəbaya, yetimlərə, yoxsullara, yaxın və uzaq qonum-qonşuya, yaxın (yoldaş və) dosta, (pulu qurtarıb yolda qalan) müsafirə (yolçulara), əlinizin altında olana (sahib olduğunuz qul və kənizlərə) yaxşılıq edin! Həqiqətən, Allah özünü bəyənənləri, lovğalıq edənləri sevməz!

37. O kəslər ki, özləri xəsislik etməklə bərabər, başqalarını da xəsisliyə təhrik edir və Allahın öz lütfündən bəxş etdiyi nemətləri gizlədirlər (mütləq cəzalarına çatacaqlar). Biz (belə) kafirlər üçün alçaldıcı əzab hazırlamışıq!

38. Öz mallarını xalqa göstərmək (şöhrət qazanmaq) xətrinə xərcləyənləri, Allaha və axirət gününə inanmayanları da (Allah sevməz). Şeytanla yoldaşlıq edənlərin yoldaşı necə də pisdir!

39. Əgər onlar Allaha və axirət gününə inanıb, Allahın onlara verdiyi ruzidən (yoxsullara) sərf etsəydilər, nə olardı (nə zərər çəkərdilər)?! Allah onları (ən yaxşı) tanıyandır.

40. Həqiqətən, Allah (heç kəsə) zərrə qədər zülm etməz. Əgər yaxşı bir əməl baş verərsə, onu (onun savabını) ikiqat artırar və öz tərəfindən də (bu əməlin sahibinə) böyük mükafat verər!

41. (Ya Rəsulum!) Hər ümmətdən (peyğəmbərini) bir şahid gətirəcəyimiz və səni də onlara şahid təyin edəcəyimiz zaman (kafirlərin halı) nə cür olacaq?

42. O gün Allahı dananlar və Peyğəmbərə asi olanlar yerlə yeksan olmağı arzu edərlər və heç bir sözü Allahdan gizlədə bilməzlər!

43. Ey iman gətirənlər! Sərxoş ikən nə dediyinizi anlamayana qədər və cunub (murdar) olduğunuz zaman - yol ötən müsafirlər müstəsnadır - qüsl edənədək namaza (namaz qılınan yerə) yaxınlaşmayın. Xəstələndikdə və ya səfərdə olduqda, sizlərdən biri ayaq yolundan gəldikdə, yaxud qadınlara toxunmuş (yaxınlıq etmiş) olduqda (qüsl və dəstəmaz üçün) su tapmadığınız zaman pak bir torpaqla təyəmmüm edin, (ovuclarınızı) üzünüzə və əllərinizə sürtün! Şübhəsiz ki, Allah əfv edəndir, bağışlayandır!

44. (Ya Rəsulum!) Məgər sən kitabdan (Tövratdan) bir pay verilmiş olanları (yəhudi alimlərini) görmürsənmi ki, onlar zəlaləti satın alır və sizin də (doğru) yoldan azmanızı istəyirlər?

45. Allah sizin düşmənlərinizi (sizdən) daha yaxşı tanıyır. Bir dost və yardımçı kimi Allah (sizə) kifayət edər!

46. Yəhudilərin bir qismi (Tövratdakı) sözlərin yerini dəyişib təhrif edir və dillərini əyərək dinə (islama) tənə vurmaq məqsədilə (sənə qarşı): “Eşitdik və qəbul etmədik; eşit, eşitməz olasan (kar olasan) və raina”, - deyirlər. Əgər onlar: “Eşitdik və itaət etdik; eşit və bizə tərəf bax!”,- desəydilər, əlbəttə, onlar üçün daha xeyirli və daha doğru olardı. Lakin Allah onları öz küfrləri ucundan lənətə düçar etmişdi. Onların yalnız az bir hissəsi iman gətirmişdir.

47. Ey kitab verilmiş kimsələr! Bəzi üzləri tanınmaz hala salıb ənsələrinə (arxalarına) çevirməmişdən və şənbə gününün hörmətini saxlamayanlara (əshabus-səbtə) etdiyimiz kimi, onlara da lənət etməmişdən əvvəl əlinizdə olanı (Tövratı) təsdiqləyən olaraq nazil etdiyimizə (Qurana) iman gətirin! Allahın əmri mütləq yerinə yetəcəkdir!

48. Şübhə yoxdur ki, Allah Özünə şərik qoşanları əfv etməz, amma istədiyi şəxsin bundan başqa olan günahlarını bağışlar. Allaha şərik qoşan şəxs, əlbəttə, böyük günah etmiş olur.

49. (Ya Rəsulum!) Özlərini təmizə çıxaranları görmürsənmi? Xeyr (elə deyil). Allah istədiyini təmizə çıxardar və onlara xurma çərdəyindəki nazik tel qədər zülm olunmaz!

50. Sən onların Allaha qarşı necə yalan uydurduqlarına bax! Bu, açıq-aşkar bir günah olaraq kifayətdir!

51. (Ya Rəsulum!) Kitabdan (Tövratdan və ya yazıb-oxumaqdan) bir pay (az bir şey) verilənləri (yəhudiləri) görmürsənmi? Onlar Cibt və Tağuta (bu adda iki bütə, yaxud Cibt adlı bütə və Tağut deyilən Şeytana) inanır və kafirlər üçün də: “Bunlar möminlərdən daha doğru yoldadırlar”, - deyirlər.

52. Onlar Allahın lənət etdiyi kimsələrdir. Allahın lənət etdiyi kimsəyə isə heç bir kömək edən tapa bilməzsən!

53. Yoxsa onların (dünyada) hökmranlıqdan bir payı vardır? Əgər elə olsaydı, onlar insanlara xurma çərdəyinin bir tumurcuğunu (zərrəsini) belə verməzdilər.

54. Yoxsa onlar Allahın öz nemətindən bəxş etdiyi şeylərə görə insanlara həsəd aparırlar? Halbuki Biz İbrahim övladına da kitab və hikmət vermişdik və onlara böyük mülk (hökmranlıq) bəxş etmişdik.

55. Onlardan (yəhudilərdən) kimisi ona (İbrahimə, yaxud Muhəmmədə və ya ilahi kitaba) iman gətirdi, kimisi də ondan üz döndərdi. (Üz döndərənlərə) Cəhənnəmin alovlanmış odu kifayət edər!

56. Ayələrimizi inkar edənləri oda (Cəhənnəmə) atacağıq. Onların dəriləri bişdikcə, əzabı (həmişə) dadsınlar deyə, o dəriləri başqası ilə əvəz edəcəyik. Əlbəttə, Allah yenilməz qüvvət, hikmət sahibidir!

57. İman gətirən və yaxşı işlər görən şəxsləri (ağacları) altından çaylar axan cənnətlərə daxil edəcəyik ki, orada əbədi qalsınlar. Orada onları pak zövcələr gözləyir. Biz onları daim rahatlıq verən sıx (ləzzətli) kölgəlikdə yerləşdirəcəyik.

58. Allah sizə əmanətləri öz sahiblərinə qaytarmanızı və insanlar arasında hökm etdiyiniz zaman ədalətlə hökm etmənizi əmr edir. Həqiqətən, Allahın bununla (belə bir tapşırıqla) sizə verdiyi öyüd necə də gözəldir! Əlbəttə, Allah (hər şeyi) eşidəndir, görəndir!

59. Ey iman gətirənlər! Allaha, Peyğəmbərə və özünüzdən olan ixtiyar (əmr) sahiblərinə itaət edin! Əgər bir iş barəsində mübahisə etsəniz, Allaha və qiyamət gününə inanırsınızsa, onu Allaha və Peyğəmbərə həvalə edin! Bu daha xeyirli və nəticə etibarilə daha yaxşıdır.

60. (Ya Rəsulum!) Sənə nazil edilənə (Qurana) və səndən əvvəl nazil edilənlərə (Tövrata, İncilə) iman gətirdiklərini iddia edənləri

(münafiqləri) görmürsənmi? Onlar Tağutun (Şeytanın) hüzurunda mühakimə olunmaq (Şeytanın məhkəməsinə müraciət etmək) istəyirlər. Halbuki onlara (Şeytana) inanmamaları əmr olunmuşdur. Şeytan isə onları (doğru yoldan) çox uzaq olan zəlalətə sürükləmək istər

61. Onlara: “Allahın nazil etdiyinə (Qurana) və Peyğəmbərə tərəf gəlin!” – deyildiyi zaman, münafiqlərin səndən büsbütün üz döndərdiklərini görərsən.

62. Bəs etdikləri əməllərin cəzası olaraq başlarına bir müsibət gəldiyi zaman (onların halı) necə olacaq? Sonra onlar sənin yanına gəlib: “Biz yalnız yaxşılıq etmək və (iddiaçılar arasında) barışıq yaratmaq istədik”, - deyərək Allaha and içəcəklər.

63. Onlar elə şəxslərdir ki, Allah onların ürəklərindəkini (yaxşı) bilir. (Ya Rəsulum!) Sən onlardan üz çevir, onlara öyüd ver və onlara özləri haqqında təsirli söz de!

64. Biz hər bir peyğəmbəri, ancaq ona Allahın iznilə itaət olunsun deyə, göndərdik. Onlar (münafiqlər) özlərinə zülm etdikləri zaman dərhal sənin yanına gəlib Allahdan bağışlanmaq diləsəydilər və Peyğəmbər də onlar üçün əfv istəsəydi, əlbəttə, Allahın tövbələri qəbul edən, mərhəmətli olduğunu bilərdilər.

65. Amma, xeyr! (Ya Rəsulum!) Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən ixtilaflarda səni hakim (münsif) təyin etməyincə və verdiyi hökmlərə görə özlərində bir sıxıntı duymadan sənə tam bir itaətlə boyun əyməyincə, (həqiqi surətdə) iman gətirmiş olmazlar.

66. Əgər Biz onlara: “Özünüzü öldürün, yaxud yurdlarınızdan çıxın!” – deyə yazıb əmr etsəydik, içərilərində az bir hissəsi müstəsna olmaqla, (bu əmri) yerinə yetirməzdilər. Əgər onlar verilən nəsihətlərə əməl etsəydilər, əlbəttə, bu onlar üçün daha xeyirli və

daha düzgün olardı. (imanda sabitqədəmlik baxımından daha möhkəm bir addım olardı).

67. O zaman Biz də onlara Öz tərəfimizdən böyük mükafat verərdik.

68. Və onları düz yola yönəldərdik.

69. Allaha və Peyğəmbərə itaət edənlər (axirətdə) Allahın nemətlər verdiyi nəbilər (peyğəmbərlər), siddiqlər (tamamilə doğru danışanlar, etiqadı dürüst, peyğəmbərləri hamıdan əvvəl təsdiq edən şəxslər), şəhidlər və salehlərlə (yaxşı əməl sahibləriylə) bir yerdə olacaqlar. Onlar necə də gözəl yoldaşlardır!

70. Bu mükafat Allah tərəfindəndir. (Hər şeyi) bilən Allah (sizə) kifayət edər!

71. Ey iman gətirənlər! Ehtiyatı əldən verməyib silahınızı götürün və (düşmənə qarşı cihada) ya dəstə-dəstə, ya da hamınız bir yerdə çıxın!

72. Aranızda elələri də (münafiqlər) vardır ki, (siz cihada çıxdıqda) ağır tərpənər və əgər sizə bir müsibət üz versə: "Allah mənə lütf etdi ki, onlarla birlikdə (döyüşdə) olmadım", - deyər.

73. Əgər Allah tərəfindən sizə bir nemət (qabiliyyət) yetişərsə, o zaman guya aranızda heç bir dostluq yoxmuş kimi: "Kaş ki, mən də onlarla birlikdə olub böyük bir qənimət əldə edəydim!" (söyləyərlər).

74. Elə isə, qoy dünyanı verib əvəzində axirəti satın alanlar Allah yolunda vuruşsunlar. Hər kim Allah yolunda vuruşaraq ölərsə və ya (düşmənə) qalib gələrsə, ona böyük mükafat verəcəyik.

75. (Ey müsəlmanlar!) Sizə nə olub ki, Allah yolunda (hicrət etməyib, yaxud əsir kimi Məkkədə qalıb): "Ey Rəbbimiz, bizi əhalisi zalım olan bu şəhərdən (Məkkədən) kənara çıxart, bizə öz tərəfindən

mühafizəçi göndər, yardımçı yolla!” – deyə dua edən aciz kişilər, qadınlar və uşaqlar uğrunda vuruşmursunuz?

76. İman gətirənlər Allah yolunda, kafir olanlar isə Şeytan yolunda vuruşurlar. O halda Şeytanın dostlarıyla (kafirlərlə) vuruşun! Şübhəsiz ki, Şeytanın hiyləsi zəifdir!

77. (Ya Rəsulum!) O şəxsləri görmürsənmi ki, onlara (vaxtilə): “(Müharibədən) əl çəkin, namaz qılın, zəkat verin!” – deyilmişdi. Onlara cihad etmək vacib olduqda isə, içərilərindən bir qismi Allahdan qorxan kimi və ya daha artıq bir qorxu ilə insanlardan qorxuya düşərək: “Ey Rəbbimiz! Cihad etməyi nə üçün bizə vacib etdin, nə olardı ki, bizi yaxın zamana qədər (öz əcəlimiz çatana qədər) yubandıraydın! (Daha bir müddət cihadı bizə vacib buyurmayaydın!)” – dedilər. Onlara söylə: ”Dünyanın ləzzəti və faydası azdır, lakin müttəqilər üçün axirət daha xeyirlidir. Sizə (müttəqilərə) xurma çərdəyində olan nazik tel qədər belə zülm olunmayacaq!”

78. Harada olursunuz olun, hətta uca (möhkəm) qalalar içərisində olsanız belə, ölüm sizi haqlayacaq. (Ya Rəsulum!) Onlara (yəhudilərə və münafiqlərə) bir xeyir yetişdikdə: “Bu Allahdandır!” – deyərlər, bir pislik üz verdikdə isə: “Bu səndəndir!” – söyləyərlər. (Onlara) de: “Hamısı Allahdandır”. Bu camaata nə olub ki, az qala söz də anlamır!

79. (Ey insan!) Sənə yetişən hər bir yaxşılıq Allahdandır, sənə üz verən hər bir pislik isə özündəndir. (Ya Rəsulum!) Biz səni insanlara peyğəmbər göndərdik. Allahın buna şahid olması (sənə) kifayət edər.

80. Peyğəmbərə itaət edən kimsə, şübhəsiz ki, Allaha itaət etmiş olur. Kim üz döndərsə (qoy döndərsin)! Biz ki səni onların üzərində gözətçi olaraq göndərməmişik.

81. (Ya Rəsulum!) Onlar: (Sənə) itaət edirik!” – deyir, lakin sənin yanından çıxıb getdikləri zaman onların bir qismi dediyinin əksinə fikirləşir. Allah onların niyyətində olanları (əməl dəftərlərinə) yazır. Sən onlardan üz çevir, Allaha təvəkkül et! Allahın (sənə) vəkil olması kifayət edər!

82. Onlar Quran barəsində (onun Allah kəlamı olması haqqında) düşünməzlərmi? Əgər o, Allahdan qeyrisi tərəfindən olsaydı, əlbəttə, onda çoxlu ziddiyyət (ixtilaf, uyğunsuzluq) tapardılar.

83. Onlara (münafiqlərə bəzi müsəlmanların sadəlövhlüyü üzündən döyüş meydanından) əmin-amanlıq və ya qorxu xəbəri gəldikdə dərhal onu yayarlar. Halbuki əgər (müsəlmanlar) bunu (münafiqlərə deyil), Peyğəmbərə və ya özlərindən (möminlərdən) olan ixtiyar (əmr) sahiblərinə demiş olsaydılar, əlbəttə, həmin xəbəri onun mahiyyətinə varan (belə bir xəbərin yayılmasının məqsədəuyğun olub-olmadığını təyin etməyə qadir olan) kimsələr bilərdilər. Əgər Allahın lütfü (mərhəməti) üzərinizdə olmasaydı, şübhəsiz ki, az bir qisminiz müstəsna olmaqla, Şeytana uyardınız.

84. (Ya Rəsulum!) Allah yolunda vuruş (cihad et). Sən yalnız özünə cavabdehsən, lakin möminləri də (cihada) təşviq et! Ola bilsin ki, Allah kafirlərin gücünü qırmış (sizi kafirlərin qəzəbindən saxlamış) olsun. Allahın qəzəbi (qəhri) də, əzabı da çox şiddətlidir!

85. Yaxşı işə vasitəçi olana (onun savabından), pis işə vasitəçi olana (onun günahından) bir pay düşür. Əlbəttə, Allah hər şeyə qadirdir. (Hər şeyin əvəzini verəndir).

86. Sizə salam verildiyi zaman onu daha gözəl alın və ya (eynilə sahibinə) qaytarın! Şübhəsiz, Allah hər şeyi hesaba alandır.

87. Allahdan başqa heç bir tanrı yoxdur. Olacağına şübhə edilməyən qiyamət günü hamınızı (bir yerə), əlbəttə, O toplayacaqdır. Allahdan daha doğru danışan kim ola bilər?!

88. Siz nə üçün münafiqlər barəsində iki hissəyə ayrıldınız? Halbuki Allah onları etdikləri əməllərinə görə əvvəlki hallarına (kafirliyə) qaytarmışdır. Siz Allahın (öz istəyi, öz iradəsi ilə küfr edəcəyini, azğın yola düşəcəyini, haqq yoldan azacağını əzəldən bildiyi üçün) azdırdığı kimsəni doğru yolamı gətirmək istəyirsiniz? Allahın sapdırdığı kimsə üçün heç bir (doğru) yol tapa bilməzsən!

89. Onlar özləri kafir olduqları kimi, sizin də kafir olub özlərilə bərabər olmanızı istərlər. Onlar Allah yolunda (Məkkədən) hicrət etməyənə qədər onlardan (özünüzə) dost tutmayın! Əgər onlardan (tövhiddən və hicrət etməkdən) üz çevirsələr, onları harada görsəniz, tutub öldürün. Onlardan özünüzə nə bir dost, nə də bir köməkçi tutun!

90. Ancaq sizinlə aralarında əhd olan bir tayfaya sığınanlar, yaxud sizinlə və ya öz qövmlərilə (Məkkə müşriklərilə) vuruşmaqdan ürəkləri sıxılaraq (xoşlanmayaraq) sizin yanınıza gələn şəxslər müstəsnadır. Əgər Allah istəsəydi, onları sizin üstünüzə qaldırardı və onlar da sizinlə vuruşardılar. Əgər onlar sizdən aralanıb bir tərəfə çəkilsələr və sizinlə vuruşmayıb sülh təklif etsələr, o zaman Allah sizin üçün onların əleyhinə çıxmağa heç bir yol qoymaz.

91. Siz elə kəslərə də rast gələcəksiniz ki, onlar həm sizdən, həm də öz camaatından arxayın olmaq istərlər. (Sizin yanınızda özlərini müsəlman kimi, qəbilələrinə qayıtdıqda isə kafir kimi aparırlar). Bunlar da hər dəfə fitnə-fəsad törətməyə sövq edildikdə başıaşağı ora atılarlar (cani-dildən bu işə qoşularlar). Əgər onlar sizi tərk edib getməsələr, sülh təklif etməsələr və sizdən əl çəkməsələr, onda onlara

harada rast gəlsəniz, tutub öldürün. Biz onların əleyhinə çıxmaq üçün sizə açıq fərman verdik.

92. Heç bir möminə başqa bir mömini öldürmək yaraşmaz. Bu ,səhvən (xəta üzündən) olduqda müstəsnadır. Hər kəs bir mömini səhvən öldürərsə, o zaman o, mömin bir qul azad etməli və öldürülmüş şəxsin ailəsi qanbahasını sədəqə olaraq bağışlamadıqda, onlara (ölən şəxsin varislərinə) tam şəkildə qanbahası verməlidir. Əgər (öldürülən şəxsin özü) mömin olduğu halda, sizə düşmən olan bir tayfadandırsa, o vaxt (öldürülən şəxs) mömin bir qul azad etməlidir. Əgər (öldürülən şəxs) sizinlə əhd (müqavilə) bağlamış bir tayfadan olarsa, o zaman onun ailəsinə qanbahası verməklə bərabər, mömin bir qul dəxi azad etmək lazımdır. Hər kəs (azad etməyə qul) tapa bilməsə, o, Allah tərəfindən tövbəsinin qəbul edilməsi üçün bir-birinin ardınca (arası kəsilmədən) iki ay oruc tutmalıdır. Allah (hər şeyi) biləndir, hikmət sahibidir!

93. Hər kəs bir mömin şəxsi qəsdən öldürərsə, onun cəzası əbədi qalacağı Cəhənnəmdir. Allah ona qəzəb və lənət edər, (axirətdə) onun üçün böyük əzab hazırlar!

94. Ey iman gətirənlər! Allah yolunda (cihad etmək üçün) səfərə çıxdığınız zaman diqqətli olun! Sizə müsəlman olduğunu bildirən (salam verən) bir kimsəyə dünya həyatının puç mənfəətinə tamahlanaraq: “Sən mömin deyilsən!” deməyin! Halbuki çox qənimətlər Allah yanındadır. Siz özünüz də bundan əvvəl onlar kimi idiniz, lakin Allah sizə mərhəmət etdi. Elə isə, siz də (insanları bir-birindən fərqləndirməkdə) diqqətli olun! Şübhəsiz ki, Allah bütün etdiklərinizdən xəbərdardır!

95. Zərər çəkmədən (üzrsüz səbəbə görə evlərində) əyləşən möminlərlə Allah yolunda öz malları və canları ilə cihad edən (vuruşan) kimsələr bir olmazlar. Allah malları və canları ilə

vuruşanları (evlərində) əyləşənlərdən (cihada getməyənlərdən) dərəcə etibarilə üstün tutdu. Allah bunların hamısına (hər ikisinə savab) vəd etmişdir. (Lakin) Allah mücahidlərə (evlərində) oturanlardan daha böyük mükafatlarla imtiyaz vermişdir.

96. (Onları) Allah tərəfindən yüksək dərəcələr, bağışlanma və mərhəmət gözləyir. Allah bağışlayandır, rəhm edəndir.

97. Mələklər öz nəfslərinə zülm edənlərin (Məkkədə kafirlər içərisində qalıb hicrət etməyənlərin) canlarını alarkən (onlara) deyəcəklər: “Siz (hicrət zamanı) nə işdə idiniz?” Onlar söyləyəcəklər: “Biz yer üzərində zəif (aciz) kəslər idik.” (Mələklər də onlara: ) “Allahın torpağı geniş deyildimi ki, siz də hicrət edəydiniz?” – deyəcəklər. Onların sığınacaqları yer Cəhənnəmdir. O necə də pis yerdir!

98. Yalnız hicrət etməyə yol və çarə tapmağa qadir olmayan aciz kişi, qadın və uşaqlar müstəsnadır.

99. Ola bilsin ki, Allah onları əfv etsin. Allah əfv edəndir, bağışlayandır!

100. Allah yolunda hicrət edən şəxs yer üzündə çoxlu sığınacaq və genişlik (bolluq) tapar. Kim evindən çıxıb Allaha və onun Peyğəmbərinə tərəf hicrət etsə, sonra isə (mənzil başına çatmadan) ölüm onu haqlasa, həmin şəxsin mükafatını Allah Özü verər! Allah bağışlayandır, rəhm edəndir!

101. Səfərə çıxdığınız zaman kafirlərin sizə zərər yetirəcəklərindən qorxarsınızsa, namazı qısaltmaq (dörd rəkətli namazı iki rəkət qılmaq) sizə günah hesab edilməz. Həqiqətən kafirlər sizinlə açıq düşməndirlər.

102. (Ya Rəsulum!) Sən (əsgərlərin) içərisində olub onlara namaz qıldırdığın zaman onlardan bir dəstə silahlarını (özlərilə) götürsünlər.

(Namazlarını qılıb) səcdə edən kimi sizin arxanıza (düşmənin önünə) keçsinlər. (Və ya onlar namaz qılanda digər dəstə arxalarında olsun). Sonra (namaz qılmamış) o biri dəstə öz ehtiyat vasitələrini və silahlarını götürərək gəlib səninlə birlikdə namaz qılsın! Kafirlər istərdilər ki, sizin silahlarınızdan və mallarınızdan heç bir xəbəriniz olmayaydı və onlar da sizin üzərinizə birdəfəlik (qəfil bir hücumla) basqın edəydilər. Yağışdan əziyyət çəkdiyiniz, yaxud xəstə olduğunuz zaman silahlarınızı (namaz vaxtı) yerə qoymaq sizə günah deyildir, lakin ehtiyatınızı gözləyin! Şübhəsiz ki, Allah kafirlər üçün alçaldıcı əzab hazırlamışdır!

103. Namazınızı qıldıqdan sonra ayaq üstə olanda da, uzananda da Allahı zikr edin, arxayınlığa çıxdıqda isə, namazı (öz qaydasınca) qılın! Çünki namaz möminlərə bəlli vaxtlarda fərz (vacib) edilmişdir.

104. (Kafir) qövmü təqib etməkdə (ey müsəlmanlar!) zəiflik göstərməyin! Əgər siz (yaralarınızdan və səfərin çətinliklərindən) əziyyət çəkirsinizsə, onlar da sizin kimi əziyyət çəkirlər. Halbuki siz onların ummadıqlarını Allahdan umursunuz. Allah (hər şeyi) biləndir, hikmət sahibidir!

105. (Ya Rəsulum!) Həqiqətən, Biz sənə Quranı haqq olaraq nazil etdik ki, Allahın sənə göstərdiyi (öyrətdiyi, bildirdiyi) ilə insanlar arasında hökm edəsən. Xainləri müdafiə edən (onların xeyrinə mübahisə aparan) olma!

106. Allahdan bağışlanmaq dilə! Əlbəttə, Allah bağışlayandır, rəhm edəndir!

107. Özlərilə (bir-birinə) xəyanət edən şəxslərdən ötrü mübahisə etmə! Şübhəsiz ki, Allah günaha batmış xaini sevməz!

108. Onlar (xəyanətlərini) insanlardan gizlətsələr də, Allahdan gizlədə bilməzlər. Onlar (Allaha) xoş getməyən sözləri ürəklərində

tutduqda belə, yenə O onların yanındadır (Allah onları bilir). Allah onların nələr etdiyini biləndir.

109. (Ey xainləri müdafiə edənlər!) Budur, siz dünyada onlardan ötru (onların xeyrinə) mübahisə etdiniz, bəs qiyamət günü kim onlardan ötrü Allahla mübahisə edəcəkdir? Yaxud onlara kim vəkil olacaqdır?

110. Hər kəs pis iş gördükdən və ya özünə zülm etdikdən sonra Allahdan bağışlanmağını diləyərsə, Allahın bağışlayan, mərhəmətli olduğunu görər.

111. Hər kəs bir günah qazanarsa, mütləq o günahı özünün zərərinə qazanmış olar. Allah hər şeyi biləndir, hikmət sahibidir!

112. Hər kəs bir xəta və ya günah edib onu günahsız bir adamın boynuna atarsa, şübhəsiz ki, öz boynuna böhtan və açıq-aşkar günah götürmüş olar (günah üstündən günah qazanar).

113. (Ya Rəsulum!) Əgər sənə Allahın lütfü (mərhəməti) olmasa idi, əlbəttə, onların bir dəstəsi səni düz yoldan azdırmaq niyyətində olacaqdı. Halbuki onlar özlərindən qeyrisini azdıra bilməz və sənə də heç bir zərər verə bilməzlər. Çünki Allah sənə Quranı və hikməti nazil edərək bilmədiklərini öyrətdi. Allahın sənə lütfü böyükdür!

114. Onların gizli söhbətlərinin çoxunda xeyir yoxdur. Xeyir ancaq sədəqə verməyi, yaxud yaxşılıq etməyi və ya insanlar arasında sülh yaratmağı əmr edən kimsənin söhbətindədir. Allahın razılığını qazanmaq üçün belə işlər görən kimsəyə (axirətdə) böyük mükafat verəcəyik!

115. Hər kəs özünə doğru yol aşkar olandan sonra Peyğəmbərdən üz döndərib möminlərdən qeyrisinin yoluna uyarsa, onun istədiyi (özünün yönəldiyi) yola yönəldər və Cəhənnəmə varid edərik. Ora necə də pis yerdir.

116. Allah Ona şərik qoşmağı əsla bağışlamaz. Bundan başqa olan günahları isə dilədiyi kimsə üçün bağışlar. Allaha şərik qoşan şəxs, şübhəsiz ki, (haqq yoldan) çox azmışdır.

117. (Məkkə müşrikləri) Allahı qoyub yalnız qadın bütlərə (Lata, Mənata, Uzzəyə, Nailəyə) tapınır və yalnız asi (inadkar) Şeytana ibadət edirlər.

118. Allah ona (Şeytana) lənət etdi (rəhmətindən kənar edib dərgahından qovdu). O isə dedi: "Əlbəttə, mən Sənin bəndələrindən müəyyən bir qismini ələ alacağam".

119. Onları hökmən (doğru yoldan) sapdıracaq, (puç) xülyalara salacaq, heyvanlarının qulaqlarını kəsməyi və Allahın yaratdıqlarını dəyişdirməyi əmr edəcəyəm! Allahı atıb Şeytanı özünə dost tutun şəxs, əlbəttə, açıq-aşkar ziyana uğramışdır.

120. (Şeytan) onlara (müşriklərə) vədlər verir, ürəklərində arzular oyadır. Lakin Şeytan onlara yalnız yalan vədlər verir.

121. Onların (Şeytana uyanların) yeri Cəhənnəmdir. Və oradan xilas olmağa çarə tapmazlar.

122. İman gətirib yaxşı işlər görənləri isə, Biz (ağacları) altından çaylar axan cənnətlərə daxil edəcəyik. Allahın haqq olan vədi üzrə, onlar orada əbədi qalacaqlar. Allahdan daha doğru danışan kimdir?!

123. Bu, (Cənnətə daxil olmaq) nə sizin, nə də kitab əhlinin arzusu ilə deyildir. Pislik edən şəxs, onun cəzasını görəcək və o, Allahdan başqa özünə nə bir dost, nə də bir imdada yetən tapacaqdır!

124. Mömin olmaqla bərabər, yaxşı işlər görən kişilər və qadınlar Cənnətə daxil olarlar. Onlara xurma çərdəyi qədər haqsızlıq edilməz!

125. Yaxşı əməl sahibi olun özünü Allaha təslim edən, İbrahimin hənif millətinə (dininə) tabe olan şəxsdən din etibarilə daha gözəl kim ola bilər? Həqiqətən, Allah İbrahimi (Özünə) dost tutmuşdur!

126. Göylərdə və yerdə nə varsa, (hamısı) Allaha məxsusdur. Allah hər şeyi (elmi və qüdrətilə) ehtiva etmişdir.

127. (Ya Rəsulum!) Səndən qadınlar barəsində fitva (əsasında hökm çıxarılan şəri məsləhət) istəyirlər. De ki: "Onlar barəsində fitvanı sizə Allah və Kitabdan (Qurandan) sizə oxunan (ayələr) verir. Onlar verilməsi vacib olanı (mirası) özlərinə verməyərək evlənmək istədiyiniz yetim qızlar (qadınlar) və aciz uşaqlar haqqında, həmçinin yetimlərlə ədalətlə rəftar etməniz barədə olan ayələrdir". Sizin etdiyiniz bütün xeyirli işləri, şübhəsiz ki, Allah bilir!

128. Əgər bir qadın öz ərinin qaba rəftarından, yaxud ondan üz çevirməsindən qorxarsa, onların öz aralarında bir növ barışıb düzəlişmələrindən (ər-arvada) heç bir günah gəlməz. Çünki barışmaq daha xeyirlidir. Ancaq nəfslərdə xəsislik (qısqanclıq) həmişə mövcuddur. Əgər siz yaxşı dolanıb (dava-dalaşdan, kobud rəftardan) çəkinsəniz (bu sizin üçün daha yaxşı olar). Şübhəsiz ki, Allah etdiyiniz hər bir işdən xəbərdardır!

129. Siz nə qədər çox istəsəniz də, heç vaxt arvadlar arasında ədalətlə rəftar etməyi bacarmazsınız. Barı, (birisinə) tamamilə meyl göstərib, digərini asılı vəziyyətdə (nə ərli kimi ərli, nə də boşanmış kimi boşanmış) qoymayın. Əgər özünüzü islah edib (belə hərəkətlərdən) çəkinsəniz (Allah sizi bağışlar). Həqiqətən, Allah bağışlayandır, rəhm edəndir!

130. Əgər onlar (ər-arvad) bir-birindən ayrılacaq olsalar, Allah onların hər birini Öz geniş lütfü (kərəmi) ilə ehtiyacsız edər. Həqiqətən, Allah geniş lütf sahibi, hikmət sahibidir!

131. Göylərdə və yerdə nə varsa, (hamısı) Allaha məxsusdur. (Ey müsəlmanlar!) Biz sizdən əvvəl kitab verilənlərə də, sizə də Allahdan qorxmanızı tövsiyə etdik. Əgər Allahı inkar etsəniz belə, (yenə də) göylərdə və yerdə nə varsa, (hamısı) Allahındır. Allah ehtiyacsızdır, (öz-özlüyündə) şükür olunmağa, (tərif olunmağa) layiqdir.

132. Göylərdə və yerdə nə varsa, (hamısı) Allaha məxsusdur. Təkcə Allahın vəkil olması kifayət edər.

133. Ey insanlar! Əgər O istərsə, sizi yox edər, (yerinizə) başqalarını gətirər. (İnsanları məhv edib əvəzində başqa bir məxluq yaradar). Allah buna qadirdir!

134. Hər kəs dünya savabını (mükafatını) istərsə, (bilməlidir ki) dünyanın da, axirətin də mükafatları Allahın yanındadır. Allah eşidəndir, görəndir!

135. Ey iman gətirənlər! (Şahidliyiniz) sizin özünüzün, ata-ananızın, yaxın qohumlarınızın əleyhinə olsa belə, ədalətdən möhkəm yapışan Allah şahidi olun! (Əleyhinə şahidlik edəcəyiniz şəxs) istər dövlətli, istər kasıb olsun, hər halda Allah onların hər ikisinə (sizdən) daha yaxındır. Nəfsinizin istəyinə uyub haqdan üz çevirməyin! Əgər dilinizi əyib büzsəniz və ya (doğru şəhadət verməkdən, yaxud ümumən şahidlikdən) boyun qaçırsanız, (bilin ki) Allah etdiyiniz işlərdən xəbərdardır!

136. Ey iman gətirənlər! Allaha və Peyğəmbərinə, Onun Öz Peyğəmbərinə endirdiyi Kitaba (Qurana) və ondan əvvəl nazil etdiyi kitablara iman gətirin! Allaha, onun mələklərinə, kitablarına, peyğəmbərlərinə və axirət gününə inanmayan şəxs, şübhəsiz ki, (doğru yoldan) çox azmışdır.

137. (Əvvəlcə) iman gətirib sonra kafir olan, sonra iman gətirib yenə kafir olan, sonra da küfrünü artıran kəsləri Allah heç vaxt bağışlayan və doğru yola yönəldən deyildir!

138. (Ya Rəsulum!) Münafiqlərə müjdə ver ki, onlardan ötrü (axirətdə) şiddətli əzab var.

139. O münafiqlər ki, möminləri qoyub kafirləri dost tuturlar. (İzzət və) qüdrəti onların yanındamı axtarırlar? Şübhəsiz ki, (izzət və) qüdrət tamamilə Allaha məxsusdur!

140. Allah Kitabda (Quranda) sizə nazil etmişdir (bildirmişdir) ki, Allahın ayələrini inkar edildiyini və onlara istehza olunduğunu eşitdiyiniz zaman müşriklər başqa bir söhbətə girişməyənə qədər onlarla bir yerdə əyləşməyin! Çünki o vaxt siz də onların tayı olarsınız. Həqiqətən, Allah münafiqlərin və kafirlərin hamısını Cəhənnəmdə bir yerdə toplayacaqdır!

141. (Ey müsəlmanlar!) Sizə göz qoyan (münafiqlər) Allah tərəfindən sizə bir qələbə üz verdikdə: "Məgər biz də sizinlə deyildikmi? " deyər, kafirlərə (zəfər) nəsib olduqda isə: "Məgər (möminlərlə birlikdə sizə qarşı vuruşsaydıq) biz sizə qalib gələ bilməzdikmi? Məgər biz möminlərə (onların sizə qarşı təcavüzünə cürbəcür vasitələrlə) mane olmadıqmı? " – söyləyərlər. Qiyamət günü Allah Özü sizin aranızda hökm verəcəkdir. Allah heç vaxt kafirlərə möminlərin əleyhinə olan bir yol göstərməz!

142. Münafiqlər Allahı aldatmağa çalışırlar. Halbuki əslində (Allah) onları aldadır. Onlar namaza durduqları zaman (yerlərindən) tənbəlliklə (könülsüz) qalxar, özlərini (yalandan) xalqa göstərər və Allahı olduqca az yad edərlər.

143. (Münafiqlər imanla küfr arasında) tərəddüd edib nə (tamamilə) bunlara (möminlərə), nə də onlara (kafirlərə) tərəf dönərlər. Allahın azdırdığı şəxs üçün heç bir yol (nicat yolu) tapa bilməzsən!

144. Ey iman gətirənlər! Möminləri qoyub kafirləri dost tutmayın! Məgər Allaha öz əleyhinizə açıq bir dəlilmi vermək istəyirsiniz?

145. (Ya Rəsulum!) Əlbəttə, münafiqlərin yeri Cəhənnəmin ən aşağı təbəqəsindədir. Sən heç vaxt onlara yardım edən tapmazsan!

146. Tövbə edənlər, özlərini islah edib düzəldənlər, Allahdan möhkəm yapışanlar və Allah qarşısında dinini (etiqadını) təmizləyənlər müstəsnadır. Çünki onlar möminlərə bərabərdirlər. Möminlərə isə Allah böyük mükafat verəcəkdir!

147. Əgər siz şükür etsəniz və iman gətirsəniz, Allah sizə nə üçün əzab versin ki, Allah şükrə qiymət verəndir, (hər şeyi) biləndir!

148. Allah pis sözün açıq (ucadan) deyilməsini sevməz. Yalnız zülm olunmuş şəxslər müstəsnadır. Allah (hər şeyi) eşidəndir, biləndir!

149. Əgər yaxşı bir əməli aşkara çıxarsanız, yaxud onu gizlətsəniz və ya bir pisliyi əfv etsəniz (Allah onları bilər). Həqiqətən, Allah bağışlayandır, qüdrət sahibidir!

150. Allahı və peyğəmbərlərini inkar edənlər, Allahı peyğəmbərlərindən ayırmaq istəyənlər. "Biz peyğəmbərlərdən bəzisinə inanır, bəzilərinə isə inanmırıq", - deyənlər və bunun (iman ilə küfr) arasında bir yol (məzhəb) tapmaq istəyənlər -

151. Bütün bunlar, həqiqətən, kafirdirlər. Biz (axirətdə) kafirlərdən ötrü alçaldıcı əzab hazırlamışıq!

152. Lakin Allaha və peyğəmbərlərinə iman gətirən və onların heç birini digərindən ayırmayan şəxslərə Allah Özü mükafatlarını verəcəkdir. Şübhəsiz ki, Allah bağışlayandır, rəhm edəndir!

153. (Ya Rəsulum!) Kitab əhli (yəhudilər) sənin onlara göydən (birdəfəlik) bir kitab endirməyini istəyirlər. Halbuki onlar (vaxtilə) Musadan bundan daha böyüyünü istəmiş və: “Bizə Allahı aşkar göstər!” – demişdilər. Və öz ədalətsizlikləri üzündən onları ildırım vurmuşdu. Sonra onlara açıq-aydın möcüzələr gəldiyi halda, buzova sitayiş etmişdilər. Biz bundan da (onların bu günahından da) keçdik və Musaya açıq-aşkar dəlil (parlaq möcüzələr) verdik.

154. Əhdə riayət etsinlər deyə, Tur dağını onların (başları) üzərinə qaldırdıq və onlara: “Qapıdan (ibadət çadırının qapısından) səcdə edərək daxil olun, şənbə gününün qayda-qanununu pozmayın!” – dedik. Və onlardan möhkəm əhd aldıq.

155. Lakin onlar verdikləri əhdi pozduqları, Allahın ayələrini inkar etdikləri, peyğəmbərləri haqsız yerə öldürdükləri və: “Ürəklərimiz pərdəlidir!” - dedikləri ucundan (Allahın lənətinə düçar oldular). Bəli, öz küfrləri üzündən Allah onların ürəklərinə möhür vurmuşdur (kilidləmişdir). Buna görə də onların yalnız az bir hissəsi iman gətirər.

156. Onlar həm də küfr etdikləri (İsanı inkar etdikləri) və Məryəmə qarşı böyük bir böhtan dedikləri üçün (lənətə düçar oldular).

157. (Onların lənətə düçar olmalarının bir səbəbi də: ) ”Biz, Allahın elçisi Məryəm oğlu İsa əl-Məsihi öldürdük”, - demələridir. Halbuki onlar İsanı nə öldürdülər, nə də çarmıxa çəkdilər. Onlarda yalnız belə bir təsəvvür yarandı. Bu haqlı ixtilafda olanlar onun (şəxsən öldürülməsi) barəsində, əlbəttə, şəkk-şübhə içərisindədirlər. Onların buna dair heç bir məlumatı yoxdur. Onlar ancaq zənnə qapılırlar. Həqiqətdə onu (İsanı) öldürməmişdilər.

158. Xeyr, Allah onu Öz dərgahına qaldırmışdır. Şübhəsiz, Allah yenilməz qüvvət sahibi, hikmət sahibidir!

159. Kitab əhlindən (yəhudilərdən və xaçpərəstlərdən) elə bir kəs olmaz ki, ölümündən əvvəl (can verdiyi zaman) ona (İsaya) iman gətirməsin, lakin o, (İsa) qiyamət günündə onların (kitab əhlinin) əleyhinə şəhadət verəcəkdir.

160. Yəhudilər zülm etdiklərinə və bir çoxlarını Allahın yolundan döndərdiklərinə görə (əvvəlcə) özlərinə halal edilmiş gözəl (təmiz, halal) nemətləri onlara haram etdik.

161. Və qadağan olunmasına baxmayaraq, sələm (faiz) aldıqlarından, haqsız yerə xalqın malını yediklərindən dolayı (halal olanı onlara haram buyurduq). Biz onlardan olan kafirlər üçün şiddətli bir əzab hazırlamışıq!

162. Lakin onların elmdə qüvvətli (möhkəm) olanları və möminləri sənə nazil edilənə və səndən əvvəl nazil edilənə və səndən əvvəl nazil olanlara inanır, namaz qılır, zəkat verir, Allaha və axirət gününə iman gətirirlər. Biz, əlbəttə, onlara böyük mükafat verəcəyik!

163. (Ya Rəsulum!) Biz Nuha və ondan sonrakı peyğəmbərlərə vəhy göndərdiyimiz kimi, sənə də vəhy göndərdik. Biz İbrahimə, İsmailə, İshaqa, Yəquba və onun övladlarına, İsaya, Əyyuba, Yunisa, Haruna və Süleymana da vəhy göndərdik. Biz Davuda da Zəburu verdik.

164. (Biz) peyğəmbərlər (göndərdik). Onların bəzisinin əhvalatını bundan əvvəl sənə danışdıq, bəzisinin əhvalatını isə söyləmədik. Və Allah Musa ilə sözlə (arada heç bir başqa vasitə olmadan) danışdı.

165. Biz peyğəmbərləri (möminlərə) müjdə gətirən və (kafirləri) əzabla qorxudan kimi göndərdik ki, daha insanlar üçün peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın. Allah yenilməz qüvvət sahibi, hikmət sahibidir!

166. Lakin (Ya Rəsulum!) Allah sənə nazil etdiyi (Quran) ilə şəhadət verir ki, onu (Quranı) Öz elmi ilə (Özünə xas olan elm və hikmətlə)

nazil etmişdir. Mələklər də buna şahidlik edirlər. Təkcə Allahın şahid olması yetər!

167. (Allahı) inkar edən və (insanları) Allahın yolundan döndərən şəxslər, şübhəsiz ki, (haqdan) çox uzaq bir zəlalətə uğramışlar.

168. Kafirləri və zülmkarları, şübhəsiz ki, Allah bağışlayan və onlara (cəhənnəm yolundan başqa) bir yol göstərən deyildir!

169. Əbədi, həmişəlik qalacaqları cəhənnəm yolundan başqa! Bu isə Allah üçün çox asandır!

170. Ey insanlar! Peyğəmbər Rəbbinizdən sizə haqla (Quranı) gətirdi. (Ona) iman gətirin! Bu sizin üçün xeyirli olar. Siz (onu) inkar etsəniz də, (bilin ki) göylərdə və yerdə nə varsa, (hamısı) Allaha məxsusdur. (Allahın sizin Ona inanıb-inanmamağınıza heç bir ehtiyacı yoxdur. Bu, ancaq sizin özünüzə xeyir və ya zərər gətirə bilər). Həqiqətən, Allah (hər şeyi) biləndir, hikmət sahibidir!

171. Ey kitab əhli! Öz dininizdə həddi aşmayın! Allah barəsində yalnız haqqı deyin. Həqiqətən, Məryəm oğlu İsa əl-Məsih ancaq Allahın peyğəmbəri, (Cəbrail vasitəsilə) Məryəmə çatdırdığı bir söz və Onun tərəfindən olan bir ruhdur. Allaha və peyğəmbərlərinə iman gətirin. (Allah barəsində) "üçdür" deməyin. (Belə sözlərə) son qoyun ki, (bu) sizin üçün daha yaxşı olar. Həqiqətən, Allah tək bir tanrıdır. Övladı olmaqdan (bu bəşəri xüsusiyyətdən) kənardır. Göylərdə və yerdə nə varsa, (hamısı) Onundur. Allahın (sizə) vəkil olması bəs edər!

172. İsa əl-Məsih də, yaxın mələklər də Allahın qulu olmağı əsla özlərinə ar bilməzlər. Allah Ona ibadət etməyi özünə ar bilənlərin və təkəbbür göstərənlərin hamısını Öz hüzuruna toplayacaqdır!

173. (Allah) iman gətirənlərin və yaxşı işlər görənlərin mükafatlarını büsbütün verəcək, üstəlik Öz nemətindən onlar üçün (bir qədər)

artıracaqdır. (Allaha ibadət etməyi) özlərinə sığışdırmayanları və təkəbbür göstərənləri isə acı bir əzaba düçar edəcəkdir! Onlar özlərinə Allahdan savayı nə bir dost, nə də havadar tapacaqlar!

174. Ey insanlar! (Bu Muhəmməd) sizə Rəbbiniz tərəfindən dəlil gəlmişdir. Biz sizə aydın bir nur (Quran) endirdik.

175. Allah Ona iman gətirən və Ondan möhkəm yapışanları öz mərhəməti, lütfü altına alar və onları özünə tərəf gedən düz yola yönəldər.

176. (Ya Rəsulum!) Səndən fitva istəyirlər. De: "Atası və övladı olmayan şəxs (şəxsin mirası) haqqında Allah sizə belə fitva verir: Övladı (və atası) olmayan bir şəxs vəfat etdikdə onun (atabir-anabir və ya yalnız atabir) bir bacısı varsa, qoyub getdiyi malın yarısı bacıya çatır. Övladı (və atası) olmayan bir qadın vəfat etdikdə qardaşı onun varisidir (malının hamısı onun payına düşür). Əgər vəfat edən şəxsin iki (və ya daha artıq) bacısı varsa, mirasın üçdə ikisi onlara çatır. Əgər varislər qardaş və bacılardan (bir qardaş, bir bacı və ya bir neçə bacı-qardaşdan) ibarət olarsa, kişiyə (qardaşa) qadına (bacıya) düşən payın iki misli verilir". Allah bunu sizə doğru yoldan çıxmamağınız üçün aydınlaşdırır. Allah hər şeyi biləndir!

## .5.
## əl-Maidə (Süfrə) surəsi
**(Mədinədə nazil olmuşdur, 120 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Ey iman gətirənlər! Əhdlərə sadiq olun. Ehramda olarkən ov sizə qadağan edilməklə, (aşağıda) adları çəkiləcək heyvanlar müstəsna olaraq, qalanları sizə halal edildi. Şübhəsiz ki, Allah istədiyini hökm edər!

2. Ey iman gətirənlər! Allahın müəyyən etdiyi mərasimə (həcc mərasiminə), haram (hörmətli) aya (həcc ayı hesab edilən zülhiccəyə və ya rəcəb zülqədə, zülhiccə və məhərrəm aylarına), (Kəbəyə gətirilən) qurbanlara, boynuna nişan taxılmış qurbanlıq heyvanlara, həmçinin Rəbbinin lütfünü və razılığını diləyərək Beytülhərama (müqəddəs evə) üz tutub (ziyarətə) gələnlərə hörmətsizlik etməyin! [Onlara qarşı nalayiq işlər görməyi özünüzə halal (rəva) bilməyin!] Ehramdan çıxdığınız zaman (istəsəniz) ov edin. (Vaxtilə) sizi Məscidülhərama daxil olmağa qoymayan camaata qarşı bəslədiyiniz kin sizi təcavüzə sövq etməsin (zülm və haqsızlıq günahına batırmasın). Yaxşılıq etməkdə və pis əməllərdən çəkinməkdə əlbir olun, günah iş görməkdə və düşmənçilik etməkdə bir-birinizə kömək göstərməyin. Allahdan qorxun. Həqiqətən, Allahın əzabı şiddətlidir!

3. Ölü (kəsilmədən ölüb murdar olmuş) heyvan, qan, donuz əti, Allahdan başqasının adı ilə (bismillah deyilmədən) kəsilmiş, boğulmuş, (küt alət və ya silahla) vurulmuş, (bir yerdən) yıxılaraq ölmüş, (başqa bir heyvanın buynuzu ilə) vurulub gəbərmiş, vəhşi heyvanlar tərəfindən parçalanıb yeyilmiş - canı çıxmamış kəsdiyiniz heyvanlar müstəsnadır - dikinə qoyulmuş daşlar (bütlər və ya Kəbənin ətrafındakı bütpərəst qurbangahlar) üzərində kəsilmiş heyvanlar və fal oxları ilə pay bölmək sizə haram edildi. Bunlar günahdır. Bu gün kafirlər dininizdən (onu məhv edə bilmədikləri üçün) əllərini üzdülər. Onlardan qorxmayın, Məndən qorxun! Bu gün dininizi sizin üçün kamil etdim, sizə olan nemətimi (Məkkənin fəthi, islamın mövqeyinin möhkəmlənməsi, Cahiliyyət dövrünün bir sıra zərərli adətlərinin aradan qaldırılması və i. a.) tamamladım və sizin üçün din olaraq islamı bəyənib seçdim. Kim aclıq üzündən naçar qalarsa (çətinliyə düşərsə), günaha meyl etmək niyyətində olmayaraq (zəruri ehtiyacını ödəyəcək qədər bu haram ətlərdən yeyə bilər). Həqiqətən, Allah bağışlayandır, rəhm edəndir!

4. (Ya Rəsulum!) Səndən hansı şeylərin halal edildiyini soruşurlar. De: “Bütün pak nemətlər sizə halal buyurulmuşdur. Allahın sizə öyrətdiyi (ov üsulları) ilə təlim edib əhliləşdirdiyiniz yırtıcı heyvanların (ov iti, şahin və s. ) ovladıqları da sizə halaldır. Onların sizin üçün tutub gətirdiklərindən yeyin və ona görə (təlim etdiyiniz heyvan və quşları ov üzərinə qısqırtdığınız, silah işlətdiyiniz və ovu kəsdiyiniz zaman) Allahın adını çəkin (bismillah, Allahu-əkbər deyin). Allahdan qorxun. Şübhəsiz ki, Allah tezliklə haqq-hesab çəkəndir!

5. Bu gün pak nemətlər sizə halal edilmişdir. Kitab əhlinin yeməkləri sizə, sizin yeməkləriniz isə kitab əhlinə halaldır. Möminlərin, həmçinin sizdən əvvəl kitab verilmişlərin (yəhudilərin və xaçpərəstlərin) azad və isмətli (özlərini zinadan və nəfslərini haram şeylərdən qoruyan) qadınları mehrlərini verdiyiniz, namuslu olub zina etmədiyiniz və aşna saxlamadığınız təqdirdə (evlənmək üçün) sizə halaldır. İmanı dananın bütün işləri boşa çıxar və o, axirətdə zərər çəkənlərdən olar!

6. Ey iman gətirənlər! Namaza durduğunuz zaman üzünüzü və dirsəklərlə birlikdə (dirsəklərdən və ya dirsəklərə qədər) əllərinizi yuyun. (Yaş əlinizlə) başınızı və hər iki bəndə (oynağa) qədər ayaqlarınızı məsh edin (və ya: başınızı məsh edin, ayaqlarınızı isə hər iki topuğa qədər yuyun). Əgər cünub (murdar) olmusunuzsa, qüsl edin (bədəninizi başdan ayağa qədər yuyub təmizləyin). Xəstələndiyiniz, səfərdə olduğunuz, ayaq yolundan gəldiyiniz və ya qadınlarla yaxınlıq etdiyiniz zaman su tapmasanız, pak torpaqla təyəmmüm edin, ondan üzünüzə və əllərinizə sürtün (paklığı niyyət edib əllərinizi bir dəfə torpağa sürtərək üzünüzü, bir dəfə də torpağa sürtərək əllərinizi məsh edin). Allah sizi çətinliyə salmaq istəməz, lakin O sizi pak, təmiz etmək və sizə olan nemətini tamamlamaq (artırmaq) istər ki, bəlkə, şükür edəsiniz!

7. Allahın sizə olan nemətini və: “Eşitdik və itaət etdik”, - dediyiniz zaman sizinlə bağladığı əhdi unutmayın. Allahdan qorxun. Şübhə yoxdur ki, Allah ürəklərdə olanları (qəlblərin sirrini) biləndir!

8. Ey iman gətirənlər! Allah qarşısında (borcunuzu yerinə yetirməkdə) sabitqədəm və ədalətli şahidlər olun. Hər hansı bir camaata qarşı olan kininiz sizi ədalətsizliyə sövq etməsin. Ədalətli olun. Bu, təqvaya daha yaxındır. Allahdan qorxun. Allah etdiklərinizdən xəbərdardır!

9. Allah iman gətirib yaxşı işlər görənlərə onlara bağışlanma və böyük mükafat gözlədiyini vəd buyurmuşdur!

10. Kafir olub ayələrimizi təkzib edənlər isə cəhənnəmlikdirlər!

11. Ey iman gətirənlər! Allahın sizə olan lütfünü xatırlayın ki, (bir dəfə) bir tayfa (Məkkə müşriklərini və ya Bəni Sələb qəbiləsi) sizə əl qaldırmaq (hücum etmək) niyyətində olduğu zaman Allah onlara maneçilik törətmişdi. Allahdan qorxun. Möminlər yalnız Allaha təvəkkül etsinlər!

12. Allah İsrail oğullarından əhd almışdı. Biz onlardan (özlərinə) on iki nəzarətçi (vəkil) göndərmişdik. Allah buyurmuşdu: “Mən sizinləyəm. Əgər namaz qılsanız, zəkat versəniz, peyğəmbərlərimə iman gətirib onlara kömək etsəniz, Allaha (Allah yolunda) gözəl bir borc (sədəqə) versəniz, əlbəttə, günahlarınızın üstünü örtər və sizi (ağacları) altından çaylar axan cənnətlərə daxil edərəm. Lakin bundan sonra sizdən hər kəs (əhdi pozaraq) küfr edərsə, o artıq doğru yoldan azmış olar!”

13. Sonra əhdlərini pozduqları üçün onları lənətlədik və ürəklərini sərtləşdirdik. Onlar sözlərin (Tövratda peyğəmbərin vəsfinə dair kəlmələrin və bəzi başqa ayələrin) yerlərini dəyişib təhrif edir və xəbərdar edildikləri şeylərin bir hissəsini (Muhəmməd peyğəmbərə iman gətirməyi) unudurlar. Onların az bir qismi müstəsna olmaqla,

sən onlardan həmişə xəyanət görəcəksən. Bununla belə, onları bağışla, günahlarından keç. Şübhəsiz ki, Allah yaxşılıq edənləri sevər!

14. “Biz xaçpərəstik”, - deyənlərdən də əhd almışdıq. Sonra onlar xəbərdar olunduqları şeylərin bir hissəsini (Muhəmməd peyğəmbərə iman gətirməyi) unutdular. Biz də aralarına qiyamət gününə qədər davam edəcək ədavət və kin saldıq. Allah onlara gördükləri işlər barəsində xəbər verəcəkdir!

15. Ey kitab əhli! Sizə kitabda (Tövratda və İncildə) gizlətdiyiniz şeylərin bir çoxunu bildirən, bir çoxunu da sizə bağışlayıb üstünü vurmayan (və ya sizdən bir çoxunu bağışlayan) Peyğəmbərimiz gəldi. Artıq Allah tərəfindən sizə bir nur və açıq-aydın bir Kitab (Quran) gəldi.

16. Allah Öz lütfünə sığınanları onunla (Peyğəmbər və Quran vasitəsilə) əmin-amanlıq (sülh) yollarına yönəldər, onları öz iznilə zülmətdən nura çıxarar və düz yola istiqamətləndirər!

17. “Allah Məryəm oğlu Məsihdir”, - deyənlər, şübhəsiz ki, kafir oldular. (Onlara) de: “Əgər Allah Məryəm oğlu Məsihi, anasını və yer üzündə olanların hamısını məhv etmək istəsə, (bu işdə) kim Ona bir şeylə mane ola bilər? Göylərin, yerlərin və onların arasında olan hər bir şeyin ixtiyarı Allahın əlindədir. O, istədiyini yaradar, Allah hər şeyə qadirdir!

18. Yəhudilər və xaçpərəstlər dedilər: “Biz Allahın oğulları və sevimliləriyik”. (Onlara) de: “Bəs onda Allah nə üçün günahlarınıza görə sizə əzab verir?” Xeyr, siz də Onun yaratdığı bir bəşərsiniz. (Allah) istədiyini bağışlar, istədiyinə əzab verər. Göylərin, yerin və onların arasında olan hər bir şeyin ixtiyarı Allahın əlindədir və axır dönüş də Onun hüzurunadır!

19. Ey kitab əhli! Peyğəmbərlərin ardı-arası kəsildiyi bir dövrdə: "Bizə nə bir (Cənnətlə) müjdə verən, nə də bir (cəhənnəm əzabı ilə) qorxudan kimsə gəldi", - deməməyiniz üçün sizə Peyğəmbərimiz (Muhəmməd) gəldi. Artıq sizə müjdə verən və qorxudan (xəbərdarlıq edən) şəxs gəlmişdir. Allah hər şeyə qadirdir!

20. Bir zaman Musa öz camaatına belə demişdi: "Ey camaatım, Allahın sizə olan nemətini xatırlayın ki, sizdən peyğəmbərlər göndərdi, padşahlar təyin etdi və aləmlərdən (bəşər övladından) heç birinə vermədiyini sizə verdi.

21. Ey camaatım! Allahın sizin üçün əzəldən (vətən) müəyyən etdiyi müqəddəs torpağa (Beytülmüqəddəs və ya Şama) daxil olun, geri dönməyin (düşməndən qorxub qaçmayın və ya dininizdən dönməyin), yoxsa zərər çəkmiş halda geri dönərsiniz.

22. Onlar dedilər: "Ya Musa, orada nəhəng (qüvvətli) adamlar (Ad qövmünə mənsub Əmaliqə tayfası) vardır. Onlar oradan çıxmayınca bir ora girməyəcəyik. Əgər onlar oradan çıxsalar, biz ora daxil olarıq".

23. (Allahdan) qorxanlardan Allahın nemət verdiyi iki nəfər dedi: "Onların üstünə (qəflətən) qapıdan (yaşadıqları şəhərin qapısından) girin. Əgər (qapıdan) girsəniz, onlara mütləq qələbə çalarsanız. Əgər möminsinizsə, Allaha təvəkkül edin!"

24. (İsrail oğulları) dedilər: "Ey Musa, nə qədər ki, onlar oradadırlar, biz ora girməyəcəyik. Sən və Rəbbin gedib onlarla vuruşun. Biz isə burada oturacağıq".

25. (Musa) dedi: "Ey Rəbbim! Mənim yalnız özümə və qardaşıma (Haruna) gücüm çatar (sözüm keçər). Sən bizi bu günahkar və azğın camaatdan ayır!"

26. (Allah Musaya) buyurdu: “Artıq ora (müqəddəs torpaq) qırx il müddətinə onlara haram edildi. Onlar olduqları yerdə (Tih səhrasında) sərgərdan gəzib dolaşacaqlar. O günahkar (və azğın) camaatın halına acıma!”

27. (Ya Rəsulum!) Onlara Adəmin iki oğlunun əhvalatını olduğu kimi söylə. Onlar qurban gətirdikləri zaman birinin qurbanı qəbul edilmiş, digərininki isə qəbul olunmamışdı. (Qurbanı qəbul olunmayan Qabil qardaşı Habilə) demişdi: “Səni mütləq öldürəcəyəm! (Habil ona) belə cavab vermişdi: “Allah yalnız müttəqilərdən (qurban) qəbul edər!

28. Sən məni öldürməkdən ötrü mənə əl qaldırsanda, mən səni öldürmək üçün sənə əl qaldıran deyiləm. Mən aləmlərin Rəbbi olan Allahdan qorxuram.

29. Mən istəyirəm ki, sən (məni öldürməklə) mənim də günahımı öz günahınla birlikdə üstünə götürəsən və beləliklə də, Cəhənnəm sakinlərindən olasan. Zalımların cəzası budur!”

30. Nəfsi onu (Qabili) qardaşını öldürməyə sövq etdi, onu (Habili) öldürdü və bununla da zərərçəkənlərdən oldu.

31. Sonra Allah qardaşının cəsədini necə basdırmağı ona göstərmək üçün yer eşən bir qarğa göndərdi. (Qabil) dedi: “Vay halıma! (Gör nə günə qalmışam!) Bu qarğa qədər olub qardaşımın cəsədini də basdıra bilmərəm?” O, artıq peşman olmuşdu.

32. Buna görə də İsrail oğullarına (Tövratda) yazıb hökm etdik ki, hər kəs bir kimsəni öldürməmiş (bununla da özündən qisas alınmağa yer qoymamış) və yer üzündə fitnə-fəsad törətməmiş bir şəxsi öldürsə, o, bütün insanları öldürmüş kimi olur. Hər kəs belə bir kimsəni diriltsə (ölümdən qurtarsa), o, bütün insanları diriltmiş kimi olur. Bizim peyğəmbərlərimiz onlara (İsrail oğullarına) açıq

möcüzələr gətirmişdilər. Bundan (bu möcüzələrdən) sonra da onların bir çoxu yer üzündə (küfr, qətl və cinayət etməklə) həddi aşdılar.

33. Allaha və Peyğəmbərinə qarşı vuruşanların, yer üzündə fitnə-fəsad salmağa çalışanların cəzası ancaq öldürülmək, çarmıxa çəkilmək, ya da əl-ayaqlarının çarpazvari (sağ əllərilə sol ayaqlarını) kəsilməsi, yaxud da yaşadıqları yerdən sürgün olunmalıdırlar. Bu (cəza) onlar üçün dünyada bir rüsvayçılıqdır. Axirətdə isə onları böyük bir əzab gözləyir.

34. Sizin əlinizə keçməmişdən əvvəl tövbə edənlər müstəsnadır. Bilin ki, Allah bağışlayandır, rəhm edəndir!

35. Ey iman gətirənlər! Allahdan qorxun, Ona (Onun rəhmətinə və lütfünə qovuşmaq üçün) vəsilə (yol) axtarın. (Allah) yolunda cihad edin ki, nicat tapasınız!

36. Əgər yer üzündə olanların hamısı, üstəlik bir o qədər kafirlərin əlində olsaydı və onlar bunu qiyamət gününün əzabından qurtarmaq üçün fidyə versəydilər, yenə də onlardan (fidyə) qəbul olunmazdı. Onları şiddətli bir əzab gözləyir!

37. Onlar atəşdən çıxmaq istədilər, lakin heç cür oradan çıxa bilməzlər. Onlar əbədi əzaba düçar olanlardır!

38. Oğru kişi ilə oğru qadının gördükləri işin əvəzi kimi Allahdan cəza olaraq (sağ) əllərini kəsin. Allah yenilməz qüvvət sahibi, hikmət sahibidir!

39. Lakin hər kəs gördüyü haqsız işdən (oğurluqdan) sonra tövbə edib özünü düzəltsə, Allah onun tövbəsini qəbul edər. Həqiqətən, Allah bağışlayandır, rəhm edəndir!

40. (Ey insan!) Məgər bilmirsən ki, göylərin və yerin hökmü Allaha məxsusdur?! O, istədiyinə əzab verər, istədiyini bağışlar. Allah hər şeyə qadirdir!

41. Ya Peyğəmbər (Ya Rəsulum!) ürəklərində inanmadıqları halda, dildə (ağızları ilə): "İnandıq", deyənlərin (münafiqlərin), yəhudilərdən yalana qulaq asanların, sənin hüzuruna gəlməyən başqa bir camaata qulaq asanların (onlara casusluq edənlərin) küfr içində vurnuxanları səni kədərləndirməsin. Onlar (Tövratdakı) sözlərin yerini sonradan dəyişib təhrif edir və deyirlər: "Əgər sizə bu (təhrif olunmuş dini hökm) verilsə, onu qəbul edin. Əgər verilməsə, ondan qaçının". Allahın fitnəyə (azğınlığa) düşməsini istədiyi şəxs üçün Allaha qarşı sənin əlindən heç bir şey gəlməz. Onlar elə kəslərdir ki, Allah onların ürəklərini təmizləmək istəməmişdir. Onları dünyada rüsvayçılıq, axirətdə isə böyük (dəhşətli) bir əzab gözləyir!

42. Onlar yalana qulaq asanlar və haram yeyənlərdir. Əgər yanına gəlsələr, aralarında hökm et və ya onlardan üz çevir. Əgər onlardan üz döndərsən, sənə heç bir zərər verə bilməzlər. Əgər aralarında hökm etsən, ədalətlə hökm et. Allah ədalət sahiblərini sevər!

43. İçərisində Allahın hökmü olan Tövrat əllərində ola-ola səni necə (nə üzlə) hakim təyin edir, sonra da ondan (sənin Tövrata müvafiq verdiyin hökmdən) üz çevirirlər? Onlar iman gətirmiş (mömin) kimsələr deyildirlər.

44. Şübhəsiz ki, Tövratı da Biz nazil etdik. Onda haqq yol və nur vardır. (Allaha) təslim olan peyğəmbərlər yəhudilər arasında onunla, din alimləri və fəqihlər isə kitabdan qorunub saxlanılanlarla (Tövratdan ələ gəlib çatan ayələrlə) hökm edərdilər. Onlar (peyğəmbərlər, din alimləri və fəqihlər) ona (Tövratın ilahi bir kitab olmasını) şahiddirlər. (Ey yəhudi alimləri və rəisləri!) İnsanlardan qorxmayın, Məndən qorxun. Mənim ayələrimi ucuz qiymətə

satmayın. Allahın nazil etdiyi (kitab və şəriət) ilə hökm etməyənlər, əlbəttə, kafirdirlər!

45. Biz (Tövratda İsrail oğullarına) yazıb hökm etdik ki, canın qisası can, gözün qisası göz, burununku burun, qulağınkı qulaq, dişinki diş və yaralarınkı yaralardır. Lakin hər kəs (qisası) bağışlasa, bu onun üçün bir kəffarədir (Allah onun günahlarının üstünü örtüb bağışlar. Və ya zərərdidə qisası bağışlasa, bu, cani üçün bir kəffarədir. Haqq sahibi haqqından vaz keçib onu tələb etməsə, Allah da cinayətkarı cəzalandırmaz). Allahın nazil etdiyi (kitab və şəriət) ilə hökm etməyənlər, əlbəttə, zalımdırlar!

46. Onların ardınca Məryəm oğlu İsanı özündən qabaqkı Tövratı təsdiqləyici olaraq göndərdik. Ona içində haqq yolu və nur olan, özündən əvvəlki Tövratı təsdiq edən, müttəqilər üçün doğru yol və nəsihət olan İncili verdik.

47. İncil əhli Allahın onda nazil etdiyi (ehkam) ilə hökm etsin. Allahın nazil etdiyi ilə hökm etməyənlər, əlbəttə, günahkarlardır.

48. (Ya Rəsulum!) Biz (Quranı) sənə haqq olaraq, özündən əvvəlki kitabı (bütün ilahi kitabları) təsdiq edən və onu qoruyan (və ya onların doğruluğuna şahid) olaraq endirdik. Sən onların arasında Allahın nazil etdiyi (Quran) ilə hökm et. Sənə gələn haqdan ayrılıb onların nəfslərinin istədiyinə uyma. Sizin hər biriniz üçün bir şəriət və bir yol təyin etdik. Əgər Allah istədiyi, sizi (eyni şəriətə tabe) vahid bir ümmət edərdi. Lakin bu (müxtəliflik) Allahın verdikləri ilə sizi imtahan etməsi üçündür. Elə isə yaxşı işlər görməkdə bir-birinizi ötməyə çalışın (bir-birinizlə yarışın). Hamınızın axır dönüşü Allahadır. (Allah) aranızda ixtilaf doğuran məsələlər barəsində sizə xəbər verəcəkdir!

49. O halda onların arasında Allahın nazil etdiyi Kitabla hökm et. Onların nəfslərinin istədiyinə uyma. Allahın sənə nazil etdiyinin

(hökmlərin) bir qismindən səni tovlayıb yayındıra biləcəklərindən ehtiyat edib özünü onlardan gözlə. Əgər onlar (bu hökmlərdən) üz döndərsələr, bil ki, Allah onları bəzi günahlarına görə müsibətə düçar etmək istəyir. Doğrudan da, insanların çoxu (Allahın itaətindən çıxmış) fasiqlərdir!

50. Onlar Cahiliyyət dövrünün hökmünümü istəyirlər? Tam qənaət sahibi olan bir camaat üçün Allahdan daha yaxşı hökm verə bilən kimdir?!

51. Ey iman gətirənlər! Yəhudi və xaçpərəstləri (özünüzə) dost tutmayın! Onlar bir-birinin dostudurlar. Sizdən kim onlarla dostluq edərsə, o da onlardandır. Allah zalım tayfanı düz yola yönəltməz!

52. Ona görə də qəlblərində mərəz (nifaq xəstəliyi) olanları onların (yəhudi və xaçpərəstlərin) içində vurnuxan və: "Bizə bir fəlakət üz verməsindən (islamın məğlubiyyətindən) qorxuruq", - deyən görərsən. Amma, ola bilsin ki, Allah (möminlərə) bir zəfər gətirsin və Öz tərəfindən elə bir iş qursun ki, onlar (münafiqlər) ürəklərində gizlətdiklərindən (küfr və nifaqdan) peşman olsunlar.

53. İman gətirənlər isə deyəcəklər: "Sizinlə birlikdə olacaqları barədə Allaha (yalandan) möhkəm andlar içən kəslər bunlarmıdır?" Onların (bütün) əməlləri puça çıxdı və (axirətdə) zərərçəkənlərdən oldular.

54. Ey iman gətirənlər! Sizdən hər kəs dinindən dönsə, (bilsin ki) Allah (onun yerinə) elə bir tayfa gətirər ki, (Allah) onları, onlar da (Allahı) sevərlər. Onlar möminlərə qarşı mülayim, kafirlərə qarşı isə sərt olar, Allah yolunda vuruşar və heç kəsin tənəsindən qorxmazlar. Bu, Allahın lütfüdür, onu istədiyinə verər. Allah (öz lütfü ilə) genişdir, (O, hər şeyi) biləndir!

55. Sizin haminiz ancaq Allah, Onun Peyğəmbəri və iman gətirənlərdir. O kəslər ki, (Allaha) namaz qılır və rükuda olduqları halda zəkat verirlər.

56. Hər kəs Allahı, Onun Peyğəmbərlərini və iman gətirənləri özünə dost tutarsa, (hər iki dünyada işləri yaxşı gedər). Şübhəsiz ki, qələbə çalanlar məhz Allahın firqəsidir (Allahı özünə hami və dost seçən şəxslərdir).

57. Ey iman gətirənlər! Sizdən əvvəl kitab verilmiş olanlardan dininizi oyun-oyuncaq hesab edənləri və kafirləri özünüzə dost tutmayın. Əgər möminsinizsə Allahdan qorxun!

58. Siz (bir-birinizi) namaza çağırdığınız zaman onlar onu oyun-oyuncaq sayarlar. Bu, onların anlamaz bir tayfa olmalarındandır.

59. (Ya Rəsulum!) De: "Ey kitab əhli! Bizdən xoşunuz gəlməməyiniz yalnız bizim Allaha, bizə nazil edilənə və bizdən daha əvvəl nazil edilənlərə inanmağımıza və sizin əksəriyyətinizin fasiq olmasınamı görədir?!

60. De: "Allah yanında cəza etibarilə bundan (dediklərinizdən) daha pisini sizə xəbər verimmi? Allahın lənətlədiyi, qəzəbləndiyi, özlərini meymunlara, donuzlara və şeytanlara (bütlərə) ibadət edənlərə döndərdiyi şəxslər mövqecə daha pis və doğru yoldan daha çox azanlardır!

61. (Münafiqlər) sizin yanınıza gəldikləri zaman: "Biz iman gətirdik!" - deyirlər. Halbuki onlar (sizin hüzurunuza ürəklərində gizlətdikləri) küfrlə daxil olmuş, küfrlə də çıxıb getmişlər. Allah onların gizlətdiklərini (özlərindən) daha yaxşı bilir!

62. Onların bir çoxunu günah işləməyə, düşmənçilik etməyə və haram yeməyə tələsən görərsən. Onların gördüyü işlər necə də pisdir!

63. Kaş onların (yəhudilərin) din alimləri və fəqihləri onlara günah söyləməyi və haram yeməyi qadağan edəydilər! Onların törətdiyi əməllər necə də pisdir!

64. Yəhudilər dedilər: “Allahın əli bağlıdır!” Bu dedikləri sözə görə onların öz əlləri bağlandı və lənətə gəldilər. (Və ya dedikləri sözə görə onların öz əlləri bağlansın və lənətə gəlsinlər!) Xeyr, Allahın əlləri açıqdır. (O, kərimdir, səxavətlidir), istədiyi kimi lütf (və ehsan) edər. Rəbbindən sənə nazil edilən (Quran) onlardan bir çoxunun yalnız küfrünü və azğınlığını artırar. Biz onların arasında qiyamət gününə qədər davam edəcək düşmənçilik və kin saldıq. Onlar müharibə alovu yandırdıqca Allah onu söndürər. Onlar yer üzündə fitnə-fəsad törətməyə çalışarlar. Allah isə fitnə-fəsad törədənləri sevməz!

65. Əgər kitab əhli (Muhəmməd peyğəmbərə və Qurana) iman gətirsə və Allahdan qorxaraq pis əməllərdən çəkinsə, Biz, sözsüz ki, onların günahlarının üstünü örtər və özlərini də (neməti bol olan) Nəim cənnətlərinə daxil edərik.

66. Əgər onlar Tövrata, İncilə və Rəbbi tərəfindən özlərinə nazil edilənə (ilahi kitabların sonuncusu olan Qurana) düzgün əməl etsəydilər, onlar həm (başları) üstündə, həm də ayaqları altında olanlardan (göylərin və yerin nemətlərindən) yeyərdilər. Onlar arasında mötədil (islam dininə qarşı heç bir ədavət bəsləməyib onun müqəddəsliyini etiraf edən) bir camaat vardır. Lakin onların çoxusunun gördüyü işlər necə də pisdir!

67. Ya Peyğəmbər! Rəbbin tərəfindən sənə nazil edilәni (Quranı) təbliğ et. Əgər (bunu) etməsən, (Allahın) risalətini (sənə həvalə edilən elçilik, peyğəmbərlik vəzifəsini) yerinə yetirmiş olmazsan. Allah səni insanlardan qoruyacaq. Həqiqətən, Allah kafir camaatı düz yola yönəltməz!

68. De: “Ey kitab əhli! Tövrata, İncil və Rəbbiniz tərəfindən sizə nazil edilmiş olana (Qurana) düzgün əməl etmədikcə, siz (Allah yanında məqbul, dini baxımdan doğru olan) heç bir şey üzərində deyilsiniz. Rəbbin tərəfindən sənə nazil edilən (Quran) onlardan bir çoxunun yalnız azğınlığını və küfrünü artıracaqdır. Elə isə kafir tayfanın halına acıma!

69. Şübhəsiz ki, iman gətirənlərdən, yəhudilərdən, sabiilərdən və xaçpərəstlərdən Allaha və axirət gününə inanıb yaxşı iş görənlərin heç bir qorxusu yoxdur və onlar qəm-qüssə də görməzlər!

70. Biz İsrail oğullarından əhd almış, onlara peyğəmbərlər göndərmişdik. Hər dəfə bir peyğəmbər onlara ürəklərinə yatmayan bir hökm gətirdikdə (həmin peyğəmbərlərin) bir qismini yalançı hesab edər, bir qismini də öldürərdilər.

71. Və elə hesab edərdilər ki, (bunun müqabilində özlərinə) heç bir bəla üz verməyəcəkdir. Onlar kor və kar oldular. (Haqqı görməkdən və eşitməkdən aciz qaldılar). Sonra Allah onların tövbələrini qəbul etdi. Bundan sonra onların bir çoxu yenə (haqqı) görməz və eşitməz oldu. Allah onların nə etdiklərini görəndir!

72. Şübhəsiz ki: “Allah Məryəm oğlu Məsihdir!” – deyənlər kafir oldular. Halbuki Məsih (İsa) belə demişdi: “Ey İsrail oğulları! Mənim də, sizin də Rəbbiniz olan Allaha ibadət edin! Allaha şərik qoşana Allah, şübhəsiz ki, Cənnəti haram edər. Onun düşəcəyi yer Cəhənnəmdir. Zalımların heç bir köməkçisi yoxdur!”

73. “Allah üçün (üç ilahinin) üçüncüsüdür!” – deyənlər, əlbəttə, kafir olmuşlar. Halbuki bir olan Allahdan başqa heç bir tanrı yoxdur. Əgər onlar dediklərinə son qoymasalar, onlardan kafir olanlara, şübhəsiz ki, şiddətli bir əzab üz verəcəkdir (toxunacaqdır).

74. Məgər onlar Allaha tövbə edib Ondan bağışlanmalarını istəməyəcəklər? Axı Allah bağışlayandır, rəhm edəndir!

75. Məryəm oğlu Məsih ancaq bir peyğəmbərdir. Ondan əvvəl də peyğəmbərlər gəlib getmişdir. Onun anası isə çox pak (Allahın hökmlərini sidq-ürəkdən təsdiq edən) bir qadın idi. Onlardan hər ikisi (adi insanlar kimi) yemək yeyirdi. Gör Biz ayələri onlara necə başa salırıq, onlar (bu ayələrdən) gör necə üz çevirirlər.

76. De: “Allahı qoyub sizə nə bir zərər, nə də bir xeyir verən şeylərəmi ibadət edirsiniz? Halbuki Allah (hər şeyi) eşidəndir, biləndir!”

77. De: “Ey kitab əhli! Dininizdə haqsız yerə ifrata varmayın. Əvvəlcə yolunu azmış, bir çoxlarını da azdırmış və doğru yoldan çıxmış bir tayfanın nəfsinin istəklərinə uymayın!”

78. İsrail oğullarından kafir olanlara həm Davudun, həm də Məryəm oğlu İsanın dili ilə lənət oxundu. Bu onların üsyan etmələrinə və həddi aşmalarına görə idi.

79. Onlar etdikləri pis əməldən əl çəkmirdilər (və ya onlar bir-birini etdikləri pis əməldən çəkindirmirdilər). Onların gördükləri iş necə də pis idi!

80. Onların (kitab əhlinin) bir çoxunun kafirlərlə dostluq etdiyini görürsən. Gör nəfslərinin əvvəlcədən onlar üçün hazırladığı şey (küfr) necə pisdir ki, Allahın onlara qəzəbi tutmuşdur. Onlar əbədi əzaba düçar olanlardır!

81. Əgər onlar Allaha, Peyğəmbərə və ona nazil olana inansaydılar, onları (kafirləri) özlərinə dost tutmazdılar. Lakin onların çoxu itaətdən çıxmış fasiqdirlər!

82. (Ya Rəsulum!) Yəhudiləri və müşrikləri iman gətirənlərin ən pis düşməni, “Biz xaçpərəstik”, - deyənləri isə onların ən yaxın dostu görəcəksən. Bu onların (möminlərin) içində (bilikli, abid) keşiş və rahiblərin olması və onların özlərini yuxarı tutmalarına görədir.

83. Peyğəmbərə nazil olanı dinlədikləri zaman haqqı bildikləri üçün onların gözlərinin yaşla dolduğunu görürsən. Onlar (belə) deyirlər: “Ey Rəbbimiz! Biz iman gətirdik, bizi (haqqa) şahid olanlarla bir yerə yaz!

84. Rəbbimizin bizi əməlisaleh camaatla birlikdə (Cənnətə) daxil etməsini umduğumuz halda, biz nə üçün Allaha və bizə haqdan gələnə inanmayaq?!

85. Allah da bu sözlərinə görə onlara (ağacları) altından çaylar axan cənnətlər əta etdi. Onlar orada əbədi qalacaqlar. Yaxşı işlər görənlərin mükafatı budur!

86. Kafir olub ayələrimizi yalan hesab edənlər isə cəhənnəmlikdirlər!

87. Ey iman gətirənlər! Allahın sizə halal buyurduğu pak nemətləri (özünüzə) haram etməyin və həddi aşmayın. Doğrudan da, Allah həddi aşanları sevməz!

88. Allahın sizə verdiyi ruzidən halal və təmiz olanını yeyin. İnandığınız Allahdan qorxun!

89. Allah sizi bilmədən (səhvən) içdiyiniz andlarınıza görə cəzalandırmaz (məzəmmət, sorğu-sual etməz), lakin (bilə-bilə və ya qəsdən) içdiyiniz andları (pozmağa) görə cəzalandırar. Belə bir andın pozmağın kəffarəsi ailənizə yedirtdiyinizin orta hesabından on yoxsulu yedirdib doyurmaq, yaxud geyindirmək, yaxud da bir kölə azad etməkdir. Bunları etməyə imkanı olmayan şəxs üç gün (dalbadal) oruc tutmalıdır. Bu, içdiyiniz andların kəffarəsidir.

Bununla belə, andlarınızı qoruyun (onları pozmaqdan çəkinin). Allah ayələrini sizə belə izah edir ki, bəlkə, şükür edəsiniz!

90. Ey iman gətirənlər! Şərab da (içki də), qumar da, bütlər də, fal oxları da Şeytan əməlindən olan murdar bir şeydir. Bunlardan çəkinin ki, bəlkə, nicat tapasınız!

91. Şübhəsiz ki, Şeytan içki və qumarla aranıza ədavət və kin salmaqdan və namaz qılmaqdan ayırmaq istər. Artıq bu işə son qoyacaqsınızmı?

92. Allaha və Peyğəmbərə itaət edin. Əgər (itaətdən) boyun qaçırsanız, bilin ki, Peyğəmbərimizin vəzifəsi yalnız açıq bir təbliğdir (Quranı açıq-aydın təbliğ etməkdir).

93. İman gətirib yaxşı işlər görənlərə pis əməllərdən çəkinib iman gətirdikləri, saleh əməllər etdikləri, sonra pis əməllərdən çəkinib iman gətirdikləri, sonra yenə də pis əməllərdən çəkinib yaxşı işlər gördükləri təqdirdə, (haram edilməmişdən əvvəl) daddıqları (yeyib içdikləri) şeylərdən ötrü günah tutulmaz. Allah yaxşı iş görənləri sevər!

94. Ey iman gətirənlər! Allah Özünü görmədən (gizlində) Ondan qorxanları ayırd etmək (xalqa bildirmək) üçün sizi (ehramda ikən) əllərinizin və mizraqlarınızın çata biləcəyi (azacıq) bir ovla imtahan edəcəkdir. Bundan sonra həddi aşanı (ov edəni) şiddətli bir əzab gözləyir!

95. Ey iman gətirənlər! Ehramda olarkən ovu (əti yeyilən heyvanları) öldürməyin. Sizdən ovu qəsdən öldürən hər bir kəsin boynuna cəza və ya kəffarə düşür. Onun cəzası içərinizdən olan iki ədalətli şəxsin hökmü ilə öldürdüyünə bənzər (onun qiymətinə bərabər) bir heyvanı Kəbəyə çatası (Kəbənin yaxınlığında kəsilib oradakı yoxsullara paylanacaq) qurban etmək, kəffarəsi isə, gördüyü

işin zərərini, acısını dadsın deyə, (öldürdüyü heyvanın dəyəri müqabilində) yoxsullara yedirtmək, yaxud ona bərabər (hərəsi üçün bir gün olmaq şərtilə yedirəcəyi yoxsulların sayı qədər) oruc tutmaqdır. Allah keçmişdə olanları bağışlamışdır. Hər kəs bundan sonra belə bir iş görsə, Allah ondan intiqam alar. Allah yenilməz qüvvət sahibi, intiqam sahibidir!

96. Sizin üçün bir dolanacaq vasitəsi olsun deyə, (ehramda ikən) dəniz ovu və onu yemək sizə də, yolçulara (səfərdə olanlara) da halal edildi. Ehramda olduğunuz müddətdə isə quruda ov etmək sizə haram buyuruldu. Hüzuruna toplanacağınız Allahdan qorxun!

97. Allah Beytülhəram (müqəddəs ev) olan Kəbəni haram ayı (zülhiccəni), (Kəbəyə gətirilən) boyunları bağsız və bağlı (boyunlarına nişan taxılmamış və taxılmış) qurbanları insanların (dini və dünyəvi işlərinin) düzəlib sahmana düşməsi üçün bir yol müəyyən etdi. Bu ona görədir ki, Allahın göylərdə və yerdə nə varsa (hamısını) bilməsini, özü də Allahın hər şeyi (layiqincə) bilən olmasını siz də biləsiniz!

98. Bilin ki, Allahın əzabı şiddətlidir və Allah bağışlayandır, rəhm edəndir!

99. Peyğəmbərin üzərinə düşən vəzifəsi ancaq (Allahın əmrlərini insanlara) təbliğ etməkdir. Allah üzə çıxartdıqlarınızı və gizlətdiklərinizi (hamısını) bilir!

100. (Ya Rəsulum!) De: “(Ey insan!) Murdar (haram) şeyin çoxluğu xoşuna gəlsə belə, murdarla təmiz (haramla halal) bir ola bilməz”. Ey ağıl sahibləri, Allahdan qorxun ki, nicat tapasınız.

101. Ey iman gətirənlər! Sizə bəlli olunca qanınızı qaraldacaq şeylər barəsində soruşmayın. Əgər onlar haqqında Quran nazil edildikdə soruşsanız, onlar sizə aydın olar. (Lakin pis vəziyyətdə qalar və

kədərlənərsiniz). Allah onları (indiyə qədər verdiyiniz bu cür sualları) bağışladı. Allah bağışlayandır, həlimdir! (Bəndələrinə əzab verməkdə tələsən deyildir!)

102. Sizdən əvvəl bir tayfa (belə lüzumsuz şeyləri) soruşmuş, sonra da buna görə (onlara aid olan hökmləri inkar edib yerinə yetirmədikləri üçün) kafir olmuşdu.

103. Bəhirə, saibə, vəsilə və haminin heç birisini Allah (sizin üçün müəyyən edib) qanuni buyurmamışdır. Lakin kafirlər Allaha qarşı yalan uydururlar. Onların (kafirlərə uyan camaatın) əksəriyyəti isə (bu cür iddiaların Allaha qarşı böhtan, iftira olduğunu) dərk etmirlər.

104. Onlara: "Allahın nazil etdiyinə və Peyğəmbərə tərəf gəlin!" – deyildiyi zaman: "Atalarımızın getdiyi yol bizə yetər", - deyə cavab verirlər. Bəs ataları heç bir şey bilməyib doğru yolda deyildilərsə necə?!

105. Ey iman gətirənlər! Nəfslərinizi qorumaq sizin borcunuzdur. Siz doğru yolda olsanız, (haqq yoldan) azanlar sizə heç bir zərər yetirə bilməzlər. Hamınızın axır dönüşü Allahadır. Allah etdiyiniz əməllər barəsində sizə xəbər verəcəkdir!

106. Ey iman gətirənlər! Sizlərdən hər hansı birinizi ölüm haqladıqda vəsiyyət vaxtı aranızdan iki ədalətli şəxsi, səfərdə olduğunuz zaman başınıza ölüm müsibəti gəldikdə isə özünüzdən (müsəlman) olmayan iki nəfəri şahid tutun. Əgər (bu qeyri-müsəlman şahidlərin doğruluğuna) şübhə etsəniz, namazdan (əsr, ikindi namazından) sonra hər ikisini tutub saxlayın və onları: "Andımızı qohumlarımıza belə heç bir qiymətə satmarıq (qohumlarımızın lehinə belə yalandan şəhadət verməri) və Allahın şahidliyini gizlətmərik. Yoxsa, şübhəsiz ki, günahkarlardan olarıq", - deyə Allaha and içdirin!

107. Əgər onların (bu qeyri-müsəlman şahidlərin yalan yerə and içmək və yalandan şəhadət verməklə) günah qazandıqları bəlli olsa, o zaman onların yerini (həmin şahidlər tərəfindən) haqsızlığa məruz qalmış (varislərdən ölənə) daha yaxın (mirası almağa daha layiq) olan başqa iki nəfər tutar. Onlar: "Həqiqətən, bizim şahidliyimiz onların hər ikisinin şahidliyindən daha doğrudur. Biz (yalandan and içib) həddi aşmadıq. Əks təqdirdə, biz şübhəsiz ki, zalımlardan olarıq", - deyə Allaha and içərlər.

108. Bu (hökm) onların (əvvəlki şahidlərin) şəhadəti olduğu kimi vermələri və andlarının sonradan başqa andlarla rədd edilməsindən qorxmaları üçün daha münasib bir üsuldur. Allahdan qorxun və (Onu) eşidin. Allah fasiq qövmü doğru yola yönəltməz!

109. Allah peyğəmbərləri toplayacağı gün (qiyamət günü) belə buyuracaq: "(Ümmətlərinizi Mənim əmrimə tabe olmağa dəvət etdiyiniz zaman) sizə nə cavab verildi?" Onlar isə (təvazökarlıq edib): "Biz heç bir şey bilmirik. Həqiqətən, qeybləri (görünməyənləri) bilən ancaq Sənsən! – deyə cavab verəcəklər.

110. (Ya Rəsulum!) Xatırla ki, o gün (qiyamət günü) Allah (İsaya) belə buyuracaq: "Ya Məryəm oğlu İsa! Sənə və anana nemətimi yadına sal. O zaman səni müqəddəs ruhla qüvvətləndirmişdim. Sən beşikdə olanda da, yetkin çağında da adamlarla danışırdın. Sənə kitabı (yazıb-oxumağı), hikməti, Tövratı və İncili öyrətmişdim. O zaman sən Mənim iznimlə palçıqdan quşa bənzər bir şey düzəldib ona üfürürdün, o da Mənim iznimlə quş olurdu. Sən Mənim iznimlə anadangəlmə kora və cüzamlı xəstəyə şəfa verir və Mənim iznimlə ölüləri (qəbirdən çıxardıb) dirildirdin. Sən İsrail oğullarına açıq-aşkar möcüzələr gətirdiyin zaman Mən (onların bəlasını) səndən dəf etmişdim (səni öldürmək istədikdə onlara mane olmuşdum). Onlardan küfrə batanlar isə belə demişdilər: "Bu, açıq-aydın sehrdən başqa bir şey deyildir!"

111. Xatırla ki, o zaman həvarilərə (İsanın on iki əshabəsinə): “Mənə və peyğəmbərimə iman gətirin!” – deyə əmr etmişdim. Onlar isə: “Bizim (Sənə və peyğəmbərinə) itaətkar kəslər olmağımıza şahid ol!” – deyə cavab vermişdilər.

112. Onu da xatırla ki, o zaman həvarilər demişdilər: “Ya Məryəm oğlu İsa! Rəbbin bizə göydən (yeməklə dolu) bir süfrə göndərə bilərmi? O (İsa):” Əgər möminsinizsə, Allahdan qorxun!” – demişdi.

113. (Həvarilər) demişdilər: “Biz istəyirik ki, ondan yeyək, ürəklərimiz sakit olsun, sənin bizə doğru dediyini bilək və ona (süfrənin göydən enməsi möcüzəsini görməklə sənin peyğəmbərliyinin həqiqiliyinə) şahidlik edənlərdən olaq”.

114. Məryəm oğlu İsa dedi: “Ya Allah , ey bizim Rəbbimiz! Bizə göydən bir süfrə nazil et ki, o bizim həm birincimiz, həm də axırıncımız (həm bizim, həm də bizdən sonra gələnlər) üçün bir bayram və Səndən (Sənin qüdrətindən) bir möcüzə olsun. Bizə ruzi ver ki, Sən ruzi verənlərin ən yaxşısısan!”

115. Allah buyurdu: “Mən onu sizə, əlbəttə, nazil edərəm. Lakin ondan sonra sizlərdən kim küfrə düşərsə, ona aləmlərdə olanlardan (bəşər övladından, zəmanə əhlindən) heç kəsə verməyəcəyim bir əzab verərəm!”

116. (Ya Rəsulum!) Xatırla ki, o zaman (qiyamət günü) Allah belə buyuracaq: “Ya Məryəm oğlu İsa! Sənmi insanlara: “Allahla yanaşı, məni və anamı da özünüzə tanrı bilin!” – demişdin? “(İsa cavabında) deyəcək:” Sən pak və müqəddəssən! Haqqım çatmayan bir şeyi demək mənə yaraşmaz. Əgər bunu mən demiş olsaydım, Sən onu mütləq bilərdin. Sən mənim ürəyimdə olan hər şeyi bilirsən, mən isə Sənin zatından ola bilmərəm. Şübhəsiz ki, qeybləri bilən ancaq Sənsən!

117. Mən onlara yalnız Sənin mənə etdiyin əmri çatdırıb belə demişəm: “Mənim də, sizin də Rəbbiniz olan Allaha ibadət edin!” Nə qədər ki, onların arasında idim, onlara şahid mən idim (onları belə nalayiq hərəkətlər etməyə qoymurdum). Sən məni (göyə qaldırıb dərgahına) qəbul etdikdən sonra onlara nəzarətçi Özün oldun. Yalnız Sən hər şeyə şahidsən!

118. Əgər onlara əzab versən, şübhə yoxdur ki, onlar Sənin qullarındır. Əgər onları bağışlasan, yenə şübhə yoxdur ki, Sən yenilməz qüvvət sahibi, hikmət sahibisən” (İstədiyin bəndəyə əzab verməyə, istədiyini bağışlamağa və hər hansı bir məsələni həkimanə həll etməyə qadir olan ancaq Sənsən!)

119. Allah buyurdu: “Bu (qiyamət günü) elə bir gündür ki, düz danışanlara düzlükləri fayda verər. Onları (ağacları) altından çaylar axan cənnətlər gözləyir. Onlar orada əbədi qalacaqlar. Allah onlardan, onlar da Allahdan razıdırlar. Bu, (möminlər üçün) böyük qurtuluşdur (uğurdur)!”

120. Göylərin, yerin və onlarda olan hər şeyin hökmü Allaha məxsusdur. Allah hər şeyə qadirdir!

## .6.
## əl-Ənam (Davar) surəsi

**(Məkkədə nazil olmuşdur, 165 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Göyləri və yeri (yoxdan) xəlq edən, zülmətləri və nuru yaradan Allaha həmd (şükür və tərif) olsun! (Bu qüdrəti gördükdən) sonra kafir olanlar yenə (bütləri) öz Rəbbinə tay tuturlar.

2. Sizi palçıqdan yaradan, sonra da (sizin üçün) bir əcəl (ölüm vaxtı) müəyyən edən Odur. (Allahın) yanında məlum bir əcəl də (bütün

ölülərin diriləcəyi qiyamət günü) vardır. (Bütün bunlardan) sonra siz yenə də şübhə edirsiniz!

3. Göylərdə də, yerdə də (ibadətə layiq olan) yalnız O Allahdır! Sizin gizlində də, aşkarda da nəyiniz varsa, tutduğunuz (bütün) əməlləri də O bilir!

4. Onlara (Məkkə müşriklərinə) Rəbbinin ayələrindən elə bir ayə gəlməz ki, onlardan üz çevirməsinlər!

5. Onlara haqq olan (Quran) gəldiyi zaman onu yalan hesab etdilər. (Müşriklərin) məsxərəyə qoyduqlarının (Quranın müsəlmanların qalib gələcəyi, müşriklərin məğlub olacağı və axirətdə şiddətli əzab görəcəkləri barəsindəki) xəbərləri onlara gəlib çatacaq!

6. Məgər özlərindən əvvəl neçə-neçə nəsilləri (ümmətləri) məhv etdiyimizi görmədilərmi? Onlara yer üzündə sizə (məkkəlilərə) vermədiyimiz imkanlar (qüvvət və sərvət) vermişdik. Göydən onlara bol yağış göndərmiş, (evlərin, saraylarının və bağçalarının) altından çaylar axıtmışdıq. Biz onları günahlarına görə məhv etdik və onlardan sonra başqa yeni bir nəsil (ümmətlər) yaratdıq.

7. (Ya Rəsulum!) Əgər sənə kağız üzərində (yazılı) bir kitab nazil etsəydik və onlar əlləri ilə ona toxunmuş olsaydılar belə, kafirlər yenə də: “Bu, açıq-aydın bir sehrdir”, - deyərdilər.

8. Onlar dedilər: “Məgər ona (Həzrəti–Muhəmmədə peyğəmbərliyinin həqiqi olmasını təsdiq edən) bir mələk endirilməli deyildimi?” Əgər Biz bir mələk göndərsəydik, iş bitmiş olar (iman gətirməyəcəkləri üçün onlar məhv edilər) və (tövbə etmək üçün) onlara bir an belə möhlət verilməzdi.

9. Əgər Biz onu (peyğəmbəri) mələk etsəydik (və ya kafirlərə mələklərdən bir peyğəmbər göndərsəydik), yenə də onu bir insan

qiyafəsində göndərər və onları (göndərilənin mələk deyil, özləri kimi bir adam olması barəsində) bir daha düşdükləri şübhəyə salardıq.

10. Əlbəttə, səndən əvvəlki peyğəmbərlər də məsxərəyə qoyulmuşdular. Lakin məsxərəyə qoyanları məsxərəyə qoyduqlarının özü məhv etdi.

11. (Ya Rəsulum!) De: “Yer üzünü dolaşın və sonra görün ki, (peyğəmbərlərə) yalançı deyənlərin aqibəti necə oldu?”

12. De: “Göylərdə və yerlərdə olanlar kimindir?” De: “Allahındır!” O Öz-özünə rəhmli olmağı yazmışdır. (Bəndələrinə qarşı rəhmli olmağı Özü üçün əzəldən O Müəyyən etmişdir). Olacağına heç bir şübhə edilməyən qiyamət gününə sizi O toplayacaqdır. Özlərinə zərər vuranlar, əlbəttə, iman gətirməzlər!

13. Gecədə və gündüzdə mövcud olan hər bir şey Onundur. O, (hər şeyi) eşidəndir, biləndir.

14. (Ya Rəsulum!) De: “Mən göyləri və yeri yaradan, hamısını bəsləyib Özü bəslənməyən (hamını yedirdib Özü yeməkdən uzaq olan) Allahdan başqasını özümə Rəbbmi edərəm?!” De: “Mənə ilk müsəlman olmaq əmr edildi və müşriklərdən olma!” (deyə buyuruldu).

15. De: “Əgər mən Rəbbimə asi olsam, böyük günün (qiyamət gününün) əzabından qorxaram”.

16. O gün kim əzabdan qurtulsa, şübhəsiz ki, (Allah) ona mərhəmət əta etmişdir. Bu isə açıq-aydın qurtuluşdur (uğurdur).

17. Əgər Allah sənə bir sıxıntı versə, (səni ondan) Allahdan başqa heç kəs qurtara bilməz. Əgər (Allah) sənə bir xeyir yetirsə (heç kəs Ona mane ola bilməz). Çünki O, hər şeyə qadirdir!

18. O Öz qulları üzərində hakimi-mütləqdir. O, hikmət sahibidir, (hər şeydən) xəbərdardır!

19. De: “Şahidlik baxımından nə daha böyükdür? Mənimlə sizin aranızda Allah şahiddir. Bu Quran mənə sizi və ona (gələcəkdə) yetişəcək kimsələri (qiyamətə qədər) xəbərdarlıq edib qorxutmağım üçün vəhy olundu. Məgər siz Allahla yanaşı başqa tanrılar olduğuna şahidlik edirsiniz?” De “O, tək bir Tanrıdır. Mən sizin Ona şərik qoşduqlarınızdan (bütlərdən) tamamilə kənaram!”

20. Kitab verilmiş şəxslər onu (Muhəmməd peyğəmbəri) öz oğullarını tanıdıqları kimi tanıyırlar. Özlərinə zərər edənlər, əlbəttə, iman gətirməzlər!

21. Allaha iftira yaxan və Onun ayələrini yalan hesab edən kəsdən daha zalım kim ola bilər?! Şübhəsiz ki, zalımlar nicat tapmazlar!

22. O gün (qiyamət günü) onların hamısını (bir yerə) toplayacaq, sonra (Allaha) şərik qoşanlara deyəcəyik: “(Tanrı olduqlarını) iddia etdiyiniz şərikləriniz (bütləriniz) haradadır?!

23. Onların: “Rəbbimiz Allaha and olsun ki, biz müşrik deyildik!” deməkdən başqa heç bir çarələri qalmayacaq.

24. Gör onlar özlərinə qarşı necə yalan deyirlər. Özlərindən uydurub düzəltdikləri bütlər də onlardan qeyb olacaq!

25. (Müşriklərin) içərisində səni dinləyənlər də vardır. Lakin (müsəlmanlara qarşı düşmən hərəkətlərinə görə) onu (Quranı) başa düşməsinlər deyə, onların ürəklərinə pərdə çəkdik, qulaqlarına da karlıq (ağırlıq) verdik. Onlar hər hansı bir möcüzə görsələr, yenə də ona inanmazlar. Hətta yanına gəldikdə səninlə höcətləşərlər. Kafir olanlar isə: ”Bu, qədimlərin əfsanələrindən (nağıllardan) başqa bir şey deyildir!, - deyərlər.

26. (Müşriklər özlərinə uyanları Quranı) dinləməyi qadağan edər, özləri də onlardan uzaq durarlar. Onlar (başqalarını deyil), yalnız özlərini həlak edər, lakin (bunun) fərqinə varmazlar.

27. (Ya Rəsulum!) Gətirilib od üstündə saxlandıqları zaman sən onların: “Kaş ki, biz dünyaya qaytarılıb Rəbbimizin ayələrini yalan hesab etməyəydik və möminlərdən olaydıq!” – demələrini görəydin!

28. Xeyr, əvvəlcə (ürəklərində) gizlətdikləri (küfr, nifaq və çirkin əməllər) onların qabağına çıxdı. Əgər geri qaytarılsaydılar, yenə də onlar qadağan olunduqları şeyə (küfr və günaha) əl qatardılar. Onlar, şübhəsiz ki, yalançıdırlar!

29. (Əgər onlar dünyaya qaytarılsaydılar) yenə də: “Həyat yalnız bu dünyadakı həyatımızdan ibarətdir. Bizlər bir daha dirilən deyilik!” – deyərdilər.

30. Sən onları (sorğu-sual üçün) Rəbbinin hüzurunda saxlandıqları zaman görəydin! Allah onlara (mələklər vasitəsilə) belə buyuracaq: “Bu, (öləndən sonra dirilmək, sorğu-sual) haqq deyilmi? Onlar: ”Bəli, Rəbbimizə and olsun (ki, bu, haqdır!)” – deyə cavab verəcəklər. (Allah) buyuracaq: “Elə isə etdiyiniz küfrlərə görə dadın əzabı!”.

31. Allahın hüzurunda duracaqlarını inkar edən kimsələr, həqiqətən, ziyana uğramışlar. Belə ki, saat (qiyamət vaxtı) qəflətən başlarının üstünü aldığı zaman onlar günahlarını dallarında daşıyaraq deyəcəklər: “Dünyadakı təqsirlərimizə görə vay halımıza!” Bir baxın, daşıdıqları şey (günah yükü) necə də pisdir!

32. Dünya həyatı oyun və əyləncədən başqa bir şey deyildir. Axirət yurdu müttəqilər üçün daha xeyirlidir. Məgər dərk etmirsiniz?

33. Bilirik ki, onların (Quran barəsində) dedikləri söz səni çox kədərləndirir. Həqiqətdə isə onlar səni yalançı hesab etmirlər

(ürəklərində sənin həqiqi peyğəmbər olduğunu yaxşı bilirlər). Ancaq o zalımlar (müşriklər) Allahın ayələrini inadla inkar edirlər.

34. Səndən əvvəl də peyğəmbərlər təkzibə məruz qalmışdılar. Lakin onlar təkzib olunduqları və əziyyət verildikləri şeylərə dözdülər. Nəhayət, Bizimköməyimiz onlara yetdi. Allahın sözlərini (peyğəmbərlərə verdiyi vədləri) dəyişə biləcək heç bir kimsə yoxdur! Doğrudan da, peyğəmbərlərə aid xəbərlərin bəzisi sənə gəlib çatdı.

35. Onların (haqq dindən) üz döndərməsi sənə ağır gəlirsə, yerdə (yerin dibinə gedən) bir lağım və ya göyə çıxacaq bir nərdivan tapıb onlara (Bizim sənə verdiyimizdən daha yaxşı) bir möcüzə gətirə bilərsənsə, durma gətir! (Allah sənə bu qüdrəti verməmişdir, hətta gətirsən belə, yenə onu sehr hesab edəcəklər). Allah istəsəydi, onları yığıb doğru yola salardı. Elə isə (Allahın insanların zorla deyil, könüllü surətdə iman gətirmək istədiyini) bilməyənlərdən olma!

36. (Sənin dəvətini) ancaq cani-dildən eşidənlər qəbul edər. Ölüləri də Allah dirildər. Sonra onlar Allahın hüzuruna qaytarılar.

37. (Məkkə müşrikləri) dedilər: “Məgər ona (Peyğəmbərə) Rəbbindən bir möcüzə endirilməli deyildimi?” De: “Allah möcüzə endirməyə qadirdir. Lakin onların çoxu (belə bir möcüzə göndərildikdə onu inkar edəcəkləri təqdirdə başlarına gələcək müsibət və fəlakəti) bilməz!

38. Yerdə gəzən elə bir heyvan, qanadları (iki qanadı) ilə uçan elə bir quş yoxdur ki, sizin kimi ümmətlər olmasın. (Onlar da sizin kimi bir zümrədir. Allah onlara da ruzi vermiş, əcəllərini əvvəlcədən müəyyənləşdirmişdir. Onlar da öz qabiliyyətlərinə görə Allahın vəhdaniyyətini mədh edib, şəninə tərif deyirlər). Biz Kitabda (Quranda) heç bir şeyi nəzərdən qaçırmadıq (əskiltmədik). Sonra onlar (bütün canlılar, bütün məxluqat) Rəbbinin hüzuruna cəm ediləcəkdir.

39. Ayələrimizi təkzib edənlər zülmət içində (küfr və cəhalətdə) qalmış karlar və lallardır. Allah istədiyini (haqq yoldan) azdırar, istədiyini isə düz yola yönəldər.

40. (Müşriklərə) de: “Mənə deyə bilərsinizmi? Sizə Allahın əzabı gəlsə və ya qiyamət başınızın üstünü alsa, Allahdan başqasına dua edib yalvaracaqsınızmı? Əgər doğrudanışanlarsınızsa (deyin görək)!”

41. Xeyr, yalnız Ona (Allaha) dua edib yalvaracaqsınız. O əgər istəsə, yalvardığınız bəlanı aradan qaldırar, siz də Ona şərik qoşduğunuz bütlərinizi unudarsınız. (Buna görə də başınıza bir bəla gəlməmişdən əvvəl Allaha ibadət edin. Ona heç bir şərik qoşmayın!)

42. Səndən əvvəl də ümmətləri (peyğəmbərləri yalançı hesab etdikləri üçün) müsibət və fəlakətə düçar etdik ki, (Allaha) yalvarsınlar.

43. Barı, əzabımız onların başlarının üstünü alanda yalvaraydılar. Lakin (inadları üzündən) qəlbləri sərtləşdi və Şeytan da onlara etdikləri əməlləri süslü göstərdi.

44. (Kafirlərə) edilmiş xəbərdarlığı unutduqları zaman (küfrlərini daha da artırmaq məqsədilə) hər şeyin (bütün nemətlərin) qapılarını onların üzünə açdıq. (Kafirlər) özlərinə verilən nemətlərə sevindikləri vaxt onları qəflətən yaxaladıq və onlar (hər şeydən) məhrum oldular.

45. Artıq o zalım tayfanın kökü kəsildi. Həmd olsun aləmlərin Rəbbi Allaha!

46. (Ya Rəsulum!) De: “Bir deyin görüm, əgər Allah sizin qulaqlarınızı və gözlərinizi əlinizdən alsa, ürəklərinizə möhür vursa, onları sizə Allahdan qeyri hansı tanrı qaytara bilər?” Gör Biz ayələrimizi onlara necə izah edirik, sonra onlar ondan gör necə üz döndərirlər.

47. De: “Bir deyin görüm, əgər Allahın əzabı sizə qəflətən və ya aşkar gəlsə, zalım tayfadan başqası həlak edilərmi?”

48. Biz peyğəmbərləri ancaq müjdə verənlər və (əzabla) qorxudanlar sifətilə göndərdik. İman gətirib yaxşı işlər görənlərin heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər!

49. Ayələrimizi təkzib edənlərə isə qazandıqları günahlara görə əzab üz verəcəkdir!

50. De: “Mən sizə demirəm ki, mənim yanımda Allahın xəzinələri vardır. Mən qeybi bilmirəm və sizə də demirəm ki, mən mələyəm. Mən yalnız özümə gələn vəhyə tabe oluram”. De: “Kor görənlə bir olarmı? Məgər düşünmürsünüz?”

51. Rəbbinin hüzuruna cəm ediləcəklərindən qorxanları onunla (Quranla) xəbərdar et. Onların Allahdan başqa heç bir hamisi və havadarı yoxdur. Bəlkə də, onlar (bununla) pis əməllərdən çəkinsinlər!

52. (Ya Rəsulum!) Rəbbinin camalını (rizasını) diləyərək səhər-axşam Ona dua edənləri yanından qovma. Onların əməllərini sənə, sənin əməllərinin isə onlara heç bir dəxli yoxdur. Buna görə də (onları qovsan) zalımlardan olarsan.

53. Beləliklə, onları (insanları) bir-birilə imtahana çəkdik ki, onlar desinlər: “Əcəba, Allahın aramızda lütfünü görüb bəxş etdiyi kimsələr bunlarmıdır? Məgər Allah şükür edənləri daha yaxşı tanıyan deyildirmi?”

54. Ayələrimizə iman gətirənlər yanına gəldikdə onlara de: “Sizə salam olsun! Rəbbiniz Özü-Özünə rəhmli olmağı yazmışdır (bəndələrinə qarşı rəhmli olmağı əzəldən Özü Özü üçün müəyyən etmişdir) ki, sizlərdən hər kəs pis iş görsə, sonra tövbə edib düzəlsə

(Allah onun günahından keçər). Şübhəsiz ki, Allah bağışlayandır, rəhm edəndir!"

55. Biz ayələrimizi belə müfəssəl izah edirik ki, günahkarların yolu açıq-aydın bilinsin.

56. (Ya Rəsulum) De: "Sizin Allahdan qeyri tapındığınız bütlərə ibadət etmək mənə qadağan edilmişdir". De: "Mən sizin nəfsinizin istəklərinə əsla uymaram. Belə ola biləcəyi təqdirdə mən (haqq yoldan) azar və doğru yola yönəlmişlərdən olmaram!"

57. De: "Mən Rəbbimdən açıq-aydın bir dəlilə (Qurna) istinad edirəm. Siz isə onu yalan hesab etdiniz. Sizin tələm-tələsik istədiyiniz (ilahi əzab) məndə (mənim əlimdə) deyildir. Hökm ancaq Allahındır. Haqqı yalnız O bəyan edər. O (haqla batili) ayırd edənlərin ən yaxşısıdır!"

58. De: "Əgər təcili istədiyiniz (əzab) mənim əlimdə olsaydı, iş mənimlə sizin aranızda əlbəttə, bitmiş olardı (sizi dərhal məhv edərdim), Allah zalımları daha yaxşı tanıyandır!"

59. Qeybin açarları (Allahın) yanındadır. Onları ancaq O (Allah) bilir. (Allah) suda və quruda nə varsa bilir. Yerə düşən elə bir yarpaq yoxdur ki, (Allah) onu bilməsin. Yerin zülmətləri içində elə bir toxum, (kainatda) yaş-quru elə bir şey yoxdur ki, açıq-aydın kitabda (lövhi-məhfuzda) olmasın!

60. Sizi gecələr yuxuya daldıran (bu minvalla sizi bir növ ölüm halına salıb hiss-həyəcandan məhrum edən), gündüz isə nə etdiyinizi (nə qazandığınızı) bilən Odur. Sonra O sizi gündüz (yuxudan) oyandırır ki, müəyyən olunmuş vaxt (əcəl) gəlib yetişsin. Sonra onun hüzuruna qayıdacaqsınız və sonra da O sizə etdiyiniz əməllər barəsində xəbər verəcəkdir.

61. (Allah) Öz bəndələri üzərində hakimi-mütləqdir. O sizə (yaxşı və pis əməllərinizi yazan, sizi Şeytandan qoruyan) gözətçi mələklər göndərir. Nəhayət, birinizin əcəli gəlib çatdıqda onun canını (göndərdiyimiz) mələklər alar. Onlar (öz vəzifələrində) heç bir əyər-əskikliyə yol verməzlər!

62. Sonra insanlar Allahın – özlərinin həqiqi ixtiyar sahibinin hüzuruna qaytarılar. Bilin ki, hökm Onundur (Allahındır) və O, ən tez haqq-hesab çəkəndir!

63. (Ya Rəsulum!) De: "Gizlində (Allaha) dua edib:" Əgər bizi suyun və qurunun zülmətindən qurtarsan, əlbəttə, şükür edənlərdən olarıq", - deyə yalvardığınız zaman sizləri bunlardan xilas edən kimdir?"

64. De: "Sizi ondan xilas edən və hər bir qəmdən qurtaran Allahdır. (Bütün bunlardan) sonra siz yenə də (Ona) şərik qoşursunuz?"

65. De: "Allah başınızın üstündən və ayaqlarınızın altından (göydən və yerdən) sizə əzab göndərməyə, sizi dəstələr halında qarışdırmağa və birinizə digərinizin zorunu daddırmağa qadirdir!" Gör ayələrimizi onlara nə cür izah edirik ki, bəlkə, başa düşsünlər!

66. (Ya Rəsulum!) Sənin camaatın onu (Quranı), haqq olduğu halda, yalan hesab etdi. (Onlara) de: "Mən sizin vəkiliniz deyiləm!"

67. Hər bir xəbərin (Quranda sizə xəbər verdiyim əzabın Allah tərəfindən təqdir olunmuş) müəyyən bir vaxtı vardır və siz (onu) biləcəksiniz.

68. (Ya Rəsulum!) Ayələrimizi istehza edənləri gördüyün zaman onlar söhbəti dəyişənə qədər onlardan üz çevir. Əgər Şeytan (bu qadağan əmrini) sənə unutdursa, xatırlayandan sonra o zalım tayfa ilə bərabər oturma.

69. Müttəqilərə onların (iman gətirməyənlərin) əməllərindən heç bir günah gəlməz. Lakin bu, bir öyüddür ki, bəlkə, (kafirlər onun təsirilə) pis əməllərdən çəkinsinlər.

70. Dinlərini oyun və əyləncə sayanları, dünya həyatının məğrur etdiyi (və ya aldatdığı) şəxsləri boşla getsinlər. (Onlara Quranı) xatırlat ki, heç kəs qazandığı əmələ görə özünü həlaka düçar etməsin. Allahdan başqa onun nə bir dostu var, nə də bir şəfaətçisi (havadarı). O, hər hansı bir fidyəni versə belə, qəbul olunmaz. Onlar etdikləri əməllərə görə əzaba düçar olanlardır. Onları küfr etdiklərinə görə qaynar su (cəhənnəm içkisi həmim) və şiddətli əzab gözləyir!

71. De: "Biz Allahı qoyub bizə nə bir xeyir, nə də bir zərər verə bilməyən bütlərəmi tapınacaq və Allah bizi düzgün yola yönəltdikdən sonra yer üzündə şaşqın dolaşarkən şeytanların azdırdığı adam kimi geriyəmi (küfrə) döndəriləcəyik? Halbuki dostları onu: "Bizə tərəf gəl!" – deyərək haqq yola çağırırdılar! De: "Allahın hidayəti (islam dini) doğru yoldur. Bizə aləmlərin Rəbbinə təslim olmaq əmr edilmiş,

72. Həmçinin: "Namaz qılın, Allahdan qorxun, hüzuruna toplanacağınız məhz Odur!" (deyə buyurulmuşdur)".

73. Göyləri və yeri haqq olaraq yaradan Odur. Onun: "Ol!" deyəcəyi gün (hər şey) dərhal olar. Onun sözü haqdır. Surun (İsrafilin surunun) çalınacağı gün hökm Onundur. Qeybi və aşkarı bilən də Odur. O, hikmət sahibidir, (hər şeydən) xəbərdardır!

74. (Ya Rəsulum) Xatırla ki, bir zaman İbrahim atası Azərə demişdi: "Sən bütləri tanrılarmı qəbul edirsən? Mən səni və sənin tayfanı açıq-aydın zəlalət içində görürəm!"

75. Beləcə, İbrahimə göylərin və yerin mülkünü (səltənətini, oradakı qəribəlikləri və gözəllikləri, onların Allah qüdrəti ilə yaradılmasını) göstərdik ki, tam qənaətlə inananlardan olsun!

76. Gecə qaranlığı (onu) bürüdükdə o, bir ulduz görüb: “Bu mənim Rəbbimdir!” dedi. (Ulduz) batdıqda isə: “Mən batanları sevmirəm”, söylədi.

77. (Sonra) doğan ayı görüb: “Bu mənim Rəbbimdir!” – dedi. (Ay) batdıqda isə: “Doğrudan da, əgər Rəbbim məni doğru yola yönəltməsəydi, mən zəlalətə düşənlərdən olardım”, - söylədi.

78. (Daha sonra) doğan günəşi görüb: “Bu mənim Rəbbimdir, bu, daha böyükdür!” – dedi. (Günəş) batdıqda isə dedi: “Ey camaatım, mən, həqiqətən, sizin Allaha şərik qoşduqlarınızdan (bütlərdən, səma cisimlərindən) uzağam!

79. Mən, həqiqətən, batildən haqqa tapınaraq (dönərək) üzümü göyləri və yeri yaradana çevirdim. Mən (Allaha) şərik qoşanlardan deyiləm!”

80. Tayfası onunla (İbrahimlə) mübahisəyə girişdi. (İbrahim) dedi: “Allah məni doğru yola saldığı halda, siz Onun barəsində mənimlə mübahisə edirsiniz? Rəbbimin istədiyi hər hansı bir şey (bəla, müsibət) istisna olmaqla, mən sizin Ona şərik qoşduğunuz bütlərdən qorxmuram. (Onlar mənə heç bir şey edə bilməzlər). Rəbbim hər şeyi elmlə (Öz əzəli elmi ilə) ehtiva etmişdir. Məgər düşünüb ibrət almırsınız?

81. Allahın sizə (ibadət edilməsi barədə) heç bir dəlil endirmədiyi bütləri Ona şərik qoşmaqdan qorxmadığınız halda, mən niyə sizin qoşduğunuz şəriklərdən qorxmalıyam? Əgər bilirsinizsə, (deyin görək) bu iki dəstədən hansı (qiyamət əzabından) əmin olmağa daha layiqdir?

82. İman gətirib imanlarını zülmə qatışdırmayanlar əmin-amanlıqdadırlar. Haqq yola yönəlmişlər də onlardır!

83. Bu bizim İbrahimə öz tayfasına qarşı verdiyimiz dəlildir. Biz istədiyimiz şəxsi dərəcə-dərəcə yüksəldərik. Şübhəsiz ki, Rəbbin hikmət sahibi, elm sahibidir.

84. Biz İshaqı və Yəqubu Ona əta etdik. Onların hər birini hidayətə (peyğəmbərliyə) çatdırdıq. Bundan əvvəl Nuhu və onun nəslindən olan Davudu, Süleymanı, Əyyubu, Yusifi, Musanı və Harunu da hidayətə qovuşdurmuşduq. Biz yaxşı iş görənləri (yaxşılıq edənləri) belə mükafatlandırırıq.

85. Zəkəriyyanı, Yəhyanı, İsanı, İlyası da (hidayətə çatdırdıq). Onların hamısı əməlisalehlərdən idi.

86. Biz, həmçinin İsmaili, Əlyəsəi, Yunisi və Lutu da (hidayətə qovuşdurduq) və onları aləmlərdən (özləri ilə bir dövrdə yaşayan bütün insanlardan) üstün tutduq.

87. Biz onların atalarından, nəsillərindən və qardaşlarından da (bir qismini hidayətə çatdırdıq), onları seçdik və düz yola yönəltdik.

88. Bu, Allahın haqq yoludur. Bəndələrindən istədiyini ona yönəldir. Əgər onlar (Allaha) şərik qoşsaydılar, etdikləri əməllər puça çıxardı.

89. Onlar Bizim kitab, hökm və peyğəmbərlik verdiyimiz kimsələrdir. Əgər (indi) bunlar (Qüreyş müşrikləri və başqa kafirlər) bu dəlilləri dansalar, Biz onlara həmin dəlilləri inkar etməyən bir tayfanı müvəkkil edərik (onların yerinə dəlillərimizi inkar etməyəcək bir zümrə gətirərik).

90. Onlar (adları çəkilən peyğəmbərlər) Allahın doğru yola yönəltdiyi kimsələrdir. Sən də onların haqq yolunu tutub get. De:

“Mən bunun (islam dinin təbliği) müqabilində sizdən bir əvəz istəmirəm. Bu (Quran) aləmlər (bütün bəşəriyyət) üçün yalnız bir moizədir (öyüd-nəsihətdir)”.

91. Onlar (yəhudilər): “Allah heç bir bəşərə bir şey (Quran) nazil etməmişdir”, - deməklə Allahı layiqincə qiymətləndirmədilər. De: “Musanın insanlara bir nur və hidayət olaraq gətirdiyi kitabı (Tövratı) kim nazil etmişdir? Siz onu vərəqlərə yazıb göstərir, bir çoxunu da gizlədirsiniz. (Əslində) siz (Quran vasitəsilə) özünüzün və atalarınızın bilmədiklərini öyrənmiş olursunuz. (Ya Rəsulum!) Sən: “Allah!” deyib çağır, sonra da onları burax ki, düşdükləri bataqlıqda oynaya-oynaya qalsınlar. (Özlərinin dedi-qodularında, pis işlərində və yaramaz əqidələrində davam etsinlər).

92. Bu (Quran) da mübarək (xeyir-bərəkəti daim, faydası çox), özündən əvvəlkiləri təsdiq edən bir kitabdır ki, onu sənə Məkkə əhlini və ətrafındakı insanları (Allahın əzabı ilə) qorxutmaq üçün nazil etmişik. Axirətə iman gətirənlər ona da iman gətirər, namazlarını da qoruyub saxlayarlar (vaxtlı-vaxtında qılarlar).

93. Allaha iftira yaxan, özünə heç bir vəhy olunmadığı halda: “Mənə də vəhy olunmuşdur, mən də Allahın nazil etdiyi (Quran) kimi bir kitab endirəcəyəm”, - deyən şəxsdən daha zalım kim ola bilər? Kaş sən zalımları ölüm əzabı içində çapalayan, mələklərin də (bu zaman) əllərini uzadıb: “Çıxarın canlarınızı! Siz bu gün Allaha qarşı nahaq sözlər danışdığınıza və Onun ayələrinə təkəbbür göstərdiyinizə görə alçaldıcı bir əzabla cəzalandırılacaqsınız!” – dediklərini görəydin!

94. Siz Bizim hüzurumuza ilk dəfə sizi yaratdığımız kimi tək-tənha, özü də sizə verdiyimiz (var-dövləti, əhli-əyalı) arxanızda (dünyada) qoyub gəlmisiniz. Artıq sizin (vaxtı ilə) öz aranızda Allahın şərikləri iddia etdiyiniz şəfaətçilərinizi görmürük. Artıq aranızdakı (rabitə)

qırılmış və (Allaha şərik) iddia etdikləriniz (bütlər) də sizdən (uzaqlaşıb) qeyb olmuşdur.

95. Şübhəsiz ki, toxumu da, çəyirdəyi də cücərdib çatladan, ölüdən diri, diridən də ölü çıxardan (ölü yumurtadan diri toyuq, diri toyuqdan ölü yumurta yaradan) Allahdır. Budur Allah! Axı siz Ondan (haqq olan Allahdan) nə cür döndərilirsiniz?

96. (Gecənin zülmətindən) səhəri yarıb çıxaran, gecəni bir istirahət vaxtı, günəşi və ayı (vaxt üçün) bir ölçü vasitəsi edən də Odur. (Bütün) bunlar yenilməz qüvvət sahibi, (hər şeyi) bilən Allahın təqdiridir (əzəli hökmüdür).

97. Suyun və qurunun zülmətində (yolunuzu) düz getmək üçün ulduzları sizin üçün yaradan da Odur. Biz bu ayələri anlayan bir camaat üçün bu cür ətraflı izah etdik.

98. Sizi tək bir nəfərdən (Adəmdən) yaradan da Odur. (Sizin üçün) bir qərar yeri (ana bətni, ata beli və ya yer üzü), bir də bir əmanət yeri (qəbir) vardır. Biz ayələrimizi anlayan bir camaat üçün belə müfəssəl bəyan etdik.

99. Göydən su (yağış) endirən Odur. Biz onunla hər bir bitkini yetişdirdik, yaşıl fidanlar göyərtdik, onlardan bir-birinə sarmaşmış (sünbül olmuş) dənələr çıxartdıq. Biz xurma ağacından, onun tumurcuğundan bir-birinə sarmaşmış salxımlar yetişdirdik. (Biz, həmçinin) üzüm bağları, bir-birinə bənzəyən və bənzəməyən zeytun və nar yetişdirdik. (Onlardan hər birinin) bar verdiyi vaxt meyvəsinə və onun yetişməsinə baxın. Şübhəsiz ki, bunda (Allahın Öz qüdrəti ilə yaratdığı bu şeylərdə) iman gətirən bir camaat üçün (Rəbbinizin varlığını sübut edən) dəlillər vardır.

100. Cinləri (Allah) yaratdığı halda, (kafirlər və cahillər) onları Allaha şərik qoşdular, (nəyə inandıqlarını, nə danışdıqlarını)

bilmədən (özlərindən) Onun üçün oğullar və qızlar uydurub düzəltdilər. Allah isə onların Ona aid etdikləri sifətlərdən uzaqdır (pakdır) və yüksəkdə durur.

101. O, göyləri və yeri (yoxdan) var edəndir. Allahın necə övladı ola bilər ki, Onun heç bir yoldaşı (zövcəsi) yoxdur. Hər şeyi O yaratmışdır. O, hər şeyi biləndir!

102. O Allah Rəbbinizdir! Ondan başqa heç bir tanrı yoxdur. Hər şeyi yaran Odur. Buna görə də yalnız Ona ibadət edin. O, hər şeyə vəkildir!

103. Gözlər Onu (görüb) dərk etməz. O, gözləri dərk edər. O, lətifdir (cisimlikdən uzaqdır), (hər şeydən) xəbərdardır!

104. Rəbbinizdən sizə parlaq dəlillər gəlmişdir. Kim (onları) görsə, öz lehinə, kim görməsə, öz əleyhinədir. Mən sizə nəzarətçi deyiləm. (Mənim vəzifəm ancaq dini təbliğ etməkdir)

105. Biz ayələrimizi belə açıqlayırıq ki, onlar (sənin peyğəmbərliyini inkar edənlər): "Sən dərs almısan (bunları başqalarından öyrənmisən)", - desinlər və Biz də onu (Quranı) bilən (elm və bilik sahibi olan) bir camaata izah edək. (Kafirlər Allahın birliyini, qüdrət və əzəmətini inkar etməklə daha şiddətli əzaba layiq olsunlar, möminlər isə onları təsdiq etdikləri üçün daha çox savab qazansınlar).

106. (Ya Rəsulum!) Rəbbindən sənə vəhy edilənə (Qurana) tabe ol. (Sən yəqin bilirsən ki) Ondan başqa heç bir tanrı yoxdur. Müşriklərdən isə üz çevir!

107. Əgər Allah istəsəydi, onlar müşrik olmazdılar. Biz səni onların üzərində gözətçi qoymamışıq və sən onların vəkili də deyilsən!

108. Allahdan başqalarına tapınanları söyməyin. Yoxsa onlar da (Allaha qarşı hörmət və ehtiram) bilmədikləri üzündən Allahı düşməncəsinə söyərlər. Beləcə, hər bir ümmətə öz əməllərini gözəl göstərdik. (Möminlərə Allah rizasına gördükləri işləri gözəl göstərdiyimiz kimi, kafirlərə də çirkin əməllərini yaxşı göstərdik). Sonra onlar Rəbbinin hüzuruna qayıdacaqlar. (Allah isə) onlara etdikləri əməllər barəsində xəbər verəcəkdir!

109. (Məkkə müşrikləri) Allaha ürəkdən and içdilər ki, əgər onlara bir ayə gəlsə, ona mütləq inanacaqlar. (Onlara) de: “Ayələr ancaq Allahın yanındadır. (Ey müşriklərin imana gəlməsini istəyən müsəlmanlar!) Siz nədən bilirsiniz ki, onlara (istədikləri) ayə (möcüzə) gəldikdə yenə də iman gətirməyəcəklər!”

110. Biz onların ürəklərini və gözlərini əvvəlcə ona (Qurana və ya göndərdiyimiz hər hansı ayəyə) iman gətirmədikləri kimi tərsinə çevirər və onları öz azğınlıqları içində şaşqın bir vəziyyətdə qoyarıq.

111. Əgər Biz (istədikləri kimi) mələkləri onlara göndərsəydik, ölülər onlara danışsaydı və hər şeyi dəstə-dəstə toplayıb onların qarşısına qoysaydıq belə, Allah istəmədikcə, onlar iman gətirməzdilər. Lakin onların əksəriyyəti (bunu) bilməz.

112. Beləcə, Biz hər peyğəmbər üçün insan və cin şeytanlarından düşmənlər yaratdıq. Onlar (biri digərini) aldatmaq məqsədilə bir-birinə təmtəraqlı (zahirən gözəl, daxilən çirkin) sözlər təlqin edərlər. Əgər Rəbbin istəsəydi, onlar bunu etməzdilər. Onları uydurduqları yalanlarla birlikdə boşla getsinlər!

113. (İnsanlardan və cinlərdən olan şeytanlar bu təmtəraqlı sözləri) axirətə inanmayanların ürəkləri onlara meyl etsin, onlar ondan (həmin sözlərdən) xoşlansınlar və gördükləri çirkin işləri bir daha görsünlər (deyə, təlqin edərlər).

114. Allah sizə Kitabı (Quranı) müfəssəl surətdə nazil etdiyi halda, mən (haqq ilə batili ayırd etmək üçün) Ondan başqasınımı özümə hakim istəməliyəm?! Kitab verilmiş şəxslər Quranın sənin Rəbbindən haqq olaraq nazil edildiyini bilirlər. Sən şübhəyə düşənlərdən olma!

115. (Ya Rəsulum!) Rəbbinin sözü düzgün və ədalətli şəkildə tamam oldu. Onun sözlərini dəyişdirə biləcək bir kimsə yoxdur. O, (hər şeyi) eşidəndir, biləndir!

116. Əgər yer üzündə olanların çoxuna itaət etsən, onlar səni Allahın yolundan azdırarlar. Onlar ancaq zənnə uyar və ancaq yalan danışarlar!

117. Şübhəsiz ki, yolundan azanları ən yaxşı tanıyan Rəbbindir. Haqq yola yönələnləri də ən yaxşı bilən Odur!

118. Əgər siz Allahın ayələrinə inanan kimsələrsinizsə, üstündə Onun adı çəkilmiş (bismillah deyilərək kəsilmiş) heyvanları yeyin!

119. Sizə nə olub ki, üstündə Allahın adı çəkilmiş (heyvanların) ətindən yeməyəsiniz? Halbuki məcburiyyət qarşısında (yeməli) olduğunuz şeylər istisna edilməklə, sizə haram buyurduqların artıq O (Allah) müfəssəl şəkildə sizə bildirmişdir. Şübhəsiz ki, çoxları (şəriəti) bilmədiklərindən nəfslərinin istəklərinə uyaraq (xalqı) düz yoldan azdırarlar. Rəbbin həddi aşanları ən yaxşı tanıyandır!

120. Günahın aşkarından da, gizlisindən də əl çəkin! Günah qazananlar etdikləri əməllərə görə cəzalandırılacaqlar!

121. Üstündə Allahın adı çəkilməmiş heyvanların ətindən yeməyin. Bu, şübhəsiz ki, günahdır. Həqiqətən, şeytanlar öz dostlarına sizinlə mücadilə etmək üçün (çirkin fikirlər və yaramaz əqidələr) təlqin edirlər. Əgər onlara itaət etsəniz, şübhəsiz ki, siz də müşrik olarsınız.

122. Heç (küfrlə) ölü olub diriltdiyimiz, sonra insanlar arasında gəzmək üçün özünə bir nur (islam dini) verdiyimiz kəs zülmət içində qalıb oradan çıxa bilməyən kimsə kimi ola bilərmi? Etdikləri əməllər kafirlərə belə gözəl göstərildi.

123. Beləliklə, hər bir obanın günahkarlarını oranın başçıları təyin etdik ki, onlar (günahlarını, bunun nəticəsində də axirətdə əzablarını daha da artırmaq üçün) orada bacardıqları qədər məkrlə məşğul olsunlar. Onlar yalnız özlərinə qarşı məkr edərlər, lakin (bunun) fərqinə varmazlar.

124. Onlara bir ayə gəldiyi zaman: “Allahın peyğəmbərlərinə verildiyinin (nübüvvətin, möcüzələrin) misli bizə verilməyincə biz iman gətirməyəcəyik!” – deyərlər. Allah peyğəmbərliyi hara (kimə) göndərəcəyini Özü daha yaxşı bilir. Günahkarlar Allahın hüzurunda etdikləri məkrlərə görə zillətə və şiddətli əzaba düçar olacaqlar!

125. Allah kimi düz yola yönəltmək istəsə, onun köksünü islam (dini) üçün açıb genişləndirər, kimi azdırmaq istəsə, onun ürəyini daraldıb sıxıntıya salar. O, sanki (sıxıntının şiddətindən) göyə çıxar. Allah iman gətirməyənlərə pisliyi belə edər!

126. Bu, Rəbbinin doğru yoludur. Biz ayələrimizi düşünüb anlayan bir camaat üçün artıq müfəssəl izah etmişik.

127. Onları Rəbinin yanında əmin-amanlıq yurdu (Cənnət) gözləyir. Allah onların gördüyü işləri himayə edəndir (və ya gördükləri yaxşı işlərə görə Allah onların dostudur).

128. (Allah insanları və cinləri) toplayacağı gün (qiyamət günü) belə buyuracaq: “Ey cin tayfası, artıq insanların bir çoxunu yoldan çıxartdınız”. Onların (cinlərin) insanlardan olan dostları deyəcəklər: “Ey Rəbbimiz! Biz bir-birimizdən bəhrələndik (şeytanlar bir sıra batil şeyləri insanlara gözəl göstərdikləri üçün insanlar onlardan

faydalandıqlarını zənn edərlər. Cinlər, şeytanlar isə insanları özlərinə tabe edə bildikləri üçün onlardan öz qərəzli məqsədləri naminə istifadə edərlər) və bizim üçün müəyyən etdiyin əcəlimiz gəlib çatdı!" (Allah) buyuracaq: "Sizin düşəcəyiniz yer atəşdir. Allahın istədiyi (vaxt və ya sonradan islamı qəbul edib nicat tapan kimsələr) istisna olmaqla, siz orada həmişəlik qalacaqsınız!" Şübhəsiz ki, Rəbbin hikmət, elm sahibidir!

129. Beləliklə, qazandıqlarına (qazandıqları günahlara) görə zalımların bəzisini digərinin arxasına taxaraq (və ya pis işləri bir yerdə gördükləri üçün qiyamət gününün əzabından onları bir-birinə belə yaxınlaşdırarıq).

130. Ey cin və insan tayfası! Məgər sizə öz içərinizdən ayələrimi söyləyən və bu gününüzün gəlib çatacağı barədə sizə xəbərdarlıq edən peyğəmbərlər gəlmədimi? Onlar deyəcəklər: "Biz öz əleyhimizə şahidik!" (Peyğəmbərlər bizə pis işlərimiz barədə xəbərdarlıq etsələr də, biz onlara qarşı çıxıb günah işləməkdə davam etdik. Biz indi hər cəzaya layiqik). Dünya həyatı onları aldatdı və onlar kafir olduqları barədə öz əleyhlərinə şəhadət verdilər.

131. Bu, (peyğəmbərləri göndərmək) ona görədir ki, Rəbbin məmləkətlərin əhalisini, onlar qafil ola-ola (özlərinə peyğəmbər gəlmədiyi üçün dini vəzifələrini bilməyib icra etmədikləri halda) zülmlə məhv etməyi özünə rəva bilməz!

132. Hər kəs üçün etdiyi əməllərə görə dərəcələr (müxtəlif mükafatlar və cəzalar) vardır. Rəbbin onların nə etdiklərindən qafil deyildir!

133. Rəbbin heç bir şeyə (heç bir bəndənin ibadətinə) möhtac deyildir, mərhəmət sahibidir. İstəsə, sizə başqa bir qövmün nəslindən (zürriyyətindən) gətirdiyi kimi, sizi də məhv edib yerinizə dilədiyini gətirər.

134. Sizə vəd edilən (qiyamət günü), şübhəsiz ki, gələcəkdir. Siz onun qarşısını ala bilməzsiniz!

135. (Ya Rəsulum! Qüreyş kafirlərinə) de: “Ey camaatım, əlinizdən gələni edin. Mən də (öz vəzifəmi) yerinə yetirirəm. Axirət yurdunun (gözəl) aqibətinin kimə nəsib olacağını biləcəksiniz. Şübhəsiz ki, zalımlar nicat tapmayacaqlar!

136. (Müşriklər) Allah üçün Onun yaratdığı əkindən və davardan pay ayırıb öz (batil) inanclarına görə: “Bu, Allahın və bu da (Allaha) şərik qoşduğumuz bütlərin!” – dedilər. Onların bütləri üçün ayrılmış hissə Allaha çatmaz, Allah üçün ayrılmış hissə isə bütlərə çatardı. Onların verdikləri hökm necə də pisdir!

137. Beləcə, (onların şeytanlardan və cinlərdən ibarət olan) ortaqları müşriklərin bir çoxuna onları məhv etmək və dinlərinə qarmaqarışıqlıq salmaq məqsədilə övladlarını öldürməyi yaxşı bir iş kimi göstərdilər. Əgər Allah istəsəydi, bunu etməzdilər. (Ya Rəsulum!) Onları da, uydurduqları yalanları da başlı-başına burax!

138. (Müşriklər) öz (batil) iddialarına əsasən: “Bu davarlar və əkinlər haramdır, onları bizim istədiklərimizdən (bütlərə xidmət edən kişilərdən) başqa heç kəs yeyə bilməz. Bunlar da minilməsi qadağan edilmiş heyvanlardır”, - dedilər. Elə heyvanlar da vardır ki, (onları kəsərkən) Allahın adını çəkməzlər. (Müşriklər) bütün bunları (Allahın əmri deyə) Allaha iftira yaxaraq edərlər. Yaxdıqları iftiraya görə (Allah) onların cəzalarını verəcəkdir.

139. (Müşriklər) həmçinin: “Bu heyvanların qarınlarındakı balalar yalnız kişilərə məxsusdur (halaldır), onlar qadınlarımıza haram edilmişdir”, - dedilər. Əgər (bala) ölü doğularsa, (kişilər və qadınlar) ona (onu yeməyə) ortaqdırlar. (Allah) onlara (bu yalan) vəsflərinin (dəyərləndirmələrinin) cəzasını verəcəkdir. Şübhəsiz ki, O, hikmət, elm sahibidir!

140. Səfehlik üzündən anlamadan öz uşaqlarını öldürən və Allahın onlara verdiyi ruzini (müqəddəs saydıqları heyvanları) Allaha iftira yaxaraq haram edənlər, şübhəsiz ki, ziyana uğramışlar. Həqiqətən, onlar (haqq yoldan) azmış, doğru yolu tapa bilməmişlər.

141. Yer üzünə sərilmiş və sərilməmiş bağ-bağatı (bostanları və bağları), dadları müxtəlif xurmanı və taxılı, bir-birinə həm bənzəyən, həm də bənzəməyən zeytunu və narı yaradan Odur. (Onların hər biri) bar verdiyi zaman barından yeyin, yığım günü haqqını (zəkatını, sədəqəsini) ödəyin, lakin israf etməyin. (Allah) israf edənləri sevməz!

142. Yük daşıyan və (yunlarından) döşək düzəldilən heyvanları da (yaradan Odur). Allahın sizə verdiyi ruzilərdən yeyin və Şeytana uymayın. Şübhəsiz ki, o sizin açıq-aşkar düşməninizdir.

143. (Allah o heyvanları) səkkiz cift yaratdı: (erkək və dişi olmaq üzrə) bir cüt qoyun və bir cüt keçi. De: "(Allah) iki erkəyi, yoxsa iki dişini, yaxud da iki dişinin qarınlarındakı (müxtəlif cinsli) balaları haram etdi? Əgər (Allahın nəyi halal, nəyi haram buyurduğunu bildiyinizi) doğru deyirsinizsə, bir elmə əsaslanaraq (bu haqda) mənə xəbər verin!"

144. (Həmçinin erkək və dişi olmaqla) bir cüt dəvə və bir cüt inək. De: "(Allah) iki erkəyi, yoxsa iki dişini, yaxud da iki (müxtəlif cinsli) dişinin qarınlarındakı balaları haram buyurdu? Yoxsa Allah bunu (iddia etdiyinizi) sizə tövsiyə etdiyi zaman (orada) şahid idiniz? Heç bir biliyi olmadan insanları (haqq yoldan) azdırmaq üçün Allaha qarşı yalan uyduran şəxsdən daha zalım kim ola bilər? Həqiqətən, Allah zalım tayfanı doğru yola salmaz!

145. (Ya Rəsulum!) De: "Mənə gələn vəhylər içərisində murdar olduqları üçün ölü heyvan, axar qan, donuz əti və ya Allahdan başqasının adı ilə (bismillah deyilmədən) günah olaraq kəsilmiş

heyvanlar istisna olmaqla, hər hansı bir kəsin yediyi yeməklər içərisində haram buyurulan bir şey görmürəm. Bununla yanaşı, hər kəs məcburiyyət qarşısında qalsa, həddi aşmadan, zəruri ehtiyacını ödəyəcək qədər (bunlardan yesə, Allah ona cəza verməz)”. Çünki sənin Rəbbin, həqiqətən, bağışlayandır, rəhm edəndir!

146. Yəhudilərə dırnaqlı heyvanların hamısını haram etdik. İnək və qoyunun bellərinə və ya bağırsaqlarına yapışan, yaxud sümüklərinə qarışan yağlar müstəsna olmaqla, onların piylərini də yəhudilərə haram buyurduq. Həddi aşdıqlarına görə onları belə cəzalandırdıq. Şübhəsiz ki, Biz sözündə doğru olanlarıq!

147. Əgər onlar səni yalançı hesab etsələr, de: “Rəbbiniz böyük mərhəmət sahibidir. Onun günahkar bir tayfaya (verəcəyi) əzabın da qarşısı alına bilməz!”

148. Müşriklər belə deyəcəklər: “Əgər Allah istəsəydi, nə biz, nə də atalarımız müşrik olar və nə də biz bir şeyi haram edə bilərdik. Onlardan əvvəlkilər də (öz peyğəmbərlərini) belə təkzib etmişdilər. Nəhayət, əzabımızı daddılar. (Onlara) de: “Bizim qarşımıza çıxara biləcək bir elminiz varmı? Siz yalnız zənnə qapılır və yalan uydurursunuz!”

149. De: “Tutarlı dəlil yalnız Allaha məxsusdur. Əgər O istəsəydi, sizin hamınızı doğru yola yönəldərdi”.

150. De: “Bunu (haram saydıqlarınızı) Allah haram buyurmuşdur deyə, şəhadət verəcək şahidlərinizi gətirin!” Şayəd onlar (yalandan) şahidlik etsələr, sən onlarla birlikdə şahidlik etmə, ayələrimizi yalan hesab edənlərin və axirətə inanmayanların nəfslərinin istəklərinə uyma. Onlar (bütləri) öz Rəbbinə tay tutarlar.

151. (Ya Rəsulum!) De: “Gəlin Rəbbinizin sizə nələri haram etdiyini deyim: Ona heç bir şərik qoşmayın; ata-anaya yaxşılıq edin; kasıblıq

üzündən uşaqlarınızı öldürməyin. Sizin də, onların da ruzisini Biz veririk. Açıq və gizlin pis işlərə yaxın düşməyin. Allahın (qətlini) haram buyurduğu cana qıymayın (müsəlman və ya əhli-zimməni haqsız yerə öldürməyin). (Allah) bunları sizə tövsiyə etmişdir ki, bəlkə, düşünüb anlayasınız!

152. Yetimin malına, xeyirxah məqsəd (onu qoruyub saxlamaq, çoxaltmaq) istisna olmaqla, həddi-buluğa çatana qədər yaxın düşməyin. Ölçüdə və çəkidə düz olun. Biz hər kəsi yalnız qüvvəsi yetdiyi qədər yükləyirik. Söz söylədiyiniz zaman (lehinə və ya əleyhinə danışdığınız adam) qohumunuz olsa belə, ədalətli olun. Allah qarşısındakı əhdi (dini vəzifələrinizi, andlarınızı) yerinə yetirin. (Allah) bunları sizə tövsiyə etmişdir ki, bəlkə, düşünüb öyüd-nəsihət qəbul edəsiniz!

153. Bu, şübhəsiz ki, Mənim doğru yolumdur. Onu tutub gedin. Sizi (Allahın) yolundan sapdıracaq yollara uymayın. (Allah) sizə bunları tövsiyə etdi ki, pis əməllərdən çəkinəsiniz!”

154. Sonra Biz yaxşı işlər görən kimsəyə - Musaya (bəxş etdiyimiz neməti) tamamlamaq, hər şeyi ətraflı izah etmək üçün ona bir hidayət və (ilahi) mərhəmət olaraq kitabı (Tövratı) verdik ki, bəlkə, yəhudilər (bununla) öz Rəbbinə qovuşacaqlarına (Onun hüzuruna gedəcəklərinə) inansınlar!

155. Bu nazil etdiyimiz (Quran) mübarək bir kitabdır. Ona tabe olun və Allahdan qorxun ki, bəlkə, sizə rəhm edilsin!

156. Biz onu sizin: “Bizdən əvvəl kitab ancaq iki tayfaya (yəhudilərə və xaçpərəstlərə) nazil edilmişdir. Biz onların oxuduqlarından xəbərsizik”, - deməməyiniz.

157. Və ya: “Əgər bizə də kitab nazil edilsəydi, onlardan daha artıq düz yolda olardıq”, - söyləməməyiniz üçün (göndərdik). Artıq

Rəbbinizdən sizə açıq-aşkar bir dəlil, hidayət və mərhəmət gəlmişdir. Allahın ayələrini yalan hesab edib onlardan üz çevirəndən daha zalım kim ola bilər?! Ayələrimizdən üz çevirənləri üz çevirdiklərinə görə ən pis cəza ilə cəzalandıracağıq!

158. (Məkkə müşrikləri) özlərinə yalnız mələklərin, yoxsa Rəbbinin (əzabının), yaxud da Rəbbinin bəzi qiyamət əlamətlərinin gəlməsinimi gözləyirlər? (Ya Rəsulum!) Rəbbinin bəzi qiyamət əlamətləri gələcəyi gün əvvəlcə iman gətirməmiş və ya imanından bir xeyir qazanmamış şəxsə (sonrakı) imanı heç bir fayda verməz. De: “Gözləyin, doğrusu, biz də gözləyirik!”

159. (Ya Rəsulum!) Şübhəsiz ki, sənin firqə-firqə olub dinini parçalayanlarla heç bir əlaqən yoxdur. Onların işi Allaha qalmışdır. (Allah) sonra (qiyamətdə) onlara nə etdiklərini bildirəcəkdir!

160. Kim yaxşı bir iş görərsə, ona həmin işin on qat əvəzi (savabı) verilər. Kim pis bir iş görərsə, ona həmin işin misli qədər cəza verilər. Onlara haqsızlıq edilməz.

161. (Ya Rəsulum) De: “Şübhəsiz, Rəbbin məni doğru yola, həqiqi (düzgün) dinə, batildən haqqa tapınan və müşriklərdən olmayan İbrahimin dininə yönəltdi!”

162. De: “Mənim namazım da, ibadətim də, həyatım və ölümüm də aləmlərin Rəbbi Allah üçündür!

163. Onun heç bir şəriki yoxdur. Mənə belə buyurulmuşdur və mən ilk müsəlmanam!”

164. De: “Allah hər şeyin Rəbbi olduğu halda, heç mən Ondan başqa Rəbbmi istərəm? “Hər kəsin qazandığı günah ancaq özünə aiddir. Heç bir günahkar başqasının günahını daşımaz. Axır dönüşünüz Rəbbinizədir. O zaman (Allah) sizə aranızda ixtilaf doğuran məsələlər barəsində xəbər verəcəkdir.

165. (Ey insanlar!) Verdiyiniz nemətlərlə sınamaq üçün sizi yer üzünün varisləri təyin edən, dərəcələrə görə birinizi digərinizdən üstün edən Odur. (Ya Rəsulum!) Həqiqətən, sənin Rəbbin (kafirlərə, müşriklərə, Onun birliyini inkar edənlərə) tezliklə cəza verən və şübhəsiz ki, (möminləri) bağışlayan, (onlara) rəhm edəndir!

## .7.
## əl-Əraf (Sədd) surəsi

**(Məkkədə nazil olmuşdur, 206 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Əlif, Lam, Mim, Sad.

2. Bu, (kafirləri cəhənnəm əzabı ilə) qorxutmaq və möminlərə öyüd-nəsihət vermək üçün sənə nazil edilən Kitabdır. (Ya Rəsulum!) Ondan (onun təbliğindən) ötrü ürəyində bir sıxıntı olmasın!

3. Rəbbinizdən sizə nazil edilənə (Qurana) tabe olun. Allahı qoyub başqa dostlara uymayın. Siz öyüd-nəsihətə olduqca az qulaq asırsınız!

4. Biz neçə-neçə məmləkətləri (onların əhalisini) məhv etdik. Əzabımız onlara (Lut peyğəmbərin qövmünə) gecə (yatarkən), yaxud (Şüeyb peyğəmbərin qövmünə) günün günorta çağı (istirahət edərkən) gəldi.

5. Əzabımıza düçar olduqları zaman onların: “Biz həqiqətən, zalım olmuşuq!” – deməkdən başqa heç bir sözləri olmamışdır.

6. (Özlərinə) peyğəmbər göndərilən ümmətləri (peyğəmbərlərə tabe olub-olmadıqları barədə) sorğu-suala çəkəcək, göndərilən peyğəmbərləri də (dinimizi onlara təbliğ edib-etməmələri haqqında) sorğu-sual edəcəyik.

7. Sonra da onlara (nə etdiklərini) bildiyimiz üçün (hamısını bir-bir) söyləyəcəyik. Axı Biz qaib deyildik (onların yanındaydıq).

8. O gün (qiyamət günü) çəki (əməllərin tərəzidə çəkilməsi) haqdır. Tərəziləri ağır gələnlər (yaxşı əməlləri pis əməllərindən çox olanlar) nicat tapanlardır!

9. Tərəziləri yüngül gələnlər (pis əməlləri yaxşı əməllərindən çox olanlar) isə ayələrimizə haqsızlıq etdiklərindən özlərinə zərər eləyənlərdir.

10. Sizi yer üzündə yerləşdirdik və orada sizin üçün dolanacaq vasitələri yaratdıq. Siz isə olduqca az şükür edənlərsiniz!

11. Sizi (babanız Adəmi) yaratdıq, sonra sizə surət verdik və mələklərə: "Adəmə səcdə edin!" – dedik. İblisdən başqa hamısı səcdə etdi. O, səcdə olanlardan olmadı.

12. (Allah iblisə): "Mən sənə əmr edəndə sənə səcdə etməyə nə mane oldu?" – deyə buyurdu. (İblis:) "Mən ondan daha yaxşıyam (üstünəm), çünki Sən məni oddan, onu isə palçıqdan yaratdın!" – dedi.

13. (Allah) buyurdu: "Oradan (Cənnətdən) aşağı en. Orada sənə (Allahın əmrinə) təkəbbür göstərmək yaraşmaz. (Oradan) çıx, çünki sən alçaqlardansan!"

14. (İblis) dedi: "Mənə qiyamətə qədər möhlət ver!"

15. (Allah) buyurdu: "Sən möhlət verilənlərdənsən!"

16. (İblis) dedi: "Sən məni (Adəmə səcdə etmədiyimə görə) azdırıb yoldan çıxartdığın üçün mən də Sənin düz yolunun üstündə oturub insanlara (Sənə ibadət və itaət etməyə) mane olacam!

17. Sonra onların yanına qarşılarından və arxalarından, sağlarından və sollarından gələcəyəm (soxulacağam) və Sən onların əksəriyyətini şükür edən görməyəcəksən!”

18. (Allah) buyurdu: “Oradan (Cənnətdən) rüsvay olmuş və (mərhəmətimdən) kənar edilmiş (qovulmuş) halda çıx. Onlardan (insanlardan) hər kim sənə uysa, (cəzasını alacaq). Əlbəttə, Cəhənnəmi sizin hamınızla dolduracağam!

19. Ey Adəm! Sən zövcənlə birlikdə Cənnətdə sakin ol. Hər ikiniz istədiyiniz yerdən (cənnət meyvələrini dərib) yeyin, ancaq bu ağaca (buğdaya və ya üzüm tənəyinə) yaxınlaşmayın, yoxsa (özünüzə) zülm edənlərdən olarsınız!”

20. Şeytan (Adəmin və Həvvanın) örtülü ayıb (övrət) yerlərini özlərinə göstərmək məqsədilə onlara vəsvəsə verib dedi: “Rəbbiniz sizə bu ağacı yalnız mələk olmamağınız və ya (Cənnətdə) əbədi qalmamağınız üçün qadağan etmişdir!”

21. Həm də onlara: “Mən, əlbəttə, sizin xeyirxah məsləhətçilərinizdənəm”, - deyə and içdi.

22. Beləliklə, (Şeytan) onları batil sözlərlə aldatdı (onları aldadaraq uca yerlərdən, yüksək mərtəbələrdən aşağı endirdi). (Adəm və Həvva) ağacın meyvəsindən daddıqda ayıb yerləri (gözlərinə) göründü. Onlar Cənnət (ağaclarının) yarpaqlarından (dərib) ayıb yerlərinin üstünü örtməyə başladılar. Rəbbi onlara müraciət edib buyurdu: “Məgər sizə bu ağacı (ağaca yaxınlaşmağı) qadağan etməmişdimmi? Şeytan sizin açıq-aşkar düşməninizdir, deməmişdimmi?”

23. (Adəm və Həvva) “Ey Rəbbimiz! Biz özümüzə zülm etdik. Əgər bizi bağışlamasan, rəhm etməsən, biz, şübhəsiz ki, ziyana uğrayanlardan olarıq!” – dedilər.

24. (Allah) buyurdu: “Bir-birinizə düşmən olaraq (Cənnətdən yer üzünə) enin! Yerdə sizin üçün bir müddət (əcəliniz çatana qədər) sığınacaq və dolanacaq (yaşayış vasitələri) vardır”.

25. (Allah) buyurdu: “Orada yaşayacaq, orada öləcək və oradan (dirilib) çıxarılacaqsınız!”

26. Ey Adəm oğulları! Sizə ayıb yerlərinizi örtəcək bir geyim və bir də bəzəkli libas (və ya mal-dövlət) nazil etdik. Lakin təqva libası daha yaxşıdır (xeyirlidir). Bu, Allahın ayələrindəndir ki, bəlkə, (onunla) öyüd-nəsihətə qulaq asasınız.

27. Ey Adəm oğulları! Ayıb yerlərini özlərinə göstərmək üçün libaslarını soyundurub valideyninizi (Adəm və Həvvanı) Cənnətdən qovdurduğu kimi, Şeytan sizi də aldadıb yoldan çıxartmasın. Şübhəsiz ki, o (Şeytan) və onun camaatı sizləri sizin onları görə bilmədiyiniz yerlərdən görürlər. Biz şeytanları iman gətirməyənlərin (kafirlərin) dostları etdik.

28. (Şeytanla dost olanlar) ədəbsizlik (bütpərəstlik adəti üzrə Kəbəni çılpaq təvaf) etdikləri zaman: “Atalarımızı belə gördük. Bunu bizə Allah əmr etmişdir” ,- deyirlər. (Ya Peyğəmbərim!) De: “Allah ədəbsizlik (yaramaz işlər) əmr etməz. Allaha qarşı bilmədiyiniz şeyimi deyirsiniz?”

29. De: “Rəbbim ədaləti əmr etdi. Hər səcdədə (namaz vaxtı) üzünüzü (bütlərə deyil, Ona tərəf və ya qibləyə) tutun. (Allah) dini yalnız Ona məxsus edərək ibadət edin. Sizi (yoxdan) yaratdığı kimi, yenə Onun hüzuruna qayıdacaqsınız!

30. (Allah) insanların bir qismini doğru yola yönəltdi, onların bir qismi isə (haqq yoldan) azmağa layiq görüldü. Çünki onlar Allahı qoyub şeytanları özlərinə havadar tutmuşdular və özlərinin doğru yolda olduqlarını güman edirlər.

31. Ey Adəm oğulları! Hər bir ibadət vaxtı (namaz qılarkən, məscidə gedərkən və ya təvaf edərkən) gözəl libaslarınızı geyin, yeyin-için, lakin israf etməyin, çünki (Allah) israf edənləri sevməz!

32. (Ya Peyğəmbərim!) De: "Allahın Öz bəndələri üçün yaratdığı zinəti və təmiz (halal) ruziləri kim haram buyurmuşdur?" De: "Bunlar dünyaya iman gətirənlər üçündür (lakin kafirlər də onlardan istifadə edə bilərlər), qiyamət günündə (axirətdə) isə yalnız möminlərə məxsusdur". Biz ayələrimizi anlayıb-bilən bir tayfaya belə ətraflı izah edirik.

33. De: "Rəbbim yalnız aşkar və gizli alçaq işləri (zina etmək, lüt gəzmək və s.), hər cür günahı, haqsız zülmü, Allahın haqqında heç bir dəlil nazil etmədiyi hər hansı bir şeyi Ona şərik qoşmağınızı və Allaha qarşı bilmədiyiniz şeyləri deməyinizi haram buyurmuşdur.

34. Hər bir ümmətin (əzəldən müəyyən edilmiş) əcəl vaxtı (ölüm, tənəzzül və ya əzaba düçar olma çağı) vardır. Onların əcəli gəlib çatdıqda bircə saat belə (ondan) nə geri qalar, nə də irəli keçə bilərlər!"

35. Ey Adəm oğulları! Sizə içərinizdən peyğəmbərlər gəlib ayələrimi söyləyən zaman Allahdan qorxaraq pis işlərdən çəkinib özlərini islah edən şəxslərin heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər!

36. Ayələrimizi yalan hesab edib onlara təkəbbürlə yanaşanlar isə cəhənnəmlikdirlər və onlar orada əbədi qalacaqlar!

37. Allaha iftira yaxan, Onun ayələrini yalan hesab edən kimsədən daha zalım kim ola bilər? Kitabda (lövhi-məhfuzda) yazılmış qismətləri onlara çatacaqdır. Nəhayət, elçilərimiz (göndərdiyimiz mələklər) canlarını almaq üçün yanlarına gəldikdə: "Allahdan başqa ibadət etdiyiniz bütləriniz haradadır?" – deyincə: "Onlar bizi qoyub

qaçdılar!” – deyə cavab verəcək və öz əleyhlərinə, kafir olduqlarına şahidlik edəcəklər.

38. (Allah qiyamət günü onlara) buyuracaq: “Sizdən əvvəl gəlib-getmiş (kafir) cin və insan tayfaları ilə birlikdə Cəhənnəmə girin!” Hər tayfa girdikcə (özündən əvvəlki) dindaşına və tayfadaşına (onu doğru yoldan azdırdığı üçün) lənət oxuyacaq. Nəhayət, hamısı birlikdə orada (Cəhənnəmdə) toplandığı zaman sonra gələnlər (tabe olanlar) əvvəl gələnlər (tabe olduqları) barəsində deyəcəklər: “Ey Rəbbimiz! Bizi azdıran bunlardır. Bunlara ikiqat cəhənnəm əzabı ver! (Allah) buyuracaq: “Hər birinizi ikiqat əzab gözləyir, lakin siz bilmirsiniz!”

39. Əvvəl gələnlər isə sonrakılara: “Sizin bizdən heç bir üstünlüyünüz yoxdur. (Biz sizi günah işlərə məcbur etmədiyimiz, əksinə, siz onları könüllü surətdə gördüyünüz üçün hər ikimiz eyni əzaba düçar olmalıyıq). Buna görə də qazandığınız günahların cəzası olaraq dadın əzabı! – deyəcəklər.

40. Ayələrimizi yalan hesab edənlərə və onlara təkəbbürlə yanaşanlara göyün qapıları açılmaz (əməlləri, duaları qəbul olunmaz, ruhları göyə qalxmaz) və dəvə iynənin gözündən keçməyənə qədər onlar da Cənnətə daxil ola bilməzlər. Biz günahkarlara (müşriklərə və kafirlərə) belə cəza veririk!

41. Onlar üçün Cəhənnəmdən (cəhənnəm odundan) döşək və üstlərinə örtmək üçün (atəşdən) yorğan vardır. Biz zalımları belə cəzalandırırıq!

42. İman gətirib yaxşı işlər görənlər isə - Biz heç kəsi qüvvəsi yetdiyindən artıq yükləmərik – cənnətlikdirlər, onlar orada əbədi qalacaqlar!

43. Biz onların (cənnət əhlinin) ürəklərindəki kin-küdurəti çəkib çıxardarıq. Onların (qaldıqları yerin) altından çaylar axar. Onlar (Rəbbinin bu lütfünü gördükdə) deyərlər: “Bizi bura gətirib çıxaran Allaha həmd olsun! Əgər Allah bizi doğru yola yönəltməsəydi, biz özümüzə doğru yolu tapa bilməzdik. Həqiqətən, Rəbbimizin peyğəmbərləri haqqı gətirmişdilər!” Onlara: “Etdiyiniz əməllərə görə varisi olduğunuz Cənnət budur!” – deyə müraciət ediləcəkdir.

44. Cənnət əhli cəhənnəm əhlinə müraciət edib: “Biz Rəbbimizin bizə vəd etdiyini (axirət nemətlərini) haqq olaraq gördük. Siz də Rəbbinizin sizə vəd etdiyini (cəhənnəm əzabını) gerçək olaraq gördünüzmü?” – deyə soruşacaq. Onlar: “Bəli!” – deyə cavab verəcəklər. Elə bu zaman onların (hər iki dəstəsinin) arasında bir carçı (İsrafil və ya cənnətdəkilərdən biri): “Allah zalımlara lənət eləsin!” – deyə səslənəcək.

45. O kəslər ki, insanları Allah yolundan döndərər, onu (Allah yolunu) əyri hala salmaq (əymək) istəyər və axirətdə də inkar edərlər!”

46. Onların ikisinin (cənnət əhli ilə cəhənnəm əhlinin) arasında pərdə (səs, maneə) və Əraf (Cənnətlə Cəhənnəm arasındakı səddin yüksəklikləri) üzərində isə (savabları və günahları, xeyir və şər əməlləri bərabər olan) insanlar (kişilər) vardır ki, onlar hamını (cənnətlikləri və cəhənnəmlikləri) üzündən tanıyıb cənnət əhlinə: “Sizə salam olsun!” - deyə müraciət edərlər. Bunlar (əraf əhli) çox istədiklərinə baxmayaraq hələ ora (Cənnətə) daxil olmamış (lakin Ərafda günahları təmizləndikdən sonra daxil olacaq) kimsələrdir.

47. Onların nəzərləri cəhənnəm əhlinə çevrildiyi zaman: “Ey Rəbbimiz! Bizi zalımlarla bir etmə!” - deyərlər.

48. Əraf əhli üzlərindən tanıdıqları adamlara müraciət edib: “Sizə nə yığdığınız mal-dövlət, nə də təkəbbürünüz fayda verdi”, - deyəcək.

49. (Və fağır, yoxsul möminləri kafirlərin böyüklərinə göstərərək: ) “Allah onları Öz mərhəmətinə nail etməyəcək, -deyə and içdiyiniz kəslər bunlarmıdır?” – söyləyəcəklər. (O anda Allah həmin möminlərə müraciətlə belə buyuracaq: ) “Cənnətə daxil olun. Sizin heç bir qorxunuz yoxdur və siz qəm-qüssə görməyəcəksiniz!”

50. Cəhənnəm əhli cənnət əhlinə müraciət edib: “Üstümüzə bir az su tökün və ya Allahın sizə verdiyi ruzilərdən bizə bir qədər ehsan edin!” – deyəcək. Onlar isə: “Doğrusu, Allah bunları kafirlərə haram buyurmuşdur!” – deyə cavab verəcəklər.

51. O kəslər ki, dinlərini oyun-oyuncaq (əyləncə) etmiş və (fani) dünya həyatı onları aldatmışdı. Onlar bu günə qovuşacaqlarını unutduqları və ayələrimizi (bilə-bilə) inkar etdikləri kimi, Biz də onları bu gün unudarıq!

52. Həqiqətən, Biz onlara (Məkkə müşriklərinə və kafirlərinə) elmlə müfəssəl izah etdiyimiz, inanan bir qövm üçün hidayət və mərhəmət olan (dini vəzifələrini öyrətmək üçün mükəmməl) bir Kitab (Quran) gətirdik.

53. Onlar (kafirlər) ancaq aqibətimi (Kitabın xəbər verdiyi aqibətimi) gözləyirlər? Onun xəbər verdiyi aqibət (qiyamət) gəlib çatdığı gün əvvəllər onu unutmuş olanlar deyəcəklər: “Doğrudan da, Rəbbimizin elçiləri (bizə) haqqı gətirmişdilər. İndi bizdən ötrü şəfaət edəcək bir kimsə varmı? Yaxud geri (dünyaya) qaytarıla bilərikmi ki, etdiyimiz əməllərdən başqasını edək?” Onlar özlərinə ziyan etdilər. Uyduqları (bütlər də) onlardan uzaqlaşıb qeyb oldu.

54. Həqiqətən, Rəbbiniz göyləri və yeri altı gündə xəlq edən, sonra ərşi (və onun əhatə etdiyi hər şeyi) yaradıb hökmü altına alan, (bir-birini) sürətlə təqib edən gündüzü gecə ilə (gecəni də gündüzlə) örtüb bürüyən, günəşi, ayı və ulduzları əmrinə boyun əymiş halda yaradan

Allahdır. Bilin ki, yaratmaq da, əmr etmək də Ona məxsusdur. Aləmlərin Rəbbi olan Allah nə qədər ucadır (nə qədər böyükdür)!

55. Rəbbinizə yalvara-yalvara, həm də gizlicə dua edin. Şübhəsiz ki, O, həddi aşanları (qışqıraraq dua edənləri) sevməz!

56. Yer üzü (Peyğəmbərin gəlməsi sayəsində iman və ədalətlə) düzəldikdən sonra, orada fəsad törətməyin. Ona (Allaha) həm qorxu, həm də ümidlə dua edin. Həqiqətən, Allahın mərhəməti yaxşılıq edənlərə çox yaxındır!

57. Külələri Öz mərhəməti önündə (yağışdan qabaq) müjdəçi olaraq göndərən Odur. Belə ki, küləklər (yağmur yüklü) ağır buludları hərəkətə gətirdiyi (daşıdığı) zaman Biz onları (buludları) ölü (qurumuş) bir məmləkətə tərəf qovur, ora yağmur endirir və onunla hər cür meyvə yetişdiririk. Biz ölüləri də (dirildib qəbirlərindən) belə çıxaracağıq. Bəlkə, düşünüb ibrət alasınız!

58. Təmiz (torpağı münbit) bir məmləkətin bitkiləri Rəbbinin iznilə (bol, vaxtında) çıxar. Pis (torpağı qeyri-münbit) bir məmləkətin bitkiləri isə yalnız çox çətinlikdə (özü də az) yetişər. Biz ayələrimizi (nemətlərimizə) şükür edən bir tayfa üçün belə müfəssəl izah edirik.

59. Biz Nuhu öz tayfasına (peyğəmbər) göndərdik. O dedi: “Ey camaatım! Allaha ibadət edin. Sizin Ondan başqa heç bir tanrınız yoxdur. Mən (müsibəti) böyük günün (qiyamət gününün) sizə üz verəcək əzabından qorxuram!”

60. Tayfasının başçıları ona! “Biz səni (haqq yoldan) açıq-aydın azmış görürük!, - deyə cavab verdilər.

61. (Nuh) dedi: “Mən (haqq yoldan) heç azmamışam, lakin mən aləmlərin Rəbbi tərəfindən göndərilmiş bir peyğəmbərəm!

62. Mən sizə Rəbbimin əmrlərini təbliğ edir və öyüd-nəsihət verirəm. Allahdan (gələn vəhy ilə) sizin bilmədiklərinizi bilirəm!

63. Yoxsa sizi (Allahın əzabı ilə) qorxutmaq, sizin də qorxmanız və (bunun nəticəsində) rəhm oluna bilinməniz üçün içərinizdən olan bir adam (peyğəmbər) vasitəsilə Rəbbinizdən sizə xəbərdarlıq gəlməsinə təəccüb edirsiniz?"

64. Buna görə onlar (Nuhu) yalançı hesab etdilər. Biz də onu və onunla birlikdə gəmidə olanları xilas etdik. Ayələrimizi təkzib edənləri isə (tufan vaxtı) qərq etdik (suda boğduq). Onlar, həqiqətən, kor bir camaat idilər.

65. Ad tayfasına da qardaşları Hudu (peyğəmbər göndərdik). O dedi: "Ey camaatım! Allaha ibadət edin. Sizin ondan başqa heç bir tanrınız yoxdur. Məgər (Allahın əzabından) qorxmursunuz?"

66. (Hud) tayfasının kafir başçıları ona: "Biz səni səfehlik içində görür və yalançılardan (biri) hesab edirik!" – deyə cavab verdilər.

67. (Hud) dedi: "Ey camaatım! Mən heç də səfeh deyiləm, lakin mən aləmlərin Rəbbi tərəfindən göndərilmiş bir peyğəmbərəm!

68. Mən sizə Rəbbimin əmrlərini təbliğ edirəm. Mən sizə doğru məsləhət verənəm.

69. Yoxsa sizi (Allahın əzabı ilə) qorxutmaq (xəbərdar etmək) üçün içərinizdən olan bir adam (peyğəmbər) vasitəsilə Rəbbinizdən sizə bir xəbərdarlıq gəlməsinə təəccüb edirsiniz? Xatırlayın ki, Allah sizi Nuh tayfasından sonra onun yerinə gətirdi (yer üzünün varisləri etdi), sizi xilqətcə (onlardan) daha qüvvətli (üstün) etdi. Allahın nemətlərini yada salın ki, bəlkə, nicat tapasınız!"

70. (Hud tayfasının kafirləri) dedilər: "Sən bizə yalnız Allaha ibadət etməyimiz və atalarımızın tapındıqları bütlərdən əl çəkməyimiz

üçünmü gəldin? Əgər doğru danışanlardansansa, bizi qorxutduğun (bizi təhdid etdiyin əzabı) bir gətir görək!”

71. (Hud) onlara belə dedi: “Artıq Rəbbinizdən sizə bir əzab və qəzəb gəlməsi vacib oldu (artıq əzab və qəzəb gəldi). Sizin və atalarınızın (özlərindən uydurub) verdiyi adlar (bütlər) barəsində mənimlə mübahisəmi edirsiniz? Halbuki Allah onlar (onlara ibadət edilməsi) barədə heç bir dəlil endirməmişdir. (Allahın əzabının gəlməsini) gözləyin. Doğrusu, mən də sizinlə birlikdə gözləyənlərdənəm!”

72. Beləliklə, onu (Hudu) və onunla birlikdə olanları (iman gətirənləri) Öz mərhəmətimizlə (əzabdan) xilas etdik. Ayələrimizi yalan hesab edib iman gətirməyənlərin isə kökünü kəsdik.

73. Səmud tayfasına da qardaşları Salehi (peyğəmbər göndərdik). O dedi: “Ey camaatım! Allaha ibadət edin. Sizin Ondan başqa heç bir tanrınız yoxdur. Rəbbinizdən sizə açıq-aydın bir dəlil gəldi. Allahın bu dişi (maya) dəvəsi sizin üçün (peyğəmbərliyimi təsdiq edən) bir möcüzədir. Buraxın Allahın torpağında otlasın, ona pislik etməyin, yoxsa çox şiddətli bir əzaba düçar olarsınız!

74. (Allahın) sizi Ad tayfasından sonra onun yerinə gətirdiyi, düzlərində qəsrlər tikdiyiniz, dağlarını ovub (yonub) evlər düzəltdiyiniz yer üzündə yerləşdiyi vaxtı xatırlayın. Allahın nemətlərini yada salın, yer üzündə dolaşıb fitnə-fəsad törətməyin!”

75. Saleh tayfasının (iman gətirməyi) özlərinə sığışdırmayan təkəbbürlü başçıları içərilərindən iman gətirən əlsiz-ayaqsız yoxsullara üz tutub: “Siz Salehin, doğrudan da, Rəbbi tərəfindən göndərilmiş (bir peyğəmbər) olduğunu bilirsinizmi?” – deyə soruşdular. Onlar: “Bəli, biz onunla göndərilən hər bir şeyə (bütün dini hökmlərə) inanırıq!” – deyə cavab verdilər.

76. (Təkəbbür üzündən iman gətirməyi) özlərinə ar bilənlər: "Sizin inandığınıza (Salehin peyğəmbərliyinə) biz inanmırıq!" – dedilər.

77. Sonra o dəvəni tutub kəsdilər və (bununla da) Rəbbinin əmrini saymazyana pozub (istehza ilə): "Ey Saleh! Əgər sən (həqiqi) peyğəmbərlərdənsənsə, bizi qorxutduğunu (bizi təhdid etdiyin əzabı) gətir görək!" – dedilər.

78. Buna görə də onları dəhşətli bir sarsıntı (yerdən zəlzələ, göydən tükürpədici bir səs) bürüdü, onlar öz evlərində diz üstə düşüb qaldılar (bir göz qırpımında həlak oldular).

79. (Saleh) onlardan üz döndərib belə dedi: "Ey camaatım! Mən sizə Rəbbimin əmrini (mənə lütf etdiyi peyğəmbərliyi) təbliğ etdim və sizə öyüd-nəsihət verdim. Lakin siz öyüd-nəsihət verənləri sevmirsiniz!"

80. Lutu da (peyğəmbər göndərdik). Bir zaman o öz tayfasına demişdi: "Sizdən əvvəl bəşər əhlindən heç kəsin etmədiyi həyasızlığı (kişilər arasında olan cinsi əlaqəni) sizmi edəcəksiniz?

81. Siz qadınları atıb şəhvətlə kişilərin üstünə gəlirsiniz. Siz, doğrudan da, həddi aşmış bir tayfasınız!"

82. (Lut) tayfasının (bu sözə) cavabı (istehza ilə): "Onları (Lutu və ona tabe olanları) məmləkətinizdən çıxarın, çünki onlar (həddindən ziyadə) təmiz (bu cür işlərlə məşğul olmayan) adamlardır!" – deməkdən başqa bir şey olmamışdı.

83. Biz onu (Lutu) və ailəsini (həmçinin ona iman gətirənləri) xilas etdik. Yalnız övrəti (Vailə öz küfrü səbəbilə) həlak oldu.

84. Onların üstünə yağış (kibrit və atəşlə yoğrulmuş əzab yağışı) yağdırdıq. Bir gör (Allaha asi olan, peyğəmbərləri inkar edən) günahkarların axırı necə oldu!

85. Mədyən tayfasına da qardaşları Şüeybi (peyğəmbər) göndərdik. (Şüeyb) onlara belə dedi: “Ey camaatım! Allaha ibadət edin. Sizin Ondan başqa heç bir tanrınız yoxdur. Artıq sizə Rəbbinizdən aşkar bir dəlil (möcüzə) gəldi. Ölçüdə və tərəzidə düz olun. Adamların mallarının dəyərini (və ya onların haqqını) azaltmayın. Yer üzü (peyğəmbərlərin şəriətləri sayəsində) düzələndən sonra orada fitnə-fəsad törətməyin. Əgər siz möminsinizsə, bu (dediklərim) sizin üçün xeyirlidir!

86. Hər yolun başında əyləşib Allaha iman gətirənləri qorxudaraq Onun yolundan döndərməyin, onu (Allah yolunu) əymək istəməyin. (Ey Mədyən tayfası!) Xatırlayın ki, bir zaman siz çox az idiniz, amma (Allah) sizi çoxaltdı. Bir görün fitnə-fəsad törədənlərin axırı necə oldu!

87. Əgər sizin bir qisminiz mənimlə göndərilən (dini hökmlərə) inanmış, bir qisminiz isə inanmamışsa, Allah aramızda öz hökmünü verincəyə qədər səbr edin. Axı O, hökm verənlərin ən yaxşısıdır!”

88. (Şüeyb) tayfasının (iman gətirməyi) özlərinə sığışdırmayan təkəbbürlü əyanları: “Ey Şüeyb! Ya səni və səninlə birlikdə iman gətirənləri məmləkətimizdən mütləq qovacağıq, ya da siz bizim dinimizə dönəcəksiniz!” – dedilər. (Şüeyb) belə cavab verdi: “(Dininizə) nifrət etdiyim halda beləmi (bizi bu işə məcbur edəcəksiniz)?

89. Allah bizi sizin (batil) dininizdən xilas etdikdən sonra biz sizin dininizə dönsək, (sizin bütpərəst dininizin haqq olduğunu etiraf etməklə) Allaha qarşı yalan uydurmuş olarıq. Rəbbimiz Allah istəməsə, biz əsla sizin dininizə dönə bilmərik. Rəbbimiz elm ilə (Öz əzəli elmi ilə) hər şeyi ehtiva etmişdir. Biz yalnız Allaha təvəkkül etmişik. Ey Rəbbimiz! Bizimlə tayfamız arasında ədalətlə hökm et. Axı Sən hökm verənlərin ən yaxşısısan!”

90. (Şüeyb) tayfasının kafir əyanları (tabeliyində olanlara) dedilər: “Əgər (dininizi atıb) Şüeybin ardınca getsəniz, şübhəsiz ki, (çox böyük) ziyana uğramış olarsınız!”

91. Elə bu zaman onları dəhşətli bir sarsıntı (yerdən zəlzələ, göydən tükürpədici bir səs) bürüdü və onlar öz evlərində diz üstə düşüb qaldılar (bir göz qırpımında həlak oldular).

92. Şüeybi yalançı adlandıranlar, sanki orada (evlərində) heç bir şənlik (nemət) içində yaşamamışdılar. Şüeybi təkzib edənlərin özləri ziyana uğrayanlar oldular.

93. (Şüeyb) onlardan üz döndərib dedi: “Ey camaatım! Mən sizə Rəbbimin əmrlərini təbliğ etdim və öyüd-nəsihət verdim. İndi kafir bir tayfadan ötrü necə yas tutum?”

94. Biz hansı bir məmləkətə peyğəmbər göndərdiksə, onun əhalisini (peyğəmbərləri tanımadıqları üçün bir müddət) müsibətə və bəlaya (xəstəlik, yoxsulluq, qıtlıq, aclıq və s.) saldıq ki, bəlkə, (günahlarını başa düşərək Allaha) yalvarıb-yaxarsınlar!

95. Sonra sıxıntını (bəlanı, pisliyi) firavanlıqla əvəz etdik. Beləliklə, onlar artıb çoxaldılar və dedilər: “Atalarımıza da belə yaxşı-yaman günlər üz vermişdi”. Elə bu an onları özləri də bilmədən, qəflətən (əzabla) yaxaladıq.

96. Əgər o məmləkətlərin əhalisi iman gətirib (pis əməllərdən) çəkinsəydilər, sözsüz ki, onların başlarına göydən və yerdən bərəkət yağdırardıq (göyün və yerin bərəkət qapılarını onların üzünə açardıq). Lakin onlar (öz peyğəmbərlərini) yalançı hesab etdilər, Biz də onları qazandıqlarına (qazandıqları günahlara) görə məhv etdik.

97. Məgər o məmləkətlərin əhalisi əzabımızın onlara gecə yatarkən gəlməyəcəyinə əmin idilərmi?

98. Və ya o məmləkətlərin əhalisi əzabımızın onlara gündüz oynayıb əylənərkən gəlməyəcəyinə arxayın idilərmi?

99. Yaxud (o məmləkətlərin əhalisi) Allahın onları dolaşdırıb bəla toruna salmayacağına (naz-nemət içində yaşadıqları halda qəflətən onlara əzab göndərməyəcəyinə) əmin idilərmi? Allahın (bu yolla) dolaşdırıb bəla toruna salmayacağına özlərinə zərər eləyənlərdən başqa heç kəs arxayın ola bilməz!

100. Yer üzünün (qədim) sakinlərindən sonra ona varis olanlara (onların yerinə gələnlərə) aydın olmadımı ki, əgər Biz istəsəydik, onları da günahlarına görə müsibətlərə düçar edər, ürəklərini möhürləyərdik (düşüncə və təfəkkür qabiliyyətindən məhrum edərdik) və onlar da (öyüd-nəsihət) eşitməzdilər?

101. (Ya Rəsulum!) O məmləkətlərin bəzi xəbərlərini (əhvalatlarını) sənə söylədik. Peyğəmbərləri onlara açıq-aşkar dəlillər (möcüzələr) gətirmişdilər. (Həmin məmləkətlərin əhalisi) əvvəlcə yalan hesab etdiklərinə (möcüzələrə, dəlillərə) yenə də inanmadılar. Allah kafirlərin ürəklərini belə möhürləyər.

102. Onların əksəriyyətində əhdə vəfa görmədik. (Əksinə) onların əksəriyyətini (Allahın itaətindən çıxmış, Onun əmrlərini pozmuş) günahkar kəslər gördük.

103. Onlardan sonra Musanı möcüzələrimizlə Firona və onun əyanlarına (peyğəmbər) göndərdik. Onlar (həmin möcüzələri) inkar etdilər. Bir gör fəsad törədənlərin axırı necə oldu!

104. Musa dedi: “Ey Firon! Mən aləmlərin Rəbbi tərəfindən göndərilmiş bir peyğəmbərəm!

105. Mən Allah barəsində yalnız haqqı deməyə borcluyam. Mən sizə Rəbbinizdən açıq-aşkar bir dəlil (möcüzə) gətirmişəm. İndi (kölə

etdiyin) İsrail oğullarını mənimlə bərabər (babalarının vətəni olan Şama) göndər!"

106. (Firon Musaya) dedi: "Əgər möcüzə ilə gəlmisənsə və doğru deyirsənsə, onu gətir göstər!"

107. (Firon bunu deyən kimi) Musa əsasını (yerə atdı) və o, dərhal (hamının gözünə) aşkar görünən bir əjdaha oldu.

108. (Sonra) əlini (qoltuğunun altından və ya cibindən) çıxartdı və o, bir anda baxanlara nur kəsildi.

109. Firon tayfasının əyanları dedilər: "Şübhəsiz ki, bu çox bilikli bir sehrbazdır.

110. O sizi yurdunuzdan çıxartmaq istəyir!" (Firon da: ) "Elə isə tədbiriniz nədir?" - (deyə soruşdu).

111. Onlar dedilər: "Onu (Musanı) qardaşı (Harun) ilə birlikdə saxla və şəhərlərə (sehrbazları) yığan adamlar göndər ki,

112. Nə qədər bilikli sehrbaz varsa, hamısını tutub gətirsinlər!"

113. Sehrbazlar Fironun yanına gəlib dedilər: "Əgər biz (Musaya) üstün gəlsək, yəqin ki, bizə bir mükafat veriləcək!"

114. (Firon:)"Bəli şübhəsiz ki, siz (mənə) ən yaxın adamlardan olacaqsınız!" – deyə cavab verdi.

115. Sehrbazlar dedilər: "Ya Musa! Ya sən (əvvəlcə əsanı yerə) at, ya da biz (əlimizdəkiləri) ataq!"

116. (Musa: ) "Siz atın" – dedi. Onlar (əllərindəkiləri və əsaları yerə) atdıqda, adamların gözlərini bağlayıb (sehrləyib) onları qorxutdular və böyük bir sehr göstərdilər.

117. Biz də Musaya: “Əsanı tulla!” – deyə vəhy etdik. Bir də (baxıb gördülər ki) əsa onların uydurub düzəltdikləri bütün şeyləri udur.

118. Artıq haqq zahir, olanların uydurub düzəltdikləri yalanlar isə batil oldu.

119. (Sehrbazlar) orada məğlub edildilər və xar olaraq geri döndülər.

120. Onlar (hamı birlikdə) səcdəyə qapanıb

121. Dedilər: “Biz iman gətirdik aləmlərin Rəbbinə -

122. Musanın və Harunun Rəbbinə!”

123. Firon (onlara) dedi: “Mən sizə izin vermədən əvvəl siz ona iman gətirdiniz?” Bu (sizin Musa ilə birlikdə gördüyünüz işlər), şübhəsiz ki, əhalisini çıxartmaq (qibtiləri qovub Misiri ələ keçirmək) məqsədilə şəhərdə qurduğunuz (gizli) bir hiylədir. (Gördüyünüz işlərə görə başınıza nə oyun açacağımı) biləcəksiniz!

124. Əl-ayağınızı çarpaz kəsdirəcək, sonra isə hamınızı çarmıxa çəkdirəcəyəm!”

125. (Sehrbazlar) belə cavab verdilər: “Şübhə yoxdur ki, biz Rəbbimizin hüzuruna dönəcəyik! (Bizi ölümlə qorxuda bilməzsən!)

126. Sənin bizdən intiqam almağın isə ancaq Rəbbimizin möcüzələri gələn kimi bizim onlara iman gətirməyimizə görədir. Ey Rəbbimiz! Bizə (bolluca) səbir əta et və bizi müsəlman olaraq öldür!”

127. Firon tayfasının əyan-əşrafı dedi: “Musanı və tayfasını fitnə-fəsad törətmək, həm səni, həm də sənin tanrılarını atıb getmək üçünmü buraxacaqsan?” (Firon onlara) belə cavab verdi: “Biz onların oğullarını (erkəklərini) öldürəcək, qadınlarını isə (bizə xidmət etmək üçün) diri saxlayacağıq. Biz onlara, mütləq, qələbə çalacağıq! (Onlar əvvəlki kimi yenə əlimizin altında olacaqlar!)”

128. Musa öz tayfasına: “Allahdan kömək diləyin və səbr edin. Yer üzü Allahındır. Bəndələrindən istədiyini onun varisi edər. Aqibət (dünyada zəfər, axirətdə yüksək məqamlar) müttəqilərindir!” - dedi.

129. (Musaya iman gətirənlər) dedilər: “Sən bizə peyğəmbər gəlməmişdən əvvəl də, sonra da biz əziyyət çəkdik!” (Musa onlara belə) cavab verdi: “Bəlkə də, Rəbbiniz düşməninizi məhv edib sizi yer üzünün varisləri edəcək, sonra isə nə etdiyinizə (özünüzü necə apardığınıza) baxacaq!”

130. Biz Firon əhlini (illərlə) qıtlığa, quraqlığa və məhsul çatışmazlığına məruz qoyduq ki, bəlkə, düşünüb ibrət alsınlar!

131. Onlara bolluq qismət olduğu zaman: “Bu bizim (haqqımızdır)!” – deyər, bir pislik üz verdikdə isə bunu (bir uğursuzluq, nəhslik kimi) Musadan və yanındakılardan görərdilər. Agah olun ki, onların başına gələn uğursuzluq (nəhslik) Allahdandır, lakin onların əksəriyyəti (bunu) bilməz!

132. (Firon adamları Musaya) dedilər: “Sən bizi ovsunlamaq üçün nə möcüzə gətirsən də, yenə sənə iman gətirən deyilik!”

133. Biz ayrı-ayrı möcüzələr üzrə onlara tufan, (əkinlərinə) çəyirtkə və həşərat, (evlərinə, yeməklərinə) qurbağa və (çeşmələrinə, kəhrizlərinə) qan göndərdik. Onlar yenə də (iman gətirməyi) özlərinə sığışdırmayıb kafir bir tayfa oldular.

134. Onlara əzab gəldikdə dedilər: “Ya Musa! (Allahın sənin dualarını qəbul etmək və peyğəmbərlik vermək barəsində) səninlə olan əhdi hörmətinə bizim üçün Rəbbinə dua et. Əgər bu əzabı bizdən götürsə, biz, hökmən, sənə iman gətirəcək və İsrail oğullarını səninlə birlikdə (istədikləri yerə) göndərəcəyik”.

135. Elə ki, əzabı bir müddətə onlardan götürdük, dərhal (əhdi) pozdular.

136. Biz də ayələrimizi yalan hesab edib onlardan qafil olduqları (onlara etinasız yanaşdıqları) üçün (Firon əhlindən) intiqam alaraq onları dənizdə batırdıq.

137. Zəif (həşr) görünən o tayfanı (İsrail oğullarını) yer üzünün daim xeyir-bərəkət verdiyiniz şərq tərəflərinə (Şam diyarına) varis etdik. (Müsibətlərə, fəlakətlərə) səbr etdiklərinə görə Rəbbinin İsrail övladına verdiyi gözəl sözlər (vədlər) tam yerinə yetdi. Fironun və onun camaatının qurduqları (imarətləri) və ucaltdıqlarını (qəsrləri, kaşanələri) isə viran qoyduq.

138. Biz İsrail oğullarını dənizdən keçirtdik, (sonra) onlar öz bütlərinə tapınan bir tayfaya uğradılar. (İsrail oğulları) dedilər: “Ya Musa! Bizə onların sitayiş etdikləri bütlər kimi bir büt düzəlt!” (Musa belə) cavab verdi: “Siz, doğrudan da, cahil bir tayfasınız!

139. Şübhəsiz ki, bunların tapındıqları bütlər məhvə məhkumdur, etdikləri əməllər isə puçdur!”

140. (Musa yenə) dedi: “Allah sizi aləmlərə (dövrünüzdəki bütün insanlara) üstün etdiyi halda, heç mən sizin üçün Allahdan başqa bir tanrı istərəmmi?!”

141. (Ey İsrail övladı!) Yadınıza salın ki, sizi Firon əhlinin əlindən qurtardıq. Onlar sizə şiddətli əzab verir, oğullarınızı öldürür, qadınlarınızı isə (özlərinə xidmət etmək üçün) diri saxlayırdılar. Bu sizin üçün Rəbbiniz tərəfindən böyük bir sınaq idi.

142. Musa ilə otuz gecə (oruc tutub dua edəcəyi, bunun müqabilində ona Tövratı nazil edəcəyimiz və özü ilə danışacağımız) barədə vədələşdik, sonra ona daha bir on gün də əlavə etdik. Beləliklə, Rəbbinin (ibadət üçün) təyin etdiyi müddət tam qırx gecə (gün) oldu. Musa qardaşı Haruna dedi: “Sən tayfam içində mənim xəlifəm ol,

(camaatı) islah etməyə çalış və (yer üzündə) fitnə-fəsad törədənlərin yolu ilə getmə!”

143. Musa təyin etdiyimiz vaxtda (Tur-i Sinaya) gəldikdə Rəbbi onunla (arada heç bir vasitə olmadan) danışdı. (Musa: ) “Ey Rəbbim! Özünü (camalını) mənə göstər. Sənə baxım!” – dedi. Allah: “Sən Məni əsla görə bilməzsən. Lakin (bu) dağa bax. Əgər o yerində dura bilsə, sən də Məni görə bilərsən”, - buyurdu. Rəbbi dağa təcəlli etdikdə (Allahın nuru dağa saçıldıqda) onu parça-parça etdi. Musa da bayılıb düşdü. Ayılandan sonra isə: “Sən paksan, müqəddəssən! (Bütün eyib və nöqsanlardan uzaqsan!) Sənə (bu işimdən ötrü) tövbə etdim. Mən (İsrail oğullarından Səni görməyin mümkün olmadığına) iman gətirənlərin birincisiyəm!” – dedi.

144. (Allah) belə buyurdu: “Ya Musa! Mən Öz risalətlərimdə (Tövratın lövhələrini nazil etməklə) və (səninlə arada heç bir vasitə olmadan) danışmağımla (dövründəki bütün) insanlardan səni seçib üstün tutdum. İndi sən verdiyimi al və (bu nemətlərə görə) şükür edənlərdən ol!”

145. Biz onun üçün lövhələrdən hər şeydən, moizə və təfsilata dair hər şeyi yazdıq. (Və belə buyurduq: ) “Bundan möhkəm yapış və ümmətinə də onun ən gözəl (savabı çox olan) hökmlərindən yapışmağı (onlara əməl etməyi) əmr et. (Axirətdə) sizə fasiqlərin yurdunu (Cəhənnəmi) göstərəcəyəm!

146. Yer üzündə haqsız yerə (layiq olmadıqları halda) təkəbbürlük edənləri ayələrimi anlamaqdan yayındıracağam (mane olacağam). Onlar nə möcüzə görsələr, ona inanmazlar. Onlar haqq yolu görsələr, onu qəbul etməz, azğınlıq yolunu görsələr, onu özlərinə yol seçərlər. Bunun səbəbi isə onların ayələrimizi yalan hesab etmələri və ondan qafil olmalarıdır.

147. Ayələrimizi və axirətə qovuşmağı doğru hesab etməyənlərin (bütün) əməlləri puça çıxdı. Onlar ancaq öz əməllərinin cəzasını çəkəcəklər!”

148. (Tur dağına gedən) Musanın ardınca tayfası öz bəzək-düzək şeylərindən (canlıymış kimi) böyürtüsü olan bir buzov heykəli düzəltdilər. Məgər (buzovun) onlarla danışmadığını, onlara bir yol göstərə bilmədiyini görmədilərmi? (Bununla belə) ona (buzova) tapınıb (özlərinə) zülm eləyən oldular.

149. Elə ki (peşmançılıqdan başları) əlləri arasına düşdü və haqq yoldan azmış olduqlarını gördülər, (əməllərindən çox məyus olub) dedilər: “Əgər Rəbbimiz bizə rəhm etməsə və bizi bağışlamasa, mütləq ziyana uğrayanlardan olacağıq!”

150. Musa qəzəbli və kədərli halda tayfasının yanına dönərkən onlara dedi: “Məndən sonra mənə nə pis xələf oldunuz! (Nə pis işlər gördünüz!) Rəbbinizin əmrini (əzabını) tezləşdirməkmi istədiniz?” (Musa) qəzəbindən (əlindəki Tövrat) lövhələrini yerə atdı, qardaşının başından (saç-saqqalından) yapışıb özünə tərəf çəkməyə başladı. (Harun) dedi: “Ey anam oğlu! Bu tayfa məni zəif bilib az qaldı ki, öldürə. Mənimlə belə rəftar etməklə düşmənləri sevindirmə! Məni zalımlarla bərabər tutma!”

151. (Musa) dedi: “Ey Rəbbim! Məni də, qardaşımı da bağışla. Bizi Öz mərhəmətin altına al. Sən rəhm edənlərin ən rəhmlisisən!”

152. Şübhəsiz ki, buzovu (tanrı) qəbul edənlərə Rəbbindən bir qəzəb yetişəcək və onlar dünyada zillətə düçar olacaqlar! Biz (Allaha) iftira yaxanları belə cəzalandırırıq!

153. Pis əməllər etdikdən sonra tövbə edib iman gətirənlərə gəldikdə isə, Rəbbin tövbədən sonra (onları) bağışlayandır, rəhm edəndir!

154. Musanın qəzəbi yatanda lövhələri götürdü. Onların birində: “Rəbbindən qorxanlar doğru yola və mərhəmətə nail olacaqlar!” - (deyə yazılmışdı).

155. Musa Bizim (Sina dağında) təyin etdiyimiz vaxt üçün öz tayfasından yetmiş (mötəbər) adam seçmişdi. Onları sarsıntı yaxalayanda (ildırım vuranda Musa) dedi: “Ey Rəbbim! Əgər istəsəydin, bundan qabaq onları da, məni də məhv edərdin. Aramızdakı səfehlərin törətdiyi günahlar üzündən bizi məhvmi edəcəksən? Bu (baş verən işlər) Sənin sınağından başqa bir şey deyildir. Sən onunla (bu sınaqla) istədiyini zəlalətə düçar edər, istədiyini doğra yola salarsan. Sən bizim hamimizsən (ixtiyar sahibimizsən). Bizi bağışla və rəhm et. Axı sən bağışlayanların ən yaxşısısan!

156. Bizə bu dünyada da yaxşılıq yaz. (Dünyada yaxşı əməllər, axirətdə Cənnət qismət elə). Biz (tövbə edib bağışlanmağımızı diləyərək). Sənə tərəf (hüzuruna) döndük!” (Allah) buyurdu: “İstədiyimi əzabıma düçar edərəm. Mərhəmətim hər şeyi ehtiva etmişdi. Onu Allahdan qorxub pis əməllərdən çəkinənlərə, zəkat verənlərə, ayələrimizə iman gətirənlərə yazacağam!

157. O kəslər ki, əllərindəki Tövratda və İncildə (adını, vəsfini və əlamətlərini) yazılmış gördükləri rəsula–ümmi (heç kəsin yanında oxuyub elm öyrənməmiş və ya məkkəli) peyğəmbərə tabe olurlar. (O Peyğəmbər) onlara yaxşı işlər görməyi buyurar, pis işləri qadağan edər, təmiz (pak) nemətləri halal, murdar (napak) şeyləri haram edər, onların ağır yükünü yüngülləşdirər və üstlərindəki buxovları açar (şəriətin çətin hökmlərini götürər). Ona (o Peyğəmbərə) iman gətirən, yardım göstərən və onunla (Quranın) ardınca gedənlər məhz onlar nicat tapanlardır!”

158. (Ya Rəsulum!) De: “Ey insanlar! Mən Allahın sizin hamınıza göndərilmiş peyğəmbəriyəm. (O Allah ki) göylərin və yerin hökmü Onundur, Ondan başqa heç bir tanrı yoxdur. O dirildir və öldürür. Buna görə də Allah, eləcə də Onun Allaha və Allahın sözlərinə (ayələrinə, nazil etdiyi kitablara) inanan və ümmi peyğəmbər olan Rəsuluna iman gətirin və ona tabe olun ki, doğru yolu tapa biləsiniz!”

159. Musa ümməti arasında bir dəstə də vardır ki, onlar (insanları) haqq yola aparır və haqqı rəhbər tutaraq (onlar arasında) ədalətlə hökm edirdilər.

160. Biz onları (İsrail oğullarını) on iki qəbiləyə - ümmətə böldük. Camaatı (Tih səhrasında) ondan (Musadan içməyə) su istədiyi zaman ona: “Əsanı daşa vur!” – deyə vəhy etdik. (Əsanı daşa vuran kimi) ondan on iki çeşmə qaynayıb axmağa başladı. Hər qəbilə özünün su içəcəyi yeri bildi. Biz buludları onların üstündə kölgəlik etdik, onlara qüdrət halvası və bildirçin endirdik. Onlara: “Sizə ruzi olaraq verdiyimiz pak nemətlərdən yeyin!” dedik. Onlar (naşükür olmaqla, əmrlərimizi yerinə yetirməməklə) Bizə deyil, ancaq özlərinə zülm edirdilər!

161. (Ya Rəsulum!) Yadına sal ki, o zaman onlara (yəhudilərə) belə deyilmişdi: “Bu şəhərdə (Qüdsdə) sakin olun, ondan (onun meyvələrindən) istədiyiniz yerdə yeyin, “hittə” (“bizi bağışla”) deyin və qapıdan (Beytülmüqəddəsin qapısından) səcdə edərək daxil olun ki, günahlarınızı bağışlayaq. Biz yaxşı işlər görənlərin mükafatını artıracağıq!”

162. Lakin (İsrail oğullarından Allahın əmrlərini yerinə yetirməməklə) özlərinə zülm edənlər onlara deyilən sözü dəyişdirib başqa şəklə saldılar. Etdikləri haqsızlığa görə Biz də onlara göydən əzab göndərdik.

163. (Ey Peyğəmbərim!) Onlardan (yəhudilərdən) dəniz kənarında yerləşən qəsəbə haqqında xəbər al. O zaman onlar şənbə günü (balıq ovlamaqla Allahın əmrini pozub) həddi aşırdılar. O vaxt şənbə günü (işləmək, ov etmək qadağan edildiyi, ibadətlə məşğul olmaq buyurulduğu üçün üçün) balıqlar (hər tərəfdən suyun üzərində görünüb) dəstə-dəstə onlara tərəf axışır, şənbədən başqa günlərdə isə gəlmirdi. İtaətdən çıxdıqları (günah işlədikləri) üçün Biz onları belə imtahana çəkirdik.

164. Onlardan (dəniz kənarındakı qəsəbədə yaşayan İsrail oğullarından) bir dəstə: “Allahın məhv edəcəyi və ya şiddətli əzab verəcəyi bir tayfaya nə üçün öyüd–nəsihət verirsiniz?” – dediyi zaman, (nəsihət verənlər) onlara cavab olaraq: “(İnsanları yaxşı işlərə sövq etmək, pis işlərdən çəkindirmək bizə vacib olduğundan) bu, Rəbbiniz qarşısında üzrxahlıq etmək üçündür. Bəlkə, onlar (bu öyüd-nəsihətdən nəticə çıxarıb) pis əməllərdən çəkinsinlər!” – dedilər.

165. Onlar (balıq ovlayanlar) özlərinə verilən öyüdü unutduqları zaman Biz də (onları) pislikdən çəkindirənlərə nicat verdik, zülm edənləri isə itaətdən çıxdıqları, günah işlətdikləri üçün şiddətli bir əzabla məhv etdik.

166. Qadağan olunduqları işə (balıq ovuna) saymazyana münasibət bəslədikləri vaxt onlara: “Həqir (zəlil) meymunlar olun!” – deyə əmr etdik.

167. (Ey Rəsulum!) O zaman Rəbbin onlara (yəhudilərə) qiyamət gününədək şiddətli əzab verəcək kimsələr göndərəcəyini xəbər vermişdi. Həqiqətən, Rəbbin (günahkarlara) tezliklə əzab verəndir. Sözsüz ki, O, həm də (tövbəkarları) bağışlayandır, rəhm edəndir!

168. (Yəhudiləri) yer üzündə (ayrı-ayrı) dəstələrə parçaladıq. İçərilərində əməlisaleh olanlar da, olmayanlar da var idi. Onları yaxşı-yamanla imtahan etdik ki, bəlkə, (haqq yola) dönsünlər.

169. Onlardan sonra yerlərinə kitaba (Tövrata) sahib olan xələflər keçdilər. Onlar fani dünya malını alıb deyirdilər: “Biz (Allah tərəfindən) bağışlanacağıq!” Onlara bunun misli qədər (kimi) daha bir haram gəlsəydi, onu da alardılar. Məgər Allaha dair yalnız haqqı demək barədə kitabda (Tövratda) onlardan əhd alınmamışdımı?! Halbuki orada (kitabda) olanları oxuyub öyrənmişdilər. Axirət evi Allahdan qorxanlar üçün daha xeyirlidir. Məgər dərk etmirsiniz?

170. Kitabdan (möhkəm) yapışanlar, (vaxtlı-vaxtında, lazımınca) namaz qılanlar (bilsinlər ki) Biz əməlisalehlərin mükafatını zay etmirik!

171. Bir zaman dağı (Tur dağını) yerindən qoparıb onların (İsrail oğullarının) başı üstünə kölgəlik (tavan) kimi qaldırmışdıq və onlar da elə güman etmişdilər ki, dağ üstlərinə düşəcək. Onlara: “Sizə verdiyimizdən (Tövratdan) möhkəm yapışın, orada olanları yada salın ki, bəlkə, pis əməllərdən çəkinəsiniz!” – demişdik.

172. (Ey Peyğəmbərim!) Xatırla ki, bir zaman Rəbbin Adəm oğullarının bellərindən (gələcək) nəsillərini çıxardıb onların özlərinə (bir-birinə) şahid tutaraq: “Mən sizin Rəbbiniz deyiləmmi?” – soruşmuş, onlar da: “Bəli, Rəbbimizsən!” – deyə cavab vermişdilər. (Belə bir şahidliyin səbəbi) qiyamət günü: “Biz bundan qafil idik”;

173. Və ya: “Atalarımız daha əvvəl (Allaha) şərik qoşmuşdular, bis də onlardan sonra gələn bir nəsil idik (onların izi ilə getdik). Məgər biz batilə uyanların (haqq yoldan sapanların) törətdikləri əməllərə görə məhv edəcəksən?” – deməməniz üçündür.

174. Biz ayələrimizi belə ətraflı izah edirik ki, onlar, bəlkə, (batildən haqqa, küfrdən imana) dönələr!

175. (Ya Rəsulum!) Onlara (yəhudilərə) ayələrimizi verdiyimiz kimsənin xəbərini də söylə (oxu). O, (ayələrimizi inkar edib)

imandan döndü. Şeytan onu özünə tabe etdi və o, (haqq yoldan) azanlardan oldu

176. Əgər Biz istəsəydik, onu (həmin ayələrlə) ucaldardıq. Lakin o, yerə (dünyaya) meyl edib nəfsinin istəklərinə uydu. O elə bir köpəyə bənzəyir ki, üstünə cumsan da dilini çıxardıb ləhləyər, cummasan da (Onun üçün heç bir fərqi yoxdur). Bu, ayələrimizi yalan hesab edənlər barəsində çəkilən məsəldir. (Ey Peyğəmbərim!) Bu əhvalatları (yəhudilərə) söylə ki, bəlkə, (lazımınca) düşünsünlər!

177. Ayələrimizi yalan hesab edib özlərinə zülm edənlər barəsində çəkilən məsəl necə də pisdir!

178. Allahın doğru yola yönəltdiyi kimsə kimsə doğru yoldadır. Onun (haqq yolundan) sapdırdığı kimsələr isə ziyana uğrayanlardır.

179. Biz cinlərdən və insanlardan bir çoxunu Cəhənnəm üçün yaratdıq. Onların qəlbləri vardır, lakin onunla (Allahın birliyini sübut edən dəlilləri, özlərinin dini borc və vəzifələrini) anlamazlar. Onların gözləri vardır, lakin onunla (Allahın möcüzələrini) görməzlər. Onların qulaqları vardır, lakin onunla (öyüd-nəsihət) eşitməzlər. Onlar heyvan kimidirlər, bəlkə də, (ondan) daha çox zəlalətdədirlər. Qafil olanlar da məhz onlardır!

180. Ən gözəl adlar (əsmayi-hüsna) Allahındır. Onu bu adlarla çağırıb dua edin. Onun adları barəsində küfr edənləri (əziz sözündən Uzza, Allah sözündən əl-Lat, mənnan sözündən Mənat kimi adlar düzəldib haqq yoldan azanları) tərk edin. Onlar etdikləri əməllərin cəzasını alacaqlar!

181. Yaratdıqlarımız içərisində bir zümrə də vardır ki, onlar insanları haqq yola aparır, (haqqı rəhbər tutaraq onlar arasında) ədalətlə hökm edirlər.

182. Ayələrimizi yalan hesab edənləri haradan olduğunu özləri də bilmədən tədriclə məhvə yaxınlaşdıracağıq! (dərəcə-dərəcə aşağı endirəcəyik)!

183. Mən onlara möhlət verirəm. Lakin dolaşdırıb bəla toruna salmağım da (naz-nemət içində yaşadıqları halda gözlənilmədən onları əzabla yaxalamağım da), sözsüz ki, çox ağırdır!

184. Məgər (islamı qəbul etməli olan kəslər) düşünmürlərmi ki, onların yoldaşında (Peyğəmbərdə) hər bir cünunluq (dəlilik) əsər-əlaməti yoxdur? O ancaq (kafirlərə Allahın əzabı gələcəyini) açıq-aydın xəbər verib qorxudandır!

185. Məgər onlar göylərin və yerin mülkünə (Allahın göylərdəki və yerdəki səltənətinə, qüdrətinə), Allahın yaratmış olduğu hər şeyə, əcəllərinin yaxınlaşması ehtimalına diqqət yetirib düşünmürlərmi? Artıq buna (bu Qurana) inanmadıqdan sonra hansı kəlama inanacaqlar?

186. Allah kimi doğru yoldan sapdırsa, ona yol göstərən olmaz. (Allah) onları öz azğınlıqları içində şaşqın bir vəziyyətdə qoyar!

187. (Ya Rəsulum!) Səndən saat (qiyamət günü) haqqında soruşarlar ki, nə vaxt qopacaq? De: “O ancaq Rəbbimə məlumdur. (Qiyamətin) qopacağı vaxtı Allahdan başqa heç kəs bilə bilməz. Göylərdə və yerdə (Allahdan qeyri) bir kimsənin onu bilməsi çətindir. O sizlərə ancaq qəflətən gələr!” Sən onun haqqında bir şey bilirsənmiş kimi onlar (səndən) israrla soruşarlar. De: “O ancaq Allah dərgahında məlumdur, lakin insanların əksəriyyəti (bunu) bilməz!”

188. De: “Mən Allahın istədiyindən başqa özümə nə bir xeyir, nə də bir zərər verə bilərəm. Əgər qeybi bilsəydim, sözsüz ki, (özüm üçün) daha çox xeyir tədarük edərdim (savab qazanmaq üçün dünyada daha çox yaxşı işlər görərdim) və mənə pislik də toxunmazdı. Mən iman

gətirən bir tayfanı (pis əməlləri müqabilində Allahın əzabı ilə) ancaq qorxudan və (yaxşı əməlləri müqabilində isə Cənnətlə) müjdələyənəm!”

189. Sizi tək bir nəfərdən (Adəmdən) xəlq edən və onunla ünsiyyət etmək (sakit, rahat olmaq) üçün özündən (qabırğasından) zövcəsini (Həvvanı) yaradan Odur. (Adəm) zövcəsi ilə yaxınlıq etdikdə o, (Həvva) yüngül bir yüklə yükləndi (hamilə oldu) və (bir müddət həmin yükü) daşıdı (onunla oturub-durdu). (Həvva) ağırlaşdığı vaxt onların hər ikisi Allaha dua edib: “Əgər bizə saleh (sağlam, ağıllı, hər şeyi yerli-yerində) bir uşaq versən, (bu nemətə görə Sənə) şükür edənlərdən olarıq!” – dedi.

190. Allah onlara saleh övlad verdikdə (Adəm və Həvvadan qeyri valideynlər) özlərinə verdiyi (uşağın adı) ilə əlaqədar Allaha bir para şəriklər qoşmağa başladılar. Allah isə Ona qoşulan şəriklərdən ucadır! (Onun heç bir şəriki yoxdur!)

191. Məgər (bu Adəm övladı) heç bir şey yaratmağa qadir olmayıb özləri yaradılanımı (bütlərimi Allaha) şərik qoşarlar?

192. Halbuki bu bütlər nə onlara (müşriklərə), nə də özlərinə bir kömək edə bilər!

193. Siz onları (müşrikləri və ya bütləri) doğru yola dəvət etsəniz, sizə tabe olmazlar. İstər onları dəvət edin, istər susun – birdir (onlar üçün heç bir əhəmiyyəti yoxdur).

194. Allahdan başqa ibadət etdiyiniz bütlər də sizin kimi bəndələrdir. Əgər (bu bütlərin sizə bir kömək edə biləcəyi barəsindəki iddianızda) doğrusunuzsa, haydı, çağırın onları, sizə cavab versinlər.

195. Məgər onların yeriyən ayaqları, ya tutan əlləri, ya görən gözləri, yaxud eşidən qulaqları var?! De: “Haydı, çağırın şəriklərinizi, mənim barəmdə istədiyiniz hiyləni qurun və mənə heç möhlət də verməyin!

196. Şübhəsiz ki, mənim hamim Kitabı (Quranı) nazil edən Allahdır. O, əməlisalehlərə himayədarlıq edər!

197. Sizin Ondan başqa tapındıqlarınız isə nə sizə, nə də özlərinə bir köməklik edə bilər!”

198. Əgər siz onları (bütləri və ya müşrikləri) sizə doğru yol göstərməyə çağırsanız, eşitməzlər. (Ya Rəsulum!) Sən onları sənə baxan görərsən, halbuki onlar görməzlər!

199. Sən bağışlama yolunu tut, yaxşı işlər görməyi əmr et və cahillərdən üz döndər!

200. Əgər sənə Şeytandan (bu əmr olunduğun işləri yerinə yetirməmək məqsədilə) bir vəsvəsə gəlsə (fəsad toxunsa), Allaha sığın. Şübhəsiz ki, Allah (hər şeyi) eşidəndir, biləndir!

201. Allahdan qorxanlara Şeytandan bir vəsvəsə (zərər) toxunduğu zaman onlar (Allahın əzabını, lütfünü və mərhəmətini) xatırlayıb düşünərlər və dərhal (gözləri açılıb) görən olarlar.

202. (Kafirlərin qardaşları olan şeytanlar) öz qardaşlarını azğınlığa sürükləyər, sonra da (o kafirlər azğınlığa qurşanıb ondan) əl çəkməzlər (və ya Şeytanların yaxalarından əl çəkməzlər).

203. (Ya Peyğəmbərim!) Sən onlara (Məkkə müşriklərinə) bir ayə gətirmədiyin zaman (sənə ayə nazil olmayanda): “Məgər sən onu öz tərəfindən uydurub düzəltməli deyildin? – deyə soruşarlar. De: “Mən ancaq Rəbbimdən mənə vəhy edilənlərə tabe oluram. Bu (Quran, vəhylər) Rəbbiniz tərəfindən (göndərilmiş) aşkar dəlillərdir, həm də iman gətirən bir tayfa üçün hidayət və mərhəmətdir.

204. Quran oxunan zaman onu dinləyin və susun ki, (onun sayəsində) sizə rəhm olunsun!

205. Səhər-axşam yalvararaq, qorxaraq, səsini qaldırmadan ürəyində Rəbbini yad et və qafillərdən olma!

206. Rəbbinin yanında olanlar (Allaha yaxın olan mələklər) Ona ibadət etməyi özlərinə ar bilməzlər. Onu pak, müqəddəs tutub şəninə təriflər deyər və ancaq Ona səcdəyə qapanarlar!

## .8.
## əl-Ənfal (Qənimət) surəsi

**(Mədinədə nazil olmuşdur, 75 ayədir. 30-36-cı ayələr Məkkədə nazil edilmişdir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Ya Peyğəmbərim!) Səndən (müharibədə əldə edilmiş) qənimətlər (onların kimə çatması) haqqında soruşarlar. De: “Qənimətlər Allahın və Peyğəmbərinindir (onun bölünməsi Allaha və Peyğəmbərinə aiddir). Buna görə də əgər (həqiqi) möminsinizsə, Allahdan qorxun, aranızdakı münasibətləri düzəldin, Allaha və Onun Peyğəmbərinə itaət edin!

2. Möminlər yalnız o kəslərdir ki, Allah adı çəkiləndə (Onun heybət və əzəmətindən) ürəkləri qorxudan titrəyər, Allahın ayələri oxunduğu zaman həmin ayələr onların imanlarını daha da artırar, onlar ancaq öz Rəbbinə təvəkkül edər.

3. (Vaxtlı-vaxtında, lazımınca) namaz qılar və verdiyimiz ruzidən (Allah yolunda) sərf edərlər.

4. Onlar həqiqi möminlərdir. Onların öz Rəbbi yanında dərəcələri vardır. Onları (qiyamət günü) bağışlanma və (Cənnətdə) tükənməz (gözəl, minnətsiz) ruzi gözləyir!

5. (Qənimətlərin bölüşdürülməsi üsulundan bəzilərinin narazı qalması) möminlərdən bir dəstənin (Bədr vuruşuna getmək) xoşuna gəlmədiyi halda, Rəbbinin səni haqq (cihad) uğrunda öz evindən çıxartmasına bənzər! (Bəzi möminlər müsəlmanların sayca az, qüvvətcə zəif olduqları üçün Bədr müharibəsinə getməyi Peyğəmbər əleyhissəlama məsləhət görməmiş, özləri də orada iştirak etmək istəməmişdilər. Lakin Peyğəmbər onların sözünə baxmayıb yaxın əshabələri ilə vuruşa yollanmış və düşməni məğlub edərək xeyli qənimət əldə etmişdi. Qənimətin bölünməsi haqqında cürbəcür təkliflər irəli sürülmüş, nəhayət Peyğəmbər bu barədə öz fikrini demişdi. Bu fikir əvvəlcə bəzilərinin xoşuna gəlməmiş, sonra onun düzgünlüyü başa düşülüb hamılıqla qəbul edilmişdi. Beləliklə, hər iki halda – həm müharibəyə getməkdə, həm də qənimətlərin bölünməsi üsulunda Peyğəmbər əleyhissəlamın haqlı olduğu sübuta yetmişdi).

6. Gözləri baxa-baxa ölümə sürüklənirlərmiş kimi, haqq (Bədr vuruşunun vacib olması) bəlli olduqdan sonra belə, onlar yenə də bu barədə səninlə mübahisə edirdilər.

7. O zaman Allah sizə iki dəstədən birinin (Şamdan qayıdan karvanın və ya Məkkədən çıxıb onların köməyinə gələn Qüreyş əsgərlərinin) sizin olmasını vəd edirdi. Siz silahsız (qüvvətsiz) karvanın sizin olmasını arzu edirdiniz. Allah isə Öz sözləri (bu barədə nazil etdiyi ayə) ilə haqqı (islamı) bərqərar etmək və kafirlərin kökünü kəsmək istəyirdi.

8. (Allah bununla) günahkarların xoşuna gəlməsə də, haqqı (islamı) bərqərar etmək və batili (küfrü) yox etmək istəyirdi.

9. O zaman siz (dua edərək) Rəbbinizdən kömək diləyirdiniz. (Allah: ) “Mən sizin imdadınıza bir-birinin ardınca gələn min mələklə çatacağam!” – deyə duanızı qəbul buyurmuşdu.

10. Allah bu köməyi sizə yalnız sizin üçün bir müjdə və ürəkləriniz sakit olsun deyə etmişdi. Qələbə yalnız Allahdandır. Allah yenilməz qüvvət sahibi, hikmət sahibidir!

11. O vaxt (Bədr vuruşunda) Öz tərəfindən (köməyindən) arxayınlıq əlaməti olaraq, Allah sizi xəfif bir uyğuya daldırmış, sizi (çirkdən-pasdan) təmizləmək (və ya dəstəmaz almaq), Şeytanın vəsvəsəsini sizdən çıxartmaq, ürəklərinizi (qələbəyə inamla) doldurmaq və (quma batmasın deyə) ayaqlarınızın altını möhkəm etmək üçün göydən üstünüzə yağış yağdırmışdı.

12. (Ya Peyğəmbərim!) Xatırla ki, o zaman Rəbbin mələklərə belə vəhy edirdi: “Mən də sizinləyəm. Möminlərə qüvvət (mətanət) verin. Mən kafirlərin ürəklərinə qorxu salacağam. Onların boyunlarını vurun, bütün barmaqlarını (əl-ayaqlarını) doğrayın!”

13. Bu onların Allaha və Onun Peyğəmbərinə qarşı çıxmalarına görədir. Kim Allaha və Onun Peyğəmbərinə qarşı çıxsa, (bilsin ki) Allah (ona) şiddətli əzab verər.

14. Hələ ki, bunu (dünyadakı bu əzabı) dadın. Kafirləri üstəlik cəhənnəm əzabı da gözləyir.

15. Ey iman gətirənlər! Kafirlərlə bir yerə toplaşdıqları vaxt rastlaşsanız, dönüb onlardan qaçmayın!

16. (Düşməni aldatmaq məqsədilə yalandan özünüzü qaçan kimi göstərib) təkrar döyüş üçün bir tərəfə çəkilən və ya (kömək məqsədilə müsəlmanlardan ibarət) başqa bir dəstəyə qoşulan istisna edilməklə, kim belə bir gündə düşmənə arxa çevirib qaçarsa, sözsüz ki, Allahın qəzəbinə uğramış olar. Onun məskəni Cəhənnəmdir. Ora nə pis dönüş yeridir.

17. (Ey möminlər Bədrdə) onları (kafirləri) siz öldürmədiniz, Allah öldürdü. (Ya Peyğəmbərim! Düşmənlərin gözünə bir ovuc torpaq)

atdığın zaman sən atmadın, Allah atdı. Allah bununla möminləri (qənimət əldə etmək və zəfər çalmaq üçün) yaxşı bir imtahandan keçirtdi. Allah (hər şeyi) eşidəndir, biləndir!

18. Bu (hadisələr) bir həqiqətdir. Allah, sözsüz ki, kafirlərin hiyləsini zəiflədəndir!

19. (Ey müşriklər!) Əgər siz (Kəbənin örtüklərinə yapışıb dua edərək) qələbə istəyirsinizsə, artıq sizə zəfər (möminlərin qələbəsilə Allahın əleyhinizə olan hökmü) gəldi. Əgər (küfrdən və Peyğəmbərə qarşı müharibə aparmaqdan) əl çəksəniz, bu sizin xeyrinizə olar. Yox, əgər təkrar (müharibəyə) qayıtsanız, Biz də qayıdarıq. Dəstəniz nə qədər çox olsa da, sizdən heç bir şeyi (Allahın bəlasını, əzabını) dəf edə bilməz. Allah, həqiqətən, möminlərlədir!

20. Ey iman gətirənlər! Allaha və Onun Peyğəmbərinə itaət edin, (Quranı, oradakı öyüd-nəsihətləri) eşitdiyiniz halda, ondan üz döndərməyin!

21. Eşitmədikləri (ürəkləri ilə təsdiq etmədikləri) halda (dilləri ilə): “Eşitdik!” deyənlər (münafiqlər) kimi olmayın!

22. Allah yanında (yer üzündə) gəzən canlıların ən pisi (haqqı) dərk etməyən karlar və lallardır.

23. Əgər Allah (əzəldən) onlarda bir xeyir (olacağını) bilsəydi, (haqq sözü) onlara eşitdirərdi. Onlar eşitməsəydilər belə, yenə də (haqdan inadla) üz çevirərək dönüb gedərdilər.

24. Ey iman gətirənlər! Peyğəmbər sizi, sizləri dirildəcək bir şeyə (imana, haqqa) dəvət etdiyi zaman Allahın və Onun Peyğəmbərinin dəvətini qəbul edin. Bilin ki, Allah insanla onun qəlbi arasına girər (insanın bütün varlığına hakim olar; Allah ürəklərdən keçən hər şeyi bilir, bütün ürəklərin ixtiyarı da Onun əlindədir) və siz axırda Onun hüzuruna cəm ediləcəksiniz!

25. Sizdən təkcə zalımlara toxunmayacaq (pis əməllərin müqabilində hamıya üz verə biləcək) bəladan qorxun. Bilin ki, Allah (Onun əmrlərini pozanlara) şiddətli əzab verəndir!

26. (Ey mühacirlər!) Xatırlayın ki, bir zaman siz yer üzündə (Məkkədə) az idiniz; zəif (aciz) sayılırdınız, (buna görə də) adamların (kafirlərin) sizi ələ keçirməsindən qorxurdunuz. (Belə bir vaxtda Allah) sizə (Mədinədə) sığınacaq verdi, (Bədrdə) sizə köməklik göstərib müdafiə etdi və təmiz (halal qənimətlərdən) ruzi verdi ki, bəlkə, şükür edəsiniz!

27. Ey iman gətirənlər! Bilə-bilə Allaha, Peyğəmbərə (Onun Peyğəmbərinə) və aranızdakı əmanətlərə xəyanət etməyin! (Allahın əmrlərinə, Peyğəmbərin şəriətinə, dini vəzifələrinizə və borclarınıza sadiq olun!)

28. Bilin ki, mal-dövlətiniz və övladınız sizin üçün (Allah qarşısında) ancaq bir imtahandır. Ən böyük mükafat isə məhz Allah yanındadır!

29. Ey iman gətirənlər! Əgər Allahdan qorxsanız, O sizə haqla-nahaqı ayırd edən (bir nur) verər (dünyada və axirətdə çıxış yolu göstərər), günahlarınızın üstünü örtüb sizi bağışlayar. Allah böyük lütf (mərhəmət) sahibidir!

30. (Ya Rəsulum!) Yadına sal ki, bir zaman kafirlər səni həbs etmək və ya öldürmək, yaxud da (Məkkədən) çıxardıb qovmaq üçün (Darunnədvədə) sənə qarşı hiylə qururdular. Allah da (onların bu hiyləsinə qarşı) tədbir tökdü. Allah tədbir tökənlərin ən yaxşısıdır!

31. Ayələrimiz onlara oxunduğu zaman: “Eşitdik: istəsək, biz də bunu bənzərini deyə bilərik. Bu, qədimlərin əfsanələrindən (uydurmalarından) başqa bir şey deyildir!” – söyləyərlər.

32. Bir zaman da: “Ya Allah! Əgər bu (Quran) Sənin tərəfindən gəlmiş haqdırsa, onda başımıza göydən daş yağdır və ya bizə şiddətli bir əzab göndər!” – demişdilər.

33. Halbuki sən onların arasında ola-ola Allah (sənə hörmət əlaməti olaraq) onlara əzab verən deyildir. (Tövbə edib) bağışlanmalarını diləyərkən də Allah onlara əzab verməz!

34. Lakin onlar (müşriklər) Məscidülhəramın sahibləri (və ya ona xidmət etməyə layiq) olmadıqları halda, (möminlərə onu təvaf etməyə) mane olduqda Allah nə üçün onlara əzab verməsin! Onun sahibləri (və ya Allahın dostları) yalnız Allahdan qorxub pis əməllərdən (küfrdən, şirkdən, bütpərəstlikdən) çəkinənlərdir. Lakin onların (müşriklərin) əksəriyyəti bunu bilməz!

35. Onlar Beytullahın (Kəbənin) yanındakı namazı (duaları) fit verib əl çalmaqdan başqa bir şey deyildir. (Ey müşriklər!) Etdiyiniz küfrə görə indi dadın əzabı!

36. Küfr edənlər öz mallarını (insanları) Allah yolundan döndərmək (islamı qəbul etməyə mane olmaq) üçün sərf edərlər. Onlar mallarını sərf edəcək, lakin sonra (məqsədlərinə çata bilmədiklərinə görə) peşman olacaq, axırda da məğlub ediləcəklər. Kafirlər Cəhənnəm tərəfə sürüklənəcəklər ki,

37. Allah (orada) murdarı (kafiri) pakdan (mömindən) ayırd etsin, sonra murdarları bir-birinin üstünə yığıb hamısını bir yerə toplasın və Cəhənnəmə atsın. Bunlar özlərinə zərər eləyənlərdir!

38. (Ya Rəsulum!) Kafir olanlara de: “Əgər onlar (öz küfrlərindən, Peyğəmbərə və möminlərə qarşı müharibədən) əl çəksələr, keçmişdəki günahları bağışlanar. Yox, əgər yenə (yaramaz işlərə, döyüşməyə) qayıtsalar, əvvəlkilərin (keçmiş ümmətlərin) başına gələnlər onların da başına gələr.

39. (Yer üzündə) fitnə (şirk) qalmayıb, bütün din (ibadət) yalnız Allaha məxsus olanadək onlarla vuruşun. Əgər (Allaha şərik qoşmağa) son qoysalar (bilsinlər ki), Allah onların nə etdiklərini görəndir (bunun əvəzində mükafatlarını verəcəkdir).

40. Əgər onlar (sizdən) üz döndərsələr (sizinlə ədavətə son qoymasalar, iman gətirməkdən, itaət etməkdən boyun qaçırsalar), bilin ki, Allah sizin havadarınızdır. O ən gözəl havadar, ən yaxşı imdada çatandır!

41. (Ey möminlər!) Əgər siz Allaha və haqla batilin ayırd edildiyi gün – iki dəstənin bir-birilə qarşılaşdığı gün (Bədr günü) bəndəmizə (Muhəmmədə) nazil etdiyimizə (ayələrə) iman gətirmisinizsə, bilin ki, ələ keçirdiyiniz hər hansı qənimətin beşdə biri Allahın, Peyğəmbərin, onun qohum-əqrəbasının, yetimlərin, yoxsulların və müsafirlərindir (pulu qurtarıb yolda qalan yolçularındır). Allah hər şeyə qadirdir!

42. O zaman (Bədr günü) siz vadinin (Mədinəyə) ən yaxın tərəfində, onlar (düşmənləriniz) isə ən uzaq tərəfindən idilər. Karvan sizdən aşağıda (sahilə yaxın gözəl, sulu bir yerdə) durmuşdu. Əgər siz (onlarla vuruşmaq üçün müəyyən bir vaxtda üz-üzə gəlmək haqqında) vədələşsəydiniz, (onların çox olmasından və sizi öldürməsindən qorxaraq) təyin etdiyiniz vaxt barəsində aranıza ixtilaf düşərdi. Lakin Allah olacaq işi (möminlərin qələbəsini, kafirlərin məğlubiyyətini) yerinə yetirmək üçün belə etdi ki, həlak olan aşkar bir möcüzə ilə (dəlillə) həlak olsun, sağ qalan da aşkar bir möcüzə ilə sağ qalsın. Həqiqətən, Allah (hər şeyi) eşidəndir, biləndir!

43. O zaman Allah röyanda sənə onları (düşmənləri) az göstərirdi. . Əgər onları sənə çox göstərsəydi, mütləq qorxar və döyüş barəsində bir-birinizlə çənə-boğaz olardınız. Lakin Allah sizi (düşmənin

təhlükəsindən) salamat qurtardı. O, həqiqətən, ürəklərdə olanları biləndir!

44. (Düşmənlə) üz-üzə gəldiyiniz zaman Allah olacaq işi yerinə yetirmək məqsədilə onları sizin gözünüzdə (sayca) az göstərir, sizi də onların gözündə azaldırdı. Bütün işlər axırda Allaha qayıdacaqdır. (Zəfər də, məğlubiyyət də sayın çoxluğu ilə deyil, Allahın iradəsi ilədir).

45. Ey iman gətirənlər! Bir dəstə (kafir dəstəsi) ilə üz-üzə gəldikdə möhkəm olun və Allahı çox yada salın ki, nicat tapasınız!

46. Allah və Onun Peyğəmbərinə itaət edin. Bir-birinizlə çəkişməyin, yoxsa qorxub zəifləyər və gücdən düşərsiniz. Səbr edin, çünki Allah səbr edənlərlədir!

47. (Ey möminlər!) Yurdlarından təkəbbürlə, özlərini camaata göstərmək üçün çıxanlar və (insanları) Allah yolundan döndərənlər (Məkkə müşrikləri) kimi olmayın. Allah onların nə etdiklərindən xəbərdardır!

48. O zaman (Bədr günü) Şeytan onlara öz əməllərini gözəl göstərib demişdi: “Bu gün insanlar içərisində sizə qalib gələ biləcək bir kimsə yoxdur. Mən də sizin (pənahınız) dadınıza çatanam!” Lakin iki dəstə üz-üzə gəldiyi zaman dönüb qaçaraq: “Mənim sizinlə heç bir əlaqəm yoxdur. Mən sizin görmədiklərinizi (möminlərin köməyinə gələn mələkləri) görürəm. Mən Allahdan qorxuram. Allah (Ona asi olanlara) şiddətli əzab verəndir!” – demişdi.

49. O zaman münafiqlər və ürəklərində mərəz (etiqad zəifliyi və islama qarşı şəkk-şübhə) olanlar: “Bunları (müsəlmanları) öz dinləri aldatdı!” – deyirdilər. Lakin Allaha təvəkkül edən (qalib olar). Çünki Allah, həqiqətən, yenilməz qüvvət sahibidir, hikmət sahibidir!

50. (Ya Rəsulum!) Kaş sən kafirləri mələklər onların üzünə və yanlarına vura-vura: “Dadın atəşin əzabını!” – deyib canlarını alanda görəydin!

51. Bu (əzab) sizin öz əllərinizlə qazandığınız (əllərinizin törətdiyi) günahlara görədir. Yoxsa Allah bəndələrinə əsla zülm edən deyildir!

52. Eynilə Firon nəslinin və onlardan əvvəlkilərin hərəkətləri kimi. Onlar Allahın ayələrini yalan hesab etdilər, Allah da onları günahlarına görə yox etdi. Həqiqətən, Allah yenilməz qüvvət sahibidir, cəzası da çox şiddətlidir!

53. (Kafirlərə verilən) bu əzab ona görədir ki, bir tayfa özünə bəxş edilən neməti (naşükürlük üzündən küfrə) dəyişməyincə, Allah da ona əta etdiyi neməti dəyişən (pisliyə çevirən) deyildir. Həqiqətən, Allah (hər şeyi) eşidəndir, biləndir! (Həmin tayfalar Allahın nemətlərinə şükür etmək əvəzinə Ona asi olduqlarına, itaəti küfrlə əvəz etdiklərinə, peyğəmbərlərə qarşı düşmən münasibət bəslədiklərinə görə Allah da onlara verdiyi nemətini qəzəbə, etdiyi yaxşılığı pisliyə çevirib hamısını əzaba düçar etdi).

54. Eynilə Firon nəslinin və onlardan əvvəlkilərin hərəkətləri kimi. Onlar Rəbbinin ayələrini yalan hesab etdilər, Biz də onları günahlarına görə məhv etdik. Firon nəslini (dənizdə) batırdıq. Onların hamısı zalım idi!

55. Allah yanında (yer üzündə) gəzən (yürüyən) canlıların ən pisi küfr edənlərdir. Onlar artıq iman gətirməzlər.

56. Onlar (sənə qarşı müharibə etməmək barədə) əhd bağladığın kimsələrdir ki, (onu bağladıqdan) sonra hər dəfə əhdlərini pozar və Allahdan da qorxmazlar.

57. Əhdi pozanları müharibədə yaxalasan (ələ keçirtsən), onlar ilə (onlara tutacağın divanla, verəcəyin cəza ilə) arxalarında olan

kimsələri də (qorxudub) dağıt ki, onlar (bundan) ibrət alsınlar (bir daha əhdi pozmağa cürət etməsinlər)!

58. Əgər (əhd bağladığın) bir tayfanın sənə xəyanət edə biləcəyindən qorxsan, (döyüşə başlamazdan əvvəl) onlarla olan əhdini pozduğunu açıq-aydın (mərdi-mərdanə) özlərinə elan et. Çünki Allah xainləri sevməz!

59. (Bədr müharibəsində qaçıb) canlarını qurtaran kafirlər əsla elə zənn etməsinlər ki, (əzabımızdan) xilas olmuşlar. Onlar (Allahı özlərinə əzab verməkdən) aciz edə bilməzlər! (Allahın əzabından qaçıb qurtara bilməzlər!)

60. (Ey möminlər) Allahın düşmənini və öz düşməninizi, onlardan başqa sizin bilmədiyiniz, lakin Allahın bildiyi düşmənləri (münafiqləri) qorxutmaq üçün kafirlərə qarşı bacardığınız qədər qüvvə və (cihad üçün bəslənilən) döyüş atları tədarük edin. Allah yolunda nə xərcləsəniz, onun əvəzi artıqlaması ilə ödənilər və sizə heç bir haqsızlıq edilməz!

61. Əgər onlar sülhə (barışığa) meyl etsələr, sən də sülhə meyl et və Allaha bel bağla. Həqiqətən, O (Allah hamınızın sözlərini) eşidəndir, (niyyətlərinizi) biləndir!

62. Əgər onlar səni aldatmaq istəsələr, (qorxma və bil ki, onların şərindən və məkrindən qorumağa) sənə təkcə Allah kifayətdir. (O Allah ki) səni Öz köməyilə və möminlərlə müdafiə edib möhkəmlətdi.

63. Və onların (birini düşmən Ovs və Xəzrəc qəbilələrindən olan ənsarın) ürəklərini (ülfətlə, dostluqla) birləşdirdi. Əgər sən yer üzündə nə varsa, hamısını xərcləsəydin belə, yenə də onların ürəklərini birləşdirə bilməzdin. Lakin Allah onları birləşdirdi, çünki O, yenilməz qüvvət sahibi, hikmət sahibidir.

64. Ya Peyğəmbər! Sənə və sənin ardınca gedən möminlərə təkcə Allah bəs edər.

65. Ya Peyğəmbər! Möminləri döyüşə həvəsləndir (təşviq et). İçərinizdə iyirmi səbirli kişi olsa, iki yüz kafirə, yüz səbirli kişi olsa, min kafirə qalib gələr. Çünki onlar (həqiqətən, Allahın möminlərə olan köməyini) anlamayan bir tayfadır!

66. (Ey möminlər!) İndi Allah (yükünüzü) yüngülləşdirdi. Çünki O sizdə bir zəiflik olduğunu bilirdi. Artıq aranızda yüz səbirli kişi olsa, iki yüz nəfərə (kafirə), min kişi olsa, iki min nəfərə Allahın iznilə qələbə çalar. Allah səbr edənlərlədir!

67. Heç bir peyğəmbərə yer üzündə (küfrün kökünü kəsmək üçün bacardığı qədər çox kafir) öldürməyənə qədər əsirləri özünə mal etmək (onları öldürməyib fidyə müqabilində azad etmək) yaramaz. (Ey möminlər!) Siz (fidyə almaqla) puç dünya malını istəyirsiniz, Allah isə (sizin) axirəti qazanmağınızı istəyir. Allah yenilməz qüvvət sahibi, hikmət sahibidir!

68. Əgər əvvəlcə (bu barədə) Allahdan bir hökm olsaydı (lövhi-məhfuzda qənimətlərin və əsirlərin halal olması haqqında yazılmasaydı), aldığınız (fidyə) müqabilində sizə şiddətli bir əzab üz verərdi (toxunardı).

69. Əldə etdiyiniz qənimətləri halal və təmiz olaraq (halallıq və nuşcanlıqla) yeyin. Allahdan qorxun. Həqiqətən, Allah bağışlayandır, rəhm edəndir!

70. Ya Peyğəmbər! Əlinizdə olan əsirlərə de: “Əgər Allah (Öz əzəli elmi ilə) ürəklərinizdə bir yaxşılıq olduğunu bilsə, sizə sizdən alınandan (fidyədən) daha yaxşısını verər və sizi bağışlayar. Axı Allah bağışlayandır, rəhm edəndir!

71. Əgər əsirlər sənə xəyanət etmək istəsələr, (bilsinlər ki) bundan (Bədr vuruşundan) əvvəl Allaha xəyanət etmişdilər. Allah (sənə Bədrdə olanlardan intiqam almağa) imkan verdi. Allah (hər şeyi) biləndir, hikmət sahibidir!

72. İman gətirib hicrət edənlər, Allah yolunda malları və canları ilə cihad edənlər (mühacirlər) və (Peyğəmbərlə mühacirlərə) sığınacaq verib kömək istəyənlər (ənsar) – məhz onlar bir-birinə dostdurlar (varisdirlər). İman gətirib hicrət etməyənlərə gəldikdə isə, onlar hicrət etməyənə qədər sizin heç bir şeydə onlara varisliyiniz yoxdur (onların dostluğundan sizə heç bir mənfəət və ya qohum olsanız belə, aranızda heç bir varislik yoxdur). Lakin əgər onlar din yolunda (kafirlərə qarşı) sizdən kömək istəsələr, aranızda saziş olan bir tayfa əleyhinə yardım istisna olmaqla, onlara kömək göstərmək sizə vacibdir. Allah nə etdiklərinizi görəndir!

73. Kafirlər də bir-birinin dostlarıdır (köməkçiləridir). Əgər siz bunları (yuxarıda sizə buyurulanları) etməsəniz, yer üzündə böyük bir fitnə-fəsad olar (islam zəifləyər, küfr isə artıb qüvvətlənər).

74. İman gətirib (Məkkədən Mədinəyə) köçənlər, Allah yolunda cihad edənlər (mühacirlər) və (Peyğəmbərlə mühacirlərə) sığınacaq verib kömək edənlər (ənsar) – məhz onlar həqiqi möminlərdir. Onları (axirətdə) bağışlanma və tükənməz (gözəl, minnətsiz) ruzi gözləyir!

75. Sonradan (Hüdeybiyyə sazişindən sonra, Məkkənin fəthindən əvvəl) iman gətirib hicrət edənlər və sizinlə bərabər döyüşənlər (cihad edənlər) də sizdəndirlər. Qohumlar Allahın Kitabında (lövhi-məhfuzda və ya Quranda irs, varislik baxımından) bir-birinə daha uyğundurlar (yaxındırlar). Həqiqətən, Allah hər şeyi biləndir! (Məkkənin fəthinə qədər mühacirlər və ənsar qohumluq əlaqələrindən asılı olmayaraq bir-birinin varisi hesab edilirdilər.

Məkkənin fəthindən sonra bu hökm ləğv olunub varislik hüququ yalnız qohumlara aid edildi).

## .9.
## ət-Tovbə (Tövbə) surəsi
**(Mədinədə nazil olmuşdur, 129 ayədir)**

1. Allahdan və Onun Peyğəmbərindən saziş bağladığımız müşriklərə (onlarla olan əhdlərinin pozulması, əlaqələrin kəsilməsi barədə) bir xəbərdarlıq!

2. (Ey müşriklər!) Yer üzündə dörd ay sərbəst gəzib dolaşın və bilin ki, siz Allahı aciz qoya bilməzsiniz (Allahın əzabından qaçıb canınızı qurtara bilməzsiniz). Allah kafirləri (dünyada və axirətdə) rüsvay edəcəkdir!

3. Allahdan və Onun Peyğəmbərindən böyük həcc günü (zülhiccə ayında vacib, fərz olan həcc; qurban bayramı və ya Ərəfə günü) insanlara bir bildiriş! Allahın və Onun Peyğəmbərinin müşriklərlə heç bir əlaqəsi yoxdur. Əgər (küfrdən və şirkdən) tövbə etsəniz, bu sizin üçün xeyirli olar. Əgər (imandan) üz döndərsəniz, bilin ki, Allahın əzabından qaçıb canınızı qurtara bilməzsiniz. (Ey Peyğəmbərim!) Kafir olanları şiddətli bir əzabla müjdələ!

4. Müqavilə bağlandıqdan sonra sizə qarşı bir naqislik etməmiş (onun şərtlərini pozmamış) və sizin əleyhinizə heç kəsə yardım göstərməmiş müşriklər istisnadır. Onlarla əhdinizə axıra qədər (müddəti bitənədək) vəfa edin. Şübhəsiz ki, Allah müttəqiləri (əhdi nahaq yerə pozmaqdan çəkinənləri) sevər!

5. Haram aylar (onlara möhlət verilmiş zülhiccə, məhərrəm, səfər və rəbiüləvvəl ayları) çıxınca müşrikləri harada görsəniz, öldürün, yaxalayıb əsir alın, həbs (mühasirə) edin və bütün yollarını – keçidlərini tutun. Lakin əgər tövbə etsələr, namaz qılıb zəkat

versələr, onları sərbəst buraxın (işiniz olmasın). Həqiqətən, Allah bağışlayandır, rəhm edəndir!

6. Əgər (basqına uğrayan) müşriklərdən biri səndən aman istəsə, ona aman ver ki, Allah kəlamını (Quranı) dinləsin. Sonra (islamı qəbul etmədiyi təqdirdə) onu əmin olduğu (müşriklərin yaşadığı) yerə çatdır. Çünki onlar (haqqı) bilməyən bir tayfadır!

7. Məscidülhəramın yanında (Hüdeybiyyədə) müqavilə bağladığınız kəslər (Bəni–Zəmirə və Kinanə qəbilələri) istisna olmaqla, müşriklərin Allah və Onun Peyğəmbəri yanında necə əhdi ola bilər?! Onlar sizinlə doğru-düzgün davrandıqca (əhdi pozmadıqca) siz də onlarla doğru-düzgün dolanın. Həqiqətən, Allah müttəqiləri (xəyanətdən, əhdi pozmaqdan çəkinənləri) sevər!

8. Necə ola bilər ki, onlar sizə qalib gəlsələr, nə bir anda, nə də bir əhdə əməl edərlər? Onlar ürəkləri istəmədikləri halda, sözdə sizi razı salmağa çalışarlar. Onların əksəriyyəti (Allaha asi olan, itaətdən çıxan, əhdi pozan) fasiqlərdir!

9. Onlar (müşriklər və ya onlara yardım edən yəhudilər) Allahın ayələrini ucuz qiymətə satdılar, sonra da (insanları) Onun yolundan döndərdilər (islamı qəbul etməyə mane oldular). Həqiqətən, onların gördükləri iş necə də pisdir!

10. Onlar bir mömin barəsində nə bir anda, nə də bir əhdə əməl edərlər. Onlar (günah etməklə) həddi aşanlardır!

11. Əgər tövbə etsələr, namaz qılıb zəkat versələr, onlar sizin din qardaşlarınızdır. Biz ayələrimizi anlayıb bilən bir tayfa üçün belə ətraflı izah edirik!

12. Əgər əhd bağladıqdan sonra andlarını pozsalar və dininizi yamanlayıb təhqir etsələr, (sözlərinin üstündə durmayan) küfr başçıları ilə vuruşun. Onların həqiqətdə andları (əhdləri) yoxdur

(onlar üçün heç bir andın, əhdin əhəmiyyəti yoxdur). Bəlkə, (bu yaramaz işlərdən) əl çəkələr!

13. (Ey möminlər!) Məgər siz andlarınızı (əhdlərini) pozan, Peyğəmbəri (öz yurdundan) çıxardıb qovmaq niyyətində olan, üstəlik sizinlə döyüşə də birinci başlayan bir tayfa ilə vuruşmayacaqsınızmı? Məgər onlardan qorxursunuz? Əgər (həqiqi) möminlərsinizsə, bilin ki, əslində qorxmalı olduğunuz məhz Allahdır!

14. Onlarla vuruşun ki, Allah sizin əlinizlə onlara əzab versin, onları rüsvay etsin, sizə onların üzərində qələbə çaldırıb möminlərin ürəklərini fərəhləndirsin.

15. Və onların (müşriklərin əlindən əziyyət çəkən müsəlmanların) qəlblərindən qəzəbi silib aparsın. Allah istədiyi kəsin tövbəsini qəbul edər. Allah (hər şeyi) biləndir, hikmət sahibidir!

16. Yoxsa elə güman edirsiniz ki, Allah içərinizdə cihad edənləri, Allahdan, Onun Peyğəmbərindən və möminlərdən başqasını özlərinə dost tutanları ayırd etməmiş siz sərbəst buraxılacaqsınız? Allah nə etdiklərinizdən xəbərdardır!

17. Müşriklər küfr etdikləri barədə öz-özlərinə şahid olduqları halda, Allahın məscidlərini təmir etmək onlara layiq olmaz. Onların əməlləri puça çıxmışdır. Onlar Cəhənnəmdə (atəşdə əbədi qalacaqlar!)

18. Allahın məscidlərini yalnız Allaha və qiyamət gününə iman gətirən, namaz qılıb zəkat verən və Allahdan başqa heç kəsdən qorxmayanlar təmir edə bilərlər (yalnız bu qəbildən olan şəxslərin əməlləri Allah dərgahında qəbul olunar). Məhz onlar doğru yolu tapa bilənlərdən ola bilərlər!

19. (Ey müşriklər!) Məgər siz hacılara su verməyi və Məscidülhəramı təmir etməyi Allaha və qiyamət gününə iman gətirib

Allah yolunda cihad edənlərdə eynimi tutursunuz? Onlar Allah yanında eyni olmazlar. Allah zalım tayfanı doğru yola yönəltməz!

20. İman gətirib hicrət edənləri, Allah yolunda malları və canları ilə vuruşanları Allah yanında ən yüksək dərəcələr gözləyir. Onlar nicat tapanlardır (xeyrə qovuşanlardır).

21. Rəbbi onları Özündən bir mərhəmət (bağışlanma), razılıq və içərisində onlar üçün tükənməz nemətlər olan cənnətlərlə müjdələr.

22. Onlar orada əbədi qalacaqlar. Böyük mükafat, həqiqətən, Allah yanındadır!

23. Ey iman gətirənlər! Əgər atalarınız və qardaşlarınız küfrü imandan üstün tuturlarsa, onları özünüzə dost bilməyin. Sizdən onları dost tutanlar özlərinə zülm etmiş olarlar.

24. (Ya Rəsulum!) De: “Əgər atalarınız, oğullarınız, qardaşlarınız, övrətləriniz, qəbiləniz (qohumlarınız), qazandığınız mallar, kasad olmasından qorxduğunuz ticarət, xoşunuza gələn məskənklər sizə Allahdan, Onun Peyğəmbərindən və Allah yolunda cihaddan daha əzizdirsə, Allahın əmri (əzabı) gəlincəyə qədər gözləyin. Allah fasiqləri doğru yola yönəltməz!

25. Allah sizə bir çox yerlərdə, həmçinin Hüneyn (vuruşu) günündə kömək etdi. O gün çox olmağınız xoşunuza gəlsə də, bir faydası olmadı, gen dünya sizə dar oldu (yer üzü genişliyinə baxmayaraq sizə dar gəldi), sonra dönüb qaçdınız.

26. Sonra da Allah Öz Peyğəmbərinə və möminlərə arxayınlıq nazil etdi, (köməyinizə mələklərdən ibarət) görmədiyiniz əsgərlər endirdi və kafirləri əzaba düçar etdi. Bu, kafirlərin cəzasıdır!

27. Bundan (bu əzabdan) sonra Allah yenə də istədiyinin tövbəsini qəbul edər. Allah bağışlayandır, rəhm edəndir!

28. Ey iman gətirənlər! Müşriklər (batinləri xəbis, etiqadları puç və iyrənc olduğuna, su başına çıxdıqdan sonra yuyunmadıqlarına, dəstəmaz almadıqlarına və cənabət qüslü etmədiklərinə görə), doğrudan da, murdardırlar. Özlərinin bu ilindən (hicrətin doqquzuncu ilindən) sonra Məscidülhərama yaxınlaşmasınlar. Əgər yoxsulluqdan (ehtiyacdan) qorxursunuzsa, (bilin ki) əgər Allah istəsə, öz nemətindən (verib) sizi mütləq dövlətli edəcəkdir. Allah (hər şeyi) biləndir, hikmət sahibidir!

29. Kitab əhlindən Allaha və qiyamət gününə iman gətirməyən, Allahın və Peyğəmbərinin haram buyurduqlarının haram bilməyən və haqq dini (islamı) qəbul etməyənlərlə zəlil vəziyyətə düşüb öz əlləri ilə cizyə verincəyə qədər vuruşun.

30. Yəhudilər: “Üzeyr Allahın oğludur”, xaçpərəstlər də: “Məsih (İsa) Allahın oğludur”, - dedilər. Onların ağzında gəzən bu (boş) sözlər daha öncə küfr edənlərin (“mələklər Allahın qızlarıdır” - deyənlərin) sözlərinə bənzəyir. Allah onları öldürsün! (Allah onlara lənət eləsin!) Necə də (yalana uyub haqdan) döndərilirlər!

31. Onlar Allahı qoyub alimlərini və rahiblərini, Məryəm oğlu Məsihi özlərinə tanrılar (rəblər) qəbul etdilər. Halbuki onlar ancaq bir olan Allaha ibadət etmək əmr olunmuşdu. Ondan başqa heç bir tanrı yoxdur. Allah pak və müqəddəsdir. Ona şərik qoşulan bütlərlə heç bir əlaqəsi yoxdur! (Allah müşriklərin Ona şərik qoşduqları bütlərdən uzaqdır!)

32. Onlar Allahın nurunu (dəlillərini, islam dinini, Quranı) ağızları (batil sözləri) ilə söndürmək istəyirlər. Allah isə kafirlərin xoşuna gəlməsə də, ancaq öz nurunu (dinini) tamamlamaq istər.

33. Müşriklərin xoşuna gəlməsə də, onu (islamı) bütün dinlərin fövqündə (bütün dinlərdən üstün) etmək üçün Öz Peyğəmbərini doğru yolla və haqq dinlə göndərən Odur!

34. Ey iman gətirənlər! (Yəhudi) alimlərindən və (xaçpərəst) rahiblərindən çoxu insanların mallarını haqsızlıqla yeyir və (onları) Allah yolundan döndərirlər. (Ya Rəsulum!) Qızıl-gümüş yığıb onu Allah yolunda xərcləməyənləri şiddətli bir əzabla müjdələ!

35. O gün (qiyamət günü) yığdıqları qızıl-gümüş cəhənnəm atəşində qızdırılıb alınlarına, böyürlərinə və kürəklərinə dağ basılacaq (və onlara): “Bu sizin özünüz üçün yığıb saxladığınız mallardır. Yığdığınız mal-dövlətin (əzabını, acısını) dadın!” - (deyiləcəkdir!)

36. Həqiqətən, Allah yanında ayların sayı göyləri və yeri yaratdığı gündən bəri Allahın Kitabında on ikidir. Onların dördü (rəcəb, zülqədə, zülhiccə və məhərrəm) haram aylardır. Bu, doğru dindir (İbrahim və İsmailin gətirdikləri dinin doğru hesabı və hökmüdür). Ona görə də həmin aylarda özünüzə zülm etməyin. Müşriklərin hamısı sizinlə vuruşduqları kimi, siz də onlarla vuruşun və bilin ki, Allah müttəqilərlədir!

37. Həqiqətən, (haram ayları) gecikdirmək (məsələn, rəcəbi şəbana və ya zülqədə, zülhiccə və məhərrəmi gecikdirib səfərə, yaxud başqa bir aya saxlamaq) ancaq küfrü artırmaqdır ki, bununla kafir olanlar (doğru yoldan) azdırılarlar. Onlar Allahın haram etdiyi ayların sayını düzəltmək, Allahın haram buyurduğunu halal etmək məqsədilə onu (gecikdirilən ayı) bir il halal, bir il haram sayarlar. (Ayları gecikdirmək, yerlərini dəyişdirmək və qəməri ilə daha bir ay əlavə etməklə haram olan bir ayı bəzən halal, halal olan bir ayı da bəzən haram hesab edərlər). Pis əməlləri onlara gözəl görünmüşdür. Allah kafir qövmü doğru yola yönəltməz!

38. Ey iman gətirənlər! Sizə nə oldu ki, “Allah yolunda döyüşə çıxın!” – deyildikdə yerə yapışıb qaldınız. Yoxsa axirətdən vaz keçib dünya həyatına razı oldunuz? Halbuki dünya malı axirət yanında (axirətlə müqayisədə) yalnız cüzi bir şeydir!

39. Əgər (sizə əmr olunan bu döyüşə) çıxmasanız, Allah sizə şiddətli bir əzab verər və sizi başqa bir tayfa ilə əvəz edər (yerinizə başqa bir tayfa gətirər). Siz isə Ona (döyüşə çıxmamağınızla Allaha və Peyğəmbərinə) heç bir zərər verə bilməzsiniz. Allah hər şeyə qadirdir!

40. (Ey möminlər!) Əgər siz ona (Peyğəmbərə) kömək etməsəniz, Allah ona kömək göstərmiş olar. Necə ki, kafirlər onu (Məkkədən) iki nəfərdən biri (ikinin ikincisi) olaraq çıxartdıqları, hər ikisi mağarada olduğu və öz dostuna (Əbu Bəkrə): "Qəm yemə, Allah bizimlədir!" –dediyi zaman (göstərmişdi). O vaxt Allah ona bir arxayınlıq (rahatlıq) nazil etmiş, onu sizin görmədiyiniz (mələklərdən ibarət) əsgərlərlə müdafiə etmiş, kafirlərin sözünü alçaltmışdı. Yalnız Allahın sözü (kəlmeyi-şəhadət) ucadır. Allah yenilməz qüvvət, hikmət sahibidir!

41. (Ey möminlər!) Ağırlı-yüngüllü (qocalı-cavanlı, atlı-piyada, güclü-gücsüz, dövlətli-kasıb) hamınız cihada çıxıb malınız və canınızla Allah yolunda vuruşun! Bilsəniz bu sizin üçün nə qədər xeyirlidir!

42. Əgər o (dəvət olunduqları yürüş), asan əldə edilən mənfəət (dünya malı, yaxud qənimət) və orta (mənzilli) bir səfər olsaydı, onlar mütləq sənin ardınca gedərdilər. Lakin yorucu (məşəqqətli) məsafə (Təbuk səfəri) onlara uzaq gəldi. Bununla belə, onlar: "Əgər gücümüz çatsaydı, biz də sizinlə bərabər səfərə çıxardıq", - deyə Allaha and içəcəklər. Onlar (yalandan Allaha and içməklə) özlərini həlak edirlər. Allah isə onların yalançı olduqlarını bilir.

43. Allah səni bağışlasın! (Allah səni əfv etdi). Doğru danışanlar sənə bəlli olmadan, yalançıları tanımadan əvvəl nə üçün onlara (cihadda iştirak etməməyə) izin verdin?

44. Allaha və axirət gününə iman gətirənlər malları və canları ilə cihad etmək barəsində səndən izin istəməzlər (o saat cihada çıxarlar). Allah müttəqiləri tanıyandır!

45. Səndən (cihada çıxmamaq üçün) izin istəyənlər ancaq Allaha, axirət gününə iman gətirməyənlər və ürəkləri şəkk-şübhəyə düşənlərdir. Onlar öz şübhələrində tərəddüd edib durarlar.

46. Əgər onlar (münafiqlər cihada) çıxmaq istəsəydilər, ona hazırlıq görərdilər. Lakin onların davranışı Allaha xoş gəlmədi, buna görə də (cihada çıxmaqlarına) mane oldu. Onlara: "(Evdə) oturanlara (qocalar, zəiflər, qadınlar və uşaqlarla bərabər) siz də oturun!" - deyildi.

47. Əgər (münafiqlər) sizinlə birlikdə (cihada) çıxsaydılar, yalnız içinizdə pozuntunu (fəsadı) artırar və sizi fitnəyə uğratmaq üçün aranıza soxulardılar. İçinizdə onlara qulaq asanlar da vardır. Allah zalımları tanıyandır!

48. Onlar əvvəl də (Ühüd döyüşündə) fitnə törətmək istəmiş və sənin üçün bir para işləri alt-üst etmişdilər. Nəhayət, onlar istəmədikləri halda, haqq gəldi və Allahın əmri zahir oldu.

49. Onlardan (münafiqlərdən): "Mənə (döyüşə getməməyə) izin ver, məni fitnəyə salma!" – deyənlər də var. Bilin ki, onlar (özləri) fitnəyə düşmüşlər. Şübhəsiz ki, Cəhənnəm kafirləri bürüyəcəkdir!

50. Sənə bir yaxşılıq (zəfər, qənimət) nəsib olsa, onların halı pis olar. Sənə bir müsibət üz versə: "Biz tədbirimizi qabaqcadan görmüşük!" deyər və sevincək halda dönüb gedərlər.

51. De: "Allahın bizim üçün (lövhi-məhfuzda) yazdığından başqa bizə heç bir şey üz verməz. O bizim ixtiyar sahibimizdir. Buna görə də möminlər yalnız Allaha təvəkkül etsinlər!"

52. De: “Biz Allahın Özü tərəfindən və ya bizim əlimizlə sizi əzaba düçar etməsini gözlədiyimiz halda, siz bizlərə ancaq iki yaxşı işdən (zəfər çalmaqdan və şəhid olmaqdan) birinin gəlməsinimi gözləyirsiniz? Doğrusu, biz də sizinlə birlikdə gözləməkdəyik”!

53. (Münafiqlərə) de: “İstər könül xoşluğu ilə, istər zorla (mallarınızı) xərcləyin. Onsuz da (Allah dərgahında) sizdən qəbul olunmayacaq. Çünki siz fasiq bir tayfasınız.

54. Onların xərclədiklərinin qəbul olunmasına mane olan yalnız Allahı və Onun Peyğəmbərini inkar etmələri, namaza tənbəl-tənbəl gəlmələri və istəməyə-istəməyə xərcləmələridir.

55. (Ya Peyğəmbərim! Münafiqlərin) nə malları, nə də oğul-uşağı səni təəccübləndirməsin. Allah onlarla ancaq münafiqlərə dünyada əzab vermək, kafir olduqları halda, canlarını almaq istər.

56. (Münafiqlər) sizdən olmaya-olmaya mütləq sizdən olduqları barədə Allaha and içərlər. Lakin onlar (əslində sizin onları öldürmənizdən ehtiyat edən, buna görə də zahirən özlərini müsəlman kimi göstərən) qorxaq bir zümrədir.

57. Əgər onlar bir sığınacaq və ya (gizlənmək üçün) mağara, yaxud girməyə bir deşik (yer) tapsaydılar, tələsik ora üz tutardılar.

58. Onlardan (münafiqlərdən) sədəqələr (onların bölünməsi) barəsində sənə eyib tutanlar da var. Əgər (sədəqədən) onlara bir şey verilsə, razı qalar, verilməsə, dərhal qəzəblənərlər.

59. Kaş münafiqlər Allahın və Peyğəmbərinin onlara verdiklərindən razı qalıb: “Allah bizə kifayətdir. Allah bizə Öz nemətindən bəxş edəcək, Peyğəmbəri də (sədəqədən). Biz, həqiqətən, Allaha ürəkdən bağlananlarıq!” – deyəydilər!

60. Sədəqələr (zəkatlar) Allah tərəfindən müəyyən edilmiş bir fərz (vacib əməl) olaraq ancaq yoxsullara, (ehtiyacı olan, lakin utandığından əl açıb dilənməyən) miskinlərə, zəkatı yığıb paylayanlara, ürəkləri (müsəlmanlığa) isinişib bağlanmaqda olanlara (iman gətirib hələ kamil mömin olmayanlara), azad ediləcək kölələrə (və ya boynuna kəffarə düşüb verə bilməyənlərə), həmçinin (borcu ödəməyə imkanı olmayan) borclulara, Allah yolunda cihad edənlərə və yolçulara (pulu qurtardığı üçün yolda qalan, vətəninə qayıda bilməyən müsafirlərə) məxsusdur. Allah (hər şeyi) biləndir, hikmət sahibidir!

61. (Münafiqlər içində) Peyğəmbəri incidib: “O (hamını dinləyən, hər sözü eşidib inanan) bir qulaqdır”, - deyənlər də var. De: “O qulaq sizin üçün bir nemətdir. Allaha da inanır, möminlərə də. O sizdən iman gətirənlər üçün rəhmətdir. Allahın Rəsuluna əzab verənləri isə şiddətli bir əzab gözləyir!”

62. (Ey möminlər!) Onlar sizin razılığınızı qazanmaq üçün (münafiq olmadıqları barədə) Allaha and içirlər. Əgər onlar mömindirlərsə, (bilsinlər ki) Allahın və Onun Peyğəmbərinin razılığını qazanmaq daha vacibdir!

63. Məgər bilmirlərmi ki, Allaha və Onun Peyğəmbərinə qarşı çıxanı içində əbədi qalacağı cəhənnəm atəşi gözləyir. Bu isə çox böyük rüsvayçılıqdır.

64. Münafiqlər ürəklərində olanları xəbər verəcək bir surənin nazil edilməsindən çəkinirlər. De: “Siz istehza etməyinizdə olun. Allah qorxub çəkindiyiniz şeyi üzə çıxaracaqdır!”

65. (Ya Rəsulum!) Onlardan (Təbuk döyüşünə gedərkən səni lağa qoyan münafiqlərdən nə üçün belə etdiklərini) soruşsan: “Biz ancaq söhbət edib zarafatlaşırdıq (əylənirdik)”,- deyə cavab verərlər. De: “Allaha, Onun ayələrinə və Peyğəmbərinə istehzamı edirsiniz?!

66. (Əbəs yerə) üzr istəməyin. Siz iman gətirdikdən sonra (daxilinizdəki ikiüzlülüyü büruzə verməklə, Allahın əmrlərini unutmaqla) artıq kafir oldunuz. Aranızda bir qismini (tövbə edəcəyinə görə) bağışlasaq da, digər qismini günahkar olduğu üçün əzaba düçar edəcəyik!

67. Münafiq kişilərlə münafiq qadınlar (ikiüzlülükdə) bir-birinin eynidirlər. Onlar (insanlara) pis işlər görməyi əmr edər, yaxşı işləri qadağan edərlər. Hələ əlləri də bərkdir (xəsisdirlər). Onlar Allahı unutdular, Allah da onları unutdu. Həqiqətən, münafiqlər (Allahın itaətindən çıxmış) fasiqlərdir!

68. Allah münafiq kişilərə, münafiq qadınlara və kafirlərə içində əbədi qalacaqları cəhənnəm odu vəd etmişdir. (Atəş, əzab) onlara kifayətdir. Allah onlara lənət elədi (mərhəmətindən qovdu). Onları daimi bir əzab gözləyir!

69. (Ey münafiqlər!) Siz özünüzdən əvvəlkilər kimisiniz. Hələ onlar sizdən daha qüvvətli (möhkəm), mal-dövlət, övlad baxımından daha artıq idilər. Onlar (dünyadakı) qismətlərindən həzz alıb bəhrələndilər. Siz də özünüzdən əvvəlkilər kimi (dünyadakı) qismətinizdən ləzzət alıb bəhrələndiniz. Siz də onlar kimi (yalan bataqlığına) yuvarlandınız. Onların əməlləri dünyada da, axirətdə də puça çıxmışdır. Onlar özlərinə zərər eləyənlərdir!

70. Məgər onlara özlərindən əvvəlki Nuh, Ad, Səmud tayfasının, İbrahim qövmünün, Mədyən əhalisinin və Mötəfikilərin (şəhərləri alt-üst olmuş Lut tayfasının) xəbəri gəlib çatmadımı? Peyğəmbərləri onlara aşkar möcüzələrlə gəlmişdilər. Allah onlara zülm edən deyildi, lakin onlar özlərinə zülm etdilər.

71. Mömin kişilərlə mömin qadınlar bir-birinə dostdurlar (hayandırlar). Onlar (insanlara) yaxşı işlər görməyi əmr edər, pis işləri yasaq edər, namaz qılıb zəkat verər, Allaha və Peyğəmbərinə

itaət edərlər. Allah, əlbəttə ki, onlara rəhm edəcəkdir. Allah, həqiqətən, yenilməz qüvvət sahibi, hikmət sahibidir!

72. Allah mömin kişilərə və qadınlara (ağacları) altından çaylar axan cənnətlər və Ədn cənnətlərində gözəl məskənlər vəd buyurmuşdur. Onlar orada əbədi qalacaqlar. Allahdan olan bir razılıq isə (bunların hamısından) daha böyükdür. Bu, böyük qurtuluşdur (uğurdur)!

73. Ya Peyğəmbər! Kafirlərə və münafiqlərə qarşı vuruş! (Kafirləri qılıncla, münafiqləri isə dəlil-sübutla, sözlə məhv et!) Onlarla sərt davran! Onların məskəni Cəhənnəmdir. Ora nə pis yerdir!

74. (Münafiqlər) Allaha and içirlər ki, (Peyğəmbər haqqında nalayiq sözlər) deməyiblər. (And olsun ki) onlar küfr sözünü demiş, islamı (zahirən) qəbul etdikdən sonra kafir olmuş, müvəffəq ola bilmədikləri bir işə (Təbuk döyüşündən qayıdarkən Peyğəmbərə qarşı hazırladıqları sui-qəsdə) girişmişdilər. (Münafiqlərin Peyğəmbərə və möminlərə qarşı) kin-küdurət bəsləmələrinin səbəbi yalnız Allahın və Peyğəmbərinin Öz nemətləri ilə onları varlandırmasıdır. Bununla belə, əgər (ikiüzlülüklərindən və digər yaramaz əməllərindən) tövbə etsələr, onlar üçün xeyirli olar. Yox, əgər (imandan) üz döndərsələr, Allah onları dünyada və axirətdə şiddətli bir əzaba mübtəla edər. Yer üzündə onların nə bir dostu, nə də bir imdada yetəni var!

75. (Münafiqlərin) bəzisi də Allahla belə əhd etmişdir: “Əgər Allah bizə Öz nemətindən (mal-dövlət) bəxş etsə, biz mütləq sədəqə (həmin malın zəkatını) verəcək və sözsüz ki, əməlisalehlərdən olacağıq”.

76. (Allah) Öz nemətindən onlara (istədiklərini) ehsan buyurduqda xəsislik etdilər və (əhdə vəfa etməyib itaətdən də) üz döndərdilər. Onlar elə zatən dönükdürlər!

77. (Allaha) verdikləri vədə xilaf çıxdıqlarına, yalan danışdıqlarına görə Allah da onların ürəyinə qarşılaşacaqları günə (qiyamət gününə) qədər (davam edəcək) nifaq saldı.

78. Məgər (o münafiqlər) bilmirdilər ki, Allah onların (ürəklərindəki) sirlərini də bilir, gizli danışıqlarını da. Və Allah qeybləri (gizli şeyləri) çox gözəl biləndir?!

79. Könüllü surətdə (bollu) sədəqə verən möminlərə tənə edənləri və güc-bəla ilə əllərinə düşəni təsəddüq edən kəsləri məsxərəyə qoyanları Allah Özü məsxərəyə qoyacaqdır. Onlar şiddətli bir əzaba düçar olacaqlar!

80. (Ya Peyğəmbərim!) Onlar (o münafiqlər) üçün istər bağışlanma dilə, istər diləmə; onlar üçün yetmiş dəfə bağışlanma diləsən də, yenə Allah onları bağışlamayacaq. Bu onların Allahı və Onun Peyğəmbərini inkar etmələrinə görədir. Allah fasiq tayfanı doğru yola yönəltməz!

81. (Təbuk döyüşündə iştirak etməyib) arxada qalanlar (münafiqlər) Allahın Rəsuluna qarşı çıxaraq (evdə) oturub qalmalarına sevindilər, Allah yolunda malları və canları ilə cihad etmək istəmədilər və (möminlərə): “Bu istidə döyüşə çıxmayın!” – dedilər. (Ya Peyğəmbərim!) De: “Cəhənnəm odu daha istidir!” Kaş biləydilər!

82. Qazandıqlarının (qazandıqları günahların) cəzası (əvəzi) olaraq az gülüb çox ağlasınlar!

83. Əgər (Təbuk döyüşündən sonra) Allah səni (Mədinədə qalıb cihada çıxmayan münafiqlərdən) bir dəstənin yanına qaytarsa və onlar səndən (döyüşə çıxmaq üçün) izin istəsələr, de: “Mənimlə əsla (cihada) çıxmayacaq, mənimlə birlikdə heç vaxt heç bir düşmənə qarşı döyüşməyəcəksiniz. Çünki əvvəlcə (evdə) oturmağa razı

oldunuz. İndi də arxada qalanlarla (qadınlar və uşaqlarla) birlikdə (evdə) oturun!”

84. Onlardan (münafiqlərdən) ölən heç bir kəsə heç vaxt namaz qılma, qəbrinin başında durma. Çünki onlar Allahı, Onun Peyğəmbərini dandılar və fasiq olaraq öldülər.

85. Onların nə mal-dövləti, nə də oğul-uşağı səni heyrətə salmasın. Allah bununla onlara (münafiqlərə) ancaq dünyada əzab vermək və kafir olduqları halda, canlarının (çətinliklə) çıxmasını istər.

86. “Allaha iman gətirin, Onun Peyğəmbəri ilə birlikdə vuruşun!” – deyən bir surə nazil edildiyi zaman aralarında sərvət sahibi olanlar səndən izin istəyib: “Qoy biz də (döyüşə çıxmayıb evdə) oturanlarla bir yerdə qalaq!” – deyərlər.

87. Onlar arxada qalanlarla (qadınlar, uşaqlar və xəstələrlə) bir yerdə qalmağı özlərinə rəva bildilər. Onların ürəkləri möhürlənmişdir, buna görə də (Allahın öyüd-nəsihətini, cihadın savabını, ondan boyun qaçırmağın rəzalətini) anlamazlar.

88. Lakin Peyğəmbər və onunla birlikdə olan möminlər malları və canları ilə cihad etdilər (vuruşdular). Bütün nemətlər məhz onlarındır, nicat tapanlar da məhz onlardır!

89. Allah onlar üçün əbədi qalacaqları, (ağacları) altından çaylar axan cənnətlər hazırlamışdır. Bu, böyük qurtuluşdur (uğurdur)!

90. Bədəvilərdən (Təbuk döyüşünə getməmək üçün) izin almağa üzrxahlar gəldi. Allaha və Onun Peyğəmbərinə yalan söyləyənlər isə (üzr belə istəməyib evlərində) oturdular. Onlardan kafir olanlara şiddətli bir əzab üz verəcəkdir.

91. Allaha və Onun Peyğəmbərinə sadiq qalmaq (heç bir pisliyə meyl etməmək) şərtilə, acizlərə (qocalara və anadan gəlmə zəiflərə),

xəstələrə və (cihad yolunda) sərf etməyə bir şey tapa bilməyənlərə (cihadda öz xərcini təmin etməyə qadir olmayanlara döyüşə getməməkdə) heç bir günah yoxdur. Yaxşı işlər görənləri də (üzrlü səbəbə görə evdə qaldıqda) məzəmmət etməyə heç bir əsas (lüzum) yoxdur. Allah bağışlayandır, rəhm edəndir!

92. (Döyüşə getməyə minikdən ötrü) yanına gəldikdə: “Sizin minməyiniz üçün bir heyvan tapmıram”, - deyərkən (cihad yolunda) sərf etməyə bir şey tapa bilmədikləri üçün kədərdən gözlərindən yaş axa-axa geri dönənlərdə heç bir günah yoxdur!

93. Ancaq varlı olduqları halda (döyüşə getməmək üçün) səndən izin istəyənlər məzəmmətə layiqdirlər. Onlar (cihada getməyib) arxada qalanlarla (qadınlar və uşaqlarla) bir yerdə qalmağa razı oldular. Allah onların ürəklərini (qazandıqları günaha görə) möhürləmişdir. Buna görə də onlar (başlarına gələcək müsibəti) bilməzlər!

94. (Döyüşdən geri dönüb) yanlarına qayıtdığınız zaman onlar sizdən üzr istəyərlər. (Onlara) belə de: “(Əbəs yerə) üzr istəməyin, onsuzda sizə inanmayacağıq. Allah əhvalınızdan bizi xəbərdar etmişdir. (Bundan belə) əməlinizi Allah da görəcək, Onun Peyğəmbəri də”. Sonra qeybi və aşkarı bilənin (Allahın) hüzuruna qaytarılacaqsınız, O da sizə nə etdiklərinizi xəbər verəcəkdir!

95. Yanlarına qayıtdığınız zaman onlardan vaz keçməniz (onları məzəmmət etməməniz) üçün (yalandan) Allaha and içəcəklər. Siz də onlardan vaz keçin! (Qoyun qiyamət günü əzabı daha şiddətli olacaq küfr və nifaqlarında davam etsinlər!) Çünki onlar murdardırlar və qazandıqlarının (qazandıqları günahların) cəzası olaraq düşəcəkləri yer də Cəhənnəmdir!

96. Onlardan razı olasınız deyə, qarşınızda (Allaha) and içəcəklər. Siz onlardan razı olsanız da, Allah fasiq bir tayfadan razı olmaz!

97. Bədəvilər küfr və nifaq baxımından daha pis (qəliz) və Allahın öz Peyğəmbərinə nazil etdiyi hökmləri (cahillikləri üzündən) bilməməyə (başa düşməməyə) daha layiqdirlər. Allah (hər şeyi) biləndir, hikmət sahibidir!

98. Bədəvilər içərisində elələri vardır ki, (Allah yolunda) xərclədiklərini ziyan sayar və (bundan xilas olmaq üçün) başınıza bəlalar (münasibətlər) gəlməsini gözləyərlər. (Möminlərə arzu etdikləri) bəla (müsibət) öz başlarına gəlsin! Allah (hər şeyi) eşidəndir, biləndir!

99. Bədəvilər içərisində elələri də vardır ki, Allaha, axirət gününə inanır, xərclədiklərini Allaha yaxınlıq və Peyğəmbərin dualarına nail olmaq üçün vəsilə sayırlar. Bilin ki, bu onlar üçün (Allaha) yaxınlaşmağa bir səbəbdir. Allah onları Öz mərhəmətinə nail edəcəkdir. Həqiqətən, Allah bağışlayandır, rəhm edəndir!

100. (İslamı) ilk əvvəl qəbul edib (bu işdə başqalarından) irəli düşən mühacirlərə və ənsara, həmçinin yaxşı işlər görməkdə onların ardınca gedən kimsələrə gəldikdə, Allah onlardan, onlar da Allahdan razıdırlar. (Allah) onlar üçün əbədi qalacaqları, (ağacları) altından çaylar axan cənnətlər hazırlamışdır. Bu, böyük qurtuluşdur (uğurdur)!

101. Ətrafınızdakı bədəvilər və Mədinə əhalisi içərisində ikiüzlülüyü özlərinə adət etmiş (bu işdə mahir) münafiqlər vardır. Sən onları tanımazsan, Biz isə onları tanıyırıq. Onlara iki dəfə (dünyada və qəbir evində) əzab verəcəyik. Sonra (axirətdə) isə ən böyük əzaba uğrayacaqlar.

102. (Münafiqlərin) bir qismi də günahlarını etiraf etdi. Onlar (əvvəl etdikləri) yaxşı bir əməllə (sonradan etdikləri) pis bir əməli bir-birinə qarışdırmışlar. Ola bilsin ki, Allah onların tövbələrini qəbul etsin. Həqiqətən, Allah bağışlayandır, rəhm edəndir!

103. (Ya Rəsulum!) Onların mallarından sədəqə (zəkat) al. Bununla onları (günahlarından) təmizləmiş, pak etmiş (mallarına bərəkət vermiş, əməllərinin savabını artırmış) olarsan. Onlardan ötrü dua et, çünki sənin duan onlar üçün bir arxayınçılıqdır (rahatlıqdır). Allah (hər şeyi) eşidəndir, biləndir.

104. Məgər onlar bilmirlər ki, Allah qullarından tövbə qəbul edər, sədəqə (zəkat) alar və Allah tövbələri qəbul edəndir, rəhmlidir?!

105. De: "(Ey insanlar, ey tövbəkarlar! İstədiyinizi) edin. Allah, Onun Peyğəmbəri və möminlər əməllərinizi görəcəklər. Siz qeybi və aşkarı bilən Allahın hüzuruna qaytarılacaqsınız, O da sizə nə etdiklərinizi xəbər verəcəkdir!"

106. (Bədəvilərdən və Mədinə əhalisindən) döyüşə getməyənlərin bir qisminin də işi Allaha qalıb. Allah ya onlara əzab verəcək, ya da tövbələrini qəbul edəcək. Allah (hər şeyi) biləndir, hikmət sahibidir!

107. (Quba məscidinə və müsəlmanlara) zərər vurmaq, küfr etmək, möminlər arasına təfriqə salmaq məqsədilə, əvvəllər Allaha və Onun Peyğəmbərinə qarşı müharibə edən kimsədən (gəlib onlara rəhbərlik edəcəyi təqdirdə) göz-qulaq olmaq üçün məscid düzəldən və: "Biz (bununla) yaxşılıqdan başqa bir şey istəmədik", - deyə and içənlərin (münafiqlərin) , həqiqətən, yalançı olmaları barədə Allah Özü şahidlik edəcəkdir!

108. (Ya Rəsulum!) Orada heç vaxt namaz qılma. İlk gündən binası təqva (Allahdan qorxub pis əməllərdən çəkinmək) üzərində qurulmuş məscid namaz qılmağına daha layiqdir. Orada paklanmağı sevən insanlar vardır. Allah pak olanları (özlərini cismən təmizləyənləri, mənəvi qüsurlardan, çirkinliklərdən qorumağa çalışanları) sevər!

109. Elə isə (məscid) binasını Allah qorxusu və rizası üzərində quran kəs daha yaxşıdır, yoxsa uçulmaqda olan bir yerin(uçurumun)

kənarında qurub onunla birlikdə cəhənnəm oduna yuvarlanan kəs?! Allah zalım tayfanı doğru yola yönəltməz!

110. Onların qurduğu bina (məscid) ürəkləri parça-parça olana (ölənə) qədər qəlblərində bir şübhə (nigarançılıq və nifaq mənbəyi) olaraq qalacaqdır. Allah (hər şeyi) biləndir, hikmət sahibidir!

111. Allah, şübhəsiz ki, Allah yolunda vuruşub öldürən və öldürülən möminlərin canlarını və mallarını Tövratda, İncildə və Quranda haqq olaraq vəd edilmiş Cənnət müqabilində satın almışdır. Allahdan daha çox əhdə vəfa edən kimdir? Etdiyiniz sövdəyə görə sevinin. Bu, böyük qurtuluşdur (uğurdur)!

112. (Onlar Allaha) tövbə, ibadət və şükür-səna edənlər, oruc tutanlar (və ya cihad uğrunda, elm təhsil etmək üçün yurdundan ayrılıb başqa yerlərə gedənlər), rüku və səcdə edənlər (namaz qılanlar), yaxşı işlər görməyi əmr edib pis işləri yasaq edənlər və Allahın hədlərini (halal-haramı) qoruyanlardır. (Ya Rəsulum!) Belə möminləri (Cənnətlə) müjdələ!

113. Müşriklərin cəhənnəmlik olduqları (müsəlmanlara) bəlli olduqdan sonra onlarla qohum olsalar belə, Peyğəmbərə və iman gətirənlərə onlar üçün bağışlanma diləmək yaraşmaz!

114. İbrahimin öz atası üçün bağışlanma diləməsi isə ancaq ona verdiyi bir vədə görə idi. Atasının Allaha düşmən olması İbrahimə aydın olduqda o öz atasından uzaqlaşdı (onunla bütün əlaqələrini kəsdi). Həqiqətən, İbrahim (Allaha çox dua edərək) yalvarıb-yaxaran və həlim xasiyyətli bir zat idi.

115. Allah bir tayfanı doğru yola yönəltdikdən sonra qorxub çəkinməli olduqları şeyləri özlərinə bildirmədən onları (haqq yolundan) sapdırmaz! Həqiqətən, Allah hər şeyi (olduğu kimi, layiqincə) biləndir!

116. Həqiqətən, göylərin və yerin hökmü (mülkü) Allaha məxsusdur. Dirildən də, öldürən də Odur. Sizin Allahdan başqa havadarınız və köməyə çatanınız yoxdur!

117. Allah (müsəlmanlardan) bir qismini ürəyi (şəkk-şübhəyə düşüb Peyğəmbərdən və cihaddan) dönmək üzrə ikən Peyğəmbərə, çətin saatda onun arxasında gedən mühacirlərə və ənsara tövbə nəsib etdi. Sonra da onların tövbələrini qəbul buyurdu (onları bağışladı). Çünki O, həqiqətən, onlara qarşı çox şəfqətli, çox rəhimlidir.

118. Həmçinin (Təbuk döyüşündən) geri qalmış üç nəfərin də (tövbələrini qəbul etdi). Belə ki, dünya onlara dar olmuş, ürəkləri (qəm-qüssədən) təngə gəlib sıxılmışdı. Onlar Allahdan (Allahın əzabından) yalnız Onun Özünə sığınmağın mümkün olduğunu başa düşdülər. Şübhəsiz ki, Allah tövbələri qəbul edəndir, rəhmlidir!

119. Ey iman gətirənlər! Allahdan qorxun və (imanında, sözündə, işində) doğru olanlarla olun! (Peyğəmbər və onun sadiq əshabələri ilə birlikdə olun!)

120. Mədinəlilərə və onların ətrafında olan bədəvilərə (döyüşdə) Allahın Peyğəmbərindən geri qalmaq, ondan (ona üz verən məşəqqətlərdən) özlərini kənara çəkmək (belə çətinliklərin özlərinə üz verməsini istəməmək, beləliklə də, özlərini Peyğəmbərdən üstün tutmaq) yaraşmaz. Çünki Allah yolunda onlara elə bir susuzluq, yorğunluq və aclıq üz verməz, kafirlərin qəzəbinə səbəb olan elə bir yerə onlar ayaq basmaz və düşməndən elə bir bəla, müsibət görməzlər ki, bunların müqabilində onlara yaxşı bir əməl yazılmamış olsun! Həqiqətən, Allah yaxşı işlər görənlərin mükafatını zay etməz!

121. Onların sərf etdikləri elə bir az-çox xərc, (cihad zamanı Peyğəmbərlə) keçdikləri elə bir vadi olmaz ki, Allah (qiyamət günü) əməllərinin qarşılığını daha gözəl versin deyə, əvəzində onlara (savab) yazılmamış olsun!

122. (Ehtiyac olmadıqda) möminlərin hamısı birdən (cihada, döyüşə) çıxmamalıdır. Barı, hər tayfadan bir dəstə (elm öyrənmək, sonra da onu dindaşlarına öyrətmək üçün) qalsın ki, camaatı (döyüşdən) qayıtdığı zaman onları (Allahın əzabı ilə) qorxutsun. Bəlkə, onlar (əldə etdikləri biliklər sayəsində yaramaz işlərdən, nalayiq hərəkətlərdən) çəkinsinlər!

123. Ey iman gətirənlər! Yaxınlığınızda olan kafirlərlə vuruşun. Qoy onlar sizdən (özlərinə qarşı) sərtlik görsünlər. Bilin ki, Allah müttəqilərlədir!

124. Bir surə nazil edildiyi zaman onlardan (münafiqlərdən): "Bu sizin hansınızın imanını artırdı?" – deyənlər də var. Möminlərə gəlincə, (hər bir surə) onların imanını artırar və onlar (bu surələrin nazil olmasına) sevinərlər.

125. Qəlblərində mərəz (şəkk-şübhə, nifaq) olanlara gəldikdə isə, (hər bir surə) onların murdarlığı (küfrə, nifaqı) üstünə bir murdarlıq da gətirər və onlar kafir olaraq ölərlər!

126. Münafiqlər ildə bir-iki dəfə bəlaya giriftar olduqlarını görmürlərmi? Bununla belə, yenə tövbə edib ibrət almırlar!

127. (Münafiqlərin yaramaz işlərindən, qəbahətlərindən xəbər verən) bir surə nazil edildiyi zaman bir-birinə baxıb: "(Müsəlmanlardan) sizi görən varmı?" – deyə soruşur, (görən yoxdursa) dönüb aradan çıxırlar. Onlar (haqqı) anlamaz bir tayfa olduqları üçün Allah da ürəklərini (imandan, xeyirdən) döndərmişdir!

128. (Ey ümmətim!) Sizə özünüzdən bir peyğəmbər gəldi ki, sizin əziyyətə (məşəqqətə) düşməyiniz ona ağır gəlir, o sizdən (sizin iman gətirməyinizdən) ötrü təşnədir, möminlərlə şəfqətli, mərhəmətlidir!

129. (Ya Peyğəmbərim!) Əgər onlar (sənə iman gətirməkdən, əmrlərinə itaət etməkdən) üz döndərsələr, de: "Mənə təkcə Allah

yetər. Ondan başqa heç bir tanrı yoxdur. Ona təvəkkül etdim mən. O, böyük ərşin sahibidir! (O, bütün kainatın xaliqi və ixtiyar sahibidir!)

## .10.
## Yunus (Yunis) surəsi
**(Məkkədə nazil olmuşdur, 109 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Əlif, Lam, Ra. Bunlar hikmətlə dolu Kitabın (Quranın) ayələridir!

2. İçərilərindən bir adama: "İnsanları (Allahın əzabı ilə) qorxut, iman gətirənləri (yaxşı əməllərinə görə) Rəbbi yanında gözəl mükafat gözlədiyi ilə müjdələ!" – deyə vəhy etməyimiz xalqa təəccüblü gəldimi ki, kafirlər: "Bu, həqiqətən, açıq-aşkar bir sehrbazdır!" dedilər.

3. Rəbbiniz göyləri və yeri altı gündə xəlq edən, sonra ərşi yaradıb hökmü altına alan (ərşə üz tutan), hər işi yerinə qoyan (səhmana salan) Allahdır. Onun izni olmadan heç bir şəfaət edən ola bilməz. Bu, Rəbbiniz olan Allahdır. Ona ibadət edin. Məgər öyüd-nəsihət qəbul etməyəcəksiniz?

4. Hamınızın (axır) dönüşü Onadır. Bu, Allahın haqq olan vədidir. (Hamınız Onun hüzuruna qayıdacaqsınız). O, insanları (məxluqu) yoxdan yaradır, sonra iman gətirib yaxşı işlər görənləri ədalətlə mükafatlandırmaq üçün (qiyamət günü) yenidən diriltdir. Kafirləri etdikləri küfrlərə görə qaynar su (cəhənnəm içkisi həmim) və şiddətli bir əzab gözləyir!

5. Günəşi işıqlı (parlaq), ayı nurlu edən, illərin sayını və hesabı biləsiniz deyə, ay üçün mənzillər müəyyən edən məhz Odur. Allah bunları ancaq haqq olaraq yaratdı. O, ayələrini anlayıb bilən bir tayfa üçün belə müfəssəl izah edər!

6. Gecə ilə gündüzün bir-birinin ardınca gəlməsində, Allahın göylərdə və yerdə yaratdıqlarında Allahdan qorxan bir tayfa üçün (Onun birliyini və qüdrətini sübut edən) dəlillər vardır.

7. Bizimlə qarşılaşacaqlarına (qiyamət günü dirilib hüzurumuzda duracaqlarına, cəzamıza yetişəcəklərinə) ümid etməyənlərin, (axirətdən vaz keçərək) dünyanı bəyənib ona bel bağlayanların və ayələrimizdən qafil olanların -

8. Məhz onların qazandıqları günahlara görə düşəcəkləri yer Cəhənnəmdir!

9. İman gətirib yaxşı işlər görənlərin Rəbbi iman gətirdiklərinə görə hidayətə (Cənnətə) qovuşdurar. (Bol nemətli) Nəim cənnətlərində onların (qəsrləri, köşkləri) altından çaylar axar. [Və ya Rəbbi onlara imanları müqabilində (ağacları) altından çaylar axan Nəim cənnətlərinə yol göstərər].

10. Onların oradakı (möminlərin Cənnətdəki) duası: “Pərvərdigara! Sən paksan, müqəddəssən!”, orada salamlaşması: “Salam!” duası: “Həmd olsun aləmlərin Rəbbi Allaha!” sözləridir.

11. Əgər Allah insanlara, xeyri tezliklə istədikləri kimi, şəri də o tezliklə versəydi, şübhəsiz ki, əcəlləri çoxdan tamam olmuşdu. (Allah insanların yaxşı dualarını tez qəbul etdiyi kimi, qəzəbli halda etdikləri bəd duaları da dərhal qəbul buyursaydı, onlar çoxdan məhv olub gedərdilər. Allah bəndələrinə əzab verməkdə tələsməz, özlərini islah edib pis əməllərdən çəkinmək üçün möhlət verər). Bizimlə qarşılaşacaqlarına ümid etməyənləri öz azğınlıqları içərisində şaşqın bir vəziyyətdə qoyarıq!

12. İnsana bir sıxıntı (xəstəlik, yoxsulluq, bəla) üz verən zaman uzananda da, oturanda da, ayaq üstə duranda da Bizə dua edər. Lakin onu sıxıntıdan qurtardıqda ondan ötrü (əvvəlcə) Bizə heç dua

etməmiş kimi çıxıb gedər. (Allaha şükür etməyi də unudub yaramaz işlərində davam edər). Həddi aşanlara etdikləri əməllər beləcə yaxşı göstərildi.

13. Sizdən əvvəl neçə-neçə nəsilləri (ümmətləri) peyğəmbərləri özlərinə açıq-aşkar möcüzələr gətirdikləri halda (onlara) zülm etdikləri və iman gətirəsi olmadıqları üçün məhv etdik. Biz günahkarları belə cəzalandırırıq.

14. Onların ardınca yer üzünün varisləri sizi təyin etdik ki, görək özünüzü necə aparacaqsınız.

15. (Müşriklərə) ayələrimiz açıq-aydın oxunduğu zaman (qiyamət günü haqq–hesab üçün) Bizimlə qarşılaşacaqlarına ümid etməyənlər: "Bundan ayrı bir Quran gətir və ya onu dəyişdir!" – deyərlər. Onlara de: "Mən onu özbaşına (istədiyim kimi) dəyişə bilmərəm. Mən ancaq mənə gələn vəhyə tabe oluram. Əgər Rəbbimə asi olsan, (müsibəti) böyük günün (qiyamət gününün) əzabından qorxuram".

16. De: "Əgər Allah istəsəydi, mən onu sizə oxutmazdım və Allah da onu sizə bildirməzdi. Mən ondan (Quran nazil ediləndən) qabaq sizin aranızda (qırx il) ömür sürmüşəm. ( Bu müddət ərzində məni doğru danışan bir adam kimi tanıyırsınız. Qırx yaşından sonra mən sizə necə yalan deyə bilərəm?) Məgər (Quranın mənim sözlərim deyil, məhz Allah kəlamı olduğunu) dərk etmirsinizmi?"

17. Allaha iftira yaxan, Onun ayələrini yalan hesab edən adamdan daha zalım kim ola bilər? Günahkarlar nicat tapa bilməzlər!

18. Onlar Allahı qoyub özlərinə nə bir xeyir, nə də bir zərər verə bilən bütlərə ibadət edir və: "Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!" – deyirlər. De: "Allaha göylərdə və yerdə (Özünə şərik) bilmədiyi bir şeyimi xəbər verirsiniz? Allah Özünə şərik qoşulan bütlərdən uzaqdır və ucadır!"

19. İnsanlar (əvvəlcə) ancaq tək bir ümmət idilər (eyni bir dində idilər). Sonra (aralarında ixtilaf düşdüyü üçün) ayrıldılar. Əgər Rəbbin tərəfindən öncə bir söz (ilahi hökm, təqdir) olmasaydı (sorğu-sual və cəza qiyamətə saxlanılmasaydı), ixtilafda olduqları məsələlər barəsində aralarında dərhal hökm verilmişdi.

20. Müşriklər: "Barı, Peyğəmbərə (bizə dediklərinizin doğru olduğunu bilməyimiz üçün) Rəbbi tərəfindən bir möcüzə nazil ediləydi!" – deyirlər. Onlara belə cavab ver: "Qeyb (aləmi) ancaq Allaha məxsusdur. Elə isə (Allahın əzabını gözləyin). Doğrusu, mən də sizinlə birlikdə gözləyləyənlərdənəm!"

21. İnsanların başına gələn bir müsibətdən sonra onlara bir mərhəmət (asudəlik) dadızdırsaq, (ayələrimiz barəsində) dərhal hiylə qurmağa girişərlər. De: "Allah daha tədbirlidir". Şübhəsiz ki, elçilərimiz (mələklər) qurduğunuz hiylələri (əməl dəftərinizə) yazırlar!

22. Sizi suda və quruda gəzdirən Odur. Siz gəmidə olduğunuz, gəmilər gözəl bir külək vasitəsilə içərisində olanları apardığı, onlar da sevindikləri vaxt birdən fırtına qopub dalğalar hər tərəfdən gəmilərin üzərinə hücum etdikdə və müsafirlər dalğaların onları bürüdüyünü (həlak edəcəyini) başa düşdükdə sidqi-ürəkdən Allahın dininə sarılaraq Ona belə dua edərlər: "Əgər bizi bu təhlükədən qurtarsan, Sənə şükür edənlərdən olarıq!"

23. Onları xilas edincə yer üzündə haqsız yerə zülm etməyə, azğınlığa başlayarlar. Ey insanlar! Etdiyiniz zülm, haqsızlıq fani dünya malı kimi öz əleyhinizədir. Sonra hüzurumuza qayıdacaqsınız, Biz də nə etdiklərinizi sizə xəbər verəcəyik.

24. Həqiqətən, (nemətləri, cah-cəlalı ilə fəxr etdiyiniz) dünya həyatı göydən endirdiyimiz yağmura bənzər ki, onunla yer üzündə insanların və heyvanların yeyəcəyi bitkilər yetişib (əlvan çiçəklər və

müxtəlif meyvələrlə) bir-birinə qatışar. Nəhayət, yer üzü bəzəklənib süsləndiyi və sakinləri də (onun məhsulunu, meyvəsini) yığmağa qadir olduqlarını zənn etdikləri vaxt gecə, yaxud gündüz əmrimiz (bəlamız) gələr və Biz onu, dünən üzərində bol məhsul olmamış kimi, (yolunub) biçilmiş bir hala gətirərik. Biz ayələrimizi düşünən bir ümmət üçün belə ətraflı izah edirik!

25. Allah (bəndələrini) əmin-amanlıq yurduna (Cənnətə) çağırır və istədiyini doğru yola salır!

26. Yaxşı işlər görənləri Cənnət və daha artıq mükafat (Allah rizası) gözləyir. Onların üzünə nə bir toz (ləkə), nə də bir zillət qonar. Onlar cənnətlikdirlər və orada əbədi qalacaqlar!

27. Günah qazananlara günahları qədər cəza verilər. Onları zillət basar (bürüyər). Onları Allahdan (Allahın əzabından) heç kəs qurtara bilməz. Onların üzü, sanki gecənin zülmət parçaları ilə örtülmüşdür. Onlar cəhənnəmlikdirlər, özləri də orada əbədi qalacaqlar!

28. O gün onların hamısını (haqq-hesab çəkmək üçün bir yerə) yığacaq, sonra müşrikləri: “Siz də, Allaha qoşduğunuz şərikləriniz (bütləriniz) də yerinizdə durun!” – deyəcək və onları (bir-birindən, yaxud başqalarından) ayıracağıq. Şərikləri (bütlər) dilə gəlib deyəcəklər: “Siz bizə ibadət etmirdiniz”.

29. Sizinlə bizə aramızda təkcə Allahın şahid olması yetər. Biz (eşitməz, görməz və duymaz olduğumuz üçün) sizin bizə ibadət etməyinizdən xəbərsiz idik!”

30. Orada hər kəs əvvəlcə gördüyü iş barəsində xəbər (hesabat) verəcək və həqiqi ixtiyar sahibi olan Allahın hüzuruna qaytarılacaqdır. (Müşriklərin) uydurub düzəltdikləri bütlər isə onlardan (uzaqlaşıb) qeyb olacaqlar.

31. (Ya Rəsulum!) De: “Sizə göydən və yerdən kim ruzi verir? Qulaqlara və gözlərə sahib olan (onları yaradan) kimdir? Ölüdən diri, diridən ölü çıxardan kimdir? Hər işi düzüb qoşan (səhmana salan) kimdir? Onlar: “Allahdır!” – deyəcəklər. De: “Bəs onda Allahdan qorxmursunuz?”

32. O sizin həqiqi Rəbbiniz olan Allahdır. Artıq haqdan sonra zəlalətdən başqa nə qalır?! Belə isə (haqdan) necə döndərilirsiniz?”

33. (Allahın itaətindən çıxmış) fasiqlərin iman gətirməyəcəkləri barədə Rəbbinin sözü (hökmü) belə gerçək oldu. (Və ya: fasiqlər iman gətirməyəcəkləri üçün Rəbbinin hökmü-cəzası onlara belə vacib oldu).

34. (Ya Rəsulum!) De: “Allaha qoşduğunuz şəriklər içərisində məxluqu (insanları) yoxdan yaradan, sonra onu (öldürüb qiyamət günü haqq-hesab üçün yenidən həyata) qaytara bilən bir kəs varmı?” De: “Allah məxluqu yoxdan yaradır, (öldükdən) sonra onu (yenidən dirildib əvvəlki halına) qaytarır. Elə isə (haqdan) necə döndərilirsiniz?”

35. De: “Şəriklərininiz içərisində (insanları) haqq yola yönəldə bilən bir kimsə varmı?” (Sənə cavab verə bilməyən müşriklərə) de: “Allah (insanları) haqq yola yönəldir. Belə olduqda doğru yola yönəldən kəs arxasınca gedilməyə daha çox layiqdir, yoxsa doğru yol göstərilmədikcə özü onu tapa bilməyən kəs? Sizə nə olub? Necə mühakimə yürüdürsünüz?”

36. Onların əksəriyyəti ancaq zənnə uyar, zənn isə əsla həqiqət ola bilməz. Allah nələr etməkdə olduğunuzu biləndir!

37. Bu Quran Allahdan başqasına yalandan aid edilə bilməz. (O ancaq Allahdandır, başqası tərəfindən uydurula bilməz). Lakin o özündən əvvəlkiləri (Tövratı və İncili) təsdiq edən kitabı (lövhi-

məhfuzdakı hökmləri) ətraflı izah edər. Onun aləmlərin Rəbbi tərəfindən nazil edilməsinə heç bir şübhə yoxdur!

38. Yoxsa: "(Peyğəmbər) onu özündən uydurdu!" – deyirlər. De: "Əgər doğru deyirsinizsə, ona (Qurana) bənzər bir surə gətirin və Allahdan başqa, kimə gücünüz çatırsa, onu da (köməyə) çağırın!"

39. Xeyir, o kafirlər elmini qavraya bilmədikləri və hələ yozumu (müşriklərə, kafirlərə vəd edilmiş əzab) onlara gəlib çatmamış Quranı yalan hesab etdilər. Onlardan əvvəlkilər də (Allahın əmrlərini, ilahi kitabları, öz peyğəmbərlərini) təkzib etmişdilər. Bir gör zalımların axırı necə oldu!

40. (Kafirlər) içərisində ona (Qurana) inanan da var, inanmayan da. Rəbbin fitnə-fəsad törədənləri daha yaxşı tanıyandır!

41. Əgər səni yalançı hesab etsələr, de: "Mənim əməlim mənə, sizin əməliniz isə sizə aiddir. Mənim etdiyim əməllərin sizə, sizin etdiyiniz əməllərin mənə heç bir dəxli yoxdur!"

42. Onların içərisində (Quran oxuyarkən) səni dinləyənlər (lakin onu qəbul etməyənlər) də vardır. (Onun) ağlıkəsməz, anlamaz karlara sənmi eşitdirə biləcəksən?!

43. Onların içərisində sənə baxanlar da (peyğəmbərliyini təsdiq edənlər, möcüzələri görənlər də) vardır. Bəsirəti olmayan korlara doğru yolu sənmi göstərə biləcəksən?!

44. Həqiqətən, Allah insanlara zərrəcə zülm etməz, lakin insanlar özləri özlərinə zülm edərlər!

45. (Allah müşrikləri) gündüz bir saat belə (dünyada) olmamışlar kimi, bir yerə toplayacağı gün (qiyamət günü) onlar bir-birini tanıyacaqlar. Allahla qarşılaşacaqlarını yalan hesab edənlər, sözsüz ki, ziyana uğrayacaqlar. Onlar heç doğru yolda da deyildilər.

46. (Ya Rəsulum! Kafirlərə) vəd etdiyimiz əzabın bir qismini sənə (dünyada) göstərsək də, yaxud (ondan əvvəl) səni axirətə qovuşdursaq (canını alsaq) da, bil ki, onların axır dönüşü Bizədir. Allah onların nə etdiklərinə şahiddir!

47. Hər ümmətin bir peyğəmbəri vardır. Onlara peyğəmbər gəldiyi zaman aralarında ədalətlə hökm olunar və onlara zülm edilməz!

48. (Kafirlər: ) "Əgər doğru danışırsınızsa, (bir xəbər verin görək) bu vəd etdiyiniz qiyamət (və ya əzab) nə vaxt olacaq?" – deyə soruşarlar.

49. (Ya Rəsulum!) De: "Allahın istədiyindən başqa, mən özümə nə bir xeyir, nə də bir zərər verə bilərəm. Hər ümmətin (əzəldən müəyyən olunmuş) bir əcəl vaxtı (ömrünün sona çatma, məhv olma, tənəzzülə uğrama, əzaba, müsibətə düçar olma çağı) vardır. Onların əcəli gəlib çatdıqda (ondan) bircə saat belə nə geri qalar, nə də irəli keçərlər".

50. De: "Bir deyin görək. Əgər (Allahın) əzabı sizə gecə, yaxud gündüz gəlsə (nə edərsiniz)! Günahkarlar buna (əzabın gəlməsinə) niyə tələsirlər?

51. O əzab gəldikdən sonramı ona inanacaqsınız? İndimi? Halbuki siz onun tez gəlməsini istəyirsiniz!"

52. Sonra zülm edənlərə: "Dadın əbədi əzabı. Siz ancaq qazandığınız günahlara görə cəzalandırılırsınız!" – deyiləcək.

53. (Ya Peyğəmbərim!) Səndən: "O (bizi qorxutduğun əzab və ya qiyamət günü) doğrudurmu?" – deyə xəbər alacaqlar. Onlara belə cavab ver: "Rəbbimə and olsun ki, o doğrudur. Siz ondan canınızı qurtara bilməzsiniz!"

54. Əgər zülm etmiş bir şəxs yer üzündə olan hər şeyə sahib olsaydı, onu (Allahın əzabından qurtarmaq üçün) fidyə verərdi. Onlar əzabı gördükləri zaman için-için peşman olarlar. İnsanlar arasında ədalətlə hökm olunar, onlara zülm edilməz. (Birinin günahı o birinin boynuna qoyulmaz və heç kəsə günahından artıq cəza verilməz).

55. Bilin ki, göylərdə və yerdə nə varsa, hamısı Allahındır. Xəbəriniz olsun ki, Allahın vədi haqdır, lakin (kafirlərin) əksəriyyəti (bunu) bilməz!

56. Dirildən də, öldürən də Odur. Məhz Onun hüzuruna qaytarılacaqsınız!

57. (Ey insanlar!) Sizə Rəbbinizdən bir öyüd-nəsihət, ürəklərdə olana (cəhalətə, şəkk-şübhəyə, nifaqa) bir şəfa, möminlərə hidayət və mərhəmət (Quran) gəlmişdir!

58. (Ya Rəsulum!) De: “Allahın neməti və mərhəməti ilə - ancaq onunla sevinsinlər. Bu onların yığdıqlarından (fani dünya malından) daha xeyirlidir!”

59. De: “Allahın sizə ruzi olaraq (göydən) nə endirdiyini gördünüzmü ki, onun bir qismini haram, bir qismini isə halal etdiniz?” De: “(Bunu deməyə) Allah Özü sizə izin verdi, yoxsa Allaha iftira yaxırsınız?”

60. Allaha iftira yaxanların qiyamət günü barəsindəki zənləri nədən ibarətdir? (Onlara əzab verilməyəcəyinimi güman edirlər?) Allah insanlara qarşı mərhəmətlidir, lakin onların əksəriyyəti (Allahın nemətlərinə və mərhəmətinə) şükür etməz!

61. (Ya Peyğəmbərim!) Sən nə iş görsən, Qurandan nə oxusan, (ümmətinlə birlikdə) nə iş görsəniz, onlara daldığınız (onları etdiyiniz) zaman Biz sizə şahid olarıq. Yerdə və göydə zərrə qədər bir şey sənin Rəbbindən gizli qalmaz. Ondan daha böyük, daha kiçik

elə bir şey də yoxdur ki, açıq-aydın kitabda (lövhi-məhfuzda) olmasın!

62. Bilin ki, Allahın dostlarının heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər.

63. O kəslər ki, iman gətirmiş və pis əməllərdən çəkinmişlər -

64. Onlara dünyada da, axirətdə də müjdə vardır. Allahın sözləri (verdiyi vədlər) heç vaxt dəyişməz. Bu, böyük qurtuluşdur (uğurdur)!

65. (Ya Peyğəmbərim!) Onların (kafirlərin boş, mənasız) sözləri səni kədərləndirməsin. Yenilməz izzət (qüvvət) bütövlükdə yalnız Allaha məxsusdur. O, (hər şeyi) eşidəndir, biləndir!

66. Bilin ki, göylərdə və yerdə kim (nə) varsa (mələklər, cinlər, insanlar – bütün canlılar, bütün məxluqat) hamısı Allahındır (Allahın quludur). Allahdan başqasına tapınanlar həqiqətdə Allaha qoşduqları şəriklərə tabe olmazlar (çünki əslində heç kəs Allaha şərik olmağa layiq deyildir və ola bilməz). Onlar ancaq zənnə uyar və yalandan başqa bir şey deməzlər.

67. Gecəni dincəlməyiniz üçün (qaranlıq), gündüzü (çalışıb ruzi qazanmağınız üçün) işıqlı edən Odur. Həqiqətən, bunda (Allah kəlamını) eşidənlər üçün (ibrətamiz) dəlillər vardır.

68. (Müşriklər:) “Allah Özünə övlad götürdü!” dedilər. Allah pak və müqəddəsdir. O, (övlada, uşağa) möhtac deyildir. Göylərdə və yerdə nə varsa, hamısı Onundur. Bu haqda (Allahın Özünə övlad götürməsi barədə) sizin əlinizdə heç bir dəlil yoxdur. Allaha qarşı bilmədiyiniz şeyimi deyirsiniz?

69. (Ya Rəsulum!) De: “Allaha qarşı yalan uyduranlar, sözsüz ki, nicat tapmazlar!”

70. (Onlar üçün) dünyada bir qədər dolanacaq, mənfəət vardır. Sonra hüzurumuza qayıdacaqlar, ondan sonra küfr etdiklərinə görə onlara çox şiddətli bir əzab daddıracağıq!

71. (Ya Rəsulum!) Müşriklərə Nuhun xəbərini söylə. Bir zaman o öz ümmətinə belə demişdi: "Ey ümmətim! Əgər aranızda qalmağım və Allahın ayələri ilə öyüd-nəsihət verməyim sizə ağır gəlirsə, mən (sizin mənə qarşı bütün pis niyyətlərinizdən) Allaha təvəkkül edirəm. Şəriklərinizlə birlikdə (mənim barəmdə) nə edəcəyinizi qərarlaşdırın. Görəcəyiniz iş gizli qalmasın (onu mənə də bildirir), sonra mənə heç möhlət də verməyib haqqımda istədiyinizi edin (istədiyiniz hökmü çıxarın!).

72. Əgər siz (mənim öyüd-nəsihətimdən, dəvətimdən) üz çevirsəniz, (bilin ki) mən (bunun müqabilində) sizdən heç bir mükafat istəmirəm. Məni mükafatlandırmaq yalnız Allaha aiddir. Mənə müsəlmanlardan (özünü Allaha təslim edənlərdən) olmaq əmr edilmişdir!"

73. Onlar yenə də Nuhu yalançı hesab etdilər. Biz Nuha və onunla birlikdə gəmidə olanlara nicat verdik, onları (yer üzünə) varislər (xələflər) etdik. Ayələrimizi yalan hesab edənləri isə suda batırıb boğduq. Bir gör (əzabla) qorxudulanların (lakin yola gəlməyənlərin) axırı necə oldu!

74. Nuhun ardınca öz ümmətlərinə peyğəmbərlər göndərdik. Onlar (öz ümmətlərinə) açıq-aşkar möcüzələr gətirmişdilər. Bunlar isə öncə (peyğəmbər gəlməzdən əvvəl) yalan hesab etdikləri şeylərə iman gətirmədilər. Biz (küfr etməklə, günah işləməklə) həddi aşanların ürəklərini belə möhürləyirik.

75. Onlardan sonra Musanı və Harunu Firona və camaatına açıq möcüzələrlə peyğəmbər göndərdik. Lakin onlar (iman gətirməyi) özlərinə sığışdırmadılar və günahkar bir tayfa oldular.

76. Onlara Bizim tərəfimizdən haqq gəldikdə: “Bu, aşkar bir sehrdir!” – dedilər.

77. Musa onlara belə dedi: “Məgər sizə haqq gəldiyi zaman onun barəsində beləmi deyirsiniz? Bu sehrdirmi? Sehrbazlar (dünyada və axirətdə) nicat tapmazlar!”

78. Onlar (Musaya və Haruna): “Bizi atalarımızın tapındığı dindən döndərmək, özünüz də yer üzündə böyüklük etmək üçünmü gəldiniz? Biz sizə iman gətirən deyilik!” – dedilər.

79. Firon: “Nə qədər bilikli sehrbaz varsa, gətirin!” – dedi.

80. Sehrbazlar gəldikdə Musa: “Nə atacaqsınızsa, atın (istədiyiniz əsaları və kəndirləri yerə atın!)” – dedi.

81. Onlar (əllərindəkini yerə) atdıqda Musa dedi: “Sizin etdiyiniz (gətirdiyiniz) hər şey sehrdir. Allah, sözsüz ki, onu batil edəcəkdir. Allah fitnə-fəsad törədənləri sevməz!

82. Günahkarlar istəməsələr də, Allah sözləri (əmr və hökmləri) ilə haqqı gerçəkləşdirəcək (bərqərar edəcəkdir)!”

83. Fironun və əyanlarının bəlası qorxusundan Musaya öz qövmündən (və ya Firon camaatından) yalnız kiçik bir dəstə (nəsil) iman gətirdi. Çünki Firon o yerdə hakim idi. O, (küfr və azğınlıq etməkdə) həddi aşmışdı.

84. Musa dedi: “Ey qövmüm! Əgər Allaha iman gətirmişsinizsə və təslim olmuşsunuzsa, Ona təvəkkül edin!”

85. Onlar dedilər: “Biz yalnız Allaha təvəkkül etdik. Ey Rəbbimiz! Bizi zalım tayfanın fitnəsinə uğratma! Zalım tayfanın əlində sınağa çəkmə!

86. Və bizi öz mərhəmətinlə kafirlərin əlindən qurtar!”

87. Musaya və qardaşına: “Camaatınız üçün Misirdə evlər tikdirib onları qiblə (namazgah) edin, namaz qılın və möminləri (zəfərlə, Cənnətlə) müjdələyin!” – deyə vəhy etdik.

88. Musa dedi: “Ey Rəbbimiz! Sən Firona və əyan-əşrafına dünyada zinət və mal-dövlət ehsan etdin! Ey Rəbbimiz! (Bu sərvəti onlara bəndələrini) Sənin (haqq) yolundan azdırmaq üçün verdin? Ey Rəbbimiz! Onların mal-dövlətini məhv et və ürəklərini möhürlə (sərtləşdir) ki, şiddətli əzabı görməyincə iman gətirməsinlər!”

89. (Allah) buyurdu: “Hər ikinizin duasını qəbul etdim. Siz (öz dəvətinizdə və təbliğinizdə) sabitqədəm olun və cahillərin yoluna uymayın!

90. İsrail oğullarını dənizdən (sağ-salamat) keçirtdik. Firon və əsgərləri zalımcasına və düşməncəsinə onların arxasınca düşdülər. (Firon) batacağı anda: “İsrail oğullarının inandıqlarından başqa tanrı olmadığına iman gətirdim. Mən artıq (Ona) təslim olanlardanam!” – dedi.

91. İndimi? (Bütün var-dövlətin, hakimiyyətin əlindən çıxdıqdan sonramı iman gətirirsən?) Halbuki əvvəlcə (Allaha) qarşı çıxmış və fitnə-fəsad törədənlərdən olmuşdun!

92. Səndən sonrakılara bir ibrət olsun deyə, bu gün səni xilas edəcəyik (sənin cansız bədənini sahilə atacağıq). Həqiqətən, insanların çoxusu ayələrimizdən qafildir!

93. İsrail oğullarına (Misirdə və Şamda) çox gözəl bir yerdə təmiz (halal) ruzi verdik. Onlar özlərinə bir elm (Quran) gələnə qədər ixtilafda olmadılar. (Yəhudilər Tövratda Muhəmməd peyğəmbər haqqında oxumuşdular, onun əlamətlərini bilir və gələcəyinə inanırdılar. Lakin Quran nazil olduqda həsədləri üzündən əksəriyyəti onun peyğəmbərliyini inkar etdi). Qiyamət günü (Ya Rəsulum!)

Rəbbin ixtilafda olduqları məsələlər barəsində aralarında hökm verəcəkdir!

94. (Ya Peyğəmbərim!) Əgər sənə nazil etdiyimizə şübhə edirsənsə, (bu haqda) səndən əvvəl kitab (Tövrat) oxuyanlardan (Abdullah ibn Salam kimi kitab əhlindən) soruş. Haqq sənə, sözsüz ki, Rəbbindən gəlmişdir. Şübhə edənlərdən olma!

95. Allahın ayələrini təkzib edənlərdən də olma, yoxsa ziyana uğrayanlardan olarsan!

96. Həqiqətən, əleyhinə sənin Rəbbinin sözü gerçəklənmiş olanlar iman gətirməzlər!

97. Onlara hər hansı bir ayə gəlsə, şiddətli əzabı görməyincə (inanmazlar).

98. Əzab gəlməkdə ikən Yunisin ümmətindən başqa iman gətirib imanı özlərinə fayda verə bilən bir məmləkət əhli vardırmı? (Yunisin ümməti) iman gətirən zaman onları dünyadakı rüsvayçılıq əzabından qurtardıq və onlara bir müddət (ömürlərinin axırınadək) gün-güzəran verdik.

99. Əgər Rəbbin istəsəydi, yer üzündə olanların hamısı iman gətirərdi. İnsanları iman gətirməyə sənmi məcbur edəcəksən?! (Bu sənin işin deyildir. Sənin vəzifən ancaq islamı təbliğ etməkdir).

100. Heç kəs Allahın izni olmadan iman gətirə bilməz (buna görə də əbəs yerə özünü yorma). Allah (Özünün öyüd-nəsihətlərini, hökmlərini) anlamayanları əzaba (kəsafətə) düçar edər.

101. De: “Bir gör göylərdə və yerdə (Allahın birliyini və qüdrətini sübut edən) nələr var. Lakin iman gətirməyən bir tayfaya ayələr və (Allahın əzabı ilə qorxudan) peyğəmbərlər heç bir fayda verməz!

102. Onlar ancaq özlərindən əvvəl gəlib-gedənlərin günləri (başlarına gələn müsibətlər) kimi bir gün gözləyirlər!” De: “Gözləyin, doğrusu, mən də sizinlə birlikdə gözləyənlərdənəm!”

103. Sonra peyğəmbərlərimizi və iman gətirənləri xilas edərik. Möminləri (verdiyimiz vədə əməl edərək) belə xilas etmək Bizə vacibdir.

104. De: “Ey insanlar! (Ey Məkkə müşrikləri!) Əgər mənim dinim barəsində şübhəyə düşmüşsünüzsə, (bilin ki) mən Allahı qoyub tapındığınız başqa bütlərə ibadət etmirəm. Ancaq sizin canınızı alacaq Allaha ibadət edirəm. Mənə möminlərdən olmaq əmr edilmişdir”.

105. Və: “Batildən haqqa tapınaraq üzünü islam dininə çevir, müşriklərdən olma,

106. Allahdan başqa, sənə nə bir xeyir, nə də zərər verə bilən şeylərə (tanrılara və bütlərə) ibadət etmə! Əgər belə etsən, şübhəsiz ki, özünə zülm edənlərdən olarsan!, - deyə buyurulmuşdur.

107. Əgər Allah sənə bir zərər toxundursa (sıxıntı versə), onu Özündən başqa (səndən) heç kəs sovuşdura bilməz. Əgər Allah sənə bir xeyir diləsə, heç kəs Onun nemətini (lütfünü) geri qaytara bilməz. Allah onu bəndələrindən istədiyinə nəsib edər. O, bağışlayandır, rəhm edəndir.

108. (Ya Rəsulum!) De: “Ey insanlar! Artıq Rəbbinizdən sizə haqq (Quran və Peyğəmbər) gəlmişdir. Doğru yolu tutan özünə savab, doğru yoldan azan isə özünə günah qazanar. Mən sizə zamin deyiləm!”

109. Sənə nə vəhy gəlirsə, ona tabe ol. Allah hökm (zəfər hökmünü) verənə qədər səbr et. O, hökm verənlərin ən yaxşısıdır!

# .11.
# Hud surəsi
## (Məkkədə nazil olmuşdur, 123 ayədir)

Bismillahir–rəhmanir-rəhim!

1. Əlif, Lam, Ra! Bu, ayələri hikmət sahibi, (hər şeydən) agah olan (Allah) tərəfindən təsbit olunmuş, sonra da müfəssəl izah edilmiş bir Kitabdır ki,

2. Siz Allahdan başqasına ibadət etməyəsiniz. Mən sizi Allah tərəfindən (Cəhənnəmlə) qorxudan və (Cənnətlə) müjdələyənəm.

3. Və Rəbbinizdən bağışlanmağınızı diləyəsiniz. Sonra Ona tövbə edin ki, müəyyən bir müddət (ömrünüzün sonunadək) sizə yaxşı gün-güzəran versin və hər bir əməl sahibinə (əməlinin) mükafatını ehsan buyursun. Əgər (imandan, mənim dəvətimdən, öyüd-nəsihətimdən) üz döndərsəniz, bilin ki, mən (müsibəti) böyük günün (qiyamət gününün) sizə üz verəcək əzabından qorxuram.

4. Siz məhz Allahın hüzuruna qayıdacaqsınız. O, hər şeyə qadirdir!

5. Bilin ki, (kafirlər və münafiqlər) Allahdan gizlənmək (küfrlərini, ikiüzlülüklərini Peyğəmbərdən və möminlərdən gizlətmək) məqsədilə ikiqat olarlar (sinələrini bükərlər). Xəbərdar olun ki, onlar libaslarına büründükdə belə, Allah onların gizli saxladıqları və aşkar etdikləri hər şeyi (bütün gizli və aşkar əməllərini) bilir. Allah ürəklərdə olanları biləndir.

6. Yer üzündə yaşayan elə bir canlı yoxdur ki, Allah onun ruzisini verməsin. Allah onların (ata belindəki, ana bətnindəki və ya dünyadakı) sığınacaqlarını da, əmanət qoyulacaq (ölüb dəfn ediləcək) yerlərini də bilir. (Bunların) hamısı açıq-aşkar kitabdadır (lövhi-məhfuzdadır).

7. Ərşi su üzərində ikən hansınızın daha gözəl əməl (itaət) sahibi olacağını sınayıb bilmək üçün göyləri və yeri altı gündə yaradan Odur. (Ya Peyğəmbərim!) Əgər desən ki: "Siz öləndən sonra, həqiqətən, dirildiləcəksiniz!", kafir olanlar: "Bu, açıq-aşkar sehrdən (yalandan) başqa bir şey deyildir!" – deyə cavab verərlər.

8. Əgər onlara gələcək əzabı az bir müddət yubatsaq, sözsüz ki, (istehza ilə): "Bu əzabı gecikdirən (ona mane olan) nədir?" – deyəcəklər. Bilin ki, əzab onlara gələcəyi gün dəf olunmaz. Məsxərəyə qoyduqları əzab onları məhv edər.

9. Əgər insana Özümüzdən bir nemət (mərhəmət) daddırsaq, sonra da onu geri alsaq, şübhəsiz ki, o, məyus (ümidsiz) və nankor olar.

10. Əgər başına gələn bir müsibətdən sonra, ona firavanlıq, səadət nəsib etsək, mütləq: "Artıq fəlakətlər məndən sovuşdu" - deyər və sözsüz ki, sevinib öyünər.

11. Səbr edənlər və yaxşı işlər görənlər müstəsnadır. Məhz onları (günahlardan) bağışlanma və böyük bir mükafat gözləyir.

12. (Ya Rəsulum!) Müşriklərin: "Heç olmasa, (Peyğəmbərliyinin doğruluğunu təsdiq etmək üçün) ona bir xəzinə endiriləydi və ya onunla birlikdə bir mələk gələydi!" – deməklərindən dolayı, bəlkə də, sənə gələn vəhyin bir hissəsini tərk etməli (bəzi ayələri dərhal təbliğ etməyib təxirə salmalı) olacaqsan və (bəzən) buna görə ürəyin qısılacaq! Sən ancaq (müşrikləri və kafirləri Allahın əzabı ilə) qorxudan bir peyğəmbərsən. Allah isə hər şeyə vəkildir!

13. Yoxsa (müşriklər): "Onu (Quranı) özündən uydurdu!" - deyirlər. (Onlara) de: "Əgər doğru deyirsinizsə, onun kimi özünüzdən on surə uydurub gətirin və (bu işdə) Allahdan başqa, kimi bacarırsınızsa, onu da köməyə çağırın.

14. Yox, əgər (köməyə çağırdıqlarınız) sizə cavab verməsələr, bilin ki, o ancaq Allahın elmi ilə nazil olmuşdur. Ondan başqa heç bir tanrı yoxdur! (Bütün bunlardan sonra) islamı qəbul etməzmisiniz?

15. Kim (axirətdən vaz keçib) dünyanı və onun bərbəzəyini istəyirsə, Biz ona əməllərinin əvəzini (sağlamlıq, sərvət, övlad, gözəl yaşayış) elə orada (dünyada) verərik. Onların dünyadakı mükafatları əsla azaldılmaz. (Dünyada yaxşı işlər görüb etiqadı olmayan şəxsə axirətdə dünyəvi əməlləri heç bir fayda verməz. Çünki Allah ona dünyadakı yaxşı əməllərinin əvəzini elə dünyanın özündə verər).

16. Belələrini axirətdə atəşdən (cəhənnəm odundan) başqa heç bir payı yoxdur. Onların dünyada gördükləri işlər puç olar və bütün əməlləri boşa çıxar!

17. Məgər Rəbbindən açıq-aydın bir dəlilə (Qurana) istinad edən, ardınca Allahdan bir şahid (Cəbrail) gələn, ondan da əvvəl Musanın (öz ümməti üçün) bir rəhbər və mərhəmət olan kitabının (Tövratın) təsdiq etdiyi kimsə (dünyaya meyl edənlər, ona bel bağlayanlar kimi ola bilərmi)?! Bunlar (bu dəlilləri təsdiq edən müsəlmanlar) Qurana inanırlar. (Ya Rəsulum!) Quranı inkar edən zümrənin (bütün müşriklərin və kafirlərin) vəd olunduğu yer Cəhənnəmdir. Artıq sən də onun barəsində şübhəyə düşmə. O sənin Rəbbindən (gələn) haqdır, lakin insanların (Məkkə əhlinin) əksəriyyəti (buna) inanmaz!

18. Allaha iftira yaxandan (öz sözünü yalandan Allaha aid edəndən) daha zalım kim ola bilər? Onlar Allahın hüzuruna gətirilər, şahidlər (mələklər, peyğəmbərlər, bütün məxluqat, yaxud insanın öz bədəninin üzvləri) belə deyərlər: “Bunlar Rəbbi barəsində yalan söyləyənlərdir!” Bilin ki, zalımlar Allahın lənətinə gələcəklər!

19. O kəslər ki, (insanları) Allah yolundan döndərir, onu (yolu) əymək istəyirlər – onlar, məhz onlar axirəti inkar edənlərdir.

20. Onlar yer üzündə (Allahı) aciz qoya (Allahın əzabından qaçıb canlarını qurtara) bilməzlər. Allahdan başqa onların köməyinə çata bilən də (əzabdan xilas etməyə qadir olan da) yoxdur. Onları ikiqat əzab gözləyir. Onlar (haqqı) eşidə bilməz və (onu) görməzlər!

21. Onlar özlərinə zərər eləyənlərdir. Yalandan uydurduqları bütlər də onlardan uzaqlaşıb qeyb olacaqlar.

22. Şübhəsiz ki, axirətdə də ən çox ziyana uğrayanlar onlardır!

23. İman gətirib yaxşı işlər görənlər və ümidlərini Rəbbinə bağlayanlar isə cənnətlikdirlər. Onlar orada əbədi qalacaqlar!

24. Bu iki tayfanın (kafirlərin və möminlərin) vəziyyəti korla karın, görənlə eşidənin vəziyyəti kimidir. Onlar eyni ola bilərlərmi?! Məgər ibrət almırsınız?

25. Həqiqətən, Biz Nuhu öz tayfasına peyğəmbər göndərdik. Nuh dedi: “Mən sizi (Allahın əzabı ilə) açıq-aşkar qorxudan bir peyğəmbərəm!

26. Allahdan başqasına ibadət etməyin. Mən (cəzası) şiddətli (ağrılı-acılı) günün (qiyamət gününün) sizə üz verəcək əzabından qorxuram!”

27. (Nuh) tayfasının kafir əyan-əşrafı dedilər: “Biz səni ancaq özümüz kimi (adi) bir insan sayır, elə ilk baxışda yalnız içimizdəki səfillərin (cütçü, pinəçi, dəmirçi, dərzi və i. a.) sənə uyduğunu görürük. Eyni zamanda sizin bizdən (heç bir şeydə) üstün olduğunuzu da görmürük. Əksinə, biz sizi yalançı hesab edirik!”

28. (Nuh) dedi: “Ey camaatım! Bir deyin görək. Əgər mən Rəbbimdən açıq-aydın bir dəlilə (möcüzəyə) istinad etsəm, Rəbbim mənə Özündən bir mərhəmət (peyğəmbərlik) bəxş etsə və o sizə gizli qalsa (sizin bəsirətsiz gözünüz onu görməyə qadir olmasa),

istəmədiyiniz halda, biz sizi ona (iman gətirməyə) məcburmu edə bilərik?!

29. Ey camaatım! Mən peyğəmbərliyi təbliğ etməyə görə sizdən bir mal, mükafat istəmirəm. Mənim mükafatım ancaq Allaha aiddir. Mən iman gətirənləri qovan deyiləm. Onlar (qiyamət günü) öz Rəbbi ilə qarşılaşacaqlar. Lakin mən sizi cahil bir tayfa görürəm!

30. Ey camaatım! Əgər mən onları qovsam, (bu hərəkətimə görə) məni Allahın əzabından kim qurtara bilər? Məgər (səhv etdiyinizi) düşünmürsünüz?

31. Mən sizə demirəm ki, Allahın xəzinələri məndədir. Mən qeybi də bilmirəm. Mən demirəm ki, mələyəm. Mən eyni zamanda sizin xor baxdığınız kəslərə (iman gətirən yoxsullara) Allahın heç bir xeyir verməyəcəyini də demirəm. Onların ürəklərində olanı (hamıdan yaxşı) Allah bilir. (Əgər mən iman gətirənləri qovsam və bu sözləri desəm), onda şübhəsiz ki, zalımlardan olaram!”

32. Onlar dedilər: “Ey Nuh! Bizimlə çənə-boğaz olub çox mübahisə etdin. Əgər doğru danışanlardansansa, bizi təhdid etdiyin əzabı gətir görək!”

33. (Nuh) belə cavab verdi: “Onu istəsə, ancaq Allah sizə gətirər və siz əsla Allahı aciz buraxa (Allahın əzabından qaçıb canınızı qurtara) bilməzsiniz.

34. Əgər Allah sizi (haqq yoldan) sapdırmaq (və ya məhv etmək) istəyirsə, mən sizə nəsihət vermək istəsəm də, heç bir faydası olmaz. O sizin Rəbbinizdir və siz Onun hüzuruna qaytarılacaqsınız!”

35. Yoxsa (Məkkə müşrikləri): “O (Muhəmməd) onu (Quranı və ya Nuha dair xəbərləri) özündən uydurdu!” – deyirlər. Onlara belə cavab ver: “Əgər mən onu özümdən uydururamsa, günahı mənim boynumadır. Mən isə sizin törətdiyiniz günahlardan uzağam!”

36. Nuha belə vəhy olundu: “Əvvəlcə iman gətirənlərdən başqa, tayfandan daha heç kəs iman gətirməyəcək. Onların etdikləri əməllərə görə kədərlənmə! (Biz tezliklə onları məhv edər, səni kafirlərin zülmündən qurtararıq!)

37. Nəzarətimiz altında və vəhyimiz üzrə (sənə öyrədəcəyimiz kimi) gəmini düzəlt, zülm edənlər barəsində mənə müraciət etmə (onların bağışlanmalarını Məndən xahiş etmə). Çünki onlar suda boğulacaqlar!”

38. (Nuh) gəmini düzəldir, ümmətinin əyan-əşrafı isə yanından ötüb-keçdikcə onu məsxərəyə qoyurdular. (Nuh) onlara deyirdi: “Əgər (indi) siz bizi məsxərəyə qoyursunuzsa, biz də (Allahın əzabı gəldikdə) sizi siz bizi məsxərəyə qoyduğunuz kimi məsxərəyə qoyacağıq.

39. Onda rüsvayedici əzabın kimə gələcəyini və kimin əbədi əzaba düçar olacağını biləcəksiniz!”

40. Nəhayət, (onları məhv etmək barəsində) əmrimiz gəldiyi və təndir qaynadığı (təndirdən və ya yer üzündən, yaxud gəminin qazanından su qaynayıb daşdığı) zaman (Nuha) dedik: “Hər heyvandan biri erkək, biri dişi olmaqla bir cüt, həmçinin əleyhinə (ölümünə) əvvəlcədən hökm verilmiş şəxslər istisna olmaqla, qalan ailə üzvlərini və iman gətirənləri gəmiyə mindir!” Əslində onunla birlikdə (tayfasından) çox az adam iman gətirmişdi.

41. Nuh dedi: “Gəmiyə minin! Onun (üzüb) getməsi də, dayanması da Allahın adı ilədir. Həqiqətən, Rəbbim bağışlayandır, rəhm edəndir!”

42. Gəmi onları dağlar kimi (yüksək) dalğaların içi ilə apardığı zaman Nuh (gəmidən) aralı olan oğlunu (Kənanı) haraylayıb dedi: “Oğlum! Bizimlə birlikdə gəmiyə min, kafirlərdən olma!”

43. (Oğlu ona) belə cavab verdi: “Mən bir dağa sığınaram, o da məni sudan qoruyar”. Nuh dedi: “Allahın rəhm etdiklərindən başqa, bu gün heç kəs (insanları) Onun əzabından qoruya bilməz!” Nəhayət, dalğa ata ilə oğulun arasına girib onları bir-birindən ayırdı və o da suda boğulanlardan oldu.

44. (Allahdan bir əmr olaraq: ) “Ey yer! Suyunu ud! Ey göy! (Yağışını) saxla (açıl)!” – deyildi. Su çəkildi. İş bitdi (Nuha iman gətirməyənlərin məhv edilməsi barədə Allahın əmri yerinə yetdi). Gəmi Cudi dağı üzərində oturdu və: “Zalımlar məhv (Allahın mərhəmətindən uzaq) olsun!” – deyildi.

45. Nuh Rəbbinə (dua ilə) müraciət edib dedi: “Ey Rəbbim! Oğlum (Kənan) mənim ailə üzvlərimdəndir. Sənin vədin, sözsüz ki, haqdır. Sən hakimlərin hakimisən!”

46. (Allah) buyurdu: “Ey Nuh! O sənin ailəndən deyildir. Çünki o (küfr etməklə) pis bir iş görmüşdür. (Və ya sənin Məndən onu xilas etmək xahişin yaxşı iş deyildir). Elə isə bilmədiyin bir şeyi Məndən istəmə. Sənə cahillərdən olmamağı tövsiyə edirəm (məsləhət görürəm)”.

47. (Nuh) dedi: “Ey Rəbbim! Bilmədiyim bir şeyi Səndən istəməkdən (belə bir işə cürət etməkdən) Sənə sığınıram. Əgər məni bağışlamasan, rəhm etməsən, ziyana uğrayanlardan olaram!”

48. (Sonra) belə deyildi: “Ey Nuh! Sənə və səninlə birlikdə (gəmidə) olan camaatdan törənəcək (mömin) ümmətlərə Bizdən əmin-amanlıq və bərəkətlər bəxş edilməklə (gəmidən) en. (Gələcəkdə sizin nəsildən olub küfr edəcək) bəzi ümmətlərə də (dünyada) dolanışıq verəcək, sonra isə (axirətdə) onları şiddətli bir əzaba düçar edəcəyik!”

49. Bunlar (bu əhvalatlar) sənə vəhy etdiyimiz (vəhylə bildirdiyimiz) qeyb xəbərlərindəndir. Bundan qabaq onları nə sən, nə də ümmətin bilirdi. (Ya Peyğəmbərim! Müşriklərin və kafirlərin əzab-əziyyətinə) səbr et. Həqiqətən, (gözəl) aqibət müttəqilərindir!

50. Ad tayfasına da qardaşları Hudu (peyğəmbər göndərdik). O dedi: “Ey camaatım! Allaha ibadət edin. Sizin Ondan başqa heç bir tanrınız yoxdur. Siz isə (Allaha şərik qoşmaqla) yalnız iftiraçısınız!

51. Ey camaatım! Mən buna (peyğəmbərliyi təbliğ etməyə) görə sizdən heç bir mükafat istəmirəm. Mənim mükafatım yalnız məni yaradana aiddir. Məgər dərk etmirsiniz?

52. Ey camaatım! Rəbbinizdən bağışlanmanızı diləyin. Sonra Ona tövbə edin ki, göydən sizə bollu (peydərpey) yağış göndərsin, qüvvətinizin üstünə bir qüvvət də artırsın. (Mənim dəvətimdən və imandan) günahkar olaraq üz çevirməyin!”

53. Onlar da dedilər: “Ey Hud! Sən bizə açıq-aşkar bir möcüzə gətirmədin. Sənin sözünlə tanrılarımızı tərk edən deyilik. Biz sənə inanmırıq!

54. Biz ancaq bunu deyirik ki, bəzi tanrılarımız (onlara tapınmağımızı qadağan etdiyinə görə) sənə sədəmə (xətər) toxundurmuşdur (ona görə də ağzına gələni danışırsan)”. (Hud) belə cavab verdi: “Allahı şahid tuturam və siz də şahid olun ki, mən sizin (Rəbbinizə) qoşduğunuz şəriklərdən uzağam!

55. Bircə Ondan (Allahdan) başqa! (Yalnız Ona ibadət edirəm). İndi hamılıqla mənə qarşı nə hiylə qurursunuzsa, qurun və mənə heç möhlət də verməyin!

56. Mən özümün və sizin Rəbbiniz olan Allaha təvəkkül etdim. (Yer üzündə) elə bir canlı yoxdur ki, onun ixtiyarı (Allahın) əlində olmasın. Həqiqətən, Rəbbim düz yoldadır! (Ədalət sahibidir. Hər

kəsin cəzasını öz əməli müqabilində verir. Heç kəsin haqqını tapdalayıb mükafatını azaltmır. Möminə Cənnət, kafirə isə Cəhənnəm qismət edir).

57. Əgər (imandan) üz çevirsəniz, bilin ki, mən (Allahın mənə lütf etdiyi peyğəmbərliyi, buyurduğu hökmləri) sizə təbliğ etdim. Rəbbim yerinizə başqa bir ümmət gətirər və siz (Ona) heç bir zərər yetirə bilməzsiniz. Həqiqətən, Rəbbim hər şeyi hifz edəndir!"

58. (Hud tayfasının məhvi barəsində) əmrimiz gəldikdə Bizdən bir mərhəmət olaraq Hudu və onunla birlikdə iman gətirənləri xilas etdik və onları şiddətli əzabdan qurtardıq!

59. Bu da Ad tayfasıdır! Onlar Rəbbinin ayələrini inkar etdilər, Onun Peyğəmbərlərinə qarşı çıxdılar (peyğəmbərlərin hamısı tövhid, təkallahlılıq təbliğ etdiklərinə görə bir peyğəmbərə qarşı çıxan kimsə bütün peyğəmbərlərə qarşı çıxmış olur), başlarının üstündə duran hər bir inadkar böyüyün əmrinə tabe oldular.

60. Və, beləliklə, dünyada da, qiyamət günündə də lənətə uğradılar. Bilin ki, Hud tayfası Rəbbini inkar etmişdi. Xəbəriniz olsun ki, Hudun tayfası Ad (Allahın mərhəmətindən) kənar (uzaq) oldu. (Ərəb tarixində iki Ad tayfasının adı çəkilir. Biri Hudun tayfası Ad, digəri isə Adul–İrəmdir ki, ona Zatul–İmad da deyilir. Onları bir-birindən fərqləndirmək üçün burada birinci Ad qəbiləsi Hud qövmü adlandırılır).

61. Səmud qövmünə də qardaşları Salehi (peyğəmbər göndərdik). O dedi: "Ey camaatım! Allaha ibadət edin. Sizin Ondan başqa heç bir tanrınız yoxdur. O sizi (atanız Adəmi) yerdən (torpaqdan) yaradıb orada sakin etdi (və ya uzun ömür verdi). (Allahdan) bağışlanmağınızı diləyin, sonra da Ona tövbə edin. Həqiqətən, Rəbbim (Öz elmi, qüdrəti, mərhəməti ilə yaratdıqlarına) yaxındır, (duaları) qəbul edəndir!"

62. Onlar dedilər: “Ey Saleh! Sən bundan əvvəl içərimizdə (böyüyümüz, ağsaqqalımız olmağa) ümid edilən bir adam idin. İndi atalarımızın ibadət etdiyinə (bütlərə, tanrılara) ibadət etməyi bizə qadağanmı edirsən? Doğrusu, biz sənin bizləri dəvət etdiyin (tövhid) barədə şəkk-şübhə içindəyik”.

63. (Saleh onlara) belə cavab verdi: “Ey camaatım! Bir deyin görək. Əgər mənim Rəbbimdən aşkar bir möcüzə olsa, O mənə Özündən bir mərhəmət (peyğəmbərlik) lütf etsə, mən də Ona asi olsam, məni Allahın əzabından kim qurtara bilər? Siz mənə ziyandan başqa bir şey artırmayacaqsınız!

64. Ey camaatım! Allahın bu dişi (maya) dəvəsi sizin üçün bir möcüzədir. Qoyun Allahın torpağında otlasın, ona bir pislik etməyin, yoxsa şiddətli bir əzaba düçar olarsınız!”

65. Onlar (dəvəni) tutub (ayaqlarından) kəsdilər. (Saleh də onlara) dedi: “Daha üç gün yurdunuzda yaşayıb kef çəkin. Bu elə bir vəddir (sözdür) ki, yalan çıxmaz!”

66. (Saleh tayfasının məhvi barəsində) əmrimiz gəldikdə Bizdən bir mərhəmət olaraq Salehi və onunla birlikdə iman gətirənləri xilas etdik və o günün rüsvayçılığından qurtardıq. Həqiqətən, Rəbin yenilməz qüdrət sahibi, qüvvət sahibidir!

67. O zülm edənləri qorxunc (tükürpədici) bir səs bürüdü və evlərində diz üstə çöküb qaldılar (bir göz qırpımında həlak oldular).

68. Sanki onlar heç yaşamamışdılar. Bilin ki, Səmud tayfası Rəbbini inkar etmişdi. Xəbəriniz olsun ki, Səmud tayfası (Allahın mərhəmətindən) kənar (uzaq) oldu!

69. Həqiqətən, elçilərimiz (mələklər) İbrahimə müjdə (İshaqın anadan olacağı xəbərini) gətirib: “Salam!” – dedilər. (İbrahim də: )

“Salam!” – deyə cavab verdi və dərhal (gedib onlara) qızarmış bir buzov gətirdi.

70. (İbrahim qonaqların) əllərinin yeməyə uzanmadıqlarını gördükdə onların bu hərəkəti xoşuna gəlmədi və qorxuya düşdü. Onlar dedilər: “Qorxma (biz Allahın mələkləriyik), biz Lut tayfasına (onu məhv etmək üçün) göndərilmişik!”

71. (İbrahimin) arvadı (Sara pərdə arxasında) durmuşdu (və ya qonaqlara qulluq edirdi). O (bu sözləri eşidib Lut tayfasının başına gələcək müsibətdən qafil olduğuna sevinərək və ya qoca yaşında oğlu olacağına təəccüblənərək) güldü. Bundan sonra Biz onu İshaqla, İshaqın da ardınca Yəqubla (İshaqın, ondan sonra Yəqubun dünyaya gələcəyi ilə) müjdələdik.

72. (İbrahimin arvadı) dedi: “Vay halıma! Mən qoca bir qarı, bu ərim də ixtiyar bir kişi olduğu halda, mən necə doğa bilərəm?! Bu çox təəccüblü bir şeydir!”

73. (Mələklər ona) dedilər: “Allahın əmrinə (əmr etdiyi bir şeyə) təəccübmü edirsən? Ey ev əhli! Allahın bərəkəti və mərhəməti üstünüzdə olsun. Allah təriflənib şükür olunmağa, öyünüb mədh edilməyə layiqdir!” (Allahın bütün işləri bəyənilmişdir. O, tükənməz və əvəzsiz nemət, ehsan və kərəm sahibidir!)

74. İbrahimin qorxusu çəkildikdə və ona (İshaqın doğulacağı haqqında) müjdə gəldikdə Lut tayfası barəsində Bizimlə (mələklərimizlə) mübahisə etməyə başladı. (Əzabın onlardan dəf edilməsini istədi).

75. Həqiqətən, İbrahim həlim xasiyyətli, (həmişə dua edərək) yalvarıb-yaxaran və özünü tamamilə (Allaha) təslim etmiş bir zat idi. (İbrahimin mələklərlə mübahisəsi onun bu yüksək keyfiyyətlərindən irəli gəlirdi).

76. (Mələklər dedilər: ) “Ey İbrahim! Bundan (bu mübahisədən) əl çək, Rəbbinin əmri artıq gəlmişdir. Onlara mütləq qarşısıalınmaz bir əzab gələcəkdir.

77. Elçilərimiz (mələklər) Lutun yanına gəldikləri zaman (tayfası bu gözəl qonaqlara bir pislik yetirər deyə) əndişəyə düşdü, ürəyi sıxıldı və: “Bu, çox çətin (başabəlalı) bir gündür!” – dedi.

78. Tayfası (qonaq gəldiyini bilən) tələsik (Lutun) yanına gəldi. Onlar (Lutun yanına gəlməzdən və mələkləri görməzdən) əvvəl də pis işlər görürdülər. (Lut onlara) dedi: “Ey qövmüm! Bunlar (balalarım və ya ümmətimin qadınları) mənim qızlarımdır (onlardan şəriətə müvafiq surətdə istifadə edin). Onlar (nikah baxımından) sizin üçün daha təmizdirlər. Allahdan qorxun və (yaramaz əməllərinizlə) məni qonaqların yanında rüsvay etməyin. Məgər aranızda (sizə yaxşı işlər görməyi əmr edən, pis işləri yasaq edən) ağlı başında bir adam yoxdur?”

79. Onlar dedilər: “Sənin qızlarına heç bir rəğbətimiz (və ya ehtiyacımız) olmadığını, şübhəsiz, bilirsən. Nə istədiyimizi də, yəqin ki, bilirsən!”

80. (Lut) dedi: “Kaş sizə çatan bir gücüm-qüvvətim olaydı, yaxud möhkəm bir arxaya söykənəydim (alınmaz bir qalaya və ya güclü bir qəbiləyə pənah apara biləydim)!”

81. (Mələklər) dedilər: “Ey Lut! Biz sənin Rəbbinin elçiləriyik. Onlar əsla sənə toxuna bilməzlər. Gecənin bir vaxtında ailənlə birlikdə çıx get. Heç kəs dönüb geri baxmasın. Təkcə övrətin istisnadır. Onlara toxunacaq əzab övrətinə də toxunacaqdır. Onların (ölüm) vaxtı səhərdir. Səhər yaxın deyilmi?”

82. (Lut tayfasının məhvi barəsində) əmrimiz gəldiyi zaman o yurdun altını üstünə çevirdik və üzərinə odda bişmiş (bir-birinə bitişik) bərk daşlar yağdırdıq.

83. Onlara Rəbbinin dərgahında əlamət qoyulmuş (hər daş kimə dəyəcəkdisə, üstünə adı yazılmışdı). (Ya Rəsulum!) O (daşlar sənin ümmətin içərisində olan) zalımlardan də uzaq deyildir! (Əgər şirkdən və küfrdən tövbə edib əl çəkməsələr, onların da başına yağar).

84. Mədyən əhlinə də qardaşları Şüeybi (peyğəmbər göndərdik). O dedi: "Ey qövmüm! Allaha ibadət edin. Sizin Ondan başqa heç bir tanrınız yoxdur. Ölçünü və çəkini əskiltməyin. Mən sizi xeyir-bərəkət içində (firavan yaşamaqda) görürəm. Bununla belə (Allahın hökmlərinə riayət etməyəcəyiniz təqdirdə) sizi (hər tərəfdən) bürüyəcək bir günün əzabından qorxuram!

85. Ey qövmüm! Ölçüdə və çəkidə düz (ədalətli) olun. İnsanların heç bir şeydə haqqını əskiltməyin (adamların mallarının dəyərini aşağı salmayın, hər kəsin haqqı nə isə, onu da verin). Yer üzündə gəzib fitnə-fəsad törətməyin!

86. Əgər möminsinizsə, (bilin ki, ölçüdə və çəkidə düz olandan sonra) Allahın (halal olaraq) verdiyi mənfəət (dünyada və axirətdə) sizin üçün daha xeyirlidir. Mən də sizə nəzarətçi deyiləm!"

87. Onlar (istehza ilə) dedilər: "Ey Şüeyb! Atalarımızın tapındığı bütləri tərk etməyimizi, mallarımızla istədiyimiz kimi hərəkət etməkdən vaz keçməyimizi sənə namazınmı (dininmi) əmr edir? Sən doğrudan da, həlim xasiyyətlisən, çox ağıllısan!"

88. (Şüeyb onlara) belə cavab verdi: "Ey qövmüm! Bir deyin görək! Əgər mən Rəbbimdən aşkar bir möcüzə ilə gəlsəm və Rəbbim mənə Öz dərgahından gözəl (halal) bir ruzi versə (mən ona haram qatarammı)? (Və ya mən öz Rəbbimə asi ola bilərəmmi?) Mən sizə

yasaq buyurduğum şeyin əksinə gedib onu özüm etmək istəmirəm. Mən yalnız bacardığım qədər sizi islah etmək istəyirəm. Mənim (bu işdə) müvəffəqiyyətim yalnız Allahın köməyilədir. Mən yalnız Ona təvəkkül etdim və məhz Onun hüzuruna dönəcəyəm!

89. Ey qövmüm! Mənə qarşı olan ədavətiniz (qorxun ki) Nuh tayfasının, Hud camaatının və Saleh qövmünün başına gələnləri sizin də başınıza gətirməsin. Lut tayfası da sizdən uzaq deyildir! (Mənə qarşı düşmənçilik etsəniz, onların başına gələn müsibətlər, sizin də başınıza gələr).

90. Rəbbinizdən bağışlanmağınızı diləyin və Ona tövbə edin. Həqiqətən, Rəbbim (bəndələrinə) rəhm edəndir, (onları çox) sevəndir!”

91. Onlar dedilər: “Ey Şüeyb! Dediklərinin çoxunu başa düşmür və səni aramızda zəif (gücsüz) görürük. Əgər əşirətin (dinimizə tapınan qəbilən) olmasaydı, səni daşqalaq edərdik. Yoxsa sən bizim üçün əziz (hörmətli) bir adam deyilsən!”

92. (Şüeyb) dedi: “Ey qövmüm! Məgər mənim əşirətim sizə Allahdan da əzizdir ki, Onu unudub saymırsınız? Həqiqətən, Rəbbim (elmi ilə) nə etdiklərinizi biləndir!

93. Ey qövmüm! Əlinizdən gələni edin. Mən də etdiyimi edəcəyəm. Rüsvayedici əzabın kimə gələcəyini və kimin yalançı olduğunu biləcəksiniz. (Əzabı) gözləyin. Doğrusu, mən də sizinlə birlikdə gözləyirəm!”

94. (Şüeyb tayfasının məhvi barəsində) əmriniz gəldikdə Özümüzdən bir mərhəmət olmaqla, Şüeybi və onunla birlikdə iman gətirənləri xilas etdik. O zülm edənləri isə, dəhşətli (tükürpədici) bir səs bürüdü və onlar öz evlərində diz üstə çöküb qaldılar (bir göz qırpımında məhv oldular).

95. Sanki onlar heç yaşamamışdılar. Bilin ki, Mədyən tayfası da Səmud qövmü kimi (Allahın rəhmətindən) uzaq (kənar) oldu!

96. Biz Musanı da möcüzələrimizlə və açıq-aşkar bir (dəlillə) peyğəmbər göndərdik -

97. Firona və onun əyan-əşrafında. Onlar Fironun əmrinə tabe oldular. Halbuki Fironun əmri düzgün deyildi.

98. (Firon) qiyamət günü camaatının qabağında gedib onları atəşə (Cəhənnəmə) aparacaq; Onların düşəcəkləri yer necə də pisdir!

99. Onlar burada (dünyada) da, qiyamətdə (axirətdə) də lənətə düçar olmuşlar. Onların qisməti necə də pisdir!

100. Bu, (məhv olmuş) məmləkətlərin xəbərlərindəndir ki, sənə söylədik. Onların bəzisindən əsər-əlamət qalmış, bəzisi isə yerlə yeksan olmuşdur.

101. Biz onlara zülm etmədik. Onlar özləri özlərinə zülm etdilər. Allahdan qeyri ibadət etdikləri tanrılar Rəbbinin əmri gəldikdə onlara heç bir fayda vermədi (əsla əzabdan xilas edə bilmədi), əksinə, yalnız ziyanlarını artırdı.

102. Rəbbin zülmkar məmləkətləri əzabla yaxalayanda belə yaxalayar. Onun cəzası, doğrudan da, ağrılı-acılıdır, şiddətlidir!

103. Bütün bu deyilənlərdə axirət əzabından qorxan şəxs üçün həqiqi bir ibrət dərsi vardır. Bu (bütün) insanların bir yerə cəm ediləcəyi, hamının şahid olacağı bir gündür.

104. Biz onu yalnız müəyyən bir müddət üçün təxirə salmışıq.

105. (Qiyamət) gəldiyi gün (Allahın) izni olmadan heç kəs danışa bilməz. (O gün) insanların bir qismi bədbəxt, bir qismi isə xoşbəxt olacaqdır!

106. Bədbəxt olanlar od içərisində (Cəhənnəmdə) qalacaqlar. Onların orada ah-fəryad gözləyir.

107. Rəbbinin istədiyi (tövhid və iman əhli) istisna olmaqla, onlar orada əbədi göylər və yer durduqca qalacaqlar. Həqiqətən, Rəbbin istədiyini edəndir. (Günahkar möminlər kafirlərdən fərqli olaraq bir müddət Cəhənnəmdə qalıb günahları təmizlənəndən sonra Allahın izniylə Cənnətə daxil ediləcəklər).

108. Xoşbəxt olanlar isə Cənnətdədirlər. Onlar, Rəbbinin dilədiyindən (bəzi kamil möminlərin daha yüksək mərtəbələrə - ərşi-əlaya qalxması, bir müddət Cəhənnəmdə əylənməsi və Allahın izni ilə onlara günahkarlardan ötrü şəfaət etmək şərəfi nəsib olmasından) əlavə, tükənməz bir nemət kimi göylər və yer durduqca orada əbədi qalacaqlar.

109. Elə isə bunların (bütpərəstlərin) tapındıqlarının (bütlərin) batil olmasına şübhə etmə. Onlar ancaq atalarının əvvəlcə ibadət etdikləri kimi (kor-koranə) ibadət edirlər. Biz onların qismətini əskiltmədən (tamam-kamal) verəcəyik!

110. Biz Musaya kitab (Tövrat) verdik və onun (Quranın) barəsində də ixtilaf düşdü (yəhudilərin bəzisi isə inanmadı). Əgər Rəbbindən öncə bir söz (ilahi hökm, təqdir) olmasaydı (cəza qiyamətə saxlanılmasaydı), şübhəsiz ki, (hələ dünyada ikən) işləri bitmişdi. (Ya Rəsulum!) Həqiqətən, onlar (yəhudilər və ya Məkkə müşrikləri) onun (Quranın) barəsində də şəkk-şübhədədirlər!

111. Rəbbin, şübhəsiz ki, onların hamısına əməllərinin cəzasını verəcəkdir. Allah onların nə etdiklərindən xəbərdardır!

112. (Ya Rəsulum!) Sənə əmr edildiyi kimi, düz (yolda) ol. Səninlə birlikdə iman gətirənlər (tövbə edib ardınca gedənlər) də düz (yolda)

olsunlar. (Allahın əmrlərini pozub) həddi aşmayın, çünki O sizin nə etdiklərinizi görəndir!

113. Zülm edənlərə (rəğbət bəsləməklə, kömək göstərməklə) meyl etməyin, yoxsa sizə atəş toxunar (cəhənnəmlik olarsınız). Sizin Allahdan başqa dostunuz (himayədarınız) yoxdur. Sonra sizə (dünyada da, axirətdə də Onun əzabından heç bir) kömək olunmaz!

114. (Ya Rəsulum!) Namazı gündüzün iki başında (günortadan əvvəl və sonra, yəni səhər, günorta və gün batan çağı və ya günün iki başında, yəni səhər-axşam) və gecənin (gündüzə yaxın) bəzi saatlarında (axşam və gecə vaxtı) qıl. Həqiqətən, (beş vaxt namaz kimi) yaxşı əməllər pis işləri (kiçik günahları) yuyub aparar. Bu, (Allahın mükafatını və cəzasını) yada salanlara öyüd-nəsihətdir (xatırlatmadır).

115. (Müşriklərin və kafirlərin əzab-əziyyətinə) səbr et. Allah yaxşı işlər görənlərin mükafatını zay etməz!

116. Barı, sizdən əvvəlki nəsillərin ağıl və fəzilət (hünər) sahibləri yer üzündə fitnə-fəsad törətməyi qadağan edəydilər! Onların xilas etdiyimiz az bir qismi istisnadır. (Onlar keçmiş peyğəmbərlərin əshabələridir ki, insanlara yaxşı işlər görməyi əmr edər, pis işləri yasaq edərdilər.) Zalımlar isə onlara verilmiş nemətə (dünyanın ləzzətinə) uydular və günahkar oldular.

117. Məmləkətlərin əhalisi əməlisaleh olduğu ikən Rəbbin onları haqsız yerə məhv etməz!

118. Əgər Rəbbin, istəsəydi bütün insanları (eyni dində olan) tək bir ümmət edərdi. Onlar (yəhudi, xaçpərəst, atəşpərəst və i. a. olmaqla dinləri barəsində) hələ də ixtilafdadırlar.

119. Rəbbinin mərhəmət etdiyi kimsələr istisnadır. (Rəbbin) onları bunun üçün (belə bir ixtilafa düşdüklərinə görə xoşbəxt və bədbəxt,

mömin və kafir, cənnət və cəhənnəm əhli) yaratmışdır. (Allah insanların dində ixtilafda olub-olmayacaqlarını, özlərini necə aparacaqlarını əzəldən bildiyi üçün onların bütün gələcək işlərini və hərəkətlərini öz qüdrət qələmi ilə lövhi-məhfuzda yazmışdır). Artıq Rəbbinin (mələklərə dediyi): “Mən Cəhənnəmi (Allahı inkar edən) bütün cinlər və insanlarla dolduracağam!” - sözü tamamilə yerinə yetdi!

120. (Ya Rəsulum!) Biz peyğəmbərlərin xəbərlərindən (başlarına gələnlərdən) ürəyini möhkəmləndirəcək (qəlbinə qüvvət verəcək) nə varsa, (hamısını) sənə nağıl edirik. Bu (surə) sənə haqq, möminlərə isə moizə və öyüd-nəsihət olaraq gəlmişdir!

121. İman gətirməyənlərə de: “Siz etdiyinizi (bacardığınızı) edin, biz də etdiyimizi edəcəyik!

122. Və (düçar olacağınız əzabı) gözləyin. Biz də gözləyirik!”

123. Göylərin və yerin qeybi Allaha məxsusdur (Onun elmindədir). Bütün işlər də axırda Ona (Allaha) qayıdacaqdır. (Ya Rəsulum!) Yalnız Ona ibadət et və yalnız Ona təvəkkül elə. Rəbbin nə etdiklərinizdən qafil deyildir!

## .12.
## Yusuf (Yusif) surəsi
**(Məkkədə nazil olmuşdur, 111 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Əlif, Lam, Ra! Bunlar açıq-aydın Kitabın (Quranın) ayələridir!
2. (Ey Məkkə əhli!) Biz onu ərəbcə bir Quran olaraq nazil etdik ki, (mənasını ) anlayasınız.

3. (Ya Rəsulum!) Biz bu Quranı sənə vəhy etməklə sənin üçün ən gözəl hekayəti (qissəni) danışırıq. Hərçənd ki, sən əvvəlcə (ondan) əsla xəbərdar deyildin.

4. Bir zaman Yusif atasına demişdir: "Atacan! Mən (yuxuda) on bir ulduz və Günəşlə ayı gördüm. Gördüm ki, onlar mənə səcdə (təzim) edirlər".

5. (Atası Yəqub) dedi: "Can oğul! Yuxunu qardaşlarına danışma, yoxsa sənə bir hiylə qurarlar. Çünki Şeytan insanların açıq-aşkar düşmənidir.

6. (Yuxuda gördüyü kimi) Rəbbin səni (başqalarından) seçib üstün tutacaq, sənə yuxu yozmağı öyrədəcək, bundan əvvəl babaların İbrahimə və İshaqa nemətini tamamlayıb (peyğəmbərlik) verdiyi kimi, sənə və Yəqub nəslinə də tamamlayıb verəcək. Həqiqətən, Rəbbin (hər şeyi) biləndir, hikmət sahibidir!"

7. Yusifin və qardaşlarının əhvalatında (bu haqda) soruşanlar üçün (neçə-neçə) ibrətlər vardır.

8. Bir zaman (Yusifin qardaşları öz aralarında) belə demişdilər: "Biz (bir-birimizə bağlı, sayca çox, güclü) bir dəstə olduğumuz halda, Yusif və onun (atabir-anabir) qardaşı (Bin Yamin) atamıza daha əzizdirlər. Həqiqətən, atamız açıq-aşkar səhv edir!"

9. (Aralarında biri dedi: ) "Yusifi öldürün və ya (uzaq) bir yerə atın ki, atanız mehrini yalnız sizə salsın. Ondan sonra isə (tövbə edib) əməlisaleh bir camaat olarsınız!"

10. Bir başqası (Rubil və ya Şəmun) belə dedi: "Yusifi öldürməyin, onu bir quyunun dibinə atın. Əgər belə etsəniz, yol keçənlərdən biri onu götürər".

11. Onlar dedilər: “Ata! Biz Yusifin xeyirxahları olduğumuz halda, sən nə üçün onu bizə etibar etmirsən?

12. Sabah onu bizimlə birlikdə (çölə gəzməyə) göndər, qoy oynayıb əylənsin, gözü-könlü açılsın. Biz onu mütləq qoruyacağıq!”

13. (Yəqub) dedi: “Onu aparmağınız məni çox məyus edər (ayrılığına dözə bilmərəm). Qorxuram ki, onu qurd yeyə, siz də xəbər tutmayasınız!”

14. Onlar: “Biz güclü bir dəstə (on bir nəfər) ola-ola (gözümüzün qabağında) qurd onu yesə, onda biz aciz olarıq ki!” – deyə cavab verdilər.

15. (Qardaşları) onu (Yusifi) götürüb (çölə) apararkən onu quyuya atmaq üçün sözü bir yerə qoydular. Biz (Yusifə): “Sən (bir vaxt) onlara (qardaşlarına) özlərinin bu işi barəsində heç gözləmədikləri (səni tanımadıqları) halda xəbər verəcəksən!” – deyə vəhy etdik.

16. Onlar axşamüstü ağlaya-ağlaya atalarının yanına gəldilər.

17. Və dedilər: “Ata! Biz (at çapmaq, yaxud qaçışıb-ötüşmək və ya ox atmaqda) bir-birimizlə yarışmaq üçün (səhraya) getmişdik və Yusifi şeylərimizin (libaslarımızın) yanında qoymuşduq. Bir də xəbər tutduq ki, qurd onu yemişdir. İndi biz doğru danışsaq da, sən bizə inanmayacaqsan!”

18. Onlar (Yusifin) köynəyinin üstünə yalandan bir qan (ləkəsi yaxıb) gətirmişdilər. (Yəqub) dedi: “Xeyr (heç də dediyiniz kimi deyildir), sizin öz nəfsiniz sizi bu işə sövq etmişdir (çirkin əməlinizi sizə gözəl göstərmişdir). Mənə yalnız gözəl (tükənməz, dözümlü) səbir gərəkdir. Dediklərinizdən (Yusif barəsində dediklərinizin yalan olduğunu sübut etməkdən) ötrü ancaq Allahdan kömək diləmək lazımdır!”

19. Nəhayət, (Mədyəndən Misirə gedən) bir dəstə müsafir (karvan əhli bu yerə) gəlib suçularını (su dalınca) göndərdilər. (Suçu) qabını suya salan kimi: "Müjdə! Bu bir oğlandır! – dedi. Onlar (müsafirlər və ya qardaşları Yusifi) satdıq bir şey (ticarət malı) kimi gizlədib saxladılar. Allah onların nələr etdiyini (Yusifin başına nə oyunlar açdığını) biləndir!

20. (Yusifi təqib edən qardaşları işin nə yerdə olduğunu bildikdə: "Bu bizim qaçmış köləmizdir! – deyə) onu dəyərsiz bir qiymətə - bir neçə dirhəmə satdılar və (bu işdə pul qazanmaq deyil, yalnız Yusifdən xilas olmaq, onu atası Yəqubdan ayırmaq məqsədini güddükləri üçün qardaşlarını baha məbləğə satmağa) tamah göstərmədilər.

21. (Yusifi) Misirdə satın alan (padşahın Əziz ləqəbli vəziri Qitfir) öz zövcəsinə belə dedi: "Ona hörmət et (yaxşı bax). Ola bilsin ki, bizə fayda versin və ya onu oğulluğa götürək!" Beləliklə, Yusifi o yerdə (Misirdə) yerləşdirdik, həm də ona yuxu yozmağı öyrətdik. Allah Öz işində (əmrində) qalibdir (istədiyini edəndir), lakin insanların əksəriyyəti (bunu) bilməz!

22. (Yusif gəncliyinin) ən yetkin dövründə (17, 18, 21, 30 yaxud 33 yaşına) çatdıqda ona hikmət (peyğəmbərlik) və elm verdik. Biz yaxşı işlər görənləri belə mükafatlandırırıq!

23. Evində olduğu qadın (Züleyxa Yusifi) tovlayıb yoldan çıxartmaq (onunla yaxınlıq etmək) istədi və qapıları bağlayaraq: "Di gəlsənə!" – dedi. (Yusif isə: ) "Mən (sənin bu hərəkətindən) Allaha sığınıram. Axı o (sənin ərin) mənim ağamdır. O mənə yaxşı baxır (və ya Allah mənim ixtiyar sahibimdir, mənə mərhəmət ehsan buyurmuşdur). Həqiqətən, (ağasına xəyanət etməklə, onun əhli-əyalına pis gözlə baxmaq və zina etməklə özlərinə) zülm edənlər nicat tapmazlar!" – deyə cavab verdi.

24. Doğrudan da (qadın) ona meyl salmışdı. Əgər Rəbbinin dəlilini (xəbərdarlığını) görməsəydi, (Yusif də) ona meyl edərdi. Biz pisliyi və biabırçılığı (zinanı) ondan sovuşdurmaq üçün belə etdik. O, həqiqətən, Bizim sadiq bəndələrimizdəndir!

25. (Yusif canını qurtarmaq, Züleyxa da onu yaxalayıb kamına çatmaq məqsədilə) hər ikisi qapıya tərəf cumdu. (Züleyxa) onun köynəyini arxadan cırdı. Onlar qapının ağzında (qadının) ağası (əri) ilə rastlaşdılar. (Züleyxa) dedi: "Sənin ailənə pislik (övrətinlə zina) etmək istəyənin cəzası yalnız zindana salınmaq, ya da şiddətli bir əzaba düçar edilməkdir!"

26. (Yusif) dedi: "O məni tovlayıb yoldan çıxartmaq (mənimlə yaxınlıq etmək) istədi!" Bir şahid (Züleyxanın beşikdə olan körpə əmisi oğlu) belə şəhadət verdi: "Əgər (Yusifin) köynəyi öndən cırılmışsa, (qadın) doğru deyir, o isə yalançılardandır.

27. Yox, əgər onun köynəyi arxadan cırılıbsa, (qadın) yalan deyir, o (Yusif) isə doğrudanışanlardandır."

28. (Qadının əri Yusifin) köynəyinin arxadan cırıldığını gördükdə dedi: "Bu sizin (siz qadınların) məkrlərinizdəndir. Doğrudan da, sizin məkriniz böyükdür!"

29. Ey Yusif! Sən bu işi açıb ağartma. Sən də (ey qadın) günahına görə (Allahdan) bağışlanmanı dilə. Çünki sən, həqiqətən, günah edənlərdənsən.

30. Şəhərdəki qadınlar dedilər: "Vəzirin övrəti cavanı (cavan qulunu) tovlayıb yoldan çıxartmaq (onunla yaxınlıq etmək) istəyir. (Yusifin) məhəbbəti onun bağrını qan etmişdir. Biz onun açıq-aşkar (doğru) yoldan çıxdığını görürük.

31. (Züleyxa qadınların) gizli dedi-qodularını (məkrini) eşitdikdə onlara xəbər göndərib ziyafətə dəvət etdi, onlar üçün gözəl

(mütəkkələrlə, xalılarla döşənmiş bir otaqda ləziz təamlardan ibarət) bir məclis düzəltdi. Onların hər birinə (meyvə kəsib soymaq üçün) bir bıçaq verdi, sonra (Yusifə): “Onların qarşısına çıx!” – deyə əmr etdi. (Qadınlar Yusifi) gördükdə (gözəlliyinə heyran olub) onu həddindən artıq təriflədilər və (özlərini itirib əllərindəki turuncun qabığını soymaq əvəzinə) əllərini kəsdilər. Onlar: “Aman Allah! Bu ki, bəşər deyildir. Bu ancaq (Allah yanında) möhtərəm (əziz) olan bir mələkdir!” - dedilər.

32. (Züleyxa qadınların özlərinə gəldikdən sonra kəsilmiş əllərinin ağrısından ah-vay etdiklərini və bu hərəkətlərindən xəcalət çəkdiklərini görüb onlara) belə dedi: “Bu, (könlümü ona vermədiyimə görə) məni qınadığınız (oğlandır). Mən onun olmaq istədim, o isə imtina etdi. (Bir daha deyirəm) əgər əmrimi yerinə yetirməsə, sözsüz ki, zindana atılacaq və zillətə düşənlərdən olacaq!”

33. (Yusif) dedi: “Ey Rəbbim! Mənim üçün zindan bunların məni sövq etdikləri işi görməkdən xoşdur. Əgər (bu qadınların) hiyləsini məndən dəf etməsən, mən onlara meyl edər və cahillərdən olaram”.

34. Rəbbi (Yusifin) duasını qəbul buyurub (qadınların) məkrindən qurtardı. Həqiqətən, O, (hər şeyi) eşidəndir, biləndir!

35. (Vəzir və ailəsi Yusifin günahsız olduğunu sübut edən) dəlilləri (Yusifin köynəyinin arxadan cırılmasını, üzünün cırmaqlanmasını, qadınların turunc əvəzinə əllərini kəsməsini və i. a.) gördükləri halda, yenə də onu bir müddət (dedi-qodu kəsilənədək) zindana salmaq qərarına gəldilər. (Beləliklə, Yusif zindana atıldı).

36. Onunla birlikdə iki cavan oğlan da (padşahı zəhərləməyə cəhd göstərməkdə ittiham edilmiş şah sarayının saqisi və aşpazı) zindana atıldı. (Gənclər Yusifin çox gözəl yuxu yozduğunu bildikdən sonra) onlardan biri (şərab paylayan) dedi: “Mən (yuxuda) gördüm ki, şərab (üçün üzüm) sıxıram”. Digəri (aşpaz) isə belə dedi: “Mən gördüm ki,

başımın üstündə çörək aparıram, quşlar da ondan yeyir. Gəl bu yuxunu bizə yoz. Biz, həqiqətən, sənin yaxşı adamlardan olduğunu görürük!"

37. (Yusif) belə cavab verdi: "Yeyəcəyiniz təam gəlməmişdən əvvəl mən onun mənasını (gördüyünüz yuxuların dünyada nə ilə nəticələnəcəyini və ya yeməklərin nədən ibarət olacağını) sizə xəbər verərəm. Bu, Rəbbimin mənə öyrətdiyi elmlərdəndir. Mən Allaha inanmayan və axirəti də inkar eləyən bir tayfanın dinini tərk etdim!

38. Mən ata-babalarım İbrahim, İshaq və Yəqubun dininə tabe oldum. Bizə heç bir şeyi Allaha şərik qoşmaq yaraşmaz. Bu (tövhid) Allahın bizə və (bütün) insanlara bəxş etdiyi nemətdir, lakin insanların əksəriyyəti (Ona) şükür etməz!

39. Ey mənim iki zindan yoldaşım! (Sizə nə bir xeyir, nə də bir zərər verə bilən) ayrı-ayrı tanrılar daha yaxşıdır (ibadət olunmağa daha layiqdir), yoxsa bir olan, (hər şeyə) qadir (qalib) olan Allah?!

40. (Allahdan) qeyri ibadət etdikləriniz sizin və atalarınızın (özündən uydurub) qoyduğunuz (Allaha heç bir aidiyyəti olmayan) adlardan (bütlərdən) başqa bir şey deyildir. Allah isə onlara (ibadət edilməsinə dair) heç bir dəlil nazil etməmişdir. Hökm ancaq Allahındır. O sizə yalnız Onun Özünə ibadət etmənizi buyurmuşdur. Doğru (həqiqi) din budur, lakin insanların çoxu (bu həqiqəti) bilməz!

41. Ey iki zindan yoldaşım! (Yuxularınızın mənasına gəldikdə) sizin biriniz yenə ağasına şərab içirdəcək, digəriniz isə edam olunacaq, quşlar da onun başından (dimdikləyib) yeyəcəklər. Haqqında soruşduğunuz iş belə həll edilmişdir!" (Birinizin həbsdən azad edilməsi, o birinizin asılması barəsində fərman verilmişdir!)

42. (Yusif) bu iki nəfərdən nicat tapacağını yəqin etdiyi kimsəyə (şərabpaylayana) dedi: "Ağanın yanında məni də yada sal!" Lakin

Şeytan ona ağasının yanında (Yusifi) yada salmağı unutdurdu və buna görə də o (Yusif) bir neçə (yeddi və ya on iki) il zindanda qaldı.

43. (Bir gün) padşah (Misir padşahı) belə dedi: “Mən (yuxuda) yeddi arıq inəyin yeddi kök inəyi yediyini, həmçinin yeddi yaşıl və yeddi quru sünbül (quru sünbüllərin yaşıl sünbüllərin üstünə qalxıb bellərinə sarıldığını) gördüm. Ey əyanlar! Əgər yuxu yoza bilirsinizsə, mənim bu yuxumu yozun!”

44. Onlar: “(Bu gördüklərin) qarmaqarışıq yuxulardır. Biz (belə) yuxuların yozumunu bilmirik!” – deyə cavab verdilər.

45. (Zindandakı) iki (cavan) oğlandan (edamdan) xilas olan (şərabpaylayan) bir neçə müddətdən sonra (Yusifi) xatırlayıb dedi: “Mən sizə onun yozumunu xəbər verərəm. Bircə məni (zindana – Yusifin yanına) göndərin!”

46. (Cavan oğlan padşahın izniylə zindana gəlib dedi: ) “Yusif! Ey doğru danışan adam, bizim üçün bir yoz görək! Yeddi arıq inək yeddi kök inəyi yeyir. Yeddi yaşıl sünbül, yeddi də quru sünbül. (Bir bunun mənasını mənə izah elə). Bəlkə, mən adamların yanına (düzgün cavabla) qayıda bilim; bəlkə, onlar da (bu yuxunun mənasını) bilsinlər!”

47. (Yusif) belə cavab verdi: “Yeddi il adətiniz üzrə (həmişəki kimi) əkin. Yediyiniz az bir miqdar istisna olmaqla, qalan biçdiyinizi (artıq qalan məhsulu) isə sünbüldə saxlayın.

48. Sonra bunun ardınca yeddi il quraqlıq (qıtlıq) olacaq. Onda əvvəlcədən həmin illər üçün tədarük etdiyinizi yeyər, yalnız az bir miqdar (toxumluq) saxlayarsınız.

49. Daha sonra insanların bol yağış (bərəkət) görəcəyi bir il gələcək. Onda da adamlar (zeytun, üzüm, xurma və s. meyvələrin) şirəsini sıxacaqlar (onlardan bol-bol istifadə edib bəhrələnəcəklər)”.

50. (Bunları eşidən) hökmdar: “Onu mənim yanıma gətirin!” – dedi. (Onun göndərdiyi) elçi (Yusifin) yanına gəldikdə o: “Ağanın yanına qayıdıb soruş ki, (Züleyxanın məclisində) əllərini kəsən o qadınların məqsədi nə idi? Həqiqətən, Rəbbim onların məkrini biləndir!”

51. (Padşah həmin qadınları çağırtdırıb) soruşdu: “Yusifi tovlayıb yoldan çıxartmaq istəməkdə məqsədiniz (qəsdiniz) nə idi? (Qadınlar: ) “Allah eləməsin! Biz onun barəsində pis bir şey bilmirik!” – deyə cavab verdilər. Vəzirin övrəti (Züleyxa) dedi: “Artıq indi həqiqət bəlli oldu. Yusifi tovlayıb yoldan çıxartmaq istəyən mən idim. O, şübhəsiz, doğrudanışanlardandır!”

52. (Yusif dedi:) “Bu (qadınlara həqiqəti etiraf etdirməyim) ona görədir ki, (vəzir evdə) olmadıqda mənim ona xəyanət etmədiyimi və Allahın xainlərin hiylələrinə yol vermədiyini (onları baş tutmağa qoymadığını) bilsin!

53. Mən özümü təmizə çıxartmıram. Rəbbimin rəhm etdiyi kimsə istisna olmaqla, nəfs (insana) pis işlər görməyi (şəhvətə uymağı) əmr edər. Həqiqətən, Rəbbim bağışlayandır, rəhm edəndir!”

54. Padşah dedi: “(Yusifi) yanıma gətirin, onu özümə ən yaxın (adam) edəcəyəm!” Sonra (padşah) onunla söhbət etdikdə: “Sən bu gün (bu gündən) yanımızda mövqe sahibisən, etibarlı bir şəxssən!” – dedi.

55. (Yusif) dedi: “Məni bu yerin (Misirin) xəzinələrinə məmur təyin et (Misir xəzinələrini mənə tapşır), çünki mən (özümə etibar edilən mal-dövləti) qoruyanam, (işləri idarə etməyi) bilənəm!”

56. Beləliklə, Yusifi o yerdə (Misir torpağında) mövqe (ixtiyar) sahibi etdik. O, (Misirdə) istədiyini edirdi (istədiyi yerdə mənzil sala bilirdi). Biz istədiyimizə mərhəmətimizi nəsib edər, yaxşı işlər görənlərin mükafatını zay etmərik.

57. İman gətirib (Allahdan qorxanlar) pis əməllərdən çəkinənlər üçün axirət mükafatı, əlbəttə, daha xeyirlidir.

58. (Misirə ərzaq üçün yollanan) Yusifin qardaşları gəlib onun hüzuruna daxil oldular. Onlar (Yusifi) tanımadıqları halda, (Yusif) onları dərhal tanıdı.

59. (Yusif) onların (ərzaq) yüklərini hazırlayıb dedi: “Atabir qardaşınızı yanıma gətirin. Məgər mənim ölçüdə düz və qonaqpərvərlərin ən yaxşısı olduğumu görmürsünüz?!

60. Əgər onu yanıma gətirməsəniz, məndən bir qab (keyl) belə ərzaq gözləməyin və mənə də yaxınlaşmayın!”

61. (Yusifin qardaşları) dedilər: “Ondan ötrü atasını yola gətirməyə çalışarıq və sözsüz ki, (bunu) edərik”.

62. (Yusif) xidmətçilərinə dedi: “Onların (ərzaq əvəzinə verdikləri) mallarını da (xəlvətcə) yüklərinin içinə qoyun. Bəlkə, ailələrinə döndükdə onu (mallarının geri qaytarıldığını) başa düşsünlər və ola bilsin ki, (yenidən ərzaq almaq üçün bir daha yanımıza) qayıtsınlar!”

63. (Yusifin) qardaşları atalarının yanına döndükdə dedilər: “Ata! Bizə ərzaq (taxıl ölçülüb) verilməsi qadağan edildi. (Əgər Bin Yamini bizimlə Misirə göndərməsən, bizə daha heç bir şey verilməyəcək). Yenidən ərzaq (taxıl ölçüb) almaq üçün qardaşımızı bizimlə birlikdə (Misirə) göndər. Biz, əlbəttə, onu qoruyacağıq!”

64. (Yəqub) dedi: “Bundan əvvəl qardaşını (Yusifi) sizə etibar etdiyim kimi, heç onu sizə etibar edə bilərəmmi? Allah Özü (onu) ən yaxşı qoruyandır və rəhmlilərin ən rəhmlisidir!”

65. Onlar yüklərini açdıqda mallarının özlərinə qaytarıldığını görüb dedilər: “Ata! Daha nə istəyirik? Bu bizim özümüzə qaytarılmış mallarımızdır. Biz (onun vasitəsilə) ailəmiz bir daha ərzaq alıb gətirər, qardaşımızı qoruyar və (ərzağımızın üstünə) bir dəvə yükü də ərzaq artırarıq. Bu (əvvəlcə gətirdiyimiz) isə az bir ərzaqdır!”

66. (Yəqub) dedi: “Başınıza bir bəla (ölüm, fəlakət) gəlməyəcəyi təqdirdə Bin Yamini (sağ-salamat) qaytarıb yanıma gətirəcəyinizə dair Allaha ürəkdən and içib mənə söz verməyincə onu sizinlə (Misirə) göndərməyəcəyəm!” Onlar and içib söz verdikdə (Yəqub): “Allah dediyimizə şahiddir!” – dedi.

67. (Yəqub) dedi: “Oğullarım! (Misirə) eyni bir qapıdan girməyin, ayrı-ayrı qapılardan daxil olun (sizə göz dəyməsin). Bununla belə, mən Allahın qəza-qədərini sizdən heç bir şeylə dəf edə bilmərəm. Hökm yalnız Allahındır. Mən ancaq Ona təvəkkül etdim. Qoy təvəkkül edənlər də ancaq Ona təvəkkül etsinlər!”

68. Onlar ataları (Yəqubun) əmr etdiyi kimi (Misirə ayrı-ayrı qapılardan) daxil olduqda (bu) Allahın qəza-qədərini əsla onlardan dəf edə bilmədi (özləri də bilmədən oğurluqda ittiham olundular), ancaq Yəqubun ürəyində bir diləyi (oğlanlarına göz dəyməməsini) yerinə yetirmiş oldu. Şübhəsiz ki, Yəqub onu (vəhylə) öyrətdiyimiz üçün bir elm sahibi idi. Lakin insanların (kafirlərin) əksəriyyəti (Allahın sevib-seçdiyi zatlara vəhy, ilham yolu ilə elm öyrətməsini) bilməz!

69. Onlar Yusifin hüzuruna daxil olduqları zaman (Yusif) qardaşını (Bin Yamini) bağrına basıb dedi: “Mən, həqiqətən, sənin

qardaşınam. Onların etdikləri (başımıza gətirdikləri) işlərdən kədərlənmə!”

70. (Yusif) onların yüklərini hazırlatdığı vaxt qardaşının yükünün içinə bir su qabı (piyalə) qoydu. (Karvan yola düşdükdən) sonra (arxalarınca) bir carçı: “Ey karvan əhli! Siz, həqiqətən, oğrusunuz!” – deyə haray çəkdi.

71. (Yəqubun oğlanları arxalarınca gələnlərə tərəf) dönüb: “Nə itirmisiniz?” – deyə soruşdular.

72. Onlar belə cavab verdilər: “Hökmdarın (qızıl) su qabını itirmişik. Onu tapıb gətirənə (muştuluq olaraq) bir dəvə yükü ərzaq veriləcək!” (Carçı: ) “Mən də buna zaminəm!” - (dedi).

73. (Yəqubun oğlanları) dedilər: “Allaha and olsun! Siz də yəqin bilirsiniz ki, biz bu yerə (Misir torpağına) fitnə-fəsad salmaq üçün gəlməmişik və biz oğru da deyilik!”

74. Onlar soruşdular: “Əgər yalan desəniz (yalançı çıxsanız), onun (oğrunun su qabını götürənin) cəzası nədir?”

75. (Qardaşlar: ) “Onun cəzası yükündə (oğurluq şey) tapılan adamın özüdür (onun kölə edilməsidir). Biz zalımları belə cəzalandırırıq!” – deyə cavab verdilər.

76. (Yusif doğma) qardaşının yükündən (qabından) əvvəl onların yüklərini axtarmağa başladı, sonra su qabını qardaşının yükündən (tapıb) çıxartdı. Biz Yusifə (qardaşını yanında saxlamaq üçün) belə bir tədbir öyrətdik. Yoxsa padşahın (Misir hökmdarının) dininə (şəriətinə, qanunlarına) görə, o, qardaşını tutub öz yanında saxlaya bilməzdi. Allahın istədiyi isə müstəsnadır. (Yalnız Allah istədiyi üçün bu belə oldu). Biz istədiyimiz kimsəni dərəcələrlə yüksəldərik. Hər biləndən üstün bir bilən də vardır!

77. (Qardaşlar) dedilər: “Əgər o (Bin Yamin) oğurlamışdırsa, bundan qabaq onun bir qardaşı da (Yusif də) oğurluq etmişdi. . Yusif bu sözü ürəyində saxlayıb onlara açmadı və dedi: “Siz (Allah yanında ondan) daha pis bir mövqedəsiniz. Allah sizin (mənə və qardaşıma yalandan) aid etdiyiniz şeyləri daha yaxşı bilir!”

78. (Qardaşlar) dedilər: “Ey vəzir! Bunun çox qoca bir atası vardır. Onun yerinə bizim birimizi tutub saxla. Biz sənin yaxşılıq edən adamlardan olduğunu görürük”.

79. (Yusif) belə cavab verdi: “Allah eləməsin! Malımızı kimdə tapmışıqsa, yalnız onu tutub saxlayacağıq. Yoxsa, sözsüz ki, haqsızlıq etmiş olarıq!”

80. Onlar (Bin Yamindən) ümidlərini kəsdikdə kənara çəkilib pıçıldaşmağa başladılar (pıçıldaşaraq kənara çəkildilər). Onların (qardaşların) ən böyüyü dedi: “Məgər atanız sizi Allaha and içdirib əhd aldığını və bundan qabaq Yusif barəsindəki təqsirinizi bilmirsiniz? Atam (evə qayıtmağıma) izin və ya Allah (qardaşımın xilas olması haqqında) öz hökmünü verməyincə, mən bu yerdən (Misir torpağından) ayrılmayacağam! O (Allah) hökm verənlərin ən yaxşısıdır.

81. Atanızın yanına qayıdıb deyin: “Ata! Oğlun, həqiqətən, oğurluq etdi. Biz ancaq bildiyimiz şey barəsində şahidlik edirik. (Biz Bin Yaminin oğurluq etdiyini öz gözlərimizlə görməsək də, hər halda su qabı onun yükündən çıxdı). Biz qeybi mühafizə edən deyilik. (Bin Yamini sağ-salamat qaytarıb gətirəcəyimiz barədə sənə söz verdiyimiz zaman irəlidə bir oğurluq hadisəsinin baş verəcəyini və düzgün olub-olmasa da, onun qardaşımızın boynuna qoyulacağını haradan biləydik? Buna görə də bizi üzrlü hesab et).

82. Olduğumuz şəhərdən (Misir əhalisindən) də, birlikdə gəldiyimiz karvandan da soruş. Biz, həqiqətən, doğru danışanlarıq!”

83. (Qardaşlar Yəqubun yanına qayıdıb əhvalatı atalarına danışdıqdan sonra) o dedi: “Xeyr, sizin öz nəfsiniz sizi bu işə sövq etdi (pis əməlinizi sizə yaxşı göstərdi). (Bir dəvə yükü artıq ərzaq almaq xatirinə qardaşınızı bada verdiniz. Əvvələn, Bin Yamin heç vaxt oğurluq etməz. İkincisi, oğurluq edənin tutulub kölə edilməsi bizim şəriətimizdədir. Misir hökmdarı bizim şəriətimizi haradan bilir? Bunu siz ona demisiniz). (Mənə) yalnız gözəl (tükənməz, dözümlü) səbr (gərəkdir). Ola bilsin ki, Allah onların (oğlanlarımın) hamısını mənə yetirsin! O, həqiqətən, (hər şeyi) biləndir, hikmət sahibidir!”

84. (Bu sözlərdən sonra Yəqub) onlardan (oğlanlarından) üz döndərdi. (Bin Yaminin başına gələn bu iş onun yadına sevimli oğlu Yusifin müsibətini saldı) və: “(Heyf sənə) yazıq Yusif!” – dedi. Dərd-qəmdən (həmişə ağlamaqdan Yəqubun) gözlərinə ağ gəldi. O, (bütün dərdini) içində çəkirdi (oğlanlarına bildirmirdi).

85. (Oğlanları Yəquba) dedilər: “Allaha and olsun ki, sən Yusif deyə-deyə xəstələnib əldən düşəcək, ya da öləcəksən!”

86. (Yəqub) belə cavab verdi: “Mən dərd-sərimi yalnız Allaha ərz edirəm və Allahdan (gələn vəhy ilə) sizin bilmədiklərinizi (Yusifin vaxtilə gördüyü yuxunun çin çıxacağını, sizin və mənim ona təzim edəcəyimizi) bilirəm!

87. Oğullarım! Gedin Yusifdən və qardaşından (Bin Yamından) bir xəbər bilin. Allahın mərhəmətindən ümidinizi kəsməyin. Allahın mərhəmətindən yalnız kafirlər ümidini üzər!”

88. (Yəqubun oğulları Misirə gəlib Yusifin) hüzuruna daxil olanda dedilər: “Ey vəzir! Bizə və ailəmizə müsibət (quraqlıq, qıtlıq, aclıq) üz vermişdir. Bir az dəyərsiz malla (sənin yanına) gəlmişik. (Buna baxmayaraq, yenə də onun müqabilində) bizim üçün ölçünü düz elə

(bolluca ərzaq ehsan et) və bizə sədəqə ver. Həqiqətən, Allah sədəqə verənləri mükafatlandırar!”

89. (Yusif) onlardan: “Siz cahil olduğunuz zaman Yusifə və qardaşına nələr etdiklərinizi bilirsinizmi?” – deyə soruşdu.

90. Onlar: “Yoxsa sən Yusifin özüsən?!” – dedilər. O da: “Mən Yusifəm, bu da qardaşımdır. Allah bizə lütf etdi. Kim Allahdan qorxub pis əməllərdən çəkinsə və səbr etsə, (bilsin ki) Allah yaxşı işlər görənlərin mükafatını əsla zay etməz!” – deyə cavab verdi.

91. Onlar: “Allaha and olsun ki, Allah səni bizdən üstün etmişdir. Biz isə (sənin barəndə), sözsüz ki, günah etmişik!” – dedilər.

92. (Yusif) dedi: “Bu gün sizə (etdiklərinizə görə) heç bir məzəmmət yoxdur. Allah sizi bağışlasın! Çünki O, rəhm edələrin ən rəhmlisidir! (Mən Allahdan sizin bağışlanmanızı diləyərəm. O da sizi bağışlayar!)

93. Bu köynəyimi götürüb aparın, atamın üzünə sürtün (atın), o (yenidən) görməyə başlayar. Bütün ailənizi də yığıb yanıma gəlin!”

94. Karvan (vətənə qayıtmaq üçün Misirdən) ayrılanda ataları (Yəqub yanındakı övladlarına) dedi: “Əgər məni səfeh hesab etməsəydiniz (və ya yalançı hesab edib danlamasaydınız), deyirdim ki, Yusifin ətrini alıram!”

95. Onlar: “Allaha and olsun ki, sən yenə öz köhnə yanlışlığında (şaşqınlığında) qalmaqdasan!” dedilər.

96. Muştuluqçu gəlib köynəyi (Yəqubun) üzünə sürtən kimi onun gözləri açıldı və o: “Məgər sizə demədimmi ki, mən Allahdan (gələn vəhy ilə) sizin bilmədiklərinizi bilirəm!” söylədi.

97. (Oğlanları ona: ) “Ata! Bizim üçün günahlarımızın bağışlanmasını dilə. Biz, doğrudan da, günahkar olmuşuq!” dedilər.

98. (Yəqub) dedi: “Mən Rəbbimdən sizin bağışlanmağınızı diləyəcəyəm. O, həqiqətən, bağışlayandır, rəhm edəndir!”

99. (Yəqub və ailəsi) Yusifin hüzuruna daxil olduqda o, ata-anasını (analığı olan xalasını) bağrına basıb: “İnşallah (hər şeydən) əmin olaraq Misirə daxil olun!” dedi.

100. (Yusif) ata-anasını taxt (öz taxtının) üstünə qaldırdı. Onlar (ata-ana və on bir qardaş) hamısı (hörmət əlaməti olaraq) onun qarşısında səcdəyə qapandılar. (Allah onları bir-birinə qovuşdurduğu üçün şükür səcdəsi etdilər). (Yusif) dedi: “Atacan! Bu əvvəl gördüyüm yuxunun yozumudur. Rəbbim onu (yuxunu) həqiqətə çevirdi. O mənə yaxşılıq etdi, çünki məni zindandan qurtardı, Şeytan mənimlə qardaşlarımın arasını vurduqdan sonra sizi çöldən (yanıma) gətirdi (bizi bir-birimizə qovuşdurdu). Həqiqətən, Rəbbim istədiyinə qarşı lütfkardır (istədiyi şəxs və ya iş barəsində incə tədbir sahibidir). O, doğrudan da, (hər şeyi) biləndir, hikmət sahibidir!”

101. (Yusif atası ilə bir müddət gözəl dövran sürdükdən sonra Yəqub vəfat etdi. Yusif atasını aparıb öz vətənində dəfn etdi və dünyanın heç bir etibarı olmadığını gördükdə Allaha dua edərək Ondan ölüm diləyib dedi: ) “Ey Rəbbim! Sən mənə səltənətdən (istədiyimdən də artıq) bir pay verdin. Mənə yuxu yozmağı öyrətdin. Ey göyləri və yeri yaradan! Sən dünyada da, axirətdə də mənim ixtiyar sahibimsən. Mənim canımı müsəlman olaraq al və məni əməlisalehlərə qovuşdur!”

102. (Ya Rəsulum!) Bu, sənə vəhy etdiyimiz (vəhylə bildirdiyimiz) qeyb xəbərlərindəndir. Onlar (Yusifin qardaşları) hiylə quraraq əlbir iş gördükləri (Yusifi quyuya atdıqları) zaman sən ki onların yanında deyildin!

103. Sən (qövmünün imana gəlməsi üçün) təşnə olsan da, insanların (Məkkə müşriklərinin) əksəriyyəti iman gətirən deyildir!

104. Halbuki sən bundan (islamın təbliği və imana dəvətdən) ötrü onlardan heç bir mükafat istəmirsən. Bu (Quran) isə aləmlərə yalnız bir öyüd-nəsihətdir!

105. Göylərdə və yerdə (Allahın birliyini sübut edən) neçə-neçə əlamətlər (nişanələr) vardır ki, insanlar onların yanından üzlərini çevirib keçərlər (onlara baxıb ibrət almaz, onların həqiqi mənaları haqqında düşünməzlər).

106. Onların əksəriyyəti ancaq şərik qoşaraq Allaha inanarlar. (Allah təklikdə deyil, Ona qoşduqları şəriklər-bütlər və tanrılarla birlikdə ibadət edərlər).

107. Məgər (müşriklər) Allahın əzabından onlara bir bəla gəlməyəcəyinə və ya qiyamətin, özləri də bilmədən, qəflətən başlarının üstünü almayacağına əmindirlərmi?

108. (Ya Rəsulum!) De: "Bu mənim (təbliğ, dəvət) yolumdur. Mən və mənə tabe olan (möminlər) açıq-aşkar bir dəlillə (insanları) Allaha çağırırıq. Allah pakdır, müqəddəsdir (bütün eyib və nöqsanlardan xalidir, Onun heç bir şəriki yoxdur). Mən isə müşriklərdən deyiləm!"

109. Səndən əvvəl də (səhra əhlindən deyil) ancaq şəhər əhlindən olub özlərinə vəhy etdiyimiz neçə-neçə kişilər (qadın, mələk yox, məhz kişi peyğəmbərlər) göndərdik. Məgər (bu müşriklər) yer üzündə gəzib dolaşmırlarmı ki, özlərindən əvvəl gəlib-gedənlərin (məhv olmuş xalqların, tayfaların) aqibətinin necə olduğunu görsünlər? Həqiqətən, axirət yurdu Allahdan qorxub pis əməllərdən çəkinənlər üçün daha xeyirlidir. Məgər dərk etmirsiniz?

110. Nəhayət, peyğəmbərlər ümidsizliyə qapıldıqda və özlərinin yalançı hesab edildiklərini gördükdə (yəqin etdikdə) köməyimiz

onlara yetdi, dilədiyimizə nicat verildi. Bizim əzabımız günahkarlardan əsla dəf olunmaz!

**111.** (Peyğəmbərlərin) hekayətlərində ağıl sahibləri üçün, sözsüz ki, bir ibrət vardır. (Bu Quran) uydurma bir söz deyildir. Ancaq özündən əvvəlkilərin (ilahi kitabların) təsdiqi, (Allahın bəndələrindən ötrü) hər bir şeyin (bütün hökmlərin, halal-haramın) müfəssəl izahıdır. O, iman gətirən bir tayfa üçün hidayət (doğru yolu göstərən rəhbər) və mərhəmətdir!

## .13.

## ər-Rəd (Göy gurultusu) surəsi

**(Məkkədə, bəzi təfsirçilərə görə isə tamamilə, yaxud qismən Mədinədə nazil olmuşdur, 43 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Əlif, Lam, Mim, Pa! Bunlar Kitabın (Quranın) ayələridir. Rəbbindən sənə nazil olan (Quran) haqdır, lakin insanların (Məkkə müşriklərinin) əksəriyyəti (ona) inanmaz.

2. Gördüyünüz göyləri dirəksiz olaraq yüksəldən, sonra ərşi yaradıb hökmü altına alan (ərş üzərində bərqərar olan), müəyyən vaxta (dünyanın axırına – qiyamətə) qədər (səmada) dolanan Günəşi və Ayı ram edən, bütün işləri yoluna qoyan, ayələri müfəssəl izah edən məhz Allahdır. (Bütün bu dəlillərdən sonra) Rəbbinizlə qarşılaşacağınıza (qiyamət günü dirilib haqq-hesab üçün hüzurunda duracağınıza), bəlkə, inanasınız!

3. Yeri (insanların və başqa canlıların yaşaya bilməsi üçün) döşəyən (uzadıb genəldən), orada möhkəm dağlar, çaylar yaradan, bütün meyvələrdən (erkək-dişi, yaxud şirin-acı, turş-meyxoş və s. olmaqla) cüt-cüt yetişdirən, gecəni gündüzlə (gündüzü də gecə ilə) örtüb bürüyən Odur. Şübhəsiz ki, bunda (bütün bu deyilənlərdə) düşünən

insanlar üçün (Allahın qüdrətini və vəhdaniyyətini sübut edən) neçə-neçə dəlillər vardır!

4. Yer üzündə bir-birinə yaxın (qonşu) qitələr (münbit, qeyri-münbit, şirin-şoran, dağlıq-aran yerlər, müxtəlif iqlimli torpaq sahələri), eyni su ilə sulanan üzüm bağları, əkinlər, şaxəli-şaxəsiz xurma ağacları vardır. Halbuki Biz yemək baxımından onların birini digərindən üstün tuturuq. Şübhəsiz ki, bunda da anlayıb dərk edən insanlar üçün (Allahın qüdrətinə və vəhdaniyyətinə dəlalət edən) əlamətlər vardır.

5. (Ya Rəsulum!) Əgər (müşriklərə) təəccüblənirsənsə, əsl təəccüblənilləsi (əsl təəccüb doğuran şey) onların: "Biz torpaq olduqdan sonra yenidənmi yaradılacağıq?" – söyləməsidir. Onlar Rəbbini inkar edənlərdir. Boyunlarında zəncir olanlar da (boyunlarına zəncir vurulacaq kəslər də) onlardır. Onlar cəhənnəmlikdirlər, özü də orada əbədi qalacaqlar.

6. (Müşriklər) səni tələsdirib (özlərinə) yaxşılıqdan əvvəl pislik (Allahın mərhəmətindən qabaq əzabını) istəyirlər. Halbuki onlardan öncə (Allaha asi olan tayfalar, xalqlar barəsində) bu kimi (ibrətamiz) cəzalar olub keçmişdir. Həqiqətən, Rəbbin insanların zülmünə baxmayaraq onlara qarşı mərhəmət sahibidir. Və şübhəsiz ki, Rəbbinin cəzası da şiddətlidir!

7. Kafir olanlar: "Məgər ona Rəbbindən bir möcüzə endirilməli deyildimi?" – deyirlər. Sən ancaq (insanları Allahın əzabı ilə) qorxudansan. Hər tayfanın (doğru yol göstərən) bir rəhbəri (peyğəmbəri) vardır!

8. Allah hər bir dişi məxluqun (bətnində) nə daşıdığını (oğlan, yaxud qız doğacağını), bətnlərin nəyi əskildib, nəyi artıracağını (qadınların bari-həmlini doqquz aydan tez, yaxud gec yerə qoyacağını, doğulacaq uşağın sağlam və xəstə olacağını, çox, yaxud az yaşayacağını) bilir. Hər şey Onun yanında müəyyən bir ölçü ilədir.

(Hamının ruzisi əzəldən müəyyən edilmişdir. Hər kəsin istedadı, qabiliyyəti öz-özünə artıb-əskilməz. Allahın bilmədiyi heç bir şey yoxdur. )

9. O, qeybi də, aşkarı da biləndir, (hər şeydən) böyükdür, ucadır! (Allah eyibsizdir, nöqsansızdır. Onun heç bir şəriki yoxdur!)

10. Sizdən sözünü gizlədən də, onu açıq deyəndə, gecənin qoynunda gizlənən də, gündüz aşkar gəzib dolanan da (Allah üçün) eynidir. (Allah kimin nə etdiyini bilir. Heç bir şey Ondan gizli qalmaz).

11. (İnsan üçün) onu öndən və arxadan təqib edənlər (mələklər) vardır. Onu (insanı) Allahın əmri ilə qoruyurlar. Hər hansı bir tayfa öz tövrünü (nəfsində olanları) dəyişmədikcə (pozmadıqca), Allah da onun tövrünü (onda olanları, onun əhvalını) dəyişməz. Əgər Allah hər hansı bir qövmə bir pislik yetirmək istəsə, onun qarşısı heç cür alına bilməz və Ondan başqa onların heç bir hamisi də olmaz.

12. Sizə qorxu və ümid (bir tərəfdən ildırımın verəcəyi tələfatdan qorxmaq, digər tərəfdən də yağış istəmək) məqsədilə şimşək göstərən, (yağışla yüklənmiş) ağır buludları yaradan da Odur.

13. Göy gurultusu Onun şəninə təriflər deyir, mələklər də (Allahın) qorxusundan (Onu öyüb mədh edirlər). O, ildırımlar göndərib (kafirlər) Allah barəsində mübahisə edərkən onlarla istədiyini vurar. Allahın cəzası şiddətlidir! (Allah yenilməz qüvvət sahibidir!)

14. Haqq olan (qəbul edilən) dua yalnız Ona (Allaha) olan duadır. Ondan başqasına edilən dualar (Ondan qeyrisinə ibadət edənlərin duaları) qəbul olunmaz (bütlər, tanrılar onların dualarını əsla eşitməzlər). (Müşriklərin vəziyyəti quyu üstündə duraraq) ağzına su gəlmək üçün iki ovcunu açan (dili və əlləri ilə quyuya işarə edərək ovcunun su ilə dolmasını gözləyən), lakin (quyu heç bir şey anlamadığı üçün) suyun ona yetişmədiyi adamın vəziyyətinə

bənzəyir. (Bütlər də belədir, çünki onlar görməz, eşitməz və dərk etməzlər). Kafirlərin duası zəlalətdən (puç, mənasız sözlərdən) başqa bir şey deyildir!

15. Göylərdə və yerdə kim varsa, (özləri də), kölgələri də səhər-axşam istər-istəməz Allaha səcdə edər! (Yer üzündəki möminlər sidqi-ürəkdən, kafirlər və münafiqlər isə ürəkdən istəməyərək, lakin dünyada müəyyən bir mənfəət əldə etmək xatirinə və ya kiminsə, nəyinsə qorxusundan Allaha səcdə edərlər!)

16. (Ya Rəsulum!) De: “Göylərin və yerin Rəbbi kimdir?” (Kafirlər bu sualın qarşısında aciz qaldıqda) de: “Allahdır!” De: “Belə olduqda, Onu qoyub özlərinə nə bir xeyir, nə də bir zərər verə bilənlərimi (bütləri, tanrılarımı) özünüzə dost (hami) edirsiniz?!” De: “Heç korla görən (kafirlə mömin) və ya zülmətlə nur (küfrlə iman) eyni ola bilərmi?! Yoxsa onlar (müşriklər) Allaha Onun yaratdığı kimi yaradan şəriklər qərar verdilər və onların nəzərincə bu yaratma bir-birinə bənzər göründü?!” De: “Allah hər şeyin xaliqidir. O birdir, qəhr edəndir (hər şeyə gücü yetən, hər şeyə qalib gələndir!)”

17. Allah göydən bir yağmur endirdi, vadilər öz tutumlarına görə onunla dolub daşdı. (Sudan əmələ gələn) sel, üstünə çıxan bir köpünü alıb apardı. (Haqq din olan islam insanlara, torpağa həyat verən suya, müşriklərin etiqadı isə boş köpüyə bənzər). Bəzək şeyləri və ya əşya (qab-qacaq) düzəltmək məqsədilə insanların od üzərində qızdırıb əritdikləri (qızıl, gümüş və s. filizlərin) üstündə də buna bənzər bir köpük vardır. Allah haqq ilə batili (sizdən ötrü) ayırd etmək üçün belə misallar çəkir. Köpük heç bir şey olmadığı üçün uçub gedər. İnsanlara fayda verən bir şey isə yer üzündə qalar. Allah belə misallar çəkir!

18. Rəbbinin dəvətini qəbul edənləri (Allaha və Onun Peyğəmbərinə itaət edənləri) ən gözəl nemət (Cənnət) gözləyir. Rəbbinin dəvətini

qəbul etməyənlər isə yer üzündə olan hər şeyə (bütün sərvətə), üstəlik bir qədərinə də malik olsaydılar, onu (Allahın əzabından qurtarmaq üçün) fidyə verərdilər (lakin kafirlərdən heç bir fidyə qəbul olunmaz). Onları çox pis (çətin) bir haqq-hesab gözləyir (heç bir günahları bağışlanmaz). Onların məskəni Cəhənnəmdir. O necə də pis yerdir!

19. (Ya Rəsulum!) Rəbbindən sənə nazil edilənin (Quranın) haqq olduğunu bilən kimsə (haqqı görməyən) korla eyni ola bilərmi? Yalnız ağıl sahibləri öyüd-nəsihət qəbul edərlər!

20. O kəslər ki, Allaha (yalnız Ona ibadət edəcəkləri barədə) verdikləri vədi yerinə yetirir və əhdi pozmurlar.

21. O kəslər ki, Allahın birləşdirilməsini əmr etdiyi şeyləri birləşdirir (qohumluq əlaqələrini qoruyub saxlayır, möminlərə hörmət edir), Rəbbindən və (qiyamət günü çəkiləcək) pis haqq-hesabdan qorxurlar.

22. Və o kəslər ki, Rəbbinin razılığını qazanmaq üçün (bu yolda bütün əziyyətlərə) səbr edir, (vaxtlı-vaxtında, lazımınca) namaz qılır, onlara verdiyimiz ruzidən (yoxsullara, ehtiyacı olanlara) gizli və aşkar xərcləyir, pisliyin qarşısını yaxşılıq etməklə alırlar (pisliyin əvəzində yaxşılıq edirlər) – məhz onları (gözəl) axirət yurdu -

23. Özlərinin, həmçinin əməlisaleh ataları, övrətləri və övladlarının daxil olacaqları Ədn cənnətləri gözləyir. Mələklər də hər bir qapıdan (cənnət qapılarından) daxil olub (onlara):

24. “(Dünyada Allah yolunda bütün çətinliklərə) səbr etdiyinizə görə sizə salam olsun! Axirət yurdu (Cənnət) nə gözəldir!” – deyəcəklər.

25. Allahla əhd bağladıqdan sonra onu pozanlar, Allahın birləşdirilməsini əmr etdiyi şeyləri (qohumluq əlaqələrini) qıranlar,

yer üzündə fitnə-fəsad törədənlər isə lənətə düçar olacaqlar. Onları pis yurd (Cəhənnəm, o biri dünyanın pislikləri) gözləyir.

26. Allah istədiyi bəndənin ruzisi bol da edər, azaldar da. (Məkkəlilər) dünya həyatı (bol ruzi) ilə sevindilər. Halbuki dünya həyatı (neməti) axirət həyatı (neməti) ilə müqayisədə çox cüzi (əhəmiyyətsiz) bir şeydir (dünya neməti müvəqqəti, axirət neməti isə əbədidir).

27. Kafir olanlar: "Məgər Rəbbindən ona bir möcüzə endirilməli deyildimi?" – deyirlər. (Ya Rəsulum!) De: "Allah istədiyini (haqq yoldan) sapdırır. Tövbə edən (Allahın itaətinə qayıdan) şəxsi isə Öz hidayətinə (Özünün doğru yolu olan islam dininə) qovuşdurur".

28. O kəslər ki, Allaha iman gətirmiş və qəlbləri Allahı zikr etməklə aram tapmışdır. Bilin ki, qəlblər (möminlərin ürəkləri) yalnız Allahı zikr etməklə aram tapar!

29. İman gətirib yaxşı işlər görənlərin xoş halına! (Onları) gözəl bir sığınacaq (Cənnət gözləyir)!

30. (Ya Rəsulum! Səndən əvvəl peyğəmbərlər göndərdiyimiz kimi) səni də özündən əvvəl çoxlu ümmətlər gəlib-getmiş bir ümmətə Peyğəmbər göndərdik ki, onlar Rəhmanı (Allahı) inkar etdikləri halda, sənə vəhy etdiyimiz (Quranı) onlara oxuyasan. De: "O (Rəhman) mənim Rəbbimdir. Ondan başqa heç bir tanrı yoxdur. Mən ancaq Ona təvəkkül etdim. Axır dönüşüm (və ya tövbəm) də yalnız Onadır!"

31. Əgər Quranla dağlar hərəkətə gətirilsə, yaxud yer parçalansa və ya ölülər danışsaydılar (onlar yenə də iman gətirməzdilər). (Və ya əgər aləmdə bir kitab olsaydı və onun səbəbi ilə dağlar yerindən qopardılıb hərəkətə gətirilsə, yaxud yer parçalansa və ya ölülər dirilib danışsaydılar, o kitab mütləq bu Quran olardı). Bütün işlər yalnız

Allahın ixtiyarındadır. Məgər iman gətirənlərə bəlli olmadımı ki, əgər Allah diləsəydi, bütün insanları hidayətə (doğru yola) yönəldərdi? (Və ya möminlər kafirlərin iman gətirmələrindən ümidlərini üzüb bilmədilərmi ki, doğru yolu tutmaq da, ondan çıxmaq da Allahın əlindədir?). Kafirlərə gəldikdə Allahın vədi (Məkkənin fəthi) yerinə yetənədək etdikləri əmələ görə onlara bir bəla üz verməkdə davam edəcək, yaxud yurdlarının yanında dayanıb duracaqdır. (Və ya: "Ya Rəsulum! Sən öz əshabən və ordunla onların yurdunun yaxınlığında dayanıb duracaqsan"). Həqiqətən, Allah Öz vədinə xilaf çıxmaz!

32. (Ya Rəsulum!) Səndən əvvəl gəlib-gedən peyğəmbərlərə də istehza edilmişdi. Mən kafirlərə möhlət verdim, sonra isə onları (əzabla) yaxaladım. Mənim onları cəzalandırmağım necə (də dəhşətli) idi! (Bir görəydin onlara nə dəhşətli əzab verdim!)

33. Hər bir kəsin (dünyada yaxşıdan, pisdən) nə qazandığına nəzarət edən Allah bunu bacarmayan bütlər kimidirmi?! (Əsla yox!) (Bununla belə, müşriklər götürüb) Allaha (cürbəcür) şəriklər qoşdular. (Ya Rəsulum!) De: "Bunlara bir ad verin görək! (Axı onlar kimdirlər, nəçidirlər?) Yoxsa Allaha yer üzündə (özünə şərik) bilmədiyi bir şeyimi xəbər verirsiniz? Yaxud sözün zahirinə uyub (belə həqiqətdən uzaq şeyləri) deyirsiniz? Xeyr, kafirlərə öz hiylələri (iftiraları, Allaha qarşı uydurub düzəltdikləri yalanlar) gözəl göstərildi və onlar (haqq) yoldan döndərildilər. Əslində, Allahın zəlalətə saldığı kimsəyə doğru yolu göstərən olmaz.

34. Onlar dünyada əzaba düçar olacaqlar. Axirət əzabı isə daha məşəqqətlidir. Onları Allahdan (Allahın əzabından) qurtaran olmaz.

35. Allahdan qorxub pis əməllərdən çəkinənlərə (möminlərə) vəd edilən Cənnətin vəsfi belədir: (ağacları) altından çaylar axar, yeməkləri də, kölgələri də daimidir. Bu, Allahdan qorxub pis

əməllərdən çəkinənlərin aqibətidir. Kafirlərin aqibəti isə Cəhənnəmdir!

36. Kitab verdiklərimiz (kitab əhlinin sənə iman gətirənləri) sənə nazil etdiyimizə (Qurana) sevinirlər. (Yəhudilərdən və xaçpərəstlərdən sənə qarşı ədavət bəsləyən) elə firqələr də vardır ki, onun (Quranın) bir qismini inkar edirlər. (Ya Rəsulum!) De: “Mənə Allaha ibadət etmək, Ona şərik qoşmamaq əmr olunmuşdur. Mən (insanları yalnız) Ona (ibadət etməyə) dəvət edirəm və mənim axır dönüşüm də yalnız Onadır!” (Məhz Onun hüzuruna qayıdacağam!)

37. (Ya Rəsulum!) Beləliklə, Biz onu (Quranı) ərəbcə bir hökm olaraq (insanlar arasında onunla hökm etmək üçün) nazil etdik. Əgər sənə (vəhylə) gələn elmdən (Qurandan) sonra (kafirlərin) nəfslərinin istəklərinə (puç arzularına) uysan, səni Allahın əzabından qoruyan və qurtaran olmaz! (Və ya: Sənin Allah tərəfindən nə bir dostun, nə də bir qoruyucun olar!)

38. (Ya Rəsulum!) Biz səndə əvvəl də Peyğəmbərlər göndərdik, onlara zövcələr, övladlar verdik. Allahın izni olmadıqca heç bir peyğəmbər heç bir möcüzə gətirə bilməz. Hər dövrün bir kitabı (lövhi-məhfuzda yazılmış hökmü) var. (İlahi kitablardan hər birinin öz nazil olma vaxtı var. Bunlar zamanın, dövrün tələbinə və ehtiyacına görədir).

39. Allah (həmin kitabdan) istədiyi şeyi məhv edər, istədiyini də sabit saxlayar (bəndələrinə aid hər hansı bir hökmü ləğv edib başqası ilə dəyişər və ya onu olduğu kimi saxlayar). Kitabın əsli (lövhi-məhfuz) Onun yanındadır.

40. Onlara vəd etdiyimizin (əzabın) bir qismini sənə göstərsək də və ya (ondan qabaq) səni öldürsək də (Öz dərgahımıza götürsək də, fərq etməz). Sənin vəzifən ancaq (dini) təbliğ etməkdir. Haqq-hesab çəkmək isə Bizə aiddir!

41. Məgər onlar (kafirlər) Bizim (hökmümüzlə, qüdrətimizlə) yer üzünə gəlib onu (müxtəlif) tərəflərindən əskiltdiyimizi (müsəlmanların get-gedə onların torpaqlarını fəth etdiklərini) görmürlərmi? Hökm edən Allahdır. Heç kəs Onun hökmünü dəf edə bilməz. (Allah) tezliklə haqq-hesab çəkəndir!

42. Onlardan əvvəlkilər də (ümmətlər, tayfalar da Allahın peyğəmbərinə qarşı) tələ qururdular. Bütün hiylələrin (məkrlərin) cəzasını ancaq Allah verəcəkdir. (Allah) hər kəsin (dünyada) nə qazandığını (bütün yaxşı və pis əməllərini) bilir. Kafirlər axirət yurdunun (o dünyanın gözəl aqibətini) kimin olacağını biləcəklər!

43. (Ya Rəsulum!) Kafirlər: "Sən peyğəmbər deyilsən!" – deyirlər. (Onlara) belə cavab ver: "Mənimlə sizin aranızda (doğruluğuma) Allahın və kitabı bilənlərin (Tövratı, İncili bilən mömin yəhudi və xaçpərəstlərin, yaxud Qurana bələd olan mömin müsəlmanların və ya lövhi-məhfuzdan xəbərdar olan Cəbrailin) şahid olması yetər!"

## .14.
## İbrahim surəsi
**(Məkkədə nazil olmuşdur, 52 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Əlif, Lam, Ra! (Ya Rəsulum! Bu Quran) elə bir Kitabdır ki, onu sənə insanların öz Rəbbinin izni ilə zülmətlərdən nura (küfrdən imana) – yenilməz qüvvət sahibi, (hər cür) tərifə (şükürə) layiq olan Allahın yoluna (islam dininə) çıxartmaq üçün nazil etmişik.

2. Elə bir Allah ki, göylərdə və yerdə nə varsa, hamısı Onundur. Düçar olacaqları şiddətli əzabdan ötrü vay kafirlərin halına!

3. O kəslər ki, dünyanı (fani dünya malını) axirətdən (axirət nemətlərindən) üstün tutur, (insanları) Allah yolundan döndərir

(islam dinini qəbul etməyə mane olur) və o yolu əyri hala salmaq istəyirlər. Onlar (haqq yoldan) azıb uzaq düşmüşlər.

4. Biz hər bir peyğəmbəri yalnız öz millətinin dilində (danışan) göndərdik ki, (Allahın əmrlərini) ona izah edə bilsin. Allah istədiyi kimsəni zəlalətə salar (haqq yoldan sapdırar), istədiyini də doğru yola yönəldər. O, yenilməz qüvvət sahibi, hikmət sahibidir!

5. Biz Musaya: "Tayfanın (İsrail oğullarını) zülmətdən nura çıxart və Allahın (vaxtilə onlara nemət verdiyi) günlərini xatırlat. Bunda çox səbir və şükür edənlər üçün, sözsüz ki, neçə-neçə ibrətlər var!" (deyib) onu möcüzələrimizlə (peyğəmbər) göndərdik.

6. (Ya Rəsulum!) Xatırla ki, bir zaman Musa öz tayfasına belə demişdi: "Allahın sizə bəxş etdiyi neməti yadınıza salın, çünki O sizi Firon əhlinin əlindən qurtardı. Onlar sizə dəhşətli əzab verir, oğullarınızı öldürüb, qadınlarınızı (özlərinə xidmət etmək üçün) diri saxlayırdılar. Bunda Rəbbiniz tərəfindən sizin üçün böyük bir imtahan vardır!

7. (Ey camaatım!) Yadınızı salın ki, o zaman Rəbiniz bunu bildirmişdi: "Əgər (Mənə) şükür etsəniz, sizə (olan nemətimi) artıracağam. Yox, əgər nankorluq etsəniz, (unutmayın ki) Mənim əzabım, həqiqətən şiddətlidir!"

8. Musa dedi: "Əgər siz və bütün yer üzündə olanlar nankorluq etsəniz, (bununla Allaha heç bir zərər yetirə bilməzsiniz). Çünki Allah (heç kimə, heç nəyə) möhtac deyildir. (O, bütün məxluqatı yaratdığına görə onsuz da öz-özlüyündə hər cür) tərifə (şükrə) layiqdir!"

9. Məgər sizdən əvvəlki Nuh, Ad, Səmud tayfalarının və onlardan sonra gəlib getmiş, (saylarını və təfsilatını) ancaq Allahın bildiyi ümmətlərin xəbərləri sizə gəlib çatmadımı? Peyğəmbərləri onlara açıq-aşkar möcüzələrlə gəlmişdilər. Onlar əllərini (heyrətlərindən, qəzəblərindən özlərinin, yaxud danışmağa imkan verməmək üçün

peyğəmbərlərin) ağızlarına qoyub: “Biz sizinlə göndərilənlərə (möcüzələrə və peyğəmbərliyinizə) inanmırıq və bizi dəvət etdiyiniz (din) barəsində də möhkəm bir şəkk-şübhə içindəyik!” – demişdilər.

10. Peyğəmbərləri də (onlara) belə cavab vermişdilər: “Məgər göyləri və yeri yaradan Allaha da şübhə etmək olarmı?! (Allah) günahlarınızı bağışlamaq və sizə müəyyən bir vaxta qədər (ömrünüzün sonuna kimi) möhlət vermək (sizi əzabla deyil, öz əcəlinizlə öldürmək) üçün imana dəvət edir”. Onlar demişdilər: “Siz də bizim kimi adi bir insansınız. Bizi atalarımızın ibadət etdiklərindən (bütlərdən) döndərmək istəyirsiniz. (Əgər bacarırsınızsa, sizin ibadət etdiyiniz Allahın haqq, bizim tapındığımız bütlərin isə batil olmasını sübut edən) açıq-aşkar bir dəlil gətirin!”

11. Peyğəmbərləri onlara cavab verərək demişdilər: “(Bəli) biz də sizin kimi adi bir insanıq. Lakin Allah Öz bəndələrindən dilədiyinə nemət (peyğəmbərlik) bəxş edər. Allahın izni olmadan biz sizə heç bir dəlil (möcüzə) gətirə bilmərik (buna qüdrətimiz çatmaz). Möminlər yalnız Allaha təvəkkül etsinlər!

12. Allah bizə yollarımızı (iman, nicat, səadət yollarını) göstərdiyi halda, biz nə üçün Ona təvəkkül etməməliyik? (Sizi Allahın haqq yoluna dəvət etdiyimizə görə) bizə verdiyiniz bütün əziyyətlərə, əlbəttə, dözəcəyik. Təvəkkül edənlər də yalnız Allaha təvəkkül etsinlər!

13. Küfr edənlər peyğəmbərlərinə dedilər: “Ya sizi yurdumuzdan çıxarıb qovacağıq, ya da mütləq dinimizə dönəcəksiniz!” Rəbbi də onlara (peyğəmbərlərə) belə vəhy etdi: “Biz o zalımları mütləq məhv edəcəyik!

14. Onlardan sonra da yurdlarında sizi yerləşdirəcəyik. Bu (varislik), məqamımdan (qiyamət günü haqq-hesab üçün hüzurumuza durmaqdan) və əzabımdan qorxanlara aiddir!”

15. (Peyğəmbərlər düşmənləri üzərində qələbə çalmaqdan ötrü Allahdan) kömək dilədilər. Hər bir inadkar təkəbbür sahibi (haqdan inadla üz döndərən və Allaha itaət etməyi özlərinə sığışdırmayan kafirlər) isə ziyana uğradı.

16. Hələ qarşıda (bunun ardınca) Cəhənnəm vardır. (Hər bir inadkar təkəbbür sahibinə orada Cəhənnəm əhlinin bədənlərindən axan) irinli-qanlı sudan içirdiləcəkdir!

17. O, irinli-qanlı suyu qurtum-qurtum içər, onu zorla udar (boğazından aşağı keçirə bilməz). Ona hər tərəfdən (bədəninin hər yerindən) ölüm gələr, lakin ölməz (ki, birdəfəlik canı qurtarsın). Hələ bunun ardınca (daha) dəhşətli bir əzab gələcəkdir!

18. Rəbbini inkar edənlərin (dünyadakı yaxşı) əməlləri fırtınalı bir gündə küləyin sovurub apardığı külə bənzəyir. Onlar (dünyada) etdikləri əməllərdən heç bir fayda (savab) əldə edə bilməzlər. Budur (haqq yoldan) azıb uzaqlaşmaq! (Doğru yoldan uzaq düşməyin aqibəti belədir. Bir də haqq yola qayıtmaq çətindir!)

19. (Ya Rəsulum və ya ey mömin insan!) Məgər Allahın göyləri və yeri haqq olaraq yaratdığını görmürsənmi? Əgər (Allah) istəsə, sizi yox edib yerinizə başqa bir məxluq (insan tayfası) gətirər.

20. Bu Allah üçün heç də çətin deyildir!

21. (Qiyamət günü) hamı Allahın hüzurunda peyda olacaqdır. Zəiflər (iman gətirməyə) təkəbbür göstərənlərə (öz başçılarına) deyəcəklər: “Biz sizə tabe idik. İndi Allahın əzabını, azacıq da olsa, bizdən dəf edə bilərsinizmi?” Onlar belə cavab verəcəklər: “Əgər Allah bizə doğru yolu göstərsəydi, biz də sizə göstərərik. İndi ağlayıb-sızlasaq da, səbr etsək də, fərq etməz (əzabdan xilas ola bilmərik). Bizim üçün heç bir sığınacaq (heç bir qurtuluş) yoxdur!

22. İş bitdikdə (cənnətliklər Cənnətə, cəhənnəmliklər də Cəhənnəmə daxil olduqda) Şeytan (onu məzəmmət edən kafirlərə) belə deyəcək: “Allah (peyğəmbərlər vasitəsilə) sizə (pis əməllərinizə görə Cəhənnəmə düşəcəyiniz barədə) doğru vəd vermişdi. Mən də sizə (kömək edəcəyim haqda) vəd vermişdim, amma sonra vədimə xilaf çıxdım. Əslində mənim sizin üzərinizdə heç bir hökmüm (sizi özümə tabe edə biləcək heç bir qüdrətim) yox idi. Lakin mən sizi (günah işlətməyə, Allaha asi olmağa) çağırdım, siz də mənə uydunuz. İndi məni yox, özünüzü qınayın. Nə mən sizin dadınıza çata bilərəm, nə də siz mənim dadıma. Mən öncə (dünyada) sizin məni (Allaha) şərik qoşmağınızı da inkar etmişdim (qəbul etməmişdim). Həqiqətən, zalımları şiddətli bir əzab gözləyir!

23. İman gətirib yaxşı işlər görənlər isə (ağacları) altından çaylar axan cənnətlərə daxil ediləcəklər. Onlar Rəbbinin izni ilə orada əbədi qalacaqlar. Onların orada bir-birinə (yaxud Allahın, mələklərin onlara) günaydınlıq verməsi: “Salam!” (demək) olacaqdır!

24. Məgər Allahın necə bir məsəl çəkdiyini görmürsənmi? Xoş bir söz (la ilahə illallah, Muhəmmədun rəsulullah) kökü yerdə möhkəm olub budaqları göyə ucalan gözəl bir ağac (xurma ağacı) kimidir.

25. O (ağac) Rəbbinin izni ilə bəhrəsini hər vaxt (ilin bütün fəsillərində) verər. Allah insanlar üçün belə misallar çəkir ki, bəlkə, düşünüb ibrət alsınlar! (Ağacın kökü yerdə, budaqları göydə olduğu kimi, möminin də imanı qəlbində sabit qalır, əməlləri isə göyə - Allah dərgahına yüksəlib ona daim savab qazandırır).

26. Pis söz isə yerdən qopardılmış, kökü olmayan pis bir ağaca bənzəyir.

27. Allah iman gətirənləri dünyada da, axirətdə də möhkəm bir sözlə (kəlmeyi-şəhadətlə) sabitqədəm edər. Allah zalımları (haqq yoldan) sapdırar. Allah istədiyini edər!

28. (Ya Rəsulum!) Məgər Allahın nemətini küfrə dəyişənləri (Allaha nankor olan Qüreyş kafirlərini) və ümmətini ölüm yurduna sövq edənləri görmürsənmi?

29. Onlar Cəhənnəmə daxil olacaqlar. Ora necə də pis sığınacaqdır!

30. Onlar (xalqı) Allah yolundan döndərmək üçün Ona (özlərindən uydurub cürbəcür) şəriklər qoşdular. (Ya Rəsulum! Onlara) belə de: "Hələ ki, (dünyada bir qədər) əylənib keg çəkin. Axırda məskəniniz atəş (Cəhənnəm) olacaqdır!"

31. İman gətirən bəndələrimə de: "(Vaxtlı-vaxtında, lazımınca) namaz qılsınlar, heç bir alış-verişin və dostluğun mümkün olmayacağı (günahların bağışlanması üçün heç kəsdən fidyə alınmayacağı, dostluq xatirinə heç bir güzəşt edilməyəcəyi) gün (qiyamət günü) gəlməzdən əvvəl onlara verdiyimiz ruzidən (kasıblara, ehtiyacı olanlara) gizli və aşkar xərcləsinlər.

32. Göyləri və yeri yaradan, göydən yağmur endirən, o yağmurla sizin üçün ruzi olaraq (cürbəcür) meyvələr yetişdirən, əmri ilə dənizdə üzmək (yüklərinizi bir yerdən başqa yerə daşımaq) üçün gəmiləri sizə (sizin mənafeyinizə) tabe və çayları sizə ram edən Allahdır!

33. (Daim öz hədəqəsində, özləri üçün müəyyən olunmuş yerdə) seyr edən Günəşi və Ayı, həmçinin gecəni və gündüzü sizin ixtiyarınıza verən Odur.

34. (Allah) sizə istədiyiniz şeylərin hamısından vermişdir. Əgər Allahın nemətlərini sayacaq olsanız, sayıb qurtara bilməzsiniz. Həqiqətən, insan çox zalım, həm də çox nankordur. (O, Allahdan başqasına tapınmaqla özünə zülm edər, Onun lütfünü, mərhəmətini danmaqla küfrani-nemət olar).

35. (Ya Rəsulum!) Xatırla ki, bir zaman İbrahim belə demişdi: “Ey Rəbbim! Bu diyarı (Məkkəni) əmin-amanlıq yurdu et. Məni və oğullarımı bütlərə tapınmaqdan uzaq elə!

36. Ey Rəbbim! Onlar (bütlər), həqiqətən, çox insanı (haqq yoldan) azdırıblar. İndi kim arxamca gəlsə, o, şübhəsiz ki, məndəndir. Kim mənə qarşı çıxsa, (bilsin ki, tövbə edəcəyi təqdirdə) Sən (günahları) bağışlayansan, (bəndələrinə) rəhm edənsən!

37. Ey Rəbbimiz! Mən əhli-əyalımdan bəzisini (İsmaili və anası Hacəri) Sənin Beytülhəramının (Kəbənin) yaxınlığında, əkin bitməz bir vadidə (dərədə) sakin etdim. Ey Rəbbimiz! Onlar (vaxtlı-vaxtında, lazımınca) namaz qılsınlar deyə belə etdim. Elə et ki, insanların bir qisminin qəlbləri onlara (Kəbənin ziyarətinə, əhli-əyalıma mərhəmət göstərməyə) meyl etsin. Onlara (bu yerin ağaclarının) meyvələrindən ruzi ver ki, (nemətinə) şükür edə bilsinlər!

38. Ey Rəbbimiz! Sən bizim gizli saxladığımız və aşkar etdiyimiz hər şeyi (bütün gizli və aşkar əməllərimizi) bilirsən. Yerdə də, göydə də Allahdan gizli heç bir şey qalmaz!

39. İxtiyar çağımda mənə İsmail və İshaqı bəxş etmiş Allaha həmd olsun! Həqiqətən, Rəbbim duaları eşidəndir!

40. Ey Rəbbim! Məni də, nəslimdən olanları da (vaxtlı-vaxtında, lazımınca) namaz qılan et. Ey Rəbbimiz! Duamı qəbul buyur!

41. Ey Rəbbim! Haqq-hesab çəkilən gün (qiyamət günü) məni, ata-anamı və möminləri bağışla!”

42. (Ya Rəsulum!) Allahı zalımların etdikləri əməllərdən əsla qafil sanma! (Allah) onların cəzasını yubadıb elə bir günə saxlayar ki, həmin gün gözləri hədəqəsindən çıxar;

43. Belə ki, onlar başlarını yuxarı qaldırıb, durar, gözlərini də qırpa bilməzlər. Onların qəlbləri də bomboşdur. (Ürəkləri duyğusuzdur, orada xeyirdən heç bir əsər-əlamət yoxdur).

44. İnsanları onlara əzab gələcəyi günlə qorxut. O gün zalımlar: “Ey Rəbbimiz! Bizə bir az möhlət ver. Biz Sənin dəvətini qəbul edər (iman gətirər) və peyğəmbərlərə tabe olarıq!” deyərlər. Bəs əvvəlcə sizə heç bir zaval toxunmayacağı barədə and içməmişdiniz?!

45. Siz özlərinə zülm edənlərin yurdlarında da sakin oldunuz, onların başına nələr gətirdiyimiz də sizə bəlli oldu. Üstəlik sizin üçün (ibrətamiz) məsəllər də çəkdik.

46. (Kafirlər Peyğəmbərə və islam dininə qarşı bacardıqları qədər) hiylə qurdular. Onların hiyləsi Allah dərgahında məlumdur (və buna görə də cəzalarını da alacaqlar). Onların hiyləsi ilə dağlar (islam dini, onun hökmləri) yerindən oynayan deyildir! (Və ya onların hiyləsi dağları yerindən oynatsa belə, yenə də Allahın dini qarşısında acizdir!)

47. (Ya Rəsulum!) Allahın peyğəmbərlərə verdiyi vədə xilaf çıxacağını sanma! Həqiqətən, Allah yenilməz qüvvət sahibi, intiqam sahibidir!

48. (Yadda saxla! Qiyamət günü) elə bir gündür ki, Yer (yer kürəsi) başqa bir yerlə, göylər də başqa göylərlə əvəz olunacaq (Yer dəyişib başqa cür yer, göylər də başqa cür göylər olacaq; onların mahiyyəti, şəkli o qədər dəyişəcək ki, tanınmaz hala düşəcəklər) və onlar (bütün insanlar qəbirlərindən çıxıb haqq-hesab üçün) bir olan, (hər şeyə) qalib olan Allahın hüzurunda duracaqlar!

49. O gün günahkarları qandallanmış (zəncirlə bir-birinə bağlanmış) görəcəksən!

50. Köynəkləri qətrandan olacaq, üz-gözlərini də atəş bürüyəcəkdir!

51. Allah hər kəsə (dünyada) etdiyi əməllərin cəzasını vermək üçün belə edəcəkdir! Şübhəsiz ki, Allah tezliklə haqq-hesab çəkəndir!

52. Bu (Quran) insanlar üçün elə bir moizədir ki, onunla həm qorxsunlar, həm də Allahın tək bir tanrı olduğunu bilsinlər, həm də ağıl sahibləri düşünüb ibrət alsınlar!

## .15.
## ər-Hicr (Daşlı sahə) surəsi
**(Məkkədə nazil olmuşdur, 99 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Əlif, Lam, Mim, Ra! Bunlar (mükəmməl ilahi) Kitabın və açıq-aydın (möcüzə olan) Quranın ayələridir.

2. Kafirlər (qiyamət günü), yəqin ki, müsəlman olmalarını istərdilər!

3. (Ya Rəsulum!) Qoy (kafirlər) hələ (istədikləri kimi) yeyib içsinlər ,(dünyadan) ləzzət alsınlar, arzuları-ümidləri başlarını qatsın. (Düçar olacaqları müsibəti) sonra biləcəklər!

4. Biz heç bir məmləkəti (heç bir ölkənin əhalisini) əcəli (lövhi-məhfuzda onun üçün müəyyən edilmiş vaxt) gəlib çatmamış məhv etmədik.

5. Heç bir ümmət əcəlini nə qabağa çəkə bilər, nə də yubandıra bilər.

6. (Müşriklər Peyğəmbərə) belə dedilər: “Ey özünə Kitab nazil edilən kəs! Axı sən divanəsən!

7. Əgər sən doğru danışanlardansansa (Peyğəmbər olduğun barədəki iddian düzgündürsə), mələkləri bizə gətirsənə!”

8. (Allah onların cavabında buyurdu: ) “Biz mələkləri yalnız haqq olaraq (peyğəmbərlərə vəhy gətirmək, kafirlərə əzab vermək üçün) endiririk. O zaman onlara (kafirlərə) heç bir möhlət verilməz!

9. Şübhəsiz ki, Quranı Biz nazil etdik və sözsüz ki, Biz də onu (hər cür təhrif və təbdildən; artırıb-əskiltmədən) qoruyub saxlayacağıq!”

10. (Ya Rəsulum!) Biz səndən əvvəl də ümmətlərə peyğəmbərlər göndərmişdik.

11. Onlara elə bir peyğəmbər gəlmədi ki, ona istehza etməsinlər!

12. (Əvvəlki ümmətlər barəsində etdiyimiz kimi) Biz onu (küfrü, istehzanı) günahkarların (sənin qövmündən olan müşriklərin) ürəklərinə belə yeridirik!

13. Özlərindən əvvəlkilərin başlarına gələnlər (müsibətlər) göz qabağında olduğu (olub keçdiyi) halda, onlar (yenə də) ona (Qurana) inanmazlar.

14. Əgər onlara göydən bir qapı açsaq (nərdivan endirsək) və onunla durmadan yuxarı dırmaşsalar (göydə Allahın qüdrətini və əzəmətini görsələr) yenə də (inanmayıb):

15. “Gözümüz bağlanmış (xumarlanmış), biz sehrlənmişik (Muhəmməd bizi ovsunlayıb gözümüzü bağlamışdır)”, - deyərlər.

16. Biz səmada bürclər yaratdıq, onlara baxanlar üçün (ulduzlarla) bəzədik.

17. Onları hər bir məlun (Allahın dərgahından qovulmuş, rəhmətindən kənar edilmiş, daşqalaq olunmuş) Şeytandan qoruduq.

18. Lakin (şeytanlardan) kim (mələklərin söhbətinə) xəlvəti qulaq assa, onu odlu bir axan ulduz (məşəl) təqib edər (və üstünə düşüb yandırar).

19. Biz yer üzünü döşədik (orada hər şeyi yerbəyer etdik), orada möhkəm dayanan dağlar yerləşdirdik, hər şeydən (bütün meyvələrdən) müəyyən ölçüdə (lazım olan qədər) yetişdirdik.

20. Sizdən və sizin ruzi vermədiklərinizdən (qul, kəniz, ev heyvanları və sairədən) ötrü yaşayış üçün lazım olan hər şey yaratdıq. (Ruzini siz yox, Biz veririk. Onun, sadəcə olaraq ixtiyarı sizdədir).

21. (Yerdə və göydə) elə bir şey yoxdur ki, onun xəzinələri Bizdə olmasın. Lakin Biz ondan ancaq müəyyən (lazım olduğu) qədər endiririk. (Onun nə qədər lazım olması isə yalnız Bizə məlumdur).

22. Biz (buludla) yüklənmiş (bitkilərə, ağaclara həyat verən, onları tozlandıran) külək göndərdik, göydən yağmur endirib sizə su verdik (içirtdik). Yoxsa onu yığıb saxlayan (bir yerə toplayan) siz deyilsiniz! (Allah yağış suyunu saxlayıb istədiyi vaxt, istədiyi yerə yağdırar).

23. Həqiqətən, dirildən də, öldürən də Bizik, (hər şeyə) varis olan da Biz (Sizi məhv etdikdən sonra yer üzünə sahib olub onu istədiyimizə verən də, hər şey fənaya uğradıqdan sonra əbədi qalan da Bizik!)

24. Sizdən əvvəl kimlər gəlib-gedibsə, onları da bilirik, sizdən sonra kimlər gələcəksə, onları da! (Və ya sizdən əvvəl də, sonra da iman gətirənləri bilirik!)

25. Həqiqətən, Rəbbin (qiyamət günü haqq-hesab çəkmək üçün) onları bir yerə yığacaq. O, hikmət sahibidir, (hər şeyi) biləndir!

26. Biz insanı quru (toxunduqda saxsı kimi səs çıxaran) və qoxumuş (və ya torpaqdan tədriclə dəyişib başqa şəklə düşmüş) qara palçıqdan yaratdıq!

27. (Cinlərin babası) can tayfası (və ya İblisi) daha öncə (insandan əvvəl) tüstüsüz oddan xəlq etmişdik.

28. (Ya Rəsulum!) Xatırla ki, bir zaman Rəbbin mələklərə belə demişdi: “Mən quru və qoxumuş (dəyişib başqa şəklə düşmüş) qara palçıqdan insan yaradacağam!

29. Mən ona surət verib ruhumdan üfürdüyüm zaman siz ona (ibadət yox, təzim məqsədilə) səcdə edin!"

30. Bundan sonra mələklərin hamısı ona (təzim məqsədilə) səcdə etdilər.

31. Təkcə İblisdən başqa! O, səcdə edənlərlə birlikdə olmaqdan imtina etdi.

32. (Allah buyurdu:) "Ey İblis! Sənə nə olub ki, səcdə edənlərlə birlikdə səcdə etmirsən?"

33. (Şeytan) dedi: "Sənin quru və qoxumuş qara palçıqdan yaratdığın insana səcdə etmək mənə yaraşmaz!" (Adəmə səcdə etmək mənim üçün düz olmaz, çünki mən oddan yaranmışam. Od isə torpağı yandırdığına görə ondan üstündür!)

34. (Allah) buyurdu: "Oradan (Cənnətdən və ya səmalardan) çıx. Sən məlunsan! (Dərgahımdan qovulmuş və rəhmətimdən kənar edilmişsən!)

35. Sən qiyamət gününə qədər lənətlənmişsən!"

36. (İblis) dedi: "Ey Rəbbim! İnsanların (qəbirlərindən qalxıb) diriləcəkləri günə (qiyamətə) qədər mənə möhlət ver!"

37. (Allah) buyurdu: "Sən möhlət verilənlərdənsən"

38. Ancaq məlum vaxtın gününə (İsrafil surunu birinci dəfə çalana və bütün məxluqat məhv olana) qədər!

39. (İblis) dedi: "Ey Rəbbim! Məni azdırmağına (rəhmətindən kənar etməyinə) əvəz olaraq and içirəm ki, mən də (bunun müqabilində) onlara (pis əməllərini, günahlarını) yer üzündə yaxşı göstərib onların hamısını yoldan çıxaracağam!

40. Yalnız Sənin sadiq bəndələrindən başqa!"

41. (Allah) buyurdu: “Mənə görə, bu, düz yoldur! (Və ya: Bu, sonu Mənə gəlib çatacaq doğru yoldur!)

42. Sənə uyan azğınlar istisna olmaqla, bəndələrim üzərində (onları yoldan çıxarıb günaha vadar etməyə) sənin heç bir hökmün olmaz!

43. Şübhəsiz ki, Cəhənnəm onların hamısına vəd olunmuş (onları gözləyən) yerdir!

44. (Cəhənnəmin) yeddi qapısı (təbəqəsi) var. Hər qapıdan müəyyən bir dəstə girər.

45. Allahdan qorxub pis əməllərdən çəkinənlər isə cənnətlərdə və bulaqlar başında olacaqlar.

46. Ora sağ-salamat (sağlıqla) və (hər şeydən) əmin olaraq daxil olun!”

47. Biz onların ürəklərindəki kin-küdurəti çıxarıb atdıq. Onlar qardaş olub taxt üstündə qarşı-qarşıya əyləşərlər.

48. Onlara orada (Cənnətdə) heç bir yorğunluq (zəhmət) üz verməz. Onlar oradan çıxan da deyillər. (Cənnətdə əbədi qalacaqlar).

49. (Ya Rəsulum!) Qullarıma xəbər ver ki, (tövbə edəcəkləri təqdirdə) Mən, həqiqətən, bağışlayanam, rəhm edənəm!

50. Eyni zamanda da əzabım da çox şiddətli əzabdır!

51. Həm də onlara İbrahimin qonaqlarından (yanına qonaq gələn mələklərdən) xəbər ver!

52. O zaman ki, onlar onun hüzuruna daxil olub: “Salam!” – dedilər. (İbrahim də qonaqların yeməyə əl uzatmadıqlarını görüb: ) “Biz, həqiqətən, sizdən qorxuruq!” – dedi.

53. Onlar: “Qorxma, biz səni çox bilikli bir oğulla (oğlun olacağı ilə) müjdələyirik!” – deyə cavab verdilər.

54. (İbrahim: ) “Qocalıq məni basdığı vaxtdamı mənə müjdə verirsiniz? Məni nə ilə muştuluqlayırsınız?” – deyə soruşdu.

55. (Mələklər: ) “Biz sənə doğru xəbərlə müjdə veririk. (Allah dərgahından) ümidini üzənlərdən olma!” – dedilər

56. (İbrahim) dedi: “(Haqq yoldan) azanlardan başqa, Rəbbinin mərhəmətindən kim ümidini üzə bilər?!”

57. “Ey elçilər! (Ey Allahın mələkləri! Bir deyin görək) işiniz nədir?” – dedi.

58. (Mələklər) belə cavab verdilər: “Biz günahkar bir tayfaya (əzab vermək, onları məhv etmək üçün) göndərilmişik.

59. Yalnız Lutun ailəsindən başqa! Biz, sözsüz ki, onların hamısı xilas edəcəyik!

60. Ancaq (Lutun) zövcəsi istisna olmaqla! (Allahın əmri ilə) qət etdik ki, o, (küfr etdiyinə görə) əzaba uğrayanlardan (əzab içində qalanlardan) olacaqdır!”

61. Elçilər (mələklər) Lutun yanına gələndə

62. (Lut) dedi: “Siz yad adamlarsınız (mən sizi tanımıram)!”

63. (Mələklər) belə cavab verdilər: “Xeyr, biz sənə onların (ümmətindən olan kafirlərin) şübhə etdikləri şeyi (əzabı) gətirmişik!

64. Biz sənə (Allahdan) doğru xəbər gətirmişik. Biz, həqiqətən, doğru danışanlarıq!

65. Gecənin bir vaxtı (sonuna yaxın) ailəni yola çıxart, sən özün də onların arxasınca get. Sizdən heç kəs dönüb geri baxmasın (çünki

kafirlərə veriləcək dəhşətli əzabı gördükdə halınız pis olar). Sizə əmr olunan yerə gedin!”

66. Və ona (Luta da) vəhy etdik ki, səhər çağı onların (kafirlərin) kökü kəsilmiş olacaq.

67. (Lutun gözəl qonaqları gəldiyini bilən) şəhər əhli (sevinərək) bir-birini muştuluqlayıb (onun yanına) gəldi.

68. (Lut) dedi: “Bunlar mənim qonaqlarımdır. (Onlara hörmət etmək mənim borcumdur). Məni (biabırçı hərəkətlərinizlə onların yanında) rüsvay etməyin!

69. Allahdan qorxun və məni xar etməyin!

70. Onlar: “Məgər biz sənə (şəhərimizə gələn) adamları (himayə etməyə etməyi, onları qonaq saxlamağı) qadağan etmədikmi?” – deyə soruşdular.

71. (Lut) dedi: “Bunlar mənim qızlarımdır. Əgər (istədiyinizi) edəcəksinizsə (buyurun, onlarla evlənin)!”

72. (Ya Rəsulum!) Canına and olsun ki, onlar məstlikləri (küfrləri) içində sərgərdan (şaşqın) vəziyyətdə durub qaldılar. (Lutun nəsihətini qəbul etmədilər).

73. Şəfəq doğanda o dəhşətli (tükürpədici) səs onları bürüdü.

74. Onların altını-üstünü çevirdik və başlarına odda bişmiş gildən bərk daşlar yağdırdıq.

75. Bunda (bu əzabda) düşünüb-daşınanlar üçün, sözsüz ki, neçə-neçə ibrətlər vardır!

76. Həqiqətən, o (Lut tayfasının yaşadığı Sədum şəhərinin xarabaları Qüreyş kafirlərinin Məkkədən Şama getdikləri) yolun üstündə hələ də durmaqdadır!

77. Bunda möminlər üçün, sözsüz ki, bir ibrət vardır!

78. Şübhəsiz ki, Əykə əhli də (sıx meşəlikdə yaşayan Şüeyb tayfası da) zalım idi. (Onlar Allaha asi olmaqla özlərinə zülm etdilər).

79. (Göydən od göndərib) onlardan da intiqam aldıq. Hər iki şəhər (Sədum və Əykənin qalıqları) açıq-aşkar göz qabağındadır, (Məkkə müşrikləri onlara baxıb niyə ibrət almırlar).

80. Həqiqətən , (Saleh tayfası olan) Hicr əhalisi də peyğəmbərləri yalançı adlandırmışdılar.

81. Biz onlara (Hicr əhalisinə) möcüzələrimizi göndərdik, lakin onlardan üz çevirdilər (bu möcüzələrə baxıb ibrət almadılar, Allahın qüdrəti, əzəməti haqqında düşünmədilər).

82. Onlar (Allahın əzabından) salamat qurtarmaq üçün dağları yonub (özlərinə) evlər qurudular.

83. Səhər çağı dəhşətli (tükürpədici) səs onları bürüdü.

84. Gördükləri tədbirlər (möhkəm evlər, qalalar tikmək; var-dövlət yığmaq) onlara heç bir fayda vermədi (Allahın əzabını onlardan dəf edə bilmədi).

85. Biz göyləri, yeri və onlar arasında olan hər şeyi yalnız haqq-ədalətlə (hər şeyi yerli-yerində, bir-birinə uyğun şəkildə) yaratdıq. O saat (qiyamət saatı) mütləq gələcəkdir. Sən (müşriklərdən) yaxşıca üz döndər (və ya onları alicənablıqla bağışla. Allah onsuz da onların cəzasını verəcəkdir!).

86. Həqiqətən, Rəbbin (hər şeyi) yaradandır, biləndir!

87. (Ya Rəsulum!) Biz sənə (hər namazda oxunub) təkrarlanan yeddi ayəni (Fatihə surəsini) və (böyük) əzəmətli Quranı verdik.

88. (Kafirlərin) bəzi zümrələrinə verdiyimizə (fani dünya malına) rəğbət gözü ilə baxma (və ya gözünü dikmə, çünki bunların arxasınca küfr edənləri dəhşətli bir əzab gözləyir), onlardan (onlar iman gətirmədiklərindən) ötrü kədərlənmə (yaxud onlara verdiyimiz sərvətə görə qəmgin olma, axirətdə səni daha böyük nemətlər gözləyir), möminləri qanadın altına al (iman gətirənlərə qarşı təvazökar olub yumşaq davran və onları himayə et!)

89. Və de: “Mən, həqiqətən, (sizi Allahın əzabı ilə) açıq-aşkar qorxudanam!”

90. Eynilə (Quranı) bölənlərə endirdiyimiz (əzab) kimi!

91. O kəslər ki, Quranı (müxtəlif) hissələrə böldülər! (Yəhudilər və xaçpərəstlər, yaxud müşriklər Quranın bir qisminə inanıb, digər qismini inkar edirdilər. Onların bəzisi Quranı şer, bəzisi sehr, bəzisi isə kahinlik əsəri adlandırırdı).

92. (Ya Rəsulum!) Rəbbinə and olsun ki, Biz onların hamısını (bütün məxluqatı) sorğu-suala çəkəcəyik -

93. (Dünyada) etdikləri əməllər barəsində. (Onlardan haqq-hesab tələb edəcək və cəzalarını da verəcəyik!)

94. (Ya Rəsulum!) Sənə əmr olunanı (Quranı) açıq-aşkar təbliğ et və müşriklərdən üz döndər!

95. Şübhəsiz ki, istehza edənlərə qarşı Biz sənə kifayət edərik.

96. O kəslər ki, Allaha başqa tanrı şərik qoşdular! Onlar (başlarına gələcək müsibəti, düçar olacaqları əzabı, bütün bəd əməllərinin aqibətini) mütləq biləcəklər!

97. (Ya Rəsulum!) Doğrusu, Biz onların (istehzalı) sözlərindən sənin ürəyinin qısıldığını bilirik!

98. Sən isə Rəbbini tərifləyib şükür et (sübhanallah və bihəmdihi de), səcdə edənlərlə (namaz qılanlarla) birlikdə ol!

99. Və sənə yəqin (ölüm) gələnədək Rəbbinə ibadət et!

## .16.
## ən-Nəhl (Bal arısı) surəsi

**(Məkkədə nazil olmuşdur, 128 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Allahın (möminlərin zəfər çalacağı, müşriklərin və kafirlərin məhv olacağı barəsindəki) əmri mütləq gələcəkdir. Buna görə də onu tələm-tələsik (vaxtından əvvəl) istəməyin. Allah Ona şərik qoşulan bütlərdən pak və ucadır. (Allah hər şeyin fövqündədir. Onun heç bir şəriki yoxdur!)

2. (Allah) Öz əmri ilə mələkləri (Cəbraili) vəhy ilə bəndələrindən istədiyinə göndərib belə buyurar: "İnsanları (əzabımla) qorxudub (bu həqiqəti Mənim adımdan onlara) bildirin: "Məndən başqa heç bir tanrı yoxdur. Məndən qorxun!"

3. (Allah) göyləri və yeri haqq olaraq yaratmışdır, (Allah) Ona şərik qoşulan bütlərdən ucadır!

4. Allah insanı nütfədən (mənidən, bir qətrə sudan) xəlq etdi. Bununla belə, o, (böyüyüb yetkinlik hədinə çatanda haqqı inkar, batili iqrar edib qiyamətdə diriləcəyinə inanmayaraq) birdən-birə açıq-aşkar bir düşmən kəsildi.

5. Davarı da (dəvə, inək, kəl, qoyun, keçi və s. ) O yaratdı. Bunlarda (onların yununda) sizin üçün istilik, cürbəcür mənfəət (südünü içmək; özlərini minmək, yer sürmək) vardır, həm də onlardan (onların ətindən) yeyirsiniz.

6. Onları səhər naxıra, axşam axura gətirdikdə (səhər otlamaq üçün çölə göndərib axşam tövləyə qaytardıqda) baxıb zövq alırsınız (fərəhlənirsiniz).

7. Onlar sizin yüklərinizi özünüzü yormadan çata bilməyəcəyiniz bir ölkəyə (bir yerdən başqa yerə) daşıyarlar. Həqiqətən, Rəbbin şəfqətlidir, mərhəmətlidir!

8. Sizin minməyinizdən ötrü, həm də zinət üçün atı, qatırı və uzunqulağı (O yaratdı). (Allah) hələ sizin bilmədiyiniz neçə-neçə şeylər (nəqliyyat, minik vasitələri və s.) də yaradacaqdır.

9. Doğru yolu (islamı) göstərmək Allaha aiddir. Ondan (haqdan) kəc olan yol (və ya haqdan kənara çıxan) da vardır. Əgər (Allah) istəsəydi, sizin hamınızı doğru yola salardı.

10. Göydən sizin üçün yağmur endirən Odur. Ondan (o sudan) siz də, içində (heyvanlarınızı) otardığınız ağaclar (və otlar) da içər (ağaclar və otlar da onun vasitəsilə bitər).

11. (Allah) onunla (o su ilə) sizin üçün əkin (taxıl, bitki), zeytun, xurma, üzüm və bütün (başqa) meyvələrdən yetişdirir. Düşünüb-daşınanlar üçün bunda (Allahın vəhdaniyyətini sübut edən) dəlillər vardır!

12. O, gecəni və gündüzü, Günəşi və Ayı sizə ram etdi (sizin xidmətinizə verdi). Ulduzlar da Onun əmrinə boyun əymişdir. Doğrudan da, bunda ağılla düşünənlər üçün ibrətlər vardır!

13. (Allah) yer üzündə yaratdığı cürbəcür şeyləri (heyvanları, bitkiləri, meyvələri və s.) də sizin ixtiyarınıza verdi. Öyüd-nəsihət qəbul edənlər üçün, sözsüz ki, bunda da (Allahın qüdrətini, əzəmətini bildirən) əlamətlər vardır!

14. Təzə ət (balıq əti) yeməyiniz, taxdığınız bəzək şeylərini (inci, sədəf, mərcan) çıxartmağınız üçün dənizi də sizə ram edən Odur. (Ey insan! Allahın) nemətindən ruzi axtarmağınız üçün sən gəmilərin onu yara-yara üzüb getdiyini görürsən. Bəlkə, (bundan sonra Allahın nemətlərinə) şükür edəsiniz! [Və ya: Sən gəmilərin onu yara-yara üzüb getdiyini görürsən. (Bütün bunlar) Onun lütfünü aramanız və (kəreminə) şükür etməyiniz üçündür!]

15. (Allah yer kürəsi möhkəm olsun, titrəməsin, onun hərəkəti hiss olunmasın, beləliklə də) sizi yırğalamasın deyə, yer üzündə möhkəm dayanan dağlar və (istədiyiniz yerə) gedib çata biləsiniz deyə, çaylar və yollar yaratdı;

16. (Yollarda dərə, təpə, çuxur kimi) əlamətlər də (müəyyən etdi). (İnsanlar gecə vaxtı) yollarını (və qibləni) ulduzlar vasitəsilə taparlar.

17. Heç yaradan (Allah) yaratmayana (bütlərə) bənzəyərmi?! Məgər düşünmürsünüz?! (Belə bir sadə, açıq-aydın həqiqəti xatırlayıb bütlərə ibadət etməyin səhv olduğunu anlamırsınız?!)

18. Əgər Allahın nemətlərini sayacaq olsanız, sayıb qurtara bilməzsiniz. Həqiqətən, Allah bağışlayandır, rəhm edəndir!

19. Allah sizin nəyi gizli saxladığınızı və nəyi aşkar etdiyinizi (ürəyinizdə olanları, bütün gizli və aşkar əməllərinizi) bilir!

20. (Müşriklərin) Allahdan qeyri ibadət etdikləri (bütlər) heç bir şey yarada bilməzlər, əksinə, onlar özləri (daşdan, ağacdan və sairədən) yaradılmışlar.

21. Onlar ölüdürlər, diri deyillər və (insanların, bütün məxluqatın) nə vaxt diriləcəklərini də bilməzlər. (Elə isə onlara ibadət etmək düzgündürmü?!)

22. Siz tanrınız bir olan Allahdır. Axirətə inanmayanların qəlbləri isə (Allahın qüdrət və əzəmətini, vəhdaniyyətini) inkar edər. Onlar (haqqa boyun qoymağı, Allaha iman gətirməyi) özlərinə sığışdırmazlar.

23. Şübhəsiz ki, Allah onların gizlində də, aşkarda da nə etdiklərini bilir. Allah təkəbbür edənləri sevməz!

24. (Müşriklərdən: ) "Rəbbiniz (Muhəmmədə) nə nazil etmişdir?" – deyə soruşduqda, onlar: "Qədimlərin əfsanələrini!" – deyə cavab verərlər ki,

25. Qiyamət günü öz günahlarına tamamilə, nadanlıqları üzündən yoldan çıxartdıqları adamların günahlarına da qismən yüklənsinlər. Bir görün onların daşıyacaqları (yük) necə də pisdir!

26. Onlardan əvvəlkilər də hiylə qurmuşdular. Allah onların binalarını təməlindən sarsıtdı, dərhal tavanları başlarına çökdü və heç özləri də (hiss edib) bilmədilər ki, əzab onlara haradan gəldi.

27. Sonra qiyamət günü (Allah) onları rüsvay edəcək və: "Barələrində (möminlərlə) çənə-boğaz olduğunuz şəriklərim haradadır?" – deyə soruşacaqdır. Elm verilmiş kimsələr (peyğəmbərlər və möminlər) isə: "Bu gün kafirlər rəzalətə və əzaba (pisliyə) düçar olacaqlar!" – deyəcəklər.

28. Mələklər (küfr etməklə, Allaha şərik qoşmaqla) özlərinə zülm edənlərin canlarını aldıqda onlar (ölüm qorxusundan Allahın əmrinə) təslim olub: "Biz heç bir pislik etmirdik!" – deyəcək (mələklər də onlara belə cavab verəcəklər): "Xeyr, (elə deyildir) Allah sizin nələr etdiyinizi çox yaxşı bilir!

29. Haydı, girin əbədi qalacağınız Cəhənnəmin qapılarına (təbəqələrinə). Təkəbbürlülərin (Allaha iman gətirməyi özlərinə ar bilənlərin) məskəni necə də pisdir!"

30. Allahdan qorxub pis əməllərdən çəkinənlərdən: “Rəbbiniz (öz peyğəmbərinə) nə nazil etmişdir? – deyə soruşduqda isə onlar: “Xeyir (nazil etmişdir)” – deyə cavab verərlər. Bu dünyada yaxşılıq edənləri (gözəl həyat) gözləyir. Axirət yurdu (Cənnət) isə, sözsüz ki, daha yaxşıdır. Müttəqilərin yurdu necə də gözəldir!

31. Onlar (ağacları) altında çaylar axan Ədn cənnətlərinə daxil olacaqlar. Orada onların istədikləri hər şey vardır. Allah müttəqiləri belə mükafatlandırır!

32. O kəslər ki, mələklər onların canlarını pak olduqları halda alıb: “Sizə salam olsun! Etdiyiniz (gözəl) əməllərə görə Cənnətə daxil olun!” – deyərlər.

33. O kafirlər (canlarını almaq üçün) yalnız mələklərin onların yanına gəlməsini, yaxud sənin Rəbbinin (əzab) əmrinin gəlib çatmasınımı gözləyirlər? Onlardan əvvəlkilər də belə etmişdilər. Allah onlara zülm etmədi. Onlar özləri özlərinə zülm edirdilər.

34. Onlara öz əməllərinin cəzası (pisliklər) artıq yetişdi. İstehza etdikləri (əzab da) onları yaxaladı.

35. Müşriklər (nadanlıqları üzündən və ya istehza məqsədilə) dedilər: “Əgər Allah istəsəydi, nə biz, nə də atalarımız Ondan başqa heç bir şeyə tapınmaz, Onsuz (Allahın razılığı, hökmü olmadan) heç bir şeyi haram etməzdik”. Onlardan əvvəlkilər də belə etmişdilər. Peyğəmbərlərin vəzifəsi isə yalnız açıq-aşkar bir təbliğdir. (Peyğəmbərlər heç kəsi zorla bir işə vadar etməz. Onların borcu ancaq Allahın hökmlərini insanlara təbliğ etmək, insanların borcu isə Allahın onlara verdiyi ağıl və iradə ilə haqqı batildən ayırmaq, yaxşı işlər görüb savab qazanmaqdır).

36. Biz hər ümmətə: “Allaha ibadət edin, Tağutdan çəkinin! – deyə peyğəmbər göndərmişdik. Onlardan bir qismini Allah doğru yola

yönəltmiş, bir qismi isə (Allahın əzəli elmi ilə) haqq yoldan azmalı olmuşdur. (Ey müşriklər!) Yer üzündə dolaşıb görün ki, (peyğəmbərləri) yalançı hesab edənlərin axırı necə oldu!

37. (Ya Rəsulum!) Sən onların doğru yola gəlməsini həddindən artıq istəsən də (bunun heç bir faydası yoxdur). Çünki Allah yoldan çıxartdıqlarını (bir daha) doğru yola salmaz. Onlara (Allahın əzabından xilas olmaqla) kömək edənlər də olmaz!

38. Onlar: "Allah, ölən bir kimsəni diriltməyəcəkdir!" – deyə Allaha möhkəm and içdilər. Xeyr! (Allah qiyamət günü ölüləri qəbirlərindən çıxarıb dirildəcəyi haqda) doğru vəd etmişdir. Lakin insanların əksəriyyəti (bunu) bilməz!

39. (Allah hər bir mömini və kafiri öləndən sonra dirildəcəkdir ki) ixtilafda olduqları məsələləri izah etsin və (qiyamət günü ölülərin diriləcəyini) inkar edənlər də özlərinin yalançı olduqlarını bilsinlər.

40. Biz hər hansı bir şeyi (yaratmaq) istədikdə ona sözümüz: "Ol!" deməkdir. O da dərhal olar.

41. Zülmə məruz qaldıqdan sonra Allah uğrunda hicrət edənləri dünyada gözəl bir yerdə sakin edəcəyik. Axirət mükafatı (Cənnət) isə daha böyükdür. Kaş (kafirlər və hicrətdən geri qalanlar bunu) biləydilər!

42. (O mühacirlər hər cürə əziyyətə) dözənlər və yalnız Rəbbinə təvəkkül edənlərdir!

43. (Ya Rəsulum!) Biz səndən əvvəl də özlərinə vəhy etdiyimiz ancaq kişilər (kişi peyğəmbərlər) göndərmişdik. Əgər (bunu) bilmirsinizsə, zikr (kitab, elm) əhlindən soruşun! (Müşriklər belə iddia edirdilər ki, peyğəmbərlər bəşərdən deyil, ancaq mələklərdən ola bilər. Buna cavab olaraq bildirilir ki, insanlara göndərilən

peyğəmbərlər mələk yox, məhz insan, özü də yalnız kişilərdən ibarət olmalıdır).

44. Biz onları (peyğəmbərliklərinin doğru olduğunu sübut edən) açıq-aşkar möcüzələr və kitablarla göndərdik. Sənə də Quranı nazil etdik ki, insanlara onlara göndəriləni (hökmləri, halal-haramı) izah edəsən və bəlkə, onlar da düşünüb dərk edələr!

45. (Peyğəmbərlərə qarşı) pis hiylələr quranlar (pis işlər düzüb qoşanlar) Allahın onları yerə gömməyəcəyinə, yaxud özləri də bilmədikləri bir yerdən onlara əzabın gəlməyəcəyinə əmindirlərmi?!

46. Və ya gəzib dolaşarkən (səfər əsnasında) əzabın onları yaxalamasından (Allahın onları məhv etməsindən qorxmurlarmı?) Axı onlar (Allahı) aciz edə bilməzlər (Allahın əzabından qaçıb canlarını qurtara bilməzlər!)

47. Yoxsa onlar tədriclə əzaba giriftar olmayacaqlarına (əmindirlər)?! Həqiqətən, Rəbbin şəfqətlidir, mərhəmətlidir! (Allah bəndələrinə əzab verməkdə tələsməz!)

48. Məgər onlar Allahın yaratdığı hər hansı bir şeyə baxıb görmürlərmi ki, onların kölgələri Allaha acizanə surətdə səcdə edərək sağa-sola əyilir?!

49. Göylərdə və yerdə olan (bütün) canlılar, hətta mələklər belə heç bir təkəbbür göstərmədən Allaha səcdə edərlər!

50. Onlar öz (başlarının) üstündə olan Rəbbindən qorxar və özlərinə buyurulanları edərlər!

51. Allah belə buyurdu: “İki tanrı qəbul etməyin. O (Allah) yalnız tək bir tanrıdır. Ancaq Məndən qorxun!”

52. Göylərdə və yerdə nə varsa, hamısı Onundur! Din də (itaət və ibadət də) daim Onundur. Belə olduğu təqdirdə Allahdan başqasındanmı qorxursunuz?

53. Sizə gələn hər bir nemət Allahdandır. Sonra sizə bir müsibət üz verdikdə Ona yalvarıb-yaxarırsınız!

54. Sonra sizi o müsibətdən qurtardığı zaman bir də görürsən ki, aranızda bir dəstə Rəbbinə şərik qoşur.

55. Onlar bunu özlərinə verdiyimiz nemətlərə nankorluq etmək üçün edirlər. Hələ ki (dünyada) kef çəkib ləzzət alın. (Başınıza gələcək müsibəti) sonra biləcəksiniz!

56. (Müşriklər) onlara verdiyimiz ruzidən heç bir şey bilməyənlərə (heç nə anlamayan bütlərə) pay ayırırlar. Allaha and olsun ki, yaxdığınız iftiralara görə sorğu-sual ediləcəksiniz!

57. Onlar Allaha qızlar isnad edirlər. (Mələklər Allahın qızlarıdır, deyirlər). Allah pakdır, müqəddəsdir. (Onun oğula-qıza ehtiyacı yoxdur. ) Özlərinə gəldikdə isə istədiklərini (oğlan uşaqlarını) aid edirdilər.

58. Onlardan birinə qızı olması ilə müjdə verdikdə qəzəblənib üzü qapqara qaralar.

59. Verilən müjdənin pisliyi üzündən tayfasından qaçıb gizlənər. (Allah bilir!) Görəsən, onu (o körpəni) zillət içində saxlayacaq, yoxsa torpağa göməcək? (Diri-diri basdıracaq?) Bir görün onlar necə pis mühakimə yürüdürlər! (Oğlanları özlərinə götürüb qızları Allaha isnad edirlər. )

60. Ən pis sifət (evlənmək üçün qadınlara ehtiyac hiss etdikləri halda, qız uşaqlarını diri-diri torpağa basdırmaq) axirətə

inanmayanlara, ən yüksək sifət (vəhdaniyyət) isə Allaha məxsusdur. Allah yenilməz qüvvət (qüdrət) sahibi, hikmət sahibidir!

61. Əgər Allah insanları zülmləri üzündən cəzalandırsaydı, yer üzündə heç bir canlını sağ buraxmazdı. Lakin (Allah) onlara müəyyən müddət (ömürlərinin sonunadək) möhlət verər. Əcəlləri gəlib çatdıqda isə (ondan) bircə saat belə nə geri qalar, nə də irəli keçə bilərlər.

62. (Müşriklər) özlərinin bəyənmədiklərini (qızları) Allaha isnad edərlər. Dilləri də: "Onları ən gözəl aqibət (Cənnət, Allah rizası) gözləyir!" - deyə yalan söylər. Şübhəsiz ki, onları Cəhənnəm gözləyir. Onlar (Cəhənnəm atəşinə daxil olduqdan sonra hamı tərəfindən) tərk olunacaqlar. (Və ya onlar gündən-günə Cəhənnəmə yaxınlaşanlardır. )

63. (Ya Rəsulum!) Allaha and olsun ki, səndən əvvəl də ümmətlərə peyğəmbərlər göndərmişdik. Şeytan onlar öz (çirkin) əməllərini xoş göstərmişdi. Bu gün Şeytan onların dostudur (havadarıdır). Onlar (qiyamət günü) şiddətli əzaba düçar olacaqlar!

64. Biz Kitabı (Quranı) sənə yalnız (müşriklərə) ixtilafda olduqları (tövhid, qiyamət, qəza-qədər və s. bu kimi) məsələləri izah etmək və möminlərə bir hidayət və mərhəmət olsun deyə nazil etdik!

65. Allah göydən bir yağış endirər, onunla yer üzünü öldükdən (quruduqdan) sonra dirildər. (Öyüd-nəsihətə) qulaq asanlar üçün bunda bir ibrət vardır. (Allah quru torpağa həyat verə bildiyi kimi, insanları da öləndən sonra diriltməyə qadirdir!)

66. Şübhəsiz ki, davarda (sağmal heyvanlarda) da sizin üçün bir ibrət vardır. Biz onların qarınlarındakı qanla ifrazat arasında olan təmiz südü sizə içirdirik. O, içənlərin boğazından rahat keçər. (Qanın

və ifrazatın dadı, qoxusu və rəngi əsla südə qarışmaz. Əksinə, südə elə bir tam verərik ki, o, içənlərə xoş gələr).

67. Siz xurma ağaclarının meyvəsindən və üzümlərdən şərab (yaxud sirkə) və gözəl ruzi (kişmiş, mövüc, bəhməz, quru xurma və s.) düzəldirsiniz. Şübhəsiz ki, bunda da ağılla düşünənlər üçün bir ibrət vardır.

68. Rəbbin bal arısına belə vəhy (təlqin) etdi: “Dağlarda, ağaclarda və (insanların) qurduqları çardaqlarda (evlərin damında, üzümlüklərdə) özünə evlər tik (pətəklər sal);

69. Sonra bütün meyvələrdən ye və Rəbbinin sənə göstərdiyi yolla rahat (asanlıqla) get! (Və ya: “Rəbbinin yollarını itaətlə tut!”) (O arıların) qarınlarından insanlar üçün şəfa olan müxtəlif rəngli (ağ, sarı, qırmızı) bal çıxar. Şübhəsiz ki, bunda düşünüb dərk edənlər üçün bir ibrət vardır!

70. Allah sizi yaratmışdır, sonra da (əcəliniz çatanda) öldürəcəkdir. Sizin bir qisminiz ömrün ən rəzil (ixtiyar) çağına (80-90 yaşlarına) çatdırılar ki, (vaxtilə) bildiyi hər şeyi unudar. (İnsan qocalığın ən düşkün dövründə bildiyini unudar, xasiyyətini dəyişib uşaq kimi olar. Bu, əsasən, kafirlərə aiddir. Lakin Quran oxuyan, oruc tutub namaz qılan, sidq-ürəkdən ibadət edən şəxsin isə ixtiyar çağında belə, ağlı başında olar, uzun ömür onun qiymətini və kəramətini Allah yanında daha da artırar). Həqiqətən, Allah (hər şeyi) biləndir, (hər şeyə) qadirdir!

71. Allah ruzi baxımından birinizi digərinizdən üstün etmişdir. Üstün olanlar (varlılar) tabeçiliyində olanları (qulları, kənizləri) öz ruzilərinə şərik etməzlər ki, bu cəhətdən bərabər olsunlar. (Və ya onlar hamısı ruziyə şərik olduqları halda, varlılar öz ruzilərini tabeçiliyində olanlara verməzlər. Var-dövlət sahibləri öz ruzilərini onlara tabe olanlarla bərabər bölməyi, onları mallarına şərik etməyi

özlərinə rəva bilmədikləri halda, hər şeyin xaliqi olan Allaha cansız bütləri və digər tanrıları şərik qoşmağı necə rəva görürlər?) İndi onlar Allahın nemətlərini inkarmı edirlər?

72. Allah sizin üçün özünüzdən (Adəm və Həvvadan, yaxud öz cinsinizdən) zövcələr yaratdı, zövcələrinizdən də sizin üçün oğullar, nəvələr əmələ gətirdi, pak (halal) nemətlərindən sizə ruzi verdi. Belə olduqda, onlar (müşriklər) batilə inanıb Allahın nemətini inkarmı edirlər?

73. (Müşriklər) Allahı qoyub göylərdən və yerdən onlara verəcək heç bir ruzisi olmayan və buna gücləri də çatmayanlara (bütlərə) ibadət edirlər.

74. (Allah qoşduğunuz şərikləri, Onun yaratdıqlarını) Allaha bənzətməyin. Allah (heç bir şəriki olmadığını, heç bir məxluqun Ona bənzəmədiyini) bilir, siz isə (bu həqiqəti) bilmirsiniz!

75. Allah belə bir məsəl çəkdi: "Heç bir şeyə gücü çatmayan və başqasının malı olan bir qul özünə verdiyimiz gözəl ruzidən (Allah yolunda) gizli və aşkar sərf edən birisi ilə (azad bir insanla) eyni ola bilərmi?! Həmd (hər cür tərif və şükür) yalnız Allaha məxsusdur, lakin (müşriklərin) əksəriyyəti (bunu) bilməz!

76. Allah iki nəfər (Özü ilə bütlər) barəsində yenə belə bir məsəl buyurdu: (bu iki nəfərin) biri dilsizdir (laldır), heç bir şeyə gücü çatmaz. O öz ağasına bir yükdür, onu hara yollasa, xeyirlə qayıtmaz. O heç doğru yolda olub haqq-ədaləti əmr edən (insanları ədalətli işlər görməyə sövq edən) bir kimsə kimi ola bilərmi?!

77. Göylərin və yerin qeybini (gözə görünməyən, heç kəsə bəlli olmayan məchul sirlərini) bilmək ancaq Allaha məxsusdur. Qiyamətin qopması (əmri) bir göz qırpımında, yaxud daha tez olar. Allah, həqiqətən, hər şeyə qadirdir!

78. Allah sizi analarınızın bətnlərindən heç bir şey bilmədiyiniz (dərk etmədiyiniz) halda çıxartdı. Sonra sizə qulaq, göz və qəlb verdi ki, (Allahın əmrlərini eşidib, qüdrətini və əzəmətini görüb, vəhdaniyyətini duyub) şükür edəsiniz!

79. Məgər (müşriklər) yerlə göy arasında (uçaraq Allaha) ram olmuş quşları görmürlər?! Onları (havada) yalnız Allah saxlayır (bütün hərəkətlərini ancaq Allah idarə edir). Həqiqətən, bunda möminlər üçün ibrətlər vardır!

80. Allah evlərinizi sizə məskən (yaşayıb dincəlmə yeri) etdi, heyvanların dərilərindən həm köç vaxtı, həm də bir yerdə qaldığınız zaman (daşınması) sizin üçün yüngül (asan) olan evlər-çadırlar düzəltdi, onların yunundan, tükündən və qılından müəyyən vaxta qədər (ömrünüzün sonuna kimi və ya onlar köhnələnədək) istifadə edəcəyiniz ev əşyası (pal-paltar, xalça-palaz) və (satlıq) mal verdi.

81. Allah yaratdığı şeylərdən (ağaclardan, evlərdən, dağlardan və buludlardan) sizin üçün (günəşin hərarətindən qorunmaq məqsədilə) kölgəliklər əmələ gətirdi, sizdən ötrü dağlarda sığınacaqlar (mağaralar, kahalar), sizi istidən (və soyuqdan) saxlayacaq (yun, kətan, pambıq) köynəklər, (sizi müharibədə) qoruyacaq zirehli geyimlər düzəltdi. Allah nemətini sizə belə tamamlayıb verdi ki, bəlkə, Ona itaət edəsiniz (müsəlman olasınız)!

82. (Ya Rəsulum! Əgər bütün bunlardan sonra müşriklər) yenə də (səndən) üz döndərsələr (ürəyini qısma)! Çünki sənin vəzifən ancaq (Mənim dinimi, hökmlərimi) açıq-aşkar təbliğ etməkdir!

83. Onlar Allahın nemətini (Muhəmməd əleyhissəlamı peyğəmbər göndərməklə onlara etdiyi lütfü) bilir, lakin sonra onu (Muhəmməd əleyhissəlamın peyğəmbərliyini) danırlar. Onların əksəriyyəti kafirdir.

84. Qiyamət günü hər ümmətdən bir şahid (öz peyğəmbərini) gətirəcəyik. (Onlar möminlərin lehinə, kafirlərin əleyhinə şahidlik edəcəklər). Kafirlərə (üzrxahlıq etməyə) izin verilməyəcək, heç üzr diləmələri də istənilməyəcəkdir!

85. Zalımlar (kafirlər, müşriklər) əzabı (Cəhənnəm əzabını) görüncə (yalvarıb-yaxaracaqlar), lakin (əzabları) yüngülləşdirilməyəcək, (tövbə üçün) onlara bir an belə möhlət də verilməyəcəkdir!

86. Müşriklər (Allaha qoşduqları) şəriklərini (bütləri, tanrıları) gördükdə: "Ey Rəbbimiz! Bunlar bizim Səndən savayı (bizi Sənə yaxınlaşdırmaq məqsədilə) ibadət etdiyimiz şəriklərimizdir!" – deyəcəklər. (Bütlər də) onlara: "Siz əsl yalançısınız! (Biz sizi Allahı tərk edib bizə tapınmağa dəvət etməmişdik!)" – deyə cavab verəcəklər.

87. (Müşriklər) o gün (günahlarını etiraf edərək) Allaha təslim olacaq, özlərindən uydurub düzəltdikləri (bütlər) də aradan çıxacaqlar!

88. Törətdikləri fitnə-fəsada görə (insanları) Allah yolundan döndərən kafirlərin əzablarının üstünə bir əzab da artıracağıq!

89. Qiyamət günü hər ümmətə özlərindən bir şahid (hər ümmətin öz peyğəmbərini) göndərəcəyik (tutacağıq). (Ya Rəsulum!) Səni də bunlara (öz ümmətinə) şahid gətirəcəyik. Biz Quranı sənə hər şeyi (dini hökmləri, halal-haramı, günahı və savabı) izah etmək üçün, müsəlmanlara (və ya Allahın vəhdaniyyətini qəbul edən bütün insanlara) da bir hidayət, mərhəmət və müjdə olaraq nazil etdik!

90. Həqiqətən, Allah (Quranda insanlara) ədalətli olmağı, yaxşılıq etməyi, qohumlara (haqqını) verməyi (kasıb qohum-əqrəbaya şəriətin vacib bildiyi tərzdə əl tutmağı) buyurar, zina etməyi, pis işlər

görməyi və zülm etməyi isə qadağan edir. (Allah) sizə düşünüb ibrət alasınız deyə, belə öyüd-nəsihət verir!

91. Əhd etdiyiniz zaman Allaha verdiyiniz əhdi yerinə yetirin. Allahı özünüzə zamin edib möhkəm and içdikdən sonra onu pozmayın. Həqiqətən, Allah nə etdiyinizi bilir!

92. Möhkəm əyirdiyi ipliyi sonradan qıran (təzədən açıb sökən) qadın kimi olmayın. Siz bir ümmət digərindən (sayca) çox olduğu üçün aranızdakı andları yalana çevirirsiniz (fitnə-fəsad aləti edirsiniz). (Bu gün bir qəbilə ilə müqavilə bağlayır, sabah daha qüvvətli, daha varlı bir qəbilə ilə rastlaşdıqda əvvəlki ilə bağladığınız müqaviləni pozub onunla sazişə girisiniz). Allah bununla yalnız sizi sınayır. O, qiyamət günü ixtilafda olduğunuz (dini) məsələləri sizə izah edəcəkdir!

93. Əgər Allah istəsəydi, sizi (eynilə dində olan) tək bir ümmət edərdi. (Allah) dilədiyini zəlalətə salar, dilədiyini isə doğru yola yönəldər. Sözsüz ki, etdiyiniz əməllərə görə sorğu-sual olunacaqsınız!

94. Aralarınızdakı andlarını yalana çevirib fitnə-fəsad aləti etməyin. Yoxsa ayağınız möhkəm olduğu ikən sürüşər (imana gəldikdən sonra ondan xaric olarsınız) və (insanları) Allah yolundan döndərdiyinizə görə (dünyada) əzabı dadarsınız. (Hələ axirətdə də) sizi dəhşətli bir əzab gözləyir! (Peyğəmbərlə əhd bağladıqdan sonra hörmət, ehtiram qazanan şəxs sözündə möhkəm durmayıb əhdini pozsa, nüfuzunu itirər və özünü fəlakətə, məhvə düçar etmiş olar).

95. Allahla bağladığınız əhdi ucuz satmayın. (Əhdi pozmadığınıza görə) Allah yanında olan (savab) sizin üçün (dünya mənfəətindən) daha yaxşıdır. Kaş biləydiniz!

96. Sizdə olan (dünya malı) tükənər, Allah dərgahında olan (axirət nemətləri) isə əbədidir. (Allah yolunda əziyyətlərə) dözənləri etdikləri yaxşı əməllərin müqabilində mükafatlandıracağıq (yaxud gördükləri yaxşı işlərin əvəzində onlara daha yaxşı mükafat verəcəyik!)!

97. Mömin olub yaxşı işlər görən (Allaha itaət edən) kişi və qadına (dünyada və axirətdə) xoş həyat nəsib edəcək və etdikləri yaxşı əməllərə görə mükafatlarını verəcəyik. (Və ya gördükləri yaxşı işlərin müqabilində onlara daha yaxşı mükafatlarını verəcəyik!)

98. (Ya Rəsulum!) Quran oxumaq istədiyin zaman məlun Şeytandan Allaha sığın! ("Əuzu billahi minəş-şeytanır-rəcim" sözlərini de!)

99. Həqiqətən, iman gətirib yalnız öz Rəbbinə təvəkkül edənlərin üzərində Şeytanın heç bir hökmü yoxdur!

100. Şeytanın hökmü yalnız ona itaət edib Allaha şərik qoşanlar üzərindədir! (İnsanların Allaha şərik qoşmalarının əsas səbəbi onların Şeytana itaət etmələri, Şeytanı özlərinə dost, havadar seçmələridir!)

101. Biz bir ayənin yerinə digər bir ayəni gətirdikdə (bir ayənin hökmünü ləğv edib onu başqası ilə əvəz etdikdə) – Allah nə nazil etdiyini (hansı hökmün bəndələri üçün daha münasib olduğunu) Özü daha yaxşı bilir – (Kafirlər Muhəmmədə): "Sən ancaq bir iftiraçısan (Allahın adından yalan uydurursan!)" – deyərlər. Xeyr! Onların əksəriyyəti (cahil olduğu üçün əsl həqiqəti, bir hökmü başqası ilə əvəz etməyin hikmətini) bilməz!

102. (Ya Rəsulum!) De: "Ruhülqüds (Cəbrail) onu (Quranı) sənin Rəbbindən iman gətirənlərə səbat vermək, müsəlmanları isə doğru yola yönəltmək və (onlara Cənnətlə) müjdə vermək üçün haqq olaraq nazil etmişdir!"

103. Biz (müşriklərin): "(Quranı) ona (Muhəmmədə) bir insan (ara-sıra görüb danışdığı Cəbr ər-Rumi adlı xaçpərəst bir gənc və ya Səlmani–Farsi) öyrədir!" – dediklərini də bilirik . Onların nəzərdə tutduqları adamın dili başqa dildir. Bu (Quranın dili) isə açıq-aşkar (bəlağətli, fəsahətli) ərəb dilidir! (Ərəblər özləri Quranın dil, üslub gözəlliyi qarşısında heyranlıqlarını, acizliklərini gizlədə bilmədikləri halda, əcəmlər bu cür fəsahətli ərəb dilini haradan bilə bilərlər?!)

104. Allahın ayələrinə inanmayanları, sözsüz ki, Allah doğru yola salmaz. Onları (axirətdə) şiddətli bir əzab gözləyir!

105. Yalanı ancaq Allahın ayələrinə inanmayanlar uydururlar. Onlar əsl yalançıdırlar!

106. Qəlbi imanla sabit olduğu halda (küfr sözünü deməyə) məcbur edilən (dil ilə deyib ürəyində onu təsdiq etməyən) şəxs istisna olmaqla, hər kəs iman gətirdikdən sonra küfr etsə (onu ağır təhlükə gözləyir). Lakin qəlbən küfrə razı olanlara (qəlbində könüllü surətdə küfrə yer verənlərə) Allahın qəzəbi tutar və onlar şiddətli bir əzaba düçar olarlar!

107. Bu (əzab) ona görədir ki, onlar dünyanı (fani dünya malını) axirətdən (axirət nemətlərindən) üstün tutarlar. Allah kafirləri doğru yola salmaz!

108. Bunlar o kəslərdir ki, Allah onların qəlblərini, qulaqlarını və gözlərini möhürləmişdir. Onlar (Allahın kafirlər üçün hazırladığı əzabdan) qafildirlər!

109. Şübhəsiz ki, axirətdə ziyana uğrayanlar da onlardır!

110. Fitnəyə məruz qaldıqdan sonra hicrət edənləri, daha sonra cihad edib (bu yolda hər cür əzab-əziyyətə) səbr edənləri isə (bütün) bunlardan sonra Rəbbin, şübhəsiz ki, bağışlayandır, (onlara) rəhm edəndir!

111. O gün (qiyamət günü) hər kəs öz canının hayında olar, hər kəsə əməlinin əvəzi (cəzası) verilər və onlara heç bir haqsızlıq edilməz!

112. Allah bir şəhəri (Məkkəni) misal gətirir. O şəhər əmin-amanlıq və arxayınlıq içində idi. Lakin (əhalisi) Allahın nemətini inkar etdi, Allah da həmin şəhərə (sakinlərinin) etdikləri əməllərə görə (yeddi il) aclıq və qorxu bəlası daddırdı.

113. Onlara özlərindən bir peyğəmbər gəlmişdi. Onlar onu yalançı saydılar, buna görə də əzab (Bədr müharibəsi) onları zülm edərkən (zülm etdikləri zaman) yaxaladı.

114. Allahın sizə verdiyi halal və pak ruzilərdən yeyin. Əgər Allaha ibadət edirsinizsə, Onun nemətinə şükür edin!

115. Allah sizə ancaq ölü heyvanı, qanı, donuz ətini və Allahın adı çəkilmədən (bismillah deyilmədən) kəsilmiş heyvanı haram buyurmuşdur. (Özgənin malına əl uzatmamaq şərtilə) başqa bir şey tapa bilməyib zəruri ehtiyacını ödəyəcək qədər bunlardan yeməyə məcbur olan şəxsə (günah yazılmaz). Çünki Allah (bəndələrini) bağışlayandır, rəhm edəndir!

116. Diliniz (bizə belə əmr edildiyi deyə) yalana vərdiş etdiyi üçün (dəlilsiz-sübutsuz): “Bu halaldır, o haramdır!” – deməyin, çünki (bununla) Allaha iftira yaxmış olursunuz. Allaha iftira yaxanlar (axirət əzabından) nicat tapmazlar!

117. (Onlar üçün dünyada) az bir mənfəət vardır, (axirətdə isə) onları şiddətli bir əzab gözləyir!

118. Yəhudilərə haram etdiyimiz şeyləri daha əvvəl sənə xəbər vermişdik. Biz (bunları haram buyurmaqla) onlara zülm etmədik. Onlar (günah işlər görməklə) özləri özlərinə zülm edirdilər. (Buna görə də Allah bir çox nemətləri onlara haram buyurdu).

119. Sonra (bil ki) Rəbbin cahillikləri üzündən pis iş görən (Allaha şərik qoşan), ondan sonra tövbə edib özlərini islan edən kimsələri (əfv edər). Həqiqətən, Rəbbin (tövbədən) sonra (bəndələrini) bağışlayandır, rəhm edəndir!

120. Həqiqətən, İbrahim Allaha müti, batildən haqqa tapınan bir imam (rəhbər) idi. O heç vaxt müşriklərdən olmamışdı. (Və ya: İbrahim özü bir ümmət idi. Bir ümmətə xas olan bütün yaxşı cəhətlər, gözəl xüsusiyyətlər onda cəmlənmişdi).

121. O, (Allahın) nemətlərinə şükür edən idi. (Allah da) onu (sədaqətinə, səmimiliyinə görə peyğəmbərlik üçün) seçmiş və düz yola yönəltmişdi.

122. Biz ona dünyada gözəl nemət (peyğəmbərlik, hamı tərəfindən sevilib hörmət olunmaq) bəxş etdik. Şübhəsiz ki, o, axirətdə də (ən yüksək dərəcələrə nail olacaq) salehlərdəndir!

123. Sonra (Ya Rəsulum!) sənə: “Batildən haqqa dönərək müşriklərdən olmayan İbrahimin dininə tabe ol!” – deyə vəhy etdik.

124. Şənbə günü (ibadət etmək) ancaq onun barəsində ixtilafda olanlara (ibadət və istirahət günümüz cümə deyil, şənbə olsun deyə, mübahisə edən yəhudilərə) vacib edildi. Həqiqətən, Rəbbin qiyamət günü ixtilafda olduqları məsələlər barəsində onların arasında hökm verəcəkdir.

125. (Ya Rəsulum!) İnsanları hikmətlə (Quranla, tutarlı dəlillərlə), gözəl öyüd-nəsihət (moizə) ilə Rəbbinin yoluna (islama) dəvət et, onlarla ən gözəl surətdə (şirin dillə, mehribanlıqla, əqli səviyyələrinə müvafiq şəkildə) mübahisə et. Həqiqətən, Rəbbin yolundan azanları da, doğru yolda olanları da daha yaxşı tanıyır!

126. (Ey möminlər! İntiqam almaq məqsədilə birinə) cəza verəcək olsanız, sizə nə cəza verilibsə, eynilə həmin cəzanı verin. (Artıq cəza

isə zülm etməkdir ki, bu da günahdır). Əgər (onlardan intiqam almayıb) səbr etsəniz, bu, səbr edənlər üçün daha xeyirlidir. (Əfv etmək, rəhm göstərmək savab qazanmağa çox gözəl vəsilə olduğu üçün, sözsüz ki, qisas almaqdan daha üstündür).

127. (Ya Rəsulum! Allah yolunda olan bütün əzab-əziyyətə) səbr et. Sənin səbr etməyin yalnız Allahın köməyilədir. (Dəvətini qəbul etmədiklərinə, iman gətirmədiklərinə görə) onlardan (müşriklərdən) ötrü kədərlənmə və (səni öldürmək məqsədilə) qurduqları hiylələrə görə də ürəyini qısma!

128. Həqiqətən, Allah Ondan qorxub pis əməllərdən çəkinənlər və yaxşı işlər görənlərlədir!

## .17.
## əl-İsra (Gecə vaxtı seyr) və ya Bəni–İsrail (İsrail oğulları) surəsi

**(Məkkədə nazil olmuşdur, 111 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Bəzi ayələrimizi (qüdrətimizə dəlalət edən qəribəlikləri və əcaiblikləri) göstərmək üçün bəndəsini (Peyğəmbər əleyhissəlamı) bir gecə (Məkkədəki) Məscidülhəramdan ətrafını mübarək etdiyimiz (bərəkət verdiyimiz) Məscidüləqsaya (Beytülmüqəddəsə) aparan Allah pak və müqəddəsdir. O, doğrudan da, (hər şeyi) eşidəndir, görəndir!

2. Biz Musaya kitab (Tövrat) verdik və: “Məndən başqa heç bir vəkil tutmayın (və ya tanrı qəbul etməyin)” – deyə, onu İsrail oğullarına (haqq yolu göstərən) bir rəhbər təyin etdik.

3. Ey Nuhla birlikdə (gəmiyə) mindirib apardığımız (tufandan xilas etdiyimiz) kəslərin nəsli! Həqiqətən, o (Nuh Allahın nemətlərinə) çox şükür edən bir bəndə idi!

4. Biz İsrail oğullarına kitabda (Tövratda): “Siz yer üzündə (Zəkəriyyanı, sonra da Yəhyanı öldürməklə) iki dəfə fitnə-fəsad törədəcək və çox dikbaşlıq (yaxud zülm) edəcəksiniz!” – deyə bildirdik.

5. Onlardan (o fitnə-fəsadın) birincisinin (cəza) vaxtı gələndə üstünüzə çox güclü qullarımızı (Büxtünəssəri, yaxud Calutu orduları ilə birlikdə) göndərdik. Onlar (sizi öldürmək, əsir almaq və qarət etmək üçün) evlərinizin arasında gəzib dolaşırdılar (sizi təqib edirdilər). Bu vəd artıq yerinə yetirildi. (Siz Zəkəriyyanı öldürdünüz, onlar da sizi qətl edib, əsir alıb, yurdunuzu xaraba qoydular).

6. (Bundan) sonra sizə onların üzərində təkrar zəfər çaldırdıq, (yenidən) var-dövlət, oğul-uşaq verməklə kömək göstərdik və sayca sizi (əvvəl olduğunuzdan və ya düşmənlərinizdən) daha çox etdik.

7. Yaxşılıq da etsəniz, özünüzə etmiş olursunuz, pislik də! İkinci fitnə-fəsadınızın (cəza) vaxtı gəldikdə üzünüzü qara (sizi xəcil) etmək, məscidə (Məscidüləqsaya) birinci dəfə girdikləri kimi girmək və ələ keçirtdikləri hər şeyi büsbütün məhv etmək üçün (fars və rum padşahlarını) üstünüzə göndərdik. (Siz Yəhyanı öldürdünüz, onlar da əvəzində sizi qətl edib, məbədinizi dağıdıb, yurdunuzu viran qoydular).

8. (Tövbə edəcəyiniz təqdirdə) ola bilsin ki, Rəbbiniz sizə rəhm etsin! Əgər siz (yenidən yaramaz əməllərinizə) qayıtsanız, Biz də (sizi yenidən cəzalandırmağa) qayıdarıq. Biz Cəhənnəmi kafirlərdən ötrü bir zindan etdik.

9. Həqiqətən, bu Quran (bütün bəşəriyyəti) ən doğru yola (islama) yönəldir, yaxşı işlər görən möminlərə böyük bir mükafata nail olacaqları ilə müjdə verir!

10. Axirətə inanmayanlar üçün isə şiddətli bir əzab hazırlamışıq!

11. İnsan (özünə) xeyir-dua etdiyi kimi, bəd dua da edər. (Adamın hirsi tutduqda özünə, yaxud övladına bəd dua edər. Əgər Allah həmin şəxsin duasını qəbul etsə, dərhal onun özünü, yaxud övladını məhv etməlidir. Lakin Allah səbirlidir, bəndələrinə əzab verməkdə tələsməz). İnsan (hər şeydə) tələskəndir (gördüyü işin aqibətini düşünməyə hövsələsi çatmaz).

12. Biz gecə və gündüzü (qüdrətimizə dəlalət edən) iki əlamət müəyyən etdik. Rəbbinizdən ruzi diləməniz, illərin sayını və hesabı (vaxt ölçülərini) bilməyiniz üçün gecənin əlamətini (qaranlığı) silib (yerinə) gündüzün işıqlı (görünən) əlamətini gətirdik. Biz (ehtiyac hiss etdiyiniz) hər şeyi (Quranda) müfəssəl izah etdik.

13. Biz hər bir insanın əməlini öz boynundan asar və qiyamət günü (bütün əməllərini) açıq kitab kimi qarşısına qoyarıq.

14. (Və ona belə deyərik: ) "Oxu, kitabını (əməl dəftərini). Bu gün sən haqq-hesab çəkməyə özün-özünə (özün öz əməllərinin şahidi olmağa) kifayətsən!"

15. Doğru yol tutan yalnız özünə xeyir, haqq yoldan azan da ancaq özünə zərər edər. Heç bir günahkar başqasının günahını daşımaz. (Hərə öz günahına cavabdehdir). Biz, peyğəmbər göndərməmiş (heç bir ümmətə) əzab verməmərik!

16. Biz bir məmləkəti məhv etmək istədikdə (peyğəmbərlərin dili ilə) onun naz-nemət içində yaşayan başçılarına (Allaha itaət etməyi, iman gətirməyi) əmr edərik. Lakin onlar (Allaha asi olub) pis-pis işlər törədərlər. Beləliklə, (o məmləkətə əzab verilməsi haqqındakı) hökm vacib olar və onu yerlə yeksan edərik.

17. Biz Nuhdan sonra neçə-neçə ümmətləri (nəsilləri) məhv etdik. (Ya Rəsulum!) Rəbbinin öz qullarının günahlarını bilməsi, görməsi (onlara cəza vermək üçün) kifayət edər.

18. Hər kəs fani dünyanı istəsə, dilədiyimiz şəxsə istədiyimiz neməti orada tezliklə verərik. Sonra isə (axirətdə) ona Cəhənnəmi məskən edərik. O, (Cəhənnəmə) qınanmış, (Allahın mərhəmətindən) qovulmuş bir vəziyyətdə daxil olar!

19. Mömin olub axirəti istəyən və onun uğrunda (can-başla) çalışanların zəhməti (Allah dərgahında) qəbul olunar.

20. Onların və bunların hər birinə Rəbbinin nemətindən verərik. Rəbbinin neməti (istər dünyada, istərsə də axirətdə heç kəsə) qadağan deyildir.

21. (Ya Peyğəmbərim!) Bir gör (var-dövlət, cah-cəlal baxımından dünyada) onların birini digərindən necə üstün tutduq? Axirətdə isə (dünyadakından) daha yüksək dərəcələr, daha böyük üstünlüklər vardır!

22. Allahla yanaşı başqa tanrı qəbul etmə. Yoxsa xar olar, zəlil vəziyyətə düşərsən!

23. Rəbbin yalnız Ona ibadət etməyi və valideynlərə yaxşılıq etməyi (onlara yaxşı baxıb gözəl davranmağı) buyurmuşdur. Əgər onların biri və ya hər ikisi sənin yanında (yaşayıb) qocalığın ən düşkün çağına yetərsə, onlara: “Uf!” belə demə, üstlərinə qışqırıb acı söz söyləmə. Onlarla xoş danış!

24. Onların hər ikisinə acıyaraq mərhəmət qanadının altına salıb: “Ey Rəbbim! Onlar məni körpəliyimdən (nəvazişlə) tərbiyə edib bəslədikləri kimi, Sən də onlara rəhm et!” – de.

25. Rəbbiniz ürəklərinizdə olanları (qəlblərinizin sirlərini) ən yaxşı biləndir. Əgər əməlisaleh olsanız (ata-ananıza bilmədən etdiyiniz pislikdən peşman olub tövbə etsəniz və bundan sonra onlarla yaxşı davransanız, bilin ki) Rəbbiniz, həqiqətən, tövbəkarları bağışlayandır!

26. Qohum-əqrəbaya da, miskinə də, (pulu qurtarıb yolda qalan) müsafirə də haqqını ver. Eyni zamanda (mal-dövlətini əbəs yerə) sağa-sola da səpələmə!

27. Həqiqətən, (malını əbəs yerə) sağa-sola səpələyənlər şeytanların qardaşlarıdır. Şeytan isə Rəbbinə qarşı nankordur!

28. Əgər Rəbbindən dilədiyin bir mərhəməti (ruzini) gözləmək məqsədilə onlardan (kömək göstərilməsi lazım olan şəxslərdən) üz çevirməli olsan (onlara bir şeylə kömək etmək istəsən, lakin imkanın olmadığı üçün bacarmasan və buna görə də məcburiyyət qarşısında qalıb gözlərinə görünmək istəməsən), heç olmasa, onlara ("Darıxmayın, Allah mənə ruzi bəxş edər, mən də sizə verərəm!" kimi) xoş bir söz de!

29. Nə əldən çox bərk ol, nə də əlini tamamilə açıb israfçılıq et. Yoxsa həm qınanarsan, həm də peşman olarsan!

30. Həqiqətən, Rəbbin istədiyi şəxsin ruzisini artırar da, azaldar da. Doğrudan da, O Öz bəndələrinin halından xəbərdardır, (hər şeyi) görəndir!

31. Yoxsulluqdan qorxub (Cahiliyyət dövründə olduğu kimi) övladlarınızı (xüsusilə, qız uşaqlarını) öldürməyin. Biz onların da, sizin də ruzinizi veririk. Onları öldürmək, həqiqətən, böyük günahdır!

32. Zinaya da yaxın düşməyin. Çünki o, çox çirkin bir əməl və pis bir yoldur!

33. Allahın haram buyurduğu cana haqsız yerə qəsd etməyin. (Onu yalnız və yalnız böyük bir günah işlədikdə, məsələn, iman gətirdikdən sonra küfrə düşdükdə, yaxud zinakarlıq etdikdə öldürmək olar). Haqsız yerə öldürülən məzlum bir şəxsin sahibinə (və ya varisinə qatil barəsində) bir ixtiyar verdik (istəsə, qatildən qisas alar,

istəsə, bağışlayar və ya qanbahası tələb edər). Lakin o da qətl etməkdə ifrata varmasın (qisas almalı olsa, yalnız qatili öldürməklə kifayətlənsin)! Çünki (şəriətin bü hökmləri ilə) ona artıq kömək olunmuşdur.

34. Yaxşı niyyət istisna olmaqla, yetimin malına həddi-buluğa çatana qədər yaxın düşməyin. (Bu mala ancaq onu qorumaq, artırıb çoxaltmaq və yetimin öz xeyrinə istifadə etmək məqsədilə əl vurmaq olar). Əhdə vəfa edin. Çünki (insan) əhd barəsində (qiyamət günü) cavabdehdir. (İnsan verdiyi əhdi yerinə yetirib-yetirmədiyi haqda sorğu-suala tutulacaqdır).

35. Ölçəndə ölçüdə düz olun, (çəkəndə) düzgün tərəzi ilə çəkin. Bu (sizin üçün) daha xeyirli və nəticə etibarilə daha yaxşıdır!

36. (Ey insan!) Bilmədiyin bir şeyin ardınca getmə (bacarmadığın bir işi görmə, bilmədiyin bir sözü də demə). Çünki qular, göz və ürək bunların hamısı (sahibinin etdiyi əməl, dediyi söz barəsində) sorğu-sual olunacaqdır.

37. Yer üzündə təkəbbürlə gəzib dolanma. Çünki sən nə yeri yara bilər, nə də (boyca) yüksəlib dağlara çata bilərsən

38. Bütün bunlar Rəbbinin dərgahında bəyənilməyən (məkruh), pis şeylərdir.

39. (Ya Rəsulum!) Bunlar Rəbbinin sənə vəhy etdiyi hikmətlərdəndir. Allahla yanaşı başqa tanrı qəbul etmə, yoxsa qınanmış və (Allahın mərhəmətindən) kənar edilmiş bir halda Cəhənnəmə atılarsan!

40. (Ey: “Mələklər Allahın qızlarıdır!” – deyən müşriklər!) Məgər Rəbbiniz oğlanları sizin üçün seçib, özü üçün mələklərdən qızlarımı (övladlığa) götürdü?! Həqiqətən, (özünüzə rəva bilmədiyiniz şeyi Allaha isnad etməklə) böyük-böyük danışırsınız!

41. İnsanlar düşünüb ibrət alsınlar deyə, Biz bu Quranda (Allahın vəhdaniyyət əqidəsini cürbəcür dəlillərlə, müxtəlif misallarla) izah etdik. Lakin (bu izahat) onların yalnız nifrətini artırdı (islamdan daha çox üz döndərdilər).

42. (Ya Rəsulum!) De: "Əgər Allahla yanaşı, (müşriklərin) dedikləri kimi, tanrılar olsa idi, onlar ərş sahibinə (yaxın düşmək, yaxud onunla vuruşmaq üçün) bir yol axtarardılar".

43. Allah onların dediklərindən çox uca (pak) və çox yüksəkdir!

44. Yeddi göy, yer və onlarda olanlar (bütün məxluqat) Allahı təqdis edir. Elə bir şey yoxdur ki, Allaha tərif deyib Ona şükür etməsin, lakin siz onların (dillərini bilmədiyiniz üçün) təqdisini anlamazsınız. (Allah) həqiqətən, həlimdir, bağışlayandır!

45. (Ya Rəsulum!) Sən Quran oxuduğun zaman səninlə axirətə inanmayanların arasına görünməz bir pərdə çəkərik (Onlar səni görməz və sənə heç bir xətər yetirə bilməzlər)

46. (Quranı) anlamasınlar deyə, onların qəlblərinə pərdə çəkib qulaqlarına əngəl qoyduq (kar etdik). Sən Quranda Rəbbini bir tək tanrı olaraq andığın zaman onlar nifrət əlaməti olaraq arxalarını çevirib gedərlər.

47. (Sən Quran oxuyanda) onlar sənə qulaq asdıqları zaman nəyi dinlədiklərini və zalımların (Dərünnədvədə) öz aralarında gizli-gizli danışıb: "Siz ancaq ovsunlanmış bir adama uyursunuz!" – dediklərini də bilirik.

48. Bir gör (müşriklər) səni kimlərə bənzətdilər (sənə şair, kahin, sehrbaz, məcnun, divanə və s. dedilər)! Onlar yoldan azdılar və bir daha doğru yolu tapa bilməzlər!

49. Onlar: “Biz sür-sümük, çürüyüb ovxalanmış torpaq olduğumuz halda, dirildilib yeni məxluqmu olacağıq?” – deyirlər.

50. (Ya Rəsulum!) De: “(İstər) daş olun, yaxud dəmir!

51. Və ya ürəyinizdə (özünüzü dağlar, göylər kimi) böyük bir məxluq bilin! (Yenə diriləcəksiniz!)”. Onlar deyəcəklər: “O halda bizi kim (yenidən dirildib həyata) qaytaracaqdır?” (Ya Rəsulum!) De: “İlk dəfə sizi yoxdan yaradan (Allah)!” Onlar (istehza ilə) sənə başlarını bulayıb: “Bu nə vaxt olacaqdır?” – deyə soruşacaqlar. De: “Bəlkə də, bu yaxın zamanda!”

52. O gün ki, Allah sizi (haqq-hesab üçün öz hüzuruna) çağıracaqdır. Siz də Ona (itaətlə yanaşı) şükür edərək (qəbirlərinizdən) dərhal çağırışına cavab verəcəksiniz və sizə elə gələcəkdir ki, (dünyada) çox az qaldınız!

53. (Ya Rəsulum!) Bəndələrimə de: “(Danışdıqları zaman “la ilahə illallah; yərhəmukəllah; yəğfiru ləkəllah” kimi) gözəl sözlər söyləsinlər (və ya müşrikləri imana dəvət edərkən onlarla xoş danışsınlar!)” Şeytan onların arasına fitnə-fəsad sala bilər. Həqiqətən, Şeytan insanın açıq-aşkar düşmənidir!

54. Rəbbiniz sizi daha yaxşı tanıyar (kimin mömin, kimin kafir olduğunu çox gözəl bilir). İstəsə, sizə rəhm edər, istəsə, əzab verər. Biz səni onlara vəkil göndərməmişik. (Sənin vəzifən yalnız islamı təbliğ etməkdir).

55. (Ya Rəsulum!) Rəbbin göylərdə və yerdə olanları (Özünün bütün yaratdıqlarını) çox gözəl tanıyır. Biz peyğəmbərlərin bəzisini digərlərindən üstün etdik və Davuda Zəbur verdik.

56. De: “(Allahdan) başqa tanrı güman etdiklərinizi (köməyə) çağırın. Onlar sizi nə möhnətdən qorumağa, nə də onu dəyişməyə (sizdən sovuşdurub başqasına tərəf yönəltməyə) qadir deyillər!”

57. Onların tapındıqları tanrıların özlərindən hər hansı biri (Allah dərgahına) daha yaxın olsun deyə, Rəbbinə vəsilə axtarır, Onun rəhmətini umur, əzabından qorxur. Həqiqətən, Rəbbinin əzabı qorxuludur!

58. Elə bir məmləkət yoxdur ki, qiyamət günündən əvvəl Biz onun əhalisini məhv etməyək və ya onu şiddətli əzaba düçar etməyək. Bu, kitabda (lövhi-məhfuzda) yazılmışdır!

59. Bizə möcüzələr göndərməyə mane olan şey ancaq əvvəlkilərin (keçmiş ümmətlərin) onları yalan hesab etmələridir. Biz Səmud tayfasına açıq-aşkar bir möcüzə olaraq dişi (maya) bir dəvə verdik, lakin onlar ona zülm etdilər (dəvəni tutub kəsdilər). Biz möcüzələri yalnız (bəndələrimizi) qorxutmaq üçün göndəririk.

60. (Ya Rəsulum!) Yadına sal ki, bir zaman sənə: "Rəbbin (Öz əzəli elmi və qüdrəti ilə) insanları ehtiva etmişdir (onların ixtiyarı Allahın əlində olduğu üçün sənə heç bir şey edə bilməzlər!)"–demişdik. (İsra gecəsi) sənə göstərdiyimiz mənzərəni və Quranda lənətlənmiş (Cəhənnəmdəki zəqqum adlı) ağacı insanlar (Məkkə əhli) üçün yalnız bir imtahan etdik (görək sənin sözünə inanacaqlar, ya yox). Biz onları qorxuduruq, lakin bu qorxutmaq onların tüğyanını artırmaqdan başqa bir şeyə kara gəlmir!

61. Yenə yadına sal ki, bir zaman mələklərə: "Adəmə səcdə edin!" – deyə əmr etmişdik. İblisdən başqa hamısı səcdə etmişdi. (İblis: ) "Sənin palçıqdan yaratdığına mən səcdə edərəmmi?!" – demişdi.

62. (İblis) həmçinin: "(Pərvərdigara!) Bir de görək (məni oddan, bu Adəmi torpaqdan yaratdığın halda) nə üçün onu məndən üstün tutdun? Əgər (məni öldürməyib) qiyamət gününə qədər mənə möhlət versən, az bir qismi istisna olmaqla, onun nəslini öz hökmüm altına alaram (və ya yoldan çıxarıb kökünü kəsərəm)".

63. (Allah) buyurdu: “Çıx get! (Sənə qiyamətə qədər möhlət verdim!) Onlardan hər kəs sənə uysa, (bil ki) cəzanız Cəhənnəmdir. Özü də tamam-kamal bir cəza!

64. Onlardan kimi bacarırsansa, səsinlə (vəsvəsənlə) yerindən oynat, atlı və piyadanı onlara qarşı səfərbər et, (onları harama, ziyana sövq etməklə) mallarına və övladlarına ortaq ol, onlara cürbəcür (yalan) vədlər ver. Şeytan (ona uyanlara) yalnız yalan vəd verər!

65. Doğrusu, Mənim (mömin) bəndələrim üzərində sənin heç bir hökmün ola bilməz. Rəbbinin vəkil olması (sənin şərindən və vəsvəsəndən onları qoruması) kifayət edər!”

66. Sizin üçün (bol) nemətindən özünüzə ruzi axtarmaq (qazanmaq) məqsədilə dənizdə gəmiləri hərəkətə gətirən məhz Rəbbinizdir! Həqiqətən, Rəbbiniz sizə qarşı rəhmlidir!

67. Sizə dənizdə bir çətinlik (batmaq təhlükəsi) üz verdiyi zaman (Allahdan) qeyri ibadət etdiyiniz bütlər qeyb olar. Lakin O sizi xilas edib quruya çıxartdıqda (itaətindən) üz döndərirsiniz. İnsan nankordur!

68. Məgər (Allahın) quruda sizi yerə batırmayacağına, yaxud (göydən) başınıza daş yağdırmayacağına əminsinizmi?! Sonra heç sizi qoruyan da tapılmaz (tapa bilməzsiniz).

69. Yoxsa (Allahın) bir də sizi dənizə qaytarmayacağına, şiddətli bir fırtına göndərib sizi batırmayacağına arxayınsınız? Sonra sizdən ötrü Bizdən intiqam alacaq (və ya Bizə qarşı sizə kömək edəcək) bir kəs də tapa bilməzsiniz.

70. Biz, Adəm övladını şərəfli və hörmətli elədik, onları suda və quruda (gəmilərə, heyvanlara və başqa nəqliyyat vasitələrinə) mindirib sahib etdik, özlərinə (cürbəcür nemətlərdən) təmiz ruzi verdik və onları yaratdığımız məxluqatın çoxundan xeyli üstün etdik.

(İnsan şüur, nitq qabiliyyəti, gözəl surət, boy-buxun, əllə yemək və s. bu kimi məziyyətlərinə görə həmişə Allaha şükür edib yalnız Ona tapınmalı, Rəbbinə heç bir şərik qoşmamalıdır!)

71. Bir gün (qiyamət günü) bütün insanları öz imamları (ardınca getdikləri rəhbərləri, yaxud peyğəmbərləri və ya əməl dəftərləri) ilə birlikdə (hüzurumuza) çağıracağıq. Əməl dəftərləri sağ əllərinə verilənlər onu oxuyar (şad olarlar). Onlara tük (xurma çərdəyinin yarığındakı tel) qədər haqsızlıq edilməz.

72. Bu dünyada (Allahın dəlillərini, möcüzələrini görməyib gözü və qəlbi) kor olan axirətdə də kor olar və (haqq) yoldan daha çox azar!

73. (Ya Rəsulum! Qurandan) qeyri bir şeyi yalandan Bizə istinad edəsən (iftira yaxasan) deyə, (müşriklər) səni hardasa o sənə vəhy etdiyimizdən sapdıracaqdılar. Belə olacağı təqdirdə, səni, sözsüz ki, özlərinə dost tutacaqdırlar.

74. Əgər Biz sənə səbat verməsəydik, yəqin ki, az da olsa, onlara uyacaqdın!

75. (Belə olacağı təqdirdə) sənə həyatın və ölümün ikiqat əzabını daddırardıq. Sonra Bizə qarşı özünə bir yardım edən də tapa bilməzsən. (Heç kəs səni əzabımızdan qurtara bilməz).

76. (Müşriklər) səni oradan (Məkkədən) çıxartmaq üçün az qalmışdı ki, səni o yerdə fitnəyə salsınlar (narahat eləsinlər, dünyanı başına dar etsinlər). Əgər onlar belə etsəydilər, səndən sonra (Məkkədə) yalnız az bir müddət qala bilərdilər.

77. Səndən əvvəl göndərdiyimiz peyğəmbərlər barəsindəki qayda-qanuna müvafiq olaraq. (Onların dövründə də belə etmişdik). Sən Bizim qayda-qanunumuzda heç bir dəyişiklik tapa bilməzsən! (Səndən əvvəlki ümmətlər öz peyğəmbərlərinə əziyyət verib ölkələrindən qovan kimi onlara əzab göndərər, hamısını məhv

edərdik. Əgər Məkkə müşrikləri belə etsəydilər, həmin müsibət onların da başına gələcəkdi).

78. Günortadan (gün batmağa meyl edəndən) gecənin qaranlığınadək namaz (günorta, ikindi, axşam və gecə namazları) qıl. Sübh namazını da qıl. Çünki sübh namazı (gecə və gündüz mələkləri, həmçinin bir çox insan tərəfindən) müşahidə olunur.

79. (Ya Rəsulum!) Gecənin bir vaxtı durub ancaq sənə xas olan əlavə (təhəccüd) namazı qıl. Ola bilsin ki, Rəbbin səni (qiyamət günü hamı tərəfindən) bəyənilib təriflənən bir məqama (axirətdə ən böyük şəfaət məqamına) göndərsin!

80. De: "Ey Rəbbim! Məni daxil edəcəyin yerə (Mədinəyə) xoşluqla daxil et, məni çıxaracağın yerdən (Məkkədən) də xoşluqla çıxart. Öz dərgahından mənə kömək edə bilən bir dəlil ver!" (Mənə elə bir qüdrət ver ki, müşriklər və kafirlər həmişə onun qarşısında aciz qalsınlar!)

81. De: "Haqq (islam) gəldi, batil (şirk və küfr) yox oldu. Çünki batil (öz-özlüyündə) yoxluğa (heçliyə) məhkumdur!"

82. Biz Qurandan möminlər üçün şəfa və mərhəmət olan ayələr nazil edirik. O, zalımların (kafirlərin) ancaq ziyanını artırır.

83. İnsana bir nemət (sağlamlıq, var-dövlət) verdiyimiz zaman (Bizdən) üz çevirib uzaq gəzər. Ona bir pislik üz verdikdə isə məyus olar!

84. De: "Hərə öz qabiliyyətinə (xislətinə) görə iş görər. Rəbbin kimin daha doğru yolda olduğunu daha yaxşı bilir!"

85. (Ya Rəsulum!) Səndən ruh (ruhun mahiyyəti və keyfiyyəti) haqqında soruşarlar. De: "Ruh Rəbbimin əmrindədir. (Allahın əmri

ilə yaradılmışdır). Sizə (bu barədə) yalnız cüzi (az) bir bilik verilmişdir!”

86. Əgər istəsəydik, sənə vəhy etdiyimizi (qəlbindən) çıxardıb aparardıq. Sonra Bizə qarşı özün üçün bir müdafiəçi (vəkil) də tapa bilməzdin. (Əgər Biz Quranı sənə unutdursaq, yenidən heç kəs onu sənin yadına sala bilməz).

87. Lakin (bunu etməməyimiz) Rəbbinin yalnız sənə qarşı bir mərhəmətidir. Həqiqətən, Onun sənə olan neməti böyükdür!

88. (Ya Peyğəmbərim!) De: “Əgər insanlar və cinlər bir yerə yığışıb bu Qurana bənzər bir şey gətirmək üçün bir-birinə kömək etsələr, yenə də ona bənzərini gətirə bilməzlər”.

89. Biz bu Quranda insanlar üçün hər cür məsəl çəkib (mənasını) onlara izah etdik. Lakin onların (Məkkə əhlinin) əksəriyyəti küfrdən başqa bir şeyə razı olmadı (nemətimizə nankor olub yalnız küfrü seçdi).

90. (Quranın əzəməti, fəsahət və bəlağəti qarşısında aciz qalan, lakin özlərini sındırmayan müşriklər) belə dedilər: “Bizə yerdən (Məkkədən) bir bulaq çıxarmayınca sənə iman gətirməyəcəyik.

91. Yaxud (ağacları) arasında şırıl-şırıl irmaqlar axan xurma və üzüm bağın olmayınca;

92. Yaxud, iddia etdiyin kimi, göyü parça-parça edib başımıza endirməyincə, yaxud Allahı və mələkləri (peyğəmbərliyinin doğruluğuna şahid olaraq) açıq-aşkar qarşımıza gətirməyincə;

93. Və ya qızıldan bir evin olmayınca, yaxud sən göyə qalxmayınca (biz sənə iman gətirməyəcəyik). Əgər bizə (səmadan) oxuyacağımız bir kitab endirməsən, göyə qalxmağına da əsla inanmayacağıq!” (Ya Rəsulum!) De: “Rəbbim pakdır, müqəddəsdir! (Allah gedib-gəlmək,

enib-qalxmaq kimi məxluqata aid olan xüsusiyyətlərdən uzaqdır!) Mən isə yalnız peyğəmbər olan bir insanam!" (Allahın izni olmayınca, heç bir peyğəmbər sizin dediklərinizi yerinə yetirməyə qadir deyildir!)

94. (Qüreyş müşrikləri kimi) insanlara doğru yolu göstərən bir rəhbər gəldiyi zaman ona iman gətirməyə mane olan şey yalnız onların: "Allah bir insanımı peyğəmbər göndərdi?" – deməleridir. (Müşriklərin fikrincə, peyğəmbər bəşərdən deyil, mələklərdən göndərilməlidir).

95. (Ya Rəsulum!) De: "Əgər yer üzündə (siz insanlar kimi) arxayın gəzib dolaşanlar mələklər olsaydı (yer üzünün əhalisi mələklərdən ibarət olsaydı), sözsüz ki, onlara bir mələk peyğəmbər göndərərdik!"

96. De: "Mənimlə sizin aranızda təkcə Allahın (peyğəmbərliyimin həqiqiliyinə) şahid olması kifayət edir. Şübhəsiz ki, O, bəndələrindən (bəndələrinin bütün əməllərindən) xəbərdardır, (onların gizlində və aşkarda nələr etdiyini) görəndir!"

97. Allahın doğru yola saldığı kəs doğru yoldadır. Allahın yoldan çıxartdığı kəs üçünsə (Allahdan) başqa dostlar tapa bilməzsən. Biz qiyamət günü onları üzü üstə sürünə-sürünə, kor, lal və kar kimi məhşər ayağına çəkəcəyik. Onların düşəcəkləri yer Cəhənnəmdir. Cəhənnəm odu azaldıqca onların (bədənlərinin) alovunu artıracağıq!

98. Bu, ayələrimizi inkar etdiklərinə və: "Sür-sümük, çürüyüb ovxalanmış torpaq olduğumuz halda, biz dirildilib yeni bir məxluqmu olacağıq?" – dediklərinə görə onların cəzasıdır.

99. Məgər onlar (öləndən sonra bir daha diriləcəklərini inkar edənlər bu böyüklükdə) göyləri və yeri (yoxdan) yaradan Allahın (bu kiçiklikdə) onlar kimisini (yenidən, eynilə) yaratmağa qadir olduğunu görmürlərmi?! Allah onlar üçün bir əcəl (ölüm, yaxud

əzaba düçar olma vaxtı) müəyyən etdi ki, ona heç bir şəkk-şübhə yoxdur. Zalımlar (belə bir vəziyyətdə də) ancaq öz küfrlərində israr edib dururlar (küfrdən başqa bir şeyə razı olmurlar).

100. (Ya Peyğəmbərim, müşriklərə) de: “Əgər siz Rəbbimin rəhmət xəzinələrinə (var-dövlətinə) sahib olsaydınız, yenə də (onun) xərclənib tükənməsindən (sonra da sizə yoxsulluq üz verməsindən) qorxaraq xəsislik edərdiniz. İnsan (nə qədər varlı olsa da, təbiəti etibarilə) xəsisdir!

101. Biz Musaya doqquz aşkar möcüzə (əsa, günəş kimi parlayan yədi-beyza, çəyirtkə və digər həşərat, qurbağa, qan, qıtlıq, daşların arasından fəvvarə verib çıxan su, dənizin yarılması və Tur dağının qaldırılıb İsrail oğullarının başları üstündə saxlanılması) verdik. İsrail oğullarından soruş: (Musa) onların yanına gəldikdə, Firon ona: “Ya Musa! Mənə elə gəlir ki, sən ovsunlanmışsan (ağlın başında deyildir)”, - demişdi.

102. (Musa da) ona: “Sən bunları məhz göylərin və yerin Rəbbi tərəfindən açıq-aşkar möcüzə olaraq endirildiyini, sözsüz ki, bilirsən. Mən isə, ey Firon, səni (küfrə düşdüyünə görə) artıq məhv olmuş zənn edirəm!” – deyə cavab vermişdi.

103. (Firon) onları (Misir) torpağından qovub çıxartmaq istədi. Biz isə onu (Fironu) və onunla birlikdə olanların hamısını (suya) qərq etdik.

104. Və bundan sonra İsrail oğullarına dedik: “Siz (Şam) ərazisində sakin olun. Axirət vədəsi (qiyamət) gəlib çatdıqda sizin hamınızı (sizi və Firon əhlini, yaxud möminləri və kafirləri) birlikdə (bir-birinizə qarışmış halda məhşərə) gətirəcəyik!”

105. Biz (Quranı) haqq olaraq nazil etdik, o da haqq olaraq (heç bir dəyişikliyə uğramadan) nazil oldu. Səni də yalnız (möminlərə

Cənnətlə) müjdə verən və (kafirləri cəhənnəm əzabı ilə) qorxudan sifəti ilə göndərdik.

106. İnsanlara aramla (yavaş-yavaş) oxuyasan deyə, Biz Quranı hissələrə ayırıb (ayə-ayə, surə-surə) göndərdik. Biz onu tədriclə, (iyirmi üç ilə yaxın bir müddət ərzində) nazil etdik.

107. (Ya Rəsulum, müşriklərə) de: "İstər (Qurana) inanın, istərsə də inanmayın. Şübhə yoxdur ki, ondan əvvəl elm verilmiş kimsələr (özlərinə Tövrat və İncil verilmiş kitab əhli) yanlarında (Quran) oxunduğu zaman üzüstə səcdəyə qapanar.

108. Və: "Rəbbimiz pakdır, müqəddəsdir! Rəbbimizin (möminlərə mükafat, kafirlərə əzab veriləcəyi barəsindəki) əmri mütləq yerinə yetəcəkdir!" – deyərlər.

109. Onlar üzüstə səcdəyə qapanıb ağlayar, (Qurandakı öyüd-nəsihət isə) onların (Allaha) itaətini daha da artırar.

110. (Ya Rəsulum!) De: "İstər Allah, istərsə də Rəhman deyib çağırın (dua edin). Hansını desəniz (fərqi yoxdur), çünki ən gözəl adlar (əsmayi-hüsna) yalnız Ona məxsusdur. (Ya Peyğəmbərim!) Namaz qılarkən səsini nə çox qaldır, nə də çox alçalt. Bunun (bu ikisinin) arasında orta bir yol tut!

111. Və de: "Özünə heç bir övlad götürməyən, mülkündə (səltənətində) heç bir şəriki olmayan, zəif (aciz) olmadığı üçün (Ona kömək edəcək) heç bir dosta (hamiyə də) ehtiyacı olmayan Allaha həmd olsun!" Və Allahı (layiqincə) uca tut! (Allahı bütün eyib və nöqsanlardan uzaq bilib təqdis et, şəninə təriflər de!)

## .18.
## ər-Kəhf (Mağara) surəsi

**(Məkkədə nazil olmuşdur, 110 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Həmd olsun O Allaha ki, Kitabı (Quranı mənasında və sözlərində) heç bir əyriliyə (yanlışlığa və ziddiyyətə) yol vermədən Öz bəndəsinə (Muhəmmədə) nazil etdi!

2. (Allah kafirləri) Öz dərgahından gələcək şiddətli bir əzabla qorxutmaq, yaxşı əməllər edən möminlərə isə gözəl mükafata (Cənnətə) nail olacaqları ilə müjdə vermək üçün onu doğru-düzgün (qiyamətə qədər bütün bəşəriyyətə haqq yolu göstərən bir nur) olaraq endirdi.

3. Onlar orada (Cənnətdə) əbədi qalacaqlar!

4. O, həm də (Quranı): "Allah Özünə övlad götürdü!" – deyənləri qorxutmaq üçün nazil etdi.

5. Bu barədə nə onların özlərinin, nə də (təqlid etdikləri) atalarının heç bir biliyi yoxdur. Onlar çox böyük-böyük danışırlar. (Ağızlarından çıxan söz necə də böyük küfrdür). Onlar ancaq yalan deyirlər!

6. (Ya Rəsulum!) Yoxsa (kafirlər) bu Qurana inanmasalar, (səndən üz döndərib getdiklərinə görə) arxalarınca təəssüflənib özünü həlak edəcəksən?!

7. Biz yer üzündə olanları onun (sakinləri) üçün (və ya onun özünə məxsus) bir zinət yaratdıq ki, onlardan hansının daha gözəl əməl sahibi olduğunu yoxlayıb ayırd edək.

8. (Bu da bir həqiqətdir ki) Biz yer üzündə olan hər şeyi (vaxtı gələndə) məhv edib qupquru bir torpağa döndərərik. (Fani dünyaya, onun cah-cəlalına etibar yoxdur. Yer üzündə olan heç bir şey əbədi deyildir. Müəyyən dövrdən sonra orada mövcud olan hər şey məhv olacaqdır).

9. (Ya Rəsulum!) Yoxsa əshabi-kəhfin və Rəqimin (mağara və Rəqqim əhlinin) ayələrimizdən əcaib bir şey olduğunu güman edirsən? (Xeyr, bu Bizim qüdrətimiz qarşısında adi bir işdir).

10. (Ya Rəsulum!) Xatırla ki, o zaman gənclər mağaraya sığınıb: "Ey Rəbbimiz! Bizə Öz dərgahından mərhəmət bəxş et və işimizə fərəc ver! (Bizi kafirlərin bəlasından, düşmənlərin təhlükəsindən qoru, bizə ruzi verib doğru yola yönəlt!)" – demişdilər.

11. Biz onları mağarada illərlə (üç yüz doqquz il) yuxuya verdik.

12. Sonra iki tayfadan (möminlərdən və kafirlərdən) hansının onların (mağarada) qaldıqları müddəti daha düzgün hesabladıqlarını bilmək üçün onları oyatdıq.

13. (Ya Rəsulum!) Biz onların xəbərini sənə doğru söyləyirik. Onlar Rəbbinə iman gətirmiş bir neçə gənc idi. Biz də onların hidayətini (imanını, səbatını və bəsirətini) artırmışdıq.

14. Onlar (rum qeysəri bütpərəst Diqyanusun hüzurunda) durub: "Rəbbimiz göylərin və yerin Rəbbidir. Biz Ondan başqa heç bir tanrıya ibadət etməyəcəyik. Əks təqdirdə, (Allahdan başqasına tapınacağıq, - söyləsək, küfr) danışmaqda həddi aşmış (ifrata varmış) olarıq!" – dedikləri zaman onların ürəklərinə qüvvət (mətanət) vermişdik.

15. Bizim bu camaat (qövmümüz) Allahdan başqa tanrılar qəbul etdi. Elə isə onlar öz tanrıları barəsində (bütlərə ibadət etməyin düzgün olması haqqında) bir dəlil gətirməli deyildilərmi? Allaha qarşı yalan uydurub düzəldəndən daha zalım (özünə zülm edən) kim ola bilər?!

16. (Gənclərin başçısı, yaşca böyüyü Təmlixa yoldaşlarına belə demişdi: ) "Onları və Allahdan başqa tapındıqları tanrıları tərk edib getdiyiniz zaman mağaraya çəkilin ki, Rəbbiniz sizə Öz mərhəmətindən əta etsin və işinizdə sizin üçün fayda hazırlasın (sizə kafirlərdən nicat versin, düşmənlərdən qoruyub saxlasın)".

17. (Ya Rəsulum! Əgər o zaman onlara baxsaydın) günəşin doğduğu zaman onların mağarasının sağ tərəfinə meyl etdiyini, batdığı zaman isə onları tərk edib sol tərəfə yönəldiyini (mağaranın içinə düşüb onları yandırmadığını), onların da mağaranın ortasında geniş bir yerdə olduqlarını (küləyin onları oxşadığını və rahat nəfəs aldıqlarını) görərdin. Bu, Allahın möcüzələrindəndir. Allahın doğru yola saldığı kəs doğru yoldadır. Allahın yoldan çıxartdığı (zəlalətə saldığı) kimsəyə isə əsla doğru yolu göstərən bir dost (rəhbər) tapa bilməzsən!

18. (Gözləri açıq olduğu üçün) onlar yuxuda ikən sən onları oyaq sanardın. (Torpağın rütubəti bədənlərini çürütməsin deyə) Biz onları sağa-sola çevirirdik. Onlar iti də iki əlini (qabaq pəncələrini mağaranın) astanasına uzadıb yatmışdı. Əgər sən onları (bu vəziyyətdə) görsəydin, yəqin ki, (qorxudan) dönüb qaçar, dəhşət səni bürüyərdi.

19. (Gəncləri illərlə yatırtdığımız kimi) beləcə də onları bir-birindən hal-əhval tutsunlar deyə, oyatdıq. Onların biri dedi: “(Mağarada) nə qədər qaldınız?” Onlar: “Bir gün və ya bir gündən az!” – deyə cavab verdilər. Onlardan (bəziləri isə) belə dedi: “Qaldığınız müddəti Rəbbiniz daha yaxşı bilir. İndi içərinizdən birini bu gümüş pulunuzla şəhərə (Tərsusa və ya Əfsusa) göndərin ki, görsün ən təmiz təam hansıdırsa, ondan sizə ruzi (yemək alıb) gətirsin. O, çox ehtiyatlı olsun (ağıllı hərəkət etsin) və sizin barənizdə heç kəsə bir xəbər (nişan) verməsin!

20. Doğrusu, onlar sizi ələ keçirsələr ya sizi daşqalaq edəcək, ya da öz dinlərinə döndərəcəklər. Belə olacağı təqdirdə, siz (nə dünyada, nə də axirətdə) nicat tapa bilməzsiniz!”

21. (İnsanları–Tərsusun əhalisini) onların halı ilə beləcə tanış etdik ki, Allahın (məxluqatın öləndən sonra diriləcəyi haqqındakı) vədinin

doğru olduğunu və qiyamətin qopacağına əsla şübhə olmadığını bilsinlər. O zaman (Tərsusdakı möminlər və kafirlər) öz aralarında onların (əshabi-kəhfin) işi (və ya insanın öləndən sonra dirilib-dirilməyəcəyi, dirilmənin yalnız ruhla, yaxud ruh və bədənlə birlikdə olacağı kimi dini məsələlər) barəsində mübahisə edirlər. (Nəhayət, əshabi-kəhf öldükdən sonra kafirlər) dedilər: “Onların üstündə bir bina tikin. Rəbbi (onların öldüyünü, yaxud yenidən yuxuya getdiyini və nəyə etiqad etdiyini) daha yaxşı bilir!” Onların (əshabi-kəhfin) haqqındakı mübahisədə qalib gələnlər (möminlər) isə: “Onların (məzarı) üstündə (Allaha ibadət etmək məqsədilə) bir məscid tikəcəyik!” – dedilər.

22. (Kitab əhlindən əshabi-kəhfin sayı barəsində mübahisə edənlər) sanki qaranlıq yerə daş ataraq: “Onlar üçdür, dördüncüsü köpəkləridir!” - deyəcəklər. Bəziləri: “Onlar beşdir, altıncısı köpəkləridir!” – deyəcəklər. Digərləri (möminlər) isə: “Onlar yeddidir, səkkizincisi köpəkləridir!” – söyləyəcəklər. (Ya Rəsulum!) De: “Onların sayını Rəbbim daha yaxşı bilir. (İnsanlardan isə) bunu bilən çox azdır!” (Ya Rəsulum! Əshabi-kəhf) barəsində yalnız sənə açıq-aşkar nazil olan ayələrə əsaslanıb onlarla mübahisə et (Quranda olanlarla kifayətlənib çox dərinə getmə) və (kitab əhlinin) heç birindən onlar haqqında bir şey soruşma!

23. Və heç bir şey barəsində: “Mən onu sabah edəcəyəm!” – demə!

24. Ancaq: “İnşallah (əgər Allah istəsə; Allah qoysa) deyəcəyəm!” – de. (İnşallah deməyi) unutduğun zaman Rəbbinin yada salıb: “Ola bilsin ki, Rəbbim məni bundan (əshabi-kəhfin əhvalatına dair xəbərlərdən) haqqa daha yaxın olan bir yola yönəltsin (peyğəmbərliyimə daha çox dəlalət edən bir möcüzə vesin!)” – de.

25. Onlar mağarada üç yüz doqquz il qaldılar. (Üç yüz il qaldılar, üstünə bir doqquz il də artırdılar).

26. (Ya Rəsulum!) De: “Onların nə qədər qaldıqlarını Allah daha yaxşı bilir. Göylərin və yerin qeybini bilmək ancaq Ona məxsusdur. O, hər şeyi necə gözəl görür, necə də yaxşı eşidir! Onların (yer və göy əhlinin) Allahdan başqa heç bir hamisi yoxdur. O, heç kəsi öz hökmünə (səltənətinə) şərik etməz!” (Çünki Allahın heç bir şərikə ehtiyacı yoxdur!)

27. Rəbbinin kitabından sənə vəhy olunanı oxu. Onun sözlərini heç kəs dəyişdirə bilməz. (Allahdan) başqa heç bir sığınacaq tapa bilməzsən! (Pənah yalnız Allahadır!)

28. Səhər-axşam Rəbbinin rizasını diləyərək Ona ibadət edənlərlə birlikdə özünü səbirli apar (nəfsini qoru). Fani dünyanın bər-bəzəyini arzu edib nəzərlərini onlardan (yoxsul möminlərdən) çevirmə. Qəlbini Bizi (Quranı) xatırlamaqdan qafil etdiyimiz, nəfsinin istəklərinə uyan və (hər) işində ifrata varan bir kimsəyə itaət etmə!

29. Və de: “Haqq Rəbbinizdəndir. Kim istəyir inansın, kim də istəyir inanmasın (kafir olsun). Biz zalımlar üçün elə bir atəş hazırlamışıq ki, onun pərdələri (dumanları) onları bürüyəcəkdir. (Cəhənnəmin qalın divarları zalımları əhatə edəcəkdir). Onlar imdad istədikdə onlara qətran (yaxud yaradan axan irin-qan) kimi üzlərini büryan edən bir su ilə kömək ediləcəkdir. O, nə pis içki, o (Cəhənnəm) necə də pis məskəndir!

30. İman gətirib yaxşı əməllər edənlərə gəldikdə isə Biz (o cür) yaxşı işlər görənlərin mükafatını zay etmərik!

31. Onları (ağacları) altından çaylar axan Ədn cənnətləri gözləyir. Onlar orada taxtlara söykənərək qızıl bilərziklərlə bəzənəcək (altun qolbaqlar taxacaq), nazik və qalın ipəkdən (taftadan və qumaşdan) yaşıl paltarlar geyəcəklər. O, nə gözəl mükafat, o (Cənnət) necə də gözəl məkandır!

32. Onlara (biri mömin, digəri kafir olan) iki adamı misal gətir. Onların birinə (kafirə) iki üzüm bağı verib onları xurmalıqlarla əhatə əhatə etdik və aralarında əkin (zəmi) saldıq.

33. O bağların hər ikisi öz barını verdi və bu bardan heç bir şey əskilmədi. Biz də onların arasından bir irmaq axıtdıq.

34. (Bu adamın) başqa sərvəti (gəliri) də var idi. O öz (yoxsul mömin) yoldaşı ilə söhbət edərkən (təkəbbürlə) ona dedi: “Mən səndən daha dövlətli və əşirətcə (qəbilə, qohum-əqrəba, övlad, qulluqçu və s. cəhətdən) səndən daha qüvvətliyəm!”

35. O (küfrə düşdüyü üçün) özünə zülm edərək bağına girib dedi: “(Bu bağın) nə vaxtsa yox (məhv) olacağını güman etmirəm.

36. Qiyamətin də qopacağını zənn etmirəm. Əgər (dediyim kimi, dirilib) Rəbbimin hüzuruna qaytarılsam, özümə bundan da yaxşı bir məskən (qayıdış yeri) taparam!”

37. Onunla söhbət edən (mömin) yoldaşı isə belə dedi: “Əvvəlcə səni (baban Adəmi) torpaqdan, sonra bir qətrə sudan (mənidən) yaratmış, daha sonra səni adam şəklinə (insan qiyafəsinə) salmış Allahı inkarmı edirsən?

38. Lakin (mən inanaraq deyirəm ki) Allah mənim Rəbbimdir və mən heç kəsi Rəbbimə şərik qoşmaram!

39. Bağına girdiyin zaman barı: “Maşallah (Allahın istədiyi kimi oldu), qüvvət (və qüdrət) yalnız Allaha məxsusdur!” – deyəydin! Əgər məni özündən daha az mal-dövlət və övlad sahibi görürsənsə,

40. Ola bilsin ki, Rəbbim mənə sənin bağından daha yaxşısını versin və sənin bağına göydən bir bəla endirsin ki, o, hamar (sürüşkən, ayaq basılası mümkün olmayan, heç bir şey bitməyən qupquru) bir yer olsun!

41. Yaxud suyu (tamamilə) çəkilib getsin və bir də onu əsla axtarıb tapa bilməyəsən!”

42. Beləliklə, (gecə göydən gələn bir ildırım vasitəsilə) onun (bağının) meyvəsi (bütün var-dövləti) tələf edildi. (Səhər o kafir bağa gəldiyi zaman onu bu vəziyyətdə görüb bağa) qoyduğu xərcə görə (peşmançılıqdan) əllərini ovuşdurmağa başladı. Bağın talvarları yerə çöküb viran qalmışdı. O (qarşısındakı mənzərəyə baxaraq): “Kaş Rəbbimə heç kəsi şərik qoşmayaydım!” – deyirdi.

43. Allahdan başqa ona yardım edə biləcək kəslər yox idi və o da (öz-özünə) kömək edə biləcək bir halda deyildi.

44. Belə bir vəziyyətdə kömək göstərmək (və ya hökm,) ancaq haqq olan Allaha məxsusdur. Mükafat verməkdə də, aqibət qismət etməkdə də ən xeyirlisi Odur.

45. (Ya Rəsulum! Səndən yoxsulları öz məclisindən qovmağı tələb edən təkəbbür sahiblərinə) bu dünyanı misal çək: (Bu dünya) göydən yağdırdığımız yağmura bənzər. Yerdəki bitkilər onunla qarışıb (onu içib) yetişər, sonra isə dönüb küləyin sovurduğu quru çör-çöp (həşəm) olar. Allah hər şeyə (hər şeyi yaratmağa və məhv etməyə) qadirdir!

46. (Bəzi adamların fəxr etdiyi) mal-dövlət, oğul-uşaq (oğullar) bu dünyanın bər-bəzəyidir. Əbədi qalan yaxşı əməllər isə Rəbbinin yanında həm savab, həm də (Allahın mərhəmətinə) ümid etibarilə daha xeyirlidir!

47. O gün (qiyamət günü) dağları (yerindən qoparıb) hərəkətə gətirəcəyik. (O vaxt) yeri dümdüz görəcəksən, (möminləri və kafirləri) bir yerə toplayacaq, onların heç birini (kənarda) qoymayacağıq.

48. Onlar Rəbbinin hüzuruna cərgə-cərgə (səf-səf) gətiriləcəklər. (Onlara belə deyiləcək: ) “Siz Bizim yanımıza sizə ilk dəfə yaratdığımız kimi (lüt-üryan, mal-dövlətsiz) gəldiniz. Lakin siz elə güman edirdiniz ki, Biz sizə verdiyimiz vədi (öləndən sonra diriləcəyinizi) yerinə yetirməyəcəyik!”

49. (Qiyamət günü hər kəsin) əməl dəftəri qarşısına qoyulacaq. (Ya Rəsulum! O zaman) günahkarların orada (yazılmış) olanlardan qorxduqlarını görəcəksən. Onlar belə deyəcəklər: “Vay halımıza! Bu necə bir kitab imiş! O Bizim heç bir kiçik və böyük günahımızı gözdən qaçırmadan hamısını sayıb yazmışdır ki!” Onlar (dünyada) etdikləri bütün əməllərin (öz qarşılarında) hazır durduğunu görəcəklər. Rəbbin heç kəsə haqsızlıq etməz! (Hər kəs öz əməlinin cəzasını alacaqdır!)

50. (Ya Rəsulum!) Xatırla ki, bir zaman mələklərə “Adəmə (təzim məqsədilə) səcdə edin!” – demişdik. İblisdən başqa hamısı səcdə etdi. O, cinlərdən (cin tayfasından) idi. O öz Rəbbinin əmrindən çıxdı. Onlar sizin düşməniniz olduğu halda, siz Məni qoyub onu və nəslini (övladını özünüzə) dostmu tutursunuz? Bu, zalımlar üçün necə də pis dəyiş-düyüşdür!

51. Mən onları nə göylərin, nə yerin yaradılışına, nə də öz yaradılışlarına şahid etmədim və Mən (insanları haqq yoldan) çıxardanları Özümə köməkçi də tutmadım!

52. O gün (qiyamət günü Allah müşriklərə) belə buyuracaq: “(Mənə ortaq olduqlarını) iddia etdiyiniz şəriklərimi (sizə şəfaət diləməkdən ötrü) çağırın! (Müşriklər) öz tanrılarını (bütlərini) çağıracaq, lakin onlar (müşriklərə) heç bir cavab verməyəcəklər. Biz onların arasında (hamısının birlikdə məhv olacağı) bir cəhənnəm dərəsi bərqərar edərik!

53. Günahkarlar atəşi (Cəhənnəmi) görüncə ona düşəcəklərini yəqin edəcək və oradan baş götürüb qaçmağa (kənara çıxmağa) bir yer tapa bilməyəcəklər.

54. Biz bu Quranda insanlar üçün cürbəcür məsəllər çəkdik. İnsan isə (bütün məxluqat içərisində) ən çox mübahisə edəndir. (Haqqa boyun qoymaz, öyüd-nəsihət qəbul etməyib batilə uyar).

55. İnsanlara (Məkkə müşriklərinə) doğru yol göstərən bir rəhbər (peyğəmbər, Allah kəlamı) gəldiyi zaman ona iman gətirməyə və Rəbbindən bağışlanmalarını diləməyə mane olan şey yalnız əvvəlkilərin başına gələnlərin (adətimiz üzrə əvvəlki ümmətləri düçar etdiyimiz müsibətlərin) onların da başına gəlməsini, yaxud da gözləri baxa-baxa əzabın gəlib onlara yetişməsini gözləməlidirlər.

56. Biz peyğəmbərləri yalnız (möminlərə Cənnətlə) müjdə verənlər və (kafirləri cəhənnəm əzabı ilə) qorxudanlar (xəbərdar edənlər) olaraq göndərdik. Kafirlər isə batil (sözləri) ilə haqqı (Quranı) yalana çıxartmaq məqsədilə (Peyğəmbərlə boş-boşuna) mübahisə aparırlar. Onlar Mənim ayələrimi və (Peyğəmbər vasitəsilə) qorxudulduqları əzabı məsxərəyə qoyurlar.

57. Rəbbinin ayələri özünə xatırlandırılarkən onlardan üz döndərən, əvvəlcə (öz əlləri ilə) etdiyi günahları unudan (əvvəlki günahlarından peşman olub tövbə etməyən) adamdan daha zalım kim ola bilər?! (Bu cür adamlar) onu (Quranı) anlamasınlar deyə, Biz onların qəlblərinə pərdə çəkib, qulaqlarına ağırlıq verdik (maneə qoyduq). Sən onları doğru yola dəvət etsən belə, onlar əsla haqq yola gəlməzlər (islamı qəbul etməzlər).

58. Rəbbin bağışlayandır, mərhəmətlidir. Əgər (Rəbbin) onları günahlarına görə cəzalandırmaq istəsəydi, onların əzabını sürətləndirərdi. Lakin onların (öz əzab) vaxtı vardır (O zaman) onlar

(Allahın əzabından qaçıb canlarını qurtarmağa) əsla bir yer tapa bilməzlər!

59. O məmləkətlərin əhalisini (Ad, Səmud tayfalarını) zülm etdikləri zaman məhv etdik. Biz onları məhv etmək üçün vaxt (vədə) müəyyən etmişdik.

60. (Ya Rəsulum!) Yadına sal ki, bir zaman Musa öz gənc dostuna (xidmətində olan Yuşə ibn Nuna) belə demişdi: “Mən (Xızırla görüşmək üçün) iki dənizin qovuşduğu yerə çatmayınca və uzun müddət gəzib dolanmayınca (bu səfərdən) geri dönməyəcəyəm!”

61. Onlar iki dənizin qovuşduğu yerə gəlib çatdıqda (yeməyə götürdükləri) balığı unutmuşdular, balıq isə (dirilib suya atılmış) dənizdə bir yarğana tərəf üz tutmuşdu.

62. Onlar (iki dənizin qovuşduğu yerdən) keçib getdikləri zaman (Musa) gənc dostuna dedi: “Nahar yeməyimizi gətir. Bu səfərimiz bizi lap əldən saldı!”

63. O isə: “Görürsənmi, biz (həmin yerdə) qayanın yanında gizləndiyimiz zaman mən balığı unutdum. Doğrusu, onu xatırlamağı mənə yalnız Şeytan unutdurdu. (Balıq dirilib) əcaib bir şəkildə dənizə yollanmışdır!” – deyə cavab verdi.

64. (Musa: ) “Elə istədiyimiz də (axtardığımız da) budur!” – dedi və onlar öz ləpirlərinin izinə düşüb gəldikləri yolla geri (iki dənizin qovuşduğu yerə) qayıtdılar.

65. (Musa və Yuşə orada) Öz dərgahımızdan mərhəmət (peyğəmbərlik və vəhy, yaxud ilham və kəramət) əta etdiyimiz və Öz tərəfimizdən elm (qeybə dair bəzi biliklər) öyrətdiyimiz bəndələrimizdən birini (Xızırı) tapdılar.

66. Musa ondan soruşdu: “Öyrədildiyin doğru yolu göstərən elmdən mənə öyrətmək şərtilə sənə tabe olummu?”

67. (Xızır) belə cavab verdi: “Sən mənimlə bir yerdə olsan (görəcəyim işlərə) əsla dözə bilməzsən. (Sənin onlara səbrin çatmaz, çünki mən batini elmlə iş görürəm. Sənin bildiyin isə ancaq zahiri elmdir. Sən peyğəmbər olduğun üçün mən zahirən qadağan olunmuş bir iş gördükdə ona etiraz edib əleyhimə çıxacaqsan).

68. Axı sən bilmədiyin (batininə, mahiyyətinə bələd olmadığın) bir şeyə necə dözə bilərsən?

69. (Musa) dedi: “İnşallah, səbirli olduğumu görəcəksən. Sənin heç bir əmrindən çıxmayacağam!”

70. (Xızır: ) “Əgər mənə tabe olacaqsansa, səbəbini sənə izah etməyincə məndən heç bir şey haqqında soruşma!” – dedi.

71. Bundan sonra onlar durub yola düşdülər. Gəmiyə mindikləri zaman (Xızır) onu deşdi (gəminin bir-iki taxtasını sındırıb çıxartdı). (Musa) dedi: “Sən gəmidə olanları suya qərq etmək üçünmü gəmini deşdin? Doğrusu, (günahı) böyük bir şey etdin (olduqca çirkin bir iş gördün)”.

72. (Xızır) belə cavab verdi: “Sənə demədimmi ki, mənimlə bir yerdə olanda (görəcəyim işlərə) əsla dözə bilməzsən?”

73. (Musa) dedi: “Unutduğum bir şeyə görə məni danlama və məni öz işimdə (sənə tabe olmaqda) çətinliyə salma!”

74. Yenə getdilər, nəhayət, bir oğlan uşağı ilə rastlaşdıqda (Xızır) dərhal onu öldürdü. (Musa) dedi: “(Heç bir günah iş tutmayan, buna görə də qisasa layiq olmayan) pak (məsum) bir canamı qıydın? Doğrudan da, çox pis bir şey etdin (çox pis bir iş gördün)”.

75. (Xızır) yenə belə cavab verdi: “Sənə demədimmi ki, mənimlə birlikdə olanda (edəcəyim əməllərə) əsla dözə bilməzsən?

76. (Musa) dedi: “Əgər bundan sonra səndən bir şey barəsində xəbər alsam, bir daha mənimlə yoldaşlıq etmə. (Hərəkətlərinə etiraz etdiyim, səni qınadığım üçün) sən artıq mənim tərəfimdən üzrlüsən (məni atıb getməyə haqqın vardır)”.

77. Sonra yenə yola düzəlib getdilər. Axırda bir məmləkət əhlinə yetişib onlardan yeməyə bir şey istədilər. Əhali onları qonaq etmək (Musaya və Xızıra yemək vermək) istəmədi. Onlar orada yıxılmaq (uçulmaq) üzrə olan bir divar gördülər. (Xızır) onu düzəltdi. (Musa) dedi: “Əgər istəsəydin, sözsüz ki, bunun müqabilində bir muzd (çörək pulu) alardın. . .”

78. (Xızır) dedi: “Bu artıq mənimlə sənin aranda ayrılıq vaxtıdır. (Zahirən naməqbul olduğunu gördüyün üçün) dözə bilmədiyin şeylərin yozumunu (batinini, iç üzünü) sənə xəbər verəcəyəm!

79. Belə ki, gəmi dənizdə çalışıb-vuruşan bir dəstə yoxsula mənsub idi. Mən onu xarab etmək istədim, çünki həmin adamların arasında (yaxud qabağında) hər bir saz gəmini zorla ələ keçirən bir padşah var idi.

80. Oğlana gəldikdə, onun ata-anası mömin kimsələr idi. (Mən onun alnına baxıb gördüm ki, həddi-buluğa yetişəndə kafir olacaq) buna görə də biz (onun böyüyəndə) ata-anasını da (öz arxasınca) azğınlığa və küfrə sürükləməsindən qorxduq.

81. Və Rəbbinin onun əvəzində onlara daha təmiz və (ata-anasına qarşı) daha mərhəmətli olan başqa bir övlad verməsini istədik.

82. Divara gəldikdə isə, o, şəhərdə olan iki yetim oğlanın idi. Altında onlara çatası bir xəzinə vardı. Onların atası əməlisaleh (bir adam) idi. Rəbbin onların həddi-buluğa çatmalarını və Rəbbindən bir

mərhəmət olaraq öz xəzinələrini tapıb çıxartmalarını istədi. (Ya Musa!) Mən bunları öz-özümdən etmədim (yalnız Allahın əmrini yerinə yetirdim). Sənin səbr edib dözə bilmədiyin şeylərin yozumu (batini mənası) budur!”

83. (Ya Rəsulum!) Səndən Zülqərneyn barəsində soruşarlar. De: “Onun barəsində sizə bir hekayət (bəzi xəbərlər) söyləyəcəyəm!”

84. Biz onu yer üzərində möhkəmləndirib qüvvətləndirdik və hər şey verdik (hər şeyin yolunu ona öyrətdik).

85. O, (məğribə çatmaq üçün) yola çıxdı. (Tövbə qapısı məğribdə olduğuna görə səfərini oradan başladı).

86. Nəhayət, günəşin batdığı yerə gəlib çatdıqda onu qara palçıqlı bir çeşmədə (lehməli bir suda) batan gördü. O, çeşmənin yanında (Allahı tanımayan, kafir) bir tayfa da gördü. Biz ona belə buyurduq: “Ya Zülqərneyn! Sən onlara (imana gəlməsələr) əzab da verə bilərsən, (haqq yola dəvət edib) onlarla yaxşı rəftar da edə bilərsən!”

87. O (İsgəndər) belə cavab verdi: “Zülm (küfr) edənə əzab verəcəyik. Sonra o, Rəbbinin hüzuruna qaytarılacaq. (Rəbbi də) ona (Cəhənnəmdə) görünməmiş bir əzab verəcəkdir!

88. İman gətirib yaxşı iş görənləri isə ən gözəl mükafat (Cənnət) gözləyir. Biz ona asan bir şey əmr edəcəyik!” (Onu Allaha yaxınlaşdırmaq üçün bacardığımız hər şeyi – oruc, namaz, zəkat, cihad və s. öyrədəcək, gücü çatmayan bir işi isə görməyə vadar etməyəcəyik).

89. Sonra o, başqa bir yola (məşriqə) tərəf üz tutub getdi.

90. Nəhayət, günəşin çıxdığı yerə çatdıqda onu bir qövm üzərində doğan gördü ki, onlardan ötrü ona (günəşə) qarşı heç bir sipər yaratmamışdıq. (Yalnız günəşin özü onlar üçün sipər idi).

91. (Zülqərneynin qüdrət və səltənəti, səyahəti) belə idi. Biz hələ onun yanında daha nələr olduğunu da bilirik. (Zülqərneynin qüdrətini, nə qədər əsgərlə səfərə çıxdığını Allahdan başqa heç kəs dəqiq bilməz).

92. Daha sonra o (Zülqərneyn) başqa bir yola (cənubdan şimala) üz tutub getdi.

93. Nəhayət, (sədd salmış olduğu Azərbaycandakı, yaxud Türküstanda Yəcud–Məcüc tayfaları yaşayan ərazidəki) iki dağ arasına gəlib çatdıqda onların ön tərəfindən az qala söz anlamayan (yaxud danışıqları çox çətin başa düşülən) bir tayfa gördü.

94. Onlar (tərcüməçi vasitəsilə) dedilər: "Ey Zülqərneyn! Yəcuc–Məcuc (tayfaları) bu ərazidə fitnə-fasad törədirlər. Bizimlə onlar arasında bir sədd çəkmək üçün sənə müəyyən məbləğ (yaxud xərac) versək olarmı?"

95. O (Zülqərneyn) dedi: "Rəbbimin mənə verdiyi (qüdrət və sərvət sizin mənə verəcəyiniz məbləğdən) daha yaxşıdır. Gəlin öz qüvvənizlə (bənna, fəhlə, dülgər və s.) mənə kömək edin, mən də sizinlə onlar arasında möhkəm bir sədd düzəldim!

96. Mənə dəmir parçaları gətirin!" (Onlar gətirdilər). O (Zülqərneyn) iki dağın arasını (dəmir parçaları ilə doldurub) bərabərləşdirən kimi: "(Körükləri) üfürün!" – dedi. (Onlar körükləri üfürdülər). (Zülqərneyn dəmiri) od halına salınca: "Mənə ərimiş mis gətirin, onun üstünə tökün!" dedi. (Dəmir və mis bir-birinə qarışdı, ərimiş mis divarın dəliklərini doldurdu və beləliklə, möhkəm bir sədd əmələ gəldi).

97. (Yəcuc–Məcuc tayfaları) artıq nə (səddi) aşa bildilər, nə də onu dəlib keçə bildilər.

98. O (Zülqərneyn) dedi: “Bu (sədd) Rəbbimdən bəxş edilən bir mərhəmətdir. Rəbbimin təyin etdiyi vaxt (qiyamətə yaxın Yəcuc–Məcüc tayfalarının dünyanı bürüyəcəyi zaman) gəldikdə isə (Allah) onu yerlə yeksan (dümdüz) edəcəkdir. Rəbbimin vədi haqdır!” (Allahın buyurduğu hər bir şey, o cümlədən İsgəndərin səddinin dağılması, Yəcuc–Məcuc tayfalarının yer üzünün hər tərəfinə səpələnməsi, orada fitnə-fəsad törətməsi, nəhayət bir cür həşərat tərəfindən məhv edilməsi mütləq baş verəcəkdir).

99. O gün (həddindən artıq çox olduqlarına görə) onları (yaxud bütün insanları başlı-başına) buraxarıq. Belə ki, onlar dalğalar kimi bir-birinə qarışarlar (heyrət onları bürüyər, özlərini itirib nə etdiklərini bilməzlər). Sur çalınan kimi onların (məxluqatın) hamısını bir yerə cəm edərik.

100. O gün Biz Cəhənnəmi (gətirib) kafirlərə əyanən göstərərik.

101. O kəslər ki, gözləri Məni anmaqdan qapalı (pərdəli) idi və eşitməyə də qadir deyildilər. (Onlar Quranın ülviyyətini, Mənim ayələrimi, qüdrətimə dəlalət edən əlamətləri görmür, öyüd-nəsihətlərimi də eşitmirdilər).

102. Kafirlər Məni qoyub qullarımı (mələkləri, Üzeyiri, İsanı və başqalarını) özlərinə dost (hami) edəcəklərinimi güman edirlər? (Xeyr, onlar bəndələrimi Mənim əzabımdan əsla qurtara bilməzlər). Biz Cəhənnəmi kafirlər üçün mənzil hazırlamışıq!

103. (Ya Rəsulum!) De: “Sizə əməlləri baxımından (axirətdə) ən çox ziyana uğrayanlar barəsində xəbər verimmi?”

104. O kəslər ki, onların dünyadakı zəhməti boşa getmişdir. Halbuki onlar yaxşı işlər gördüklərini (və bunun müqabilində mükafata nail olacaqlarını) zənn edirdilər.

105. Onlar o kəslərdir ki, Rəbbinin ayələrini və Onunla qarşılaşacaqlarını (qiyamət günü dirilib haqq-hesab üçün Onun hüzurunda duracaqlarını) inkar etdilər, bununla da onların bütün əməlləri puça çıxdı. Buna görə də Biz (qiyamət günü) onlar üçün bir daş-tərəzi qurmayacağıq!

106. Küfr etdiklərinə, ayələrimi və peyğəmbərlərimi məsxərəyə qoyduqlarına görə budur onların cəzası – Cəhənnəm!

107. İman gətirib yaxşı işlər görənlərin mənzili isə Firdovs cənnətləri olacaqdır!

108. Onlar orada (o cənnətlərdə) əbədi qalıb oradan ayrılmaq (başqa yerə getmək) istəməyəcəklər!

109. (Ya Rəsulum! Quranda buyurulduğu kimi, sizə çox az elm verilmişdir, söyləyən yəhudilərə) de: "Əgər Rəbbimin sözlərini yazmaq üçün dərya mürəkkəb olsaydı və bir o qədər də ona əlavə etsəydik, yenə də Rəbbimin sözləri tükənmədən öncə onlar tükənərdi!"

110. De: "Mən də sizin kimi ancaq bir insanam. Mənə vəhy olunur ki, sizin tanrınız yalnız bir olan Allahdır. Kim Rəbbi ilə qarşılaşacağına (qiyamət günü dirilib haqq-hesab üçün Allahın hüzurunda duracağına) ümid bəsləyirsə (yaxud qiyamətdən qorxursa), yaxşı iş görsün və Rəbbinə etdiyi ibadətə heç kəsi şərik qoşmasın!"

## .19.
## Məryəm surəsi
**(Məkkədə nazil olmuşdur, 98 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Kaf, Ha, Ya, Eyn, Sad!

2. (Ya Rəsulum!) Bu sənin Rəbbinin öz qulu Zəkəriyyaya olan mərhəmətinin xatırlanmasıdır!

3. (Zəkəriyyaya) Rəbbinə gizlicə dua edib yalvardığı zaman

4. Belə demişdi: "Ey Rəbbim! Artıq sümüyüm sustalmış, başım ağappaq ağarmışdır. Ey Rəbbim! Sənə dua etməklə heç vaxt naümid olmamışam. (Nə dua etmişəmsə, qəbul olunmuşdur).

5. Mən özümdən sonra gələn qohum-əqrəbamdan (yerimə keçəcək əmioğlularımın və digər vərəsələrimin məsləkimi ləyaqətlə davam etdirməyəcəyindən) qorxuram. Zövcəm də ki, qısırdır. Buna görə də mənə Öz dərgahından bir oğul (vəli) bəxş et ki,

6. O həm mənə, həm də Yəqub nəslinə (onlara lütf edilmiş peyğəmbərliyə) varis olsun. Ey Rəbbim! Həm də elə et ki, o (öz əqidəsi, itaəti və gözəl əxlaqı ilə) riza (Sənin rizanı) qazanmış olsun!"

7. (Allahdan belə bir nida gəldi:) "Ey Zəkəriyya! Sənə bir oğulla (oğlun olacağı ilə) müjdə veririk ki, adı Yəhyadır. Biz bu adı əvvəllər heç kəsə verməmişik!"

8. (Zəkəriyya) dedi: "Ey Rəbbim! Zövcəm doğmayan bir qadın, mən də qocalıb əldən düşmüş (sümüyü sustalmış bir kişi) ikən mənim necə oğlum ola bilər?"

9. (Allah Cəbrailin dili ilə buyurdu: ) "Dediyin kimidir, lakin Rəbbin buyurdu ki, bu işi görmək Mənim üçün asandır. Necə ki, ilk əvvəl səni heç bir şey deyilkən (yoxdan) yaratmışdım!"

10. (Zəkəriyya) dedi "Ey Rəbbim! Mənim üçün (ürəyim arxayın olsun deyə, bu barədə) bir əlamət müəyyən et!" (Allah) buyurdu: "Əlamətin budur ki, sən sağlam ikən üç gün-üç gecə adamlarla danışa bilməyəcəksən!"

11. (Nəhayət, Zəkəriyyanın dili tutulduğu, ona danışmaq qadağan edildiyi üçün artıq zövcəsinin hamilə olduğunu başa düşdü və Allahın Öz əhdinə sadiq olduğuna bir daha əmin olub Ona canidildən şükür etdi). Sonra (Zəkəriyya) mehrabdan (məbəddən) öz camaatının qabağına çıxıb (əli ilə) onlara belə işarə etdi: “Səhər-axşam (Allahı) təqdis edib şəninə təriflər deyin! (Və ya namaz qılın!)”

12. (Yəhya dünyaya gəldikdən sonra ona dedik: ) “Ey Yəhya! Kitabdan bərk yapış (Tövratı möhkəm tutub onun hökmlərinə ciddi əməl et!). Biz uşaq ikən ona hikmət (Allah kəlamının incəliklərini anlamaq, peyğəmbərlik) verdik.

13. Biz həm də ona Öz dərgahımızdan bir mərhəmət (yaxud insanlara qarşı şəfqət) və (günahlardan) paklıq bəxş etdik. O, (çox) müttəqi idi.

14. (Yəhya) ata-anasına qarşı da olduqca itaətkar (nəvazişkar) idi: zalım, asi (dikbaş) deyildi.

15. Ona doğulduğu gün də, öləcəyi gün də (qiyamətdə) diriləcəyi (qəbirdən diri olaraq qaldırılacağı) gün də salam olsun! (Yəhya anadan olduğu gün Şeytan şərindən, vəfat etdikdə qəbir əzabından, axirətdə isə qiyamət dəhşətindən salamat olsun!)

16. (Ya Rəsulum!) Kitabda (Quranda) Məryəmi də yad et. O zaman o, ailəsindən ayrılıb (evinin, yaxud Beytülmüqəddəsin) şərq tərəfində (ibadət məqsədilə xəlvət) bir yerə çəkilmişdi.

17. Və ailə üzvlərindən gizlənmək (paltarını dəyişmək, yaxud yuyunub təmizlənmək) üçün pərdə tutmuşdu. Biz də Öz ruhumuzu (Cəbraili Məryəmin) yanına göndərdik. Ona (Məryəmə) kamil bir insan qiyafəsində göründü.

18. (Məryəm) dedi: “Mən səndən Rəhmana (Allaha) pənah aparıram. Əgər müttəqisənsə (mənə toxunma)!”

19. (Cəbrail:) “Mən sənə ancaq təmiz (məsum) bir oğlan bağışlamaq üçün Rəbbinin (göndərdiyi) elçisiyəm!” – dedi.

20. (Məryəm) dedi: “Mənim necə oğlum ola bilər ki, mənə indiyədək bir insan əli belə toxunmamışdır. Mən zinakar da deyiləm!”

21. (Cəbrail) dedi: “Elədir, lakin Rəbbin buyurdu ki, bu Mənim üçün asandır. Biz onu insanlar üçün (qüdrətimizə dəlalət edən) bir möcüzə, (sənə və möminlərə isə) dərgahımızdan bir mərhəmət olaraq edəcəyik. Bu, əzəldən təqdir olunmuş bir hökmdür!”

22. (Məryəm) artıq (Cəbrailin üfürməsi ilə İsaya) hamilə oldu və onunla (bətnindəki uşaqla) birlikdə uzaq bir yerə (xəlvətə) çəkildi.

23. Doğuş sancısı onu bir xurma ağacının gövdəsinə söykənməyə məcbur etdi. (Məryəm uşaq anadan olandan sonra atası bilinmədiyi üçün cahil insanların dedi-qodusuna səbəb olacağından əndişəyə düşüb) dedi: “Kaş ki, mən bundan əvvəl ölüb qurtaraydım və ya tamamilə unudulub getmiş olaydım!”

24. Dərhal (Məryəmin, yaxud xurma ağacının) alt tərəfindən ona (Cəbraildən və ya doğulmaqda olan İsadan) belə bir nida gəldi: “Kədərlənmə, Rəbbin sənin üçün (ayağının) altından bir irmaq axıtdı (və ya bətnindəki uşağı hörmət sahibi etdi).

25. (Qurumuş) xurma ağacını özünə tərəf silkələ, üstünə təzə yetişmiş (xurma) tökülsün!

26. (Xurmadan və sudan) ye-iç, (belə bir uşaq doğduğuna görə) gözün aydın olsun. Əgər (səndən bu uşaq barəsində soruşan) bir adam görəcək olsan, belə de: “Mən Rəhman yolunda oruc (sükut

orucu) tutmağı nəzir eləmişəm, ona görə də bu gün heç kəslə danışmayacağam!”

27. (Məryəm) uşağı götürüb öz adamlarının yanına gəldi. Onlar dedilər: “Ey Məryəm! Sən çox əcaib bir şeylə (atasız uşaqla) gəldin! (Və ya çox çirkin bir iş gördün!)

28. Ey Harunun bacısı! Atan pis kişi, anan da zinakar deyildi!”

29. (Məryəm onun özü ilə danışın, deyə) ona (uşağa) işarə etdi. Onlar: “Beşikdə olan uşaqla necə danışacaq?” – dedilər.

30. (Allahdan bir möcüzə olaraq körpə dilə gəlib) dedi: “Mən, həqiqətən, Allahın quluyam. O mənə kitab (İncil) verdi, özümü də peyğəmbər etdi.

31. O, harada oluramsa olum, məni mübarək (həmişə hamıya xeyir verən, dini hökmləri öyrədən) etdi və mənə diri olduqca namaz qılıb zəkat verməyi tövsiyə buyurdu.

32. O, həmçinin məni anama qarşı olduqca itaətkar (nəvazişkar) etdi, (heç kəsə qarşı) zülmkar, asi (dikbaş) eləmədi!

33. Doğulduğum gün də, öləcəyim gün də, diriləcəyim (qəbirdən diri olaraq qaldırılacağım) gün (qiyamət günü) də (Allahdan) mənə salam olsun!”

34. Bu, (yəhudilərin və xaçpərəstlərin barəsində) şübhəyə düşdükləri Məryəm oğlu İsa haqqında (Allahın buyurduğu) haqq sözdür! [Yaxud (yəhudilərin və xaçpərəstlərin) barəsində şəkk-şübhə etdikləri Məryəm oğlu İsa haqq söz olaraq budur].

35. Allaha (özü üçün) övlad götürmək yaraşmaz. O, pakdır, müqəddəsdir. O, hər hansı bir şeyi yaratmaq istədikdə ona yalnız: “Ol!” deyər, o da dərhal olar.

36. (İsa sonra belə dedi: ) “Allah mənim də, sizin də Rəbbinizdir. Yalnız Ona ibadət edin. Bu, doğru yoldur!”

37. (Xaçpərəstlərdən olan) firqələr (İsa Allahdır, yaxud Allahın oğludur və s. sözlər deyərək) öz aralarında anlaşılmazlığa düşdülər. Vay o böyük günü (qiyamət gününü) görəcək kafirlərin halına!

38. (Sən indi onların özlərini karlığa, korluğa vurmalarına baxma!) Onlar Bizim hüzurumuza gələcəkləri gün (qiyamət günü hər şeyi) elə yaxşı eşidəcək, elə yaxşı görəcəklər ki! Lakin zalımlar bu gün açıq-aşkar bir zəlalət içindədirlər (haqq yoldan aşkar azmışlar).

39. (Ya Rəsulum!) Qəflətdə olanları və iman gətirməyənləri işin bitmiş olacağı (haqq-hesab çəkilib möminlərin Cənnətə, kafirlərin isə Cəhənnəmə girəcəyi) peşmançılıq günü (insanın pis əməllərinə görə peşman olacağı, lakin bu peşmançılığın heç bir fayda verməyəcəyi qiyamət günü) ilə qorxut!

40. (O gün bütün) yer üzünə və onun üzərində olan hər şeyə yalnız biz varis olacağıq. (Bizdən başqa heç kəs və heç nə qalmayacaq). Onlar (əməllərinin cəzasını almaq üçün) Bizim hüzurumuza qaytarılacaqlar.

41. (Ya Rəsulum!) Kitabda (Quranda) İbrahimi də yad et (onun hekayətini də ümmətinə söylə). Həqiqətən, o, büsbütün doğru danışan kimsə (siddiq) – bir peyğəmbər idi.

42. O, bir zaman atasına belə demişdi: “Atacan! Nə üçün eşitməyən, görməyən və sənə heç bir fayda və zərər verə bilməyən bütlərə ibadət edirsən?

43. Atacan! Həqiqətən, sənə gəlməyən bir elm (peyğəmbərlik) mənə gəlmişdir (sənə müyəssər olmayan bir şey mənə müyəssər olmuşdur). Ardımca gəl ki, səni (Allahın buyurduğu) doğru bir yola çıxardım!

44. Atacan! Şeytana ibadət etmə, həqiqətən, Şeytan Rəhmana (Allaha) çox asi olmuşdur!

45. Atacan! Qorxuram ki, (tövbə etməsən) Rəhmandan sənə bir əzab toxunsun və beləcə (Cəhənnəmdə) Şeytana yoldaş olasan!"

46. (Atası Azər İbrahimə) dedi: "Ya İbrahim! Sən mənim tapındığım tanrılardan üzmü çevirirsən? Əgər (onlara qarşı pis hərəkətlərinə) son qoymasan, səni mütləq daşqalaq edəcəyəm (yaxud səni təhqir edib acı sözlər deyəcəyəm). Bir müddət məndən uzaq ol (gözlərim səni görməsin)!"

47. (İbrahim) belə cavab verdi: "Sənə salam olsun! (Allah özü sənə rəhm etsin. Məndən sənə heç bir pislik gəlməz!) Mən Rəbbimdən sənin bağışlanmağını diləyəcəyəm. O mənə qarşı çox mehribandır (çox lütfkardır, duamı qəbul edər).

48. Mən sizi və sizin Allahdan başqa tapındığınız bütləri tərk edib bir kənara çəkilir və öz Rəbbimə dua (ibadət) edirəm. Ola bilsin ki, mən Rəbbimə ibadət etməklə bədbəxt (Onun mərhəmətindən naümid, məhrum) olmayım. (Mənim Allaha etdiyim ibadət, sizin bütlərə, tanrılara etdiyiniz ibadət kimi puça çıxmasın!)"

49. (İbrahim müşrikləri) və onların Allahdan başqa tapındıqları bütləri tərk edib (Şama) getdiyi zaman Biz ona (oğlu) İshaqla (nəvəsi) Yəqubu bəxş etdik və onların hər ikisini peyğəmbər etdik.

50. (Onların üçünü də) öz mərhəmətimizdən (ruzimizdən) ehsan buyurub təriflərini dillər əzbəri etdik. (Bütün din sahiblərinin, möminlərin yanında onların ehtiramını və mərtəbəsini ucaltdıq).

51. (Ya Rəsulum!) Kitabda (Quranda) Musanı da yad et! Həqiqətən o, (öz ibadətində) çox səmimi idi. O (Bizim tərəfimizdən İsrail oğullarına göndərilmiş) bir elçi, bir peyğəmbər idi.

52. Biz (Musanı) Tur dağının sağ tərəfindən çağırdıq və (Allahla danışmaq üçün yalvarıb) gizli dua edərkən özümüzə yaxınlaşdırdıq.

53. Və öz mərhəmətimizdən qardaşı Harunu da bir peyğəmbər olaraq ona bəxş etdik.

54. (Ya Rəsulum!) Kitabda (Quranda) İsmaili də yada sal! O öz vədinə sadiq və (Bizim tərəfimizdən öz ümmətinə göndərilmiş) bir elçi, bir peyğəmbər idi.

55. O öz ümmətinə namaz qılmağı, zəkat verməyi əmr edirdi. O, Rəbbinin rizasını qazanmışdı. (İsmailin əməli Allah dərgahında bəyənilmişdi).

56. (Ya Rəsulum!) Kitabda (Quranda) İdrisi də yad et! O, həqiqətən, büsbütün doğru danışan kimsə (siddiq) – bir peyğəmbər idi.

57. Biz onu yüksək bir məqama (Cənnətə, yaxud dördüncü göyə) qaldırdıq.

58. Bunlar Adəmi və Nuhla gəmiyə mindirdiyimiz adamların nəslindən, İbrahimin, İsrailin (Yəqubun) nəslindən seçib haqq yola yönəltdiyimiz və Allahın nemət bəxş etdiyi peyğəmbərlərdəndir. Onlar Rəhmanın (Allahın) ayələri özlərinə oxunduğu zaman ağlayaraq səcdəyə qapanırdılar. [İdris Adəmin, Nuh İdrisin, İbrahim Nuhun (və ya Nuhun gəmisində olanlardan birinin), İsmail, İshaq, Yəqub İbrahimin nəslindən, Musa, Harun, Zəkəriyya və İsa isə Yəqubun nəslindən olan peyğəmbərlərdəndir].

59. Onlardan sonra namazı tərk edib şəhvətə uyan bir nəsil gəldi. Onlar (Cəhənnəmdəki) Fəyy dərəsinə düşəcəklər. (Yaxud, onlar da öz əməllərinin cəzasını alacaqlar).

60. Tövbə edib iman gətirən və yaxşı işlər görənlərdən başqa! Onlar heç bir zülm (haqsızlıq) görmədən Cənnətə daxil olacaqlar –

61. Rəhmanın (Allahın) Öz bəndələrinə vəd etdiyi və onların görmədiyi Ədn cənnətlərinə. Onun vədi mütləq yerinə yetəcəkdir.

62. Onlar orada boş (lağlağı) söhbətlər deyil, (mələklərdən və bir-birindən) ancaq: “Salam!” eşidərlər. Ruziləri də səhər-axşam (həmişə) oradadır.

63. Bu, həmin o Cənnətdir ki, bəndələrimizdən müttəqi olanları ona varis edəcəyik.

64. (Cəbrailin bir müddət yanına gəlməməsindən xiffət çəkən Peyğəmbərə Allaha yaxın olan bu əzəmətli mələk belə demişdi: ) “Biz (dünyaya) yalnız sənin Rəbbinin əmri ilə enirik. Önümüzdə, arxamızda və onların arasında nə varsa ancaq Ona məxsusdur. (Keçmişə, indiyə və gələcəyə aid işlər, dünya yaranandan qiyamət gününə qədər baş verəcək hər bir şey məhz Allahın iradəsinə tabedir). Rəbbin (Öz bəndələrini) unudan deyildir”. (Cəbrail Quranı Muhəmməd peyğəmbərə öyrətməyə təhkim olunsa da, Allahın əmri olmadan yerə enib heç bir ayə gətirə bilməz. Onun yer üzünə nə vaxt enməsi, hansı ayəni gətirməsi məhz Allahın buyuruğu ilədir. Allaha isə insandan fərqli olaraq unutmaq xüsusiyyəti yaddır. O, heç zaman bəndələrini unutmaz. İstədiyin bu və ya digər ayənin, vəhyin sənə dərhal nazil olmaması Rəbbindən başqa heç kəsin bilmədiyi müəyyən bir hikməti-ilahi ilə bağlıdır. Ona görə də belə şeydən ötrü ürəyini qısma!)

65. O, göylərin və yerin, onların arasında olan hər şeyin Rəbbidir! Yalnız Ona ibadət et və Onun ibadətinə səbirli ol! Heç (Allahın özündən başqa) Ona bənzərini (Onun adını daşıyan başqa birisini) görmüsənmi? (Müşriklər öz bütlərinə tanrı, ilahi desələr də, heç zaman onlara Allah adını verməzlər).

66. (Qiyaməti inkar edən) insan: “Mən öldükdən sonra (qəbirdən) dirimi çıxardılacağam?” – deyə soruşur.

67. Məgər insan ilk öncə onu heç bir şey deyilkən (yoxdan) yaratdığımızı xatırlamırmı?

68. (Ya Rəsulum!) Rəbbinə and olsun ki, Biz onları (özlərinə dost tutduqları) şeytanlarla birlikdə yığıb məhşərə gətirəcək, sonra onları (qorxudan ayaq üstə dura bilməyib) diz üstə çökmüş halda Cəhənnəmin ətrafına düzəcəyik.

69. Sonra hər bir firqədən Rəhmana ən çox asi olanı dartıb çıxardacağıq (araya gətirəcəyik).

70. Sonra (onlardan) Cəhənnəmə girib yanmağa ən çox layiq olanları, sözsüz ki, Biz daha yaxşı bilirik.

71. Sizdən elə bir kəs olmaz ki, oraya varid olmasın. Bu, Rəbbinin (əzəldən) buyurduğu vacib bir hökmdür. (Bütün insanlar Cəhənnəmin müdhiş mənzərəsini onun körpüsü üstündən keçərkən öz gözləri ilə görəcəklər. Cənnətliklər cəhənnəm odunun içindən yanmadan, sağ-salamat keçəcək, cəhənnəmliklər isə ora düşüb əbədi əzaba məhkum olacaqlar. Bir qism insan da müəyyən müddət orada qalıb günahı təmizlənəcək, sonra Cənnətə qayıdacaqdır).

72. Sonra Biz Allahdan qorxub pis əməllərdən çəkinənlərə nicat verəcək, zalımları isə orada diz üstə çökmüş halda saxlayacağıq!

73. Ayələrimiz özlərinə açıq-aşkar oxunduğu zaman kafir olanlar iman gətirənlərdən: “Bu iki tayfadan hansının (bizim, yoxsa sizin) məqamı daha yaxşı, hansının məclisi daha gözəldir?” – deyə soruşarlar.

74. Halbuki Biz onlardan əvvəl neçə-neçə nəsilləri məhv etdik ki, onlar mal-dövlət və simaca (bu kafirlərdən) daha üstün (daha gözəl) idilər.

75. (Ya Rəsulum!) De: “(Bizdən və sizdən) kim zəlalət içindədirsə, qoy Rəhman ona (öz zəlalətində qalmaq üçün) uzun müddət möhlət versin”. Nəhayət, vəd olunduqları ya əzabı, ya da qiyamət gününü gördükdə onlar kimin məqamının daha pis, kimin tərəfdarlarının daha zəif olduğunu biləcəklər.

76. Allah doğru yolda olanların doğruluğunu artırar. Əbədi qalan yaxşı işlər isə Rəbbinin yanında savab etibarilə daha xeyirli, nəticə etibarilə daha yaxşıdır!

77. (Ya Rəsulum!) Ayələrimizi inkar edib: “(Əgər qiyamət qopsa, axirətdə) mənə mütləq mal-dövlət və övlad veriləcəkdir!” – deyən adamı (As ibn Vaili) gördünmü?

78. Görəsən, o, qeybə vaqif olmuş, yoxsa Rəhmandan (bu barədə) söz (əhd) almışdır?!

79. Xeyr, onun dediklərini (əməl dəftərinə) yazacaq, əzabını artırdıqca artıracağıq.

80. Onun dediyi şeylər (mal-dövləti, övladı) Bizə qalacaq və hüzurumuza tək-tənha gələcəkdir. (Bütün malını və övladını əlindən alacağıq və o məhşərə ilk dəfə dünyaya gəldiyi kimi lüt-üryan, heç kimsiz və heç nəsiz gələcəkdir).

81. (Müşriklər qiyamət günü) onlar üçün şəfaət diləsinlər (yaxud Allahın əzabını onlardan dəf etsinlər) deyə, Allahdan başqa tanrılar qəbul etdilər.

82. Xeyr, (qiyamət günü tanrıları) onların ibadətini danacaq və onlara düşmən olacaqlar.

83. (Ya Rəsulum!) Məgər kafirlərin üstünə onları yoldan çıxarıb günaha sövq edən şeytanları göndərdiyimizi görmədinmi?

84. Elə isə onlardan ötrü (onların tezliklə məhv edilməsinə) tələsmə, çünki Biz onların günlərini bir-bir sayırıq. (Qoy hələ bir az da yaşayıb daha çox günah etsinlər. Biz müəyyən müddətdən sonra onların cəzasını verəcəyik).

85. O gün (qiyamət günü) Biz müttəqiləri Rəhmanın hüzuruna möhtərəm elçilər (şahanə qafilələrlə gələn əziz qonaqlar) kimi cəm edərik.

86. Günahkarları isə Cəhənnəmə susuz vəziyyətdə sürükləyib gətirərik.

87. Rəhmandan əhd almış kəslər istisna olmaqla, qalanları (kafirlər) şəfaət etməyə qadir olmazlar. (Yalnız iman gətirib yaxşı işlər görənlər qiyamət günü Rəhmanın izni ilə şəfaət etməyə layiqdirlər).

88. (Müşriklər: ) "Rəhman özünə övlad götürmüşdür!" – dedilər.

89. Siz, doğrudan da, olduqca pis bir şey etdiniz (çox böyük-böyük danışdınız)!

90. Buna görə az qaldı ki, göylər parçalansın, yer yarılsın və dağlar yerindən qopub uçsun!-

91. (Müşriklərin) Rəhmana övlad isnad etdiklərinə görə!

92. Halbuki Rəhmana özünə övlad götürmək yaraşmaz.

93. Çünki göylərdə və yerdə olan bütün məxluqatdan bir eləsi yoxdur ki, (qiyamət günü) Rəhmanın hüzuruna bir qul kimi gəlməsin.

94. And olsun ki, (Allah) onları (bütün yaratdıqlarını) hesablamış və təkrar-təkrar saymışdır.

95. Onların hamısı qiyamət günü Onun hüzuruna gələcək.

96. Həqiqətən, iman gətirib yaxşı işlər görənlər üçün Rəhman (ürəklərdə) bir sevgi yaradacaq. (Allah həm özü onları dost tutacaq, həm də onların məhəbbətini hamının, o cümlədən möminlərin qəlbinə salacaqdır).

97. (Ey Muhəmməd!) Biz (Quranı) sənin dilinlə asan (hamıya müyəssər) etdik ki, onunla ancaq Allahdan qorxub pis əməllərdən çəkinənlərə (Cənnətlə) müjdə verəsən və inadkar bir camaatı (batil dəlillərlə mübahisə aparan Məkkə müşriklərini Cəhənnəmlə) qorxudasan.

98. Biz onlardan əvvəl neçə-neçə nəsilləri məhv etdik. İndi heç onlardan birini görür, yaxud onlardan bir səs-səmir eşidirsənmi? (Bu müşrikləri də onlar kimi məhv edib kökünü kəsəcəyik).

## .20.
## Taha surəsi

**Məkkədə nazil olmuşdur, 135 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Ta, Ha!

2. Biz Quranı sənə məşəqqət çəkməyin üçün nazil etmədik! (Peyğəmbər ayaq üstə, barmaqlarının ucunda durub o qədər namaz qılmışdı ki, mübarək qıçları şişmişdi).

3. (Biz onu Allahın əzabından) qorxan bir kimsəyə yalnız öyüd-nəsihət olaraq (göndərdik).

4. O, yeri və uca göyləri yaradandan (Allahdan) nazil olmuşdur.

5. Rəhman ərşi yaradıb hökmü altına almışdır (ərşə hakimdir).

6. Göylərdə və yerdə, onların arasında və torpağın altında (yeddi qat yerdə) nə varsa (hamısı) Onundur.

7. (Ey insan!) Sən (dua edərkən) səsini ucaltsan da (ucaltmasan da, heç bir fərqi yoxdur). Çünki Allah sirri də, sirdən daha gizli olanı da (məxfini də) bilir. (Allah nəinki qəlblərin sirlərindən, hətta ani olaraq ürəklərdən keçən gizli niyyətlərdən də xəbərdardır. Buna görə də özünü yorub uca səslə dua, yaxud zikr etmə. Əsas məsələ Allaha edilən ibadətin səmimiyyətidir).

8. Allahdan başqa heç bir tanrı yoxdur. Ən gözəl adlar (əsmayi-hüsna) yalnız Ona məxsusdur!

9. Musanın hekayəti sənə gəlib çatdımı? (Yaxud Musanın əhvalatı artıq sənə gəlib çatdı).

10. (Musa Şüeybi Mədyəndə qoyub anasına və qardaşına baş çəkmək üçün zövcəsi ilə birlikdə Misirə gedərkən Tur dağının qərbində yerləşən Tuva vadisində gecə vaxtı bir uşağı dünyaya gəlmişdi. Onlar zil qaranlıq gecədə işıqsız qalıb yolu itirmişdilər). O zaman (Musa qarşıda) bir od görüb ailəsinə belə demişdi: "Siz (yerinizdə) durun. Mənim gözümə bir od sataşdı. Bəlkə, ondan sizə bir göz gətirdim, yaxud odun yanında bir bələdçi tapdım!"

11. (Musa) odun yanına yetişdikdə belə bir nida gəldi: "Ya Musa!

12. Mən, həqiqətən, sənin Rəbbinəm. Nəleynini çıxart, çünki sən müqəddəs vadidə - Tuvadasan!

13. Mən səni (peyğəmbər) seçdim. (Sənə) vəhy olunanı dinlə!

14. Mən, həqiqətən, Allaham. Məndən başqa heç bir tanrı yoxdur. Mənə ibadət et və Məni anmaq üçün namaz qıl!

15. O saat (qiyamət saatı) mütləq gələcəkdir. Mənim onu az qala açmağım gəlir ki, hər kəs etdiyi əməlin əvəzini (mükafatını, yaxud cəzasını) alsın. (Və ya: Mən onu az qala Özümdən belə gizlədirəm; və ya: Mən onu Özümdən başqa hamıdan gizlədirəm. Yaxud: Mən

onu zorla gizlədirəm, çünki qiyamətin yaxınlaşması hər addımda özünü müxtəlif əlamətlərlə büruzə verir).

16. Ehtiyatlı ol ki, (qiyaməti) danıb nəfsinin istəklərinə uyan bir kəs səni ona inanmaqdan yayındırmasın, yoxsa məhv olarsan!

17. Ya Musa! Sağ əlindəki nədir?”

18. (Musa) dedi: “O mənim əsamdır. Ona söykənir, onunla qoyunlarımı xəzəl silkələyirəm. O, başqa işlərdə də karıma gəlir!”

19. (Allah) buyurdu: “Ya Musa! Onu (əsanı yerə) at!”

20. (Musa əsanı yerə) atan kimi o, dərhal bir ilan (əjdaha) olub sürətlə sürünməyə başladı.

21. (Allah) buyurdu: “Tut onu, qorxma. Biz onu qaytarıb əvvəlki şəklinə salacağıq!

22. Əlini qoltuğunun altına qoy ki, əlin (oradan sənin peyğəmbərliyinin həqiqiliyinə dəlalət edən) başqa bir möcüzə olaraq eyibsiz-qüsursuz, ağappaq çıxsın (günəş şüası kimi gözqamaşdırıcı şəfəq saçsın).

23. Və Biz də (bununla) sənə ən böyük möcüzələrimizdən (bir neçəsini) göstərək.

24. (Ya Musa! Bu möcüzələrlə bir peyğəmbər kimi) Fironun yanına get! O, həqiqətən, azğınlaşıb həddini aşmışdır (Allahlıq iddiasına düşmüşdür)”.

25. (Musa) dedi: “Ey Rəbbim! (Peyğəmbərliyi yerinə yerinə yetirməyə qadir olmaq, Fironla danışmağa cürət etmək və bu yolda bütün məşəqqətlərə tab gətirə bilmək üçün) köksümü açıb genişlət;

26. İşimi yüngülləşdir;

27. Dilimdəki düyünü aç (pəltəkliyimi götür) ki,

28. Sözümü yaxşı anlasınlar!

29. Və mənə öz ailəmdən bir vəzir (köməkçi) ver –

30. Qardaşım Harunu!

31. Onunla arxamı möhkəmləndir.

32. Onu işimə ortaq et (ona da peyğəmbərlik ver) ki,

33. Səni çox təqdis edib şəninə təriflər deyək.

34. Və Səni çox zikr edək (daim yada salıb şükr-səna edək).

35. Sən, şübhəsiz ki, Bizi görürsən!"

36. (Allah) buyurdu: "Dilədiyin sənə verildi, ya Musa!

37. Sənə (bundan əvvəl də) bir dəfə nemət bəxş etmişdik

38. Anana vəhy olunacaq şeyi vəhy etdiyimiz zaman.

39. (O zaman ki, Mən anana buyurmuşdum: ) "(Musanı) bir sandığa qoyub çaya (Nilə) at. Qoy çay onu sahilə çıxartsın və Mənə də, ona düşmən olan birisi (Firon) onu (sudan tapıb) götürsün". (Ya Musa!) Gözümün qabağında boya-başa çatdırılasan deyə, Öz tərəfimdən (insanların ürəklərində) sənə bir sevgi yaratdım. (Mərhəmət nəzərim heç vaxt üstündən əskik olmadı. Elə etdim ki, Firon özü, arvadı Asiyə və ətrafındakıların hamısı səni sevdi).

40. O zaman bacın (sənin ardınca guya yad bir adam kimi saraya) gedib (oradakılara) deyirdi: "Sizə ona baxa biləcək (süd verəcək) birisini göstərimmi?" (Onlar razılıq verdilər, anan saraya gəldi). Artıq (salamat qalmağına görə) gözü aydın olsun və kədərlənməsin deyə, səni anana qaytardıq. Sən (on iki yaşında ikən tayfadan olan bir yəhudi ilə mübahisə edən) bir nəfəri (bir qibtini) vurub öldürdün.

Sonra Biz səni (Mədyənə qaçırtmaqla) o qəmdən qurtardıq. Biz səni bir çox sınaqlardan keçirtdik (cürbəcür bəlalara, möhnətlərə düçar edib hamısından salamat qurtardıq). İllərlə Mədyən əhli içində (Şüeybin yanında) qaldın. Sonra da müəyyən olunmuş vaxta (qırx yaşına) gəlib çatdın, Ya Musa!

41. Və Mən səni Özümə (peyğəmbər) seçdim! (Qırx yaşına çatan kimi sənə peyğəmbərlik bəxş edib möcüzələrlə Fironun yanına göndərdim).

42. Sən və qardaşın möcüzələrimlə gedin və Məni zikr etməkdə zəiflik göstərməyin. (Bu sizin ürəyinizə mətanət, dizinizə qüvvət verər).

43. Fironun yanına yollanın. O (allahlıq iddiasına düşməklə), həqiqətən, azğınlaşıb həddini aşmışdır.

44. Onunla yumşaq danışın. Bəlkə, öyüd-nəsihət qəbul etsin, yaxud (Rəbbindən) qorxsun!”

45. Onlar: “Ey Rəbbimiz! (Fironun möcüzə göstərməyimizə hövsələsi çatmayıb) bizə şiddətli cəza verməsindən və ya azğınlaşaraq həddini aşmasından (dikbaşlıq etməsindən) qorxuruq!” – dedilər.

46. (Allah) buyurdu: “Qorxmayın, Mən də sizinləyəm, (hər şeyi) eşidirəm və görürəm!

47. Onun yanına gedib deyin: “Biz ikimiz də sənin Rəbbinin peyğəmbəriyik. İsrail oğullarını bizimlə göndər (Şama getməklərinə mane olma) və onlara işgəncə vermə. Biz sənin yanına Rəbbindən dəlillə (möcüzə ilə) gəlmişik. Haqq yolu tutub gedənlərə salam olsun!

48. Bizə vəhy olundu ki, (Allahın vəhdaniyyətini və ayələrini, qiyaməti və peyğəmbərləri) yalan hesab edənləri və (haqdan) üz döndərənləri (axirətdə) əzab gözləyir!”

49. (Firon:) “Elədə Rəbbiniz kimdir, ya Musa?” –deyə soruşdu.

50. (Musa) belə cavab verdi: “Rəbbimiz hər şeyə Öz xilqətini verən, sonra da ona doğru yolu göstərəndir!”

51. (Firon) soruşdu: “Bəs əvvəlki nəsillərin halı necədir?”

52. (Musa) belə cavab verdi: “Onlara dair bilik yalnız Rəbbimin dərgahında olan bir kitabdadır (lövhi-məhfuzdadır). Rəbbim (heç bir şeydə) xəta etməz və (heç bir şeyi) unutmaz!”

53. O (böyük Allah) ki, yer üzünü sizin üçün döşəmiş (döşək etmiş), orada sizin üçün yollar salmış, göydən yağmur yağdırmışdır. Biz o yağmurla növbənöv bitkilərdən cütlər yetişdirmişik.

54. (Onlardan nuşcanlıqla) yeyin, həm də heyvanlarınızı otarın. Həqiqətən, bunda (gördüyümüz bu işlərdə) ağıl sahibləri üçün (Allahın vəhdaniyyətinə, qüdrətinə dəlalət edən) əlamətlər vardır!

55. Sizi (ulu babanız Adəmi) də onda (o torpaqdan) yaratdıq. Sizi (öləndən sonra) ora qaytaracaq və (qiyamət günü) bir daha oradan (dirildib) çıxardacağıq.

56. Biz, ayələrimizin (dəlillərimizin və möcüzələrimizin) hamısını ona (Firona) göstərdik. Lakin (Firon) onları yalan sayıb (heç birini) qəbul etmədi.

57. (Firon) dedi: “Ya Musa! Sən sehrinlə bizi öz torpağımızdan (Misirdən) qovub çıxartmağa gəlmisən?

58. Elədə biz sənə eyni ilə onun kimi bir sehr göstərəcəyik. Bizimlə öz aranda bir vaxt təyin et. Nə biz, nə də sən vədimizə xilaf

çıxmayaq. Bu (ikimizə də) əlverişli bir yerdə olsun!” (Görək kim-kimə qalib gələcək!)

59. (Musa) dedi: “Sizə verilən vədə sizin bayram gününüz və camaatın (bir yerə) toplaşacağı günorta vaxtıdır!”

60. (Bu söhbətdən sonra) Firon dönüb getdi, nəhayət, bütün hiylə (və sehr) vasitələrini (sehrbazlarını) yığıb (vəd olunmuş vaxtda həmin yerə) gəldi.

61. Musa onlara (sehrbazlara) dedi: “(Ay yazıqlar!) Vay sizin halınıza! Allaha iftira yaxmayın, yoxsa O sizi əzabla məhv edər. (Allaha) iftira yaxan naümid olar (muradına çatmaz)”.

62. Onlar (bu Musa heç sehrbaza oxşamır; əgər qalib gəlsək, heç; yox əgər qalib gələ bilməsək, ona iman gətirərik, deyə) öz aralarında öz işləri barədə mübahisə edir və xəlvətcə pıçıldaşırdılar.

63. Onlar (uzun-uzadı mübahisədən sonra Musadan və Harundan qorxub astaca bir-birinə) dedilər: “Bu ikisi, əlbəttə, sehrbazdır. Onlar öz sehrləri ilə sizi yurdunuzdan qovub çıxartmaq və sizin ən gözəl yolunuzu (dininizi, təriqətinizi) yox etmək (əyan-əşrafınızı öz tərəflərinə çəkmək) istəyirlər.

64. Ona görə də bütün hiylə (sehr) vasitələrinizi toplayın, sonra da (meydana) səf-səf gəlin. Bu gün qalib gələn nicat tapacaqdır! (Mətləbinə yetişəcəkdir!)”

65. Onlar dedilər: “Ya Musa! (Özün seç). Ya sən (əvvəlcə əsanı yerə) tulla, ya da biz birinci tullayaq!

66. O (Musa) dedi: “Xeyr, (əvvəlcə) siz tullayın!” (Sehrbazlar əllərindəkini yerə atan kimi) onların sehri üzündən birdən (Musaya) elə gəldi ki, onların ipləri və dəyənəkləri hərəkətə gəlib (ilan kimi qarnı üstə) sürünür.

67. Musanın canına qorxu düşdü. (O qorxdu ki, camaat sehrlə möcüzə arasında fərq qoya bilməyib iman gətirməsin).

68. Biz ona belə buyurduq: “Qorxma, üstün gələcək mütləq sənsən!

69. Sağ əlindəki əsanı yerə tulla, onların düzüb qoşduqlarını (bütün kəndirləri və dəyənəkləri bir anda) udsun. Onların düzəltdikləri sehrbaz hiyləsindən (əfsundan) başqa bir şey deyildir. Sehrbaz isə, hara gedirsə getsin, mətləbinə çatmaz!”

70. (Musa əsasını yerə atan kimi o bir əjdahaya dönüb sehrbazların iplərini, kəndirlərini və dəyənəklərini yerli-dibli uddu). Nəhayət, sehrbazlar: “Biz Harunun və Musanın Rəbbinə (rəbbül-aləminə) iman gətirdik!” – deyib səcdəyə qapandılar.

71. O (Firon) dedi: “Mən sizə izin verməmişdən əvvəl siz ona iman gətirdiniz, çünki o, əslində sizə sehr öyrədən böyüyünüzdür. (Heç eybi yoxdur). Mən də sizin əl-ayağınızı çarpaz kəsdirib xurma ağaclarının kötüklərindən asacağam. Onda hansımızın (mən Fironun, yoxsa Musanın Allahının) əzabının daha şiddətli və daha sürəkli olduğunu biləcəksiniz!”

72. (Sehrbazlar) dedilər: “Biz heç vaxt səni bizə gələn bu açıq möcüzələrdən və bizi yaradandan üstün tutmayacağıq. İndi nə hökm edəcəksənsə, et. Sən ancaq bu dünyada hökm edə bilərsən!

73. Biz, həqiqətən, Rəbbimizə iman gətirdik ki, O bizi günahlarımıza və sənin bizi məcbur etdiyin sehrə (sehrlə məşğul olmağımıza) görə bağışlasın. Allah (sən Firondan) daha xeyirli və (Onun günahkarlara verəcəyi əzab) daha baqidir!”

74. Kim Rəbbinin hüzuruna günahkar kimi gələrsə, onu Cəhənnəm (cəhənnəm əzabı) gözləyir. O, orada nə ölər, nə də yaşayar. (Cəhənnəm əhli nə ölü kimi ölü, nə də diri kimi diridir, əbədi əzaba düçar olub bir gün görməz).

75. Kim (Rəbbinin hüzuruna) yaxşı əməllər etmiş bir mömin kimi olaraq gələrsə, belələrini ən yüksək dərəcələr gözləyir –

76. Əbədi qalacaqları, (ağacları) altından çaylar axan Ədn cənnətləri. Bu, (günahlardan) pak olanların (təmizlənənlərin) mükafatıdır.

77. (İzzət və cəlalıma) and olsun ki, Biz Musaya belə vəhy etdik: "Qullarımla gecə yola çıx, (əsanı suya vurmaqla) onlar üçün dənizdə quru bir yol aç. (Fironun) sizə yetişməsindən qorxma, (suya qərq olmaqdan da) əndişəyə düşmə!"

78. Firon öz ordusu ilə onları təqib etdi, dəniz də (şahə qalxan dalğaları ilə) onları (onun əsgərlərini) çulğayıb qərq etdi, özü də necə!

79. Firon (mənəm sizin ən böyük rəbbiniz, deyərək) öz tayfasını yoldan çıxartdı və (onları) doğru yola aparmadı.

80. Ey israil oğulları! Sizi düşməninizdən (Fironun əlindən) xilas etdik. (Tövratın nazil olması üçün) sizə Tur dağının sağ tərəfini vəd buyurduq. Sizə (göydən) qüdrət halvası və bildirçin endirdik!

81. Sizə verdiyimiz ruzilərin təmizindən (halalından) yeyin, lakin bunda həddi aşmayın (israfçılıq, xəsislik və nankorluq etməyin, ehtiyacı olana şəri qayda üzrə kömək göstərin), yoxsa qəzəbimə düçar olarsınız. Qəzəbimə düçar olan isə mütləq uçuruma düşüb bədbəxt (cəhənnəmlik) olar.

82. Şübhəsiz ki, Mən həm də tövbə edib iman gətirəni yaxşı işlər görüb, sonra da doğru yolu tutanı çox bağışlayanam!

83. (Allah buyurdu: ) "Ya Musa! Səni öz camaatından (Tur dağına getdiyin yetmiş kişidən) ayırıb (bu məqama) tələsdirən nə idi?"

84. (Musa) belə cavab verdi: “Onlar da arxamca gəlirlər. Ey Rəbbim! Məndən razı qalasan deyə, hüzuruna tələsdim!”

85. (Allah: ) “Səndən sonra ümmətini imtahana çəkdik. Samiri onları yoldan çıxartdı (buzova sitayiş etdilər)”, - deyə buyurdu.

86. Musa qəzəbli, kədərli halda camaatının yanına qayıdıb dedi: “Ey ümmətim! Məgər Rəbbiniz (Tövratı nazil etmək, keçmiş günahlarınızı bağışlamaq, göydən qüdrət halvası və bildirçin endirmək haqqında) sizə gözəl bir vəd verməmişdimi? Yoxsa (mənim sizdən ayrılmağımdan) uzun bir müddət keçdi? (Nə tez hər şeyi unudub nankor oldunuz?) Yaxud Rəbbinizdən sizə bir qəzəb gəlməsini istəyib mənə verdiyiniz vədə xilaf çıxdınız?”

87. Onlar dedilər: “Biz sənə verdiyimiz vədə öz ixtiyarımızla xilaf çıxmadıq. Amma biz (Firon) tayfasının (bir bayram günü əmanət olaraq aldığımız) zinətlərindən ibarət ağır bir yüklə yüklənmişdik. Onları (“əmanətə xəyanət haramdır” -deyərək günahdan qurtulmaq məqsədilə oda) atdıq. Samiri də bizim kimi (özündə olan bəzək şeylərini oda) atdı”.

88. (Oda atılmış qızıl-gümüş əridikdən sonra Samiri çuxurun içində) onlara böyürən bir buzov heykəli (düzəldib) çıxartdı. (Samiri və onun yoldan çıxartdığı bir neçə kişi) dedilər: “(Ey İsrail oğulları!) Bu sizin tanrınızdır. Musanın da tanrısı budur, lakin unutmuşdur”. (Musa heykəli itirmiş, onu axtarıb tapmaqdan ötrü Tur dağına getmişdir).

89. (Məgər bu cansız heykələ sitayiş edənlər) buzovun onların heç bir sözünə cavab verə bilmədiyini və onlara nə bir zərər, nə də bir xeyir verməyə qadir olmadığını görmürdülərmi?! (Nə böyük cəhalət!)

90. Harun isə bundan (Musa Tur dağından qayıtmamışdan) əvvəl onlara belə demişdi: “Ey ümmətim! Siz bununla (hansınızın əqidəcə

möhkəm, hansınızın şəkkak olduğunu ayırd etmək məqsədilə Allah tərəfindən) yalnız imtahana çəkildiniz. Sizin Rəbbiniz, şübhəsiz ki, Rəhmandır. Mənə tabe olub əmrimə itaət edin!”

91. Onlar: “Musa (Tur dağından) qayıdıb yanımıza gələnə qədər bu buzova sitayiş etməkdən əl çəkməyəcəyik!” – deyə cavab vermişdilər.

92. (Musa ümmətinin yanına qayıtdıqdan sonra) dedi: “Ya Harun! Onların (haqq yoldan) azdıqlarını gördüyün zaman sənə nə mane oldu ki,

93. (Möminləri də götürüb) arxamca gəlmədin? (Mənə bu barədə heç bir xəbər vermədin, yaxud mənim yolumla gedərək bütə tapınanları danlayıb onlara qarşı hiddətlənmədin?) Əmrimə asimi oldun? (Allahdan başqasına ibadət edənlərlə bir yerdə yaşamağı özünə nə cür rəva bildin?)”

94. (Harun) belə cavab verdi: “Ey anam oğlu! Saçımdan, saqqalımdan tutma. (Saqqalımı, başıma yolma). Doğrusu, sənin: “İsrail oğulları arasına ayrılıq saldın, sözümə baxmadın!” – deyəcəyindən qorxdum.

95. (Musa: ) “Ey Samiri! Sənin (bu pis, əcaib işi görməkdə) məqsədin nə idi?” – deyə soruşdu.

96. (Samiri) belə cavab verdi: “Mən (İsrail oğullarının) görmədiklərini (Cəbraili) gördüm (yaxud bilmədiklərini bildim). Mən o Rəsulun (Allah elçisinin) ləpirindən (Cəbrailin atının ayağı dəydiyi yerdən) bir ovuc torpaq götürdüm və onu (çaladakı od içində əriyən bəzək şeylərinə) atdım (o da dönüb böyürən bir buzov oldu). Beləcə, öz nəfsim məni bu işə sövq etdi”. (Nəfsim bu işi mənə xoş göstərdi, mən də ona uydun).

97. (Musa) dedi: “Çıx get burdan. Həyatın boyu (cəza olaraq): “Bir kəs mənə toxunmasın (mən də bir kəsə toxunmayım)!” – deməli olacaqsan. (Heç kəs səni dindirməyəcək, süfrəsinə buraxmayacaq, səninlə alış-veriş etməyəcək. Heç kəslə ünsiyyət etməyib tamamilə təcrid olunmuş bir vəziyyətdə yaşayacaqsan. Dəhşət səni bürüyəcək). Hələ səni əsla qaçıb canını qurtara bilməyəcəyin daha bir vədə (qiyamət günü) gözləyir. İndi tapınıb durduğun tanrına (bütünə) bax. Biz onu yandıracaq, sonra da (külünü) dənizə atacağıq!

98. Sizin tanrınız ancaq O Allahdır ki, Ondan başqa heç bir tanrı yoxdur. O, elm (Öz əzəli elmi) ilə hər şeyi ehtiva etmişdir!”

99. (Ya Rəsulum!) Keçmişin xəbərlərinin (olub keçənlərin) bir qismini sənə belə nəql edirik. Sənə Öz dərgahımızdan (insanların düşünüb daşınması, ibrət alması üçün) Quran da vermişik!

100. Hər kəs ondan üz döndərsə, şübhəsiz ki, qiyamət günü ağır bir günaha yüklənəcəkdir.

101. Belələri (o günah yükünün) altında (yükü ilə birlikdə Cəhənnəm əzabında) əbədi qalacaqlar. Qiyamət günü onların daşıyacağı yük necə də pisdir!

102. Surun (ikinci dəfə) çalınacağı və günahkarları (qorxudan, yaxud susuzluqdan) gözləri göm-göy göyərmiş (və ya gözləri kor olmuş, üzləri qapqara qaralmış) halda məhşərə gətirəcəyimiz gün

103. Onlar öz aralarında pıçıldaşıb bir-birinə: “(Dünyada) cəmi on gün qaldınız!” deyəcəklər.

104. Biz onların nə danışacaqlarını da yaxşı bilirik. Onların ən ağıllısı: “(Dünyada) cəmisi bir gün qaldınız!” – deyəcək.

105. (Ya Rəsulum!) Səndən dağlar (qiyamət günü dağların nə cür olacağı) haqqında soruşarlar. De: “Rəbbim onları ovxalayıb havaya sovuracaq;

106. Dümdüz (hamar) bir yer edəcək (heç bir şey bitməyən qupquru torpaq halına salacaq);

107. Və sən orada heç bir eniş-yoxuş (əyrilik, kələ-kötürlük) görməyəcəksən!”

108. O gün insanlar (qəbirlərindən qalxıb) heç bir başqa tərəfə meyl etmədən carçının (hamını məhşərə çağıran İsrafilin) ardınca gedəcəklər. Rəhmanın (əzəməti, heybəti) qarşısında səslər kəsiləcək, yalnız pıçıltı eşidəcəksən!

109. O gün Rəhmanın izin verdiyi və söz danışmağına razı olduğu kəslərdən başqa heç kimin şəfaəti fayda verməz!

110. (Rəbbin) onların keçmişini də, gələcəyini də bilir. (Allah insanların nə etdiklərini, nə edəcəklərini, qazanacaqları savabları və günahları, dünyada və axirətdə aqibətlərinin necə olacağını Öz əzəli elmi ilə bilir). Onların elmi isə Onu (Allahın zatını) əhatə edib qavraya bilməz!

111. (O gün) üzlər (bütün insanlar) əzəli, əbədi olan (məxluqatın hər işini yoluna qoyan, onları dolandıran) Allaha təslim olub zəlil bir görkəm alar. Zülmə (günaha) yüklənən (Allaha şərik qoşan, küfr edən) ziyana düşüb mətləbinə yetişməz (ümidsizliyə uğrayar).

112. Mömin olub yaxşı işlər görən kəs isə nə zülmə məruz qalmaqdan, nə də (mükafatının) əskilməsindən qorxar!

113. (Ya Rəsulum!) Biz onu (sənə göndərilən ilahi Kitabı) ərəbcə Quran olaraq nazil etdik. Biz orada (kafirlərə əzab veriləcəyinə dair) təhdidləri (cürbəcür misallarla) təkrar-təkrar izah etdik ki, bəlkə,

onlar pis əməllərindən çəkinsinlər, yaxud (onu öyüd-nəsihətlərindən) ibrət alsınlar! (Quran onlara öyüd-nəsihət versin!)

114. Həqiqi hökmdar olan Allah (hər şeydən) ucadır! (Müşriklərin Ona aid etdikləri sifətlərdən uzaqdır!) Həm də (ey Peyğəmbərim! Cəbrail tərəfindən) sənə tamam-kamal vəhy olunmadan əvvəl Quranı oxumağa tələsmə və: “Ey Rəbbim! Mənim elmimi artır!” – de.

115. Doğrusu, bundan əvvəl Adəmə də (Şeytana uymamağı) tövsiyə etmişdik. Lakin o (tövsiyəmizi) unutdu və Biz onda (əhdi qorumağa) əzm (səbat) görmədik.

116. Bir zaman mələklərə: “Adəmə (təzim, hörmət məqsədilə) səcdə edin!” – deyə buyurmuşduq. İblisdən başqa hamısı səcdə etdi. O, (səcdədən) boyun qaçırtdı.

117. Biz də belə dedik: “Ey Adəm! Bu (İblis) sənin də, övrətinin də düşmənidir. (Ehtiyatlı olun ki) sizi (tovlayıb) Cənnətdən çıxartmasın, yoxsa (ey Adəm!) məşəqqətə düşüb bədbəxt olarsan! (Gecə-gündüz əziyyət çəkib öz əlinin zəhməti ilə yaşamağa məcbur olarsan!)

118. Həqiqətən, sən orada (Cənnətdə) acmaq nədir, çılpaq olmaq nədir bilməzsən!

119. Sən orada susamaq nədir, günəşin hərarətindən əziyyət çəkmək nədir, onu da bilməzsən!”

120. (Allahın bütün bu xəbərdarlığından sonra) Şeytan ona (Adəmə) vəsvəsə edib (pıçıldayıb) belə dedi: “Ey Adəm! Sənə (meyvəsindən yeyəcəyin təqdirdə heç vaxt ölməyəcəyin və həmişə Cənnətdə yaşayacağın) əbədiyyət ağacını və köhnəlib xarab olmayacaq (fənaya uğramayacaq) bir mülkü göstərimmi?”

121. (Adəm və Həvva) ondan (həmin ağacın meyvəsindən) yedilər və dərhal hər ikisinin ayıb yerləri göründü. Onlar (lüt bədənlərinə)

cənnət ağaclarının yarpaqlarından yapışdırmağa başladılar. Beləliklə, Adəm Rəbbinin əmrindən çıxdı, amma mətləbinə yetmədi. (Adəm Rəbbinə asi oldu və yoldan çıxdı. Qadağan olunmuş ağacın meyvəsindən yemək heç də onu Cənnətdə əbədi qalmaq arzusuna çatdırmadı, əksinə, Həvva ilə birlikdə yer üzünə endirildi).

122. Sonra Rəbbi (tövbə etdirməklə) onu seçdi (Özünə yaxınlaşdırdı), tövbəsini qəbul buyurdu və doğru yola müvəffəq etdi.

123. (Allah Adəmə və Həvvaya) belə buyurdu: “Bir-birinizə (siz İblisə və nəslinə, İblis də sizə və nəslinizə) düşmən kəsilərək hamınız oradan (Cənnətdən yerə) enin. Məndən sizə doğru yolu göstərən bir rəhbər (kitab, yaxud peyğəmbər) gəldiyi zaman hər kəs Mənim haqq yolumu tutub getsə, nə (dünyada) yolunu azar, nə də (axirətdə) bədbəxt olar!

124. Hər kəs Mənim öyüd-nəsihətimdən (Qurandan) üz döndərsə, güzəranı daralar (yaxud qəbir evində şiddətli əzaba düçar olar) və Biz qiyamət günü onu məhşərə kor olaraq gətirərik!”

125. O belə deyər: “Ey Rəbbim! Nə üçün məni məhşərə kor olaraq gətirdin, halbuki mən (dünyada hər şeyi) görürdüm!”

126. (Allah) buyurar: “Elədir, amma sənə ayələrimiz (möcüzələrimiz, qüdrətimizə dəlalət edən əlamətlər) gəldi, sən isə (özünü görməməzliyə vurub) onları unutdun (iman gətirmədin). Bu gün eləcə də sən unudulacaqsan!”

127. Biz (Allaha şərik qoşmaqla, küfr etməklə) həddi aşanları və Rəbbinin ayələrinə iman gətirməyənləri də belə cəzalandırırıq. Axirət əzabı isə, şübhəsiz ki, daha şiddətli, daha sürəklidir!

128. Məgər (kafirlərə) bəlli olmadımı ki, Biz onlardan əvvəl (indi) məskənlərində gəzib dolandıqları neçə-neçə nəsilləri məhv etdik?

Həqiqətən, bunda (keçmiş ümmətlərin giriftar olduğu müsibət və fəlakətlərdə) ağıl sahibləri üçün ibrətlər vardır!

129. Əgər Rəbbindən (bu ümmətin əzabının axirətə saxlanılması haqda) öncə bir söz (hökm) və (lövhi-məhfuzda bu kafirlərin əzabı üçün əzəldən) müəyyən edilmiş bir vaxt olmasaydı, şübhəsiz ki, (dünyada tezliklə) onlara da (belə bir əzab) verilməsi lazım gələrdi.

130. (Ya Rəsulum! Elədə Məkkə müşriklərinin) dediklərinə səbr et. Günəş doğmamışdan və batmamışdan əvvəl Rəbbinə şükür edib şəninə təriflər de (sübh və əsr namazlarını qıl), gecənin bir vədəsində (axşam və gecə saatlarında) və günorta radələrində də Rəbbini öyüb təqdis et (şam, gecə və günorta namazlarını qıl) ki, (bunun müqabilində Allahın səni böyük savaba, yüksək dərəcələrə, yaxud ümmətin üçün şəfaətə nail etməsindən) razı (xoşhal) olasan!

131. (Kafirlərin) bəzi zümrələrini sınamaq üçün onlara dünya həyatının zinəti olaraq verdiyimiz mal-dövlətə rəğbət gözü ilə baxma! (Gözünü dikmə!) Rəbbinin ruzisi (bərəkəti) həm daha xeyirli, həm də daha baqidir (sürəklidir, əbədidir)!

132. Əhlinə (əhli-beytə və ümmətinə) namaz qılmağı əmr et, özün də ona (namaza) səbirlə davam et (yaxud məişət çətinliklərinə döz). Biz səndən ruzi istəmirik, (əksinə) sənə ruzi verən Bizik. (Gözəl) aqibət təqva sahiblərinindir (müttəqilərindir)!

133. (Kafirlər) dedilər: “Nə üçün o (Muhəmməd) Rəbbindən bizə (həqiqi peyğəmbər olmasına dəlalət edən) bir möcüzə gətirmir?” Məgər (Quranda) onlara əvvəlki (ilahi) kitablarda (keçmiş ümmətlərin həyatına, küfrləri üzündən düçar olduqları müsibətlərə dair) olanların bəyanı (yaxud açıq-aşkar dəlili) gəlmədimi?!

134. Əgər Biz onları (Məkkə müşriklərini) bundan (Peyğəmbər və Quran gəlməzdən) əvvəl əzabla məhv etsəydik, (qiyamət günü)

mütləq belə deyəcəkdilər: "Ey Rəbbimiz! Nə üçün zəlil və rüsvay olmazdan əvvəl bizə bir peyğəmbər göndərmədin ki, Sənin ayələrinə (hökmlərinə) tabe olaydıq?!

135. (Ya Rəsulum!) De: "Hamı (axirət) gözləməkdədir, siz də gözləyin. (Qiyamət günü) doğru yol sahiblərinin kimlər (biz, yoxsa siz) olduğunu və kimin haqq yolu tapdığını (hidayətə yetişdiyini) biləcəksiniz!"

## .21.

## əl-Ənbiya (Peyğəmbərlər) surəsi

**(Məkkədə nazil olmuşdur, 112 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. İnsanların haqq-hesab vaxtı (qiyamət günü) yaxınlaşdı, onlar isə hələ də qəflət içindədirlər və (qiyamətə inanmaqdan) üz döndərirlər. (Qiyamət insanlar üçün nə qədər uzaq isə, Allahın dərgahında bir o qədər yaxındır. Fani dünyaya, şan-şöhrətə olan meyl, varlanmaq həvəsi insanların başını elə qatmışdır ki, qiyamət günü barəsində əsla fikirləşmirlər).

2. Rəbbindən onlara (bir-birinin ardınca) elə bir yeni xəbərdarlıq (öyüd-nəsihət) gəlməz ki, onu məsxərəyə qoyub dinləməsinlər;

3. Qəlbləri qəflət içində olaraq (ona qulaq asmasınlar). Zalımlar öz aralarında gizli pıçıldaşıb (bir-birinə): "Bu (Muhəmməd) sizin kimi ancaq adi bir insandır. (Onun gətirdiyi Quran sehrdən, cadudan başqa bir şey deyildir). Gözünüz görə-görə sehrəmi uyursunuz?" – dedilər.

4. (Peyğəmbər Məkkə müşriklərinə) belə dedi: "Rəbbim göydə və yerdə (söylənən) hər sözü bilir. O, (hər şeyi) eşidəndir, biləndir!"

5. Onlar (müxtəlif fikirlərə düşərək) belə dedilər: "Xeyr, (bu Quran) qarmaqarışıq yuxulardır; xeyr, onu özü uydurmuşdur; xeyr, o, bir

şairdir. (Əgər o, həqiqi peyğəmbərdirsə, bunu sübut etmək üçün) qoy əvvəlki peyğəmbərlərə göndərilən möcüzələr kimi bizə bir möcüzə gətirsin!”

6. Onlardan əvvəl məhv etdiyimiz heç bir məmləkət (əhli möcüzələrlə gəlmiş peyğəmbərlərinə) iman gətirmədi. Bunlarmı iman gətirəcəklər?

7. (Ya Rəsulum! Biz səndən əvvəl də hər bir ümmətə mələk deyil) ancaq kişilər (kişi peyğəmbərlər) göndərdik ki, onlara vəhy edirdik. Əgər bilmirsinizsə, zikr (kitab) əhlindən soruşun!

8. Biz onları (peyğəmbərləri) yeməz-içməz (yemək yeməz) bir bədən yaratmadıq. Onlar (dünyada) əbədi də deyillər.

9. Sonra onlara verdiyimiz vədi yerinə yetirdik. (Peyğəmbərlərə) və istədiyimiz kəslərə (onlara iman gətirənlərə) nicat verdik, (Allaha şərik qoşmaqla, küfr etməklə) həddi aşanları isə məhv etdik.

10. Həqiqətən, sizə (Qüreyş əhlinə) elə bir Kitab nazil etdik ki, o sizdən ötrü bir şərəfdir. (O sizin qədir-qiymətinizi yüksəldər, dini və dünyəvi ehtiyaclarınızı aradan qaldırar, ürəkdən inananlara behişt yolunu göstərər. Halal-haramı daim möminlərin yadına salar). Məgər dərk etmirsinizmi?

11. Biz zalım olan (küfr edən) neçə-neçə məmləkəti (məmləkət əhlini) məhv etdik və onlardan sonra başqa bir qövm (camaat) yaratdıq.

12. Onlar əzabımızı (onları məhv edəcəyimizi) hiss edən kimi dərhal oradan (öz yurdlarından) qaçmağa üz qoydular.

13. (Mələklər istehza ilə onlara belə dedilər: ) “Qaçmayın, kef çəkdiyiniz yerə, məskənlərinizə qayıdın”. Yəqin ki, (hara

getmişdiniz; mal-dövlətiniz, cəh-cəlalınız necə oldu, deyə) sorğu-sual ediləcəksiniz!

14. Onlar (nicat tapmaqdan ümidlərini üzüncə): “Vay halımıza! Biz, həqiqətən, zalım olmuşuq (Rəbbimizə küfr etməklə özümüz özümüzə zülm etmişik)”, - dedilər.

15. Biz onları ot kimi biçənəcən (külə döndərənəcən) elə bu sözləri deyib dururdular (nalə çəkirdilər).

16. Biz göyü, yeri və onlar arasında olanları oyun-oyuncaq yaratmadıq. (Kainat əbəs yerə deyil, Allahın qüdrətinin təcəssümü kimi yaradılmışdır. Buna görə də insanlar yalnız onun xaliqi Allaha ibadət etməlidirlər).

17. Əgər Biz (Özümüzə) əyləncə etmək (arvad-uşaq düzəltmək) istəsəydik, onu mütləq Öz dərgahımızdan (mələklərdən, hurilərdən) edərdik. Lakin Biz (bunu) etmədik. (Çünki Allaha, insanlardan fərqli olaraq, əylənmək, Özünə övlad götürmək, yaxud kimisə Özünə yoldaş etmək yaraşmaz).

18. Xeyr, Biz batili haqla (küfrü imanla) rədd edərik (haqqı batilin təpəsinə atarıq) və o da onu (batili) yox edər. (Bir də baxıb görərsiniz ki) o yox olub getmişdir. (Batil sözlərlə Allaha) isnad etdiyiniz sifətlərə görə vay halınıza!

19. Göylərdə və yerdə olan (bütün) məxluqat Onundur (Allahın qüdrət əsəridir). Onun dərgahında olanlar (rütbə və şərəf etibarilə mənən Allaha yaxın mələklər) Ona ibadət etməyə təkəbbür göstərməz və (bu ibadətdən) yorulmaq bilməzlər.

20. Onlar gecə-gündüz, yorulub-usanmadan (Rəbbini) təqdis edib şəninə təriflər deyərlər.

21. Yoxsa (Məkkə müşrikləri) yerdən (yerdə mövcud olan daş, qızıl-gümüş və s. -dən özləri üçün) tanrılar qəbul etdilər ki, onlar ölüləri dirildəcəklər? (Xeyr, Allahdan başqa heç kəs (ölüləri) dirildib məhşərə gətirməyə qadir deyildir!)

22. Əgər (yerdə və göydə) Allahdan başqa tanrılar olsa idi, onların ikisi də (müvazinətdən çıxıb) fəsada uğrayardı. Ərşin sahibi olan Allah (müşriklərin Ona) aid etdikləri sifətlərdən tamamilə uzaqdır!

23. (Allah) gördüyü işlər barəsində sorğu-sual olunmaz; onlar (bütün bəndələr) isə (tutduqları əməllərə görə) sorğu-sual ediləcəklər.

24. Yoxsa (müşriklər özləri üçün) Ondan (O Allahdan) başqa tanrılar qəbul etdilər? (Ya Rəsulum!) De: “(Etdiyiniz əməlin düzgünlüyünü sübut edən) dəlilinizi gətirin. Bu mənimlə onların (ümmətimin) Kitabı (Quran), bu da məndən əvvəlkilərin kitabı (Tövrat və İncil)! Xeyr, onların əksəriyyəti haqqı bilməz və buna görə də (ondan) üz döndərər!”

25. (Ya Rəsulum!) Səndən əvvəl elə bir peyğəmbər göndərmədik ki, ona: “Məndən başqa heç bir tanrı yoxdur. Buna görə də yalnız Mənə ibadət edin!” – deyə vəhy etməyək.

26. (Kafirlər: ) “Rəhman (mələklərdən Özünə) övlad götürdü!” – dedilər. O, pakdır, müqəddəsdir! (Belə şeylərdən tamamilə uzaqdır!) Xeyr, (mələklər Onun övladı deyil, xəlq etdiyi) möhtərəm qullardır.

27. (Mələklər) Ondan qabaq söz danışmaz, Yalnız Onun əmri ilə iş görərlər.

28. (Allah) onların öndəkilərini də, arxalarındakını da (nə etdiklərini və nə edəcəklərini) bilir. Onlar yalnız (Allahın) razı olduğu (izin verdiyi) kəslərdən ötrü şəfaət edə bilər və Onun heybətindən qorxarlar.

29. (Mələklərdən) heç kəs: “Mən Ondan başqa bir tanrıyam!” – desə, onu Cəhənnəmlə cəzalandırarıq. Biz zalımlara belə cəza veririk.

30. Məgər kafir olanlar göylə yer bitişik ikən Bizim onları ayırdığımızı, hər bir canlını sudan yaratdığımızı bilmirlərmi?! Yenə də iman gətirməzlər? (Göylər ilk yaradılışda bir-birinə bitişik bir təbəqə olduğu halda, onların arası hava ilə açılıb yeddi təbəqəyə ayrılmış, yer də bir təbəqə ikən sonra yeddi təbəqəyə bölünmüşdür. Bu, Allahın qüdrətini, əzəmətini sübut edən ən tutarlı dəlillərdəndir).

31. Yer onları silkələməsin (atıb-tutmasın) deyə, orada möhkəm (durmuş) dağlar yaratdıq; onlar (istədikləri yerə) rahat gedib çata bilsinlər deyə, orada geniş yollar əmələ gətirdik.

32. Göyü (yerdən ötrü və onun üstünə düşməsin deyə) qorunub saxlanılan bir tavan etdik. Halbuki (kafirlər) ayələrimizdən (vəhdaniyyətimizi, qüdrətimizi sübut edən bu dəlillərdən) üz döndərdilər.

33. Gecəni və gündüzü də, Günəşi və Ayı da yaradan Odur. Onların (həmçinin ulduzların) hər biri (özünə məxsus) bir göydə üzür (öz hədəqəsində, öz dairəsində hərəkət edir).

34. (Ya Rəsulum!) Səndən əvvəl də (dünyada) heç bir bəşərə əbədiyyət (ölməzlik) vermədik. Belə olduğu təqdirdə, sən ölsən, onlar dirimi qalacaqlar?!

35. Hər bir kəs (hər bir canlı) ölümü dadacaqdır. (Dözüb-dözməyəcəyinizi, şükür edəcəyinizi, yaxud nankor olacağınızı) yoxlamaq məqsədilə Biz sizi şər və xeyirlə (xəstəlik, yoxsulluq, ehtiyac və sağlamlıq, var-dövlət və cah-cəlalla) imtahana çəkərik. Və siz (qiyamət günü əməllərinizin əvəzini almaq üçün) ancaq Bizim hüzurumuza qaytarılacaqsınız!

36. (Ya Rəsulum!) Kafir olanlar səni gördükləri zaman ancaq məsxərəyə qoyaraq (bir-birinə): “Sizin tanrılarınıza tənə edən bumudur?” – deyərlər. Halbuki onlar, məhz onlar Rəhmanın öyüd-nəsihətini (Quranı) inkar edirlər.

37. İnsan tələsən (hövsələsiz) yaradılmışdır. (İnsan təbiəti etibarilə hövsələsizdir, tələskəndir. Allahın əzabının tez gəlməsini istəyən müşriklər kimi). Ayələrimi (Peyğəmbərin dediyi sözlərin düzgün olmasını, əzabımı tezliklə) sizə göstərəcəyəm. Hələ Məni tələsdirməyin!

38. Onlar (kafirlər): “Əgər siz doğru danışırsınızsa, bu vədin (əzabın, yaxud qiyamətin) nə vaxt olacağını bildirin!” – deyirlər.

39. Kaş kafirlər atəşi üzlərindən və arxalarından dəf edə bilməyəcəkləri və onlara heç bir kömək olunmayacağı vaxtı (qiyaməti) biləydilər! (Əgər bilsəydilər, belə bir sual verməz, həm də Allahın əzabının tezliklə gəlməsini istəməzdilər).

40. Xeyr, (qiyamət) onları gözlənilmədən yaxalayar və şaşırdar (mat-məbhut edər). (Kafirlər) onu əsla geri qaytara bilməzlər və onlara (tövbə, üzrxahlıq üçün) möhlət də verilməz!

41. (Ya Rəsulum!) Səndən əvvəl də peyğəmbərlərə istehza edilmişdi. İstehza edənləri məsxərəyə qoyduqların şeyin özü (peyğəmbərlərin onları qorxutduğu əzab) məhv etdi.

42. De: “Sizi gecə (yatdığınız vaxt) və gündüz (gəzib dolandığınız zaman) Rəhmandan (Rəhmanın əzabından) kim qurtara bilər?” Amma onlar Rəbbinin öyüd-nəsihətindən (Qurandan) üz döndərdilər.

43. Yoxsa onların Bizdən başqa (əzabı) onlardan dəf edə biləcək tanrıları vardır?! Onlar (o tanrılar) heç özlərinə belə yardım etməyə qadir olmaz, Bizdən də (əzabımızdan da) qoruna bilməzlər. (Və ya: Bizdən də dəstək görə bilməzlər).

44. Doğrusu, Biz bununla (bu kafirlərə) və atalarına ömürləri uzanıncaya qədər (dünyada) gün-güzəran verdik. (Onlar fani dünya malına aldanıb məğrur oldular). Məgər Bizim (onların) torpağına girib onu hər tərəfdən əskiltdiyimizi (gündən-günə yurdlarının müsəlmanların əlinə keçdiyini) görmürlərmi? Belə olduqda, qalib olanlar onlarmıdır?!

45. (Ya Rəsulum!) De: "Mən sizi ancaq vəhy ilə qorxuduram". Karlar qorxudulduğu zaman çağırışı eşitməzlər!

46. Həqiqətən, əgər Rəbbinin əzabından az bir şey onlara toxunsa, onlar mütləq: "Vay halımıza! Biz, doğrudan da, zalım olmuşuq (Allaha şərik qoşmaqla, küfr etməklə özümüz özümüzə zülm etmişik)" – deyəcəklər.

47. Biz qiyamət günü üçün ədalət tərəzisi qurarıq. Heç kəsə əsla haqsızlıq edilməz. Bir xardal dənəsi ağırlığında olsa belə onu (hər hansı bir əməli tərəziyə) gətirərik. Haqq-hesab çəkməyə Biz kifayətik.

48. Biz Musa və Haruna Furqanı (haqqı batildən ayıran Tövratı doğru yolu göstərən) bir nur və müttəqilərdən ötrü öyüd-nəsihət olaraq vermişdik.

49. O kəslərdən ötrü ki, onlar öz Rəbbindən Onu görmədən (yaxud Allahın axirətdə verəcəyi əzabdan) qorxar və qiyamətdən lərzəyə gələrlər.

50. Bu (Quran) nazil etdiyimiz mübarək (insanlara daim xeyir-bərəkət gətirən) bir Kitabdır. İndi siz onu inkarmı edirsiniz?

51. Biz daha öncə İbrahimə də doğru yolu nəsib etmişdik (peyğəmbərlik ehsan buyurmuşduq). Biz onu (onun buna layiq olduğunu) bilirdik.

52. (İbrahim) atasına və tayfasına: “Sizin tapınıb durduğunuz bu heykəllər nədir?” – dediyi zaman

53. Onlar: “Biz atalarımızı onlara ibadət edən gördük!” – deyə cavab vermişdilər.

54. (İbrahim onlara: ) “And olsun ki, siz də, atalarınız da (haqq yoldan) açıq-aşkar azmısınız!” – demişdi.

55. Onlar: “Sən bizə ciddi deyirsən, yoxsa zarafat edirsən? (Sən bizə haqlamı gəldin, yoxsa oyunbazlardansan?)” – deyə soruşduqda

56. (İbrahim) belə cavab vermişdi: “Xeyr, Rəbbiniz göylərin və yerin Rəbbidir ki, onları yaratmışdır. Mən də buna şahidlik edənlərdənəm!

57. Allaha and olsun ki, siz çıxıb getdikdən sonra bütlərinizə bir hiylə quracağam! (Başlarına bir oyun açacağam!)”

58. (Onlar gedən kimi İbrahim bütləri) parça-parça edib yalnız onların böyüyünü saxladı ki, bəlkə, qayıdıb ona baş çəkdilər. (Qoy anlasınlar ki, bu dilsiz-ağılsız bütlər nəinki başqalarını, hətta özlərini belə qorumağa qadir deyillər. Buna görə də onlara ibadət etmək ən böyük günahdır).

59. (Onlar qayıdan kimi işin nə yerdə olduğunu görüb) dedilər: “Bunu tanrılarımıza kim edibsə, o, şübhəsiz ki, zalımlardandır!”

60. (Müşriklərin bəziləri:) “İbrahim deyilən bir gəncin onları pislədiyini eşitmişik!” – dedilər.

61. (Qalanları: ) “Bunların şahidlik edə bilmələri üçün onu (tapıb) camaatın gözü qabağına gətirin!” – dedilər.

62. (Müşriklər İbrahimi tapıb gətirərək:) “Ya İbrahim! Tanrılarımızı sənmi bu günə saldın?” - deyə soruşdular.

63. (İbrahim sındırmadığı iri bütü göstərib:) “Bəlkə, onların bu böyüyü bunu etmişdir. Əgər danışa bilirlərsə, özlərindən soruşun!” – deyə cavab verdi.

64. Bunun nəticəsində onlar (ağıllarını başlarına yığıb) öz-özlərinə müraciətlə: “Siz, doğrudan da, zalımlarsınız (dilsiz-ağılsız, heç özlərini belə qorumağa qadir olmayan bütlərə tapınmaqla özünüz özünüzə zülm edirsiniz)”, - dedilər.

65. Sonra (mübahisədə aciz qaldıqlarını görüb) yenə də öz küfrlərinə (başlarında olan əski etiqada) qayıdaraq (İbrahimə): “Axı sən bilirsən ki, bunlar danışmırlar!” – dedilər.

66. (İbrahim) dedi: “Elə isə Allahı qoyub sizə heç bir xeyir və zərər verə bilməyən bütlərəmi ibadət edirsiniz?

67. Tfu sizə də, Allahdan başqa ibadət etdiyiniz bütlərə də! Əcaba, (etdiyiniz əməllərin qəbahətini) anlamırsınız?”

68. (Nəmrud və ətrafındakılar öz camaatına) belə dedilər: “Əgər (tapındıqlarınıza yardım göstərmək, onları xilas etmək üçün) bir iş görəcəksinizsə, onu (İbrahimi) yandırın və tanrılarınıza kömək edin!”

69. Biz də: “Ey atəş! İbrahimə qarşı sərin və zərərsiz ol! (Hətta soyuğun belə ona zərər yetirməsin!)” – deyə buyurduq.

70. Onlar (İbrahimə) hiylə qurmaq istədilər, lakin Biz onları (cürbəcür müsibətlərə düçar etməklə, xüsusilə üstlərinə ətlərini yeyib qanlarını içən həşərat göndərməklə) daha çox ziyana uğratdıq.

71. Biz onu da (İbrahimi də), (qardaşı oğlu) Lutu da (Nəmrud tayfasının əlindən qurtarıb) aləmlər üçün mübarək etdiyimiz (torpağında bəşər övladına bərəkətlər verdiyimiz) yerə (Şama) qovuşdurduq.

72. Biz ona (İbrahimə) İshaqı, üstəlik Yəqubu da bəxş edib onların hamısını saleh kimsələr etdik.

73. Biz onları əmrimizlə (insanları) doğru yola gətirən imamlar (rəhbərlər) etdik. Biz onları xeyirli işlər görməyi, namaz qılmağı və zəkat verməyi vəhy etdik. Onlar yalnız Bizə ibadət edirdilər.

74. Biz Luta da bir hökm (hikmət, peyğəmbərlik; çətin məsələləri həll edib hökm çıxartmaq) və elm verdik, onu (əhalisi) çirkin işlər görən bir məmləkətdən (çıxardıb) xilas etdik. Həqiqətən, onlar pis, fasiq (Allaha asi olan, pozğun) bir tayfa idilər.

75. Biz onu mərhəmətimizə qovuşdurduq, çünki o, doğrudan da, saleh kimsələrdən idi.

76. (Ya Rəsulum!) Nuhu da (yad et)! O daha öncə (öz kafir ümmətinin əzaba düçar olması haqqında) yalvarıb dua etmişdi. Biz onun duasını qəbul buyurmuş, onu da, ailəsini də böyük fəlakətdən (tufandan) qurtarmışdıq!

77. Biz ayələrimizi yalan hesab edən bir qövmə qarşı ona yardım göstərmişdik. Onlar, həqiqətən, pis bir camaat idilər. Buna görə də Biz onların hamısını (suya) qərq etdik.

78. (Ya Rəsulum!) Davudu və Süleymanı da (yad et)! O zaman ki, onlar bir tayfanın qoyunlarının girib xarab etdiyi bir əkin sahəsi haqqında hökm verirdilər və Biz də onların hökmünə şahid idik.

79. Biz onu (məsələnin hökmünü) dərhal Süleymana anlatdıq. Və onların hər birinə hökm (hikmət, peyğəmbərlik) və elm (şəriəti dərindən bilmək) verdik. Biz dağları və quşları Davudla birlikdə (Allahı) təqdis edib tərifləsinlər deyə ona ram etdik. Bunları (sizə təəccüblü görünsə də, lövhi-məhfuzdakı əzəli hökmümüzlə) Biz etmişdik.

80. Biz (Davuda) sizi (düşmənlə) vuruşda qorumaq üçün zireh (toxumaq) sənətini öyrətdik. (Ey Məkkə əhli! Rəbbinizin bu nemətinə) artıq şükür edərmisiniz?

81. Əmrilə bərəkət verdiyimiz yerə (Şama) doğru şiddətlə əsən küləyi də Süleymana Biz ram etdik. Biz hər şeyi bilənik!

82. Biz şeytanlardan qəvvaslıq edənləri və başqa işlər görənləri (ev tikənləri, mehrab düzəldənləri) də onun ixtiyarına verdik. Biz (Süleymanın əmrindən çıxmasınlar, gördükləri işləri təzədən korlamasınlar, fitnə-fəsad törətməsinlər deyə) onların üstündə göz olurduq.

83. (Ya Rəsulum!) Əyyubu da (yada sal)! Bir vaxt o, Rəbbinə yalvarıb dua edərək belə demişdi: "Mənə bəla üz verdi (Sənə pənah gətirdim). Sən rəhmlilərin rəhmlisisən!"

84. Biz (Əyyubun) duasını qəbul buyurduq, onu düçar olduğu bəladan (xəstəlikdən və ailəsinə üz vermiş müsibətdən) qurtardıq. Dərgahımızdan (Əyyuba) bir rəhmət və (Allaha) ibadət edənlərə ibrət dərsi (öyüd-nəsihət) olsun deyə, (həlak olmuş) övladlarını qaytarıb ona verdik, üstəlik bir o qədər də əlavə etdik.

85. (Ya Rəsulum!) İsmaili, İdrisi və Zülkifli də (yad et)! Onların hər biri səbr edən kimsələrdən idi.

86. Biz onları mərhəmətimizə qovuşdurduq (peyğəmbər etdik). Onlar, doğrudan da, saleh bəndələrdən idilər.

87. Zün-Nunu (balıq sahibi Yunisi) da xatırla! Bir zaman o (küfr etməkdə həddi aşmış ümmətinə qarşı) qəzəblənərək çıxıb getmiş və (Bizə xoş gəlməyən bu səbirsizliyinə görə) onu möhnətə düçar etməyəcəyimizi (gücümüz, yaxud hökmümüzün ona yetməyəcəyini) güman etmişdi. Amma sonra qaranlıqlar içində (balığın qarnında; gecənin, yaxud dənizin zülmətində): "(Pərvərdigara!) Səndən başqa

heç bir tanrı yoxdur. Sən paksan, müqəddəssən! Mən isə, həqiqətən, zalımlardan olmuşam (əmrinə qarşı çıxaraq özümə zülm eləmişəm)”, -deyib dua etmişdi.

88. Biz onun (Yunisin) duasını qəbul buyurduq və (balığın qarnından çıxartmaqla) onu qəmdən qurtardıq. Biz möminlərə belə nicat veririk!

89. (Ya Rəsulum!) Zəkəriyyanı da (yada sal)! Bir vaxt o: “Ey Rəbbim! Məni tək (kimsəsiz, varissiz) buraxma. Sən varislərin ən yaxşısısan! (Bütün məxluqat yox olar, ancaq Sən qalarsan!)” – deyə yalvarıb Rəbbinə dua etmişdi.

90. Biz (Zəkəriyyanın) duasını qəbul buyurduq, ona Yəhyanı bəxş etdik və zövcəsini (doğmağa) qabil bir hala gətirdik. Onlar xeyirli işlər görməyə tələsər (yaxşı əməllər etməkdə bir-birini ötməyə çalışar), ümid və qorxu ilə (rəhmətimizə ümid bəsləyib əzabımızdan qorxaraq) Bizə ibadət edirdilər. Onlar Bizə müti idilər.

91. (Ya Rəsulum!) İsmətini (bəkarətini) qoruyanı da (Məryəmi də yad et)! Biz Öz ruhumuzdan (Özümüzün yaratdığımız ruhdan Cəbrail vasitəsilə) ona üfürdük, onu və oğlunu (atasız doğulmuş İsanı) aləmlərə (mələklərə, bütün insanlara və cinlərə) bir möcüzə etdik.

92. (Ey insanlar!) Həqiqətən, bu (tövhid dini olan islam) tək bir din olaraq sizin dininizdir. Mən də sizin Rəbbinizəm. Buna görə də yalnız Mənə ibadət edin!

93. Amma (insanlar din barəsində) öz aralarında firqələrə bölünüb parçalandılar. Onların hamısı Bizim hüzurumuza qayıdacaqlar. (Biz də müvafiq surətdə əməllərinin əvəzini verəcəyik).

94. Hər kim mömin ikən yaxşı işlər görsə, onun zəhməti danılmayacaqdır (mükafatı tamamilə ödəniləcəkdir). Şübhəsiz ki, Biz onun üçün (gördüyü işləri mələklər vasitəsilə əməl dəftərinə) yazırıq.

95. Məhv etdiyimiz hər hansı bir məmləkət əhlinin (qiyamət qopana qədər tövbə etmək üçün bir də dünyaya, yaxud haqq dinə) qayıtması mümkün deyildir (haramdır).

96. Nəhayət, Yəcuc-Məcüc (səddinin) açılıb (dağılıb) onlar hər tərəfdən (alçaq və yüksək təpələrdən) sürətlə (məhşərə) axışdıqları zaman;

97. Doğru vəd (qiyamət günü) yaxınlaşdıqda kafir olanların gözləri (dəhşətdən) dərhal bərəlib: "Vay halımıza! Biz (dünyada) bundan qafil idik. Xeyr, biz zalım olmuşuq (peyğəmbərlərin dediklərinə inanmamaqla zülm etmişik)!" – deyərlər.

98. (Ey Məkkə əhli!) Siz və Allahdan qeyri ibadət etdiyiniz bütlər isə cəhənnəm yanacağısınız (odunusunuz). Siz ora varid olacaqsınız!

99. Əgər bunlar tanrı olsaydılar, ora girməzdilər. Hamısı orada həmişəlik qalacaqlar.

100. Onları orada inilti (ah-nalə) gözləyir. Onlar orada (heç bir xoş söz) eşitməzlər.

101. (Yaxşı əməllərin mükafatı olaraq) öncədən özlərinə ən gözəl nemət (Cənnət, əbədi səadət) yazılmış kəslər – məhz onlar ondan (Cəhənnəmdən) uzaqlaşdırılmış olacaqlar.

102. Onlar (Cəhənnəmin) uğultusunu eşitməyəcəklər. Onlar (Cənnətdə) ürəklərinin istədiyi (nemətlər) içində əbədi qalacaqlar.

103. Onları ən böyük qorxu (İsrafilin suru axırıncı dəfə çalınıb cəhənnəmliklərin Cəhənnəmə atılması) məhzun etməyəcəkdir. Mələklər onları qarşılayıb: "Bu sizə vəd olunmuş gününüzdür!" – deyəcəklər.

104. Göyü kitab səhifəsi kimi büküb qatlayacağımız günü (qiyamət gününü) yadınıza salın. (O gün insanları) ilk dəfə (yoxdan)

yaratdığımız kimi qaytarıb (dirildib) əvvəlki halına salarıq. Biz yerinə yetirməli olduğumuz vədi mütləq yerinə yetirəcəyik. (Biz qiyamət günü sizi dirildib lüt-üryan, anadangəlmə vəziyyətdə məhşərə gətirməyi vəd etmişdik. Biz onu mütləq edəcəyik).

105. Biz kitabdan (Tövratdan, yaxud lövhi-məhfuzdan) sonra Zəburda da (cənnət torpağına, yer üzünə və ya müqəddəs) torpağa yalnız Mənim saleh bəndələrimin daxil olacağını yazmışdıq.

106. Həqiqətən, bunda da (Quranda da Allaha) ibadət edən bir ümmətdən ötrü (kifayət qədər) moizə (öyüd-nəsihət) vardır.

107. Səni də (Ya Rəsulum!) aləmlərə (bütün insanlara və cinlərə) ancaq bir rəhmət olaraq göndərdik. (Sən təkcə insanlara deyil, eyni zamanda cinlərə də peyğəmbər göndərilmisən. Bütün aləmlər əhli, o cümlədən göydəki mələklər, yerdəki insanlar və cinlər sənin vücudunla şərəfə nail olurlar. Sənin sayəndə günahkarlara möhlət verilmiş, hətta səni inkar edənlərin belə cəzası qiyamətə qədər təxirə salınmışdır. Möminlər isə sənə iman gətirməklə dünyada böyük savab qazanıb axirətdə yüksək dərəcələrə, əbədi səadətə nail olacaqlar).

108. (Müşriklərə) de ki, mənə, həqiqətən, belə vəhy olunur: “Sizin tanrınız ancaq bir olan Allahdır. Bundan sonra (Ona) itaət etməyə (müsəlman olmağa) boyun qoyacaqsınızmı?”

109. (Ya Rəsulum!) Əgər onlar (imandan) üz döndərsələr, de: “(Mənə vəhy olunanı) sizə olduğu kimi (hamıya eyni dərəcədə) bildirdim. Sizə vəd olunan şeyin (qiyamət gününün və ya möminlərin qələbəsinin) yaxınmı, uzaqmı olduğunu bilmirəm.

110. Şübhəsiz ki, (Allah) aşkar (ucadan) deyilən sözü də, sizin gizlətdiklərinizi də bilir!

111. Mən bilmirəm, bəlkə də, (cəzanızın) təxirə salınması sizi imtahana çəkmək və bir müddət (əcəliniz çatana qədər) sizə gün-güzəran vermək üçündür”.

112. (Peyğəmbər) dedi: “Ey Rəbbim! (Mənimlə məni təkzib edən Məkkə müşrikləri arasında) ədalətlə hökm et. Sizin mənə aid etdiyiniz sifətlərə (dediyiniz pis sözlərə) qarşı kömək dilənilməsi kimsə yalnız Rəhman olan Rəbbimizdir!”

## .22.
## əl-Həcc (Həcc) surəsi

**(Mədinədə nazil olmuşdur, 78 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Ey insanlar! Rəbbinizdən qorxun. (Allahın əzabından qorxub pis əməllərdən çəkinin, yalnız Ona ibadət və itaət edin). Həqiqətən, qiyamət gününün (axır saatın) zəlzələsi dəhşətli şeydir!

2. Onu görəcəyiniz gün hər bir əmzikli qadın əmizdirdiyi uşağını unudar, hər bir hamilə qadın bari-həmlini (vaxtından əvvəl) yerə qoyar (uşaq salar). İnsanları sərxoş görərsən, halbuki onlar sərxoş deyillər. Ancaq Allahın əzabı çox şiddətlidir!

3. Allah haqqında heç bir şey bilmədən (elmsiz-dəlilsiz “Rəbbimiz mələklərdən Özünə övlad götürmüşdür” - deyə) mübahisə edən və Allaha asi olmuş hər bir şeytana uyan insanlar da vardır.

4. (Şeytan) haqqında əzəldən belə yazılmışdır (hökm edilmişdir): hər kəs onunla (Şeytanla) dostluq etsə, (Şeytan) onu yoldan çıxardıb cəhənnəm əzabına sürükləyər.

5. Ey insanlar! Öləndən sonra yenidən diriləcəyinizə şübhəniz varsa (ilk yaradılışınızı yada salın). Həqiqətən, Biz sizi (babanız Adəmi) torpaqdan, sonra mənidən (nütfədən), sonra laxtalanmış qandan, daha

sonra müəyyən, tam bir şəklə düşmüş (vaxtında doğulmuş) və düşməmiş (vaxtından əvvəl doğulmuş) bir parça ətdən yaratdıq ki, (qüdrətimizi) sizə göstərək. İstədiyimizi ana bətnində müəyyən bir müddət (adətən, doqquz ay) saxlayar, sonra sizi (oradan) uşaq olaraq (doğurub) çıxardarıq. Sonra yetkinlik çağına (otuz-qırx yaşlarına) yetişəsiniz deyə (sizi böyüdərik). Kiminiz (bu həddə çatmamış) vəfat edər, kiminiz də ömrün elə bir rəzil (ən ixtiyar) çağına çatdırılar ki, vaxtilə bildiyini (tamamilə unudub körpə uşaq kimi) bilməz olar. (Ey insan!) Sən yer üzünü qupquru görərsən. Biz ona yağmur endirdiyimiz zaman o, hərəkətə (cana) gəlib qabarar (yaxud xəmir kimi acıyar) və hər növ gözəl (meyvədən, bitkidən) bar gətirər.

6. Bu (insan yaradılışının müxtəlif mərhələləri, ölü torpağın cana gətirilməsi) ona görədir ki, Allah haqdır, ölüləri dirildir və O, hər şeyə qadirdir!

7. Bu (həm də belə bir danılmaz həqiqətə inanmağınız üçündür ki) o saat (qiyamət günü) mütləq gələcəkdir, ona heç bir şəkk-şübhə yoxdur və Allah qəbirlərdə olanları dirildəcəkdir!

8. İnsanlar içində (Əbu Cəhl kimi) eləsi də vardır ki, heç bir şey bilmədən, haqq yolu göstərən heç bir rəhbəri (yaxud tutarlı dəlili) və nurani (səmadan endirilib hökmünü açıq bildirən) kitabı olmadan Allah barəsində mübahisə edər.

9. O, boynunu (təkəbbürlə sağa-sola) əyərək (insanları) Allahın yolundan çıxarmaq məqsədilə bunu edər. Onu dünyada rüsvayçılıq gözləyir, qiyamət günü isə ona cəhənnəm odunun əzabını daddıracağıq!

10. (O zaman ona belə deyiləcək:) “Bu, (dünyada) öz əllərinlə etdiyin günahların cəzasıdır, yoxsa Allah bəndələrinə əsla zülm edən deyildir!”

11. İnsanlardan eləsi də vardır ki, Allaha şəklə ibadət edər. Əgər ona bir xeyir toxunsa, (dini barəsində) arxayın olar (islamdan möhkəm yapışar). Yox, əgər ona bir bəla (müsibət) üz versə, çöhrəsi dəyişər (islamdan üz döndərib yenə küfrə qayıdar). Beləsi dünyanı da əldən verər, axirəti də. Açıq-aşkar ziyan budur, bu!

12. O, Allahı buraxıb özünə nə zərər, nə də xeyir verən bütlərə tapınar. Haqq yoldan azıb uzaq düşmək də budur!

13. Özü də zərəri xeyrindən daha çox (Cəhənnəmə daha yaxın) olana ibadət edər. O (büt) nə pis köməkçi, necə də pis yoldaşdır!

14. Həqiqətən, Allah iman gətirib yaxşı işlər görənləri (ağacları) altından çaylar axan cənnətlərə daxil edər. Allah istədiyini edər.

15. Hər kim Allahın dünyada və axirətdə ona (Öz Peyğəmbərinə) kömək göstərməyəcəyini zənn edirsə, qoy göyə (evinin tavanına) bir ip uzatsın, sonra da (ipi boğazına salıb) kəssin (özünü ondan assın) və görsün ki, onun bu hiyləsi qəzəbinə səbəb olan şeyi (Allahın peyğəmbərə göstərəcəyi yardımı) aradan qaldıra bilərmi? (Əlbəttə, qaldıra bilməz! Allahın öz peyğəmbərinə yardım etməsini istəməyənlər, qəzəblərindən özlərini assalar da, partlayıb çatlasalar da, Allah ona dünyada zəfər, axirətdə isə yüksək məqamlar nəsib edəcəkdir).

16. Biz (Quranı) beləcə açıq-aşkar ayələr şəklində nazil etdik. Allah dilədiyini doğru yola müvəffəq edər.

17. Həqiqətən, Allah iman gətirənlər (müsəlmanlar), yəhudilər, sabiilər (ulduzpərəstlər), xaçpərəstlər, atəşpərəstlər və müşriklər arasında qiyamət günü (haqq ilə batili ayırd edərək) hökmünü verəcəkdir. Şübhəsiz ki, Allah hər şeyə şahiddir! (Onların nə etdiklərini və nəyə layiq olduqlarını çox gözəl bilir!)

18. (Ey insan!) Məgər göylərdə və yerdə olanların (bütün canlıların), Günəşin, Ayın və ulduzların, dağların, ağacların və heyvanların, insanların bir çoxunun (möminlərin) Allaha səcdə etdiyini görmürsənmi? Bir çoxuna da (kafirlərə də) əzab vacib olmuşdur. Allahın alçaltdığı kimsəni heç kəs yüksəldə (səadətə qovuşdura) bilməz. Həqiqətən, Allah dilədiyini edər!

19. Rəbbi barəsində mübahisə aparan bu iki zümrə (möminlər və kafirlər bir-birinə) düşməndir. Onu inkar edənlər üçün atəşdən paltar biçilmişdir; başlarına da qaynar su töküləcəkdir.

20. O su ilə qarınlarında olanlar (bağırsaqları, ciyərləri) və dəriləri əridiləcəkdir.

21. Hələ onlar üçün (başlarına vurulacaq) dəmir toppuzlar da vardır.

22. (Kafirlər) oradan – (Cəhənnəmdə düşdükləri) qəmdən qurtarmaq istədikcə, yenidən ora qaytarılar və (onlara:) “Dadın atəşin əzabını!” (deyilər).

23. Həqiqətən, Allah iman gətirib yaxşı işlər görənləri (ağacları) altından çaylar axan cənnətlərə daxil edəcəkdir. Onlar orada altun və incilərlə bəzənəcəklər (qızıldan və mirvaridən bilərziklər taxacaqlar), orada libasları da ipəkdən olacaqdır!

24. Onlar (dünyada) təmiz (pak) sözə (la ilahə illallaha, yaxud Qurana) müvəffəq olmuş, həm də Allahın bəyəndiyi yola (islama) yönəldilmişlər.

25. Kafir olub (insanları) Allah yolundan, həm yerlilər, həm də gəlmələr üçün (qiblə, məbəd) etdiyimiz Məscidülhəramdan döndərənlərə və orada zülmə, haqsızlığa meyl etmək istəyənlərə də şiddətli əzabdan daddıracağıq!

26. (Ya Rəsulum!) Yadına sal ki, bir zaman İbrahimə Kəbənin yerini bildirib belə buyurmuşduq: “Mənə heç bir şeyi şərik qoşma, evimi təvaf edənlər, namaza duranlar, rüku edən və səcdəyə qapananlar (namaz qılanlar) üçün (bütlərdən) təmizlə!”

27. İnsanları həccə çağır ki, onlar sənin yanına (istər) piyada və (istərsə də) hər uzaq yoldan yollanan hər cür arıq (yorğun-arğın) dəvələr üstündə (süvari olaraq) gəlsinlər.

28. Belə ki, öz mənfəətlərinin şahidi olsunlar və məlum günlərdə Allahın onlara ruzi verdiyi (dördayaqlı) heyvanların üstündə (onları qurban kəsərkən) Onun adını çəksinlər (bismillah desinlər). Onlardan özünüz də yeyin, biçarə (zavallı) yoxsullara da yedirdin!

29. Sonra həcc əməllərini (dırnaq kəsmək, saçını qırxmaq, yaxud qısaltmaq və s.) yerinə yetirsinlər (və ya kirlərini təmizləsinlər), nəzirlərini versinlər və (Nuhun tufanından salamat çıxmış, yaxud bəşər övladı üçün ilk ziyarətgah olan) qədim evi (Kəbəni) təvaf etsinlər!

30. (Ey insanlar! Həccin sizə vacib olan əməli) budur. Və hər kəs (ehramda ikən) Allahın haram buyurduqlarına hörmət (riayət) etsə, bu, Rəbbi yanında onun üçün xeyirli olar. (Haram olduğu “Maidə” surəsində) sizə deyilənlərdən başqa, qalan heyvanlar (onların ətini yemək) sizə halal edilmişdir. Belə olduğu təqdirdə, murdar (başdan-ayağa murdarlıq olan) bütlərdən qaçın, yalan sözlərdən də (Allaha şərik qoşmaqdan da) çəkinin -

31. Batildən haqqa dönərək yalnız Allaha təslim olduğunuz və Ona şərik qoşmadığınız halda! Allaha şərik qoşan kimsə göydən düşən, quşların onu sürətlə alıb apardığı, yaxud küləyin sovurub uzaqlara atdığı bir şeyə (məxluqa) bənzər.

32. (Ey insanlar! Sizə əmr etdiyim) budur. Və hər kəs Allahın mərasiminə (həcc əməllərinə, yaxud qurbanlıq heyvanlara) hörmət etsə, bu (hörmət), şübhəsiz ki, qəlblərin təqvasındadır (Allahdan qorxmasındadır).

33. Sizin üçün (qurbanlıq heyvanlarda) müəyyən bir vaxta qədər mənfəət vardır. (Kəsilənə qədər onları minər, südünü içər, yunundan istifadə edərsiniz). Sonra onların gətirilib kəsiləcəyi yer (Mina) qədim ev (Kəbə) istiqamətindədir. (Yaxud həcc əməllərini yerinə yetirməkdə sizin üçün qiyamətə qədər mənfəət vardır. Həcc günləri Kəbəyə toplanar, bütün müsəlmanlara lazım olan dini və dünyəvi məsələlər barəsində məsləhət-məşvərət edərsiniz).

34. Biz hər bir ümmət üçün qurbangah (yaxud məbəd) müəyyən etdik (və ya hər bir ümmətə qurban kəsməyi lazım bildik) ki, Allahın onlara ruzi verdiyi (dördayaqlı) heyvanların üstündə (onları kəsdikləri zaman) Allahın adını çəksinlər (bismillah desinlər). Sizin tanrınız yalnız bir olan Allahdır. Yalnız Ona təslim olub itaət edin. (Ya Rəsulum!) Sən də (Allaha) itaət edənlərə (təvazökar olanlara Cənnətlə) müjdə ver!

35. O kəslər ki, Allahın adı çəkiləndə (zikr ediləndə) qəlbləri (qorxudan) titrəyər, üz verən müsibətlərə səbr edər, namaz qılar və onlara verdiyimiz ruzidən (ehtiyacı olanlara) sərf edərlər.

36. Biz qurbanlıq dəvələri də Allahın nişanələrindən (Onun haqq dininin əlamətlərindən) etdik. Sizin üçün bu qurbanlarda (dini və dünyəvi) xeyir vardır. Artıq onları ayaq üstə durduqları (sol əli bağlı, sağ əli və iki ayağı açıq vəziyyətdə olduqları) halda kəsərkən üstlərində Allahın adını çəkin (bismillah deyin). Onlar böyrü üstə düşən (canları çıxdığı) zaman (ətindən) özünüz də yeyin, (yanınızda olub utandığından) əl açmayana (lakin verilənə etiraz etməyənə) və

dilənçiyə də yedirdin. Onları (qurbanlıq heyvanları) sizə belə ram etdik ki, bəlkə, (nemətimizə) şükr edəsiniz!

37. Onların nə əti, nə də qanı, əlbəttə, Allaha çatmaz. Allaha çatacaq olan yalnız sizin təqvanızdır (səmimi-qəlbdən etdiyiniz ibadətdir). Allah sizi doğru yola yönəltdiyi (sizə həccin əməllərini göstərdiyi) üçün Onu (layiqincə) uca tutasınız deyə, bunları sizə belə ram etdi. (Ey Muhəmməd!) Ehsan edənlərə (Cənnətlə) müjdə ver!

38. Şübhəsiz ki, Allah iman gətirən kəslərdən (kafirlərin əzab-əziyyətini) dəf edər. Allah, həqiqətən, heç bir xaini, nankoru sevməz!

39. Zülmə məruz qaldıqlarına görə vuruşanlara (kafirlərə qarşı Allah yolunda döyüşməyə) izin verilmişdir. Allah onlara kömək etməyə, əlbəttə, qadirdir!

40. O kəslər ki, haqsız yerə, ancaq “Rəbbimiz Allahdır” - dediklərinə görə yurdlarından (Məkkədən) çıxarıldılar. Əgər Allah insanların bir qismini digər qismi ilə (müşrikləri möminlərlə) dəf etməsəydi, sözsüz ki, içərisində Allahın adı çox zikr olunan soməələr (rahiblərin yaşadığı monastırlar), kilsələr, məbədlər (yəhudi məbədləri) və məscidlər dağılıb gedərdi (darmadağın edilərdi). Allah Ona (öz dininə) yardım edənlərə, şübhəsiz ki, yardım edər. Həqiqətən, Allah yenilməz qüvvət, qüdrət sahibidir!

41. O kəslər ki, əgər onları yer üzündə yerləşdirsək (onlara bir yer versək), namaz qılar, zəkat verər, (insanlara) yaxşı işlər görməyi əmr edib, pis işlər görməyi qadağan edərlər. Bütün işlərin sonu (nəticəsi) Allaha aiddir. (Allah qiyamət günü əməllərinə müvafiq olaraq möminlərə mükafat, kafirlərə isə cəza verəcəkdir).

42. (Ya Rəsulum!) Əgər (bu müşriklər) səni təkzib edərlərsə (ürəyini qısma). Səndən əvvəl Nuh, Ad və Səmud tayfası da (peyğəmbərlərini) təkzib etmişdi.

43. İbrahim tayfası da, Lut qövmü də,

44. Mədyən əhli də (peyğəmbərlərini təkzib etmişdi). Musa da (Fironun özü və camaatı tərəfindən) yalançı sayılmışdı. Kafirlərə (bir qədər) möhlət verdim, sonra onları (əzabla) yaxaladım. (Bir görəydin, küfr etdiklərinə, peyğəmbərləri yalançı sayıb inkar etdiklərinə görə) Mənim onları inkar etməyim necə oldu! (Onlara verdiyim neməti müsibətlə əvəz etdim!)

45. Neçə-neçə məmləkəti (əhalisini) zülm edərkən məhv etdik; onlar alt-üst olmuşdu (evlərin tavanları çökmüş, divarları onların üstünə yıxılmışdı). Neçə-neçə quyular, neçə-neçə möhtəşəm qəsrlər bomboş qalmışdı.

46. Məgər onlar (peyğəmbərləri yalançı hesab edən kafirlər) yer üzündə gəzib dolaşmırlarmı ki, düşünən qəlbləri (bəsirət gözləri), eşidən qulaqları olsun? Həqiqətən, gözlər kor olmaz, lakin sinələrindəki ürəklər (qəlb gözü) kor olar. (Kafirlər keçmiş ümmətlərin başına gələn müsibətləri zahiri gözləri ilə görsələr də, qəlb gözü ilə görüb onlardan heç bir ibrət almazlar).

47. (Ya Rəsulum!) Onlar səni tələsdirib əzabın tez gəlməsini istəyirlər. Allah Öz vədinə əsla xilaf çıxmaz! Rəbbinin dərgahında bir gün sizin saydığınızın (hesabladığınız vaxtın) min ili kimidir!

48. Neçə-neçə məmləkətə (məmləkət əhlinə) zülm etdikləri (kafir olduqları) halda möhlət verdim, sonra onları (əzabla) yaxaladım. Axır dönüş ancaq Mənədir! (Onlar, nəhayət, Mənim hüzuruma gələcək, qazandıqları günaha görə əbədi əzaba düçar olacaqlar).

49. De: “Ey insanlar! Mən sizi yalnız açıq-aşkar bir qorxudanam (Allahın əzabı ilə açıq-aşkar qorxudan, xəbərdar edən bir peyğəmbərəm)!

50. İman gətirib yaxşı işlər görənləri (günahlardan) bağışlanma və tükənməz (minnətsiz) ruzi gözləyir!

51. Ayələrimizdən (Quranı batil etməkdən) ötrü səy göstərib (Peyğəmbəri) aciz etmək istəyənlərə (yaxud Peyğəmbəri məğlub etməklə xalqı imandan döndərməyə cəhd edənlərə) gəldikdə isə, məhz onlar cəhənnəmlikdirlər!

52. (Ya Rəsulum!) Biz səndən əvvəl də (şəriət sahibi olan) elə bir rəsul, (şəriət sahibi olmayıb onun ardınca gedən) elə bir nəbi (peyğəmbər) göndərmədik ki, o, (hər hansı bir şeyi) arzu etdikdə Şeytan onun arzusuna (diləyinə vəsvəsə yolu ilə) bir xələl qatmasın! (Yaxud o, ayələrimizi oxumaq istədiyi zaman Şeytan onu çaşdırıb oxuduğu ayə barəsində pis bir fikir təlqin etməsin!) Lakin Allah Şeytanın vəsvəsəsini batil (yox) edər. Sonra isə Allah Öz ayələrini möhkəmlədər. Allah (hər şeyi) biləndir, hikmət sahibidir!

53. (Allah ona görə belə edir ki) Şeytanın vəsvəsəsini qəlblərində mərəz (nifaq, şəkk mərəzi) və ürəkləri qatı (sərt) olanlar (müşriklər) üçün bır sınaq vasitəsi etsin. Şübhəsiz ki, zalımlar (münafiqlər, müşriklər və kafirlər) haqdan uzaq bir nifaq içindədirlər (ixtilafdadırlar).

54. Və elm verilən kəslər də bilsinlər ki, haqq (Quran) sənin Rəbbindəndir. Artıq ona inansınlar və ürəkləri ondan arxayın olsun. Şübhəsiz ki, Allah iman gətirənləri doğru yola yönəldər!

55. Kafir olanlar isə qiyamət günü qəflətən başlarının üstünü alanadək, yaxud heç bir xeyri olmayan (səmərəsiz) bir günün (onların kökünü kəsəcək Bədr vuruşunun) əzabı onlara gəlib yetişənədək (Quran barəsində) şəkk-şübhədə olmaqda davam edəcəklər.

56. O gün (qiyamət günü) hökm yalnız Allahındır. (Allah) onların (müşriklərin və möminlərin) arasında hökm edəcəkdir. İman gətirib yaxşı işlər görənlər Nəim cənnətlərində olacaqlar!

57. Kafir olanlar, ayələrimizi yalan hesab edənlər isə rüsvayedici bir əzaba düçar olacaqlar!

58. Allah yolunda hicrət edənlərə, sonra (bu yolda) öldürülənlərə, yaxud ölənlərə Allah, həqiqətən, gözəl ruzi (cənnət ruzisi) verəcəkdir. Şübhəsiz ki, Allah ruzi verənlərin ən yaxşısıdır!

59. (Allah) onları razı qalacaqları (xoşhal olacaqları) bir yerə (Cənnətə) daxil edəcəkdir. Həqiqətən, Allah (hər şeyi) biləndir, (bəndələrinə qarşı) həlimdir!

60. (Allahın hökmü) budur. Və hər kim özünə verilən cəza kimi cəza versə, sonra yenə də (müşriklərin müsəlmanları Məkkədən qovduqları kimi) təcavüzə məruz qalsa, şübhəsiz ki, Allah ona kömək edər. Həqiqətən, Allah (özünümüdafiə məqsədilə düşməndən intiqam alan mömin bəndəsini) əfv edəndir, bağışlayandır!

61. Bu belədir. (Allah zalıma qarşı, zalımın zülmündən xilas olmaq üçün məzluma kömək edər, çünki O, hər şeyə qadirdir). Necə ki, Allah gecəni gündüzə, gündüzü də gecəyə qatar. (Allah bəndələrinin mənafeyi naminə bəzən insanlar daha çox ruzi qazana bilsinlər deyə, gündüzü qısaldıb gecəni uzadar). Allah (hər şeyi) eşidəndir, görəndir!

62. Bu belədir. Çünki Allah haqq, (müşriklərin) Ondan başqa ibadət etdikləri (bütlər, tanrılar) isə batildir. Həqiqətən, Allah (hər şeydən) ucadır, böyükdür! (Allahın allahlığı öz-özlüyündə mövcud olduğu üçün O haqq, bütlərin tanrılığı öz-özlüyündə mövcud olmadığı üçün onlar batildir. Buna görə də yalnız Allaha ibadət edilməlidir!)

63. (Ya Rəsulum!) Məgər Allahın göydən yağmur endirdiyini və yer üzünün (onunla) yamyaşıl olduğunu görmürsənmi? Həqiqətən, Allah

(gözlənilməyən yerdən ruzi yetirməklə bəndələrinə) lütfkardır, (onların hər işindən) xəbərdardır.

64. Göylərdə və yerdə nə varsa, Hamısı Onundur (Onun qüdrətindən yaranmış əsərdir). Həqiqətən, Allah ehtiyacsızdır, (hər cür) şükürə, tərifə layiqdir! (Hər işi bəyənilendir!)

65. (Ya Rəsulum!) Məgər Allahın yerdə olanları (heyvanları), dənizdə Onun əmrilə üzən gəmiləri sizə ram etdiyini və Onun izni olmadan yerə düşə bilməməsi üçün göyü tutub saxladığını görmürsənmi? Həqiqətən, Allah insanlara şəfqətlidir, mərhəmətlidir!

66. Sizi (əzəl başdan) dirildən, sonra (əcəliniz çatanda) öldürəcək, daha sonra (qiyamət günü) yenə dirildəcək məhz Odur.

67. Biz (keçmişdən bəri) hər ümmət üçün bir şəriət müəyyən etdik ki, ona əməl edərlər. Elə isə (müşriklər) bu işdə (din, şəriət işində, yaxud qurbanlıqlar barəsində) səninlə mübahisə etməsinlər. (Ya Rəsulum!) Sən onları öz Rəbbinə (ibadət etməyə, Onun hökmlərini yerinə yetirməyə) dəvət et. Şübhəsiz ki, sən doğru yoldasan (dindəsən).

68. (Ya Rəsulum!) Əgər (müşriklər öz kəsdiyiniz qurbanların ətindən yediyiniz halda, bəs Allahın öldürdüyü, yəni öz əcəli ilə ölmüş heyvanların ətini niyə yemirsiniz deyə) səninlə mübahisə etsələr, (onlara) belə cavab ver: “Allah sizin nə etdiyinizi daha yaxşı bilir!

69. İxtilafda olduğunuz məsələlər barəsində Allah qiyamət günü aranızda öz hökmünü verəcəkdir!”

70. (Ya Rəsulum!) Məgər bilmirsənmi ki, Allah göydə və yerdə nə varsa (hamısını) bilir? Həqiqətən, bu, (lövhi-məhfuz deyilən) bir kitabdadır. Şübhəsiz ki, bu (bütün bunları bilmək) Allah üçün asandır!

71. (Müşriklər) Allahı qoyub elə bir şeyə ibadət edərlər ki, (Allah Ona ibadət edilməsi haqda) heç bir dəlil nazil etməmişdir. Və (müşriklərin) ona dair heç bir biliyi də (dəlili-sübutu da) yoxdur. Zalımlara (müşriklərə) heç bir yardım edən olmaz!

72. Ayələrimiz onlara açıq-aşkar surətdə oxunduğu zaman (yaxud açıq-aşkar ayələrimiz oxunduqda) kafir olanların çöhrəsində bir ikrah (nifrət) sezərsən. Onlar ayələrimizi oxuyanların üstünə az qala hücum çəksinlər. (Ya Rəsulum!) De: "Sizə bundan (Quran oxunduğu zaman etdiyiniz nalayiq hərəkətlərdən) daha pisini xəbər verimmi? – Cəhənnəm (odu)! Allah onu kafirlərə vəd etmişdir. O nə pis məskəndir! (Nə pis qayıdış yeridir!)"

73. Ey insanlar! Bir məsəl çəkildi, ona qulaq asın! Şübhəsiz ki, Allahdan qeyri ibadət etdiyiniz bütlər heç bir milçək də yarada bilməzlər – lap hamısı bunun üçün bir yerə yığışsa belə! Əgər milçək onlardan (bütlərin üstündə olanlardan) bir şey götürüb aparsa, onu milçəkdən geri ala bilməzlər. İstəyən də aciz, istənilən də! (Bütlər də aciz, milçək də, yaxud bütlərə ibadət edən də aciz, ibadət edilən bütlər də!)

74. (Müşriklər) Allahı layiqincə qiymətləndirmədilər (uca tutmadılar). Həqiqətən, Allah yenilməz qüvvət sahibi, qüdrət sahibidir!

75. Allah mələklərdən də elçilər (peyğəmbərlər) seçər, insanlardan da. Həqiqətən, Allah (hər şeyi) eşidəndir, görəndir!

76. (Allah) onların önlərindəkini də, arxalarındakını da (nə etdiklərini və nə edəcəklərini) bilir. Bütün işlər (nəticə etibarilə axirətdə) Allaha qayıdar! (Qiyamət günü bütün məxluqat öz əməlləri ilə birlikdə Allahın hüzurunda duracaqdır).

77. Ey iman gətirənlər! (Namaz qıldıqda) rüku edin, səcdəyə qapanın; Rəbbinizə ibadət edin və yaxşı işlər görün ki, nicat tapasınız! (Mətləbinizə yetişəsiniz!)

78. (Ey möminlər!) Allah yolunda layiqincə cihad edin. O (Öz dini üçün) sizi seçdi və dində sizin üçün heç bir çətinlik yeri qoymadı – atanız İbrahimin dini (dinində olduğu) kimi. (Ey Muhəmməd ümməti!) Allah bundan (Quran nazil olmamışdan) əvvəl də, bunda (Quranda) da sizə müsəlman adını verdi ki, (qiyamət günü) Peyğəmbər (dinin təbliği, sizin ona iman gətirməyiniz, itaət etməyiniz barədə) sizə, siz də (əvvəlki peyğəmbərlərin Allahın hökmlərini öz ümmətlərinə çatdırdıqları halda) insanlara şahid olasınız. Elə isə (vaxtlı-vaxtında) namaz qılın, zəkat verin və Allaha sığının. (Allah) sizin ixtiyar sahibinizdir. O nə yaxşı ixtiyar sahibi, necə də gözəl imdada yetəndir!

## .23.
## əl-Muminun (Möminlər ) surəsi
**(Məkkədə nazil olmuşdur, 118 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Həqiqətən, möminlər nicat tapmışlar! (Cənnətə nail olmaqla mətləblərinə çatıb əbədi səadətə qovuşmuşlar!)

2. O kəslər ki, namazlarında (hər şeyi unudaraq ruhən və cismən yalnız Allaha) müti olub (Ona) boyun əyərlər! (Allahın qarşısında kiçilərlər!)

3. O kəslər ki, lağlağıdan (lüzumsuz şeylərdən, qadağan olunmuş əməllərdən) üz döndərərlər;

4. O kəslər ki, zəkat verərlər;

5. O kəslər ki, ayıb yerlərini (zinadan) qoruyub saxlayarlar;

6. Ancaq zövcələri və cariyələri istisna olmaqla. Onlar (zövcələri və cariyələri ilə görəcəkləri bu işdən ötrü) qınanmazlar.

7. Bundan artığını istəyənlər (halaldan harama addayaraq) həddi aşanlardır (Allahın əmrini pozanlardır).

8. O möminlər ki, əmanətlərini və əhdlərini qoruyub saxlayarlar (onlara tapşırılmış əmanətə xəyanət etməz, verdikləri sözü yerinə yetirərlər);

9. Namazlarına riayət edərlər (həmişə vaxtlı-vaxtında namaz qılarlar);

10. Onlardır (bilin) varis olanlar –

11. Firdovs cənnətinə varis olanlar, orada əbədi qalanlar!

12. Biz, həqiqətən, insanı tərtəmiz (süzülmüş) palçıqdan yaratdıq. (Biz Adəmi torpaqdan, Adəm övladını isə süzülmüş xalis palçıqdan – nütfədən xəlq etdik).

13. Sonra onu (Adəm övladını) nütfə halında möhkəm bir yerdə (ana bətnində) yerləşdirdik.

14. Sonra nütfəni laxtalanmış qana çevirdik, sonra laxtalanmış qanı bir parça ət etdik, sonra o bir parça əti sümüklərə döndərdik, sonra sümükləri ətlə örtdük və daha sonra onu bambaşqa (yeni) bir məxluqat olaraq yaratdıq. Yaradanların ən gözəli olan Allah nə qədər (uca, nə qədər) uludur!

15. (Belə bir yaradılışdan) sonra siz mütləq öləcəksiniz!

16. Sonra siz qiyamət günü yenidən dirildiləcəksiniz!

17. And olsun ki, Biz sizin üstünüzdə yeddi yol (göy) yaratdıq. Biz (onların altındakı) məxluqatdan da xəbərsiz deyilik. (Onları qoruyub saxlayır, nə etdiklərini bilirik).

18. Biz göydən lazımi qədər yağmur endirdik və onu yerdə (dənizdə, çayda, göllərdə və quyularda) saxladıq. Biz, sözsüz ki, onu aparmağa da (yox etməyə də) qadirik!

19. Sonra sizin üçün onunla (o su ilə) xurma və üzüm bağları yaratdıq. Sizin üçün orada bir çox meyvələr vardır ki, onlardan yeyirsiniz.

20. (Sizin üçün həmçinin mənşə etibarilə) Sina dağından çıxan bir ağac da (yaratdıq ki), o, yeyənlər üçün zeytun və (çörəyin üstünə yaxılan, xörəyə qatılan) yağ bitirər.

21. Həqiqətən, heyvanlarda (ev heyvanlarında) da sizin üçün bir ibrət vardır. Biz onların qarınlarında olandan (süddən) sizə içirdirik. Onlarda sizin üçün daha bir çox mənfəətlər də vardır. (Bəzilərini minir, bəzilərinin yunundan, bəzilərinin isə tükündən istifadə edirsiniz). Həm də onlardan yeyirsiniz!

22. Həm onların, həm də gəmilərin üstündə (bir yerdən başqa yerə) daşınırsınız.

23. Həqiqətən, Biz Nuhu öz qövmünə peyğəmbər göndərdik. O belə dedi: “Ey qövmüm! Allaha ibadət edin. Sizin Ondan başqa (ibadət edəcək) heç bir tanrınız yoxdur. Məgər (Allahın əzabından) qorxmursunuz?”

24. (Nuh) qövmünün kafir başçıları (tabeçiliyində olanlara) dedilər: “Bu sizin kimi yalnız adi bir insandır. (Peyğəmbərlik iddiası ilə) sizə böyüklük etmək istəyir. Əgər Allah (Ondan başqasına ibadət etməməyimizi) istəsəydi, (bizə peyğəmbər olaraq insan deyil) mələklər göndərərdi. Biz bunu (Nuhun təbliğ etdiyi tövhidi) ulu babalarımızdan (keçmiş ümmətlərdən) eşitməmişik.

25. Bu adamda, sadəcə olaraq, bir dəlilik var. (Ona cin toxunmuşdur). Hələ bir müddət gözləyin!” (Ya sağalıb xəstəlikdən

xilas olar, bir də belə şeylər danışmaz; ya da ölüb gedər, canımız qurtarar).

26. (Nuh onların bu sözlərindən və iman gətirməyəcəklərindən məyus olub) belə dedi: “Ey Rəbbim! Onların məni yalançı hesab etməklərinə qarşı mənə kömək et!”

27. Biz (Nuha) belə vəhy etdik: “Gözlərimiz önündə (nəzarətimiz altında) və vəhyimiz üzrə (sənə öyrədəcəyimiz kimi) gəmini düzəlt. Nəhayət, (onları məhv etmək barəsində) əmrimiz gəldiyi və təndir qaynadığı (təndirdən və ya yer üzündən, yaxud gəminin qazanından su qaynayıb daşdığı) zaman hər heyvandan biri erkək, biri dişi olmaqla bir cüt, həmçinin əleyhinə (ölümünə) əvvəlcədən hökm verilmiş kimsələr istisna olmaqla, (qalan) ailə üzvlərini (və iman gətirənləri) gəmiyə mindir. Zülm (küfr) edənlər barəsində Mənə müraciət etmə (onların bağışlanmasını Məndən iltimas etmə). Çünki onlar suya qərq olacaqlar.

28. Sən yanında olanlarla birlikdə gəmiyə minən kimi: “Bizi zalım tayfanın əlindən qurtaran Allaha həmd olsun!” – de.

29. Həmçinin (gəmidən enəndə) belə de: “Ey Rəbbim! Məni mübarək (xeyir-bərəkətli) bir yerə endir. Sən sığınacaq verənlərin ən yaxşısısan!”

30. Şübhəsiz ki, bunda (insanlar üçün) ibrətlər vardır. Həqiqətən, Biz (bəla, müsibət göndərməklə bəndələrimizi) imtahana çəkirik!

31. Onlardan sonra başqa bir nəsil (Ad tayfasını) yaratdıq.

32. Onlara özlərindən bir peyğəmbər (Hudu) göndərdik. (O, tayfasına dedi: ) “Allaha ibadət edin. Sizin ondan başqa (ibadət edəcək) heç bir tanrınız yoxdur. Məgər (Allahın əzabından) qorxmursunuz?”

33. Tayfasının kafir olan, axirətə qovuşacaqlarını (qiyamət günü dirilib haqq-hesab üçün Allahın hüzurunda duracaqlarını) yalan hesab edən və dünyada nemət verdiyimiz əyan-əşrafı (tabeçiliyində olanlara) dedi: "Bu sizin kimi ancaq adi bir insandır; yediyinizdən yeyir, içdiyinizdən içir. (O nə cür peyğəmbər ola bilər?)

34. Əgər siz özünüz kimi adi bir insana itaət etsəniz, şübhəsiz ki, ziyana uğrayarsınız. (Adi bir bəşərə aldanıb dünyada şan-şöhrətinizi, ad-sanınızı itirərsiniz).

35. O sizə ölüb torpaq və sür-sümük olduqdan sonra (qəbirlərinizdən dirildilib) çıxarılacağınızımı vəd edir?

36. Vəd olunduğunuz şey çox uzaqdır, çox uzaq! (Bu, qeyri-mümkündür!)

37. Bizim həyatımız yalnız bu dünyadadır. (Birimiz) ölür, (birimiz) dirilirik. (Birimiz dünyaya gəlir, birimiz dünyadan gedirik). Biz (öləndən sonra bir daha) dirildiləcək deyilik!

38. Bu, sadəcə olaraq, Allaha iftira yaxan bir adamdır. Biz ona iman gətirən deyilik!"

39. (O peyğəmbər) belə dedi: "Ey Rəbbim! Onlar məni yalançı hesab etmələrinə qarşı mənə kömək et!"

40. (Allah) buyurdu: "Bir azdan peşman olacaqlar!"

41. (Bir az sonra) həqiqətən, qorxunc (tükürpədici) bir səs onları bürüdü. Biz onları (sel üstündəki) saman çöpünə döndərdik. Zalım (kafir) tayfa məhv (Allahın rəhmətindən uzaq) olsun!

42. Onlardan sonra başqa-başqa nəsillər (Saleh, Lut və Şüeyb tayfalarını) yaratdıq.

43. Heç bir ümmət öz əcəlini (ölüm, yaxud cəza vaxtını) nə qabaqlayar, nə də yubada bilər!

44. Sonra bir-birinin ardınca (ümmətlərə) peyğəmbərlər göndərdik. Hər ümmətə öz peyğəmbəri gəldikcə onu yalançı saydılar. Biz də onları bir-birinin ardınca məhv edib (izi-tozu qalmayan) əfsanələrə döndərdik. İman gətirməyən tayfa məhv (Allahın rəhmətindən uzaq) olsun!

45. Sonra Musanı və qardaşı Harunu ayələrimizlə və (vəhdaniyyətimizi sübut edən) açıq-aşkar bir dəlillə göndərdik,

46. Fironun və onun əyan-əşrafının yanına. Onlar (iman gətirməyi) təkəbbürlərinə sığışdırmayıb özlərini yuxarı tutan camaat olaraq qaldılar (yaxud Misirdə hakim olduqları İsrail oğullarına əzab-əziyyət verməkdə davam etdilər).

47. (Firon və əyan-əşrafı) dedilər: “Bunların tayfası bizə bir qul kimi itaət etdiyi halda, biz özümüz kimi iki adi insana imanmı gətirəcəyik?”

48. Beləliklə, onları yalançı saydılar və nəticədə məhvə düçar edilənlərdən oldular.

49. Həqiqətən, Biz Musaya kitabı (Tövratı) verdik ki, bəlkə, (İsrail oğulları) doğru yola yönəlsinlər!

50. Məryəm oğlunu (İsanı) və (bakirə) anasını (qüdrətimizdən yaranmış) bir möcüzə etdik. Onları abad (rahat) və axar sulu uca bir yerdə yerləşdirdik.

51. (Müxtəlif zamanlarda ayrı-ayrı ümmətlərə göndərdiyimiz peyğəmbərlərə belə buyurduq: ) “Ey peyğəmbərlər! Təmiz (halal) nemətlərdən yeyin və yaxşı işlər görün! (Vacib və könüllü ibadətləri

həm zahirən, həm də gizli, həmişə yerinə yetirin!) Mən, həqiqətən, sizin nə etdiklərinizi bilirəm!

52. Bu (tövhid dini islam) tək bir din olaraq sizin dininizdir, Mən də sizin Rəbbinizəm. Məndən (əzabımdan) qorxun!”

53. Amma (ümmətlər) öz dinini aralarında parçalayıb firqə-firqə oldular (müxtəlif məzhəblərə ayrıldılar). Hər firqə öz dininə sevinir. (Öz dinini haqq, digər dinləri batil hesab edib bundan məmnun olur).

54. (Ya Rəsulum!) Sən onları bir müddət (əcəlləri çatana qədər) öz şaşqınlıqları içində burax!

55. Məgər (kafirlər) elə zənn edirlər ki, onlara (dünyada) verdiyimiz var-dövlət və övladla

56. Biz onların yaxşılıqlarına tələsirik? Xeyr, anlamırlar! (Kafirlərə dünyada istədiklərini verib tədriclə onları əzaba yaxınlaşdırmağımızı, az sonra qəflətən başlarının üstünü alacağımızı düşünmürlər!)

57. Həqiqətən, Rəbbinin qorxusundan tir-tir əsənlər;

58. Rəbbinin ayələrinə inananlar;

59. Rəbbinə şərik qoşmayanlar;

60. Ürəkləri Rəbbinin hüzuruna qayıdacaqlarından qorxuya düşüb verməli olduqlarını (zəkatı, sədəqəni) verənlər –

61. Məhz onlar yaxşı işlər görməyə tələsər (bir-biri ilə yarışar) və bu işlərdə (başqalarından) öndə gedərlər.

62. Biz heç kəsi gücü çatmayan işi görməyə vadar etmərik. (Hər kəsi yalnız qüvvəsi çatdığı qədər yükləyərik. Namazı ayaq üstə qıla bilməyən oturub qıla bilər. Xəstəliyinə, zəifliyinə görə oruc tuta bilməyən orucunu yeyə bilər). Bizdə haqqı söyləyən bir Kitab vardır. Onlara (haqsız yerə əsla) zülm olunmaz.

63. Lakin (kafirlərin) qəlbləri bundan (Qurandan) xəbərsizdir (bu barədə cəhalət içindədir) . Onların bundan başqa (Allaha xoş getməyən) ayrı işləri də vardır ki, elə onları edib durarlar (küfr edib günaha batarlar).

64. Nəhayət, onların naz-nemət içində yaşayan başçılarını əzabla yaxaladığımız zaman (Bədr vuruşu günü) fəryad edib imdad diləyərlər.

65. (Onlara belə deyirlər: ) "Yalvarıb-yaxarmayın, bu gün Bizdən sizə heç bir kömək yetişməz!"

66. Ayələrimiz sizə oxunduğu zaman arxa çevirirdiniz (onları yalan hesab edib inanmırdınız).

67. (Kəbə əhlisiniz, sizə heç bir şey olmaz, deyə iman gətirməyi) özünüzə sığışdırmayıb gecələr toplanaraq (Quran və Peyğəmbər barəsində) ağzınıza gələni deyirdiniz (yaxud onlardan üz döndərirdiniz).

68. Məgər (müşriklər) kəlam (Allah kəlamı - Quran) haqqında düşünüb daşınmırlarmı? Yaxud onlara ulu babalarına (keçmiş ümmətlərinə) gəlməyən bir şey gəldi? (Onlar Quranın, Peyğəmbərin haqq olduğunu niyə anlamırlar? Məgər ulu babalarına İbrahim, İsmail, Musa kimi peyğəmbərlər gəlmədimi? Yaxud onlara Tövrat, Sühüf kimi kitablar nazil olmadımı?)

69. Yoxsa öz Peyğəmbərini tanımadılar və buna görə onu inkar edirlər?

70. Yaxud: "Onda divanəlik var?" – dedilər. Xeyr, Peyğəmbər onlara haqla (Quranla) gəldi. Lakin onların əksəriyyəti haqqı xoşlamır.

71. Əgər haqq (Quran) onların nəfslərinin istəklərinə tabe olsaydı (və ya Allah onların istədikləri kimi hərəkət etsəydi), göylər, yer və onlarda olanlar (bütün məxluqat) korlanıb gedərdi (aləm bir-birinə qarışıb nizamı pozulardı). Xeyr, Biz (müşriklərə) onlar üçün öyüd-nəsihət (və Peyğəmbər öz qövmlərindən olduğu üçün şərəf olan Quranı) gətirdik, onlar isə özlərinə edilən öyüd-nəsihətdən (və şərəflərindən) üz döndərirlər.

72. Yoxsa (Ya Rəsulum!) sən onlardan (öz peyğəmbərliyinə, haqqı təbliğ etdiyinə görə) bir muzd (ücrət) istəyirsən? Rəbbinin əcri (dünyada verdiyi ruzi, axirətdə verəcəyi mükafat) daha xeyirlidir. O, ruzi verənlərin ən yaxşısıdır!

73. Əslində sən onları doğru yola (islam dininə) dəvət edirsən!

74. Axirətə inanmayanlar isə doğru yoldan sapanlardır!

75. Əgər Biz onlara rəhm edib düşdükləri müsibətdən qurtarsaq, onlar şaşqın vəziyyətdə yenə də azğınlıqlarında davam edərlər. (Məkkəyə yeddi il ərzində aclıq, qıtlıq üz vermişdi. Məkkə müşrikləri Peyğəmbərin yanına gedib bu bəladan qurtarmaları üçün Allaha dua etməyi xahiş etmişdilər. Peyğəmbərin duasından sonra Məkkədə bolluq olmuş, camaatın güzəranı tamamilə yaxşılaşmışdı. Bunun müqabilində Peyğəmbərə iman gətirmək əvəzinə, müşriklər ona verdikləri əzab-əziyyəti daha da gücləndirmişdilər).

76. Biz həqiqətən, onları əzabla yaxaladıq, lakin onlar yenə öz Rəbbinə itaət etmədilər, (Ona) yalvarıb-yaxarmadılar (iman gətirmədilər ki, gətirmədilər).

77. Nəhayət, onların üzünə bir əzab qapısı açdığımız (Bədr vuruşunun müsibətinə düçar etdiyimiz) zaman dərhal ümidsizliyə qapıldılar (dilləri-ağızları quruyub, mat-məəttəl qaldılar).

78. Sizə qulaq, göz və ürək verən Odur. Siz (Allahın nemətlərinə) çox az şükür edirsiniz.

79. Sizləri yer üzündə yaradıb törədən (yer üzünə yayıb səpələyən) Odur. Siz (qiyamət günü) Onun hüzuruna cəm ediləcəksiniz.

80. Diriltdən də, öldürən də Odur. Gecə və gündüzü bir-birinin ardınca gedib-gəlməsi də Onun əmrilədir. Məgər (Allahın qüdrətini, ibadətə bütlərin deyil, məhz Onun layiq olduğunu) dərk etmirsiniz?

81. Xeyr, onlar da əvvəlkilərin (keçmiş ümmətlərin) dedikləri kimi dedilər.

82. (Keçmiş ümmətlər) belə demişdilər: "Məgər biz ölüb torpaq və sür-sümük olduqdan sonra bir də dirildiləcəyik?"

83. Həqiqətən, bizə də, atalarımıza da öncə bu (dirilmə) vəd olunmuşdu. Bu, qədimlərin (keçmiş ümmətlərin) əfsanələrindən (uydurmalarından) başqa bir şey deyildir.

84. (Ya Rəsulum! Bu müşriklərə) de: "Əgər bilirsinizsə, (bir deyin görək) bu yer və yer üzündə olanlar (bütün məxluqat) kimindir?"

85. Onlar mütləq: "Allahındır!" – deyə cavab verəcəklər. Sən də de: "Bəs elə isə (məxluqatı yaratmağa qadir olan kəsin öləndən sonra onları yenidən dirildə biləcəyini) düşünmürsünüz?"

86. De: "Yeddi (qat) göyün Rəbbi, o (böyük) əzəmətli ərşin Rəbbi (sahibi) kimdir?"

87. (Müşriklər) mütləq: "(Bunlar) Allahındır!" – deyə cavab verəcəklər. Onda sən də de: "Bəs elə isə (Allahın əzabından) qorxmursunuz?"

88. De: “Əgər bilirsinizsə, (bir deyin görək) hər şeyin hökmü əlində olan, (istədiyini) himayə edən, amma Özünün himayəyə ehtiyacı olmayan kimdir?”

89. Onlar mütləq: “(Bu qüdrət, bu vəsflər yalnız) Allahındır!” – deyə cavab verəcəklər. Sən də de: “Bəs elə isə (Şeytana aldanıb haqqa boyun qoymaqdan, Allahın ayələrinə inanmaqdan və yalnız Ona ibadət etməkdən) nə cür (aldanılıb) döndərilirsiniz?

90. Xeyr, Biz onları haqqı (haqq yol olan islam dinini) gətirdik. Onlar isə, şübhəsiz ki, yalançıdırlar!

91. Allah (Özünə) heç bir övlad götürməmişdir. (Nə İsa Onun oğlu, nə də mələklər Onun qızlarıdır. Əksinə, onların hamısı Allahın qüdrətindən yaranmış məxluqatlardır). Onunla yanaşı (ibadət ediləcək) heç bir tanrı yoxdur. Əgər belə olsaydı, onda heç bir tanrı əlahiddə öz yaratdıqları ilə gedər, (öz məxluqatını ayırıb aparar) və onların bir qismi (dünyadakı padşahlar kimi) digərinə üstün olmağa çalışardı. Allah müşriklərin (Ona) aid etdikləri sifətlərdən tamamilə kənardır!

92. O, qeybi də, aşkarı da bilir. Allah (müşriklərin) Ona qoşduğu şəriklərdən çox ucadır!

93. (Ya Rəsulum!) De: “Ey Rəbbim! Əgər (müşriklərə) vəd etdiyin əzabı mənə göstərəcəksənsə,

94. Onda məni zalım tayfanın içində qoyma, ey Rəbbim!” (“Məni də onlarla birlikdə həlak etmə. Məni razı qaldığın kəslərlə bir yerdə et!”)

95. (Ya Rəsulum!) Biz onlara vəd etdiyimizi (əzabı) sənə göstərməyə, əlbəttə, qadirik!

96. Sən pisliyi yaxşılıqla dəf et! (Gözəl xislət sahibi olub sənə pislik edəni, əziyyət verəni əfv et!) Biz (müşriklərin Bizə) aid etdikləri sifətləri (və sənin haqqında dedikləri nalayiq sözləri) daha yaxşı bilirik!

97. Və de: “Ey Rəbbim! Mən şeytanların vəsvəsələrindən Sənə sığınıram!

98. Onların yanımda olmalarından (işlərimə xələl qatmalarından) Sənə pənah gətirirəm, ey Rəbbim!”

99. Nəhayət, (müşriklərdən) birinin ölümü gəlib çatdığı zaman o belə deyər: “Ey Rəbbim! Məni geri (dünyaya) qaytar!

100. Bəlkə, (indiyə qədər) zay etdiyim ömrüm müqabilində yaxşı bir iş görüm! (Yaxud, bu günə qədər tərk etdiyim imana qayıdıb saleh bir əməl edim!) Xeyr, bu onun dediyi boş (faydasız) bir sözdür. Onların önündə dirilib (haqq-hesab üçün Allahın hüzurunda) duracaqları günə (qiyamət gününə) qədər maneə (öldükdən sonra qiyamətədək qalacaqları bərzəx aləmi) vardır.

101. Sur çalınacağı gün artıq aralarında nə qohumluq (əlaqəsi) olar, nə də onlar bir-birindən soruşub hal-əhval tutarlar. (Qiyamət günü heç bir qohumluq fayda verməz, qohumlar bir-birini tanımaz; hərə öz hayında olar).

102. Məhz tərəziləri ağır gələnlər (dünyada yaxşı əməlləri çox olanlar) nicat taparlar.

103. Tərəziləri yüngül gələnlər (dünyada çoxlu günah qazananlar) isə özlərinə ziyan edənlərdir. Onlar Cəhənnəmdə əbədi qalarlar.

104. Cəhənnəm odu onların üzünü yandırar. Onlar orada (üst dodaqları başlarının tən ortasına, alt dodaqları isə göbəklərinə qədər uzanaraq) dişləri ağarmış vəziyyətdə durarlar.

105. (Onlara deyilər: ) “Məgər Mənim ayələrim sizlərə oxunmurdumu? Siz isə onları yalan hesab edirsiniz!”

106. Onlar deyərlər: “Ey Rəbbimiz! Rəzil taleyimiz (bədbəxtliyimiz) bizə qələbə çaldı və biz haqq yoldan azan bir camaat olduq!

107. Ey Rəbbimiz! Bizi oradan (cəhənnəm odundan çıxart! Əgər bir də (Sənin xoşuna gəlməyən pis işlərə) qayıtsaq, şübhəsiz ki, zalım (özümüz özümüzə zülm etmiş) olarıq”.

108. (Allah) buyurar: “Orada zəlil (məyus) vəziyyətdə durub qalın və Mənə heç bir şey deməyin! (Cəhənnəm odundan xilas edilməyinizi Məndən diləməyin!)”

109. Çünki bəndələrimdən bir zümrə (möminlər) var idi ki, onlar: “Ey Rəbbimiz! Biz (Sənə) iman gətirdik. Artıq bizi bağışla, bizə rəhm et. Sən rəhm edənlərin ən yaxşısısan!” – deyirdilər.

110. Siz isə onları məsxərəyə qoyurdunuz. (Bu məsxərə, lağlağı başınızı o qədər qatmışdı ki) Məni yada salmağı belə sizə unutdurmuşdu. Siz (istehza ilə) onlara gülürdünüz.

111. Həqiqətən, Mən səbr etdiklərinə görə onları mükafatlandırdım. Onlar nicat tapanlardır (uğura yetənlərdir)!”

112. (Allah qiyamət günü kafirlərə) belə buyuracaqdır: “Yer üzündə neçə il qaldınız?”

113. Onlar: “Bir gün, bir gündən də az, hər halda, sayanlardan (insanların əməllərini sayan mələklərdən) soruş!” – deyə cavab verəcəklər.

114. Allah buyuracaq: “Əgər (həqiqəti) bilirsinizsə, siz (orada) çox az qaldınız! (Dünya həyatı axirət həyatı ilə müqayisədə olduqca qısadır).

115. Yoxsa sizi əbəs yerə yaratdığımızı və (qiyamət günü dirilib haqq-hesab üçün) hüzurumuza qaytarılmayacağınızı güman edirdiniz?"

116. Həqiqi hökmdar olan Allah (hər şeydən) ucadır. Ondan başqa heç bir tanrı yoxdur. O, kərim (uca, qiymətli) olan ərşin Rəbbidir! (Allahın rəhməti, xeyir-bərəkəti, peyğəmbərlərə gələn vəhy ərşdən nazil olduğu üçün o kərimdir).

117. Kim Allahla yanaşı başqa bir tanrıya ibadət edərsə - bunun üçün isə onun heç bir dəlili yoxdur – (qiyamət günü) onun cəzasını Rəbbi özü verəcəkdir. Həqiqətən, kafirlər nicat tapmazlar!

118. (Ya Rəsulum!) De: "Ey Rəbbim (Bizi) bağışla və rəhm et! (Ümmətimin günahlarından keç, tövbəmizi qəbul buyurmaqla bizə mərhəmət əta et!) Sən rəhm edənlərin ən yaxşısısan!

## .24.
## ən-Nur (Nur) surəsi
**(Məkkədə nazil olmuşdur, 64 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Bu, (səmadan) nazil edib (hökmlərini) vacib buyurduğumuz bir surədir. Biz onda açıq-aşkar ayələr nazil etdik ki, bəlkə, düşünüb ibrət alasınız!

2. Zinakar kişiyi və zinakar qadına yüz çubuq vurun. Allaha və axirət gününə inanırsınızsa, Allahın dini barəsində (bu işin icrasında) ürəyiniz onlara yumşalmasın və möminlərdən bir dəstə də onların əzabına şahid olsun. (Bu, subay kişiyə və ərsiz qadına aiddir. Evli kişi və qadın zina etdikdə isə onların cəzası daşqalaq edilməkdir).

3. Zinakar kişi ancaq zinakar, yaxud müşrik bir qadınla evlənə bilər. Zinakar qadın da yalnız zinakar, yaxud müşrik bir kişiyə ərə gedə bilər. Bu (belə bir evlənmə), möminlərə haram edilmişdir.

4. İsmətli qadınla zina isnad edib, sonra (dediklərini təsdiqləyəcək) dörd şahid gətirə bilməyən şəxslərə səksən çubuq vurun və onların şəhadətini heç vaxt qəbul etməyin. Onlar sözsüz ki, (Allahın itaətindən çıxmış) əsl fasiqlərdir.

5. Bundan (namuslu qadınlara atdığı böhtandan) sonra tövbə edib özlərini islah edənlər istisna olmaqla. Çünki Allah (tövbə edənləri) bağışlayandır, rəhmlidir!

6. Arvadlarına zina isnad edib özlərindən başqa şahidləri olmayanların hər biri özünün doğru danışanlardan olduğuna dair dörd dəfə Allahın adı ilə (Əşhədu billahi – Allahı şahid gətirirəm, deyə) şəhadət verməlidir.

7. Beşinci dəfə: "Əgər yalan danışanlardandırsa, Allah ona lənət eləsin!" (deməlidir).

8. Qadının da (hakimin hüzurunda) ərinin yalan danışanlardan olması barədə dörd dəfə Allahı şahid tutması əzabı ondan dəf edər.

9. Beşinci dəfə: "Əgər (əri) doğru danışanlardandırsa, Allah ona (qadının özünə) lənət (qəzəb) eləsin!" (deməlidir).

10. Əgər Allahın sizə neməti və mərhəməti olmasaydı, Allah tövbələri qəbul edən, hikmət sahibi olmasaydı (halınız necə olardı)? (O, günahkarların cəzasını dərhal verib onları rüsvay edərdi).

11. Həqiqətən, (Aişə barəsində) yalan xəbər gətirənlər öz içərinizdə olan bir zümrədir (münafiqlərdir). Onu (o xəbəri) pis bir şey zənn etməyin. O, bəlkə də, sizin üçün xeyirlidir. O zümrədən olan hər bir şəxsin qazandığı günahın cəzası vardır. Onlardan günahın böyüyünü

öz üstünə götürəni (Abdulah ibn Ubeyyi) isə (qiyamət günü) çox böyük (şiddətli) bir əzab gözləyir!

12. Məgər o yalan sözü eşitdiyiniz zaman mömin kişilər və qadınlar öz ürəklərində (özləri haqqında yaxşı fikirdə olduqları kimi, dostlarının da əhli-əyalı barəsində) yaxşı fikirdə olub: "Bu, açıq-aydın bir böhtandır!" – deməli deyildilərmi?

13. (Aişəyə iftira yaxanlar) nə üçün özlərinin doğru olduqlarını təsdiq edəcək dörd şahid gətirmədilər? Madam ki, şahid gətirmədilər, deməli, onlar Allah yanında əsl yalançıdırlar!

14. Əgər Allahın dünyada və axirətdə sizə neməti və mərhəməti olmasaydı, o yalan sözünüzə görə sizə şiddətli bir əzab toxunardı.

15. O zaman ki, siz (münafiqlərin yaydığı) yalanı dilinizə gətirir, bilmədiyiniz sözü ağzınıza alır və onu yüngül (asan, insana günah gətirməyən) bir şey sanırdınız. Halbuki bu (Peyğəmbərin əhli-əyalı haqqında nalayiq söz danışmaq) Allah yanında çox böyük günahdır!

16. Məgər siz onu eşitdiyiniz zaman: "Bizə bunu (bu yalanı) danışmaq yaraşmaz. Aman (Allah)! Bu, çox böyük bir böhtandır!" – deməli deyildinizmi?

17. Allah sizə öyüd-nəsihət verir ki, əgər möminsinizsə, bir daha belə şeylər etməyəsiniz.

18. Və Allah sizin üçün ayələrini (belə ətraflı, açıq-aydın) izah edir. Allah (hər şeyi) biləndir, hikmət sahibidir!

19. Möminlər arasında (onları nüfuzdan, hörmətdən salmaq məqsədilə) pis söz yaymaq istəyənləri dünyada və axirətdə şiddətli bir əzab gözləyir. (Hamının əməlini, yayılan şayiələrin, atılan böhtanların doğru olub-olmadığını) ancaq Allah bilir, siz bilməzsiniz!

20. Əgər Allahın sizə neməti və mərhəməti olmasaydı, Allah şəfqətli, rəhmli olmasaydı (Halınız necə olardı)? (Dediyiniz yalanlara, yaxdığınız iftiralara görə sizi dərhal məhv edərdi).

21. Ey iman gətirənlər! Şeytanın yolunu tutub getməyin! Kim Şeytanın getdiyi yolla getsə, o, (insanlara) çirkin, pis işlər görməyi (zina etməyi, yalan danışmağı, özgələrə böhtan atmağı) əmr edər. Əgər Allahın sizə neməti və mərhəməti olmasaydı, sizdən heç kəs heç vaxt (günahdan) pak olmazdı. Lakin Allah dilədiyini (günahdan) pak edər. Allah (hər şeyi) eşidəndir, biləndir!

22. Aranızda olan fəzilət və sərvət sahibləri qohum-əqrəbaya, miskinlərə və Allah yolunda hicrət edənlərə (heç bir şey) verməyəcəklərinə and içməsinlər. (Onları) əfv edib, (cəzalandırmaqdan) vaz keçsinlər! Məgər siz (bu yaxşılıq müqabilində) Allahın sizi (günahlarınızı) bağışlamağını istəmirsiniz? Allah (bəndələrini) bağışlayandır, rəhm edəndir!

23. Zinadan xəbəri olmayan namuslu, ismətli mömin qadınları zinada ittiham edənlər dünyada və axirətdə lənətə düçar olarlar. Onları (qiyamət günü) çox böyük bir əzab gözləyir.

24. Qiyamət günü (onlar dünyada qazandıqları günahlarını dandıqda) dilləri, əlləri və ayaqları etdikləri əməllər barəsində onların əleyhinə şəhadət verəcəkdir.

25. O gün Allah onların cəzasını layiqincə verəcək və onlar Allahın (Allahın onlara verdiyi vədin) açıq-aşkar bir haqq olduğunu biləcəklər!

26. Murdar qadınlar murdar kişilərə, murdar kişilər isə murdar qadınlara, eləcə də təmiz qadınlar təmiz kişilərə, təmiz kişilər də təmiz qadınlara layiqdirlər. (Pis sözlər pis adamlara, pis adamlar pis sözlərə, eləcə də yaxşı sözlər yaxşı adamlara, yaxşı adamlar da yaxşı

sözlərə layiqdirlər). Bunlar (Aişə və Səfvan kimi pak adamlar) onların (münafiqlərin) dediklərindən (yalan, pis sözlərdən) uzaqdırlar. Onları (günahlardan) bağışlanma və (Cənnətdə) tükənməz (minnətsiz) ruzi gözləyir!

27. Ey iman gətirənlər! Başqalarının evlərinə (sizin olmayan evlərə) sahiblərindən icazə almadan və onlara salam vermədən girməyin. Bu, (ədəb-ərkan baxımından) sizin üçün daha yaxşıdır. Bəlkə, (Allahın bu əmrinin hikmətini) düşünüb anlayasınız (və həmişə yadda saxlayıb ona əməl edəsiniz).

28. Əgər orada heç kəsi tapmasanız, sizə icazə verilməyənədək içəri girməyin. Sizə “Geri dönün!” – deyilsə, geri dönün. Bu, Allahın yanında sizin üçün daha təmiz bir davranışdır. Allah nə etdiklərinizi biləndir!

29. İçərisində əşyanız olan (karvansara, mehmanxana, ümumi istifadə yerləri kimi) qeyri-məskun evlərə (icazəsiz) daxil olmaq sizin üçün günah deyildir. Allah sizin aşkar etdiklərinizi də, gizli saxladıqlarınızı da (aşkarda da, gizlində də nə etdiyinizi) bilir!

30. (Ya Rəsulum!) Mömin kişilərə de ki, gözlərini haram edilmiş şeylərdən çevirsinlər (naməhrəmə baxmasınlar), ayıb yerlərini (zinadan) qorusunlar (və ya örtülü saxlasınlar). Bu onlar üçün (ədəb-ərkan, təmizlik baxımından) daha yaxşıdır. Şübhəsiz ki, Allah onların nə etdiklərindən xəbərdardır!

31. Mömin qadınlara de ki, gözlərini haram buyurulmuş şeylərdən çevirsinlər (naməhrəmə baxmasınlar), ayıb yerlərini (zinadan) qorusunlar (və ya örtülü saxlasınlar); öz-özlüyündə görünən (əl, üz) istisna olmaqla, zinətlərini (zinət yerləri olan boyun, boğaz, qol, ayaq və s. naməhrəmə) göstərməsinlər; baş örtüklərini yaxalarının üstünə çəksinlər (boyunları və sinələri görünməsin); zinət yerlərini ərlərindən, yaxud öz atalarından, yaxud ərlərinin atalarından

(qayınatalarından), yaxud öz oğullarından, yaxud ərlərinin oğullarından, yaxud öz qardaşlarından, yaxud qardaşlarının oğullarından, yaxud bacılarının oğullarından, yaxud öz (müsəlman) qadınlarından, yaxud sahib olduqları (müşrik) cariyələrdən, yaxud kişiliyi qalmamış (onlarla birlikdə yemək yeyən) xidmətçilərdən, yaxud qadınların məhrəm yerlərini hələ anlamayan uşaqlardan başqasına göstərməsinlər; gizlətdikləri bəzək şeylərini (xalxallarını) göstərmək üçün ayaqlarını (yerə və ya bir-birinə) vurmasınlar. Ey möminlər! Hamınız Allaha tövbə edin ki, nicat tapasınız! (Mətləbinizə çatasınız!)

32. (Ey möminlər!) Aranızda olan subay kişiləri və ərsiz qadınları, əməlisaleh (yaxud evlənməyə qabil) kölə və cariyələrinizi evləndirin. Əgər onlar yoxsuldurlarsa, Allah öz lütfü ilə onları dövlətli edər. Allah (lütfü, mərhəmətilə) genişdir, (hər şeyi) biləndir!

33. Evlənməyə qüvvəsi çatmayanlar (maddi imkanı olmayanlar) Allah öz lütfü ilə onlara dövlət verənə qədər iffətlərini qoruyub (özlərini zinadan) saxlasınlar. Kölələrinizdən mükatəbə etmək (əvvəlcədən bağlanılmış yazılı müqaviləyə əsasən müəyyən məbləğ pul qazanıb ağasına vermək şərtilə köləlikdən azad olmaq) istəyənlərlə - əgər onlarda bir xeyir (müqavilədəki şərtlərin yerinə yetirilməsi üçün qüdrət) görürsünüzsə - mükatəbə edin. Onlara Allahın sizə verdiyi maldan verin. (Zəkatdan onlara o qədər verin ki, özlərini satın alıb azad edə bilsinlər). Əgər cariyələriniz ismətlərini qoruyub saxlamaq istəsələr, fani dünya malı əldə etmək xatirinə onları zinaya məcbur etməyin. Kim onları (cariyələri zinakarlığa) məcbur edərsə, (bilsin ki) onların bu məcburiyyətindən sonra, əlbəttə, Allah (zinakarlığa vadar olanları) bağışlayar, rəhm edər. (Zinakarlığa vadar edilən cariyələrin günahı onlar bu işlə öz xoşuna deyil, zor gücünə məşğul olduqları üçün həmin cariyələrin özlərinə deyil, onları

pul qazanmaq məqsədilə zinakarlığa sövq edən ağalarının boynuna düşər).

34. Həqiqətən, Biz (Quranda) sizə (haqqı nahaqdan ayırd edən) açıq-aşkar ayələr, sizdən əvvəl gəlib-gedənlər (keçmiş ümmətlər) barəsində məsəllər (hekayətlər) və müttəqilər üçün öyüd-nəsihət nazil etdik.

35. Allah göylərin və yerin nurudur. (Kainatı yaradıb ona nur verən, yer və göy əhlinə haqq yolu göstərən xaliqdir). Onun (Peyğəmbərimizin və möminlərin qəlbində olan) nuru, içində çıraq olan bir taxçaya (çıraqdana) bənzər; taxçadakı o çıraq bir qəndilin içindədir, o qəndil isə, sanki parlaq bir ulduzdur. O çıraq nə şərqdə, nə də qərbdə (aləmin ortasında) olan mübarək bir zeytun ağacından yandırılır. (Şərqdə deyildir ki, günəş batdıqda, qərbdə də deyildir ki, günəş doğduqda qaranlıqda qalsın). Onun (zeytun ağacının) yağı özünə od toxunmasa da, sanki (haradasa) işıq saçır. O, nur üstündə nurdur. Allah dilədiyiniz öz nuruna qovuşdurur (istədiyinə öz nurunu bəxş edib cənnət yolu olan islam dininə yönəldir). Allah (həqiqəti anlaya bilsinlər deyə) insanlar üçün misallar çəkir. Allah hər şeyi biləndir!

36. (Həmin taxça və çıraq) Allahın tikilib ucaldılmasına və Öz adının zikr edilməsinə izin verdiyi o evlərdədir (o məscidlərdədir) ki, orada səhər-axşam Onu təqdis edib şəninə təriflər deyərlər.

37. O kəslər ki, nə ticarət, nə alış-veriş onları Allahı zikr etməkdən, namaz qılmaqdan və zəkat verməkdən yayındırmaz. Onlar qəlblərin və gözlərin haldan-hala düşəcəyi (dəhşətdən ürəklərin duymaqdan, gözlərin görməkdən qalacağı) bir gündən (qiyamət günüdən) qorxarlar.

38. (Onların vaxtlı-vaxtında, lazımınca ibadət etmələri, Allahdan qorxub pislikdən çəkinmələri ona görədir ki) Allah onlara etdikləri

əməllərin ən gözəl mükafatını (yaxud gördükləri ən yaxşı işlərin əvəzini) versin, onlara olan lütfünü artırsın. Allah dilədiyinə saysız-hesabsız ruzi verər.

39. (Allahın vəhdaniyyətini danan, Quranı yalan hesab edən) kafirlərin əməlləri ucsuz-bucaqsız çöldəki (səhradakı) ilğıma bənzər ki, susuzluqdan ürəyi yanan onu su bilər. Nəhayət, gəlib ona yetişdiyi zaman onun heç nə olduğunu görər. O öz əməlinin yanında ancaq Allahın cəzasını tapar. (Allah da) onun cəzasını (layiqincə) verər. Allah tezliklə haqq-hesab çəkəndir.

40. Yaxud (onların əməlləri) zəngin dənizin zülmətinə bənzər. Onu bir dalğa, o dalğanın üstündən bir dalğa, onun da üstündən bir bulud (dalğa) – zülmət üstündən zülmət örtər. O, əlini çıxartdıqda, hardasa onu görməz. Allah bir kəsə nur bəxş etməsə, onun nuru olmaz.

41. (Ya Rəsulum!) Məgər göylərdə və yerdə olanların (mələklərin, insanların, cinlərin), qanadlarını açıb (qatar-qatar) uçan quşların Allahı təqdis edib şəninə təriflər dediklərini görmürsənmi?! Allah onlardan hər birinin duasını, şükür-sənasını (yaxud onların hər biri öz duasını, şükür-sənasını) bilir. Allah onların nə etdiklərini (layiqincə) biləndir!

42. Göylərin və yerin hökmü Allahındır. Axır dönüş də Allahadır!

43. Məgər görmürsənmi ki, Allah buludları qovar, sonra onları bir araya toplayar, sonra da üst-üstə yığıb topa halına salar. Və görürsən ki, (o buludların) arasından yağmur çıxar, sonra Allah göydən dağlar kimi (çox və böyük) dolu yağdırar, sonra da onunla istədiyini bəlaya düçar edər, istədiyindən də onu sovuşdurar. Buludların şimşəyinin parıltısı az qala gözləri kor edər.

44. Allah gecəni gündüzə (gündüzü də gecəyə) çevirər. Həqiqətən, bunda (gecə və gündüzün bir-birinin ardınca gedib-gəlməsində) bəsirət sahibləri üçün bir ibrət vardır.

45. Allah hər heyvanı (canlını) bir sudan (nütfədən) yaratmışdır. Onların bəzisi qarnı üstə sürünür, bəzisi iki, bəzisi isə dörd ayaq üstündə gəzir. Allah istədiyini yaradır. Həqiqətən, Allah hər şeyə qadirdir!

46. Həqiqətən, Biz (hökmlərimizi, halal və haram buyurduqlarımızı, haqq yolu) açıq-aydın (bildirən) ayələr nazil etdik. Allah dilədiyini doğru yola (islam dininə) yönəldər.

47. (Münafiqlər: ) "Allaha, Peyğəmbərə iman gətirdik, itaət etdik!" – deyər, bundan sonra isə onlardan bir dəstə (Peyğəmbərdən) üz çevirər. Belələri mömin (dilləri ilə ürəkləri bir olan müsəlman) deyillər.

48. (Münafiqlər) aralarında hökm etmək üçün Allahın (Allahın kitabının) və Peyğəmbərinin yanına çağırıldıqda onlardan bir dəstə (onun yanına gəlməkdən, haqqa boyun qoymaqdan) dərhal üz çevirər.

49. Əgər haqq onların tərəfində olsa, itaət edib (tez) onun yanına gələrlər.

50. Onların qəlblərində mərəzmi (şəkk, nifaq mərəzimi) var? Yaxud Allahın və Peyğəmbərinin onlara cövr, haqsızlıq edəcəklərindən qorxurlar? Xeyr, onlar özləri zülmkardırlar! (Allaha asi olmaqla özləri-özlərinə zülm edirlər!)

51. Aralarında hökm vermək üçün Allahın (Allahın kitabının) və Peyğəmbərinin yanına çağırıldıqları zaman möminlərin sözü ancaq: "Eşitdik və itaət etdik!" – deməkdən ibarətdir. Nicat tapanlar da məhz onlardır!

52. Allaha və Onun Peyğəmbərinə itaət edənlər, Allahdan qorxub çəkinənlər – məhz belələri uğura çatanlardır (əbədi səadətə - Cənnətə qovuşanlardır).

53. (Ya Rəsulum, münafiqlər) onlara əmr etdiyin zaman mütləq (cihada) çıxacaqları haqda Allaha çox möhkəm and içdilər. Onlara de: "(Yalandan) and içməyin, itaətiniz məlumdur (yaxud sizdən tələb olunan and yox, adicə itaətdir). Həqiqətən, Allah nə etdiklərinizdən xəbərdardır!"

54. De: "Allaha itaət edin, Peyğəmbərə itaət edin. (Çünki Peyğəmbərə itaət etmək elə Allaha itaət etməkdir). Əgər (Peyğəmbərin əmrindən) üz döndərsəniz, (bilin ki) onun vəzifəsi ancaq ona tapşırılanı, sizin də vəzifəniz ancaq sizə tapşırılanı yerinə yetirməkdir. Əgər ona itaət etsəniz, doğru yolu tapmış olarsınız. Peyğəmbərin öhdəsinə düşən isə yalnız (dini, Allahın hökmlərini, risalətini) açıq-aşkar təbliğ etməkdir.

55. Allah aranızdan iman gətirib yaxşı işlər görənlərə - yalnız Mənə ibadət edərlər, heç nəyi Mənə şərik qoşmazlar deyə - onları özlərindən əvvəlkilər kimi yer üzünün varisləri edəcəyini (İsrail övladını yer üzündə kafirlərin yerinə gətirdiyi kimi onları da müşriklərin yerinə gətirəcəyini), onlar (möminlər) üçün onların Allahın Özü bəyəndiyi dinini (islamı) möhkəmləndirəcəyini (hər tərəfə yayacağını) və onların qorxusunu sonra əmin-amanlıqla (arxayınçılıqla) əvəz edəcəyini vəd buyurmuşdur. Bundan sonra küfr edənlər, şübhəsiz ki, (Allahın itaətindən çıxmış) əsl fasiqlərdir!

56. Namaz qılın, zəkat verin və Peyğəmbərə itaət edin ki, sizə rəhm olunsun!

57. (Allahın vəhdaniyyətini inkar edən) kafirlərin yer üzündə (öz Rəbbini) aciz edə biləcəyini (Allahın əzabından qaçıb canlarını

qurtara biləcəklərini) güman etməyin. Onların məskəni Cəhənnəmdir. O, necə də pis sığınacaqdır!

58. Ey iman gətirənlər! Sahib olduqlarınız (kölə və kənizlər), həddi-buluğa çatmayanlar (yanınıza daxil olmaq istədikdə) bu üç vaxtda sizdən icazə alsınlar: sübh namazından əvvəl, günorta (yatıb dincəlmək, istirahət etmək üçün) paltarınızı çıxartdığınız zaman və gecə namazından sonra. (Bu vaxtlar insan paltarını çıxarda bilər, zövcəsi ilə bir yerdə uzanıb ixtilaf edə bilər və i. a.) bu üç vaxt sizin üçün xəlvət vaxtdır (paltarsız ola bilərsiniz). Qalan vaxtlarda bir-birinizin yanına (icazəsiz) girib-çıxmaqda sizə də, onlara da heç bir günah yoxdur. Allah ayələri sizə belə izah edir. Allah (hər şeyi) biləndir, hikmət sahibidir!

59. Sizdən olan uşaqlar da həddi-buluğa çatanda (yanınıza daxil olmaq istədikləri zaman) özlərindən əvvəlkilər kimi izin istəsinlər. Allah Öz ayələrini sizə belə izah edir. Allah (hər şeyi) biləndir, hikmət sahibidir!

60. (Heyzdən və doğuşdan kəsildikləri üçün) ərə getməyə ümidi qalmayan yaşlı qadınların qadağan olunmuş zinətlərini (zinət yerlərini naməhrəmə) göstərmədən üst paltarını (çarşab, niqab, bürüncək və s.) çıxarmasında günah yoxdur. Bununla belə, (həmin geyimləri soyunmaqdan) çəkinmələri onlar üçün daha yaxşıdır. Allah (hər şeyi) eşidəndir, biləndir!

61. Kora, çolağa, xəstəyə (başqaları ilə bir yerdə oturub yemək yeməkdə) günah yoxdur. Sizin özünüzə də öz evlərinizdə, yaxud atalarınızın evlərində, yaxud analarınızın evlərində, yaxud qardaşlarınızın evlərində, yaxud bacılarınızın evlərində, yaxud əmilərinizin evlərində, yaxud bibilərinizin evlərində, yaxud dayılarınızın evlərində, yaxud xalalarınızın evlərində, yaxud açarları əllərinizdə olan (səlahiyyətiniz çatan) evlərdə, yaxud dostlarınızın

evlərində yemək yeməkdən heç bir günah gəlməz. Bir yerdə, yaxud ayrı-ayrılıqda yeməyinizdə də heç bir günah yoxdur. Evlərə daxil olduğunuz zaman özünüzü (bir-birinizi, qohum-əqrəbanızı, dostlarınızı və dindaşlarınızı) Allah dərgahından bərəkət və xoşluq diləyən bir salamla salamlayın. Allah ayələri sizə belə izah edir ki, düşünüb daşınasınız!

62. Həqiqətən, möminlər ancaq Allaha və Onu Peyğəmbərinə iman gətirən, ümumi bir iş (cihad, cümə xütbəsi, məsləhət-məşvərət) üçün Peyğəmbərlə bir yerdə olduqda ondan izin almamış bir yerə getməyən kimsələrdir. (Ya Rəsulum!) Səndən izin istəyənlər - məhz belələri Allaha və Onun Peyğəmbərinə inananlardır. Əgər onlar bəzi işləri üçün səndən izin istəsələr, onlardan özün istədiyinə (yanından getməyə) izin ver və onlar üçün Allahdan bağışlanma dilə. Həqiqətən, Allah (bəndələrini) bağışlayandır, rəhm edəndir!

63. Peyğəmbəri çağırmağı öz aranızda bir-birinizi çağırmağınızla eyni tutmayın! (Peyğəmbəri özünüz bir-birinizi çağırdığınız kimi çağırmayın. Ona “Muhəmməd, nə deyirsən?” yox, “Bəli! Buyur, ey Allahın elçisi, ey Allahın peyğəmbəri!” – deyə cavab verin. Və ya Peyğəmbərin duasını öz duanız kimi hesab etməyin. Onun duası, sizinkilərdən fərqli olaraq, Allah dərgahında mütləq qəbul olunar). Həqiqətən, Allah sizlərdən (xütbə zamanı məsciddən) xəlvət sovuşub aradan çıxanları bilir. Onun (Allahın, yaxud Peyğəmbərin) əmrinə qarşı çıxanlar başlarına gələcək bir bəladan, yaxud düçar olacaqları şiddətli bir əzabdan həzər etsinlər!

64. Bilin və agah olun ki, göylərdə və yerdə nə varsa, (hamısı) Allahındır. O, həqiqətən, sizin nə əməl sahibi olduğunuzu (hansı məzhəbə qulluq etdiyinizi) bilir. Allah (məxluqatın, yaxud münafiqlərin dirilib) Onun hüzuruna qaytarılacaqları gün (qiyamət günü) onlara (dünyada) nə etdiklərini bildirəcəkdir. Allah hər şeyi biləndir!

## .25.

## əl-Furqan (Fərqləndirmə) surəsi

**(Məkkədə nazil olmuşdur, 77 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Aləmləri (insanları və cinləri Allahın əzabı ilə) qorxutmaq üçün (haqqı batildən ayıran) Quranı Öz bəndəsinə (Muhəmmədə) nazil edən Allah nə qədər (uca, nə qədər) uludur! (Ucalardan ucadır; əzəli və əbədidir, xeyir-bərəkəti bol və daimidir!)

2. O Allah ki, göylərin və yerin hökmü (səltənəti) Onundur. O (Özünə) heç bir övlad götürməmişdir; mülkündə heç bir şəriki yoxdur. O, hər şeyi yaratmış və onu (onun nə cür olacağını) təqdir (əzəldən müəyyən) etmişdir.

3. (Müşriklər isə) Onu qoyub heç bir şey yarada bilməyən, əksinə, özləri yaradılan, özlərinə nə bir zərər, nə də bir xeyir verə bilən, diriltməyə, öldürməyə, həyat verməyə və (öləndən sonra qiyamət günü) yenidən diriltməyə gücləri çatmayanları (bütləri) özlərinə tanrılar qəbul etdilər.

4. Kafir olanlar: “Bu (Quran) onun (Muhəmmədin) uydurmasından başqa bir şey deyildir. Ona bu işdə başqa bir tayfa (yəhudilər) kömək etmişdir!” – deyərək (özləri bu batil iddiaları ilə) zülmə (küfrə) və böhtana yuvarlandılar.

5. Onlar həmçinin: “Bu, qədimlərin əfsanələridir (yalan sözlərdir). O (Muhəmməd) onları (yəhudilərə) yazdırtmışdır; (əzbərlənməsi üçün) səhər-axşam (Muhəmmədin) özünə oxunur”, - dedilər.

6. (Ya Rəsulum!) De: “Onu (Quranı) göylərin və yerin sirrini bilən (Allah) nazil etmişdir. Həqiqətən, O, (möminləri) bağışlayandır, rəhm edəndir!”

7. (Müşriklər) dedilər: “Bu necə peyğəmbərdir ki, yemək yeyir, bazarları gəzib dolaşır? Məgər ona özü ilə birlikdə (insanları Allahın əzabı ilə) qorxudan (və onun həqiqi peyğəmbər olduğunu təsdiq edən) bir mələk göndərilməli deyilmi?

8. Yaxud ona (ruzi qazanmaqdan ötrü bazarları dolaşmasın deyə göydən) bir xəzinə endirməli və ya ondan (onun meyvəsindən) yeyib dolanmaq üçün bir bağı olmalı deyildimi?” Zalımlar (müşriklər möminlərə) dedilər: “Siz ancaq ovsunlanmış (buna görə də ağlını itirmiş) bir adama tabe olursunuz!”

9. (Ya Rəsulum!) Bir gör sənin barəndə necə məsəllər çəkdilər! (Səni divanəyə bənzətdilər, peyğəmbərliyinin həqiqi olduğunu təsdiq etmək üçün göydən mələk endirilməsini tələb etdilər!) Artıq (doğru yoldan) azdılar və bir daha (haqqa) yol tapa bilməzlər!

10. (Ya Rəsulum!) Əgər istəsə, sənə ondan (müşriklərin dediklərindən) daha yaxşısını – (ağacları) altından çaylar axan cənnətlər verə bilən, sənin üçün qəsrlər yarada bilən Allah nə qədər (uca, nə qədər) uludur!

11. Lakin onlar (təkcə səni deyil) o saatı da (qiyaməti də) yalan saydılar. Biz də o saatı (qiyaməti) yalan hesab edənlər üçün (Cəhənnəmdə) şiddətli bir atəş hazırladıq.

12. O (atəş) onları uzaqdan görüncə (kafirlər) onun qəzəblə qaynamasını və uğultusunu eşidərlər.

13. Onlar əlləri boyunlarına bağlı vəziyyətdə o atəşdən dar bir yerə atıldıqları zaman (Dünyada Allaha asi olduqlarına görə özlərinə bəd dua edib) ölüm diləyərlər.

14. (Onlara istehza ilə deyilər: ) “Bu gün özünüzə bir ölüm diləməyin, çox ölüm diləyin!” (Belə bir gündə bir dəfə vaveyla deməkdən, bir dəfə özünə ölüm istəməkdən heç nə çıxmaz. Allahın

əzabı intəhasız və dəhşətli olduğu üçün dəfələrlə vaveyla deyib, dəfələrlə özünüzə ölüm diləməlisiniz!)

15. (Ya Rəsulum!) Onlara de: “Bu (cəhənnəm odu) yaxşıdır, yoxsa Allahdan qorxub pis əməllərdən çəkinənlərə bir mükafat və sığınacaq olaraq vəd edilən Xüld cənnəti?”

16. Onlar üçün orada istədikləri hər şey vardır. Onlar orada əbədi qalacaqlar. Bu, (bəndələr tərəfindən) sənin Rəbbindən (yerinə yetirilməsi) istənilən bir vəddir. (Bəndələr öz yaxşı əməlləri müqabilində Allahın onlara Cənnət qismət etməsini diləmiş, Allah da onlara bu barədə verdiyi vədi yerinə yetirmişdir).

17. (Allah müşrikləri) və onların Allahdan qeyri ibadət etdiklərini (bütləri) məhşərə toplayacağı gün (qiyamət günü) belə buyuracaqdır: “Mənim bu bəndələrimi (haqq yoldan) siz (bütlər) çıxartdınız, yoxsa onlar özləri yoldan çıxdılar?”

18. (Bütlər) deyəcəklər: “Sən paksan, müqəddəssən! Səni qoyub (özümüzə) başqa dostlar (hamilər) qəbul etmək bizə yaraşmaz. Lakin sən onlara və atalarına o qədər nemət verdin ki, hətta (Sənin öyüd-nəsihətini, Quranı) xatırlamağı belə unutdular və (buna görə də) məhvə məhkum edilmiş bir tayfa oldular!”

19. (Allah buyuracaqdır: ) “(Ey müşriklər, sizin tanrılarınız) dediklərinizi təkzib etdilər. Artıq nə əzabı (özünüzdən) sovuşdurar, nə də (özünüzə) bir kömək edə bilərsiniz. Sizdən zülm edənlərə (Allaha şərik qoşanlara) şiddətli bir əzab daddıracağıq”.

20. (Ya Rəsulum!) Səndən əvvəl göndərdiyimiz peyğəmbərlər də, şübhəsiz ki, yemək yeyər, (ruzi qazanmaq üçün) bazarları gəzib dolaşardılar. Sizin bir qisminizi digərinizə sınaq vasitəsi etdik ki, görək (möhnətlərə) dözə biləcəksinizmi? (Birinizi varlı, digərinizi kasıb, birinizi sağlam, digərinizi xəstə, zəif etdik ki, hansınızın daha

səbirli, daha dözümlü olduğunu, Allahın öz əzəli hökmü ilə ona verdiyi qismətə razı olub-olmadığını bilək). Sənin Rəbbin (çətinliklərə səbr edənləri və onlardan qorxanları) görəndir!

21. Bizimlə qarşılaşacaqlarına ümid etməyənlər (qiyamət günü dirilib haqq-hesab üçün hüzurumuzda duracaqlarında qorxmayanlar): "Bizə (Muhəmmədin həqiqi peyğəmbər olduğunu təsdiq edən) mələklər endirilməli, yaxud biz (onun doğru danışıb-danışmadığını bilmək üçün) Rəbbimizi görməli idi!" – dedilər. Həqiqətən, onlar özləri barəsində təkəbbürə qapıldılar və (Allahı bilavasitə görmək, onunla danışmaq istəməyə cürət etməklə) azğınlaşıb həddi çox aşdılar.

22. Mələkləri görəcəkləri gün – həmin gün günahkarlara (Cənnətlə) heç bir müjdə olmaz. (Mələklər onlara: ) "(Sizə şad xəbər eşitmək) haramdır!" – deyərlər.

23. Onların etdikləri hər hansı bir (yaxşı) əməli Biz qəsdən (havadan uçan) dağınıq zərrələrə (toz dənələrinə) döndərərik! (Onların qohum-əqrəbaya, yoxsullara göstərdikləri köməyin, qonağa, qəribə etdikləri hörmətin və dünyada gördükləri digər yaxşı işlərin zərrə qədər qiyməti olmaz!)

24. O gün cənnət əhlinin qalacağı yer daha yaxşı, istirahət edəcəyi yer daha gözəl olacaqdır!

25. Göyün (yeddi qat səmanın yuxarısından enən ağ) buludla parçalanacağı, mələklərin bölük-bölük (yerə) endiriləcəyi gün -

26. O gün həqiqi hökmranlıq (mülk) ancaq Rəhmana məxsusdur; o, kafirlər üçün isə çətin bir gün olacaqdır.

27. O gün zalım (küfrə düşməklə özünə zülm edən peşmançılıqdan) əllərini çeynəyib deyəcəkdir: "Kaş ki, mən Peyğəmbər vasitəsilə (özümə) doğru bir yol tutardım;

28. Vay halıma! Kaş filankəsi özümə dost etməyəydim;

29. And olsun ki, Quran mənə gəldikdən sonra məni ondan (Qurana iman gətirməkdən) o sapdırdı. Şeytan insanı (yoldan çıxartdıqdan, bəlaya saldıqdan sonra) yalqız buraxar (zəlil, rüsvay edər).

30. Peyğəmbər də "Ey Rəbbim! Həqiqətən, qövmüm bu Quranı tərk etmişdi!" – deyəcək.

31. (Ya Rəsulum! Bu Məkkə müşriklərini sənə düşmən etdiyimiz kimi) eləcə də (səndən əvvəl) hər peyğəmbər üçün günahkarlardan bir düşmən etmişdik. Rəbbinin sənə bir rəhbər, bir mədədkar olması kifayət edər!

32. Kafirlər: "Quran ona (Muhəmmədə) bütöv (birdəfəlik) endirilməli idi!" – dedilər. (Ya Rəsulum!) Sənin ürəyinə səbat (qətiyyət) vermək üçün Biz onu ayə-ayə (tədricə) nazil etdik. (Quranın az-az endirilib, ağır-ağır oxunması onun əzbərlənməsini və mənalarının anlaşılmasını asanlaşdırır).

33. (Ya Rəsulum! Müşriklər) sənin yanına gəlib elə bir məsəl çəkməzlər ki, Biz sənə (onun) doğrusunu və (onların gətirdikləri misallardan) izahatca daha yaxşısını gətirməyək.

34. Onlar (qiyamət günü) Cəhənnəmə üzüstə sürüklənib gətiriləcək kəslərdir. Onlar ən pis yerdə olan, ən çox yoldan azan kimsələrdir.

35. Həqiqətən, Biz Musaya kitab (Tövrat) verdik və qardaşı Harunu da ona vəzir (köməkçi) etdik.

36. Və (onlara) dedik: "Ayələrimizi yalan hesab etmiş bir tayfanın (Firon əhlinin) yanına gedin!" Sonra Biz onları (suda batırmaqla) büsbütün məhv etdik.

37. Biz Nuh qövmünü də peyğəmbərlərimizi təkzib etdikləri vaxt suda boğduq və onları insanlar üçün bir ibrət dərsi etdik. Biz zalımlar üçün də şiddətli bir əzab hazırlamışıq.

38. Biz Adı da, Səmudu da, (Şüeybin) Rəss əhlini də, həmçinin onların arasında olan bir çox nəsilləri də (yerlə yeksan etdik).

39. Biz onların hər biri üçün cürbəcür məsəllər çəkdik, (amma öyüd-nəsihətlərimizə qulaq asmadıqlarına görə) onları yerli-dibli yox etdik.

40. (Qüreyş müşrikləri ticarət üçün Şama gedərkən) fəlakət yağışı yağmış şəhərə (vaxtilə Lut tayfasının yaşadığı Sədum şəhərinə) gəlib çatmışdılar. Məgər onu (o şəhərin başına nələr gəldiyini) görmədilərmi? Xeyr, onlar öldükdən sonra yenidən dirilməyə inanmırlar. (Özlərindən əvvəlki kafirlərin başlarına gətirdiyimiz müsibətlərdən ibrət almayan Məkkə müşrikləri hələ də qiyamət barəsində şəkk-şübhə içindədirlər).

41. (Ya Rəsulum!) Onlar səni gördükdə ancaq məsxərəyə qoyur (və belə deyirlər): "Allahın peyğəmbər göndərdiyi şəxs budurmu?

42. Əgər biz (bütpərəstliyimizdə) səbir (səbat) göstərməsəydik, az qala bizi tanrılarımıza tapınmaqdan sapdırmışdı". Onlar əzabı (qiyamət əzabını) gördükdə haqq yoldan kimin daha çox azdığını biləcəklər.

43. (Ya Rəsulum!) Nəfsini özünə tanrı edəni gördünmü? Onun vəkili (zamini) sənmi olacaqsan? (Onu bəd əməllərdən sənmi çəkindirib saxlayacaqsan? O özü haqqı axtarıb tapmalı, ona nail olmalıdır!)

44. Yoxsa elə güman edirsən ki, onların əksəriyyəti (sən deyən sözü) eşidəcək və ya (ağıllı-başlı) fikirləşəcək? Onlar heyvan kimidirlər, bəlkə, ondan daha çox zəlalət yolundadırlar. (Heyvan

heyvanlığı ilə öz mənfəətini bilib ona zərər gətirən bir işi görməz. Bunlar isə nə xeyirlərini, nə də zərərlərini anlayarlar).

45. Məgər Rəbbinin kölgəni (günçıxandan günbatanadək) necə uzatdığını görmürsənmi? Əgər istəsəydi, onu daim öz yerində saxlayardı. Sonra Biz günəşi (kölgəyə) bir əlamət etdik. (Əgər günəş olmasaydı, kölgə bilinməzdi).

46. Sonra onu (o kölgəni günəşin yüksəlməsi ilə) yavaş-yavaş Özümüzə tərəf çəkdik. (Əgər kölgəni yerə birdən salıb, birdən çəksəydik, insanlar vahiməyə düşərdilər).

47. Sizin üçün gecəni örtük, yuxunu rahatlıq yaradan, gündüzü də (ruzi qazanmaqdan ötrü) həyat (iş, fəaliyyət vaxtı) yaradan Odur.

48. Külələri rəhməti (yağışı) önündə müjdəçi olaraq göndərən də Odur. Biz göydən tərtəmiz su endirdik ki,

49. Onunla ölü bir yerə can verək, yaratdığımız heyvanları və bir çox (bütün) insanları sirab edək!

50. (Zati-əqdəsimə) and olsun ki, (onlara verilən nemətləri) yada salsınlar deyə, Biz (həmin suyu) onların arasında paylaşdırdıq. Bununla belə, insanların əksəriyyəti nankorluqdan başqa bir şey etmədi (nankorluğunda dirənib qaldı).

51. Əgər istəsəydik, hər məmləkətə (insanları əzabımızla) qorxudan bir peyğəmbər göndərərdik. (Lakin səni, Ya Rəsulum, ən böyük şərəfə nail edib bütün bəşəriyyətə peyğəmbər göndərdik).

52. (Ya Rəsulum!) Kafirlərə itaət etmə və onlara qarşı (Quranla) böyük bir cihad et! (Var gücünlə vuruş!)

53. Birinin suyu çox şirin, digərininki isə olduqca şor (acı) olan iki dənizi qovuşduran, aralarında (bir-birinə qarışmamaq üçün) maneə və keçilməz sədd qoyan Odur!

54. İnsanları sudan (nütfədən) yaradan, onları (bir-biri ilə) əsl qohum (qan qohumu) və sonradan qohum edən Odur. Rəbbin (hər şeyə) qadirdir! (Birinci, ata-ana tərəfdən, ikinci isə bacı, qız tərəfdən olan qohumluqdur).

55. (Belə olduğu təqdirdə müşriklər) Allahı qoyub özlərinə nə xeyir, nə də zərər verə bilənlərə (bütlərə) ibadət edirlər. Kafir özünün haqq olan Rəbbinə arxa çevirər. (Və ya kafir öz Rəbbinə qarşı Şeytana kömək edər).

56. (Ya Rəsulum!) Biz səni yalnız (möminlərə Cənnətlə) müjdə verən və (kafirləri cəhənnəm əzabı ilə) qorxudan bir peyğəmbər olaraq göndərdik.

57. De: “Mən sizdən buna (dini, peyğəmbərliyi təbliğ etməyə) görə heç bir muzd (əvəz) istəmirəm, ancaq Rəbbinə tərəf doğru yol tapmaq diləyən kimsələr istəyirəm. (Mən öz peyğəmbərliyimə görə sizdən heç bir şey istəmirəm, lakin iman gətirmiş bir şəxs malını Allah yolunda sərf etsə, ona da mane olan deyiləm).

58. (Ya Rəsulum!) Ölməz, həmişə diri olana (Allaha) bel bağla və Onu həmd-səna ilə təqdis et (və ya Onun nemətlərinə şükür edərək namaz qıl). (Allahın) Öz bəndələrinin günahlarından xəbərdar olması (onları layiqincə cəzalandırmağa) kifayət edər.

59. O, göyləri, yeri və onların arasındakıları altı günə xəlq edən, sonra ərşi yaradıb ona hakim olan Rəhmandır. Bunu bir biləndən (Allahın Özündən və ya Cəbraildən) xəbər al!

60. Onlara (müşriklərə): “Rəhmana (rəhmli olan Allaha) səcdə edin!” – deyildiyi zaman, onlar: “Rəhman nədir? Bizə əmr etdiyin şeyə səcdəmi edəcəyik?” – deyə cavab verərlər. Bu (səcdə əmri) onların (imana olan) nifrətini daha da artırar.

61. Səmada bürclər yaradan, orada bir çıraq (günəş) və nurlu ay vücuda gətirən (Allah) nə qədər (uca, nə qədər) uludur!

62. (Allahın qüdrətini həmişə) yada salmaq və (nemətlərinə) şükür etmək istəyənlər üçün gecəni və gündüzü bir-birinin ardınca gətirən də Odur!

63. Rəhmanın (əsl) bəndələri o kəslərdir ki, onlar yer üzündə təmkinlə (təvazökarlıqla) gəzər, cahillər onlara söz atdıqları (xoşlarına gəlməyən bir söz dedikləri) zaman (onları incitməmək üçün) salam deyərlər.

64. Onlar gecəni Rəbbi üçün səcdə və qiyam (namaz) içində keçirərlər.

65. Və belə deyərlər: "Ey Rəbbimiz! Cəhənnəm əzabını bizdən sovuşdur. Şübhəsiz ki, onun əzabı həmişəlikdir!

66. Doğrudan da, o, nə pis məskən, nə pis yerdir!"

67. Onlar (mallarını) xərclədikdə nə israfçılıq, nə də xəsislik edər, bu ikisinin arasında orta bir yol tutarlar.

68. Onlar Allahla yanaşı başqa bir tanrıya ibadət etməz, Allahın haram buyurduğu cana nahaq yerə qıymaz (onu öldürməz), zina etməzlər. Hər kəs bunu (bu işləri) etsə, cəzasını çəkər.

69. Qiyamət günü onun əzabı qat-qat olar və (o, əzab) içində zəlil olub əbədi qalar.

70. Ancaq tövbə edib iman gətirən və yaxşı işlər görənlərdən başqa! Allah onların pis əməllərini yaxşı əməllərə çevirər. Allah bağışlayandır, rəhm edəndir!

71. Hər kəs tövbə edib yaxşı iş görsə, o, şübhəsiz ki, Allaha tərəf yaxşı bir dönüşlə (Allahın rizasını qazanmış halda) dönər.

72. O kəslər ki, yalan yerə şahidlik etməz, faydasız bir şeylə rastlaşdıqları (lağlağı bir söhbət eşitdikləri) zaman onlardan üz çevirib vüqarla keçər (özünü ləyaqətlə aparıb onlara əhəmiyyət verməz);

73. O kəslər ki, Rəbbinin ayələri zikr olunduğu vaxt özünü onlara qarşı kar və kor kimi aparmaz (əksinə, onlara cani-dildən qulaq asar);

74. Və o kəslər ki: "Ey Rəbbimiz, bizə zövcələrimizdən və uşaqlarımızdan (sənə itaət eməklə bizi sevindirib) gözümüzün işığı (bəbəyi) olacaq övladlar ehsan buyur və bizi müttəqilərə imam (rəhbər) et! – deyərlər.

75. Məhz belələri (Allah yolunda bütün çətinliklərə, əziyyətlərə) səbr etdiklərinə görə cənnət guşəsi (Cənnətdəki yüksək məqamlardan biri) ilə mükafatlandırılacaq, orada (mələklər tərəfindən) ehtiramla, salamla qarşılanacaqlar.

76. Onlar orada əbədi qalacaqlar. O, nə gözəl mənzil, nə yaxşı iqamətgahdır!

77. (Ya Rəsulum, bu Məkkə müşriklərinə) de: "Əgər ibadətiniz olmasa, Rəbbimin yanında nə qədir-qiymətiniz olar? Siz (Quranı və öz Peyğəmbərinizi) təkzib etdiniz. Buna görə də (nə dünyada, nə də axirətdə əzab) yaxanızdan əl çəkməyəcəkdir!"

## .26.
## əş-Şüəra (Şairlər) surəsi

**(Məkkədə nazil olmuşdur, 227 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Ta, Sin, Mim!

2. Bunlar (haqqı batildən ayıran, möcüzələri, hökmləri) açıq-aydın Kitabın ayələridir.

3. (Ya Rəsulum! Məkkə müşrikləri) iman gətirməyəcəklər deyə, bəlkə, özünü həlak edəsən?! (Özünü həlakmı edəcəksən?)

4. Əgər istəsək, göydən onlara bir ayə (dəlil) göndərərik, onlar da ona (səssiz-səmirsiz) boyun əyib durarlar.

5. Onlara Rəhmandan (rəhmli olan Allahdan) elə bir öyüd-nəsihət (xəbərdarlıq) gəlməz ki, ondan üz döndərməsinlər.

6. Onlar (Quranı) yalan hesab etdilər. Onların istehza etdiklərinin (Quranın müşriklərə veriləcək əzab barəsindəki) xəbərləri gəlib onlara çatacaqdır. (Qiyamət günü, yaxud Bədr döyüşündə büsbütün məyus olacaqlar).

7. Məgər onlar yer üzünə baxıb orada növbənöv gözəl (bitkilər və meyvələr) yetişdirdiyimizi görmürlərmi?

8. Şübhəsiz ki, bunda (Quranı və Peyğəmbəri təkzib edənlər üçün Allahın vəhdaniyyətinə, qüdrətinə dəlalət edən) bir əlamət vardır. Lakin onların əksəriyyəti iman gətirməzlər.

9. Həqiqətən, Rəbbin yenilməz qüvvət, mərhəmət sahibidir! (Kafirlərdən intiqam alar, tövbə edən bəndələrini bağışlayar!)

10. (Ya Rəsulum!) Yadına gətir ki, bir zaman Rəbbin Musaya belə buyurmuşdu: “Get o zalım tayfanın yanına –

11. Firon tayfasının yanına (və onlara de ki, Məni qoyub başqalarına ibadət etməkdən, İsrail övladlarına əziyyət verməkdən) məgər qorxmurlar?”

12. (Musa) dedi: “Ey Rəbbim! Onların məni yalançı sayacaqlarından qorxuram!

13. Ürəyim sıxılır, dilim də açılmır. Buna görə Haruna da (peyğəmbərlik) ver! (Cəbraili ona göndərib nübüvvət bəxş et!)

14. (Bir qibtini öldürdüyümə görə) onların qarşısında boynumda bir günah da var. Bunun üçün məni öldürəcəklərindən qorxuram".

15. (Allah) buyurdu: "Xeyr! (Firon səni əsla öldürə bilməz!) Hər ikiniz möcüzələrinizlə (Fironun yanına) gedin. Şübhəsiz ki, Biz də sizinlə birlikdə (Firon tayfasının nə dediyini) eşidəcəyik!

16. Fironun yanına gedib belə deyin: "Biz aləmlərin Rəbbinin peyğəmbərləriyik!

17. İsrail oğullarını bizimlə birlikdə (Şama) göndər!" (onlara əzab-əziyyət vermə!)

18. (Musa Harunla Fironun yanına gedib bu sözləri deyəndən sonra Firon onu tanıyıb) dedi: "Biz səni körpə uşaq ikən yanımıza alıb böyütmədikmi? Sən illərcə yanımızda qalmadınmı?

19. Axırda elədiyini də elədin (bir qibtini vurub öldürdün). Sən nankorun birisən!"

20. (Musa) dedi: "Mən onu edərkən cahillərdən idim. (Mənə hələ peyğəmbərlik bəxş edilməmiş, Tövrat nazil olmamışdı).

21. Buna görə də sizdən qorxub qaçdım. Sonra Rəbbim mənə hikmət (peyğəmbərlik) ehsan buyurdu və məni şəriət sahibi olan peyğəmbərlərdən etdi.

22. Boynuma minnət qoyduğun bu nemət də (məni sərbəst buraxıb) İsrail oğullarını (özünə) qul etdiyinə görədir. (İsrail övladını kölə etdiyin halda, məni öz yanına alıb böyütdüyünü başımamı qaxırsan?)"

23. Firon dedi: "Aləmlərin Rəbbi nədir? (Nə cür şeydir?)"

24. (Musa: ) “Əgər yəqin inanacaqsınızsa, (bilin ki) O, göylərin, yerin və onlar arasında olanların (bütün məxluqatın) Rəbbidir!” – deyə cavab verdi.

25. (Firon) ətrafındakılara: “Eşitdinizmi?” – dedi. (Musanın cavabı mənim sualıma uyğun gəlmir. Mən ondan aləmlərin Rəbbinin mahiyyəti, keyfiyyəti və cinsi barəsində soruşuram, o isə mənə Onun sifətləri, əməlləri haqqında cavab verir).

26. (Musa) dedi: “O sizin də, ulu babalarınızın (keçmiş atalarınızın) da Rəbbidir!”

27. (Firon ətrafındakılara: ) “Sizə göndərilmiş peyğəmbər, şübhəsiz ki, divanədir!” – dedi.

28. (Musa) dedi: “Əgər (ağıllı-başlı) düşünə bilirsinizsə, (anlayın ki) O, şərqin, qərbin və onların ikisinin arasında olanların Rəbbidir!”

29. (Firon: ) “Əgər məndən başqa tanrı qəbul etsən, səni mütləq dustaq edəcəyəm!” – dedi.

30. (Musa) dedi: “Əgər sənə (dediklərimin doğru olduğunu sübut edəcək) açıq-aşkar bir şey (dəlil) gətirsəm necə?”

31. (Firon) “Əgər doğru deyirsənsə, di onu gətir!” – dedi.

32. (Musa) əsasını (yerə) atan kimi, o dərhal açıq-aşkar bir əjdaha oldu.

33. Sonra əlini (qoltuğunun altından, yaxud qoynundan) çıxarar-çıxartmaz o, baxanlara ağappaq göründü (parlaq bir nur kəsildi).

34. (Firon) ətrafındakılara dedi: “Şübhəsiz ki, bu, çox bilikli bir sehrbazdır!

35. O öz sehri ilə sizi (qorxudub) yurdunuzdan çıxartmaq istəyir. Nə buyurursunuz? (Nə edək?)”

36. Onlar dedilər: “Onu və qardaşını bir qədər gizlət və şəhərlərə də adamlar (yığanlar) göndər ki,

37. Bütün bilikli (bacarıqlı) sehrbazları (toplayıb) sənin yanına gətirsinlər!”

38. Nəhayət, sehrbazlar məlum bir günün müəyyən vaxtında (bayram günü günorta çağı) yığıldılar.

39. (Fironun xidmətçiləri tərəfindən camaata) deyildi: “Siz də yığılırsınızmı?

40. Əgər sehrbazlar (Musaya) üstün gəlsələr, güman ki, biz də onlara tabe olarıq!”

41. Sehrbazlar gələn kimi Firona dedilər: “Əgər biz (Musaya) qalib gəlsək, yəqin ki, bizə bir muzd (mükafat) veriləcək, elə deyilmi?”

42. (Firon) dedi: “Bəli! Və üstəlik siz (mənə) yaxın adamlar olacaqsınız!”

43. Musa onlara dedi: “(Sehr alətlərinizdən yerə) nə atacaqsınız, atın!”

44. Onlar iplərini və əsalarını yerə atıb: “Fironun şan-şövkətinə (qüdrətinə) and olsun ki, biz üstün gələcəyik!” – dedilər.

45. Bundan sonra Musa da əsasını (yerə) atdı. (Əsa) dərhal (bir əjdaha olub) onların hoqqabazlıqla düzəltdiyi şeyləri uddu.

46. Sehrbazlar (bunu görən kimi) səcdəyə qapandılar.

47. Və dedilər: “Biz iman gətirdik aləmlərin Rəbbinə!

48. Musanın və Harunun Rəbbinə!”

49. (Firon) dedi: “Mən sizə izin verməmişdən əvvəl siz ona iman gətirdiniz, çünki o, həqiqətdə sizə sehr öyrətmiş olan böyüyünüzdür.

(Heç eybi yoxdur. Əzabımın nə olduğunu) sözsüz ki, biləcəksiniz. Mütləq əl-ayağınızı çarpaz kəsdirib hamınızı çarmıxa çəkdirəcəyəm!”

50. (İman gətirmiş sehrbazlar) dedilər: “Zərəri yoxdur, biz öz Rəbbimizə tərəf (Allahın hüzuruna) dönəcəyik!

51. Biz (sənə tabe olan, yaxud zəmanə əhli içində Musaya və onun təbliğ etdiyi dinə) ilk iman gətirənlər olduğumuza görə Rəbbimizin xətalarımızı bağışlayacağına ümid edirik!”

52. (Sonra) Musaya belə vəhy etdik: “Qullarımla birlikdə (Misiri tərk edib) gecə yola çıx. Siz, şübhəsiz ki, (Fironun ordusu tərəfindən) təqib ediləcəksiniz!”

53. Firon şəhərlərə (əsgər) yığanlar göndərdi.

54. (O, belə deyirdi: ) “Şübhəsiz ki, bunlar (İsrail övladı) kiçik bir tayfadır!

55. Onlar (bəzək şeylərimizi götürməklə, Misiri atıb getməklə) bizi qəzəbləndirmişlər. (Və ya: İsrail oğullarına çox əziyyət verdiyimizə görə onlar bizə qarşı qəzəblidirlər).

56. Biz isə qüvvətli (yaxşı silahlanmış, yaxud ayıq-sayıq, işimizi bilən) bir camaatıq!”

57. Nəhayət, Biz onları (Fironu və tayfasını) bağlardan və bulaqlardan çıxartdıq.

58. Xəzinələrdən və (Nil ətrafındakı) gözəl (bərəkət dolu) yerdən kənar etdik.

59. (O yerlərdən onları) beləcə çıxartdıq və İsrail oğullarını oralara varis etdik.

60. (Firon və əsgərləri) günəş doğduqda onların (İsrail oğullarının) arxasınca düşdülər.

61. İki dəstə (tayfa) bir-biri ilə qarşılaşdığı zaman Musanın camaatı dedi: “(İşimiz bitdi!) Artıq yaxalandıq!”

62. (Musa) dedi: “Xeyr, Rəbbim mənimlədir. O, mütləq mənə yol göstərəcəkdir!”

63. Onda Musaya belə vəhy etdik: “Əsanla dənizə vur!” (Musa əsasını dənizə vuran kimi) o dərhal yarıldı (İsrail oğullarının soyuna müvafiq olaraq on iki hissəyə bölündü) və hər hissə böyük (uca) bir dağ kimi oldu.

64. O biriləri (Firon əhlini) də ora yaxınlaşdırdıq (dəniz sahilinə topladıq).

65. Musa və onunla birlikdə olanların hamısını xilas etdik.

66. O biriləri (Firon tayfasını) isə suya qərq etdik.

67. Şübhəsiz ki, bunda (Musanın bu hekayətində) bir ibrət vardır. Lakin onların (Firon tayfasının, qədim Misir əhalisinin, yaxud Məkkə müşriklərinin) əksəriyyəti iman gətirmədi.

68. (Ya Rəsulum!) Həqiqətən, sənin Rəbbin yenilməz qüvvət, mərhəmət sahibidir! (Kafirlərdən intiqam alar, tövbə edən bəndələrini bağışlayar!)

69. (Ya Rəsulum!) Onlara İbrahimin hekayətini söylə!

70. O zaman ki, o öz atasına və tayfasına demişdi: “Nəyə ibadət edirsiniz?”

71. Onlar: “Bütlərə ibadət edir və onlara tapınmaqda davam edirik!” – deyə cavab vermişdilər.

72. (İbrahim) demişdi: “Onları çağırdığınız (dua etdiyiniz) zaman sizi eşidirlərmi?

73. Yaxud sizə bir xeyir və ya zərər verə bilirlərmi?”

74. Onlar: “Xeyr, ancaq biz öz atalarımızın belə (ibadət) etdiklərini gördük!” – deyə cavab vermişdilər.

75. (İbrahim) demişdi: “İndi nəyə ibadət etdiyinizi görürsünüzmü?-

76. Sizin və ulu babalarınızın?

77. Aləmlərin Rəbbi istisna olmaqla, onlar (sizin bütləriniz) mənim düşmənimdir.

78. Məni yaradan və məni doğru yola yönəldən Odur!

79. Məni yedirdən də, içirdən də Odur!

80. Xəstələndiyim zaman mənə yalnız O, şəfa verir.

81. Məni öldürəcək, sonra (yenidən) dirildəcək Odur.

82. Və qiyamət günü xətamı bağışlayacağına ümid etdiyim də Odur!

83. Ey Rəbbim! Mənə hikmət (peyğəmbərlik, elm) bəxş et və məni (Sənin rizanı qazanmış) salehlərlə (yaxşılar zümrəsinə) qovuşdur!

84. Sonra gələnlər arasında mənə yaxşı ad qismət elə! (Gələcək nəsillər məni həmişə yad etsinlər, xatirimi əziz tutub adımı hörmətlə çəksinlər!)

85. Məni Nəim cənnətlərinin varislərindən et!

86. Atamı bağışla! Şübhəsiz ki, o, (haqq yolu) azanlardan oldu!

87. (İnsanların qəbirlərindən çıxardılıb) dirildəcəyi gün (qiyamət günü) məni zəlil (rüsvay) etmə!

88. O gün ki, nə mal-dövlət, nə də övlad bir fayda verər!

89. Ancaq sağlam (təmiz, daxilində şəkk-şübhəyə, küfrə, şirkə və nifaqa yer olmayan) bir qəlblə Allahın hüzuruna gələn kimsədən (möminlərdən) başqa!”

90. (O gün) Cənnət Allahdan qorxub pis əməllərdən çəkinənlərə yaxınlaşdırılar.

91. Cəhənnəm də azğınlara göstərilər.

92. Və onlara belə deyərlər: “İbadət etdikləriniz (bütlər) haradadır?

93. Allahdan başqa (ibadət etdikləriniz?). Onlar sizə kömək edə bilərlərmi? Yaxud özlərinə bir köməkləri çatarmı?”

94. Onlar (müşriklər) və azğınlar (üzüqoylu üst-üstə) oraya (Cəhənnəmə) atılarlar!

95. İblisin bütün əsgərləri də (ora sürüklənib salınarlar).

96. Onlar orada (öz bütləri və rəisləri ilə) çənə-boğaz olub deyərlər:

97. “Allaha and olsun ki, biz (haqq yoldan) açıq-aydın azmışdıq!

98. Çünki biz sizi (siz bütləri) aləmlərin Rəbbi ilə bərabər tuturduq.

99. Bizi yalnız günahkarlar azdırdı.

100. İndi artıq nə şəfaət edən kimsələrimiz,

101. Nə də bir mehriban dostumuz var!

102. Kaş bir də (dünyaya) dönə biləydik; möminlərdən olardıq!”

103. Həqiqətən, bunda (İbrahimin bu hekayətində) bir ibrət vardır. Halbuki onların (İbrahim qövmünün, yaxud bu əhvalata qulaq asanların) əksəriyyəti iman gətirmədi.

104. Həqiqətən, sənin Rəbbin yenilməz qüvvət, mərhəmət sahibidir! (Kafirlərdən intiqam alar, tövbə edən bəndələrini bağışlayar!)

105. Nuh tayfası peyğəmbərləri təkzib etdi. (Onlar Nuhu yalançı saydılar. Bir peyğəmbəri təkzib etmək bütün peyğəmbərləri təkzib etmək deməkdir).

106. O zaman ki, qardaşları Nuh onlara dedi: "Məgər (küfr etməyinizə görə) qorxmursunuz?

107. Şübhəsiz ki, mən sizin üçün etibar olunası (bel bağlanılası) bir peyğəmbərəm! (Vədimə xilaf çıxmaz, əmanətə xəyanət etmərəm!)

108. Artıq Allahdan qorxun və mənə itaət edin!

109. Mən bunun (dini, risaləti təbliğ etməyin) müqabilində sizdən heç bir muzd (əvəz) istəmirəm. Mənim mükafatım ancaq aləmlərin Rəbbinə aiddir!

110. Artıq Allahdan qorxun və mənə itaət edin!"

111. Onlar: "Sənə ən rəzil (səfil, yoxsul) adamlar tabe olmuşkən, biz sənə imanmı gətirəcəyik?" – dedilər.

112. (Nuh) dedi: "Mən onların nə etdiklərini (daxilən nə cür olduqlarını) bilmirəm!

113. Əgər başa düşürsünüzsə, (bilin ki) onların haqq-hesabı (imanlarının zahiri, yaxud daxili olduğu, ürəkdən iman gətirib-gətirmədikləri) yalnız Rəbbimə aiddir! (Mən ancaq zahirə baxıram!)

114. Və mən iman gətirənləri qovan da deyiləm!

115. Mən yalnız (günahkarları Allahın əzabı ilə) açıq-aşkar qorxudan bir peyğəmbərəm!"

116. Onlar dedilər: “Ey Nuh! Əgər (dediyin sözlərdən və bütlərimizi təhqir etməkdən) əl çəkməsən, mütləq daşqalaq ediləcəksən!”

117. (Nuh) dedi: “Ey Rəbbim! Həqiqətən, qövmüm məni təkzib etdi.

118. Artıq mənimlə onlar arasında Sən hökm ver, məni və mənimlə birlikdə olan möminləri (bu əzabdan) qurtar!

119. Buna görə də Biz onu (Nuhu) və onunla birlikdə yüklü gəmidə olanları xilas etdik.

120. Sonra yerdə qalanları suda boğduq!

121. Şübhəsiz ki, bunda (Nuhun bu hekayətində) bir ibrət vardır. Halbuki onların (Nuh tayfasının, yaxud bu hekayətə qulaq asanların) əksəriyyəti iman gətirmədi.

122. Həqiqətən, sənin Rəbbin yenilməz qüvvət sahibi, mərhəmət sahibidir! (Kafirlərdən intiqam alar, tövbə edən bəndələrini bağışlayar!)

123. Ad tayfası da peyğəmbərləri təkzib etdi.

124. O zaman ki, qardaşları Hud onlara dedi: “Məgər (küfr etməyinizə, peyğəmbərləri yalançı saymağınıza görə Allahın əzabından) qorxmursunuz?

125. Şübhəsiz ki, mən sizin üçün etibar olunası (bel bağlanılası) bir peyğəmbərəm!

126. Allahdan qorxun və mənə itaət edin!

127. Mən bunun (dini, risaləti təbliğ etməyin) müqabilində sizdən heç bir muzd (əvəz) istəmirəm. Mənim mükafatım ancaq aləmlərin Rəbbinə aiddir!

128. Doğrudanmı siz hər təpədə bir köşk (əlamət) qurub (gəlib-gedənləri məsxərəyə qoyaraq) əylənirsiniz?

129. Sanki (dünyada) əbədi qalacaqsınız deyə (yeraltı) su hövzələri (qalalar, yaxud qəsrlər) tikirsiniz!

130. Və (birini) yaxaladıqda da zalımlar kimi yaxalayırsınız! (Onun vəhşicəsinə döyüb öldürürsünüz!)

131. Artıq Allahdan qorxun və mənə itaət edin!

132. Qorxun o kəsdən ki, anlayıb bildiyiniz şeyləri (nemətləri) sizə əta etdi!

133. Sizə heyvanat, oğul-uşaq,

134. Bağlar və çeşmələr verdi!

135. Mən böyük günün (qiyamət gününün) sizə üz verəcək əzabından qorxuram!"

136. Onlar dedilər: "Bizə öyüd-nəsihət versən də, verməsən də, bizim üçün eynidir (dinimizdən dönən deyilik).

137. Bu (bizdən) əvvəlkilərin adətindən (gördükləri işlərdən) başqa bir şey deyildir! (Yaxud bizə dediyin bu sözlər qədimlərin uydurmalarından başqa bir şey deyildir!)

138. Və biz əzaba da düçar olmayacağıq!"

139. Onu (Hudu) yalançı saydılar. Biz də onları məhv etdik. Şübhəsiz ki, bunda (Hudun bu hekayətində) bir ibrət vardır. Halbuki onların əksəriyyəti iman gətirmədi.

140. Həqiqətən, sənin Rəbbin yenilməz qüvvət, mərhəmət sahibidir! (Kafirlərdən intiqam alar, tövbə edən bəndələrini bağışlayar!)

141. Səmud tayfası da peyğəmbərləri təkzib etdi.

142. O vaxt ki, qardaşları Saleh onlara dedi: “Məgər (küfr etdiyinizə, peyğəmbərləri yalançı hesab etdiyinizə görə Allahın əzabından) qorxmursunuz?

143. Şübhəsiz ki, mən sizin üçün etibar olunası (bel bağlanılası) bir peyğəmbərəm! (Vədimə xilaf çıxmaz, əmanətə xəyanət etmərəm!)

144. Artıq Allahdan qorxun və mənə itaət edin!

145. Mən bunun (Allahın hökmlərini, risaləti təbliğ etməyin) müqabilində sizdən heç bir muzd (əvəz) istəmirəm. Mənim mükafatım ancaq aləmlərin Rəbbinə aiddir!

146. Məgər siz elə burada onların içində arxayınlıqla qalacaqsınız?

147. Bağlar və çeşmələr içində,

148. Əkinlər və lətif çiçəkli (gözəl meyvəli) xurmalıqlar içində (xatircəmlikdə ömür sürəcəksiniz)?

149. Dağlardan (sanki dünyada əbədi yaşayacaqsınız deyə, özünüzə) məharətlə (və ya təkəbbürlə) evlər yonub düzəldəcəksiniz?

150. Artıq Allahdan qorxun və mənə itaət edin!

151. (Günah etməklə) həddi aşanların əmrinə tabe olmayın (onlara boyun əyməyin)!

152. O kəslər ki, yer üzündə fitnə-fəsad törədər və (pis işlərdən, günah əməllərdən əl çəkib özlərini) islah etməzlər!

153. Onlar dedilər: “Həqiqətən, sən (əməlli başlı) ovsunlanmışlardansan! (Divanənin birisən! Sən hardan peyğəmbər oldun?)

154. Sən də bizim kimi ancaq adi bir insansan! Əgər doğru danışanlardansansa (həqiqi peyğəmbərsənsə), bizə (Allahdan) bir möcüzə gətir!”

155. (Saleh) dedi: “Bu, (Allahın möcüzəsi olan) dişi (maya) bir dəvədir. Su içmək növbəsi bir gün onun, bir gün sizindir! (Bir gün çeşmədən o, su içsin, bir gün də siz için. Bir-birinizə mane olmayın!)

156. Ona heç bir pislik etməyin, yoxsa böyük günün (qiyamət günün) əzabı sizi yaxalayar!”

157. Amma onlar (dəvəni) tutub kəsdilər, sonra da (əzab qorxusu ilə) peşman oldular.

158. Artıq əzab onları yaxaladı (hamısı məhv oldu). Şübhəsiz ki, bunda (Salehin bu hekayətində) bir ibrət vardır. Halbuki onların əksəriyyəti iman gətirmədi.

159. Həqiqətən, sənin Rəbbin yenilməz qüvvət, mərhəmət sahibidir! (Kafirlərdən intiqam alar, tövbə edən bəndələrini bağışlayar!)

160. Lut tayfası da peyğəmbərləri təkzib etdi.

161. O zaman ki, qardaşları Lut onlara dedi: “Məgər (küfr etdiyinizə, peyğəmbərləri yalançı saydığınıza görə Allahın əzabından) qorxmursunuz?

162. Şübhəsiz ki, mən sizin üçün etibar olunası (bel bağlanılası) bir peyğəmbərəm! (Vədimə xilaf çıxmaz, əmanətə xəyanət etmərəm!)

163. Artıq Allahdan qorxun və mənə itaət edin!

164. Mən bunun (Allahın hökmlərini, risaləti təbliğ etməyin) müqabilində sizdən heç bir muzd (əvəz) istəmirəm. Mənim mükafatım ancaq aləmlərin Rəbbinə aiddir!

165. Doğrudanmı siz bəşər övladından yalnız erkəklərlə yaxınlıq edirsiniz?

166. Və Rəbbinizin sizin üçün yaratdığı qadınlarınızı tərk edirsiniz? Siz (günah etməklə) həddi aşan bir camaatsınız!”

167. Onlar dedilər: “Ey Lut! Əgər (bu sözlərinə, bizi danlamağa) son qoymasan, (öz yurdundan) mütləq qovulacaqsan!”

168. (Lut) dedi: “Həqiqətən, mən sizin əməlinizə nifrət edənlərdənəm!

169. Ey Rəbbim! Məni və ailəmi bunların gördüyü (pis) işdən (onların bəd əməllərinin cəzasından) qurtar!”

170. Artıq Lutu və bütün ailəsini (əzabdan) xilas etdik.

171. Ancaq geridə qalan bir qadın (Lutun günahkar övrəti) istisna olmaqla!

172. Sonra da o biriləri məhv edib kökünü kəsdik.

173. Onların üstünə (qızmar daşdan) bir yağış yağdırdıq. (Peyğəmbər tərəfindən Allahın əzabı ilə) qorxudulanların yağışı nə yaman yağışdır!

174. Şübhəsiz ki, bunda (Lutun bu hekayətində) bir ibrət vardır. Halbuki onların əksəriyyəti iman gətirmədi.

175. Həqiqətən, sənin Rəbbin yenilməz qüvvət, mərhəmət sahibidir! (Kafirlərdən intiqam alar, tövbə edən bəndələrini bağışlayar!)

176. Əykə əhli də peyğəmbərləri təkzib etdi.

177. O zaman ki, Şüeyb onlara dedi: “Məgər (küfr etdiyinizə, peyğəmbərləri yalançı saydığınıza görə Allahın əzabından) qorxmursunuz?

178. Şübhəsiz ki, mən sizin üçün etibar olunası (bel bağlanılası) bir peyğəmbərəm! (Vədimə xilaf çıxmaz, əmanətə xəyanət etmərəm!)

179. Artıq Allahdan qorxun və mənə itaət edin!

180. Mən bunun (Allahın hökmlərini, risaləti təbliğ etməyin) müqabilində sizdən heç bir muzd (əvəz) istəmirəm. Mənim mükafatım ancaq aləmlərin Rəbbinə aiddir!

181. Ölçüdə düz olun, (onu) əskildənlərdən olmayın!

182. Düz tərəzi ilə çəkin!

183. İnsanların haqqını azaltmayın! (Camaatın malını əskiltməyin. Kimin haqqı nədirsə, onu da verin!) Yer üzündə fitnə-fəsad törətməyin!

184. Və sizi də, sizdən əvvəlki nəsilləri də yaradandan qorxun!"

185. Onlar dedilər: "Həqiqətən, sən (əməlli-başlı) ovsunlanmışlardansan! (Divanənin birisən! Sən hara, peyğəmbərlik hara?)

186. Sən də bizim kimi adi bir insansan! Bizə elə gəlir ki, sən yalançının birisən!

187. Əgər, doğru danışanlardansansa (həqiqi peyğəmbərsənsə), göyün bir parçasını üstümüzə endir!"

188. (Şüeyb) dedi: "Sizin nələr etdiyinizi Rəbbim daha yaxşı bilir!"

189. Nəhayət, onu (Şüeybi) təkzib etdilər və buna görə də buludlu günün (qızmar günəşdən sonra peyda olan qara buludun) əzabı onları yaxaladı. Həqiqətən, o, böyük (müdhiş) bir günün əzabı idi.

190. Şübhəsiz ki, bunda (Şüeybin bu hekayətində) bir ibrət vardır. Halbuki onların əksəriyyəti iman gətirmədi.

191. Həqiqətən, sənin Rəbbin yenilməz qüvvət, mərhəmət sahibidir! (Kafirlərdən intiqam alar, tövbə edən bəndələrini bağışlayar!)

192. Şübhəsiz ki, bu (Quran) aləmlərin Rəbbi tərəfindən nazil edilmişdir!

193. Onu Cəbrail (Ruhuləmin) endirdi:

194. (Günahkarları Allahın əzabı ilə) qorxudan (xəbərdar edən) peyğəmbərlərdən olasan deyə, sənin qəlbinə (nazil etdi);

195. Özü də açıq-aydın ərəb dilinə.

196. Həqiqətən, o (Quranın nazil olacağı xəbəri, mənası və hökmləri; Peyğəmbərin vəsfi), əvvəlkilərin (keçmiş peyğəmbərlərin) kitablarından mövcuddur.

197. Məgər İsrail övladı alimlərinin (Quranın ilahi kitab, sənin həqiqi peyğəmbər olduğunu) bilmələri onlar (bu kafirlər) üçün bir dəlil (sübut) deyilmi?

198. Əgər onu ərəb olmayanlardan (ərəbcə bilməyənlərdən) birinə (bəzisinə) nazil etsəydik;

199. Və o (Quranı) onlara (Məkkə müşriklərinə və kafirlərə) oxusaydı, (bu şəxs ərəb dilini yaxşı bilmir, qeyri-ərəbə tabe olmaq, onun ardınca getmək bizə ayıbdır deyə) ona iman gətirməzdilər.

200. Biz (küfrü, inadkarlığı) günahkarların qəlbinə belə salarıq.

201. Onlar şiddətli əzabı görməyənədək (Qurana) inanmazlar.

202. (Əzab) onlara qəflətən, özləri də hiss etmədən gələr.

203. O zaman onlar deyərlər: “Əcaba, (tövbə etmək, iman gətirmək üçün) bizə möhlət veriləcəkmi?”

204. İndi (günahkarlar) əzabımızın (dünyada onlara) tezmi gəlməsini istəyirlər?

205. (Ya Rəsulum! Görürsənmi, əgər Biz onlara (kafirlərə) illərcə nemət (gün-güzəran) versək,

206. Sonra vəd (təhdid) olunduqları (əzab) onlara yetişsə,

207. Onlara verilmiş olan nemətlər (əzabımızı) onlardan dəf edə bilməz. (Heç bir şey onlara veriləcək əzabı geri qaytara bilməz. Əksinə, firavan həyat, bol nemət onların günahlarını, cinayətlərini daha da artırar).

208. Biz heç bir məmləkəti ora peyğəmbər göndərmədən məhv etmədik!

209. (Peyğəmbərləri) öyüd-nəsihət vermək üçün (göndərdik). Biz zalım deyilik!

210. (Quranı) əsla şeytanlar endirmədi.

211. Bu onlara layiq deyildir. Onlar (bunu) heç bacara da bilməzlər!

212. Axı onlara (vəhy eşitmək, mələklərin söhbətinə qulaq asmaq) qadağan edilmişdir.

213. Elə isə çəkin, Allahla yanaşı başqa bir tanrıya ibadət etmə, yoxsa əzaba düçar edilənlərdən olarsan!

214. Və ən yaxşın qohumlarını qorxut!

215. Sənə tabe olan möminləri qanadın altına al! (Onlarla yumşaq davran, nəzakətlə rəftar et, köməklərinə çat!)

216. Əgər (yaxın qohumların, əşirətin) sənə qarşı çıxsalar, onlara belə de: “Şübhəsiz ki, mən sizin əməllərinizdən uzağam!”

217. Və yenilməz qüvvət sahibinə, mərhəmət sahibinə təvəkkül et!

218. O Allah ki, səni namaza duranda da görür,

219. Səcdə edənlər içində dolananda da.

220. Həqiqətən, (hər şeyi) eşidən, bilən Odur!

221. (Ey müşriklər!) Şeytanların kimə nazil olduqlarını sizə xəbər verimmi?

222. Onlar hər bir yalançıya, günahkara nazil olarlar.

223. (Şeytanlar mələklərdən oğrun-oğrun) eşitdikləri (adda-budda) sözləri onlara təlqin edərlər. (Yaxud kahinlər şeytanların uydurmalarına qulaq asarlar). Onların əksəriyyəti yalançıdır!

224. (Müşrik və kafir) şairlərə gəlincə, onlara yalnız azğınlar uyar!

225. Məgər görmürsənmi ki, onlar hər bir vadidə sərgərdan gəzib-dolaşırlar? (Hər tərəfə meyl edir, birini yalandan mədh, digərini isə əbəs yerə həcv edirlər!)

226. Və onlar etmədikləri şeyləri deyirlər! (Onların dediklərinin əksəriyyəti yalandır!)

227. Ancaq iman gətirib yaxşı işlər görən, Allahı çox zikr edən və zülmə uğradıqdan sonra intiqamını alanlardan başqa! Zülm edənlər isə (öləndən sonra) hansı dönüşə dönəcəklərini (hara qayıdacaqlarını, aqibətlərinin necə olacağını, hansı inqilabla sarsılacaqlarını) mütləq biləcəklər!

## .27.
## ən-Nəml (Qarışqalar) surəsi

**(Məkkədə nazil olmuşdur, 93 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Ta, Sin! Bu, Quranın və (haqqı batildən ayıran) açıq-aydın bir Kitabın ayələridir!

2. Möminlərə (doğru yol göstərən) rəhbər və (Cənnətlə) müjdədir.

3. O kəslər ki, (vaxtlı-vaxtında, lazımınca) namaz qılır, zəkat verir və axirətə möhkəm inanırlar.

4. Həqiqətən, axirətə inanmayanların (pis) əməllərini özlərinə yaxşı göstərdik. Onlar (öz azğınlıqları içərisində) şaşqın bir vəziyyətdədirlər.

5. Onları (dünyada) çox pis əzab gözləyir, (imanı küfrə dəyişdirməklərinə görə) axirətdə ən böyük ziyana uğrayacaq kəslər də onlardır!

6. (Ya Rəsulum!) Həqiqətən, Quran sənə hikmət sahibi olan, (hər şeyi) bilən Allah tərəfindən təlqin (vəhy təlim) olunur.

7. Bir zaman Musa (Mədyəndən Misirə gedərkən) ailəsinə demişdi: "Mən bir od gördüm, (siz burada durun) mən də gedib ondan sizə bir xəbər, yaxud bir göz gətirim ki, qızınasınız".

8. Musa (alovun) yanına çatdıqda belə bir nida gəldi: "Alovun yanında olan (Musa) və ətrafında olanlar (mələklər və ya peyğəmbərlər) mübarək kimsələrdir (bərəkətlidirlər). Aləmlərin Rəbbi olan Allah pakdır, müqəddəsdir! (Bütün eyib və nöqsanlardan kənardır!)

9. Ya Musa! Yenilməz qüvvət, hikmət sahibi olan Allah Mənəm!

10. Əsanı (yerə) at! (Musa əsanı yerə atdı). O, (əsanın) ilan kimi qıvrıldığını gördükdə dönüb qaçdı, heç dala da baxmadı. (Biz ona belə buyurduq: ) "Ya Musa, qorxma! Peyğəmbərlər Mənim hüzurumda qorxmazlar.

11. Yalnız (günah etməklə özünə) zülm eləyən (qorxmalıdır). Lakin (pislik etdikdən) sonra tövbə ilə pisliyi yaxşılığa çevirən kəs (bilsin ki, Mən beləsini) bağışlayanam, rəhm edənəm!

12. Əlini qoynuna (köynəyinin yaxasına, yaxud qoltuğunun altına) qoy ki, Firona və onun tayfasına göndərilən doqquz möcüzədən biri olaraq eyibsiz-qüsursuz ağappaq (parlaq bir nur kimi) çıxsın. Həqiqətən, onlar (Allahın itaətindən çıxmış) fasiq bir camaatdır!"

13. Möcüzələrimiz aşkar şəkildə gəlib onlara çatdıqda: "Bu, açıq-aydın bir sehrdir!" – dedilər.

14. (Möcüzələrimizin) həqiqiliyinə daxilən möhkəm əmin olduqları halda, haqsız yerə və təkəbbür üzündən onları inkar etdilər. (Ya Rəsulum!) Bir gör fitnə-fəsad törədənlərin axırı necə oldu!

15. Biz Davuda və Süleymana elm (insanlar arasında mübahisəli məsələləri həll edib ədalətli hökm çıxartmaq, quşların dilini bilmək və i. a.) verdik. Onlar dedilər: "Bizi öz mömin bəndələrinin çoxundan üstün tutan Allaha həmd olsun!"

16. Süleyman Davuda (peyğəmbərlikdə, elmdə və mülkdə) vərəsə oldu və dedi: "Ey insanlar! Bizə quş dili öyrədildi və (peyğəmbərlərə, padşahlara nəsib olan) hər şeydən verildi. Bu, həqiqətən açıq-aşkar bir lütfdür!"

17. (Bir gün) Süleymanın cinlərdən, insanlardan və quşlardan ibarət qoşunu toplandı. Onlar cərgə-cərgə düzülüb (nizamla) gedirdilər.

18. Nəhayət, onlar (Taifdəki, yaxud Şamdakı) qarışqa vadisinə gəlib çatdıqda bir qarışqa (qarışqaların padşahı) dedi: "Ey qarışqalar! Yuvalarınıza girin ki, Süleyman və ordusu özləri də bilmədən sizi (ayaqları altında) basıb əzməsinlər!"

19. (Süleyman qarışqanın) bu sözündən gülümsəyib dedi: “Ey Rəbbim! Mənə mənim özümə və ata-anama ehsan buyurduğun nemətə şükür etmək, Sənin razı qalacağın yaxşı iş görmək üçün ilham (qüvvət) ver! Və məni öz mərhəmətinə saleh bəndələrinin zümrəsinə daxil et!”

20. Sonra (Süleyman) quşları yoxlayıb dedi: “(Torpaq altında suyun harada olduğunu bilən) Hüdhüdü (şanapipiyi) niyə görmürəm? Yoxsa o burada yoxdur?

21. And olsun ki, ona şiddətli bir əzab verər, ya da tutub kəsərəm (boğazını üzərəm). Yaxud da o (üzrlü səbəbə görə burada olmaması üçün) aşkar bir dəlil gətirsin!”

22. Bir azdan (Hüdhüd) gəlib dedi: “Sənin bilmədiyin bir şeyi öyrəndim. Sənə Səbadan doğru bir xəbər gətirmişəm.

23. Mən onlara (Səba əhlinə) padşahlıq edən bir qadın gördüm. Ona (dünyada şahlara lazım olan) hər şey verilmişdir. Onun çox böyük (əzəmətli) bir taxtı vardır.

24. Mən onun və tayfasının Allahı qoyub günəşə sitayiş etdiklərini gördüm. Şeytan (çirkin) əməllərini onlara gözəl göstərmiş, onları (doğru) yoldan sapdırmışdır. Buna görə də haqq yolunu tapa bilmirlər.

25. Göylərdə və yerdə pünhan olanı (yağışı, bitkiləri) aşkara çıxardan, onların gizlində və aşkarda etdikləri hər şeyi bilən Allaha səcdə etməsinlər deyə (Şeytan belə etmişdir).

26. O böyük ərşin Rəbbi (sahibi) olan Allahdan başqa heç bir tanrı yoxdur!”

27. (Süleyman Hüdhüdə) dedi: “Baxaq görək doğru deyirsən, yoxsa yalançısan!

28. Mənim bu məktubumu aparıb (göydən) onlara at, sonra yaxın bir yerə çəkilib dur, bax gör nə cavab verəcəklər!”

29. (Səba hökmdarı Bəlqis Süleymanın məktubunu alıb oxuyandan sonra) dedi: “Ey əyanlar! Mənə çox hörmətli bir məktub göndərildi (atıldı).

30. O məktub Süleymandandır və o “bismillahir-rəhmanır-rəhim”lədir (bismillahla başlanır).

31. (Məzmunu belədir: ) ”Mənə qarşı təkəbbür göstərməyin və yanıma müti (müsəlman) olaraq gəlin! (Mənim dəvətimə saymazlıqla yanaşmayın. Allaha təslim olaraq yanıma gəlin)”.

32. (Bəlqis) dedi: “Ey əyanlar! Bu iş barəsində mənə rəyinizi bildirin. Mən sizinlə məsləhətləşməmiş heç bir iş görən (hökm verən) deyiləm!”

33. Onlar dedilər: “Biz böyük bir qüvvət və qüdrət sahibiyik. (Güclü ordumuz, sursatımız, hərb alətlərimiz var. Özümüz də təcrübəli, mahir döyüşçülərik). Hökm sənindir. Nə əmr edəcəyinə özün bax (fikirləş)!”

34. (Bəlqis) dedi: Hökmdarlar bir ölkəyə (zorla) girdikləri zaman onu xarabazara çevirər, xalqının böyüklərini də zəlil (qul, əsir) edərlər. Onlar məhz belə hərəkət edərlər. (Hökmdarların adəti, davranışı belədir).

35. Mən onlara bir hədiyyə göndərəcəyəm; görüm elçilər nə ilə qayıdacaqlar! (Əgər Süleyman peyğəmbərdirsə, onu rədd edər; yox, əgər ancaq bir padşahdırsa, qəbul edər).

36. (Elçibaşı Bəlqisin göndərdiyi hədiyyə ilə) Süleymanın yanına gəldikdə o dedi: “Siz mənə mal-dövlətləmi yardım edirsiniz? Allahın mənə verdiyi (peyğəmbərlik, səltənət) sizə verdiyindən (dünya

malından) daha yaxşıdır. Amma siz (dünyanın bərbəzəyinə aldanıb) öz hədiyyələrinizlə sevinirsiniz.

37. Durma, onların (Səba əhlinin) yanına qayıt! And olsun ki, (əgər müti olaraq yanıma gəlməsələr) gücləri çatmayacaq bir ordu ilə üstlərinə gedib onları öz yurdundan zəlil və xar vəziyyətdə çıxardarıq!”

38. (Süleyman) dedi: “Ey əyanlar! Onlar müti vəziyyətdə (müsəlman olaraq) yanıma gəlməmiş hansınız onun (Bəlqisin) taxtını mənə gətirə bilər?”

39. Cinlərdən olan (çox qüvvətli və nəhəng) bir ifrit dedi: “Sən yerindən (taxtından) qalxmamış mən onu sənə gətirərəm. Mən bu işi görməyə çox qüvvətliyəm, etibarlıyam! (Mənim Bəlqisin taxtını götürüb gətirməyə gücüm çatar. Mən taxtın üzərində olan qızıl-gümüşə, ləl-cavahirata əlimi belə vurmaram, onlardan heç bir şey götürmərəm!)”

40. (Süleyman taxtın daha tez gətirilməsini istədi). Kitabdan (Allahın kitabından, yaxud lövhi-məhfuzdan) bir qədər xəbəri olan birisi (Cəbrail, yaxud Xızır və ya Süleymanın çox ağıllı və tədbirli vəziri Asəf ibn Bərxiya) dedi: “Mən onu sənə bir göz qırpımında (gözünü yumub açınca) gətirərəm!” (Süleyman) onu (taxtı) yanında hazır durmuş görüncə dedi: “Bu, Rəbbimin lütfündəndir (mərhəmətindəndir). Məni imtahana çəkməyi üçündür ki, görək (Onun nemətinə) şükür edəcəyəm, yoxsa nankor olacağam! Kim (Rəbbimin nemətinə) şükür etsə, yalnız özü üçün (öz xeyrinə) şükür edər; kim nankor olsa, (bilsin ki) həqiqətən, Rəbbim (onun şükürünə) möhtac deyildir, kərəm sahibidir!” (Allah dünyada qədirbilənə də, nankora da, möminə də, kafirə də lazımınca ruzi və gün-güzəran verər, çünki O, tükənməz mərhəmət sahibidir!)

41. (Süleyman) dedi: “(Bəlqəsin) taxtını tanımaz hala salın, görək onu tanıyacaq, ya yox?!”

42. (Bəlqis) gəldikdə ona: “Taxtın bu cürdürmü?” – deyildi. O da: “Sanki odur!” – deyə cavab verdi. (Süleyman qadının dərin zəka sahibi olduğunu görüncə dedi: ) “Bizə ondan daha öncə (tövhid haqqında) elm verilmiş və biz (ondan daha qabaq Allaha) müti (müsəlman) olmuşuq!”

43. (Süleyman) ona Allahdan başqasına (günəşə, aya) ibadət etməyi qadağan etdi. (Yaxud Allahdan başqasına tapınması o qadına Allaha ibadət etməyə mane olmuşdu). Çünki o, kafir bir tayfadan idi.

44. (Bəlqəsin əqlini, zəkasını yoxlamaq məqsədilə) ona belə deyildi: “Saraya daxil ol!” (Süleymanın sarayı büllurdan tikildiyi və altına su buraxıldığı üçün Bəlqis) sarayı gördükdə onu dərin bir gölməçə hesab etdi və (paltarı islanmasın deyə) ətəyini qaldırdı (baldırlarını açdı). O (Süleyman): “Bu (su deyil) büllurdan tikilmiş (şəffaf) bir saraydır!” – dedi. (Bəlqis) dedi: “Ey Rəbbim! Mən (günəşə sitayiş etməklə) özümə zülm etmişdim. Mən artıq Süleymanla (Süleymanın sayəsində) aləmlərin Rəbbi olan Allaha təslim oldum!”

45. Biz Səmud tayfasına – Allaha ibadət edin deyə, qardaşları Salehi (peyğəmbər) göndərdik. (Saleh öz tayfasının yanına gələn kimi) onlar bir-biri ilə çəkişən (düşmənçilik edən) iki firqəyə (möminlərə və kafirlərə) ayrıldılar.

46. (Saleh) dedi: “Ey qövmüm! Siz nə üçün yaxşılıqdan qabaq pisliyə tələsirsiniz? (Tövbədən qabaq əzabı, mərhəmətdən öncə zülmü istəyirsiniz?) Nə üçün Allahdan bağışlanmağınızı diləmirsiniz ki, bəlkə, rəhm olunasınız?”

47. Onlar dedilər: “Bizə sənin və yanında olanların ucbatından uğursuzluq üz verdi. (Ayağınız bizə düşmədiyi üçün pis günə qaldıq,

cürbəcür müsibətlərə düçar olduq). (Saleh) dedi: “Sizin uğursuzluğunuz Allahdandır. Bəlkə də, (itaət edib-etməyəcəyinizi bilmək üçün Allah tərəfindən) imtahan olunursunuz.

48. (Səmud tayfasının yaşadığı Hirc adlı) şəhərdə doqquz kişi var idi ki, yer üzündə fitnə-fəsad törədər, əsla yaxşı bir iş görməzlər.

49. Onlar öz aralarında Allaha and içib belə dedilər: “Biz gecə ona və ailəsinə (yaxud ona iman gətirənlərə) hücum edib (hamısını) öldürəcək, sonra da onun (qanını almaq istəyən) qəyyumuna deyəcəyik ki, biz onun ailəsinin (kimlər tərəfindən) öldürüldüyünü görməmişik (öldürüldüyü yerdə olmamışıq) və biz, həqiqətən, doğru danışırıq!”

50. Onlar bir hiylə qurdular. Biz isə özləri də bilmədən (gözlənilməyən bir əzabla) hiylələrinin cəzasını verdik.

51. (Ya Rəsulum!) Bir gör onların hiylələrinin axırı necə oldu. Biz onların (doqquz kişinin) özlərini də, tayfalarını da büsbütün yox etdik.

52. Bu, zülmləri üzündən onların bomboş (viran) qalmış evləridir. Həqiqətən, bunda (qüdrətimizi) anlayıb bilən bir qövm üçün ibrət vardır!

53. İman gətirib (Allaha şərik qoşmaqdan, Ona asi olmaqdan) qorxanları isə xilas etdik!

54. Lutu da (peyğəmbər göndərdik). O zaman (Lut) öz tayfasına demişdi: “Gözünüz görə-görə çirkin işləmi məşğul olursunuz? (Etdiyiniz əməlin qəbahətini, günahını başa düşə-düşə hələ də ona davam edirsiniz!)

55. Siz qadınları qoyub şəhvətlə erkəklərin yanınamı (üstünəmi) gedirsiniz? Həqiqətən, siz cahil bir tayfasınız!”

56. (Lut) tayfasının cavabı yalnız: “Lutun ailəsini yurdunuzdan qovub çıxardın. Çünki onlar (bizim gördüyümüz işlərdən) təmiz qalmaq istəyən insanlardır!” – deməkləri olmuşdu.

57. Buna görə də Biz onu və ailəsini xilas etdik, yalnız övrətini (əzab içində) qalanlardan olmasını təqdir etdik. (Canında nə olduğunu bildiyimiz üçün onun barəsində əzəldən belə hökm verdik).

58. Onların üstünə (qızmar daşdan) bir yağış yağdırdıq. (Peyğəmbərlər vasitəsilə Allahın əzabından) qorxudulanların yağışı nə yaman imiş!

59. (Ya Rəsulum!) De: “Həmd olsun Allaha! Salam olsun (Allahın peyğəmbər) seçdiyi bəndələrinə! (Ey Məkkə əhli!) Allah yaxşıdır, yoxsa (müşriklərin) Ona şərik qoşduqları (bütlər)?!

60. (Bütlər yaxşıdır) yoxsa göyləri və yeri yaradan, sizin üçün göydən yağmur endirən kimsə?! Sonra Biz o yağmurla sizin üçün gözəl bağçalar yetişdirdik. (Əgər Allahın yaratdığı və yerə endirdiyi su olmasaydı) siz (o bağçaların) ağaclarını göyərdə bilməzdiniz. Məgər Allahla yanaşı başqa bir tanrımı var?! Lakin (müşriklər bütlərini Allaha) bərabər tutan bir tayfadırlar! (Yaxud onlar qəsdən haqq yoldan yayınan bir qövmdürlər!)

61. (Bütlər yaxşıdır) yoxsa yeri (sizin üçün) məskən yaradıb ortasında çaylar axıdan, üzərində (titrəməsin deyə) möhkəm durmuş dağlar bərqərar edən və (şirin və şor suları bir-birinə qarışmasın deyə) iki dənizin arasında maneə qoyan kimsə?! Məgər Allahla yanaşı başqa bir tanrımı var?! Lakin (müşriklərin) əksəriyyəti (Allahın vəhdaniyyətini, Onun nə qədər əzəmətli olduğunu) bilmirlər!

62. (Bütlər yaxşıdır) yaxud əli hər yerdən üzülüb darda qalan birisi Ona dua etdiyi zaman onun duasını qəbul buyuran, (sizdən) şəri

sovuşduran, sizi yer üzünün varisləri edən kimsə? Məgər Allahla yanaşı başqa bir tanrımı var? Siz nə az düşünüb danışırsınız?

63. Yaxud qurunun və suyun (səhranın və dənizin) zülmətlərində sizə doğru yol göstərən, külәkləri Öz rəhməti (yağışı) önündə bir müjdəçi olaraq göndərən kimsə?! Məgər Allahla yanaşı başqa bir tanrımı var?! Allah (müşriklərin) Ona şərik qoşduqlarından (bütlərdən) ucadır!

64. Yaxud (məxluqatı) öncə yaradan (öldükdən) sonra (qiyamət günü) onu yenidən dirildən, sizə göydən (yağışla), yerdən (növbənöv bitkilərlə, meyvələrlə) ruzi verən kimsə?! Məgər Allahla yanaşı başqa tanrımı var?" De: "(Ey müşriklər!) Əgər (Allahın şərikləri olduğunu) doğru deyirsinizsə, dəlilinizi gətirin!"

65. (Ya Rəsulum!) De: "Allahdan başqa göylərdə və yerdə olan heç kəs qeybi bilməz! Onlar yenidən nə vaxt diriləcəklərini də bilməzlər!

66. Xeyr, onların (müşriklərin) elmi axirəti qavrayıb dərk edə bilməz. Xeyr, onlar (axirət) barəsində şəkk-şübhə içindədirlər. Xeyr, onlar ona qarşı kordurlar!" (Müşriklər axirətə inanmadıqları halda, nə üçün onun barəsində sual verirlər?! Məgər onların elmi belə bir sual verməyə kifayətdirmi?! Və ya müşriklər axirət haqqında yalnız qəbirlərindən çıxardılıb dirildiləcəkləri zaman biləcəklər ki, bu da onlara heç bir fayda verməyəcəkdir!)

67. Kafirlər dedilər: "Məgər bizlər və atalarımız torpaq olduqdan sonra (dirildilib qəbirlərimizdən) çıxardılacağıq?

68. Həqiqətən, bu (dirilmə) bizə vəd olunduğu kimi, öncə atalarımıza da (vəd olunmuşdu). Bu, qədimlərin əfsanələrindən (yalan sözlərindən) başqa bir şey deyildir!"

69. (Ya Rəsulum!) De: "Yer üzünü gəzib-dolaşın, günahkarların axırının necə olduğuna bir baxın!"

70. (Ya Peyğəmbərim!) Onlardan (kafirlərin təkzib etmələrindən) ötrü kədərlənmə və (sənə qarşı) qurduqlarına (hiylələrə) görə də ürəyini qısma!

71. Onlar: Əgər doğru danışırsınızsa, (deyin görək) bu vəd (bizi qorxutduğunuz əzab vədəsi) nə vaxt yerinə yetəcəkdir?" – deyə soruşarlar.

72. De: "Tez-tələsik istədiyiniz (əzabın) bir hissəsi, bəlkə də, artıq sizə gəlib çatmaq üzərədir!" (Müşriklər onlara vəd olunan əzabın bir hissəsini Ühüd vuruşunda daddılar, qalanını isə Cəhənnəmdə dadacaqlar!)

73. (Ya Rəsulum!) Həqiqətən, sənin Rəbbin insanlara mərhəmətlidir, lakin onların əksəriyyəti (Allahın bu mərhəmətinə) şükür etməz.

74. Şübhəsiz ki, sənin Rəbbin onların ürəklərinin gizli saxladığı və özlərinin aşkar etdikləri hər şeyi (qəlblərin sirlərini və açıq-aşkar əməllərini) bilir.

75. Göylərdə və yerdə (heç kəsin bilmədiyi) elə bir gizli şey yoxdur ki, açıq-aydın Kitabda (lövhi-məhfuzda) olmasın!

76. Həqiqətən, bu Quran İsrail oğullarına ixtilafda olduqları şeylərin əksəriyyətini anladıb xəbər verir.

77. Və şübhəsiz ki, o möminlərə bir hidayət (doğru yolu göstərən rəhbər) və mərhəmətdir.

78. Həqiqətən, sənin Rəbbin onların (dini məsələlərdə ixtilafda olanların) arasında Öz hökmünü (ədalətlə) verəcəkdir. O, (hər şeyə) qalib olandır, (hər şeyi) biləndir!

79. (Ya Rəsulum!) Sən ancaq Allaha təvəkkül et, çünki sən açıq-aydın həqiqi dindəsən (haqq yoldasan).

80. Şübhəsiz ki, sən nə ölülərə (haqqı) başa sala bilər, nə də dönüb gedən karlara (haqqa) çağırışı eşitdirə bilərsən!

81. Sən o korları düşdükləri əyri yoldan düz yola gətirə bilməzsən. Sən (haqqı) yalnız ayələrimizə inananlara eşitdirə bilərsən. Məhz onlar müsəlmandırlar. (Allaha ürəkdən inanıb Ona canla-başla itaət edərlər).

82. Onlara deyilən söz yerinə yetdiyi (qiyamət yaxınlaşdığı) zaman onlar üçün yerdən (möminlərlə kafirləri xüsusi nişanla bir-birlərindən ayıran) bir heyvan çıxardarıq ki, onlarla danışıb (Bizim adımızdan): "İnsanlar ayələrimizə inanmırdılar!" – deyər.

83. O gün hər ümmətdən ayələrimizi təkzib edənləri dəstə-dəstə yığarıq. Sonra onlar (bir yerə cəm edilib məhşərə) sürüklənərlər.

84. Onlar (haqq-hesab yerinə) gəlib çatdıqda (Allah) buyurar: "Ayələrimizi anlamadığınız (bilmədiyiniz) halda, onları yalanmı hesab edirdiniz? Yaxud siz (dünyada) nə edirdiniz? (O nə iş idi ki, görürdünüz?)"

85. Etdikləri zülm (küfr) üzündən onlara deyilən söz yerinə yetər (vəd olunduqları əzab, müsibət başlarına gələr). Onlar heç danışa da bilməzlər!

86. Məgər gecəni onların istirahəti üçün (qaranlıq) yaratdığımızı, gündüzü isə (işlərini görmək, ruzi qazanmaq üçün) işıqlı etdiyimizi görmürlərmi? İman gətirən bir tayfa üçün bunda (Allahın vəhdaniyyətinə, qüdrətinə dəlalət edən) əlamətlər vardır.

87. Sur çalınacağı gün Allahın istədiklərindən (məhrəm mələklərdən, yaxud Allahın yanında həmişə diri olan şəhidlərdən) başqa, göylərdə və yerdə olanlar (bütün məxluqat) dəhşətli bir qorxuya düşər və onların hamısı Onun hüzuruna müti (zəlil) vəziyyətdə gələr.

88. (O gün) dağlara baxıb onları donmuş (hərəkətsiz durmuş) zənn edərsən, halbuki onlar bulud keçdiyi kimi keçib gedərlər. Bu, hər şeyi bacarıqla (yerli-yerində) edən Allahın gördüyü işdir. Həqiqətən, O, etdiyiniz (bütün) əməllərdən xəbərdardır!

89. Hər kəs (Rəbbinin hüzuruna) yaxşı əməllə (tövhid kəlməsi ilə, səmimi-qəlbdən imanla) gəlsə, onu (bu əməlin) müqabilində daha yaxşı bir mükafat (Cənnət) gözləyir. Beləl변 o gün (qiyamət günü) dəhşətli qorxudan da əmin olarlar.

90. (Rəbbinin hüzuruna) pis əməllə gələnlər isə cəhənnəm oduna üzüstə atılarlar. (Mələklər onlara belə deyərlər: ) “Bu, yalnız (dünyadakı pis) əməllərinizin cəzasıdır! (Sizə artıq heç bir şey edilmir!)”

91. (Ya Rəsulum! De: ) “Mənə ancaq bu şəhərin (Məkkənin) Rəbbinə ibadət etmək əmr olunmuşdur. Elə bir şəhər ki, (Rəbbim) onu müqəddəs tutmuşdur. (Orada qan tökmək, bir kəsə zülm etmək qadağan olunmuşdur. Başqa yerdə halal olan şeylər orada haram buyurulmuşdur). Hər şey yalnız Onundur. Mənə müsəlman (Allaha təslim) olmaq əmr edilmişdir!

92. Və mənə Quran oxumaq (buyurulmuşdur)!” Hər kəs doğru yolda olsa, yalnız özü (öz xeyri) üçün doğru yolda olmuş olar. Hər kəs doğru yoldan çıxsa, (ona) de: “Mən yalnız (insanları Allahın əzabı ilə) qorxudan peyğəmbərlərdənəm!” (Mənim vəzifəm ancaq dini təbliğ etməkdir. Həç kəsi iman gətirməyə məcbur edən deyiləm!)

93. Və de: “Həmd olsun Allaha! O Öz ayələrini (qüdrət nişanələrini) sizə göstərəcək, siz də onları görüb tanıyacaqsınız. Rəbbin etdiyiniz əməllərdən (Məkkə müşrikləri və kafirlərin gördüyü işlərdən) əsla xəbərsiz deyildir!”

## .28.
## əl-Qəsəs (Hekayət) surəsi
**(Məkkədə nazil olmuşdur, 88 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Ta, Sin, Mim!

2. Bu, (haqqı batildən ayıran, möcüzələri, hökmləri) açıq-aydın Kitabın ayələridir!

3. Biz inanan bir tayfa üçün sənə Musanın və Fironun hekayətindən (bir qismini) olduğu kimi söyləyəcəyik.

4. Həqiqətən, Firon yer üzündə (Misirdə) baş qaldırıb onun əhalisini zümrələrə bölmüşdü. (Firon) onların arasında olan bir tayfanı (İsrail oğullarını) gücsüz (aciz) görüb onların (yeni doğulan) oğlan uşaqlarını öldürür, qızlarını isə sağ buraxırdı. O, həqiqətən, (yer üzündə) fitnə-fəsad törədənlərdən idi!

5. Bis isə istəyirdik ki, o yerdə zəif düşüb əzilənlərə (İsrail oğullarına) mərhəmət göstərək, onları (xeyirxah işlərdə) öndə gedənlər və (Fironun mülkünə) varislər edək.

6. Və onları yer üzündə (Misirdə, Şamda) yerləşdirib möhkəmləndirək, Firona, (vəziri) Hamana və ordularına onların qorxub çəkindikləri şeyi (İsrail oğullarından birinin əli ilə məhv edilib hakimiyyətlərinə son qoyulmasını) göstərək.

7. Biz Musanın anasına (ilham yolu ilə, yaxud röyada): “Onu (Musanı) əmizdir; elə ki ondan ötrü qorxdun, onu dəryaya (Nil çayına) at. (Uşağın suda boğulacağından) qorxma və (ayrılığına da) kədərlənmə. Biz onu sənə qaytaracaq, özünü də (şəriət sahibi olan) peyğəmbərlərdən edəcəyik!” – deyə bildirdik.

8. (Musa doğulduqdan sonra anası bir müddət onu əmizdirdi, sonra mamaçanın onun oğlu olduğunu Firona xəbər verəcəyindən qorxaraq körpəsini bir sandığa qoyub Allaha dua edərək Nil çayına atdı. Bu zaman Firon zövcəsi ilə oturub Nilə tamaşa edirdi. Suyun üzündə bir sandığın üzdüyünü görən Firon xidmətçilərə onu tutub gətirməyi əmr etdi). Fironun adamları axırda özlərinə düşmən kəsiləcək və başlarına bəla olacaq Musanı (içində olduğu sandıqla birlikdə) götürüb gəldilər. Həqiqətən, Firon, Haman və onların əsgərləri (küfr etdiklərinə, məsum uşaqları öldürdüklərinə görə) günahkar idilər.

9. Fironun qadını (Asiyə) dedi: "Bu uşaq mənim də, sənin də göz bəbəyimiz (gözaydınlığımız, gözümüzə sevinc olsun). Onu öldürməyin. Ola bilsin ki, (o böyüyəndə) bizə bir fayda verər, yaxud da onu oğulluğa götürərik!" Onlar (işin nə yerdə olduğunu, bu uşağın əlində həlak olacaqlarını) bilmirdilər.

10. (Oğlunun Fironun əlinə düşdüyünü bildikdən sonra) Musanın anasının ürəyi bomboş (sevimli balasının fikrindən başqa hər şeydən xali) olmuşdu. Əgər (Allahın vədinə) inananlardan olsun deyə, ürəyinə səbir (səbat) əta etməsəydik, az qala onu (saraya gətirilmiş körpənin özünkü olduğunu) büruzə verəcəkdi. (Dəhşətindən və ya sevincindən: "Bu uşaq mənimdir!" – deyəcəkdi).

11. O, (Musanın Məryəm, yaxud Gülsüm adlı) bacısına: "Onun dalınca get! (Əhvalatdan xəbər tut!)" – dedi. O da (saraya yol tapıb Fironun adamları onun kim olduğunu) hiss etmədən uzaqdan-uzağa (Musanı) gördü.

12. Bundan (anası saraya gəlməmişdən) qabaq Biz ona (Musaya) süd analarını (özgə qadınların döşünü əmməyi) qadağan etmişdik. (Musanın bacısı Firon əhlinə) belə dedi: "Sizin üçün o uşağa süd verməyi (ona baxmağı) təmin edəcək, həm də ona qarşı xeyirxah

olacaq (onunla yaxşı davranacaq) bir ailəni (ev əhlini) sizə nişan verimmi?”

13. Beləliklə, gözü aydın olsun, (oğlunun ayrılığına) kədərlənməsin və Allahın vədinin haqq olduğunu bilsin deyə, (Musanı) anasına qaytardıq. Lakin onların (insanların, yaxud Firon əhlinin) əksəriyyəti (Allahın vədinin doğru olduğunu) bilməz!

14. (Musa) yetkinləşib kamilləşəndə (otuz-qırx yaşlarına çatanda) ona hikmət və elm (şəriət elmi) verdik. Biz yaxşı əməl sahiblərini belə mükafatlandırırıq!

15. (Musa) şəhərə əhalisi xəbərsizkən (günorta istirahət vaxtı) girdi. Orada iki nəfərin vuruşduğunu gördü. Onlardan biri öz adamlarından (yəhudilərdən), digəri isə düşmənlərindən (qibtilərdən) idi. (Musanın) adamlarından olan kəs düşməninə qarşı ondan imdad istədi. Musa onu (əli, yaxud əsası ilə) vurub öldürdü və dedi: “Bu, Şeytan əməlindəndir. Həqiqətən, o, açıq-aşkar bir düşməndir, (insanı haqq yoldan) azdırandır!”

16. (Musa) dedi: “Ey Rəbbim! Şübhəsiz ki, mən (bu qibtini vurub öldürməklə) özüm-özümə zülm etdim. Buna görə məni bağışla!” (Allah Musanı) bağışladı. Həqiqətən, O, (bəndələrini) bağışlayandır, rəhm edəndir!

17. (Musa) dedi: “Ey Rəbbim! Mənə bəxş etdiyin nemət haqqı (günahımı bağışlamağına and içirəm ki) mən əsla günahkarlara arxa olmayacağam!”

18. Beləliklə, (Musa qibtini öldürdüyündən) qorxaraq səhəri şəhərdə nigaranlıq içində qarşıladı. (Bir də nə görsə yaxşıdır!) Dünən ondan imdad diləyən kəs (bu gün də başqa bir qibti ilə vuruşaraq) fəryad çəkib yenə onu köməyə çağırdı. Musa ona dedi: “Sən (gündə biri ilə vuruşduğun üçün), doğrudan da, açıq-aşkar bir azğınsan!”

19. (Musa) onların hər ikisinin (həm özünün, həm də onu köməyə səsləyən yəhudinin) düşməni (olan bu ikinci qibtini) yaxalamaq istədikdə (həmin yəhudi Musanın ona hücum etmək istədiyini zənn edərək) dedi: “Ya Musa! Sən dünən birini vurub öldürdüyün kimi, mənidəmi öldürmək istəyirsən? Sən yer üzündə (Misir torpağında) ancaq bir zalım olmaq istəyirsən! Sən xeyirxahlıq (insanları islah) edənlərdən olmaq istəmirsən!”

20. (Yəhudinin bu sözündən sonra dünən öldürülən qibtinin qatilinin Musa olduğu bütün Misir xalqına bəlli oldu. Bu xəbər Firona çatdıqda o, Musadan qisas almaq istədi). Şəhərin kənarından (Fironun şəhərin ucqarında yerləşən sarayından) bir nəfər çaparaq gəlib dedi: “Ya Musa! Əyan-əşraf səni öldürmək barəsində məsləhət-məşvərət edirlər. Elə bu saat (şəhərdən) çıx get. Mən, həqiqətən, sənin xeyirxahlarındanam!”

21. (Musa) qorxu içində (ətrafına) göz qoya-qoya oradan (şəhərdən) çıxıb: “Ey Rəbbim! Məni bu zalım tayfanın əlindən qurtar!” – dedi.

22. O, Mədyən tərəfə yönəldiyi zaman dedi: “Ola bilsin ki, Rəbbim mənə (Mədyənə aparıb çıxaran) doğru yolu göstərsin!”

23. (Musa) Mədyən kənarındakı bir quyuya çatanda onun başında (heyvanlarını sulayan) bir dəstə adam və onlardan başqa (qoyunlarını özgə heyvanlara qarışmasın deyə) geri çəkən iki qadın (qız) görüb dedi: “Sizə nə olub (dərdiniz nədir)?” Onlar: “Çobanlar (heyvanlarını) sulayıb getməmiş biz (qoyunlarımıza) su vermirik. Atamız da ixtiyar bir qocadır (buna görə qoyunları sulamağa biz gətiririk)”, - deyə cavab verdilər.

24. (Musa) onlar üçün (yaxınlıqdakı başqa bir quyudan su çəkib qoyunlarını) suladı, sonra da kölgəyə çəkilib dedi: “Ey Rəbbim! Mən Sənin mənə nazil edəcəyin xeyirə möhtacam!” (Musa yeddi gün idi

ki, çöldəki otlardan başqa yeməyə bir şey tapmırdı. Buna görə də Allahdan yemək üçün bir ruzi dilədi).

25. Sonra (o iki qadından, qızdan) biri utana-utana (Musanın) yanına gəlib dedi: "Atam qoyunlarımızı sulamağının haqqını verməkdən ötrü səni çağırır!" (Musa gördüyü işin müqabilində heç bir muzd, mükafat almamaq üçün ürəyində and içdi). (Musa qocanın) yanına gəldikdə başına gələnləri (Fironla olan əhvalatı) ona söylədi. O kişi (Şüeyb peyğəmbər) dedi: "Qorxma, artıq zalım tayfanın əlindən qurtarmısan!"

26. (O iki qızın) biri dedi: "Atacan! Onu muzdla (çoban) tut, çünki bu güclü, etibarlı adam (indiyə qədər) muzdla tutduqlarının ən yaxşısıdır!"

27. (Şüeyb) dedi: "Səkkiz il mənə xidmət etmək (qoyunlarımı otarmaq) şərti ilə qızlarımın birini sənə ərə verərəm. Əgər sən (həmin müddəti) tamamlayıb on ilə çatdırsan, bu, artıq sənin tərəfindən (olan bir lütfdür). Mən (on il müddətinə şərt kəsməklə) sənə əziyyət vermək istəmirəm. İnşallah, mənim saleh (əhdə vəfa edən) kəslərdən olduğumu görəcəksən!"

28. (Musa) dedi: "Bu (dediyin) mənimlə sənin aranda (olan bir təəhhüddür, onu pozmaq olmaz). Bu iki müddətdən hansını yerinə yetirməkdən mənə qarşı heç bir zor ola bilməz. (İstəsəm səkkiz, istəsəm on il xidmət edərəm. Bundan artıq işləməyimi tələb etməyə haqqın yoxdur). Allah da dediyimizə şahiddir (vəkildir)!"

29. Musa (onillik xidmət) müddətini başa vurub ailəsi ilə birlikdə (Misirə tərəf) yola çıxdığı zaman Tur dağı tərəfdə bir od gördü. O, ailəsinə dedi: "Siz (mən qayıdanadək burada) durun. Mən bir od gördüm. Bəlkə, gedib ondan sizə bir xəbər, yaxud bir köz gətirim ki, qızınasınız!"

30. (Musa) odun yanına gəlib çatdıqda vadinin sağ tərəfində olan mübarək (bərəkətli) yerdəki ağacdan belə bir nida gəldi: “Ya Musa! Aləmlərin Rəbbi olan Allah Mənəm!

31. Əsanı (yerə) at!” (Musa əsanı yerə atdı). O əsanın ilan kimi qıvrıldığını gördükdə dönüb qaçdı, heç dala da baxmadı. (Biz ona belə buyurduq: ) “Ya Musa! Bəri gəl, qorxma! Sən əmin-amanlıq içindəsən!

32. Əlini qoynuna qoy ki, əlin (oradan) eyibsiz-qüsursuz, ağappaq (parlaq bir nur kimi) çıxsın. Əlini (qanadını) özünə tərəf çək (yenidən qoynuna qoy) ki, (ilanın, yaxud əlinin parıltısının səni bürüdüyü) vahimə çəkilib getsin. Bu, Firona və onun əyanlarına qarşı sənin Rəbbindən olan iki möcüzədir. Onlar, həqiqətən, (Allahın itaətindən çıxmış) fasiq bir tayfadırlar!” (Musa birinci dəfə əlini qoynuna qoyub çıxartdıqda o, baxanlara bir nur kəsilib gözlərini qamaşdırar, onları qorxuya salar, ikinci dəfə qoyub çıxartdıqda isə adi halına düşərdi).

33. (Musa) dedi: “Ey Rəbbim! Mən onlardan bir nəfəri öldürmüşəm, qorxuram ki, onlar da məni öldürərlər.

34. Qardaşım Harunun dili mənimkindən daha bəlağətlidir. Onu da mənimlə dediklərimi (Firon əhlinə izah edib) təsdiqləyəcək bir köməkçi göndər. Onların məni yalançı hesab edəcəklərindən qorxuram!”

35. (Allah) buyurdu: “Sənin arxanı qardaşınla möhkəmləndirəcək, ikinizə də dəlil (möcüzə və qüdrət) verəcəyik. Onlar ayələrimiz sayəsində sizə heç bir pislik edə bilməyəcəklər. Siz də, sizə (iman gətirib) tabe olanlar da (Firona və əyanlarına) mütləq qalib gələcəksiniz!”

36. Musa açıq-aşkar ayələrimizlə (Firon əhlinin) yanına gəldikdə onlar: “Bu (sənin tərəfindən) uydurulmuş sehrdən başqa bir şey

deyildir. Biz öz ulu babalarımızdan bu barədə (sizin təbliğ etdiyiniz din, risalət haqqında) heç bir şey eşitməmişik!” – dedilər.

37. Musa dedi: “Rəbbim Öz dərgahından kimin hidayətlə (doğru yola rəhbərliklə) gəldiyini və axirət yurdunun (gözəl aqibətinin) kimə nəsib olacağını daha yaxşı bilir. Həqiqətən, zalımlar nicat tapmazlar! (Muradlarına yetişməzlər!)

38. Firon (istehza ilə) dedi: “Ey əyanlar! Mən sizin üçün özümdən başqa bir tanrı olduğunu bilmirəm. Ey Haman! Mənim üçün od qalayıb palçıqdan kərpic bişir və bir qüllə tikdir ki, (ora qalxıb) bəlkə, Musanın tanrısına tamaşa edim. Axı mən onu, həqiqətən, yalançı sayıram!

39. (Firon) və əsgərləri yer üzündə nahaq yerə təkəbbür göstərdilər və elə güman etdilər ki, (öləndən sonra bir də dirilib) hüzurumuza qaytarılmayacaqlar!

40. Buna görə də onu və əsgərlərini tutub dənizə atdıq. (Ya Rəsulum!) Bir gör zalımların axırı necə oldu!

41. Biz onları (dünyada insanları) cəhənnəm oduna (küfrə, şirkə) çağıran rəhbərlər etdik. Qiyamət günü onlara (Allahın əzabından qurtarmaq üçün) heç bir kömək edilməyəcəkdir!

42. Bu dünyada onlara lənət damğası vurduq (hamı onlara lənət oxuyar), qiyamət günü isə onlar çirkin (iyrənc, Allahın rəhmətindən kənar edilmiş) kimsələr olacaqlar.

43. Əvvəlki nəsilləri məhv etdikdən sonra insanlara (İsrail oğullarına) bir nur, doğru yolu göstərən rəhbər və rəhmət olaraq Musaya Kitab verdik ki, bəlkə, (onun vasitəsilə) öyüd-nəsihət qəbul etsinlər.

44. (Ya Rəsulum!) Biz Musaya vəhy etdiyimiz (peyğəmbərlik bəxş edib Firon əhlinin yanına getməsini buyurduğumuz) zaman sən (Tur dağının) qərb tərəfində (Musanı gözləyənlər arasında) deyildin. Sən (buna) şahid olanlardan da deyildin! (Sənin yəhudilərə və ərəb müşriklərinə bu xəbərləri doğru söyləməyin yalnız Allahdan nazil olan vəhylərdir!)

45. Lakin Biz (Musadan sonra) neçə-neçə nəsillər yaratdıq. Onlar uzun ömür sürdülər. (Vəhy kəsildi; bir çox xəbərlər unudulub getdi, şəriət təhrif olundu). Sən ayələrimizi onlara oxuyarkən Mədyən əhli arasında deyildin. (Sən Mədyəndə deyildin ki, onların əhvalını bilib Məkkə əhlinə xəbər verəsən. Buna görə də onlar sənin bu xəbərləri Mədyən camaatından öyrəndiyini deyə bilməzlər). Lakin Biz (bu əhvalatları onlara olduğu kimi xəbər vermək üçün səni) peyğəmbər göndərdik. [Və ya: Ancaq (bu xəbərləri sənə) göndərən Bizik].

46. Və Biz (Musaya) xitab etdiyimiz (Tövratı verdiyimiz) zaman da sən Tur dağının yanında deyildin. Lakin səndən əvvəl özlərinə peyğəmbər gəlməmiş bir tayfanı (Allahın əzabı ilə) qorxudasan deyə, Rəbbindən bir mərhəmət olaraq (sənə bunları öyrədib onlara peyğəmbər göndərdik). Bəlkə, öyüd-nəsihət qəbul etsinlər!

47. Öz əlləri ilə etdikləri əməlləri (qazandıqları günahları) üzündən onlara bir müsibət üz verincə: “Ey Rəbbimiz! Barı, bizə bir peyğəmbər göndərəydin ki, biz də Sənin ayələrinə uyub möminlərdən olaydıq!” – deməsəydilər, səni onlara peyğəmbər göndərməzdik. (Onların bəhanəsini kəsmək üçün belə etdik).

48. Dərgahımızdan onlara (müşriklərə) haqq (Quran və Peyğəmbər) gəldikdə onlar: “Musaya verilən (möcüzələr) nə üçün eynilə ona da verilmədi?” – dedilər. Məgər onlar daha öncə Musaya verilənləri danıb: “İki sehr (Tövrat və Quran) bir-birilə köməkləşdi və biz (iki

sehrbazın – Musanın və Muhəmmədin) hər birini inkar etdik!” – deməmişdilərmi?

49. (Ya Rəsulum!) De: “Əgər doğru deyirsinizsə, Allahın dərgahından bu ikisindən (Qurandan və Tövratdan) daha doğru yol göstərən bir kitab gətirin, mən də ona tabe olum!”

50. Əgər sənə (sənin bu təklifinə) cavab verməsələr, bil ki, onlar öz nəfslərinə uymuşlar. Allahdan bir dəlil (hidayət) olmayınca öz nəfsinə uyandan (Rəbbinə şərik qoşandan, küfr edəndən) haqq yolu daha çox azmış kim ola bilər?! Allah zalım tayfanı doğru yolda müvəffəq etməz!

51. Həqiqətən, Biz sözü (Quranı, keçmişlərə aid xəbərləri) onlar üçün bir-birinin ardınca (müfəssəl) izah etdik ki, bəlkə, öyüd-nəsihət qəbul etsinlər. (Bunlardan ibrət alıb iman gətirsinlər!)

52. (Qurandan) əvvəl kitab vermiş olduğumuz kəslər (mömin yəhudi və xaçpərəstlər) ona inanırlar.

53. Onlara (Quran) oxunduğu zaman: “Biz ona inandıq. Doğrudan da, Rəbbimizdən (nazil olmuş) haqdır. Biz ondan əvvəl də müsəlman (təkallahlıq, Allahın vəhdaniyyətini qəbul edib yalnız Ona itaət və ibadət edən kəslər) idik!” – deyirlər.

54. (İki kitaba – Tövrata və Qurana inandıqları üçün müşriklərin gördükləri əzab-əziyyətə) səbr etdiklərinə görə onlara iki dəfə mükafat veriləcəkdir. Onlar pisliyi yaxşılıqla dəf edər və özlərinə verdiyimiz ruzidən (ehtiyacı olanlara) sərf edərlər.

55. Onlar boş (yersiz) bir söz eşitdikləri zaman ondan üz çevirib: “Bizim əməllərimiz bizə, sizin əməlləriniz də sizə aiddir. (Hərə öz əməlinə cavabdehdir). Sizə salam olsun! (Salamat qalın. Bizimki bizdə, sizinki də sizdə!) Biz cahilləri (cahillərlə yoldaşlıq etmək,

onların söz-söhbətinə qulaq asmaq, sonra da onlarla çənə-boğaz olmaq) istəmirik!” – deyirlər.

56. (Ya Rəsulum!) Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən. Amma Allah dilədiyini doğru yola salar. Doğru yolda olacaq kəsləri (öz əzəli elmi ilə) daha yaxşı O bilir! (Və buna görə də onları haqq yola müvəffəq edir!)

57. (Qüreyşlilər) dedilər: “Əgər biz səninlə bilikdə haqq yolu (islam dinini) tutub getsək, (əksəriyyəti təşkil edən müşriklərin əli ilə) yurdumuzdan tezliklə didərgin salınarıq”. Məgər Biz onları Özümüzdən bir ruzi olaraq hər yerin meyvəsinin (hər cür meyvənin) daşınıb gətirildiyi, (daxilində Kəbə yerləşən) qorxusuz-xətərsiz (müqəddəs) bir yerdə (Məkkədə) sakin etmədikmi? Lakin onların əksəriyyəti (Allahın onlara bəxş etdiyi bu nemətin qədrini) bilməz!

58. Biz xoş güzəranına naşükür olub qürrələnən neçə-neçə məmləkəti (məmləkət əhlini) həlak etdik. Bu onların özlərindən sonra yalnız az bir hissəsi məskun olan (bomboş, xaraba qalmış) yurdlarıdır. Onlara Biz varis olduq.

59. (Ya Rəsulum!) Sənin Rəbbin mərkəzlərinə (ən böyük şəhərlərinə) ayələrimizi oxuyan bir peyğəmbər göndərməmiş məmləkətləri məhv etmədi. Biz yalnız əhalisi zalım olan məmləkətləri yox etdik!

60. Sizə verilən hər hansı bir şey (dövlət, övlad, xoş güzəran) ancaq bu fani dünyanın malı və bərbəzəyidir. Allah yanında olan (nemətlər) isə daha yaxşı və daha baqidir (əbədidir). Məgər ağıla gəlməzsiniz?! (Fani dünya malını axirətin əbədi nemətlərindən üstün tutursunuz!)

61. Məgər verdiyimiz gözəl bir vədə (Cənnətə) qovuşan kimsə, (əvvəlcə) fani dünya malı bəxş etdiyimiz, sonra da qiyamət günü (cəhənnəm oduna) gətiriləcək kimsə ilə eyni ola bilərmi?!

62. (Allah) həmin gün onlara xitab edib belə buyuracaqdır: “Mənim şəriklərim olduqlarını iddia etdikləriniz (bütlər, tanrılar) haradadırlar?!

63. Haqlarında hökm (vəd etdiyimiz əzab) vacib olanlar (şeytanlar və müşriklərin rəisləri) deyəcəklər: “Ey Rəbbimiz! Bunlar bizim (haqq yoldan) azdırdığımız kimsələrdir. Özümüz nə cür azmışdıqsa, onları da elə azdırdıq. Biz onlardan uzaqlaşıb (onlarla əlaqəmizi kəsib) Sənə tərəf gəldik. Əslində onlar bizə ibadət etmirdilər (yalnız öz nəfslərinə uyurdular).

64. (Müşriklərə) belə deyiləcək: “Şəriklərinizi çağırın!” (Müşriklər) ortaqlarını çağıracaq, lakin onlar (müşriklərə) cavab verməyəcəklər. Onlar mütləq əzabı görəcəklər. Əgər onlar (dünyada) doğru yola gəlmiş olsaydılar (axirətdə əzab görməzdilər).

65. (Allah) həmin gün onlara xitab edib belə buyuracaqdır: “Peyğəmbərlərə nə cavab verdiniz?”

66. O gün (canlarını qurtaracaq) xəbərlər (cavablar) onlardan gizli qalacaqdır (bütün bəhanələri kəsiləcəkdir). Onlar (qiyamətin heybətindən) bir-birindən hal-əhval belə tuta bilməyəcəklər. (Hər kəs öz hayında olacaqdır).

67. Tövbə edərək iman gətirib yaxşı işlər görənlərə gəldikdə isə, onların nicat tapmaları mümkündür.

68. Rəbbin istədiyini yaradar və (istədiyini də peyğəmbər) seçər. Onların (bəndələrin istədiklərini etməyə) heç bir ixtiyarı yoxdur. Allah pakdır, müqəddəsdir və (müşriklərin) Ona şərik qoşduqlarından (bütlərdən) ucadır! (Allah eyibsizdir, nöqsansızdır. O, hamıdan uludur!)

69. Sənin Rəbbin onların ürəklərinin gizli saxladığı və özlərinin də aşkar etdiyi hər şeyi (qəlblərinin sirlərini və açıq-aşkar əməllərini) bilir.

70. Odur Allah. Ondan başqa heç bir tanrı yoxdur. Dünyada da, axirətdə də həmd-səna Ona məxsusdur. Hökm Onundur. Siz Onun hüzuruna qaytarılacaqsınız!

71. (Ya Rəsulum!) De: "Bir deyin görək, əgər Allah gecəni qiyamətə qədər üstünüzə uzatsaydı, (haqq olan) Allahdan başqa hansı tanrı sizə bir işıq gətirə bilərdi?! Məgər (öyüd-nəsihət) eşitmirsinizmi?"

72. De: "Bir deyin görək, əgər Allah gündüzü qiyamətə qədər üstünüzə uzatsaydı, (haqq olan) Allahdan başqa hansı tanrı istirahət etdiyiniz gecəni sizə gətirə bilərdi?! Məgər (gecə ilə gündüzün bir-birinin əvəz etməsinin Allahdan sizə bir lütf olmasını) görmürsünüzmü?"

73. (Allah) öz mərhəmətindən dolayı sizi üçün gecəni (qaranlıq) və gündüzü (işıq) yaratdı ki, (gecəni) dincələsiniz, (gündüzü isə) Onun lütfündən ruzi diləyib axtarasınız. Bəlkə, (bu nemətə görə Allaha) şükür edəsiniz!

74. O gün (qiyamət günü Allah müşriklərə) müraciət edib belə buyuracaqdır: "Şəriklərim olduqlarını iddia etdikləriniz (bütlər, tanrılar) haradadırlar?"

75. (O gün) hər ümmətdən (öz peyğəmbərləri olmaqla) bir şahid çıxardacaq və (müşriklərə): "(Allah şərik qoşmağınızın lüzumu barədə) tutarlı dəlilinizi gətirin!" – deyəcəyik. Onlar haqqın yalnız Allaha məxsus olduğunu biləcəklər. Uydurub düzəltdikləri (bütlər) isə qeyb olacaqlar! (Onları qoyub qaçacaqlar!)

76. Həqiqətən, Qarun Musa qövmündən (Musanın əmisi oğlu) idi. Onlara (İsrail oğullarına) qarşı (zülm etməkdə, Musanın üzünə ağ olmaqda və özünü yuxarı tutmaqda) həddini aşmışdı. Biz ona açarlarını bir dəstə güclü adamın zorla daşıya biləcəyi xəzinələr vermişdik. Qövmü ona belə dedi: “(Malına qürrələnib) sevinmə. Şübhəsiz ki, Allah (malına qürrələnib) sevinənləri sevməz!

77. Allahın sənə verdiyindən özünə axirət qazan (malını Allah yolunda sərf et). Dünyadakı nəsibini də unutma. (O maldan qismətinin ancaq bir kəfən olduğunu bil. Pulunu mənasız yerə sağa-sola səpələmə; səhhətinin, sərvətinin, gəncliyinin qədrini bil. Sabah səni Allahın əzabından qurtara biləcək yaxşı əməllər et). Allah sənə (sərvət verməklə) yaxşılıq etdiyi kimi, sən də (varından yoxsullara, qohum-əqrəbaya xərcləməklə) yaxşılıq et. Yer üzündə fitnə-fəsad törətməyə cəhd göstərmə. Həqiqətən, Allah fitnə-fəsad törədənləri sevməz!”

78. (Qarun) dedi: “Bu (var-dövlət) mənə yalnız məndə olan elm (Tövratı gözəl bilmək, yaxud əlkimyaya yaxşı bələd olmaq, ticarətdən baş çıxartmaq) sayəsində verilmişdir. Məgər o (Qarun) Allahın ondan əvvəl özündən daha qüvvətli və daha varlı olan neçə-neçə kəsləri məhv etdiyini bilmirdimi? Günahkarlar öz günahları barəsində sorğu-sual olunmazlar. (Onların günahkar olduqları üzlərindən bilinər və buna görə də heç bir sorğu-sual edilmədən cəhənnəm oduna atılarlar).

79. (Bir gün Qarun) faxir libas geyib öz zinəti (ehtişamı) içində (dörd min vəznəli-çuxalı əyanın, qızıl-gümüş yəhərli atların müşayiətilə) qövmünün qarşısına çıxdı. Dünyaya həris olanlar dedilər: “Kaş ki, Qaruna verilən (dövlət) bizə də veriləydi. Həqiqətən, o, böyük bəxt (qismət) sahibidir!”

80. (Axirət barəsində) elm verilmiş kəslər isə belə dedilər: “Vay halınıza! (Ay yazıqlar!) İman gətirib yaxşı əməl edən kimsə üçün Allahın mükafatı (təmənnasında olduğunuz var-dövlətdən, dəbdəbədən) daha yaxşıdır. Buna (bu nemətə) yalnız səbr edənlər (Allaha itaət və ibadət etməyi fani dünya malından üstün tutanlar, həyatın çətinliklərinə dözənlər) qovuşarlar!”

81. Nəhayət, (Musanın duasını qəbul buyurub bir zəlzələ nəticəsində) onu (Qarunu) sarayı ilə birlikdə yerə gömdük. Allaha qarşı ona yardım edə biləcək (Allahın əzabından onu qurtaracaq) bir camaat da yox idi. O özü də özünə heç bir kömək edə bilmədi. (Bu qədər cah-calalın, dəbdəbənin müqabilində nə özü, nə də başqası Allahın əzabını ondan dəf etməyə qadir olmadı. Allahın əzab vermək istədiyi bir kimsəni Allahın Özündən başqa o əzabdan heç kəs qurtara bilməz!)

82. Dünən (dünyada) onun (Qarunun) yerində olmaq istəyənlər ertəsi gün səhər belə deyirdilər: “Vay (biz heç bilməmişik)! Sən demə, Allah Öz bəndələrindən istədiyinin ruzisini artırarmış da, azaldarmış da! Əgər Allah bizə lütf etməsəydi, yəqin ki, bizi də yerə gömərdi. Sən demə, kafirlər nicat tapmayacaqlarmış!”

83. Biz bu axirət yurdunu yer üzündə təkəbbürlük etməyənlərə və fitnə-fəsad törətməyənlərə qismət edərik. (Ən gözəl) aqibət ancaq Allahdan qorxub pis əməllərdən çəkinənlərindir!

84. Hər kəs (Rəbbinin hüzuruna) yaxşı əməllə (səmimi-qəlbdən imanla) gəlsə, ona bundan (əməlindən) daha yaxşısı verilər (Cənnətə nail olar). Hər kəs pis əməllə gəlsə, (bilsin ki) pis əməllər edənlərə ancaq əməllərinin cəzası verilər! (Cəzaları pislikləri qədər olar, onlara heç bir haqsızlıq edilməz!)

85. (Ya Rəsulum!) Quranı (oxumağı və təbliğ etməyi, yaxud hökmlərinə əməl etməyi) sənə vacib buyuran (Allah) qayıdacağın

yerə (hicrət edərək çıxdığın Məkkəyə) səni yenə də qaytaracaqdır. De: "Rəbbim hidayətlə (doğru yolu göstərən rəhbərlə) gələni də (yaxud doğru yolda olanı da), haqq yoldan açıq-aşkar azanı da (hamıdan) yaxşı tanıyır!"

86. Sən Quranın sənin özünə nazil olacağına ümid etmirdin. Ancaq o, Rəbbindən bir mərhəmət olaraq sənə göndərildi. Buna görə də heç vaxt kafirlərə arxa olma! (Kafirlər Peyğəmbər əleyhissəlama cürbəcür vədlər verməklə onu öz atalarının dininə dəvət edirdilər. O isə kafirlərin bu vədini Allahın köməyi ilə həmişə rədd edirdi).

87. (Ya Rəsulum!) Allahın ayələri sənə nazil edildikdən sonra ehtiyatlı ol ki, (kafirlər) səni (onları təbliğ etməkdən) çəkindirə bilməsinlər. (İnsanları) Rəbbinə (ibadətə) dəvət et və əsla müşriklərdən olma!

88. Və Allahla yanaşı başqa heç bir tanrıya ibadət etmə. Allahdan başqa heç bir tanrı yoxdur. Allahdan başqa hər şey məhvə məhkumdur. Hökm Onundur. Siz (qiyamət günü) məhz Onun hüzuruna qaytarılacaqsınız! (Peyğəmbər əleyhissəlam üçün icrası əsla mümkün olmayan bu şeyləri ona qadağan etmək və tez-tez xatırlatmaq əslində müşriklərin və kafirlərin əllərini ondan üzmələri və mənasız təkliflərlə onu narahat etməmələri üçündür).

## .29.
## əl-Ənkəbut (Hörümçək) surəsi
**(Məkkədə nazil olmuşdur, 69 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Əlif, Lam, Mim!

2. İnsanlar (möminlər) yalnız: "İman gətirdik!" – deməlerilə onlardan əl çəkilib imtahan olunmayacaqlarınımı sanırlar? (Xeyr, iman gətirmək şəhadət kəlməsini təkcə dillə demək deyildir. Biz onları yeri gəldikcə

malları, övladları və canları ilə sınayacağıq ki, hansının həqiqi, hansının yalançı mömin olduğunu ayırd edib bilək!)

3. Biz onlardan əvvəlkiləri (keçmiş ümmətləri) də imtahana çəkmişdik. Şübhəsiz ki, Allah düz danışanları da (həqiqi iman sahiblərini də), yalançıları da çox gözəl tanıyar!

4. Yoxsa pis əməllər edənlər əzabımızdan sovuşa biləcəklərini güman edirlər? Onlar necə də pis mühakimə yürüdürlər!

5. Hər kəs Allahla qarşılaşacağına (qiyamət günü dirilib Allahın hüzurunda duracağına) ümid edirsə, (ona hazırlaşsın və bilsin ki) Allahın (haqq-hesab üçün) müəyyən etdiyi vaxt mütləq gələcəkdir. Allah (hər şeyi) eşidəndir, biləndir!

6. (Allah yolunda, haqq uğrunda) cihad edən ancaq özü üçün cihad edər (cihadın savabı onun özünə yetişər). Allah aləmlərə (mələklərə, insanlara və cinlərə) əsla möhtac deyildir. (Onların ibadətlərinin Allaha nə bir xeyri, nə də bir zərəri var. Etdiklərin əməllərin savabı da, günahı da yalnız özlərinə aiddir).

7. İman gətirib yaxşı işlər görənlərin (əvvəlki) günahlarının üstünü örtər və onlara (dünyada) etdikləri əməllərdən daha gözəl (on qat artıq) mükafat verərik. (Və ya: gördükləri ən yaxşı əməllərə görə onları mükafatlandırarıq).

8. Biz insana ata-anasına yaxşılıq etməyi (onlarla gözəl davranmağı) tövsiyə etdik. (Ey insan!) Əgər (valideynlərin) bilmədiyin bir şeyi Mənə şərik qoşmağına cəhd göstərsələr, onlara itaət etmə. Hamınız (qiyamət günü) Mənim hüzuruma qayıdacaqsınız. Mən də (dünyada) nə etdiklərinizi sizə bir-bir xəbər verəcəyəm!

9. İman gətirib yaxşı işlər görənləri salehlər zümrəsinə daxil edəcəyik! (Onlar Cənnətin yüksək təbəqələrində sakin olacaqlar!)

10. Adamlar arasında elələri də vardır ki, “Biz Allaha iman gətirdik!” – deyər, Allah yolunda bir əziyyət gördükdə isə insanların (kafirlərin) fitnəsini Allahın əzabı kimi qəbul edərlər. Əgər Rəbbindən (möminlərə) bir zəfər gəlsə, mütləq: “Biz də sizinləyik!” – deyərlər. Məgər Allah məxluqatın (mələklərin, insanların və cinlərin) ürəklərində olanları (imanı, küfrü və nifaqı) bilmirmi?!

11. Şübhəsiz ki, Allah iman gətirənləri də, münafiqləri də çox gözəl tanıyandır!

12. Kafir olanlar iman gətirənlərə dedilər: “Bizim yolumuza (dinimizə) tabe olun. Günahlarınızı öz boynumuza götürərik”. Halbuki onların (iman gətirənlərin) heç bir günahını öz boyunlarına götürməzlər. Onlar, həqiqətən, yalançıdırlar!

13. Şübhəsiz ki, onlar həm öz günahlarına, həm də öz günahları ilə yanaşı, daha neçə-neçə günahlarla (yoldan çıxartdıqları kimsələrin günahlarına) yüklənəcəklər. Qiyamət günü onlar uydurduqları yalanlara görə mütləq sorğu-sual olunacaqlar!

14. Biz Nuhu öz tayfasına (peyğəmbər) göndərdik. Nuh onların arasında min ildən əlli əskik (doqquz yüz əlli il) qaldı. Onlar zülm edərkən tufan onları yaxaladı.

15. Biz onu (Nuhu) və onunla birlikdə gəmidə olanları (tufan bəlasından) qurtardıq və bunu (bu hadisəni) aləmlərə (insanlara, sonrakı nəsillərə) bir ibrət etdik.

16. (Ya Rəsulum!) İbrahimi də (yad et)! Bir zaman o öz tayfasına belə demişdi: “Allaha ibadət edin və Ondan qorxun. Heç bilirsiniz bu sizin üçün nə qədər xeyirlidir?!

17. Siz Allahı qoyub ancaq bütlərə ibadət edir, (onlara tanrı deməklə) yalan uydurursunuz. Sizin Allahdan başqa ibadət etdikləriniz sizə ruzi verməyə qadir deyillər. Ruzini Allahdan diləyin.

Ona tapının, Ona şükür edin. Siz (qiyamət günü) Onun hüzuruna qaytarılacaqsınız!”

18. (Ey Məkkə əhli!) Əgər (məni) təkzib etsəniz, (bilin ki) sizdən əvvəlki ümmətlər də (öz peyğəmbərlərini) təkzib etmişdilər. Peyğəmbərin vəzifəsi ancaq (dini, Allahın hökmlərini, risalətini) açıq-aşkar təbliğ etməkdir!

19. Məgər onlar (kafirlər) Allahın məxluqatı əvvəlcə (yoxdan) necə yaratdığını, sonra da onu (qiyamət günü) yenidən dirildəcəyini bilmirlərmi? Həqiqətən, bu, Allah üçün asandır! (Allah insanı əvvəlcə nütfədən, sonra laxtalanmış qandan, daha sonra bir parça ətdən yaradır. İnsan anadan olandan sonra ömrünün uşaqlıq, yeniyetməlik, yetkinlik, ahıllıq, qocalıq çağlarını yaşayır və nəhayət, ölür. Allah bütün məxluqatı yoxdan yaratdığı kimi, qiyamət günü onları yenidən dirildəcəkdir!)

20. (Ya Rəsulum!) De: “Yer üzünü gəzib (Allahın) məxluqatı (ilk əvvəldən) nə cür yaratdığına baxın. Sonra da Allah axirət həyatını yaradacaqdır. (Birinci yaradılışdan sonra ikinci yaradılış gələcəkdir). Allah hər şeyə qadirdir!

21. (Allah) istədiyinə əzab verər, istədiyini də bağışlayar. Siz (qiyamət günü) məhz Onun hüzuruna qaytarılacaqsınız!

22. Siz nə yerdə, nə də göydə (Allahı) aciz buraxa bilməzsiniz! (Yerdə də olsanız, göyə də çıxsanız Allahın əzabından qaçıb canınızı qurtara bilməzsiniz!) Allahdan başqa sizin nə bir haminiz, nə də bir mədədkarınız var!”

23. Allahın ayələrini və Onunla qarşılaşacaqlarını (qiyamət günü dirilib haqq-hesab üçün hüzurunda duracaqlarını) inkar edənlər Mənim mərhəmətimdən ümidlərini üzənlərdir. Onları ağrılı-acılı bir əzab gözləyir.

24. Tayfasının (İbrahimin sözlərinə) cavabı: “Onu öldürün, yaxud da yandırın!” – deməkdən başqa bir şey olmadı. Amma Allah onu oddan xilas etdi. Həqiqətən, bunda iman gətirən bir tayfa üçün ibrətlər vardır!

25. (İbrahim onlara) dedi: “Sizin Allahı qoyub bütləri tanrı qəbul etməyiniz yalnız dünyada (dolanıb keçinmək xatirinə) aranızda olan dostluğa (məhəbbətə) görədir. Sonra da qiyamət günü bir-birinizi inkar edəcək, bir-birinizə lənət oxuyacaqsınız. Məskəniniz cəhənnəm odu olacaq, özünüzə də (Allahın əzabından qurtarmağa) kömək edən kimsələr tapılmayacaqdır!”

26. Bunda sonra Lut (hamıdan əvvəl İbrahimə) iman gətirdi (onun peyğəmbərliyini təsdiq etdi). (İbrahim) dedi: “Mən (qövmümü tərk edib) Rəbbimin əmr etdiyi yerə (Kufənin Kusa kəndindən Hərrana, oradan da Fələstinə) hicrət edəcəyəm. Həqiqətən, yenilməz qüvvət sahibi, hikmət sahibi Odur!”

27. Biz ona (İbrahimə) İshaqı və Yəqubu bəxş etdik, peyğəmbərliyi və kitabı onun nəslinə əta etdik, dünyada onun mükafatını verdik. O, axirətdə də mütləq (yüksək dərəcələrə layiq) salehlərdən olacaqdır!

28. (Ya Rəsulum!) Lutu da (yad et)! Bir zaman o öz qövmünə demişdi: “Doğrudanmı siz özünüzdən əvvəl aləmlərdən (bəşər əhlindən, ins və cindən) heç kəsin etmədiyi iyrənc bir işi görürsünüz?

29. Həqiqətən siz (şəhvətlə) kişilərə yaxınlaşır, (müsafirlərin namusuna toxunmaq, mallarını əllərindən almaq üçün) yol kəsir və məclislərinizdə (bir-birinizlə) çirkin iş görürsünüz?” Tayfasının (Lutun sözlərinə) cavabı ancaq: “Əgər doğru danışanlardansansa, bizə Allahın əzabını gətir!” – deməkdən ibarət oldu.

30. (Lut:) “Ey Rəbbim! Fitnə-fəsad törədən qövmə qarşı mənə yardım et!” – dedi.

31. Elçilərimiz (mələklər) İbrahimə (İshaqın, sonra da Yəqubun doğulacağı barədə) müjdə gətirdikləri zaman: “Biz bu məmləkət əhlini məhv edəcəyik, çünki onlar zalımdırlar (Allaha asi olmaqla, onun peyğəmbərini təkzib etməklə, çirkin işlər görməklə özləri-özlərinə zülm edirlər)”, dedilər.

32. (İbrahim) dedi: “Orada (onların içində Allahın mömin bəndəsi) Lut da var!” Onlar: “Biz orada kimin olduğunu (hamıdan) yaxşı bilirik. Biz onu və ailəsini mütləq xilas edəcəyik. Yalnız övrətindən başqa. O (əzab içində) qalanlardan olacaq!” – deyə cavab verdilər.

33. Elçilərimiz Lutun yanına gəldikdə (Lut) onlara görə kədərləndi və ürəyi qısıldı. (Mələklər Lutun yanına cavan, qəşəng oğlanlar qiyafəsində gəldikləri üçün o öz tayfasının onlara pislik yetirəcəyindən qorxub məyus oldu). Onlar dedilər: “Qorxma və kədərlənmə. Biz səni və ailəni xilas edəcəyik. Yalnız övrətindən başqa. O (əzab içində) qalanlardan olacaq!

34. Biz etdikləri pozğunluğa (günahlara) görə bu məmləkət əhlinin başı üstünə göydən bir əzab endirəcəyik!”

35. Həqiqətən, Biz dərindən düşünən bir qövm üçün (baxıb ibrət alsınlar deyə) o məmləkətdən açıq-aydın bir nişanə (xarabalıq) qoyduq.

36. Mədyənə də qardaşları Şüeybi (peyğəmbər göndərdik). O dedi: “Ey qövmüm! Allaha ibadət edin! Qiyamət gününə inanın! (Dünyada ibadət etməklə qiyamət gününə ümid bəsləyib savab işlər görün. Onun əzabından qorxun!) Yer üzündə fitnə-fəsad törətməyin!”

37. Amma (mədyənlilər) onu təkzib etdilər. Buna görə də onları (dəhşətli) bir sarsıntı (zəlzələ) bürüdü. Onlar dizüstə çöküb evlərində qaldılar (hamısı həlak oldu).

38. Biz Adı və Səmudu da məhv etdik. (Ey Məkkə əhli! Onların başlarına nələr gətirdiyimiz xaraba qalmış) məskənlərindən sizə bəllidir. Şeytan (çirkin) əməllərini onlara gözəl göstərib gözləri görə-görə onları haqq yoldan çıxartdı.

39. Biz Qarunu da, Fironu da, Hamanı da (məhv etdik). Musa onların yanına açıq-aydın dəlillərlə gəldi. Lakin onlar yer üzündə (Misirdə) təkəbbürlük etdilər və (buna görə də əzabımızdan) sovuşa bilmədilər!

40. Biz onların hər birini öz günahı ilə yaxaladıq (hərəyə öz günahına görə cəza verdik). Kiminin başı üstünə (qasırğa ilə) qızmar daş yağdırdıq, kimini dəhşətli (tükürpədici) səs yaxaladı, kimini yerə gömdük, kimini də suya qərq etdik. Allah onlara zülm etmirdi, onlar özləri özlərinə zülm edirdilər.

41. Allahdan başqa özlərinə dost (hami) qəbul edənlər özünə yuva qurmuş hörümçəyə bənzəyirlər. Evlərin ən zəifi isə, şübhəsiz ki, hörümçək yuvasıdır. Kaş biləydilər! (Hörümçək toru möhkəm olmayıb adicə bir yel nəticəsində dağıldığı kimi, onların bu dostlarının da heç bir etibarı yoxdur. Bərk ayaqda onları qoyub qaçarlar).

42. Şübhəsiz ki, Allah onların Allahı qoyub nəyə ibadət etdiklərini bilir. O, yenilməz qüvvət sahibi, hikmət sahibidir!

43. Biz bu məsəlləri insanlar üçün çəkirik. Onları yalnız (haqqı) bilənlər anlayarlar.

44. Allah göyləri və yeri haqq olara (lazımınca) yaratmışdır. Həqiqətən, bunda (bu yaradılışda) möminlər üçün bir ibrət vardır!

45. (Ya Rəsulum!) Quranda sənə vəhy olunanı oxu və (vaxtı-vaxtında) namaz qıl. Həqiqətən, namaz (insanı) çirkin və pis əməllərdən çəkindirər. Allahı zikr etmək (Allahın cəlalını və

əzəmətini həmişə, hər yerdə yada salmaq), şübhəsiz ki, (savab etibarilə bütün başqa ibadətlərdən) daha böyükdür. Allah nə etdiklərinizi (bütün yaxşı və pis əməllərinizi) bilir!

46. Kitab əhlinin zülm edənləri (cizyə verməyənləri, sizinlə vuruşmaq istəyənləri) istisna olmaqla, onlarla ən gözəl tərzdə mücadilə edin! (Onlarla xoş rəftar edib ürəklərini ələ alın və özünüzdən incitməyin. Onların kobudluğuna nəzakətlə, qəzəblərinə soyuqqanlıqla cavab verin. Nalayiq işlər gördükdə nəsihət edib düz yola çağırın. Yox, əgər üstünüzə silah qaldırsalar, siz də silahlanıb onlarla vuruşun və onları təslim olmağa, cizyə verməyə məcbur edin!) Və (onlarla söhbət etdikdə) belə deyin: “Biz həm özümüzə nazil olana (Qurana), həm də sizə nazil olana (Tövrata və İncilə) inanırıq. Bizim də Allahımız, sizin də Allahınız birdir. Biz yalnız ona təslim olanlarıq!”

47. (Səndən əvvəlki peyğəmbərlərə necə kitab nazil etmişdiksə) Quranı da sənə belə nazil etdik. (Abdullah ibn Salam kimi) kitab (Tövrat) verdiyimiz şəxslər ona (Qurana) inanırlar. Bunlardan (Məkkə camaatından) da inananlar var. Bizim ayələrimizi yalnız kafirlər inkar edərlər!

48. (Ya Rəsulum!) Sən bundan (bu Qurandan) əvvəl nə bir kitab oxumusan, nə də onu əlinlə yazmısan. Əgər belə olsaydı, onda batilə uyanlar (onun barəsində) şəkk-şübhəyə düşərdilər (Onu hardansa oxuyub öyrənmişdir, deyərdilər).

49. Xeyr, bu (Quran) elm verilmiş kəslərin sinələrində (əzbər) olan açıq-aydın ayələrdir. (Və ya: sənin yazıb oxumaqla məşğul olmadığını kitab əhlindən olan elm sahibləri öz ürəklərində açıq-aşkar bilirlər). Bizin ayələrimizi yalnız zalımlar (kafirlər) inkar edərlər.

50. (Müşriklər: ) “Bəs nə üçün Rəbbindən ona (başqa peyğəmbərlər kimi) möcüzə nazil olmadı?” – dedilər. (Ya Rəsulum!) De: “Möcüzələr ancaq Allahın əlindədir. Mən isə sadəcə olaraq (insanları Allahın əzabı ilə) açıq-aşkar qorxudan bir peyğəmbərəm!”

51. Məgər (müşriklər) oxunmaqda olan Kitabı sənə nazil etməyimiz onlara kifayət etmədimi? Həqiqətən, bunda iman gətirən bir tayfa üçün həm mərhəmət, həm də öyüd-nəsihət (ibrət) vardır!

52. De: “Mənimlə sizin aranızda Allahın şahid olması kifayət edər. O, göylərdə və yerdə nə olduğunu bilir. Batilə inanıb Allahı inkar edənlər, şübhəsiz ki, ziyana uğrayanlardır!”

53. (Müşriklər istehza ilə) səni tələsdirib əzabın tez gəlməsini istəyirlər. Əgər (bunun üçün) əvvəlcədən müəyyən edilmiş bir vaxt olmasaydı, sözsüz ki, əzab onlara gələrdi. Şübhəsiz ki, (əzab) onlara qəflətən, özləri də hiss etmədən gələcəkdir.

54. Onlar səndən əzabın tez gəlməsini istəyirlər. Həqiqətən, Cəhənnəm kafirləri qapayacaqdır!

55. O gün əzab onları başlarının üstündən, ayaqlarının altından saracaqdır. (Allah) onlara: “Etdiyiniz əməllərin cəzasını dadın!” – deyə buyuracaqdır.

56. Ey iman gətirən bəndələrim! (Əgər hər hansı bir yerdə islamiyyətə görə sizi incidib əziyyət verirlərsə, orada sizi ölüm təhlükəsi gözləyirsə, yaxud dini vəzifələrinizi lazımınca yerinə yetirə bilmirsinizsə, başqa şəhərlərə və ölkələrə hicrət edə bilərsiniz. Mən oralarda da sizə ruzi verərəm). Şübhəsiz ki, Mənim yerim genişdir. Buna görə də yalnız Mənə ibadət edin!

57. Hər bir kəs (hər bir canlı) ölümü dadacaqdır. Sonra da (qiyamət günü) hüzurumuza qaytarılacaqsınız!

58. İman gətirib yaxşı işlər görənləri (ağacları) altından çaylar axan cənnət guşələrində (Cənnətin yüksək məqamlarında) sakin edəcəyik. Onlar orada əbədi qalacaqlar. (Yaxşı əməllər) edənlərin mükafatı necə də gözəldir!

59. O kəslər ki, səbr edər və yalnız Rəbbinə bel bağlayarlar!

60. (Yer üzündə zəiflikləri ucbatından) ruzisini daşıya (əldə edə) bilməyən neçə-neçə canlılar vardır. Onların da, sizin də ruzinizi Allah verir. O, (hər şeyi) eşidəndir, biləndir. (Sizə gininizə görə bir məşəqqət üz verdiyi zaman məişət çətinliklərindən qorxub başqa ölkələrə hicrət etməkdən çəkinməyin. Allah orada da ruzinizi verəcəkdir. O sizi heç vaxt darda qoymaz!)

61. (Ya Rəsulum!) Həqiqətən, əgər (Məkkə müşriklərindən): “Göyləri və yeri kim yaratmış, günəşi və ayı kim ram (öz əmrinə, insanların mənafeyinə kim tabe) etmişdir?” – deyə soruşsan, onlar mütləq: “Allah!” – deyə cavab verəcəklər. Elə isə onlar (tövhiddən, yalnız Allaha ibadət etməkdən) niyə döndərilirlər?

62. Allah Öz bəndələrindən istədiyinin ruzisini artırar da, azaldar da. Allah hər şeyi (yerli-yerində) biləndir!

63. Həqiqətən, əgər sən (Məkkə müşriklərindən): “Göydən yağmur endirib quruduqdan sonra onunla yerə təzədən can verən kimdir?” – deyə soruşsan, onlar mütləq: “Allahdır!” – deyə cavab verəcəklər. De: “Həmd olsun Allaha!” Lakin onların əksəriyyəti dərindən düşünməz! (Müşriklərin xeyirlərilə zərərlərini bir-birindən ayırmağa ağlı çatmır. Onlar cəhalətləri üzündən belə güman edirlər ki, bütlər onları haqq olan Allaha yaxınlaşdırır).

64. Bu dünya həyatı oyun-oyuncaqdan, əyləncədən başqa bir şey deyildir. Axirət yurdu isə, şübhəsiz ki, əbədi həyatdır. Kaş biləydilər! (Əgər bilsəydilər, axirəti dünyaya dəyişməzdilər).

65. (Müşriklər) gəmiyə mindikləri zaman (dəryada batacaqlarından qorxub) dini (ibadəti) yalnız Ona məxsus edərək (ixlasla) Allaha dua edərlər. Allah onları sağ-salamat quruya çıxaran kimi, yenə də (Ona) şərik qoşarlar.

66. Onlara verdiyimiz neməti inkar etsinlər və (dünyada istədikləri kimi) kef çəkib zövq alsınlar deyə (rüsxət verərik). Onlar (öz əməllərinin ağır nəticəsini) mütləq biləcəklər!

67. Məgər (müşriklər) ətraflarındakı (başqa şəhərlərdəki) adamlar qamarlanıb götürüldüyü (əsir alındığı, öldürüldüyü, qarət edildiyi) halda, (içərisində yaşadıqları Məkkəni) onlar üçün müqəddəs, qorxusuz-xətərsiz bir yer etdiyimizi görmürlərmi? İndi batiləmi inanırlar? Allahın nemətinimi danırlar?

68. Allaha qarşı yalan uydurub düzəldən (Allaha şərik qoşan), özünə haqq (Quran və peyğəmbər) gəldikdə onu təkzib edən kəsdən daha zalım kim ola bilər?! Məgər kafirlər üçün Cəhənnəmdə yer yoxdur? (Əlbəttə, vardır! Niyə bunu dərk etmirlər?)

69. Bizim uğrumuzda cihad edənləri öz yollarımıza (Bizə tərəf gətirib çıxardan behişt yollarına) qovuşduracağıq. Şübhəsiz ki, Allah yaxşı əməllər edənlərlədir! (Allah həmişə savab işlər görüb cihad edən möminlərin tərəfində durar!)

## .30.
## ər-Rum (Rumlular) surəsi
**(Məkkədə nazil olmuşdur, 60 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Əlif, Lam, Mim!

2. Rumlular (bizanslılar iranlılara) məğlub oldular.

3. (Ərəbistana) ən yaxın bir yerdə (Şamda və ya Urdunda). Lakin onlar (bu) məğlubiyyətlərindən sonra qalib gələcəklər.

4. Bir neçə ilin içində (üç illə doqquz, yaxud on il arasında). Əvvəl də, sonra da hökm Allahındır. O gün möminlər sevinəcəklər;

5. Allahın köməyi ilə. (Allah) istədiyinə kömək edər. O, yenilməz qüvvət sahibi, mərhəmət sahibidir!

6. (Bu zəfəri Kitab əhlinə) Allah vəd etdi. Allah Öz vədinə xilaf çıxmaz. Lakin insanların çoxu (müşriklər bunu) bilməzlər!

7. Onlar dünya həyatının zahirini (ticarət və əkinçilik işlərini, məişət məsələlərini) bilirlər, axirətdən isə xəbərsizdirlər.

8. Məgər onlar öz-özlüklərində Allahın göyləri, yeri və onların arasındakıları ancaq haqq-ədalətlə və müəyyən bir müddət üçün yaratdığını düşünmürlərmi? Həqiqətən, insanların çoxu Rəbbi ilə qarşılaşacağını (qiyamət günü dirilib haqq-hesab üçün Allahın hüzurunda duracağını) inkar edir.

9. Məgər onlar yer üzünü gəzib özlərindən əvvəlkilərin aqibətinin necə olduğunu görmürlərmi? Onlar (Ad, Səmud tayfaları) bunlardan daha qüvvətli idilər. Onlar (əkinçilik məqsədilə) torpağı qazıb altını üstünə çevirmiş və yer üzünü bunlardan daha çox abad etmişdilər. Peyğəmbərləri onlara açıq-aşkar möcüzələr gətirmişdilər. Allah onlara zülm etmirdi, onlar özləri özlərinə zülm edirdilər.

10. Sonra da Allahın ayələrini yalan hesab edib onları məsxərəyə qoymaqla pislik edənlərin aqibəti lap pis oldu!

11. Allah məxluqatı əvvəlcə (yoxdan) yaradır, (öləndən) sonra yenidən dirildir. Sonra da siz (qiyamət günü) Onun hüzuruna qaytarılacaqsınız.

12. Qiyamət qopacağı gün günahkarlar mat-məəttəl qalacaqlar. (Özlərini təmizə çıxarmaq üçün heç bir dəlil, sübut gətirə bilməyəcəklər).

13. (Allaha qoşduqları) şəriklərindən onlar üçün şəfaət edəcək kimsələr olmayacaq. Onlar öz şəriklərini inkar edəcəklər.

14. Qiyamət qopacağı gün – məhz o gün (möminlərlə kafirlər bir-birindən) ayrılacaqlar.

15. İman gətirib yaxşı işlər görənlər cənnət bağçalarının birində sevinc içində qalacaqlar.

16. Kafir olub ayələrimizi və axirətə qovuşacaqlarını (qiyamət günü dirilib haqq-hesab üçün hüzurumuzda duracaqlarını) inkar edənlər isə əzab verilmək üçün hazırlanacaqlar (gətiriləcəklər).

17. Elə isə axşam-səhər (axşama yetişəndə, səhərə çıxanda) Allahı təqdis edib şəninə tәriflər deyin! (Axşam, gecə və sübh namazlarını qılın!)

18. Göylərdə və yerdə həmd (şükür və tərif) yalnız Ona məxsusdur. Gün batanda da (günün sonuna yetişəndə də), gündüz də Onu təqdis edib şəninə təriflər deyin! (İkindi və günorta namazlarını qılın!)

19. (Allah) ölüdən diri, diridən də ölü çıxardır, öləndən sonra torpağı dirildir. Siz də (qiyamət günü dirildilib qəbirlərinizdən) belə çıxardılacaqsınız.

20. Sizi (atanız Adəmi) torpaqdan yaratması, sonra da sizin (hərənizin) bir insan olub yer üzünə yayılmağınız Onun qüdrət əlamətlərindəndir.

21. Sizin üçün onlarla ünsiyyət edəsiniz deyə, öz cinsinizdən zövcələr xəlq etməsi, aranızda (dostluq) sevgi və mərhəmət yaratması

da Onun qüdrət əlamətlərindəndir. Həqiqətən, bunda (bu yaradılışda) düşünən bir qövm üçün ibrətlər vardır!

22. Göylərin və yerin yaradılışı, dillərinizin və rənglərinizin müxtəlifliyi də Onun qüdrət əlamətlərindəndir. Şübhəsiz ki, bunda bilənlər (ağıl və elm sahibləri) üçün (Allahın vəhdaniyyətinə, Onun hər şeyə qadir olmasına dəlalət edən) nişanələr vardır!

23. Gecə və gündüz yatıb dincəlməyiniz (gecə istirahət etməyiniz, gündüz əlləşib çalışmağınız), nemətindən ruzi (qismətinizi) axtarmanız da Onun qüdrət əlamətlərindəndir. Həqiqətən, (öyüd-nəsihət) eşidənlər üçün bunda ibrətlər vardır!

24. Sizə həm qorxu, həm də ümid verən (sizi vurmasından qorxduğunuz, dalınca isə yağış yağmasına ümid bəslədiyiniz) ildırımı göstərməsi, göydən yağmur endirib öləndən sonra (onunla) torpağı diriltməsi də Onun qüdrət əlamətlərindəndir. Şübhəsiz ki, bunda ağılla düşünən bir qövm üçün ibrətlər vardır.

25. Göyün və yerin Onun əmrində durması, sonra sizi bircə dəfə (İsrafilin suru bir dəfə üfürməsi ilə) çağıran kimi dərhal yerdən (qəbirlərinizdən dirilib) çıxmağınız da Onun qüdrət əlamətlərindəndir.

26. Göylərdə və yerdə kim (nə) varsa, Onundur. (Mələklər, cinlər və insanlar Allahın bəndələridir). Hamısı Ona boyun əyər!

27. Məxluqatı əvvəlcə yoxdan var edən, sonra da (qiyamət günü) yenidən diriləcək Odur. Bu (iş) Onun üçün çox asandır. Göylərdə və yerdə olan ən yüksək sifət (Allahdan başqa heç bir tanrı olmaması, vəhdaniyyət sifəti) yalnız Ona məxsusdur. O, yenilməz qüvvət sahibi, hikmət sahibidir! (Allahın sifətləri nə göydəkilərin, nə də yerdəkilərin sifətlərinə bənzəyər. Allah onların hamısından ucadır).

28. (Allah) sizə özünüzdən bir məsəl çəkər. Sahib olduğunuz kölələr içərisində sizə verdiyimiz mal-dövlətə sizinlə bərabər ortaq olan, özünüzdən (özünüz kimi azad adamların haqqına toxunmaqdan) çəkindiyiniz kimi, o kölələrdən də çəkindiyiniz şərikləriniz varmı? (Siz buna razı olarsınızmı? Əlbəttə, yox! Elə isə bəs Allaha Öz aciz bəndələrini, bütləri şərik qoşmağa necə razı olursunuz?) Biz ayələri ağılla düşünən bir qövm üçün belə ətraflı izah edirik.

29. Lakin (özlərinə) zülm edənlər (kafirlər) nadanlıqla nəfslərinin istəklərinə uydular. Allahın (küfr edəcəklərini əzəldən bildiyi üçün) yoldan çıxartdıqlarını doğru yola (islam dininə) kim sala bilər? Onlara kömək edə bilən kəslər də olmaz!

30. (Ya Rəsulum! Ümmətinlə birlikdə) batildən haqqa tapınaraq (pak bir müvəhhid, xalis təkallahlı kimi) üzünü Allahın fitri olaraq insanlara verdiyi dinə (islama) tərəf tut. Allahın dinini (Onun yaratdığı tövhid dini olan islamı) heç vəchlə dəyişdirmək olmaz. Doğru din budur, lakin insanların əksəriyyəti (haqq dininin islam olduğunu) bilməz. (Allah bütün insanları xilqətcə müsəlman – təkallahlı yaratmışdır, lakin ata-anaları onları başqa dinlərə sövq etmiş, yaxud onlar yaşa dolduqda öz nadanlıqları üzündən batil dinlərə - bütpərəstliyə uymuşlar).

31. (Ya Rəsulum! Sən və ümmətin) tövbə edərək Ona tərəf dönün. Ondan (Allahın əzabından) qorxun, namaz qılın və müşriklərdən olmayın!

32. O kəslərdən ki, öz dinini parçalayıb firqə-firqə oldular (bəzisi bütlərə, bəzisi günəşə və aya, bəzisi ulduzlara səcdə etməyə başladılar). Hər bir firqə öz dininə (öz dininin haqq olduğuna) sevinər.

33. İnsanlara bir ziyan toxunduğu zaman Rəbbinə tərəf dönüb Ona tövbə edərlər. Sonra (Allah) Öz mərhəmətindən onlara daddıran

(onları möhnətdən qurtaran) kimi içərilərindən bir qismi Rəbbinə şərik qoşar.

34. Bizim onlara verdiyimiz nemətləri inkar etsinlər deyə (şirkə, küfrə düşərlər). İndi (bir az dünyada) əylənib kefə baxın. (Cəhənnəm əzabının necə şiddətli olduğunu) mütləq biləcəksiniz!

35. Yoxsa Biz (müşriklərə Allaha) şərik qoşmaqlarını söyləyən (təsdiq edən) bir dəlil (kitab) göndərdik?!

36. İnsanlara bir mərhəmət (firavan həyat, sağlamlıq, cah-calal) daddırdığımız zaman ona sevinərlər. Onları öz əlləri ilə etdikləri əməllərə (qazandıqları günahlara) görə bir müsibətə düçar etdikdə isə dərhal məyus olarlar (hər şeydən ümidlərini üzərlər).

37. Məgər onlar Allahın istədiyi kimsənin ruzisini bol etdiyini və (istədiyininkini də) azaltdığını görmürlərmi?! Həqiqətən, bunda iman gətirən bir tayfa üçün ibrətlər vardır!

38. (Ya Rəsulum!) Yaxın qohuma, yoxsula (miskinə), (pulu qurtarıb yolda qalan) müsafirə (Allahın vacib buyurduğu) haqqını ver. Allah rizasını (Allahın camalını) diləyənlər üçün bu daha xeyirlidir. (Axirətdə) nicat tapanlar (mətləbinə yetişənlər) məhz onlardır!

39. (Sərvətinizin) xalqın mal-dövləti hesabına artması üçün sələmlə (faizlə) verdiyiniz malın Allah yanında heç bir bərəkəti (artımı) olmaz. Allah rizasını diləyərək verdiyiniz sədəqə (zəkat) isə belə deyildir. Bunu edənlər (dünyada mallarının bərəkətini, axirətdə isə öz mükafatlarını) qat-qat artıranlardır!

40. Sizi (yoxdan) yaradan, sonra sizə ruzi verən, sizi öldürən və daha sonra (qiyamət günü) dirildəcək məhz Allahdır. Şərikləriniz içərisində bunlardan heç olmasa birini edə biləni varmı? (Allah) pakdır, müqəddəsdir. (Allah müşriklərin) Ona şərik qoşduqlarından (bütlərdən) ucadır!

41. İnsanların öz əlləri ilə etdikləri (pis əməllər, günahlar) üzündən quruda və suda fəsad (pozuntu) əmələ gələr (bəzi yerlərdə quraqlıq, qıtlıq olar, bəzilərində zərərli yağışlar yağar, zəlzələ baş verər, dənizlərdə gəmilər batar) ki, Allah (bununla) onlara etdiklərinin bir qismini (etdikləri bəzi günahların cəzasını) daddırsın və bəlkə, onlar (tövbə edib pis yoldan) qayıtsınlar.

42. (Ya Rəsulum! Məkkə əhlinə) de: “Yer üzünü gəzib-dolaşın və (sizdən) əvvəlkilərin axırının necə olduğuna baxın. Onların əksəriyyəti müşrik idi.

43. (Ya Rəsulum!) Allah tərəfindən qarşısıalınmaz gün (qiyamət günü) gəlməmişdən əvvəl üzünü düzgün dinə (islama doğru) çevir. O gün insanlar (haqq-hesab çəkildikdən sonra) bölük-bölük (iki dəstə) olarlar. (Möminlər Cənnətə, günahkarlar isə Cəhənnəmə gedərlər).

44. Küfr edənin küfrü öz əleyhinə olar (qazandığı günaha görə Cəhənnəmə atılar). Yaxşı iş görənlər isə özləri üçün (Cənnətdə) rahat mənzillər hazırlamış olarlar ki,

45. (Allah) iman gətirib saleh əməl edənlərə Öz lütfündən (Öz kərəmindən) mükafat versin. Şübhəsiz ki, (Allah) kafirləri sevməz!

46. Həqiqətən, külələri müjdəçi olaraq göndərməsi, sizə Öz mərhəmətindən daddırması (yağış verməsi), əmri ilə gəmilərin üzməsi, nemətindən ruzi axtarmanız Onun qüdrət əlamətlərindəndir. Bəlkə, (Allahın nemətlərinə) şükür edəsiniz!

47. (Ya Rəsulum!) Biz səndən əvvəl də onların tayfalarına (neçə-neçə) peyğəmbərlər göndərmişdik. (Peyğəmbərlər) onlara açıq-aşkar möcüzələr gətirmişdilər. Biz (peyğəmbərləri təkzib edən) günahkarlardan intiqam aldıq. Möminlərə kömək etmək Bizə vacibdir! (Biz Öz vədimizə əməl edərək möminlərə yardım etməliyik!)

48. Buludları hərəkətə gətirən küləkləri göndərib onları göy üzündə istədiyi kimi yayan və topa-topa edən Allahdır. Artıq buludların arasından yağış çıxdığını görürsən. Onu (yağışı) bəndələrindən istədiyinə verən kimi onlar sevinərlər.

49. Hərçənd ki üstlərinə (yağış) endirilməzdən (yağış yağmamışdan) əvvəl (ondan) ümidlərini üzmüşdülər.

50. (Ya Rəsulum!) Sən Allahın rəhmətinin (yağışının) əsər-əlamətinə bax ki, torpağı öldükdən sonra necə dirildir. Doğrudan da, O, ölüləri dirildəndir. O (Allah) hər şeyə qadirdir!

51. Əgər Biz (onların əkinlərinin üstünə) bir yel əsdirsək və (o yel nəticəsində əkinlərin) saralıb-solduğunu görsələr, bundan sonra mütləq nankor olmağa başlayarlar.

52. Şübhəsiz ki, sən (haqqa) çağırışı nə ölülərə bildirə bilərsən, nə də dönüb gedən karlara eşitdirə bilərsən!

53. Sən korları da düşdükləri əyri yoldan qurtarıb düz yola gətirə bilməzsən. Sən (haqqı) yalnız ayələrimizə inananlara eşitdirə bilərsən. Məhz onlar müsəlmandırlar! (Allaha ürəkdən inanıb Ona can-başla itaət edərlər!)

54. Sizi zəif bir şeydən (nütfədən, bir qətrə sudan) yaradan, gücsüzlükdən (körpəlikdən) sonra qüvvətli (cavan) edən, qüvvətli olduqdan sonra (yenidən) taqətsiz (və qoca) edən Allahdır. O, istədiyini yaradır. O, (hər şeyi) biləndir, (hər şeyə) qadirdir!

55. Qiyamət qopacağı gün (saat) günahkarlar (qəbirlərində və dünyada) bir saatdan artıq qalmadıqlarına and içərlər. Onlar (axirətdə belə yalan danışdıqları kimi, dünyada da batilə uyub haqdan) belə döndərilirdilər (yoldan çıxardılırdılar).

56. Elm və iman sahibləri isə belə deyərlər: “Siz (qəbirlərinizdə) Allahın Kitabında (əzəli elmində yazılmış) olan qiyamət gününə qədər qaldınız. Bu, (hamının dirildiyi) qiyamət günüdür, lakin siz (onun haqq olduğunu) bilmirdiniz!”

57. O gün zalımlara üzrləri heç bir fayda verməz və onların tövbə etmələri (Allah rizasını diləmələri) də istənilməz!

58. Biz bu Quranda insanlar üçün hər cür məsəl çəkdik. (Ya Rəsulum!) Həqiqətən, sən onlara (Musanın yədi-beyzası, əsası kimi) hər hansı bir möcüzə gətirsən belə, onlar mütləq: “Siz (Peyğəmbər və ona iman gətirənlər) yalançısınız!” – deyəcəklər.

59. Allah (haqqı) bilməyənlərin qəlblərini belə möhürləyər!

60. (Ya Rəsulum!) Sən (çətinliklərə, əziyyətlərə) səbr et. Şübhəsiz ki, Allahın (sənə verdiyi zəfər) vədi haqdır. Qoy (axirətə) qəti inanmayanlar səni etinasızlığa sövq etməsinlər. (Səni yüngül hesab edib yerindən oynatmasınlar, səbirsizliyə, səbatsızlığa sövq edərək öz fikrindən və amalından döndərib risaləti təbliğ etməkdən daşındıra bilməsinlər!)

## .31.
## Loğman surəsi
**(Məkkədə nazil olmuşdur, 34 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Əlif, Lam, Mim!

2. Bu hikmətli Kitabın (Quranın) ayələridir.

3. (O Quran) yaxşı əməllər edənlərə bir hidayət (doğru yolu göstərən rəhbər) və rəhmətdir.

4. O kəslər ki, namaz qılar, zəkat verər və axirətə tam yəqinliklə inanarlar.

5. Onlar öz Rəbbi tərəfindən (göstərilmiş) doğru yoldadırlar. Nicat tapanlar da (axirət əzabından qurtarıb savaba yetişənlər də) onlardır!

6. İnsanlar içərisində eləsi də vardır ki, nadanlığı üzündən (tutduğu işin günahını anlamadan xalqı) Allah yolundan (islam dinindən) döndərmək və bu minvalla onu məsxərəyə qoymaq üçün mənasız (oyun-oyuncaq) sözləri satın alarlar. Məhz belələrini alçaldıcı bir əzab gözləyir.

7. Və ayələrimiz ona oxunduğu zaman onları eşitmirmiş, qulaqlarında ağırlıq (karlıq) varmış kimi təkəbbürlə arxasını çevirər. (Ya Rəsulum!) Sən də ona şiddətli bir əzabla (axirətdə cəhənnəm odunda yanacağı ilə) müjdə ver!

8. İman gətirib yaxşı işlər görənləri Nəim cənnətləri gözləyir.

9. Onlar orada əbədi qalacaqlar. Allahın (möminlərə verdiyi cənnət) vədi haqdır. O, yenilməz qüvvət, hikmət sahibidir!

10. Allah gördüyünüz göyləri dirəksiz yaratmış (yaxud O, göyləri görə bildiyiniz bir dirək olmadan xəlq etmiş), sizi yırğalamasın (atıb-tutmasın) deyə, yerdə möhkəm durmuş dağlar bərqərar etmiş və ora (yer üzünə) cürbəcür heyvanlar səpələmişdir. Biz göydən yağış yağdırdıq və (onunla) yerdə növbənöv gözəl (bitkilər, meyvələr) yetişdirdik.

11. Bu (gördükləriniz) Allahın yaratdıqlarıdır. İndi siz də Mənə (Allahdan) başqalarının nə yaratdığını göstərin. Xeyr, zalımlar (müşriklər) açıq-aşkar əyri yoldadırlar (haqq yoldan azmışlar).

12. Həqiqətən, Loğmana: “Allaha şükür et!” (deyə) hikmət verdik. Kim (Allahın nemətlərinə) şükür etsə, özü üçün şükür edər. Kim

nankor olsa, (bilsin ki) Allah onun şükürünə möhtac deyildir, (özlüyündə) şükürə (tərifə) layiqdir! (Onun bütün işləri bəyənilləndir!)

13. (Ya Rəsulum!) Yadında olsun ki, bir zaman Loğman öz oğluna nəsihət edərək belə demişdi: “Oğlum! Allaha şərik qoşma. Doğrudan da, Allaha şərik qoşmaq böyük zülmdür! (Ağır günahdır!)”

14. Biz insana ata-anasına (yaxşılıq etməyi, valideyninə yaxşı baxmağı, onlarla gözəl davranmağı) tövsiyə etdik. Anası onu (bətnində) çox zəif bir halda daşımışdı. (Uşağın süddən) kəsilməsi isə iki il ərzində olur. (Biz insana buyurduq: ) “Mənə və ata-anana şükür et. Axır dönüş Mənədir!

15. Əgər (ata-anan) bilmədiyin bir şeyi Mənə şərik qoşmağına cəhd göstərsələr, (bu işdə) onlara itaət etmə. (Qalan) dünya işlərində onlarla gözəl keçin (onlara itaət et). Tövbə edib Mənə tərəf dönənlərin (islamı qəbul edənlərin) yolunu tut. Sonra (qiyamət günü) Mənim hüzuruma qayıdacaqsınız. Mən də (dünyada) nə etdiklərinizi (bir-bir) sizə xəbər verəcəyəm!”

16. (Loğman öyüd-nəsihətinə davam edərək) dedi: “Oğlum, (dünyada gördüyün hər hansı yaxşı, yaxud pis iş) bir xardal dənəsi ağırlığında olsa da, bir qayanın (daşın) içində, yaxud göylərdə və ya yerin təkində olsa da, Allah onu (qiyamət günü) ortaya gətirər (onun haqq-hesabını çəkər). Həqiqətən, Allah lətifdir (bütün incə, nazik işləri biləndir; lütfkardır), (hər şeydən) xəbərdardır!

17. Oğlum! Namaz qıl, (insanlara) yaxşı işlər görməyi əmr et, pis işləri qadağan elə. (Bu yolda) sənə üz verəcək müsibətlərə döz. Həqiqətən, bu (dediklərim) vacib əməllərdəndir!

18. Adamlardan təkəbbürlə üz çevirmə, yer üzündə lovğa-lovğa gəzib dolanma. Həqiqətən, Allah heç bir özündən razını, lovğalanıb fəxr edəni sevməz!

19. Yerişində müvazinət gözlə (nə çox yeyin, nə də çox asta get) və (danışanda) səsini qaldırma. Çünki ən çirkin səs uzunqulaq səsidir!

20. (Ey İnsanlar!) Məgər Allahın göylərdə və yerdə olanları (günəşi, ayı, ulduzları və buludları; meyvələri, bitkiləri, dənizləri, çayları və gölləri) sizə ram etdiyini (sizin istifadənizə verdiyini), aşkar (görmə, eşitmə, sağlamlıq) və gizli (əql, şüur, fəhm, elm və i. a.) nemətləri sizə bolluca ehsan etdiyini görmürsünüzmü? İnsanlar içərisində eləsi də vardır ki, nə bir elmi, nə bir doğru yol göstərən rəhbəri, nə də bir nurani (ilahi) kitabı olmadan Allah barəsində mübahisə edər.

21. Onlara (Məkkə əhlinə): "Allahın nazil etdiyinə (Qurana) tabe olun!" deyildikdə, onlar: "Xeyr, biz atalarımızın getdiyi yolla (ibadət etdiyi dinə) tabe olacağıq!" – deyə cavab verərlər. Bəs Şeytan onları cəhənnəm odunun əzabına çağırırsa necə? (Yenədəmi həmin yolla gedəcəklər?)

22. Kim yaxşı əməl sahibi olub özünü (səmimi-qəlbdən) Allaha təslim edərsə, o artıq ən möhkəm ipdən (dəstəkdən - Qurandan, imandan) yapışmış olur. Bütün işlərin axırı Allaha gəlib çıxacaqdır! (Buyuruq Allahındır!)

23. Kim küfr etsə, onun küfrü (ya Rəsulum) səni kədərləndirməsin. Onlar Bizim hüzurumuza qayıdacaqlar. Biz də onlara (dünyada) nələr etdiklərini xəbər verəcəyik. Həqiqətən, Allah ürəklərdə olanları biləndir!

24. Biz onlara bir qədər gün-güzəran (bir az dünya malı) verəcək, sonra da (axirətdə) ağır bir əzaba düçar edəcəyik!

25. (Ya Rəsulum!) Həqiqətən, əgər sən (müşriklərdən): “Göyləri və yeri kim yaratmışdır?” – deyə soruşsan, onlar mütləq: “Allah!” – deyə cavab verəcəklər. De: “Həmd olsun Allaha!” Lakin onların əksəriyyəti (həmd-sənanın kimə məxsus olduğunu) bilməz!

26. Göylərdə və yerdə nə varsa, Allahındır. Allah (bəndələrinin, o cümlədən müşriklərin ibadətinə) möhtac deyildir və (özlüyündə hər cür) şükrə (tərifə) layiqdir! (Onun bütün işləri bəyəniləndir!)

27. Əgər yer üzündəki bütün ağaclar qələm, dərya da arxasından yeddi dərya qatılaraq (mürəkkəb) olsaydı, yenə də Allahın sözləri (yazmaqla) tükənməzdi. Həqiqətən, Allah yenilməz qüdrət, hikmət sahibidir!

28. (Ey insanlar!) Sizi (yoxdan) yaratmaq və (qiyamət günü) diriltmək (Allah üçün) ancaq bir nəfəri yaratmaq və diriltmək kimidir. Həqiqətən, Allah (hər şeyi) eşidəndir, görəndir!

29. (Ya Rəsulum!) Məgər Allahın gecəni gündüzə, gündüzü də gecəyə qatdığını (gah gündüzü, gah da gecəni uzatdığını), günəşi və ayı ram (sizin mənafeyinizə tabe) etdiyini görmürsənmi? Onların hər biri (öz hədəqəsində, dairəsində) müəyyən müddətədək (qiyamət gününə qədər) dövr edər. Həqiqətən, Allah nə etdiklərinizdən xəbərdardır!

30. Bu (deyilənlər) ona görədir ki, Allah haqq, (müşriklərin) Ondan qeyri ibadət etdikləri isə batildir. Həqiqətən, Allah (hər şeydən) ucadır, (hər şeydən) böyükdür!

31. (Ya Rəsulum!) Sizə öz qüdrət əlamətlərindən bəzisini göstərsin deyə, gəmilərin dənizdə Allahın lütfü ilə üzdüyünü görmürsənmi? Həqiqətən, bunda (əziyyətlərə) səbr, (Allahın nemətlərinə) çox şükür edən hər kəs üçün ibrətlər vardır!

32. (Kafirləri) ətrafına kölgə salan uca dağlar (yaxud qara buludlar) kimi dalğalar bürüdüyü zaman onlar dini (ibadəti) Allaha məxsus edərək yalnız Ona dua edərlər. Allah onları sağ-salamat quruya çıxartdıqda içərilərindən bəziləri (küfrlə iman arasında) orta mövqe tutar. (Bəziləri isə öz küfründə qalar). Bizim ayələrimizi yalnız çox xain, nankor olanlar danarlar!

33. Ey insanlar! Rəbbinizdən qorxun. Atanın oğula, oğulun da ataya heç bir şeylə kara gələ bilməyəcəyi bir gündən həzər edin. Allahın vədi, şübhəsiz ki, haqdır. (Qiyamət günü mütləq gələcəkdir). Ehtiyatlı olun ki, dünya həyatı sizi aldatmasın. Şeytan sizi Allaha arxayın edib (Allah Öz bəndələrinə mehribandır, onların hamısını bağışlayacaq, günahlarından keçəcək deyə) tovlamasın!

34. Həqiqətən, o saatı (qiyamətin qopacağı vaxtı) ancaq Allah bilir. Yağışı (istədiyi vaxt) göydən O yağdırır, bətnlərdə olanı (doğulacaq uşağın oğlan, yaxud qız, xəstə və ya sağlam, xoşbəxt və ya bədbəxt, yaxşı və ya pis əməl sahibi olacağını) O bilir. Heç kəs səhər nə kəsb edəcəyini (savab, yaxud günah qazanacağını), heç kəs harada öləcəyini bilməz. Allah isə, şübhəsiz ki, (hər şeyi) biləndir, (hər şeydən) xəbərdardır!

## .32.
## əs-Səcdə (Səcdə) surəsi

**(Məkkədə nazil olmuşdur, 30 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Əlif, Lam, Mim!

2. Kitabın (Quranın) aləmlərin Rəbbi tərəfindən nazil edilməsində heç bir şəkk-şübhə yoxdur!

3. Yoxsa (müşriklər): “(Muhəmməd) onu özündən uydurmuşdur!” – deyirlər. Xeyr, o səndən əvvəl peyğəmbər göndərilməmiş bir qövmü (Allahın əzabı ilə) qorxutmağın üçün Rəbbindən (nazil) olan bir haqdır. Bəlkə, doğru yola yönələlər!

4. Göyləri, yeri və onların arasındakıları altı gündə xəlq edən, sonra ərşi yaradıb hökmü altına alan (ərşdə bərqərar olan) Allahdır. Sizin Ondan başqa heç bir haminiz və şəfaət (əzabı dəf) edəniniz yoxdur. Məgər öyüd-nəsihət qəbul etməyəcəksiniz?

5. O, göydən yerə qədər olan bütün işləri idarə edir. Sonra (həmin işlər) sizin saydığınızın (dünya ilinin) min ilinə bərabər olan bir gündə (qiyamət günündə) Ona doğru (Allahın dərgahına) yüksələr.

6. O, qeybi də, aşkarı da biləndir, yenilməz qüvvət sahibi, mərhəmət sahibidir!

7. O, yaratdığı hər şeyi gözəl yaratdı, insanı (Adəmi) yaratmağa palçıqdan başladı.

8. Sonra onun nəslini nütfədən – bir qətrə zəif (dəyərsiz) sudan əmələ gətirdi.

9. Sonra onu düzəldib insan şəklinə saldı və ona öz ruhundan (özünün yaratdığı ruhdan) üfürdü (həyat verdi). O sizə göz, qulaq və ürək verdi. Siz (bu nemətlərə) az şükür edirsiniz!

10. (Axirətə inanmayanlar) dedilər: “Məgər biz torpağa qarışıb yox olandan sonra yenidənmi yaradılacağıq?” Bəli, onlar Rəbbi ilə qarşılaşacaqlarını (qiyamət günü dirilib haqq-hesab üçün Allahın hüzurunda duracaqlarını) inkar edən kəslərdir!

11. (Ya Rəsulum!) De: “Sizə müvəkkil olan ölüm mələyi (Əzrail) canınızı alacaqdır. Sonra da (qiyamət günü) Rəbbinizin hüzuruna qaytarılacaqsınız!”

12. (Ya Rəsulum!) Kaş günahları öz Rəbbinin hüzurunda (günahlarından utanaraq) başlarını aşağı dikib: “Ey Rəbbimiz! (Dünyada yalan hesab etdiyimiz qiyaməti və onun əzabını) gördük, (peyğəmbərlərin doğru dediklərini, haqq olduqlarını Səndən) eşitdik. İndi bizi (dünyaya) qaytar ki, yaxşı iş görək. Biz (Sənin vəhdaniyyətinə) tam yəqinliklə inandıq!” – deyəndə görəydin!

13. Əgər Biz istəsəydik, hər kəsi doğru yola salardıq (imana müvəffəq edərdik). Lakin Mən: “Cəhənnəmi mütləq bütün (günahkar) cinlər və insanlarla dolduracağam!” sözünü gerçək olaraq demişəm! (Bizim bu hökmümüz labüddür. Bu sözün, bu hökmün doğruluğunu sübut etmək üçün əzəldən günahkar, kafir, yaxud müşrik olacağını bildiyimiz şəxsi doğru yola salmadıq. Çünki həmin şəxs Bizim ona bəxş etdiyimiz ağılla yaxşını pisdən ayırıb doğru yolu özü tutmalı idi. Dində heç bir məcburiyyət yoxdur!)

14. (Kafirlər Cəhənnəmə girdikdə Allah onlara belə buyurar: ) “Bu günə yetişəcəyinizi unutduğunuza görə indi dadın (əzabı)! Biz də sizi unutduq. (Cəhənnəmdə köməksiz buraxdır). Etdiyiniz əməllərin cəzası olaraq dadın əbədi əzabı!”

15. Bizim ayələrimizə ancaq ayələrimizlə öyüd-nəsihət olunduqları zaman səcdəyə qapananlar və təkəbbür göstərməyərək Rəbbini həmd-səna ilə təqdis edənlər iman gətirərlər.

16. Onlar ibadət üçün yataqlarından qalxar (gecələr az yatar), qorxu və ümid içində (Allahın əzabından qorxaraq, mərhəmətinə ümid bəsləyərək) Rəbbinə dua edər və onlara verdiyimiz ruzilərdən (ehtiyacı olanlara) sərf edərlər.

17. Etdikləri əməllərin mükafatı olaraq (Allah dərgahında) onlar (möminlər) üçün göz oxşayan (onları sevindirəcək) nə cür nemətlər gizlənib saxlandığını heç kəs bilməz!

18. Məgər mömin kimsə ilə (Allahın itaətindən çıxmış) fasiq eynidirmi?! Əlbəttə, onlar eyni ola bilməzlər!

19. İman gətirib yaxşı işlər görənləri etdikləri əməllər müqabilində qonaq qalacaqları (sakin olacaqları) Məva cənnətləri gözləyir. (Onlar orada Allahın əbədi qonaqları olacaqlar).

20. Fasiqlərə gəldikdə isə, onların məskəni cəhənnəm odudur. Onlar hər dəfə oddan çıxmaq istədikdə yenə ora qaytarılacaq və onlara: "Dadın yalan hesab etdiyiniz cəhənnəm odunun əzabını!" – deyiləcəkdir.

21. Biz ən böyük əzabdan (axirət əzabından) əvvəl onlara mütləq dünya əzabından daddıracağıq. Bəlkə, (tövbə edib düz yola) qayıdalar!

22. Rəbbinin ayələri ilə öyüd-nəsihət verildikdən sonra onlardan üz döndərən kəsdən daha zalım kim ola bilər?! Biz, şübhəsiz ki, onlardan intiqam alacağıq!

23. Biz Musaya kitab (Tövrat) vermişdik. (Ya Rəsulum!) Sən onunla (Musa ilə) görüşəcəyinə şübhə etmə. (Peyğəmbər əleyhissəlam merac gecəsi Musa ilə görüşüb danışmışdı). Biz onu (Tövratı, yaxud Musanı) İsrail oğullarına doğru yol göstərən bir rəhbər etmişdik.

24. (Çətinliklərə) səbr etdikləri və ayələrimizə ürəkdən inandıqları üçün Biz onlardan (İsrail oğullarından) əmrimizlə (insanlara) haqq yolu göstərən rəhbərlər təyin etmişdik.

25. (Ya Rəsulum!) Həqiqətən, sənin Rəbbin onların (möminlərlə kafirlərin) arasında qiyamət günü ixtilafda olduqları (dini) məsələlər barədə hökm verəcəkdir!

26. Məgər onlar indi yurdlarında gəzib-dolaşdıqları özlərindən əvvəlki neçə-neçə nəsilləri (peyğəmbərlərini yalançı saydıqlarından ötrü) məhv etdiyimizi görmürlərmi? Həqiqətən, bunda (Məkkə müşrikləri üçün) ibrətlər vardır. Məgər (haqqa) qulaq asmayacaqlar?

27. Məgər görmürlərmi ki, Biz quru yerə su göndərib onunla heyvanlarının və özlərinin yedikləri əkinlər (bitkilər, meyvələr) yetişdiririk? Məgər (bütün bunları öz gözləri ilə) görmürlər?

28. Onlar: "Əgər doğru danışanlardansınızsa, (bir xəbər verin görək) bu fəth (Məkkənin fəthi, Bədr vuruşu, yaxud qiyamət günü) nə vaxt olacaqdır? – deyə soruşarlar.

29. (Ya Rəsulum!) De: "Fəth günü kafirlərlə (sonrakı) imanı heç bir fayda verməz və onlara (tövbə etmək üçün) möhlət də verilməz!"

30. (Ya Rəsulum!) Artıq onlardan üz çevir və (Allahın onlara əzab verəcəyi günü) gözlə. Doğrusu, onlar da (sənin ölümünü, başına bir iş gələcəyini və ya sənə qələbə çalacaqlarını) gözləyirlər! (Lakin onlar sənə heç bir şey edə bilməzlər. Sən mütləq zəfər çalacaqsan, çünki Allah səninlədir!)

## .33.
## əl-Əhzab (Dəstələr) surəsi

**(Mədinədə nazil olmuşdur, 73 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Ya Peyğəmbər! Allahdan qorx, kafirlərə və münafiqlərə itaət etmə. Həqiqətən, Allah (hər şeyi) biləndir, hikmət sahibidir!

2. Rəbbindən sənə vəhy olunana (Qurana) tabe ol. Allah, şübhəsiz ki, nə etdiklərinizdən xəbərdardır!

3. Allaha təvəkkül et. Allahın (bütün işlərdə sənə) vəkil olması kifayət edər!

4. Allah bir adamın sinəsində (daxilində) iki ürək yaratmamışdır. (Eləcə də iki Allah ola bilməz). Allah nə zihar etdiyiniz (arxasını ananızın arxasına oxşadaraq yaxınlıq etmədiyiniz, talağını verdiyiniz) zövcələrinizi sizə doğma ana, nə də oğulluğa götürdüklərinizi sizə doğma oğul etmişdir. (Onlar əslində öz atalarının oğullarıdır). Bunlar sizin dediyiniz boş (mənasız) sözlərdir. Allah doğru deyir və (bəndələrini) doğru yola gətirir!

5. Onları (əsil-nəsibləri bilinsin deyə) öz atalarının adları ilə çağırın. Bu, Allah yanında daha düzgündür (daha ədalətlidir). Atalarının kim olduğunu bilməsəniz, onlar sizin din qardaşlarınız və yaxınlarınızdır (əmioğlanlarınız və ya azad kölələrinizdir; onları qardaşım, əmioğlum, dostum deyə çağırın). Etdiyiniz səhvlərə (məsələn, birinin atasını bilmədən səhv saldığınıza) görə sizə günah yoxdur. Lakin (qadağan olunduqdan sonra) qəsdən etdiyiniz işlərdən ötrü günah vardır. Allah (bəndələrini) bağışlayandır, rəhm edəndir!

6. Peyğəmbər möminlərə onların özlərindən daha yaxındır. (Möminlər peyğəmbəri özlərindən çox sevməli, onun hər bir əmrini sözsüz yerinə yetirməlidirlər). Onun övrətləri (möminlərin) analarıdır (heç kəs onlarla evlənə bilməz). Qohumlar (bir-birinə vərəsə olmaq baxımından) Allahın Kitabında möminlərdən və mühacirlərdən daha yaxındırlar. Amma (qohum olmayan) dostlarınıza (vəsiyyətlə) bir yaxşılıq edə (bir irs qoya) bilərsiniz. Bu (hökm) kitabda (lövhi-məhfuzda) yazılmışdır. (İslamın ilk dövrlərində sizə qardaş olanların, birlikdə Mədinəyə hicrət edənlərin bir-birinə vərəsə olmaq ixtiyarı var idi. Sonralar bu hökm ləğv edilib varislər məsələsində üstünlük qohumlara verildi. Qohum olmayan möminlərin bir-birinə vərəsə olması isə yalnız vəsiyyət yolu ilə mümkün hesab edildi).

7. (Ya Rəsulum!) Xatırla ki, Biz bir zaman peyğəmbərlərdən əhd almışdıq: səndən də, Nuhdan da, İbrahimdən də, Musadan da, Məryəm oğlu İsadan da! Biz onlardan möhkəm bir əhd almışdıq ki,

8. (Allah bununla) doğru danışanlardan (peyğəmbərlərdən) doğruluqlarını (risaləti təbliğ edib-etmədiklərini, ümmətlərinin onlara iman gətirib-gətirmədiklərini) xəbər alsın və kafirlərdən ötrü şiddətli bir əzab hazırlasın!

9. Ey iman gətirənlər! (Xəndək, yaxud Əhzab vuruşunda Qüreyş, Qətəfan və yəhudilərin Bəni-Nəzir qəbilələrindən təşkil olunmuş) ordular sizin üstünüzə gəldiyi zaman Allahın sizə olan nemətini yada salın. O vaxt Biz onların üstünə külək və sizin görmədiyiniz (mələklərdən ibarət) qoşun göndərmişdik. Allah o zaman sizin nə etdiyinizi görürdü.

10. O zaman onlar üstünüzə həm yuxarı, həm də aşağı tərəfdən (vadinin üst və alt tərəfindən) hücum etmiş və (qorxudan) gözünüz hədəqəsindən çıxıb ürəyiniz ağzınıza gəlmişdi. Allah barəsində də müxtəlif fikirlərə düşmüşdünüz. (Möminlər Allahın Öz vədinə doğru olduğuna inanır, münafiqlər isə etiqadı zəif olanlar isə Muhəmməd əleyhissəlamın bu bəladan xilas ola bilməyəcəyini güman edirdilər).

11. Məhz onda (Xəndək vuruşunda) möminlər imtahana çəkilmiş (kimin həqiqi mömin, kimin münafiq olduğu bəlli olmuş) və möhkəm sarsılmışdılar.

12. O zaman münafiqlər və qəlblərində mərəz (şəkk) olanlar: “Allah və Onun peyğəmbəri bizə yalan vəd etmişdir. (Biz zəfər çala bilməyəcəyik)” – deyirdilər.

13. O zaman onlardan bir tayfa: “Ey Yəsrib (Mədinə) əhli. (Burada) sizin üçün duracaq bir yer yoxdur, (evinizə) qayıdın!” – demişdi. Başqa bir dəstə isə: “Evlərimiz açıqdır (kimsəsizdir, oğru

girməsindən qorxuruq)” – deyə (geri qayıtmaq üçün) Peyğəmbərdən izin istəyirdi. Həqiqətdə evləri açıq (kimsəsiz) deyildi. Onlar ancaq (döyüşdən) qaçmaq istəyirdilər.

14. Əgər (Mədinənin) hər tərəfindən üstlərinə yüyürülüb (cumulub) onlardan fitnə törətmək (imandan dönmək, yenidən müşrikliyə qayıtmaq) istənilsəydi, sözsüz ki, dərhal onu edər və bunda (bu işdə) azacıq da olsa yubanmazdılar.

15. Halbuki bundan əvvəl (Ühüd vuruşundan sonra) bir daha (düşməndən) üz çevirib qaçmayacaqları barədə Allaha söz vermişdilər. Allaha verilən əhd barəsində (qiyamət günü) mütləq sorğu-sual olunacaqdır!

16. (Ya Peyğəmbər! Bu münafiqlərə) de: “Əgər ölməkdən, yaxud öldürülməkdən (qorxub) qaçarsınızsa, qaçmaq sizə heç bir fayda verməz. (Qaçsanız belə, dünyada) ancaq az bir müddət dolanıb-keçinərsiniz. (Alnınıza nə yazılmışsa, o da olacaq. Qaçsanız da, qaçmasanız da əcəliniz çatan kimi öləcəksiniz. Allahın əzəli hökmünü dəyişdirmək olmaz!)

17. De: “Əgər Allah sizə bir pislik, yaxud bir yaxşılıq (mərhəmət) diləsə, Allahın sizin haqqınızda görəcəyi bu işə kim mane ola bilər?! Onlar (münafiqlər) özləri üçün Allahdan başqa nə bir hami, nə də bir mədədkar tapa bilərlər.

18. Şübhəsiz ki, Allah içərinizdən (cihada getməyinizə) mane olanları da, qardaşlarına: “Bizə tərəf gəlin! (Muhəmmədə qoşulub əbəs yerə özünüzü həlak etməyin!)” – deyənləri də tanıyır. Döyüşə onların ancaq azı gələr,

19. (Gəldikdə də xəsislik göstərib köməklərini) sizdən əsirgəyərlər. (Ya Rəsulum!) Onlara qorxu üz verdikdə can üstə olan (ölüm xofundan bayılan) adam kimi gözləri (o tərəf-bu tərəfə) dolana-

dolana sənə baxdıqlarını görərsən. Qorxu canlarından çıxınca qənimətdə (möminlər əldə etdiyi qənimətin bölünməsində) xəsislik edib acı dilləri ilə sizi sancarlar. Onlar iman gətirməmişlər. Buna görə də Allah onların əməllərini puça çıxartmışdır. Bu, Allah üçün asandır!

20. (Münafiqlər qorxularından Xəndək müharibəsində mələklərin pərən-pərən saldığı düşmən) dəstələrinin çıxıb getmədiklərini zənn edirlər. O dəstələrin bir də qayıdıb gələcəyi təqdirdə onlar (qorxularından) çöldə bədəvilər arasında olmaq istərdilər ki, (gəlib-gedəndən) sizə dair xəbərləri soruşub öyrənsinlər. (Əgər möminlər zəfər çalıbsa, qənimətə şərik çıxsınlar, yox, əgər kafirlər qalib gəliblərsə, onlara qoşulsunlar). Əgər aranızda olsaydılar, çox az (özü də yalandan) döyüşərdilər.

21. Həqiqətən, Allahın Rəsulu Allaha, qiyamət gününə ümid bəsləyənlər (Allahdan, qiyamət günündən qorxanlar) və Allahı çox zikr edənlər üçün gözəl örnəkdir!

22. Möminlər (müttəfiqlərin) ordu hissələrini gördükdə dedilər: "Bu, Allahın və Peyğəmbərinin bizə olan (zəfər) vədidir. (Biz bununla imtahana çəkilirik. Əgər bu imtahandan yaxşı çıxsaq, zəfər çalacağıq, çünki Allah və Peyğəmbəri həqiqi möminlərə kafirlər üzərində qalib olmağı vəd etmişlər). Allah və Peyğəmbəri düz buyurmuşlar!" Bu (vəziyyət) onların yalnız (Allaha) imanını və itaətini artırdı.

23. Möminlər içərilərində elələri də vardır ki, Allaha etdikləri əhdə sadiq olarlar. Onlardan kimisi (bu yolda) şəhid olmuş, kimisi də (şəhid olmasını) gözləyir. Onlar (verdikləri sözü) əsla dəyişməzlər ki,

24. Allah (bununla) doğruları doğruluqlarına görə mükafatlandırsın, münafiqlərə də istəsə əzab versin, yaxud onların tövbələrini qəbul

buyursun. Həqiqətən, Allah (bəndələrini) bağışlayandır, rəhm edəndir!

25. Allah kafirləri qəzəbli olduqları (məqsədlərinə çatmadıqları) halda geri oturtdu. Onlar heç bir xeyir (qənimət) əldə edə bilmədilər. Döyüşdə (zəfər çalmağa) Allah möminlərə kifayət etdi. Allah yenilməz qüvvət sahibi, qüdrət sahibidir!

26. Allah kitab əhlindən onlara (kafirlərə) kömək edənlərin ürəklərinə qorxu salıb onları öz qalalarından endirdi. Siz onların bir qismini öldürür, bir qismini də əsir alırdınız.

27. (Allah) sizə onların yerlərinə, yurdlarına və mallarına, üstəlik də ayağınız dəyməyən bir yerə (Xeybərə) varis etdi. Allah hər şeyə qadirdir!

28. Ya Peyğəmbər! (Artıq xərclik və pal-paltar istəyən) zövcələrinə belə de: “Əgər siz dünya həyatını və onun dəbdəbəsini istəyirsinizsə, gəlin sizə talaq haqqınızı verim və (sonra da) gözəl bir tərzdə (Allahın buyurduğu qayda üzrə) boşayım!

29. Yox, əgər Allahı, Onun Rəsulunu və axirət yurdunu istəyirsinizsə, (bilin ki) Allah içərinizdən yaxşı işlər görənlər üçün böyük bir mükafat (Cənnət) hazırlamışdır. (Peyğəmbər əleyhissəlamın xanımları dünya nemətlərindən vaz keçib axirət yurdunu daha üstün tutdular).

30. Siz ey Peyğəmbərin zövcələri! Sizdən hansı biriniz açıq-aşkar bir çirkin (günah) iş görsə, onun əzabı ikiqat olar. Bu, Allah üçün asandır!

31. Sizdən hər kim Allaha və Rəsuluna itaət edib yaxşı işlər görsə, onun mükafatını ikiqat (başqa qadınların mükafatlarından iki dəfə artıq) verərik. Biz onun üçün (Cənnətdə) tükənməz (gözəl, minnətsiz) ruzi hazırlamışıq.

32. Siz ey Peyğəmbərin zövcələri! Allahdan qorxacağınız təqdirdə siz (başqa) qadınların heç biri kimi deyilsiniz. (Sizin qədir-qiymətiniz, məqamınız daha yüksəkdir. Allahdan qorxsanız, daha şərəfli olarsınız). Buna görə də (yad kişilərə) yumşaq (əzilə-əzilə) danışmayın, yoxsa qəlbində mərəz (şəkk, nifaq və günah mərəzi) olan tamaha (özgə təmənnaya) düşər. (Danışdığınız zaman) gözəl danışın! (Allahın buyurduğu kimi, yaxud qəbul olunmuş qayda üzrə gözəl, ciddi bir söz deyin!)

33. Evlərinizdə qərar tutun. İlkin Cahiliyyat dövründəki kimi açıq-saçıq olmayın. (Bər-bəzəyinizi taxaraq evdən çıxıb özünüzü, gözəlliyinizi yad kişilərə göstərməyin!) Namaz qılın, zəkat verin, Allaha və Rəsuluna itaət edin. Ey əhli-beyt! Allah sizdən çirkinliyi (günahı) yox etmək və sizi tərtəmiz (pak) etmək istər!

34. Allahın evlərinizdə oxunan ayələrini (Quranı) və hikməti (Peyğəmbərin qoyduğu qayda-qanunu) xatırlayın. Allah (möminlərə) lütfkardır, (bəndələrinin bütün əməllərindən) xəbərdardır!”

35. Həqiqətən, Allah məhz müsəlman kişilər və qadınlar, mömin kişilər və qadınlar, (Allaha) müti kişilər və qadınlar, doğru danışan kişilər və qadınlar, səbirli kişilər və qadınlar, təvazökar (yalnız Allah qarşısında kiçilən) kişilər və qadınlar, sədəqə verən, oruc tutan kişilər və qadınlar, ayıb (övrət) yerlərini (zinadan) qoruyub saxlayan kişilər və qadınlar və Allahı çox zikr edən kişilər və qadınlar üçün (axirətdə) məğfirət (bağışlanma) və böyük bir mükafat (Cənnət) hazırlamışdır!

36. Allah və Peyğəmbəri bir işi hökm etdiyi zaman heç bir mömin kişiyə və qadına öz işlərində başqa yol seçmək (öz ixtiyarları ilə ayrı cür hərəkət etmək) yaraşmaz. Allaha və Onun Peyğəmbərinə asi olan kəs, şübhəsiz ki, (haqq yoldan) açıq-aydın azmışdır!

37. (Ya Peyğəmbər!) Xatırla ki, bir zaman Allahın (islam dininə yönəltməklə) nemət verdiyi və sənin özünün (kölənlikdən azad

etməklə) nemət verdiyi şəxsə (Zeyd ibn Harisəyə): “Zövzəni (Zeynəb bint Cəhşi) saxla (boşama), Allahdan qorx!” – deyir, Allahın aşkar etdiyi şeyi (Zeynəbin boşanacağı təqdirdə onu almağın haqda sənə nazil olan vəhyi) ürəyində gizli saxlayır və adamlardan (onların Peyğəmbər oğulluğunun boşadığı övrətlə evlənir, – deyəcəklərindən) qorxurdun. Halbuki əslində sənin qorxmalı olduğuna ən çox layiq Allahdır. Zeyd zövcəsi ilə əlaqəsini kəsdikdə (Zeynəbi boşadıqda) səni onunla evləndirdik ki, oğulluqları övrətlərini boşadıqları zaman onlarla evlənməkdə möminlərə heç bir çətinlik (günah) olmasın! (Bu işdən möminlərə heç bir günah gəlmədiyini bildirmək üçün belə bir övrətlə birinci səni evləndirib bütün müsəlmanlara nümunə etdik). Allahın hökmü mütləq yerinə yetər!

38. Allahın Peyğəmbərə vacib (halal) buyurduğu bir şeydə (Zeynəblə evlənməkdə) ona heç bir günah yoxdur. Daha öncə gəlib-getmiş (Davud, Süleyman və başqaları kimi) peyğəmbərlər barəsində də Allahın qayda-qanunu (sünnəsi) belədir. Allahın əmri əzəli hökmdür! (O, mütləq yerinə yetməlidir!)

39. O Peyğəmbərlər ki, Allahın hökmlərini (onlara verdiyi risaləti) təbliğ edər, (risaləti tərk etməkdə) Ondan çəkinər və Allahdan başqa heç kəsdən qorxmazlar. Allah özü haqq-hesab çəkməyə kifayətdir.

40. Muhəmməd aranızdakı kişilərdən heç birinin atası deyildir. (Oğul odur ki, kişinin öz belindən əmələ gələ!) Lakin o, Allahın Rəsulu (elçisi) və peyğəmbərlərin sonuncusudur. Allah hər şeyi biləndir!

41. Ey iman gətirənlər! Allahı çox zikr edin!

42. Onu səhər-axşam təqdis edib şəninə təriflər deyin! (Sübh, günorta, ikindi, axşam və gecə namazlarını qılın!)

43. Sizi zülmətdən nura çıxartmaq üçün mələkləri ilə birlikdə sizə mərhəmət bəxş edən Odur. (Və ya: mələkləri də Ondan sizin bağışlanmağınızı dilərlər!). Allah möminlərə rəhm edəndir!

44. (Möminlərin) Ona qovuşacaqlarını gün (Cənnətdə bir-birinə) xeyir-duaları (və ya Allahın onlara verəcəyi xeyir-dua) "salam"dır! (Allah) onlar üçün çox qiymətli (tükənməz, gözəl) mükafat hazırlamışdır.

45. Ya Peyğəmbər! Həqiqətən, Biz səni (ümmətinə) bir şahid, bir müjdəçi və bir qorxudan kimi göndərdik!

46. (Biz səni) Allahın izni ilə Ona tərəf çağıran və nurlu bir çıraq olaraq göndərdik!

47. Möminlərə Allah tərəfindən böyük bir mükafat (Cənnət) bəxş ediləcəyi ilə müjdə ver!

48. Kafirlərə və münafiqlərə itaət etmə. Onların (sənə olan) əziyyətlərinə əhəmiyyət vermə, Allaha bel bağla. Allahın sənə vəkil olması kifayət edər.

49. Ey iman gətirənlər! Əgər mömin qadınlarla evlənib onlara toxunmadan əvvəl talaqlarını versəniz, artıq onlar üçün sizə gözləmə müddəti saymağa ehtiyac yoxdur. (Onları evlərinizdə saxlayıb gözləmə müddətini başa vurmağa məcbur etməyin. Aranızda yaxınlıq olmadığı üçün nə vaxt istəsələr, o vaxt da başqasına ərə gedə bilərlər). Belə olduqda onlara bir şey (mehrin yarısını və ya bir az mal) verib gözəl tərzdə sərbəst buraxın!

50. Ya Peyğəmbər! Mehrlərini verdiyin zövcələrini, Allahın sənə qənimət olaraq verdiklərindən sahib olduğun cariyələri, səninlə birlikdə (Mədinəyə) hicrət etmiş əmin qızlarını, bibilərinin qızlarını, dayın qızlarını, xalalarının qızlarını və bir də Peyğəmbər onunla evlənmək istədiyi təqdirdə özünü (mehrsiz) Peyğəmbərə bağışlayan

hər hansı bir mömin qadını – digər möminlərə deyil, yalnız sənə məxsus olmaq üzrə - sənin üçün halal etdik. Onların zövcələri və sahib olduqları cariyələr barəsində (“Nisa” surəsində) nə hökm etdiyimizi (onlara hansı qadınları halal buyurduğumuzu və bu məsələdə onları Peyğəmbərlə bir tutmamağımızın hikmətini), əlbəttə, bilirik. (Ya Rəsulum!) Sənə (evlənməkdə) bir çətinlik olmasın deyə (bu buyurduqlarımızı sənə halal etdik). Allah bağışlayandır, rəhm edəndir!

51. (Ya Rəsulum!) Onlardan (zövcələrindən) istədiyini (istədiyinin səninlə gecələmək növbəsini) təxirə salar, istədiyini də (gecəni onunla keçirmək üçün) öz yanına ala bilərsən. (Bir müddət özündən) ayırdığın (növbəsini təxirə saldığın, yaxud rici talaqla boşadığın) övrətlərindən də istədiyini (yenidən) öz yanına qaytarmaqdan sənə heç bir günah gəlməz. Onların gözlərinin aydın olması (sevinmələri), kədərlənməmələri və sənin onlara verdiklərindən razı qalmaları üçün ən münasib olanı budur. Allah qəlblərinizdə olanları (kimin daha çox kimə meyl etdiyini) bilir. Allah (hər şeyi) biləndir, həlimdir! (Bəndələrinə cəza verməkdə tələsməz!)

52. Bundan sonra (bu övrətlərindən əlavə) sənə (başqa) qadınlar halal olmaz. Bunları, gözəllikləri xoşuna gəlsə də, başqa qadınlarla dəyişmək olmaz. Sahib olduğunuz cariyələr isə istisnadır. Allah hər şeyə nəzarət edəndir!

53. Ey iman gətirənlər! Peyğəmbərin evlərinə sizə yeməyə icazə verilmədən (yeməyə dəvət olunmadan) girib onun bişməsini gözləməyin. Lakin dəvət olunduqda gedin və (yeməyinizi) yedikdən sonra (orada bir-birinizlə) söhbətə qapılmayıb dağılın. Bu (sizin çox oturmağınız), Peyğəmbərə əziyyət verir, amma o sizdən (bunu sizə deməkdən) utanırdı. Lakin Allah doğru sözdən çəkinməz. Onlardan (Peyğəmbərin zövcələrindən) bir şey soruşduqda, pərdə arxasından soruşun (evlərinə daxil olmayın). Bu həm sizin, həm də onların

ürəklərinə daha çox təmizlik bəxş edər. Sizə Allahın Peyğəmbərini incitmək, özündən sonra onun zövcələri ilə evlənmək əsla yaraşmaz. Həqiqətən, bu, Allah yanında böyük günahdır!

54. Əgər bir şeyi (Peyğəmbərin zövcələri ilə evlənmək arzusunu) açıq bildirsəniz, yaxud onu (qəlbinizdə) gizli saxlasanız, (fərqi yoxdur) Allah hər şeyi biləndir! (Sizin bütün aşkar və gizli əməlləriniz, hətta ürəyinizdən keçən ani fikir və duyğular belə Allaha məlumdur!)

55. Onlara (Peyğəmbərin və möminlərin övrətlərinə) ataları, oğulları, qardaşları, qardaşlarının oğulları, bacılarının oğulları, öz (müsəlman) qadınları, sahib olduqları kölə və cariyələr barədə (onlara görünmək, onlarla söhbət etmək xüsusunda) heç bir günah yoxdur. (Siz ey qadınlar!) Allahdan qorxun! (Onun sizə buyurduqlarına əməl edin!) Şübhəsiz ki, Allah hər şeyə şahiddir!

56. Həqiqətən, Allah və Onun mələkləri Peyğəmbərə salavat göndərirlər (xeyir-dua verirlər). Ey iman gətirənlər! Siz də ona salavat göndərib (onun üçün salavat deyib) layiqincə salamlayın! (Allahümmə səlli əla Muh əmmədin və ali Muhəmməd; əssəlamu əleykə əyyuhənnəbi və rəhmətullahi və bərəkətuhu–deyin!)

57. Allahı və Onun Peyğəmbərini incidənlərə Allah dünyada və axirətdə lənət eləmiş (Öz rəhmətindən qovmuş) və onlar üçün həqarətli bir əzab hazırlamışdır!

58. Mömin kişiləri və qadınları etmədikləri bir işdən (günahdan) ötrü incidənlər, şübhəsiz ki, öz üzərlərinə böhtan və açıq-aydın bir günah götürmüşlər!

59. Ya Peyğəmbər! Zövcələrinə, qızlarına və möminlərin övrətlərinə de ki, (evdən çıxdıqda cariyələrə oxşamasınlar deyə, bədənlərini başdan-ayağa gizlədən) örtüklərini örtsünlər. Bu onların tanınması

(cariyə deyil, azad qadın olduqlarının bilinməsi) və onlara əziyyət verilməməsi üçün daha münasibdir. Allah bağışlayandır, rəhm edəndir!

60. Əgər münafiqlər, qəlblərində mərəz (zinakarlıq, pozğunluq mərəzi) olanlar və Mədinədə qəsdən yalan şayiələr yayanlar (bu pis əməllərinə) son qoymasalar, şübhəsiz ki, səni onların üstünə qaldırarıq. Sonra onlar səninlə ancaq az bir müddət orada qonşu ola bilərlər.

61. (Onlar) məlunlar kimi (tezliklə şəhərdən qovular), harada ələ keçsələr, mütləq tutulub öldürülərlər.

62. Allahın (onlardan) öncə gəlib-getmişlər (münafiqlər) haqqında qayda-qanunu belədir. Sən Allahın qoyduğu qayda-qanunda əsla dəyişiklik görməzsən!

63. Camaat (Məkkə əhli) səndən o saat (qiyamətin nə vaxt qopacağı) barədə soruşar. (Ya Peyğəmbər!) De: “Onu ancaq Allah bilər!” Nə bilirsən, bəlkə də, o saat (qiyamət) yaxındır).

64. Şübhəsiz ki, Allah kafirlərə lənət eləmiş və onlar üçün yanar od hazırlamışdır.

65. Onlar orada əbədi qalacaqlar, (özlərinə) nə bir hami, nə də bir mədədkar tapa biləcəklər.

66. Üzləri odda (o tərəf-bu tərəfə) çevrildiyi (haldan-hala düşdüyü) gün onlar: “Kaş Allaha müti olaydıq, Peyğəmbərə itaət edəydik!” – deyəcəklər.

67. Onlar deyəcəklər: “Ey Rəbbimiz! Biz ağalarımıza, böyüklərimizə itaət etdik, onlarsa bizi haqq yoldan azdırdılar.

68. Ey Rəbbimiz! Onlara ikiqat əzab ver, onları böyük bir lənətə (əzaba) düçar elə!”

69. Ey iman gətirənlər! Musaya əziyyət verən kəslər kimi olmayın. Allah (Musanı) onların dediklərindən (böhtanlarından) təmizə çıxartdı. O, Allah yanında çox hörmətli (qədir-qiymətli) idi.

70. Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz söyləyin!

71. (Əgər belə etsəniz, Allah) əməllərinizi islah edər və günahlarınızı bağışlayar. Hər kəs Allaha və Peyğəmbərinə itaət etsə, böyük bir səadətə (Cənnətə) nail olar.

72. Biz əmanəti (Allaha itaət və ibadəti, şəri hökmləri yerinə yetirməyi) göylərə, yerə və dağlara təklif etdik. Onlar ona yüklənməkdən (götürüb özləri ilə daşımaqdan) qorxub çəkindilər. Ona insan yükləndi. Həqiqətən, o çox zalım, çox cahildir. (İnsan bu ağır əmanəti götürməklə özünə zülm etdi və cahilliyi üzündən onun çətinliyini, ağır nəticəsini bilmədi).

73. Allah münafiq kişiləri və qadınları, müşrik kişiləri və qadınları əzaba uğratsın, mömin kişilərin və qadınların da tövbələrini qəbul buyursun deyə (əmanəti öz razılığı ilə Adəm övladına tapşırdı). Allah (möminləri) bağışlayandır, rəhm edəndir!

## .34.
## Səba surəsi

**(Məkkədə nazil olmuşdur, 54 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Göylərdə və yerdə nə varsa, hamısının sahibi olan Allaha həmd olsun! Axirətdə də həmd Ona məxsusdur. O, hikmət sahibidir, (bəndələrinin bütün əməllərindən) xəbərdardır!

2. Yerə daxil olanı da, (yerdən) çıxanı da, göydən enəni də, (göyə) qalxanı da O bilir. (Allahdan heç nə gizli qalmaz). O, rəhm edəndir, bağışlayandır!

3. (Ayələrimizi) inkar edənlər: “Qiyamət bizə gəlməyəcəkdir!” – dedilər. (Ya Peyğəmbər! Sən onlara) de: “Xeyr, qeybi bilən Rəbbimə and olsun ki, qiyamət sizə gələcəkdir. Nə göylərdə, nə də yerdə zərrə qədər bir şey Ondan gizli qalmaz. Bundan kiçik, yaxud böyük elə bir şey yoxdur ki, açıq-aydın kitabda (lövhi-məhfuzda) olmasın!”

4. (Bütün bunlar ona görədir ki, Allah) iman gətirib yaxşı işlər görənləri mükafatlandırsın. Məhz onları bağışlanma və tükənməz (gözəl, minnətsiz) ruzi gözləyir!

5. Ayələrimizi batil (aciz) etmək (Bizi aciz buraxmaq) üçün cəhd göstərənlər isə şiddətli, iyrənc bir əzaba düçar olacaqlar.

6. (Kitab əhlindən Abdullah ibn Salam kimi) elm verilmiş kimsələr Rəbbindən sənə nazil edilənin (Quranın) haqq olduğunu və onun (möminlərə) yenilməz qüvvət sahibi, (hər cür) şükrə (tərifə) layiq olan Allahın yolunu göstərdiyini görürlər.

7. Kafirlər (öz aralarında Peyğəmbər əleyhissəlama istehza edərək bir-birinə) dedilər: “Sizə siz parça-parça olub dağılandan (çürüyüb torpağa qarışandan) sonra yenidən yaradılacağınızı (dirildiləcəyinizi) xəbər verən bir adam göstərəkmi?

8. Görəsən, o, Allaha qarşı özündən yalan uydurur, yoxsa bir dəliliyi var?” Xeyr, axirətə inanmayanlar özləri əzab içində, (haqdan) uzaq bir zəlalət içindədirlər. (Onlara axirətdə şiddətli əzab veriləcəkdir, çünki dünyada haqq yoldan çox azmışlar).

9. Məgər onlar başlarının üstündəki göyü və ayaqlarının altındakı yeri görmürlərmi? (Yer və göy onları elə əhatə etmişdir ki, bu dairədən heç yerə çıxıb qaça bilməzlər). Əgər istəsək, onları yerə batırar, yaxud göyün bir parçasını onların başına endirərik. Şübhəsiz ki, bunda tövbə edib (Allaha tərəf) dönən hər bir bəndə üçün ibrət vardır!

10. Həqiqətən, Biz Davuda Öz dərgahımızdan bir lütf bəxş edib: "Siz ey dağlar, siz ey quşlar! Onunla (Davudla) birlikdə Allahı təqdis edib şəninə təriflə deyin!" – deyə buyurduq və dəmiri onun (onun əlindən) yumşaltdıq. (Davud dəmiri əritmədən əlində mum kimi yumşaldıb istədiyi şeyi ondan düzəldərdi).

11. (Biz Davuda belə buyurduq: ) "Geniş, uzun (insanın bədənini örtən) zirehlər düzəlt, (onları) toxuduğun zaman ölçüyə riayət et! (Zirehin həlqələri bir-birinə uyğun gəlsin, biri böyük, biri kiçik olmasın!) Və (siz də ey Davud ailəsi!) yaxşı işlər görün. Həqiqətən, Mən sizin etdiyiniz əməlləri görürəm!"

12. Süleymana da küləyi ram etdik. O (külək) səhərdən günortaya qədər bir aylıq yol, günortadan axşama qədər də bir aylıq yol gedirdi (bir gündə iki aylıq məsafəni qət edirdi). Onun üçün mis mədənini sel kimi əridib axıtdıq. (Davud dəmiri əlində yumşaldıb istədiyini düzəltdiyi kimi, Süleyman da misdən istədiyini düzəldirdi). Cinlərin bir qismi Rəbbinin izni ilə onun yanında işləyirdi. Onlardan hər kəs (Süleymana itaət etməyib) əmrimizdən çıxırdısa, ona cəhənnəm odunun əzabından daddırırdıq.

13. Onun (Süleyman) üçün nə istəsə - məbədlər (uca qəsrlər), heykəllər, (min nəfərdən ibarət qonağın və qoşunun birlikdə oturub yeyə biləcəyi) böyük hovuzlara bənzər çanaqlar və yerindən tərpənməyən iri qazanlar düzəldirdilər. Siz, ey Davud ailəsi! (Allaha) şükranlıqla itaət edin! (Bu nemətə şükür edin!) Bəndələrimdən (nemətlərimə) şükür edəni azdır!

14. Sonra (Süleymanın) ölümünü hökm etdiyimiz zaman onun öldüyünü onlara (cinlərə) ancaq (Süleymanın) əsasını yeyən bir ağac qurdu xəbər verdi. (Süleymanın əlini dayayıb durduğu əsa sınandan sonra) o (ölmüş vəziyyətdə) yerə yıxıldıqda cinlərə bəlli oldu ki, əgər

onlar qeybi bilsəydilər, alçaldıcı əzab (məşəqqətli iş) içində qalmazdılar.

15. Səba (tayfasının) yurdunda (qüdrətimizə dəlalət edən) bir nişanə var idi. (Orada) sağdan və soldan (dağla əhatə olunmuş) iki bağça var idi. (Səba əhlinə belə buyurulmuşdu: ) “Rəbbinizin ruzisindən yeyin və Ona şükür edin. (Yurdunuz) gözəl bir diyar, (Rəbbiniz də) bağışlayan bir Rəbbdir!”

16. Lakin onlar (itaətimizdən) üz döndərdilər, Biz də üstlərinə Ərim (bəndinin) selini göndərdik. (Bunun nəticəsində yurdlarını su basdı). Onların iki (gözəl) bağçasını (tikanlı) acı meyvəli, (içərisində) yulğun ağacları və bir az da sidr ağacı olan iki bağçaya çevirdik.

17. Onları nankorluqlarına görə belə cəzalandırdıq. Biz heç nankordan başqasına cəzamı verərik?

18. Onların (Səba əhlinin) yurdu ilə bərəkət verdiyimiz məmləkətlər (Şam və Urdun) arasında bir-birinə bitişik (abad) qəsəbələr inşa etmiş, orada gediş-gəliş yaratmışdıq (belə ki, səfər zamanı yolçular o qəsəbələrin birində istirahət edir, axşam isə digərində yatıb dincəlirdilər). (Onlara belə demişdik: ) “Gecələri-gündüzləri (istədiyiniz vaxt) orada arxayın gəzib-dolanın!”

19. Lakin onlar: “Ey Rəbbimiz! Səfərlərimizin arasını (məsafəni) uzaq et!” – dedilər və öz-özlərinə zülm etdilər. Biz onları pərən-pərən salıb dillərdə dastan etdik. (Onlardan Qəssan qəbiləsi Şama, Əzd qəbiləsi Omana, Xüzaə qəbiləsi Təhaməyə, Hüzeymə qəbiləsi İraqa, Övs və Xəzrəc qəbilələri isə Mədinəyə köçdü. Onlar barəsində “Səba əhli kimi pərən-pərən düşdülər” məsələsi çəkilməyə başlandı). Həqiqətən, bunda (çətinliklərə) səbir, (nemətlərə) çox şükür edən hər bir kəs üçün ibrətlər vardır!

20. İblisin onlar haqqındakı zənni düz çıxdı. (İçərilərindən) bir dəstə mömin istisna olmaqla, hamısı ona uydu.

21. Əslində (İblisin) onlar üzərində heç bir hökmü yoxdur. Lakin Biz axirətə inananla ona şəkk edəni ayırd edib bilmək üçün (İblisə bu imkanı verdik). Sənin Rəbbin hər şeyi hifz edəndir! (Möminlərin və kafirlərin əməllərini mühafizə edər, qiyamət günü hərəyə öz əməlinin cəzasını verər).

22. (Ya Peyğəmbər! Müşriklərə) de: "Allahdan başqa tanrı zənn etdiklərinizi (köməyə) çağırın". Onlar göylərdə və yerdə zərrə qədər bir şeyə sahib deyillər. Nə onların bunlarda (göylərdə və yerdə) bir şərikliyi var, nə də (Allahın) onlardan bir köməkçisi var!

23. Onun hüzurunda, izin verdiyi kimsələr istisna olmaqla, heç kəsin şəfaəti fayda verməz. (Elə isə hansı ağılla bütlər sizi Allaha yaxınlaşdıracaq, sizin üçün Allahdan şəfaət diləyəcəklər deyə, onlara ibadət edirsiniz?) Nəhayət, (bəzi möhtərəm zatlara şəfaət etməyə izin verildiyinə görə məhşərə gətirilənlərin) ürəklərindən o (müdhiş) qorxu çıxınca onlar (şəfaət edəcək kəslərdən, yaxud mələklərdən sevinclə): "Rəbbiniz nə buyurdu?" – deyə soruşar, o biriləri də: "Haqqı (buyurdu)! (Şəfaətə izin verdi). O, (hər şeydən) ucadır, (hər şeydən) böyükdür!" – deyə cavab verərlər.

24. (Ya Peyğəmbər! Müşriklərə) de: "Göylərdə və yerdən sizə ruzi verən kimdir?" (Əgər onlar sənə: "Bilmirik",- deyə cavab versələr) de: "Allahdır! Elə isə doğru yolda olan, yaxud (haqq yoldan) açıq-aydın azan bizik, yoxsa siz?"

25. De: "Siz bizim etdiyimiz günahlar barəsində sorğu-sual olunmayacaqsınız, biz də sizin etdiyiniz günahlar barəsində sorğu-sual olunmayacağıq!

26. De: “Rəbbimiz (qiyamət günü) bizi (bir yerə) toplayacaq və aramızda ədalətlə hökm edəcəkdir. (Haqq olanlar Cənnətə, nahaq olanlar isə Cəhənnəmə gedəcəklər). Ədalətlə hökm edən (müşkülləri açan), (nə hökm etdiyini) bilən ancaq Odur!”

27. De: “Ona qoşduğunuz şərikləri bir mənə göstərin. Xeyr (heç kəs Ona şərik ola bilməz). Yenilməz qüvvət, hikmət sahibi ancaq O (bir olan) Allahdır!”

28. (Ya Rəsulum!) Biz səni (təkcə öz qövmünə deyil) bütün insanlara (möminlərə Cənnətlə) müjdə verən, (kafirləri isə Cəhənnəm əzabı ilə) qorxudan bir peyğəmbər olaraq göndərdik. Lakin insanların (Məkkə müşriklərinin) əksəriyyəti (bunu) bilməz!

29. Onlar (Məkkə müşrikləri): “Əgər doğru danışırsınızsa, (bir xəbər verin görək) bu vəd (əzab vədəsi) nə vaxt yerinə yetəcəkdir?” – deyə soruşarlar.

30. (Onlara) belə de: “Sizə vəd olunmuş bir gün (qiyamət günü) vardır ki, ondan bircə saat belə nə geri qalar, nə də irəli keçə bilərsiniz!”

31. (Kitab əhlinin möminləri məkkəlilərə: “Biz sizin peyğəmbərinizin vəsflərini öz kitablarımızda görmüşük”, - söylədikləri zaman) kafir olanlar dedilər: “Biz nə bu Qurana, nə də ondan əvvəlkilərə (Tövrata və İncilə) inanırıq!” (Ya Rəsulum!) Kaş sən o zalımları (haqq-hesab üçün) Rəbbinin hüzurunda saxlanılıb bir-birinə söz qaytardıqları (bir-birini təqsirləndirib məzəmmət etdikləri) və acizlərin (dünyada) özlərini yuxarı tutanlara (tabe olanların öz rəislərinə): “Əgər siz olmasaydınız, biz mütləq mömin olardıq!” – dedikləri zaman görəydin.

32. (Dünyada) özlərini yuxarı tutanlar da acizlərə belə cavab verərlər: “Əcaba, sizə doğru yol göstərən rəhbər gəldikdən sonra sizi

ondan bizmi döndərdik? Xeyr, siz özünüz günahkar idiniz (könüllü surətdə küfrü qəbul etdiniz)"

33. Acizlər özlərini yuxarı tutanlara deyərlər: "Xeyr bəs gecə-gündüz qurduğunuz hiylələr? O zaman ki, bizə Allahı danmağı və Ona şəriklər qoşmağı əmr edirdiniz". Onlar əzabı gördükdə için-için peşman olarlar. Küfr edənlərin boyunlarına zəncir vurarıq. Onlar ancaq (dünyada) etdikləri əməllərin cəzasını çəkərlər.

34. Biz hər hansı bir məmləkətə (kafirləri Allahın əzabı ilə) qorxudan bir peyğəmbər göndərdikdə, onun naz-nemət içində yaşayan zəngin başçıları ancaq: "Biz sizinlə göndərilənləri (Allahın hökmlərini, risaləti, möcüzələri) inkar edirik!" – dedilər.

35. Onlar: "Bizim mal-dövlətimiz və övladımız (iman gətirən bu yoxsullarınkından) daha çoxdur və bizə əzab da verilməyəcəkdir (əgər Allah bizdən razı olmasaydı, bol ruzi verməzdi)" – dedilər.

36. (Ya Peyğəmbər!) De: "Rəbbim istədiyinin ruzisini artırar və (istədiyininkini də) azaldar. Lakin insanların əksəriyyəti (bunu) bilməz!"

37. Sizi bizə yaxınlaşdıran nə var-dövlətiniz, nə də oğul-uşağınızdır. Yalnız iman gətirib yaxşı işlər görənlərin (dünyadakı) əməllərinə görə mükafatları qat-qat (birə-on) artıq olacaq və onlar cənnət otaqlarından (Cənnətin yüksək məqamlarında) əmin-amanlıq içində yaşayacaqlar.

38. (Bizi) aciz buraxacaqlarını sanaraq ayələrimizi batil etmək üçün cəhd göstərənlər isə (qiyamət günü) gətirilib əzaba düçar ediləcəklər.

39. (Ya Peyğəmbər!) De: "Həqiqətən, Rəbbim bəndələrindən istədiyinin ruzisini bol edər, (istədiyininkini də) azaldar. (Allah yolunda) nə xərcləsəniz, Allah onun əvəzini verər. O, ruzi verənlərin ən yaxşısıdır!"

40. O gün (qiyamət günü Allah) onları (müşrikləri, kafirləri) bir yerə yığacaq, sonra da mələklərə belə deyəcək: “Bunlar sizəmi ibadət edirdilər?”

41. (Mələklər: ) “Sən paksan, müqəddəssən. Bizin ixtiyar sahibimiz onlar deyil, Sənsən! Xeyr, onlar (bizə yox) cinlərə (şeytanlara) ibadət edirdilər. (Müşriklərin, kafirlərin) əksəriyyəti onlara (cinlərə) iman gətirmişdi”, - deyə cavab verəcəklər.

42. Bu gün bir-birinizə nə bir xeyir (fayda) nə də bir zərər verə bilərsiniz. Zalımlara da: “Dadın (dünyada) yalan hesab etdiyiniz cəhənnəm odunun əzabını!” – deyəcəyik.

43. Ayələrimiz onlara (müşriklərə) açıq-aşkar olaraq oxunduğu zaman: “Bu ancaq sizi atalarınızın ibadət etdiklərindən (bütlərdən) döndərmək istəyən bir adamdır!” deyər, (Quran haqında isə:) “Bu, uydurma yalandan başqa bir şey deyildir!” söyləyərlər. Kafir olanlara haqq (Quran) gəldikdə onun barəsində: “Bu yalnız açıq-aşkar bir sehrdir!” – deyərlər.

44. Halbuki (Ya Rəsulum!) Biz onlara oxuyacaqları bir kitab verməmiş və səndən əvvəl də özlərinə (Allahın əzabı ilə) qorxudan bir peyğəmbər göndərməmişdik.

45. Onlardan (Məkkə müşriklərindən) əvvəlkilər də (öz peyğəmbərlərini) təkzib etmişdilər. Bunlar (Məkkə əhli) onlara verdiklərimizin (mal-dövlətin, qüdrətin, ömrün) onda birinə belə nail olmamışlar. Amma onlar Mənim Peyğəmbərimi yalançı saydılar. (Ya Rəsulum! Bir görəydin) Mənim (onları) inkar etməyim necə oldu! (Peyğəmbərləri inkar etdikləri üçün Mən də o kafirləri inkar edib onlara olan nemətimi nifrətlə əvəz etdim, hamısını məhv edib yer üzünü onlardan büsbütün təmizlədim. Bu, Məkkə müşriklərinə bir ibrət dərsi olmalıdır!)

46. (Ya Peyğəmbər! Bu müşriklərə) de: “Mən sizə ancaq bir öyüd verəcəyəm. Allah xatirinə (məni dinlədikdən sonra məclisimdən) iki-iki, bir-bir durun (durub gedin), sonra da bir dərindən düşünün, (görəcəksiniz ki) sizin yoldaşınızda (Muhəmməd əleyhissəlamda) heç bir divanəlik əsəri yoxdur. O yalnız qarşıdakı şiddətli əzabla (düçar olacağınız axirət əzabı ilə) sizi qorxudan (xəbərdar edən) bir peyğəmbərdir!”

47. De: “Mən (bunun müqabilində) sizdən heç bir muzd (mükafat) istəmirəm, o sizin olsun. Mənim mükafatım ancaq Allaha aiddir. O, hər şeyə şahiddir!”

48. De: “Rəbbim haqqı (vəhyi və risaləti Öz peyğəmbərlərinə) nazil edər. O, qeybi ən yaxşı biləndir!”

49. De: “Haqq (islam dini) gəldi. Batil (küfr, şirk) bir də nə gözə görünər (nə ortaya bir şey çıxarar), nə də geri qayıdar!” (Haqq gələn kimi batil bilmərrə yox oldu, çünki o özlüyündə puçdur!)

50. De: “Əgər mən (haqq yoldan) azsam, bunun zərəri (günahı) ancaq mənə olar. Yox, əgər doğru yolla getsəm, bu da Rəbbimin mənə vəhy etdiyi (Quran) sayəsindədir. Həqiqətən, O (kimin nə dediyini) eşidəndir, (dua edən bəndələrinə) yaxındır.

51. (Ya Peyğəmbər!) Sən onları (müşrikləri) bir qorxduqları zaman görəydin! (Nə qəribə mənzərə!) Artıq qaçıb can qurtarmağa heç bir imkan yox, özləri də (Cəhənnəmə) yaxın bir yerdə (qəbir evində, yaxud Bədr vuruşunda) yaxalanmışlar.

52. Onlar: “Ona (Qurana və ya Muhəmməd əleyhissəlama) inandıq!” – deyirlər. Amma (axirət kimi) uzaq bir yerdən əlləri (imana, tövbəyə) necə çata bilər?! (Axirət aləminə getdikdən sonra heç kəsin əli imana, tövbəyə yetişməz, çünki axirətdən qayıdıb bir də

dünyaya gəlmək mümkün deyildir. İman və tövbə yeri yalnız yaşadığınız dünyadır!)

53. Halbuki onlar bundan əvvəl onu (Allah kəlamını, yaxud Peyğəmbəri) inkar etmişdilər və uzaq bir yerdən qeybə (qaranlığa daş) atırdılar (qeybə dair bilmədikləri şeylər barəsində danışırdılar).

54. Artıq onlarla istədikləri şey (iman və tövbə) arasında əngəl törədilmişdir. (Bir də dünyaya qayıdıb tövbə və iman sahibləri olmaları qeyri-mümkündür). Daha öncə özlərinə bənzər kəslər (kafirlər) barəsində də belə edilmişdir. Çünki onlar da (axirət əzabı barəsində) dərin bir şəkk içində idilər.

## .35.
## Fatir (Yaradan) surəsi

**(Məkkədə nazil olmuşdur, 45 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Göyləri və yeri yoxdan yaradan, ikiqanadlı, üçqanadlı və dördqanadlı mələkləri (peyğəmbərlərə) elçi edən Allaha həmd olsun! (Allah) məxluqatda istədiyini artırar. Həqiqətən, Allah hər şeyə qadirdir!

2. Allahın insanlara əta etdiyi mərhəmətə (verdiyi nemətə, ruziyə) heç kəs mane ola bilməz. Onun vermədiyi bir şeyi də Özündən başqa heç kəs göndərə (verə) bilməz. O, yenilməz qüvvət sahibi, hikmət sahibidir!

3. Ey insanlar! Allahın sizə olan nemətini yada salın. Allahdan başqa sizə göylərdən və yerdən ruzi verən bir xaliq varmı?! Ondan başqa heç bir tanrı yoxdur. Elə isə necə (aldanıb haqdan) döndərilirsiniz?

4. Əgər (bu müşriklər) səni təkzib etsələr (heç ürəyini sıxma). Səndən əvvəl də peyğəmbərlər təkzib olunmuşdu. Bütün işlər (axırda) ancaq

Allaha qayıdacaqdır (qaytarılacaqdır)! (Təkzib edənlərə cəza veriləcək, təkzib olunanlara isə yardım göstəriləcəkdir!)

5. Ey insanlar! Şübhəsiz ki, Allahın (qiyamət barəsindəki) vədi haqdır. Dünya həyatı sizi aldatmasın. O tovlayan (Şeytan) da sizi tovlayıb yoldan çıxartmasın!

6. Həqiqətən, Şeytan sizin düşməninizdir, onu (özünüzə) düşmən tutun. O özünə uyanları cəhənnəm əhli olmağa çağırır.

7. Kafir olanları şiddətli əzab, iman gətirib yaxşı işlər görənləri isə bağışlanma və böyük bir mükafat (Cənnət) gözləyir!

8. Pis əməli (Şeytan tərəfindən) özünə yaxşı göstərilib onu yaxşı görən (Allahın doğru yola yönəltdiyi kimsəyə bənzəyirmi?!) Şübhəsiz ki, Allah istədiyini zəlalətə, istədiyini də doğru yola salar. (Ya Peyğəmbər!) Artıq onlara (Məkkə müşriklərinin haqq yoldan azmalarına) görə özünü üzüb həlak etmə. Həqiqətən, Allah onların nə etdiklərini biləndir!

9. Buludları hərəkətə gətirən küləkləri Allahdır göndərən! Biz (o buludları) quru (ölü) bir məmləkətə tərəf qovub, öldükdən sonra torpağı onunla dirildirik. (Ölüləri) diriltmək də belədir!

10. Hər kəs (dünyada) izzət-qüdrət (şərəf-şan) istəsə, (bilsin ki, dünyada da, axirətdə də) bütün izzət-qüdrət (şərəf-şan) ancaq Allaha məxsusdur. (Buna yalnız Allaha itaət və ibadət etməklə nail olmaq mümkündür). Pak söz (tövhid kəlməsi, zikr, həmd-səna) Ona tərəf yüksələr və pak sözü də (Allah dərgahına) yaxşı əməl qaldırar. (Allah pak sözü eşidəndir, saleh əməli də qəbul edər). Pis əməllər edənləri şiddətli bir əzab gözləyir. Onların qurduqları hiylələr boşa çıxar.

11. Allah sizi (atanız Adəmi) torpaqdan, sonra nütfədən xəlq etmiş, sonra da sizi (kişi və qadın olmaqla) cüt-cüt yaratmışdır. O bilmədən heç bir qadın hamilə olmaz və bari-həmlini yerə qoymaz. Ömür

sahibi olan birinin uzun ömür sürməsi də, onun (yaxud başqa birinin) ömrünün qısaldılması da ancaq kitabda (lövhi-məhfuzda) yazılmışdır. Həqiqətən, bu, Allah üçün çox asandır.

12. İki dəniz eyni deyildir. Birinin suyu çox şirin, dadlı və içməyə rahat (boğazdan rahat keçən), digərininki isə həddindən artıq şor və acıdır. Onların hər birindən təzə ət (balıq) yeyir, taxdığınız (inci və mərcan kimi) bəzəklər çıxardırsınız. Onun (Allahın) lütfündən (nemətindən) ruzi diləyib axtarmağınız (ticarət etməyiniz) üçün gəmilərin də orada (suyu) yara-yara üzdüyünü görürsən. (Bütün bunlara görə), bəlkə, (Allaha) şükür edəsiniz.

13. (Allah) gecəni gündüzə, gündüzü də gecəyə qatar. O, günəşi və ayı ram (öz əmrinə, sizin mənafeyinizə tabe) etmişdir. Onların hər biri (öz hədəqəsində, öz dairəsində) müəyyən müddətədək (qiyamət gününə qədər) dövr (hərəkət) edər. Bu sizin Rəbbiniz olan Allahdır, hökm Onundur. Sizin Ondan qeyri ibadət etdikləriniz bir çəyirdək qabığına belə sahib deyillər.

14. Əgər siz onları çağırsanız (dua etsəniz), onlar sizin çağırışınızı eşitməzlər; eşitsələr də cavab verə bilməzlər (çünki Allah onlara nitq qabiliyyəti verməmişdir). Özləri də qiyamət günü sizin (Onları Allaha) şərik qoşduğunuzu (onlara büt kimi ibadət etdiyinizi) danacaqlar. (Ya Peyğəmbər!) Heç kəs sənə hər şeydən xəbərdar olan (Allah) kimi xəbər verə bilməz!

15. Ey insanlar! Siz Allaha möhtacsınız. Allah isə (heç nəyə, o cümlədən sizin ibadətinizə) möhtac deyildir. O (hər cür) şükrə (tərifə) layiqdir! (Onun bütün işləri bəyənilləndir!)

16. Əgər istəsə, sizi yox edib (yerinizə) başqa bir məxluq gətirər.

17. Bu, Allah üçün çətin deyildir!

18. Heç bir günahkar başqasının günahını daşımaz. Günah yükü ağır olan kimsə yükünü daşımaq üçün (başqa birisini köməyə) çağırsa və (çağırılan adam onun) yaxın qohumu olsa belə, o yükdən bir şey daşınmaz. (Ya Peyğəmbər!) Sən ancaq Rəbbindən (Onun əzabını) görmədikləri halda qorxanları və (vaxtlı-vaxtında) namaz qılanları qorxudub xəbərdar edirsən. Hər kəs (günahlardan, küfrdən) təmizlənsə, özü üçün təmizlənmiş olar (savabı özünə yetişər). Axır dönüş ancaq Allahadır!

19. Kor ilə görən eyni olmaz.

20. Zülmətlə nur da (eyni deyildir)!

21. Kölgə (sərin) ilə isti (eyni olmaz).

22. Dirilərlə ölülər də eyni deyillər! (Bütün bunlar kimi kafirlə mömin, küfrlə iman, Cəhənnəmlə Cənnət, batillə haqq da eyni olmazlar!) Şübhəsiz ki, Allah dilədiyinə (ayələrini) eşitdirər. Sən isə (ya Peyğəmbər!) qəbirlərdə olanlara (haqqı) eşitdirən deyilsən!

23. Sən ancaq (müşrikləri, kafirləri Allahın əzabı ilə) qorxudan bir peyğəmbərsən!

24. Doğrudan da, Biz səni haqla (Quranla) müjdə verən və qorxudan bir peyğəmbər olaraq göndərdik. Elə bir ümmət yoxdur ki, onun içindən (kafirləri Allahın əzabı ilə) qorxudan (xəbərdar edən) bir peyğəmbər (yaxud alim) gəlib-getməsin!

25. Əgər onlar (Məkkə müşrikləri) səni yalançı saysalar (heç ürəyini qısma). Onlardan əvvəlkilər də (öz peyğəmbərlərini) yalançı hesab etmişdilər. Halbuki peyğəmbərləri onlara açıq-aşkar möcüzələr, səhifələr və (Tövrat, İncil kimi) nurani kitab gətirmişdilər.

26. Sonra Mən o küfr edənləri (əzabla) yaxaladım. (Ya Peyğəmbər! Bir görəydin) Mənim onları inkar etməyim (nemətimi nifrətə çevirərək cəzalandırmağım) necə oldu!

27. (Ya Peyğəmbər!) Məgər Allahın göydən bir yağmur yağdırdığını görmürsənmi?! Sonra Biz onunla növbənöv meyvələr yetişdirdik və dağlarda müxtəlif rəngli – ağ, qırmızı, tünd qara yollar (yaxud tünd qara qayalar) peyda etdik.

28. İnsanların, (yer üzündə gəzən) heyvanların və davarların da bu cür müxtəlif rəngləri vardır. Allahdan Öz bəndələri içərisində ancaq alimlər qorxar. (Onlar elm sahibi olduqları üçün Allahın vəhdaniyyətini, heybət və əzəmətini daha yaxşı başa düşür və Ondan daha çox qorxurlar). Həqiqətən, Allah yenilməz qüvvət sahibidir, (möminləri) bağışlayandır!

29. Allahın Kitabını oxuyan, namaz qılan, özlərinə verdiyimiz ruzilərdən (Allah yolunda) gizli və aşkar xərcləyənlər kasad olmayacaq bir ticarət (savab) umarlar ki,

30. (Allah) onlara (əməllərinin) mükafatlarını versin və Öz lütfündən (kərəmindən) onlara artırsın! Həqiqətən, (Allah) bağışlayandır, qədirbiləndir! (Bəndələrinə Ona etdikləri şükür müqabilində bol nemət əta edər).

31. (Ya Peyğəmbər!) Sənə özündən əvvəlkiləri təsdiqləyici olaraq vəhy etdiyimiz Kitab (Quran) haqdır. Həqiqətən, Allah bəndələrindən xəbərdardır, (hər, şeyi) görəndir!

32. Sonra Kitabı bəndələrimizdən seçdiklərimizə (Muhəmməd ümmətinə) miras verdik. Onlardan kimisi özünə zülm edər (pis əməlləri yaxşı əməllərdən çox olar), kimisi mötədil (pis əməlləri ilə yaxşı əməlləri bərabər) olar, kimisi də Allahın izni ilə yaxşı işlərdə

(başqalarını ötüb) irəli keçər (yaxşı əməlləri pis əməllərindən çox olar). Bu (Kitaba varis olmaq) böyük lütfdür!

33. Onlar Ədn cənnətlərinə daxil olacaq, orada altun bilərziklər və incilərlə bəzənəcəklər. Libasları da ipəkdən olacaqdır.

34. Onlar deyəcəklər: "Qəm-qüssəni bizdən uzaq edən Allaha həmd olsun. Həqiqətən, Rəbbimiz bağışlayandır, qədirbiləndir!

35. Elə bir Rəbb ki, Öz lütfü (kərəmi) ilə bizi (əbədi qalacağımız) iqamətgahda yerləşdirdi. Orada bizə nə bir yorğunluq üz verəcək, nə bir məşəqqət (əziyyət) toxunacaqdır!"

36. Kafir olanları cəhənnəm odu gözləyir. Orada nə onların ölümünə hökm olunar ki, ölüb canlarını qurtarsın, nə də əzabları yüngülləşər. Biz hər bir kafiri belə cəzalandırırıq!

37. Onlar orada fəryad edib deyəcəklər: "Ey Rəbbimiz! Bizi buradan çıxart ki, saleh əməllər edək. O əməlləri yox ki (dünyada) edirik!" (Onlara belə deyəcəyik: ) "Məgər orada sizə öyüd-nəsihət qəbul edəcək kimsənin öyüd-nəsihət qəbul edə biləcəyi (düşünəcək kimsənin düşünəcəyi) qədər ömür vermədikmi?! Hələ sizə (siz kafirləri Allahın əzabı ilə) qorxudan peyğəmbər də gəlmişdi. Dadın (cəhənnəm əzabını)! Zalımların imdadına çatan olmaz!"

38. Şübhəsiz ki, Allah göylərin və yerin qeybini (gözə görünməyən sirlərini) bilir. O, ürəklərdə olanları da biləndir!

39. Sizi yer üzünün varisləri edən (bir-birinizin yerinə gətirən) Odur. Küfr edənin küfrü öz əleyhinə olar (zərərini özü çəkər). Kafirlərin küfrü Rəbbi yanında onlara qəzəbdən başqa bir şey artırmaz. Kafirlərin küfrü (axirətdə) onların ancaq ziyanını artırar!

40. (Ya Rəsulum! Məkkə müşriklərinə) de: "Mənə bir göstərin (deyin) görüm, Allahdan başqa ibadət etdikləriniz yer üzündə (yaxud

yerdən və yerə bənzər şeylərdən) nəyi yaradıblar? Yoxsa onların göylərdə (Allahla) bir şərikliyi var? Yaxud onlara (ilahi) bir kitab vermişik və (Allaha şərik qoşmaq barəsində) oradakı bir dəlilə istinad edirlər?! Xeyr, o zalımlar (bütlərin onlar üçün şəfaət edəcəyi haqda) bir-birinə ancaq yalan vəd verirlər.

41. Həqiqətən, Allah göyləri və yeri zaval tapmasınlar (öz mehvərindən çıxmasınlar) deyə, tutub saxlayır. Əgər öz mehvərindən çıxsalar, Ondan başqa onları heç kəs tutub saxlaya bilməz. Doğrudan da, (Allah) həlimdir, bağışlayandır! (Bəndələrinə cəza verməkdə tələsməz, tövbə edənləri əfv edər).

42. (Məkkə müşrikləri) özlərinə (Allahın əzabı ilə) qorxudan bir peyğəmbər gələcəyi təqdirdə (yəhudi, xaçpərəst və başqaları kimi) hər hansı ümmətdən daha artıq doğru yolda olacaqları barədə Allaha çox möhkəm and içmişdilər. Amma onlara belə bir peyğəmbər (Muhəmməd əleyhissəlam) gəldikdə bu ancaq onların nifrətini artırdı (haqq yoldan daha da uzaqlaşdılar).

43. (Bu isə onların) yer üzündə təkəbbür göstərmələri (iman gətirməyi özlərinə sığışdırmamaları) və pis əməlləri ucbatından idi. Pis əməl (qərəzli hiylə) ancaq onun öz sahibinin başında çatlayar. Məgər onlar Allahın adəti (qayda-qanunu) üzrə (özlərindən) əvvəlkilərin düçar olduqları müsibətlərimi (həmin müsibətlərin onların öz başlarına da gəlməsinimi) gözləyirlər? (ya Peyğəmbər!) Sən Allahın qoyduğu qayda-qanunda heç bir dəyişiklik tapmazsan!

44. Məgər onlar yer üzündə dolaşıb özlərindən əvvəlkilərin axırının necə olduğunu görmürlərmi? Halbuki onlar bunlardan daha qüvvətli idilər. Göylərdə və yerdə Allahı aciz edə biləcək heç bir şey yoxdur. Həqiqətən, O (hər şeyi) biləndir, (hər şeyə) qadirdir!

45. Əgər Allah insanları etdikləri günahlara görə cəzalandırsaydı, (Yer) üzündə bir nəfəri belə (sağ) qoymazdı. Lakin Allah onları

(onların cəzasını) müəyyən bir vaxta (qiyamət gününə) qədər gecikdirər. Nəhayət, onların vaxtı gəlib çatdıqda (həmin müddət yetişib qiyamət qopduqda hamını yenidən dirildərək hərəyə öz əməli müqabilində cəza, yaxud mükafat verər). Çünki Allah öz bəndələrini görəndir!

## .36.
## Yasin surəsi
**(Məkkədə nazil olmuşdur, 83 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Ya, Sin!

2. (Ya Rəsulum!) Hikmətlə dolu Qurana and olsun ki,

3. Sən, həqiqətən, (Allah tərəfindən göndərilmiş, şəriət sahibi olan) peyğəmbərlərdənsən!

4. Düz yoldasan! (Doğru yol üzrə göndərilən peyğəmbərlərdənsən. Allahın əsl tövhid dini olan islam dinindənsən. Bu yolu tutub gedən haqqa yetişər).

5. Bu Quran (mülkündə) yenilməz qüvvət sahibi, (bəndələrinə) mərhəmətli olan (Allah) tərəfindən nazil edilmişdir ki,

6. (Onunla Cahiliyyət dövründə) ataları (Allahın əzabı ilə) qorxudulmamış və (Allahın hökmlərindən, imandan, tövhiddən) qafil olan bir tayfanı xəbərdar edib qorxudasan!

7. And olsun ki, onların əksəriyyəti barəsində o söz (əzəldən buyurduğumuz əzab hökmü) gerçək olmuşdur, çünki onlar (Allaha və Peyğəmbərinə) iman gətirməzlər. (Biz onların iman gətirməyəcəklərini Öz əzəli elmimizlə bilib lövhi-məhfuzda təsbit etmişik).

8. Biz onların boyunlarına dəmir həlqələr (zəncir) keçirtmişik. (O həlqələr) onların lap çənələrinə dirənmişdir. Buna görə də başları yuxarı qalxmış, gözləri aşağı dikilmişdir. (Kafirlərin əlləri zəncirlə boyunlarına bağlandığı üçün başlarını yuxarı qaldırmağa, gözlərini də aşağı dikməyə məcbur olmuşlar. Onlar boyunlarını bir tərəfə döndərmək, əllərini sağa-sola tərpətmək, ətrafa nəzər salmaq, hətta ayaqlarının altını görmək iqtidarında belə deyillər. Beləliklə, kafirlər nə haqqı görər, nə də ona boyun əyərlər).

9. Biz onların önlərinə və arxalarına sədd çəkib (gözlərini) bağlamışıq. Buna görə də (Allahın qüdrətinə dəlalət edən əlamətləri) görmürlər. (Kafirlərin qəlb gözü kor edilmiş, bütün iman yolları üzlərinə bağlanmışdır. Onlar zahirən görsələr də, mənən kordurlar).

10. (Ya Peyğəmbər!) Sən onları qorxutsan da, qorxutmasan da, onlar çün birdir: iman gətirməzlər!

11. Sən ancaq Qurana tabe olub, Rəhmandan (Onu) görmədən qorxan kimsəni qorxuda bilərsən. Beləsinə (axirətdə) bağışlanacağı və çox gözəl bir mükafata (Cənnətə) nail olacağı ilə müjdə ver!

12. Həqiqətən, ölüləri diriIdən, onların (dünyada) nə etmiş olduqlarını və qoyub getdiklərini yazan Bizik. Biz hər şeyi hesaba alıb açıq-aydın Kitabda (lövhi-məhfuzda) təsbit etmişik.

13. (Ya Peyğəmbər!) Sən onlara o şəhər əhlini (antakiyalıları) misal çək! O zaman ki, onlara elçilər gəlmişdi.

14. O zaman onlara iki elçi göndərmişdik, amma onlar ikisini də təkzib etmişdilər. Biz də (o iki elçini) üçüncüsü ilə qüvvətləndirmişdik. Onlar dedilər: "Həqiqətən, biz sizə göndərilmiş elçilərik!"

15. (Antakiyalılar:) "Siz də bizim kimi ancaq adi bir insansınız. (Heç bir şeydə bizdən üstün deyilsiniz. Əgər peyğəmbər olsaydınız,

mələk qiyafəsində gələrdiniz). Rəhman (sizə) heç bir şey (kitab, möcüzə) nazil etməmişdir. Siz sadəcə olaraq yalan danışırsınız!” – dedilər.

16. (Elçilər) dedilər: “Rəbbimiz bizim, doğrudan da, sizə göndərilmiş elçilər olduğumuzu bilir.

17. Bizim vəzifəmiz yalnız (Allahın hökmlərini, peyğəmbərliyi) açıq-aşkar təbliğ etməkdir!”

18. (Antakiyalılar) dedilər: “Biz sizdə bir nəhslik gördük. (Sizin ucbatınızdan bizi bədbəxtlik basdı, bizə uğursuzluq üz verdi. Gəlişinizlə aramıza nifaq düşdü, yurdumuzun bərəkəti çəkildi, yağışımız kəsildi). Həqiqətən, əgər (Allahın elçiləri olmaq iddianızdan) əl çəkməsəniz, sizi mütləq daşqalaq edəcəyik və bizdən sizə mütləq bir şiddətli əzab toxunacaqdır”.

19. (Elçilər) dedilər: “Sizin nəhsliyiniz (uğursuzluğunuz) öz ucbatınızdandır (öz küfrünüz üzündəndir). Məgər sizə öyüd-nəsihət verildikdə (onu uğursuzluğa, nəhsliyəmi yozursunuz)! Xeyr, siz (günah etməkdə) həddi aşan bir camaatsınız!”

20. Şəhərin (Antakiyanın) ən ucqar tərəfindən (abid) bir kişi (Həbib Həccar) çaparaq gəlib dedi: “Ey qövmüm! Elçilərə tabe olun!

21. Sizdən (haqqa dəvət müqabilində) heç bir muzd (mükafat) istəməyən və özləri də doğru yolda olan kəslərin ardınca gedin!

22. (Antakiyalılar Həbib Həccardan: – Sən bu elçilərə tabe olmusanmı? – deyə soruşduqda o dedi: ) “Axı mən niyə məni yaradana ibadət etməməliyəm?! Siz də (qiyamət günü) Onun hüzuruna qaytarılacaqsınız!

23. Mən heç Ondan qeyri tanrılarmı qəbul edərəm?! Əgər Rəhman mənə bir zərər yetirmək istəsə, onların şəfaəti mənə heç bir fayda verməz və onlar məni (Allahın əzabından) xilas edə bilməzlər.

24. Belə olacağı təqdirdə mən (haqq yoldan) açıq-aşkar azmış olaram.

25. (Ey Antakiya əhli, yaxud siz ey elçilər!) Həqiqətən, mən sizin Rəbbinizə iman gətirdim. Məni eşitdin! (İman gətirməyimə şahid olun!)"

26. (Antakiyalılar bu sözü eşidən kimi Həbib Həccarı daşqalaq edib öldürdülər). Ona (şəhid olduğu üçün Allah dərgahından): "Cənnətə daxil ol! – deyildi. (Həbib Həccar Cənnətə daxil olub oradakı nemətləri, hörmət-izzəti gördükdən sonra) dedi: "Kaş qövmüm biləydi ki,

27. Rəbbim məni niyə bağışladı və nəyə görə hörmət sahiblərindən etdi!"

28. Ondan (Həbib Həccardan) sonra tayfasının üstünə göydən heç bir qoşun göndərmədik və heç göndərən də deyildik.

29. (Onların cəzası) ancaq dəhşətli (tükürpədici) bir səs (Cəbrailin qışqırtısı) oldu. Dərhal məhv olub (şam kimi sönüb) getdilər.

30. Vay bu bəndələrin halına! Onlara elə bir peyğəmbər gəlməz ki, ona istehza etməsinlər! (Buna görə də əzaba düçar olarlar).

31. Məgər onlar (Məkkə müşrikləri) özlərindən əvvəl neçə-neçə nəsilləri məhv etdiyimizi və həmin nəsillərin bir daha onların yanına qayıtmadığını görmürlərmi?

32. Hamı, (bəlli) hamı (qiyamət günü) Bizim hüzurumuza gətiriləcəkdir!

33. Ölü torpaq onlar üçün (qiyamət günü ölüləri dirildəcəyimizə) bir dəlildir. Biz onu (yağışla) dirildir, oradan (arpa, buğda, düyü və s. kimi) dənələr çıxardırıq, onlar da ondan yeyirlər.

34. Biz orada xurma və üzüm bağları əmələ gətirir, bulaqlar qaynadırıq ki,

35. Onların meyvələrindən və öz əlləri ilə becərdiklərindən (yaxud becərmədiklərindən) yesinlər. Hələ də şükür etməzlər?

36. Yerin yetişdirdiklərindən, onların (insanların) özlərindən və bilmədiklərindən (erkək və dişi olmaqla) cütlər yaradan Allah pakdır, müqəddəsdir! (Eyibsiz və nöqsansızdır!)

37. Gecə də onlar üçün (qüdrətimizə) bir dəlildir. Biz gündüzü ondan sıyırıb çıxardan kimi onlar zülmət içində olarlar.

38. Günəş də (qüdrət əlamətlərimizdən biri kimi) özü üçün müəyyən olunmuş yerdə seyr edən. Bu, yenilməz qüvvət sahibi olan, (hər şeyi) bilən Allahın təqdiridir (əzəli hökmüdür).

39. Biz ay üçün mənzillər müəyyən etdik. Nəhayət, o (həmin mənzilləri başa vurduqdan sonra) dönüb xurma ağacının qurumuş əyri budağı kimi (hilal şəklində) olar.

40. Nə günəş aya çatar (yetişər), nə də gecə gündüzü ötə bilər. (Günəş, ay və ulduzların) hər biri (özünə məxsus) bir göydə (öz hədəqəsində, öz dairəsində) üzər.

41. Övladlarını (yaxud Nuhun tufanı vaxtı ulu babalarını müxtəlif yüklərlə) dolu gəmiyə mindirməyimiz (sonra dənizdə istədikləri yerə getmələri) də onlar üçün (qüdrətimizə) bir dəlildir.

42. Onlar üçün bunun kimi (başqa) minik vasitələri də yaratdıq.

43. Əgər istəsək, onları suya qərq edərik. Nə bir dadlarına çatan olar, nə də nicat taparlar.

44. Yalnız Bizdən bir mərhəmət olaraq və bir qədər (əcəlləri çatanadək) dolanıb keçinmələri üçün (onları xilas edərik).

45. Onlara (müşriklərə): "Önünüzdə və arxanızda olandan (dünya və axirət əzabından) qorxun ki, bəlkə, rəhm olunasınız!" – deyildikdə (dönüb gedər, öyüd-nəsihətə qulaq asmazlar).

46. Onlara Rəbbinin ayələrindən elə birisi gəlməz ki, ondan üz çevirməsinlər!

47. Onlara: "Allahın sizə verdiyi ruzidən (ehtiyacı olanlara) sərf edin!" – deyildiyi zaman, kafirlər möminlərə: "Allahın istədiyi təqdirdə özü yedirə biləcəyi kimsəni bizmi yedirdəcəyik?!" – deyərlər. Siz (bu etiqadınızla) sadəcə olaraq (haqq yoldan) açıq-aşkar azmısınız.

48. Onlar: "Əgər doğru söyləyirsinizsə, (bir xəbər verin görək) bu vəd (qiyamət günü) nə vaxt yerinə yetəcək?" – deyərlər.

49. Onlar (küçədə, bazarda) bir-biri ilə çənə-boğaz olarkən özlərini saracaq yalnız bir dəhşətli (tükürpədici) səsə (İsrafilin surunun birinci dəfə çalınmasına) bənddirlər.

50. Artıq nə bir vəsiyyət etməyə iqtidarları olar, nə də ailələrinin yanına qayıda bilərlər!

51. Sur (ikinci dəfə) çalınan kimi (qiyamət günü) qəbirlərindən qalxıb sürətlə Rəbbinin hüzuruna axışacaqlar.

52. Onlar deyəcəklər: "Vay halımıza! Bizi yatdığımız yerdən (qəbir evindən) kim qaldırdı? (Onlara belə deyiləcək: ) "Bu, Rəhmanın məxluqata buyurduğu vəddir (qiyamət günüdür). Peyğəmbərlər doğru deyirlərmiş!"

53. Yalnız bir dəhşətli səs qopan (İsrafilin axırıncı dəfə surunu çalan) kimi onlar hamısı (haqq-hesab üçün) qarşımızda hazır duracaqlar.

54. Bu gün heç kəsə heç bir haqsızlıq edilməyəcəkdir. Siz ancaq etdiyiniz əməllərin cəzasını çəkəcəksiniz!

55. Cənnət əhli bu gün keflə (əyləncə ilə) məşğuldur.

56. Onlar (mömin kişilər) və zövcələri kölgəliklərdə (yumşaq) taxtlara söykənmişlər.

57. Orada onlar üçün (hər cür) meyvə və istədikləri hər şey vardır.

58. Rəhmli Rəbdən (onlara) "salam" deyiləcəkdir.

59. (Kafirlər Cəhənnəmə varid edilərək onlara belə deyiləcək: ) "Ey günahkarlar! Bu gün (möminlərdən) ayrılın!"

60. Ey Adəm övladı! Məgər Mən sizdən əhd almadımmı ki, Şeytana ibadət etməyin, o sizin açıq-aşkar düşməninizdir,

61. Və (sizə buyurmadımmı ki) Mənə ibadət edin, doğru yol budur?!

62. Həqiqətən, (Şeytan) içərinizdən çoxlarını yoldan çıxartdı. Məgər ağlınız kəsmirdi?

63. Bu sizə vəd olunan Cəhənnəmdir!

64. Kafir olduğunuza görə bu gün girin ora, yanın!

65. Bu gün (Allaha and olsun ki, biz müşrik, kafir deyildik – dediklərinə görə) onların ağızlarını möhürləyirik. Etdikləri əməllər (qazandıqları günahlar) barəsində onların əlləri Bizimlə danışar, ayaqları isə şəhadət verər.

66. Əgər istəsəydik, (dünyada) gözlərini büsbütün kor edərdik (onları zahiri gözdən də məhrum edərdik) və onda onlar (adət etdikləri) yolda bir-birini ötməyə çalışardılar (və ya doğru yolu tapmaq üçün bir-biri ilə ötüşərdilər, ora-bura vurnuxardılar). Amma (belə bir vəziyyətdə yolu) necə görə bilərdilər? (Lakin Biz onları dünyada belə bir korluğa mübtəla etmədik. Onlar Allahın qüdrət əlamətlərini görür, bununla belə öz pis yollarını tutub gedirdilər. Beləliklə, onlar iman gətirmədilər ki, gətirmədilər).

67. Əgər istəsəydik, onları lap yerlərindəcə elə bir kökə (elə bir şəklə) salardıq ki, nə irəli, nə də geri gedə bilərdilər. (Kafirləri topal edər, meymuna, donuza, daşa döndərərdik. Və ya onları evlərinin içində həlak edərdik, heç tərpənə də bilməzdilər).

68. Hər kəsə uzun ömür versək, onu xilqətcə dəyişib tərsinə çevirərik, başqa şəklə salarıq (qüvvəsini alar, gözünün nurunu aparar, hafizəsini zəiflədib bildiklərini unutdurar, özünü də uşaq kimi edərik). Məgər (kafirlər bütün bunları gördükdən sonra Allahın hər şeyə qadir olduğunu) dərk etməzlərmi?

69. Biz ona (Muhəmməd əleyhissəlama) şer öyrətmədik və bu ona heç yaraşmaz da (lazım da deyildir). Ona vəhy olunan ancaq öyüd-nəsihət və (haqla batili ayırd edən) açıq-aşkar Qurandır ki,

70. Onunla diri olanları (ağıl və bəsirət sahiblərini) qorxutsun və o deyilən söz (əzəldən buyurduğumuz əzab hökmü) kafirlər barəsində gerçək olsun.

71. Məgər (Məkkə müşrikləri) Bizim Öz əllərimizlə (Öz qüdrətimizlə) onlar üçün davarlar yaratdığımızı və özlərinin də onlara sahib olduqlarını görmürlərmi?!

72. Bunları (bu davarları) onların ixtiyarına verdik. Onlardan mindikləri də var, ətini yedikləri də.

73. Onların (o heyvanlarda başqa-başqa) mənfəətləri və içəcəkləri (südləri) də var. Hələ də şükür etməzlərmi?

74. (Müşriklər) bəlkə, özlərinə bir yardım oluna deyə, Allahdan başqa tanrılar (bütlər) qəbul etdilər.

75. (O bütlər) onlara heç bir kömək edə bilməzlər. Onlar özləri isə bütlər üçün (onları başqalarından qoruyan) hazır əsgərlərdir.

76. (Ya Rəsulum!) Onların (sən peyğəmbər deyilsən, şairsən) sözü səni kədərləndirməsin. Biz onların gizlində də, aşkarda da nə etdiklərini bilirik.

77. Məgər insan (As ibn Vail, yaxud Übeyy ibn Xələf) onu nütfədən yaratdığımızı görmədimi ki, birdən-birə (Rəbbinə) açıq bir düşmən kəsilərək,

78. Öz yaradılışını unudub: "Çürümüş sümükləri kim dirildə bilər?!" – deyə, hələ Bizə bir məsəl də çəkdi.

79. (Ya Peyğəmbər!) De: "Onları ilk dəfə yoxdan yaradan dirildəcəkdir. O, hər bir məxluqu (yaradılışından əvvəl də, sonra da) çox gözəl tanıyandır!

80. O yaradan ki, sizin üçün yaşıl ağacdan (Ərəbistanda bitən mərx və ifar ağaclarından) od əmələ gətirdi. Budur, siz indi ondan (o iki ağacı bir-birinə sürtməklə) od yandırırsınız".

81. Məgər göyləri və yeri yaradan (bir daha) onlar kimisini yaratmağa qadir deyilmi?! Əlbəttə (qadirdir). (Hər şeyi) yaradan, (hər şeyi) bilən Odur!

82. Bir şeyi (yaratmaq) istədiyi zaman (Allahın) buyurduğu ona ancaq: "Ol!" deməkdir. O da dərhal olar.

83. Hər şeyin hökmü (ixtiyarı) əlində olan (Allah) pakdır, müqəddəsdir. Siz də (qiyamət günü dirilib) Onun hüzuruna qaytarılacaqsınız!

## .37.
## əs-Saffat (Səf-səf duranlar) surəsi
**(Məkkədə nazil olmuşdur, 182 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. And olsun (Rəbbinə ibadət üçün səmada) səf-səf duranlara (mələklərə);

2. (Buludları) qovduqca qovanlara (yaxud şeytanların pis əməllərinə mane olanlara, insanlara günah işlər görməyi qadağan edənlərə)

3. Və Quran oxuyanlara!

4. Həqiqətən, sizin Allahınız birdir!

5. O, göylərin, yerin və onların arasında olanların (bütün məxluqatın) Rəbbidir. Məşriqlərin (şərqin və qərbin – günəşin, ayın və ulduzların doğub batdığı yerlərin) də Rəbbi Odur.

6. Biz (sizə) ən yaxın olan göy üzünü (dünya səmasını) ulduzlarla bəzədik. (Günəş, ay və ulduzlar başqa-başqa göylərdə olduqları halda, siz onların hamısını özünüzlə müqayisədə ən yaxın bir yerdə, sanki başınızın üstündə görürsünüz).

7. (Biz həm də göyü) itaətdən çıxmış hər bir şeytandan qoruduq.

8. Onlar ali bəzmə (yuxarı aləmə, mələklər aləminin söhbətlərinə) qulaq asa bilməz və hər tərəfdən (axan ulduzlar vasitəsilə) qovulub atılar.

9. (Səmadan) kənar edilərlər. Onları daimi bir əzab gözləyir!

10. Ancaq (şeytanlar içərisində mələklərin söhbətlərindən bir sözü, bir xəbəri) çırpışdıran (oğrun-oğrun öyrənən) olsa, onu da dərhal yandırıb-yaxan bir ulduz (hər şeyi dəlib keçən bir məşəl) təqib edər.

11. İndi (ya Peyğəmbər, bu müşriklərdən) soruş: onları yaratmaq çətindir, yoxsa Bizim (başqa) yaratdıqlarımızı? [Və ya: xilqətcə onlar güclüdürlər, yoxsa Bizim (başqa) yaratdıqlarımız?] Axı Biz onları (insanların babası Adəmi) yapışqan (kimi) bir palçıqdan yaratdıq.

12. Bəli, sən onlara (müşriklərin Allahın qüdrət əlamətlərini gördükləri halda qiyamətə inanmamalarına) təəccüblənirsən, onlar isə (sənin bu inamına) istehza edirlər.

13. Onlara (Quranla Allahın dəlilləri ilə) öyüd-nəsihət verildikdə düşünüb ibrət almazlar.

14. Bir möcüzə gördükdə isə ona istehza edərlər.

15. Və belə deyərlər: “Bu ancaq açıq-aşkar bir sehrdir.

16. Məgər biz öldükdən, torpaq və sürsümük olduqdan sonra dirildiləcəyikmi?!

17. Eləcə də (bizdən) əvvəlki atalarımız (dirildiləcəklərmi)?!”

18. (Ya Peyğəmbər!) De: “Bəli, özü də zəlil (xar) olaraq (dirildiləcəksiniz).

19. O yalnız dəhşətli bir səsdən (İsrafilin suru ikinci dəfə üfürməsindən) ibarətdir. Onlar dərhal (dirilib başlarına gətirilən müsibətlərə) baxacaqlar.

20. Və deyəcəklər: “Vay halımıza! Bu, haqq-hesab (cəza) günüdür!”

21. (Mələklər isə onlara belə deyəcəklər): “Bu (dünyada) yalan hesab etdiyiniz (haqq ilə batili, möminlə kafiri) ayırd etmə günüdür!”

22. (Allah mələklərə belə buyuracaqdır: ) "Yığın bir yerə zülm (küfr) edənləri, onların həmtaylarını və ibadət etdiklərini -

23. Allahdan qeyri! Onlara Cəhənnəm yolunu göstərin!

24. Onları tutub saxlayın, çünki sorğu-sual olunacaqlar!"

25. (Mələklər istehza ilə onlara deyəcəklər: ) "Sizə nə olub ki, (bu gün dünyadakı kimi) bir-birinizə kömək edə bilmirsiniz?"

26. Bəli, onlar bu gün (Allahın əmrinə) təslim olmuşlar!

27. Onların bir qismi (tabe olanlar) digəri (öz başçıları) ilə çənə-boğaz olmağa başlayacaq.

28. (Tabe olanlar öz başçılarına) deyəcəklər: "Siz bizim yanımıza (özünüzün haqlı olduğunuz barədə) and-amanla (bizim bərəkətli və uğurlu saydığımız sağ tərəfdən) gəlirdiniz. (Əslində isə bizi haqq yoldan azdırmısınız)".

29. (Başçıları) deyəcəklər: "Xeyr, siz (Allahın vəhdaniyyətinə) inanmırdınız.

30. Və bizim sizin üzərinizdə heç bir hökmümüz də yox idi. Xeyr, siz (özünüz) azğın (günah etməkdə həddi aşmış) bir qövm idiniz.

31. Buna görə də Rəbbimizin sözü (əzab vədəsi) bizim barəmizdə gerçəkləşdi. Biz mütləq (əzabı) dadacağıq!

32. Biz sizi yoldan çıxartdıq, çünki biz özümüz yoldan çıxmış kimsələr idik!"

33. O gün hamısı əzaba (cəhənnəm oduna yanmağa) şərik olacaqlar.

34. Həqiqətən, Biz günahkarlarla belə rəftar edirik.

35. Onlara: "Allahdan başqa heç bir tanrı yoxdur!" – deyildiyi zaman təkəbbür göstərirdilər.

36. Və: Biz heç divanə bir şairdən ötrü tanrılarımızı tərk edərikmi?!" – deyirdilər.

37. Xeyr, o, haqla (Quranla) gəldi və (özündən əvvəlki) peyğəmbərləri təsdiq etdi.

38. Siz (müşriklər) şiddətli əzabı mütləq dadacaqsınız!

39. Siz ancaq etdiyiniz əməllərin cəzasını alacaqsınız.

40. Allahın müxlis bəndələri isə müstəsnadırlar (onlara cəza verilməyəcəkdir).

41. Məhz onlar üçün məlum bir ruzi vardır.

42. (Onlar üçün) növbənöv meyvələr vardır. Onlar hörmətə (şərəfə) nail olacaqlar –

43. Nəim cənnətlərində.

44. Onlar taxtlar üstündə bir-biri ilə üzbəüz əyləşəcəklər.

45. Onlar üçün (cənnət saqiləri tərəfindən adamı kefləndirməyən, behiştdə çay kimi axan) məin (şərab) dolu piyalələr dolandırılacaqdır.

46. Ağappaq, özü də içənlərə ləzzət verən (bir məin).

47. Onun içində (dünyadakı şərabdan fərqli olaraq) ağlı başdan çıxaran (başağrısı, süstlük verən) heç bir şey yoxdur. Onlar ondan məst də olmazlar.

48. Onların yanında gözəl (irigözlü), baxışları (yalnız ərlərinə) dikilmiş zövcələr olacaqdır.

49. Onlar, sanki örtülü (bağlı, heç bir əl dəyməmiş, qabığı içində təzə-təzə qalmış, ağappaq) yumurtadırlar (yaxud sədəf içində gizlənmiş incidirlər).

50. Onlar bir-biri ilə (dünyada gördükləri barədə) sorğu-suala (söz-söhbətə) başlayacaqlar.

51. Onlardan biri belə deyəcək: “Mənim bir yoldaşım var idi.

52. O deyirdi: “Sən, doğrudan da, inanmırsan ki,

53. Biz öldükdən, torpaq və sür-sümük olduqdan sonra (dirildilib) sorğu-sual olunacağıq (və əməllərimizə görə cəzalandırılacağıq)?”

54. (Sonra həmin şəxs Cənnətdəki yoldaşlarına) deyəcək: “Siz (indi onun nə halda olduğunu) bilirsinizmi?” (Onlar: “Xeyr”, - deyə cavab verəcəklər).

55. O özü baxıb onu (yoldaşını) Cəhənnəmin ortasında görəcək

56. Və (ona üz tutub) deyəcəkdir: “Allaha and olsun ki, sən az qala məni (yoldan çıxardıb) məhv edəcəkdin!

57. Əgər Rəbbimin lütfü olmasaydı, mən də (Cəhənnəmə) gətirilənlərdən olardım!

58. Biz artıq ölməyəcəyik, elə deyilmi?

59. (Dünyadakı) ilk ölümümüz istisna olmaqla! Biz, əzab da görməyəcəyik!”

60. Həqiqətən, bu, böyük qurtuluşdur (uğurdur)!

61. Qoy (dünyada) çalışanlar bunun üçün (belə bir əbədi səadət uğrunda) çalışsınlar!

62. (Ey insanlar!) Qonaq olmağa (ziyafət üçün) bu (Cənnət) yaxşıdır, yoxsa (Cəhənnəmdəki pis qorxulu, meyvəsi zəhər kimi acı) zəqqum ağacı?

63. Biz onu zalımlar (cəhənnəm istisində heç bir ağac bitməz deyən kafirlər) üçün bir bəla (dərd) etdik.

64. O elə bir ağacdır ki, Cəhənnəmin lap dibindən (cəhənnəm odunun içindən) çıxar.

65. Onun meyvəsi şeytanların başı kimidir (olduqca çirkin və əcaibdir).

66. Onlar (cəhənnəm əhli) ondan yeyəcək və qarınlarını onunla dolduracaqlar.

67. Sonra onlar üçün (içməyə) qaynar su ilə qatışmış irin vardır.

68. Daha sonra onların qayıdacaqları yer mütləq yenə Cəhənnəmdir!

69. Çünki onlar atalarını (dünyada haqq yoldan) azmış gördülər.

70. Bununla belə yüyürə-yüyürə onların ardınca düşüb getdilər.

71. Həqiqətən, onlardan (Məkkə müşriklərindən) əvvəlkilərin (keçmiş ümmətlərin) əksəriyyəti (haqq yoldan) azmışdı.

72. And olsun ki, Biz onlara (Allahın əzabı ilə) qorxudan peyğəmbərlər göndərmişdik.

73. (Ya Rəsulum!) Bir gör o qorxudulanların (lakin düz yola gəlməyənlərin) axırı necə oldu!

74. Yalnız Allahın sadiq bəndələrindən başqa! (Onlara heç bir əzab verilmədi).

75. Həqiqətən, Nuh (öz tayfasının məhv edilməsi barədə) Bizə dua etmiş, onun duası necə də gözəl qəbul olunmuşdu!

76. Biz (Nuh qövmünü suda boğub) onu və ailəsini böyük fəlakətdən qurtardıq.

77. Məhz onun nəslini (qiyamətə qədər yer üzündə) baqi etdik.

78. Sonralar gələnlər içərisində onun üçün (yaxşı ad, gözəl xatirə) qoyduq.

79. (Onu belə yad edirlər: ) “Bütün aləmlər (bəşər əhli) içərisində Nuha salam olsun!”

80. Həqiqətən, Biz yaxşı əməl sahiblərini belə mükafatlandırırıq!

81. Şübhəsiz ki, o Bizim mömin bəndələrimizdən idi!

82. Sonra başqalarını (Nuha iman gətirməyənləri) suda boğduq.

83. Həqiqətən, İbrahim də onun yolu ilə gedənlərdən (Nuhun firqəsindən) idi.

84. O zaman o öz Rəbbinin hüzuruna tərtəmiz bir qəlblə gəlmişdi.

85. Həmin vaxt o, atasına və tayfasına belə demişdi: “Siz nəyə ibadət edirsiniz?

86. Allahı qoyub yalançı tanrılarımı istəyirsiniz?

87. Aləmlərin Rəbbi barəsində zənniniz nədir?” (Onun ruzisini yeyib bütlərə tapınırsınız? Məgər bunun cəzasını çəkməyəcəksiniz?!)

88. (İbrahim) ulduzlara bir nəzər saldı.

89. Və (ətrafındakıları özündən uzaqlaşdırmaq məqsədilə) dedi: “Mən xəstəyəm!”

90. (İbrahimin yanındakılar xəstəliyin onlara yoluxmasından qorxaraq, həm də o gün qeyd edəcəkləri bayrama tələsərək) ondan üz çevirib getdilər.

91. (İbrahim) xəlvətcə onların tanrılarının yanına gedib (istehza ilə) dedi: “Məgər (yanınızda olan bu təamları) yeməyəcəksiniz?

92. Sizə nə olub ki, danışmırsınız?”

93. Sonra bütlərin üstünə yüyürüb sağ əli ilə onlara möhkəm bir zərbə endirdi.

94. (Bundan xəbər tutan tayfası) yüyürə-yüyürə onun yanına gəldi.

95. (İbrahim onlara) dedi: “Siz özünüz yonub düzəltdiyiniz şeylərəmi ibadət edirsiniz?

96. Halbuki sizə də, sizin düzəltdiklərinizi də Allah yaratmışdır!”

97. Onlar dedilər: “Bunun (İbrahim) üçün bir bina tikin, (içərisini odunla doldurub) özünü də oda atın!”

98. Onlar onun üçün belə bir hiylə qurmaq istədilər, Biz isə onları çox səfil (zəlil) bir vəziyyətə saldıq. (Hiylələri baş tutmadı, İbrahimə heç bir şey edə bilmədilər).

99. (İbrahim oddan xilas olduqdan sonra) dedi: “Mən Rəbbimə doğru (Allahın mənə buyurduğu yerə - Şama tərəf) gedirəm. O mənə doğru yolu mütləq göstərəcəkdir!”

100. (İbrahim müqəddəs torpağa yetişdikdən sonra dua edib) dedi: “Ey Rəbbim! Mənə salehlərdən olan (bir övlad) bəxş et!”

101. Biz də ona həlim xasiyyətli bir oğlan uşağı (İsmail) ilə müjdə verdik.

102. O, yüyürüb qaçmaq (atasına kömək edə bilmək) çağına (on üç yaşına) çatdıqda (İbrahim) dedi: “Oğlum! Yuxuda gördüm ki, səni qurban kəsirəm. Bax gör (bu barədə) nə fikirləşirsən!” O dedi: “Atacan! Sənə nə əmr olunursa, onu da et. İnşallah, mənim səbirlilərdən olduğumu görəcəksən!”

103. Onların hər ikisi (Allahın əmrinə) təslim olduğu və (İbrahim İsmaili qurban kəsmək üçün) üzüstə yerə yıxdığı zaman

104. Biz ona belə xitab etdik: “Ya İbrahim!

105. Artıq sən röyanın düzgünlüyünü (Allah tərəfindən olduğunu) təsdiq etdin!” (Sənə yuxuda nə əmr olunmuşdusa, onu yerinə yetirdin. Allah sənə lütf edərək oğlunun yerinə bir qoç kəsməyi buyurur). Biz yaxşı iş görənləri belə mükafatlandırırıq.

106. Şübhəsiz ki, bu, açıq-aydın bir imtahan idi.

107. Biz ona böyük bir qurbanlıq (Habilin qurbanlıq qoçunu) əvəz verdik.

108. Sonradan gələnlər arasında onun üçün (yaxşı ad, gözəl xatirə) qoyduq.

109. (Onu belə yad edirlər: ) “İbrahimə salam olsun!”

110. Həqiqətən, Biz yaxşı əməl sahiblərini belə mükafatlandırırıq!

111. Şübhəsiz ki, o Bizim mömin bəndələrimizdən idi!

112. Ona salehlərdən olan İshaqın peyğəmbər olacağı ilə müjdə verdik.

113. Biz ona İshaqa (peyğəmbərliklə, övlad çoxluğu ilə) bərəkət verdik. Onların hər ikisinin nəslindən yaxşı işlər görən də var, açıq-aşkar özünə zülm edən də!

114. Biz Musa və Haruna da nemət (peyğəmbərlik) bəxş etdik.

115. Onların hər ikisini böyük fəlakətdən (Fironun əsarətindən, yaxud suda boğulmaqdan) qurtardıq.

116. Onlara yardım etdik və onlar (düşmənə) qalib gəldilər.

117. Onların hər ikisinə (hökmləri) açıq-aydın o kitabı (Tövratı) verdik.

118. Onların hər ikisini doğru yola müvəffəq etdik.

119. Sonradan gələnlər içərisində onların hər ikisi üçün (yaxşı ad, gözəl xatirə) qoyduq.

120. (Onları belə yad edirlər: ) “Musaya və Haruna salam olsun!”

121. Həqiqətən, Biz yaxşı əməl sahiblərini belə mükafatlandırırıq!

122. Şübhəsiz ki, onların hər ikisi Bizim mömin bəndələrimizdən idi.

123. Həqiqətən, İlyas da (Bizim tərəfimizdən göndərilmiş) peyğəmbərlərdəndir!

124. Bir zaman o öz tayfasına belə demişdi: “Məgər (bütlərə ibadət etməklə) Allahdan qorxmursunuz?

125. Məgər siz yaradanların ən yaxşısını (Allahı) qoyub Bələ (Bəl adlı bütə) ibadət edirsiniz?

126. Həm sizin Rəbbiniz, həm də (sizdən) əvvəlki atalarınızın (babalarınızın) Rəbbi olan Allahımı (tərk edirsiniz)?”

127. Lakin onlar onu təkzib etdilər, buna görə də (qiyamət günü Cəhənnəmə) gətiriləcəklər.

128. Yalnız Allahın müxlis bəndələrindən başqa!

129. Sonradan gələnlər arasında onun üçün (yaxşı ad, gözəl xatirə) qoyduq.

130. (Onu belə yad edirlər: ) “İlyasinə (İlyasa) salam olsun!”

131. Həqiqətən, Biz yaxşı əməl sahiblərini belə mükafatlandırırıq!

132. Şübhəsiz ki, o Bizim mömin bəndələrimizdən idi!

133. Həqiqətən, Lut da peyğəmbərlərdəndir!

134. (Ya Rəsulum!) Yadına sal ki, Biz o vaxt (Lut tayfasına müsibət üz verdiyi zaman) onu və bütün ailəsini xilas etdik.

135. Yalnız əzab içində qalanlar arasında olan qoca qarıdan (Lutun övrətindən) başqa!

136. Sonra isə başqalarını (iman gətirməyənləri) yox etdik.

137. Siz (Şama getdiyiniz zaman) səhər vaxtı onların yurdundan keçirsiniz;

138. Eləcə də axşam vaxtı. Məgər bir düşünüb-daşınmırsınız?

139. Həqiqətən, Yunis də (Bizim tərəfimizdən göndərilmiş) peyğəmbərlərdəndir!

140. (Ya Peyğəmbər!) Yadına sal ki, bir zaman o, (qövmünün küfrü üzündən yük və adamla) dolu bir gəmiyə qaçmışdı.

141. (Gəmidə olanlar) püşk atmış və (püşk ona düşdüyü üçün) məğlub edilənlərdən olmuşdu. (Yunis gəmiyə mindiyi zaman gəmi yerindən tərpənməmiş, buna görə də sərnişinlər: "Yəqin ki, içərimizdə ağasından qaçmış kölə vardır", - demişdilər. Kölənin kim olduğunu bilmək üçün püşk atılmış və o, Yunisə düşmüşdü. Yunis özünü dənizə atmağa məcbur olmuşdu).

142. (Yunis Allahın izni olmadan qövmünü tərk edib getdiyinə görə) özünü qınayarkən (dənizə atılarkən) balıq onu udmuşdu.

143. Əgər o, (Allahı) çox təqdis edənlərdən (namaz qılanlardan) olmasaydı,

144. Yəqin ki, balığın qarnında qiyamət gününə qədər qalardı.

145. Nəhayət, o, xəstə olduğu halda onu boş bir yerə (sahilə) atdıq.

146. Və (başı) üstündə (ona kölgə salmaq üçün) iri yarpaqlı bir ağac (yaxud qabaq tağı) bitirdik.

147. Biz onu yüz min nəfərə və daha çox kimsəyə peyğəmbər göndərdik.

148. Nəhayət, onlar ona (Yunisə) iman gətirdilər və Biz də onlara müəyyən vaxtadək (ömürlərinin axırına kimi) gün-güzəran verdik.

149. (Ya Peyğəmbər! İndi o müşriklərdən) soruş: “Deməli, qızlar sənin Rəbbinin, oğlanlar isə onların özlərinindir, eləmi?”

150. Yoxsa Biz mələkləri dişi yaratmışıq və onlar da (buna) şahid olublar?!

151. Xəbərin olsun ki, onlar öz yalanları üzündən mütləq belə deyəcəklər:

152. “Allah övlad törətmişdir (mələklər Onun qızlarıdır)”. Onlar, həqiqətən, yalançıdırlar!

153. Məgər Allah (mələkləri özünə övlad götürməklə) qızları oğlanlardan üstünmü tutmuşdur?!

154. Sizə nə olmuşdur, necə mühakimə yürüdürsünüz?

155. Heç düşünürsünüz?!

156. Yoxsa sizin açıq-aşkar bir dəliliniz vardır?!

157. Əgər doğru danışırsınızsa, kitabınızı gətirin!

158. (Müşriklərə həm də özlərindən) Onunla (Allahla) cinlər (pərilər, yaxud mələklər) arasında bir qohumluq əlaqəsi icad etdilər. Həqiqətən, cinlər onların (bu sözü deyənlərin qiyamət günü Cəhənnəmə) gətiriləcəyini bilirlər.

159. Allah (müşriklərin) Ona aid etdikləri sifətlərdən tamamilə uzaqdır!

160. Allahın müslis (mömin) bəndələri isə istisnadır.

161. (Ey Müşriklər!) Nə siz, nə də ibadət etdikləriniz

162. Heç kəsi tovlayıb yoldan çıxara bilməzsiniz;

163. Yalnız Cəhənnəmə girəcək kimsədən başqa!

164. (Cəbrail Peyğəmbər əleyhissəlama belə dedi: ) "Bizdən (mələklərdən) elə birisi yoxdur ki, onun (səmada Allaha ibadət üçün) müəyyən bir yeri olmasın!

165. Həqiqətən, biz səf-səf dururuq.

166. Və (Allahı) təqdis edib şəninə təriflər deyirik.

167. (Məkkə müşrikləri) təkidlə belə deyirdilər:

168. "Əgər bizdə əvvəlkilərin kitablarından biri olsa idi,

169. Biz də mütləq Allahın müxlis bəndələri olardıq!"

170. Amma onu (Quranı) inkar etdilər. Onlar (küfrlərinin aqibətini) mütləq biləcəklər.

171. And olsun ki, peyğəmbər bəndələrimiz haqqında əvvəlcədən (lövhi-məhfuzda) bu sözümüz deyilmişdi:

172. "Onlar mütləq qalib gələcəklər.

173. Bizim əsgərlərimiz (möminlər) labüd olaraq (kafirlərə) zəfər çalacaqlar!"

174. (Ya Peyğəmbər!) Sən bir müddət (Bədr vuruşuna, yaxud Məkkənin fəthinədək) onlardan üz çevir!

175. Və (kənardan) onlara bax! Onlar mütləq (küfrlərinin aqibətini) görəcəklər!

176. Onlar əzabımızın tezliklə gəlməsini istəyirlər?

177. (O əzab) onlara yetişdikdə (evlərində ikən başlarının üstünü aldıqda) qorxudulanların (lakin yola gəlməyənlərin) sabahı necə də pis olacaq!

178. (Ya Peyğəmbər!) Sən onlardan bir müddət üz çevir!

179. Və (kənardan) onlara bax! Onlar mütləq (küfrlərinin aqibətini) görəcəklər!

180. Sənin Rəbbin – yenilməz qüvvət sahibi (mülkündə hər şeyə qalib) olan Rəbbin (müşriklərin) Ona aid etdikləri sifətlərdən tamamilə uzaqdır!

181. Peyğəmbərlərə salam olsun!

182. Aləmlərin Rəbbi olan Allaha həmd olsun!

## .38.
## Sad surəsi

**(Məkkədə nazil olmuşdur, 88 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Sad! (Şanlı-şərəfli) öyüd-nəsihətlə dolu Qurana and olsun!

2. (Məkkə kafirlərinin iman gətirməmələri heç də, onların dediyi kimi, şəkk-şübhə üzündən deyildir). Doğrusu, o kafirlər qürur və nifaq içindədirlər. (İman gətirməyi özlərinə sığışdırmır. Muhəmməd əleyhissəlama qarşı çıxıb onunla ədavət aparırlar).

3. Biz onlardan əvvəl neçə-neçə nəsilləri məhv etdik. Onlar fəryad edib kömək diləyirdilər, lakin artıq (əzabdan) qaçıb can qurtarmaq vaxtı deyildi.

4. Onlar öz içərilərindən özlərinə (Allahın əzabı ilə) qorxudan bir peyğəmbər gəlməsinə təəccüb etdilər və kafirlər belə dedilər: “Bu, yalançı bir sehrbazdır!

5. Əcaba, o, (Allahdan başqa heç bir tanrı yoxdur deməklə) tanrıların hamısını bir tanrımı edir? Bu, doğrudan da, çox təəccüblü bir şeydir.

6. Onların əyanları (toplandıqları məclisdən) çıxıb gedərək (bir-birinə) belə dedilər: “Gedin öz tanrılarınıza (ibadətdə) möhkəm (səbatlı) olun. (Bizdən) istənilən şey budur (tövhiddir).

7. Biz bunu (Muhəmmədin dediklərini) sonuncu dində (xaçpərəstlikdə) də eşitməmişik. Bu ancaq bir uydurmadır.

8. Məgər Quran aramızdan onamı nazil olmuşdur?! (Halbuki o, yaşca bizdən kiçik, özü də kasıbdır)”. Doğrusu, onlar Mənim Quranım barədə şəkk-şübhə içindədirlər. Doğrusu, onlar hələ Mənim əzabımı dadmamışlar!

9. Yoxsa (ya Peyğəmbər!) Sənin yenilməz qüvvət, kərəm sahibi olan Rəbbinin rəhmət xəzinələri onlara məxsusdur?!

10. Yaxud göylərin, yerin və onların arasında olan hər şeyin ixtiyarı onların əlindədir?! Elə isə qoy iplərdən yapışıb (göyə) qalxsınlar! (Kainatın hökmünü öz əllərinə alıb onu idarə etsinlər. İstədiklərinə peyğəmbərlik verib ona vəhy göndərsinlər!)

11. Onlar (müşriklər) burada (yaxın zamanlarda baş verəcək Bədr vuruşunda, yaxud Məkkənin fəthində) müxtəlif firqələrdən ibarət məğlubiyyətə uğrayacaq bir ordudurlar.

12. Onlardan əvvəl Nuh qövmü, Ad və sarsılmaz səltənət (möhtəşəm binalar və ya hündür qayalar, dar ağacları) sahibi Firon da (peyğəmbərləri) təkzib etmişdi.

13. Eləcə də Səmud, Lut qövmü, Əykə əhli (Şüeyb tayfası) – bu firqələrin

14. Hər biri peyğəmbərləri ancaq yalançı saymışdı. Buna görə də əzabım (onlara) vacib oldu.

15. Bunlar (Məkkə müşrikləri) yalnız bir dəhşətli (tükürpədici) səsə (İsrafilin suru bircə dəfə üfürməsinə) bənddirlər. (Surun çalınması vaxtı gəlib çatdıqda isə) o, bir an belə gecikməz!

16. Onlar (istehza ilə): “Ey Rəbbimiz! Tez ol, bizim payımızı (əməl dəftərimizi, yaxud xeyirdən, şərdən payımıza nə düşəcəksə) haqq-hesab (qiyamət) günü gəlməmişdən əvvəl ver!” – dedilər.

17. (Ya Peyğəmbər!) Onların dediklərinə səbr et və qüvvətli bəndəmiz Davudu yadına sal! Çünki o, daim Allaha sığınan bir kimsə idi. (Davud böyük qüdrət, möhtəşəm səltənət sahibi olmasına baxmayaraq günaşırı oruc tutar, gecələri durub namaz qılar, dünya malına, naz-nemətinə aludə olmayıb yalnız Allah rizasını qazanmaq diləyərdi).

18. Biz dağları ona ram etmişdik. Onlar axşam-səhər onunla birlikdə (Allahı) təqdis edib şəninə təriflər deyərdilər.

19. Biz quşları da toplu halda (onun ixtiyarına vermişdik), hamısı ona tərəf yönəlməkdə idi.

20. Biz onun mülkünü (səltənətini) möhkəmləndirmiş, ona hikmət (peyğəmbərlik) və (haqla batili ayırd edib) düzgün hökm vermək qabiliyyəti bəxş etmişdik. (Davud çox müşkül məsələləri asanlıqla həll edər, ədalətli hökm çıxarardı).

21. (Ya Peyğəmbər!) Sənə (Davudun padşahlığı vaxtı) dava edənlərin xəbəri gəlib çatdımı? O zaman onlar (Davuda məxsus)

məbədə (ibadət vaxtı ora daxil olmaq qadağan edildiyi üçün) divardan aşıb gəlmişdilər.

22. Onlar Davudun yanına gəldikdə (Davud) onlardan (məbədə qapıdan deyil, divardan aşıb daxil olduqları üçün) qorxdu. Onlar dedilər: “Qorxma, biz bir-birimizə haqsızlıq etmiş iki iddiaçıyıq. Aramızda ədalətlə hökm et, haqqı tapdalama (heç birimizin tərəfini saxlama) və bizə doğru yolu göstər!”

23. (Onlardan biri dedi: ) “Bu mənim (din) qardaşımdır. Onun doxsan doqquz dişi qoyunu, mənim isə bircə dişi qoyunum vardır (yaxud onun doxsan doqquz zövcəsi, mənim isə bircə zövcəm var). Belə bir vəziyyətdə: “Onu mənə ver! (Məni ona sahib et!)” – dedi və (dildən pərgar olduğu üçün) mübahisədə məni məğlub etdi”.

24. (Bu sözləri eşidən Davud o biri iddiaçı ağzını açmağa macal tapmamış) dedi: “O sənin bircə qoyununu öz qoyunlarına qatmaq istəməklə, şübhəsiz ki, sənə zülm etmişdir. Doğrudan da, şəriklərin çoxu bir-birinə haqsızlıq edər. Yalnız iman gətirib yaxşı işlər görənlərdən savayı! Onlar da (təəssüf ki) çox azdırlar!” (İddiaçılar bir-birinə baxıb güldükdən, yaxud çıxıb getdikdən sonra) Davud (bu işdən şübhəyə düşərək) Bizim onu imtahana çəkdiyimizi güman etdi. O dərhal Rəbbindən öz bağışlanmasını dilədi və dizi üstə düşüb səcdəyə qapanaraq tövbə etdi.

25. Biz bunu (o biri iddiaçını dinləməyərək onu zülmkar adlandırmasını və ya belə bir səhv zənnə düşməsini) ona bağışladıq. Həqiqətən, o, (qiyamət günü) dərgahımıza yaxın olacaq və onun qayıdıb gələcəyi yer də gözəl olacaqdır (yaxud onu dünyada çoxlu nemət, axirətdə isə gözəl sığınacaq – Cənnət gözləyir).

26. Ya Davud! Biz səni yer üzündə xəlifə (və ya əvvəlki peyğəmbərlərə xələf) etdik. Buna görə də insanlar arasında ədalətlə hökm et, nəfsdən gələn istəklərə uyma, yoxsa onlar səni Allah

yolundan sapdırar. Şübhəsiz ki, Allah yolundan sapanları haqq-hesab gününü unutduqları üçün şiddətli bir əzab gözləyir!

27. Biz göyü, yeri və onların arasında olanları (bütün məxluqatı) boş-boşuna yaratmadıq. Bu, kafirlərin zənnidir. Vay cəhənnəm odunda yanacaq kafirlərin halına!

28. Yoxsa Biz iman gətirib yaxşı işlər görənləri yer üzündə fitnə-fəsad törədənlərlə eyni tutacağıq?! Yaxud Allahdan qorxub pis əməllərdən çəkinənləri günahkarlara tay edəcəyik?!

29. (Ya Peyğəmbər! Bu Quran) sənə nazil etdiyimiz mübarək (xeyir-bərəkətli) bir Kitabdır ki, (insanlar) onun ayələrini düşünüb dərk etsinlər və ağıl sahibləri də (ondan) ibrət alsınlar!

30. Biz Davuda Süleymanı bəxş etdik. Nə gözəl bəndə! O, daim Allaha sığınan bir kimsə idi. (Onun rizasını qazanmaq diləyirdi).

31. (Bir gün) axşamüstü ona cins (bir ayağını dırnağı üstünə qoyub, üç ayağı üstündə duran), çapar atlar göstərildiyi zaman

32. O dedi: "Mən gözəlliyi (bu atları) Rəbbimin zikrindən (Tövratdan) dolayı sevirəm (çünki Allahın dinini qüvvətləndirmək üçün bir cihad vasitəsi kimi onların tərifi Tövratda mövcuddur). Nəhayət, (o atlar Süleymanın gözündən) qeyb olub gizləndi. (Və ya: bu atlara olan məhəbbəti məni Rəbbimin zikrindən yayındırdı. O qədər onlara tamaşa etdim ki, ikindi namazı qıla bilmədim)".

33. (Süleyman dedi: ) "Onları (atları) mənə qaytarın!" (Atlar qaytarılıb gətirildikdən sonra) onların qıçlarını və boyunlarını sığallamağa başladı. (Yaxud onu ibadətdən yayındırdıqları üçün onları qurban kəsib fəqir-füqəraya payladı).

34. And olsun ki, Biz Süleymanı (etdiyi bir xəta üzündən) imtahana çəkdik. Taxtının üstünə (ruhsuz) bir cəsəd atdıq (və ya: taxtının

üstünə bir cin oturtduq). Sonra o (peşman olub tövbə etdi və yenidən öz mülkünə, öz taxtına) qayıtdı.

35. (Süleyman dua edib) dedi: “Ey Rəbbim! Məni bağışla və mənə elə bir mülk (səltənət) ver ki, məndən sonra (o cürəsinə) heç kəs nail ola bilməsin. Həqiqətən, Sən böyük ehsan (kərəm) sahibisən! (Allah Süleymanın duasını qəbul buyurdu. Ona həm peyğəmbərlik, həm də padşahlıq əta etdi).

36. Biz küləyi ona ram etdik. Külək onun əmri ilə istədiyi yerə rahatca gedirdi.

37. (Biz) şeytanlardan olan hər bir bənnanı və qəvvası,

38. Eləcə də başqalarını (digər şeytanları) zəncirlənmiş halda (onun ixtiyarına verdik)

39. (Və ona belə buyurduq: ) “Bu Bizim ehsanımızdır, (ondan kimə istəsən) ver, yaxud (saxlayıb) vermə! O, saysız-hesabsızdır (səndən bu nemətlər barəsində haqq-hesab tələb olunmayacaqdır)”.

40. Həqiqətən, o, (qiyamət günü) dərgahımıza yaxın olacaq və onun qayıdıb gələcəyi yer də gözəl olacaqdır (yaxud onun üçün dünyada çoxlu nemət, axirətdə isə gözəl sığınacaq – Cənnət vardır).

41. (Ya Peyğəmbər!) bəndəmiz Əyyubu da yad et! Bir zaman o öz Rəbbinə müraciətlə belə demişdi: “Şeytan mənə bəla və əzab toxundurmuşdur!”

42. (Ona belə buyurduq: ) “Ayağınla (yerə) vur! Bu, (yerdən çıxan bulaq) yuyunacaq və içiləcək sərin (sudur)!” (Əyyub o su ilə qüsl edib ondan içən kimi bütün xəstəlikləri getdi).

43. Dərgahımızdan bir mərhəmət və ağıl sahiblərinə bir ibrət olsun deyə, ona ailəsini və üstəlik bir o qədər də (oğul-uşaq) bağışladıq.

44. (Əyyub xəstə olduğu zaman övrəti bir iş dalınca harasa getmiş, yubanıb çox gec gəlmişdi. Bundan hirslənən Əyyub sağaldıqdan sonra ona yüz çubuq vuracağına and içmişdi. Əyyubun öz andına əməl etməsi, həm də zövcəsinin cəzasının yüngülləşdirilməsi üçün ona belə buyurduq:) “Əlinə (yüz yaş və ya quru çubuqdan ibarət) bir dəstə götür və onunla (övrətini) vur. Andını pozma. Biz onu (müsibətlərə) səbr edən gördük. Nə gözəl bəndə! O, (daim Allaha) sığınan bir kimsə idi.

45. (Ya Rəsulum!) Qüvvət və bəsirət sahibi olan bəndələrimiz İbrahimi, İshaqı və Yəqubu da yad et!

46. Biz yurdu (axirət yurdunu) anmaq xislətini onlara məxsus elədik. (Onlar naz-nemətə, şan-şöhrətə uymayıb ömürlərini Allaha ibadət və itaət içində keçirdər, dünyalarından daha çox axirətləri haqında düşünərdilər).

47. Şübhəsiz ki, onlar dərgahımızdan seçilmiş ən yaxşı kimsələrdəndirlər!

48. (Ya Peyğəmbər!) İsmaili, (İlyasın əmisi oğlu) əl-Yəsəi və Zül-Kifli də xatırla! Onların hamısı seçilmiş, ən yaxşı kimsələrdəndir!

49. Bu, (onları təriflə, minnətdarlıqla) yada salmaqdır (yaxud bu Quran sənin özün və ümmətin üçün bir öyüd-nəsihətdir). Allahdan qorxub pis əməllərdən çəkinənləri gözəl bir qayıdış yeri (Cənnət) gözləyir!

50. Qapıları onlar üçün (taybatay) açılmış Ədn cənnətləri!

51. Onlar orada (taxtlara) söykənib cürbəcür meyvələr və içkilər (cənnət içkiləri) istəyəcəklər.

52. Onların yanında gözlərini (yalnız ərlərinə) dikmiş həmyaşıdlar (hamısı otuz üç yaşında zövcələr) olacaqdır.

53. Haqq-hesab günü üçün (axirətdə) vəd olunduğunuz (nemətlər) bunlardır.

54. Bu, əlbəttə, Bizim ruzimizdir. O bitməz-tükənməzdir.

55. Bu belə! Şübhəsiz ki, azğınları (Allaha asi olanları) da çox pis qayıdış yeri -

56. Cəhənnəm (gözləyir). Onlar ora vasil olacaqlar. O necə də pis bir məskəndir!

57. Bu, qaynar su və irindir. Qoy onu dadsınlar!

58. (Cəhənnəmdə) ona bənzər daha başqa-başqa (əzablar) vardır.

59. (Mələklər kafirlərin dünyadakı başçılarına onlara tabe olanları göstərib deyəcəklər: ) "Bu sizinlə birlikdə (Cəhənnəmə) daxil olan dəstədir. (Başçılar deyəcəklər: ) "Onlar rahatlıq üzü görməsinlər! (Onlara salam olmasın!) Onlar Cəhənnəmə daxil olanlardır!"

60. (Tabe olanlar da öz başçılarına) belə deyəcəklər: "Xeyr, siz elə özünüz rahatlıq üzü görməyəsiniz! (Sizin özünüzə salam olmasın!) Bunu bizim üçün siz hazırladınız (bu əzaba, küfrə bizi siz uğratdınız). Bir baxın (bu Cəhənnəm) necə də pis məskəndir!

61. Onlar deyəcəklər: "Ey Rəbbimiz! Buna (bu əzaba) bizi kim uğradıbsa, onun əzabını Cəhənnəmdə ikiqat elə!"

62. (Azğınlar, Allaha asi olanlar bir-birinə) deyəcəklər: "(Dünyada) pis adamlar saydığımız kəsləri (yoxsul möminləri) niyə burda görmürük?

63. Biz onları məsxərəyə qoyurduq. Yoxsa onlar (burada olduqları halda) gözə dəymirlər?!"

64. Şübhəsiz ki, bu – cəhənnəm əhlinin bir-biri ilə bu cür çəkişməsi (çənə-boğaz olması) bir həqiqətdir!

65. (Ya Rəsulum!) De: “Mən yalnız (sizi Allahın əzabı ilə) qorxudan bir peyğəmbərəm. Bir olan, (hər şeyi) qəhr edən Allahdan başqa heç bir tanrı yoxdur!

66. O, göylərin, yerin və onların arasında olanların (bütün məxluqatın) Rəbbidir! O, yenilməz qüvvət sahibidir, çox bağışlayandır.

67. De: “O (Quran Allah dərgahından nazil olan) çox böyük xəbərdir!

68. Siz isə ondan üz döndərirsiniz!

69. (Mələklər Adəmin yaradılması barədə Allahla) mübahisə apararkən mənim yuxarı aləmdən heç bir xəbərim yox idi.

70. (Bütün onlar) mənə ancaq (sizi Allahın əzabı ilə) qorxudan bir peyğəmbər olduğum üçün bir vəhy olunur!”

71. (Ya Peyğəmbər!) Xatırla ki, o zaman sənin Rəbbin mələklərə belə demişdi: “Mən palçıqdan bir insan (Adəmi) yaradacağam.

72. Mən onu tamamlayıb (insan şəklinə salıb) Öz ruhumdan (Özümün yaratdığı ruhdan) üfürən (can verən) kimi ona (hörmət əlaməti olaraq) səcdə edin!”

73. Buna görə də mələklərin hamısı birlikdə (Adəmə) səcdə etdi;

74. Yalnız İblisdən başqa! O (səcdə etməyə) təkəbbür göstərdi və kafirlərdən oldu.

75. (Allah) buyurdu: “Ey İblis! Sənə mənim Öz əlimlə yaratdığıma səcdə etməyə nə mane oldu? Təkəbbür göstərdin, yoxsa özünü yuxarı tutdun?”

76. (İblis) dedi: “Mən ondan daha yaxşıyam (daha üstün, daha şərəfliyəm). Çünki Sən məni oddan, onu isə palçıqdan yaratmısan!”

77. (Allah) buyurdu: “Çıx ordan (Cənnətdən). Sən (Mənim rəhmətimdən, dərgahımdan) qovulmuşun birisən!

78. Qiyamət gününə qədər Mənim lənətim sənin üstündən əskik olmasın!”

79. (İblis) dedi: “Ey Rəbbim! Qiyamət gününə qədər mənə möhlət ver!”

80. (Allah) buyurdu: “Sən möhlət verilənlərdənsən,

81. (Dərgahımda) vaxtı məlum olan günə (qiyamətə) qədər!”

82. (İblis) dedi: “Sənin izzətinə-qüdrətinə and olsun ki, onların (Adəm övladının) hamısını (haqq yoldan) azdıracağam;

83. Yalnız Sənin sadiq bəndələrindən başqa!

84. (Allah) buyurdu, “Həqiqətən, doğru deyirəm,

85. And olsun ki, Mən Cəhənnəmi səninlə (sənin cinsindən olanlarla) və sənə uyanların hamısı ilə dolduracağam!”

86. (Ya Peyğəmbər!) De: “Mən buna (risaləti, Allahın hökmlərini təbliğ etməyə) görə sizdən heç bir əcr (mükafat) istəmirəm. Və mən özümdən bir şey uydurub deyənlərdən də deyiləm! (Allahdan mənə nə vəhy olunursa, yalnız onu sizə çatdırıram. Bu Quran mənim sözüm deyil, Allah kəlamıdır!)

87. Bu (Quran) aləmlərə (həm insanlara, həm də cinlərə) ancaq bir öyüd-nəsihətdir!

88. Siz onun verdiyi xəbəri (Quranda deyilənlərin doğru olduğunu) bir müddətdən (öləndən, yaxud qiyamət qopandan) sonra mütləq biləcəksiniz!”

## .39.
## əz-Zumər (Zümrələr) surəsi
**(Məkkədə nazil olmuşdur, 75 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Kitabın (Quranın) nazil edilməsi yenilməz qüvvət, hikmət sahibi Allah tərəfindəndir!

2. (Ya Peyğəmbər!) Biz Kitabı sənə haqq olaraq nazil etdik. Buna görə sən də dini məhz Allaha aid edərək yalnız Ona ibadət et! (Bütpərəstlər kimi Ona şərik qoşma. Allaha ixlasla tapın!)

3. Bil ki, xalis din (sırf ibadət, təmiz itaət) ancaq Allaha məxsusdur. Allahı qoyub (bütləri) özlərinə dost tutanlar: "Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!" (deyirlər). Şübhəsiz ki, Allah ixtilafda olduqları məsələlər barəsində (qiyamət günü) onların arasında hökm edəcəkdir. Allah yalançı, nankor olan kimsəni doğru yola müvəffəq etməz!

4. Əgər Allah özünə övlad götürmək istəsəydi, yaratdıqlarından istədiyini (özü də ən mükəmməlini) seçərdi. O, pakdır, müqəddəsdir! (Allaha övlad götürmək yaraşmaz. Bütün kainat Allahın qüdrət əsəri ola-ola Onun övlada nə ehtiyacı vardır?!) O, bir olan, (hər şeyi) qəhr edən (hər şeyə gücü yetən) Allahdır!

5. (Allah) göyləri və yeri haqq olaraq (hikmətlə) yaratdı. O, gecəni gündüzə, gündüzü də gecəyə qatar (gah gündüzü, gah da gecəni uzadar). O günəşi və ayı ram (bəndələrinin mənafeyinə tabe) etdi. Onların hər biri müəyyən bir müddətədək (qiyamət gününə qədər) hərəkət edər. Agah olun ki, O, yenilməz qüvvət sahibidir, (günahları) çox bağışlayandır!

6. Allah sizi tək bir nəfərdən (Adəmdən) xəlq etdi. Sonra onun özündən həmtayını (Həvvanı) yaratdı. O, (dəvə, inək, qoyun və keçi kimi)

heyvanlardan (erkək və dişi olmaqla) səkkiz cift (baş) əmələ gətirdi. O sizi analarınızın bətnində üç zülmət (pərdə, uşaqlıq və qarın) içində yaranışdan-yaranışa salaraq yaradır (nütfəni laxtalanmış qana, laxtalanmış qanı bir parça ətə, əti sümüyə çevirir, sonra sümüyü ətlə örtüb insan şəklinə salır). Bu sizin Rəbbiniz olan Allahdır, hökm Onundur, Ondan başqa heç bir tanrı yoxdur. Elə isə (Allaha ibadət etmək əvəzinə bütlərə tapınmaqla haqdan) necə döndərilirsiniz? (İmandan necə dönürsünüz?)

7. Əgər küfr etsəniz (Allahın nemətlərini dansanız, bunun zərəri Allaha yox, ancaq sizin özünüzə olar). Çünki Allah sizə (sizin ibadətinizə) əsla möhtac deyildir. Amma bəndələrinin küfr etməsi Ona xoş getməz. Əgər (Allahın nemətlərinə) şükür etsəniz, sizin bu şükrünüz Ona xoş gələr. Heç bir günahlar başqasının günahını daşımaz (hərə öz günahına cavabdehdir). Sonra Rəbbinizin hüzuruna qayıdacaqsınız. O sizə (dünyada) nə etdiklərinizi (bir-bir) xəbər verəcəkdir. Həqiqətən, Allah ürəklərdə olanları biləndir!

8. İnsana bir zərər toxunduqda tövbə edərək Rəbbinə yalvarar. Sonra (Allah Öz) dərgahından ona bir nemət əta etsə, əvvəlcə kimə dua etmiş olduğunu unudar və (xalqı) Allah yolundan (islam dinindən) çıxartmaq üçün Ona şəriklər qoşar. (Ey Peyğəmbər! Ona) De: "Hələ küfrünlə bir müddət dövran sür. Şübhəsiz ki, sən cəhənnəm əhlindənsən!"

9. Məgər axirətdən qorxan, Rəbbinə (Allahın mərhəmətinə) ümid bəsləyən, gah səcdəyə qapanıb, gah da ayaq üstə durub gecə saatlarını ibadət içində keçirən (müti bəndə kafirlə birdirmi)?! De: "Heç bilənlərlə bilməyənlər (alimlə cahil) eyni ola bilərmi?! (Allahın ayələrindən, dəlillərindən) yalnız ağıl sahibləri ibrət alar!"

10. (Ya Peyğəmbər! Mənim adımdan qullarıma) de: "Ey Mənim iman gətirən bəndələrim! Rəbbinizdən qorxun. Bu dünyada yaxşılıq

edənlərə (axirətdə) yaxşılıq (Cənnət) vardır. Allahın yeri genişdir (sizə bir çətinlik üz versə, başqa ölkələrə hicrət edə bilərsiniz). Yalnız (dünyada Allah yolunda çətinliklərə) səbr edənlərə (axirətdə) saysız-hesabsız mükafat veriləcəkdir!”

11. De: “Mənə dini (itaəti) məhz Allaha məxsus edərək yalnız Ona ibadət etmək əmr olunmuşdur!

12. Mənə (bu ümmətdən) ilk müsəlman olmaq buyurulmuşdur!”

13. De: “Əgər Rəbbimə asi olsam. . , doğrusu, böyük günün (müdhiş günün, qiyamətin) əzabından qorxuram!”

14. De: “Mən Allaha dinimi (ibadət və itaətimi) yalnız Ona məxsus edərək (heç bir şərik qoşmadan) tapınıram!

15. Siz də Ondan başqa istədiyinizə ibadət edin!” De: “Əsl ziyan çəkənlər (axirəti əldən verənlər) qiyamət günü özlərini və ailələrini (özlərinə bağlı olanları) ziyana uğradanlardır. Bax, açıq-aşkar ziyan budur!”

16. Onların üstlərində və altlarında oddan sipər (kölgəlik) vardır. Allah Öz bəndələrini bununla (bu əzabla) qorxudur. Ey bəndələrim! Məndən qorxun!

17. Tağuta (Şeytana, bütlərə) ibadət etməkdən çəkinib tövbə edərək Allaha tərəf qayıdanları müjdə gözləyir. (Ya Peyğəmbər!) Bəndələrimə (Cənnətlə) müjdə ver!

18. O kəslər ki, sözü (öyüd-nəsihəti) dinləyib onun ən gözəlinə (düzgününə) uyarlar. Onlar Allahın doğru yola yönəltdiyi kimsələrdir. Ağıl sahibləri də elə onlardır!

19. (Ya Peyğəmbər!) Məgər sən haqqında (lövhi-məhfuzda) əzab sözü (hökmü) vacib olmuş kimsəni (qoruya bilərsənmi)?! Məgər sən Cəhənnəmdə olanı qurtara bilərsənmi?!

20. Lakin Rəbbindən qorxanları (Cənnətdə) bir-birinin üstündə tikilmiş otaqlar (behiştin yüksək məqamları) gözləyir. Onların altından çaylar axar. Bu, Allahın vədidir. Allah vədə xilaf çıxmaz!

21. (Ya Peyğəmbər!) Məgər Allahın göydən yağış yağdırdığını, onu yer üzündəki bulaqlara axıtdığını, sonra onunla növbənöv əkin yetişdirdiyini görmürsənmi?! Sonra o (əkin) quruyar, sən onu saralmış görərsən. Sonra da (Allah) onu çör-çöpə döndərər. Həqiqətən, bunda ağıl sahibləri üçün ibrətlər vardır!

22. Məgər Allahın köksünü (qəlbini) islam üçün açmaqla Rəbbindən nur üzərində olan kəs (qəlbi möhürlənmiş kimsə kimi ola bilərmi)?! [Və ya: Məgər Allahın köksünü (qəlbini) islam üçün açdığı kəs Rəbbindən bir nur üzərində deyilmi?!] Elə isə vay qəlbləri Allahın zikrinə (Qurana) qarşı sərt olanların halına! Onlar (haqq-yoldan) açıq-aydın azmışlar.

23. Allah sözün ən gözəlini (Quranı, ayələri) bir-birinə bənzər, (xəbərləri və hekayətləri, əmrləri və qadağanları, vədləri və təhdidləri) təkrarlanan bir kitab şəklində nazil etdi. Ondan (Quranın təhdidlərindən) Rəbbindən qorxanların tükləri biz-biz olar. Allahın zikrindən (öyüd-nəsihətlərindən, vədlərindən) sonra ürəkləri yerinə gəlib qorxuları gedər. Bu (Quran) Allahın hidayətidir. Onunla istədiyini doğru yola yönəldər. Allahın (küfr edəcəyini əzəldən bildiyi üçün) yoldan çıxartdığı kimsəyə isə heç bir yol göstərən olmaz!

24. Məgər qiyamət günü (əli bağlı olduğu üçün) şiddətli əzabdan üzü ilə qorunan (yaxud cəhənnəm oduna üzüstə atılan kəs əzabdan əmin olan və ya Cənnətə daxil olan kimsə kimi ola bilərmi)?! Zalımlara (kafirlərə): “Etdiyiniz əməllərin cəzasını dadın!” – deyilər.

25. Onlardan (Məkkə müşriklərindən) əvvəlkilər də (peyğəmbərləri) təkzib etmişdilər. Buna görə də heç özləri bilmədikləri yerdən onlara əzab gəlmişdi.

26. Allah rüsvayçılığı onlara dünyada daddırdı. Axirət əzabı isə daha şiddətlidir. Kaş biləydilər!

27. Biz bu Quranda insanlar üçün hər cür məsəl çəkdik ki, bəlkə, öyüd-nəsihət qəbul etsinlər!

28. Biz (onlara) nöqsansız-qüsursuz (heç bir əyri-üyrülüyü, dolaşıqlığı olmayan) ərəbcə bir Quran nazil etdik ki, Allahdan qorxub pis əməllərdən çəkinsinlər.

29. Allah (müşriklərlə müvəhhid möminlər barəsində) bir məsəl çəkir: “Bir adamın (kölənin) bir-biri ilə çəkişən (pis xasiyyətli) bir neçə şərikli ağası var (hərəsi onu haqqı çatan qədər işlədir). Başqa bir adamın da yalnız bir ağası var (təkcə ona xidmət edir). Onların hər ikisi vəziyyətcə eyni ola bilərmi?! Həmd (şükür və tərif) ancaq Allaha məxsusdur, lakin onların (müşriklərin) əksəriyyəti (bu həqiqəti) bilməz!

30. (Ya Peyğəmbər!) Şübhəsiz ki, sən də öləcəksən, onlar da öləcəklər!

31. Sonra siz qiyamət günü Rəbbinizin hüzurunda mübahisə edəcəksiniz.

32. Allaha qarşı yalan uydurub söyləyən (Allaha övlad isnad edən, Onun şərikləri olduğunu deyən), özünə gələn həqiqəti (Quranı, peyğəmbəri) təkzib edən kimsədən daha zalım kim ola bilər? Məgər Cəhənnəmdə kafirlər üçün yer yoxdur?! (Əlbəttə, vardır!)

33. Haqqı (Quranı) gətirən və onu təsdiq edənlər (Peyğəmbər və möminlər) isə əsl müttəqilərdir.

34. Onlar üçün Rəbbinin dərgahında dilədikləri hər şey vardır. Yaxşı işlər görənlərin mükafatı budur!

35. Allah (bununla) onların etdikləri ən pis işlərin üstünü örtəcək və gördükləri ən yaxşı işlərə görə onları mükafatlandıracaqdır (yaxud etdikləri əməllərin ən gözəl mükafatını verəcəkdir).

36. (Ya Peyğəmbər!) Məgər Allah Öz bəndəsinə kifayət deyilmi?! Onlar (müşriklər) isə səni Ondan qeyriləri (öz bütləri, tanrıları) ilə qorxudurlar. Allahın yoldan çıxartdığı kimsəyə heç kəs yol göstərə bilməz.

37. Allahın doğru yola saldığı kimsəni də heç kəs yoldan çıxarda bilməz. Məgər Allah (mülkündə hər şeyə qalib olan) yenilməz qüvvət sahibi, intiqam sahibi deyilmi?!

38. Həqiqətən, əgər onlardan: "Göyləri və yeri kim yaratmışdır?!" – deyə soruşsan, mütləq: "Allah!" – deyə cavab verəcəklər. (Ya Peyğəmbər!) De: "Elə isə bir söyləyin görək, əgər Allah mənə bir zərər toxundurmaq (sıxıntı vermək) istəsə, sizin Allahdan qeyri ibadət etdikləriniz (bütlər, tanrılar) Onun zərərini aradan qaldıra bilərlərmi?! Yaxud: "Əgər Allah mənə bir mərhəmət əta etmək istəsə, onlar Onun mərhəmətinə mane ola bilərlərmi?!" De: "Mənə təkcə Allah kifayət edər. Təvəkkül edənlər yalnız Ona təvəkkül edərlər!"

39. De: "Ey qövmüm! Siz özünüzə uyğun tərzdə işinizi görün, mən də özümə münasib şəkildə işimi görəcəyəm (və ya siz əlinizdən gələni edin, mən də əlimdən gələni edəcəyəm). Siz mütləq biləcəksiniz ki,

40. Rüsvayçı əzab kimə gələcək, kim həmişəlik əzaba düçar olacaqdır!"

41. (Ya Peyğəmbər!) Biz Kitabı (Quranı) insanlar üçün sənə haqq olaraq nazil etdik. Kim doğru yolda olsa, özü üçün (öz xeyrinə) olar. Kim (haqq yoldan) çıxsa, zərəri özünə yetişər. Sən onlara vəkil deyirsən!

42. Allah (əcəli çatan kimsələrin) canlarını (ruhlarını) onlar öldüyü zaman, ölməyənlərin (hələ əcəli çatmayanların) canlarını isə yuxuda alar (çünki yuxu da ölüm kimi bir şeydir, yuxu zamanı ruh bədəni tərk edər). Ölümünə hökm olunmuş kimsələrin canlarını (ruhlar aləmində) saxlayar (onların ruhu bir daha bədənlərinə qayıtmaz, beləliklə də bədən ölüb gedər). Digər (ölümünə hökm olunmamış) kimsələrin canlarını isə müəyyən bir müddətədək (əcəlləri gəlib çatıncaya qədər yuxudan oyandıqda bədənlərinə) qaytarar. Həqiqətən, bunda düşünən bir qövm üçün (Allahın hər şeyə qadir olmasına, qiyamət günü ölüləri dirildəcəyinə dəlalət edən) əlamətlər vardır!

43. Yoxsa onlar (müşriklər) Allahdan qeyrilərini (bütləri) şəfaətçi etdilər? (Ya Peyğəmbər!) De: “Onlar heç bir şeyə malik olmadıqları və heç bir şey qanmadıqları halda (şəfaətmi edəcəklər)?!”

44. De: “Bütün şəfaət yalnız Allaha məxsusdur. Göylərin və yerin hökmü Onun əlindədir. Sonra siz (qiyamət günü) Onun hüzuruna qaytarılacaqsınız!”

45. Allah tək olaraq anıldığı (la ilahə illallah deyildiyi) zaman axirətə inanmayanların qəlbləri nifrətlə dolar. Ondan (Allahdan) başqaları (bütlər, tanrılar) yad edildiyi zaman isə onları dərhal sevinc bürüyər.

46. De: “Ey göyləri və yeri yoxdan yaradan, ey gizlini və aşkarı bilən Allah! Bəndələrin arasında ixtilafda olduqları (məsələlər) barəsində Sən hökm edəcəksən!”

47. Yer üzündə nə (sərvət) varsa, hamısı, üstəlik bir o qədər də kafirlərin olmuş olsaydı, mütləq onun qiyamət gününün pis əzabından qurtarmaq üçün fidyə verərdilər (lakin onlardan fidyə qəbul olunmaz). Və (o zaman) Allahdan onlara güman etmədikləri (gözləmədikləri əzab) görünəcəkdir.

48. Onlara (dünyada) etdikləri pis əməllərin cəzası (pis nəticəsi) görünəcək və istehza etdikləri (əzab) onları saracaqdır!

49. İnsana bir zərər toxunduğu (sıxıntı üz verdiyi) zaman Bizə dua edər. Sonra dərgahımızdan ona bir nemət əta etdikdə: "Bu mənə yalnız biliyimə (ticarətdən, qazanc işlərindən başım çıxdığına) görə verilmişdir!" – deyər. Xeyr, bu bir imtahandır, lakin onların (insanların) əksəriyyəti (cahilliyi üzündən bunu) bilməz!

50. Şübhəsiz ki, bu sözü onlardan (Məkkə müşriklərindən) əvvəlkilər (keçmiş ümmətlər) də demişdilər. Lakin qazandıqları (dünya malı) onlara heç bir fayda vermədi (əzabı onlardan dəf edə bilmədi).

51. Onlar etdikləri pis əməllərin cəzasına düçar oldular. Bunların (Məkkə müşriklərinin) zülm edənləri də qazandıqları günahların cəzasına düçar olacaqlar. Onlar (Allahı) aciz buraxan deyillər (qaçıb canlarını əzabımızdan qurtara bilməzlər).

52. Məgər onlar hələ də bilmirlərmi ki, Allah istədiyinin ruzisini artırar, (istədiyininkini də) azaldar. Həqiqətən, bunda iman gətirən bir qövm üçün ibrətlər vardır!

53. (Ya Peyğəmbər! Mənim adımdan qullarıma) de: "Ey Mənim (günah törətməklə) özlərinə zülm etməkdə həddi aşmış bəndələrim! Allahın rəhmindən ümidsiz olmayın. Allah (tövbə etdikdə) bütün günahları bağışlayar. Həqiqətən, O bağışlayandır, rəhm edəndir!

54. (Tövbə edib) Rəbbinizə dönün. Əzab sizə gəlməmişdən əvvəl Ona təslim olun. Sonra sizə heç bir kömək olunmaz!

55. Qəfil əzab özünüz də bilmədən başınızın üstünü almamışdan əvvəl Rəbbinizdən sizə nazil edilmiş ən gözəl sözə (Qurana) tabe olun!

56. (Elə edin ki, sonradan) bir kəs: “Allaha itaət barəsində etdiyim təqsirlərə görə vay halıma! Həqiqətən, mən (Allahın hökmlərinə, Qurana, Peyğəmbərə və möminlərə) istehza edirdim!” – deməsin.

57. Yaxud: “Əgər Allah məni doğru yola yönəltsəydi, mən mütləq müttəqilərdən olardım!” – söyləməsin.

58. Və ya əzabı gördüyü zaman: “Kaş bir dəfə də (dünyaya) qayıda biləydim; yaxşı işlər görənlərdən olardım!” – deməsin!

59. (Onun bu sözlərinin cavabında Allah belə buyurar: ) “Xeyr, Mənim ayələrim sənə gəlmişdi, amma sən onları yalan saydın, (iman gətirməyə) təkəbbür göstərdin və kafirlərdən olsun!”

60. (Ya Peyğəmbər!) Qiyamət günü Allaha qarşı yalan uydurub söyləyənlərin üzlərini qapqara görərsən. Məgər təkəbbür göstərənlər üçün Cəhənnəmdə yer yoxdur?! (Əlbəttə vardır!)

61. Allah müttəqilərə imanlarına (fəzilətlərinə, dünyada qazandıqları uğurlara) görə nicat verər. Onlara pislik (cəhənnəm əzabı) toxunmaz və onlar qəm-qüssə də görməzlər.

62. Allah hər şeyin xaliqidir. O, hər şeyə vəkildir!

63. Göylərin və yerin açarları (ixtiyarı) Onun əlindədir. Allahın ayələrini inkar edənlər – məhz onlar ziyana uğrayanlardır!

64. De: “Ey cahillər! (Bütün bunlardan sonra) mənə Allahdan başqasınamı ibadət etməyi əmr edirsiniz?”

65. (Ya Rəsulum!) Sənə və səndən əvvəlkilərə (keçmiş peyğəmbərlərə) belə vəhy olunmuşdur: “Əgər (Allaha) şərik qoşsan, bütün əməlin puça çıxacaq və mütləq ziyan çəkənlərdən olacaqsan!

66. Xeyr, yalnız Allaha ibadət et və (Onun nemətlərinə) şükür edənlərdən ol!”

67. (Müşriklər) Allahı lazımınca qiymətləndirmədilər (uca tutmadılar). Halbuki qiyamət günü yer bütünlüklə Onun ovcunun içində olacaq, göylər isə Onun sağ əli ilə büküləcəkdir (yerin də, göyün də hökmü ancaq Allahın əlindədir, bütün kainat Allahın qüdrətinə tabedir). (Allah müşriklərin Ona) aid etdikləri sifətlərdən tamamilə uzaq və ucadır!

68. Sur (birinci dəfə) çalınacaq, Allahın göylərdə və yerdə olan istədiyi kimsələrdən (Cəbrail, Mikail, Əzrail və İsrafildən, yaxud ərşi daşıyan mələklərdən və ya müsəlman şəhidlərindən) başqa, dərhal hamı yıxılıb öləcək. Sonra bir daha çalınan kimi onlar (qəbirlərindən) qalxıb (Allahın əmrinə) müntəzir olacaqlar!

69. Yer öz Rəbbinin nuru ilə işıqlanacaq, kitab (ortaya) qoyulacaq (hərənin əməl dəftəri öz əlinə veriləcəkdir), peyğəmbərlər və şahidlər (əməlisaleh insanlar və ya mələklər araya) gətiriləcək, onlar (bəndələr) arasında ədalətlə hökm olunacaq və onlara haqsızlıq edilməyəcəkdir!

70. Hər kəs öz əməlinin cəzası (əvəzi) veriləcəkdir! Allah onların nə etdiklərini ən yaxşı biləndir!

71. Kafirlər dəstə-dəstə Cəhənnəmə sürüklənəcəklər. Nəhayət, ora çatınca onun qapıları açılacaq və cəhənnəm gözətçiləri onlara deyəcəklər: “Məgər sizə öz içərinizdən Rəbbinizin ayələrini oxuyan, sizi bu gününüzə qovuşacağınızla qorxudan peyğəmbərlər

gəlməmişdi?” Onlar isə: “Bəli (gəlmişdi), lakin əzab sözü (əzab hökmü biz) kafirlər barəsində vacib oldu!” – deyə cavab verəcəklər.

72. (Onlara) belə deyiləcək: “Girin Cəhənnəmin qapılarına (təbəqələrinə) orada əbədi qalmaq üçün!” (İman gətirməyə) təkəbbür göstərənlərin məskəni necə də pisdir!

73. Rəbbindən qorxanlar da dəstə-dəstə Cənnətə gətiriləcəklər. Nəhayət, ora çatınca onun qapıları açılacaq və (cənnət) gözətçiləri (onlara): “Salam əleykum! (Sizə salam olsun!) Xoş gəldiniz! Əbədi qalacağınız Cənnətə daxil olun!” – deyəcəklər.

74. Onlar isə: “Bizə verdiyi vədini yerinə yetirmiş və bizi bu yerə varis etmiş Allaha həmd olsun! Biz Cənnətin istədiyimiz yerində sakin oluruq. (Dünyada yaxşı) əməllər edənlərin mükafatı necə də gözəldir!” – deyəcəklər.

75. (Ya Peyğəmbər!) Mələkləri də ərşi (hər tərəfdən) əhatə edərək Rəbbini həmd-səna ilə təqdis edən görəcəksən. Onların (bütün məxluqatın) arasında ədalətlə hökm olunacaq (möminlər Cənnətə, kafirlər Cəhənnəmə gedəcək) və (mələklərlə möminlər tərəfindən bir ağızdan): “Aləmlərin Rəbbi olan Allaha həmd olsun!” – deyiləcəkdir!

## .40.
## əl-Mumin (Mömin) surəsi
**(Məkkədə nazil olmuşdur, 85 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Ha, Mim!

2. Kitabın (Quranın) nazil edilməsi yenilməz qüvvət sahibi olan, (hər şeyi) bilən Allahdandır-

3. Günahları bağışlayan, tövbələri qəbul edən, cəzası şiddətli, kərəmi böyük olan (Allahdandır)! Ondan başqa heç bir tanrı yoxdur. Axır dönüş də Onadır!

4. Allahın ayələri barəsində ancaq kafirlər mübahisə edər. (Ya Peyğəmbər!) Onların (indi) şəhərlərdə gəzib-dolaşmaları (ticarətdən böyük mənfəət əldə etmələri, cah-calal içində yaşamaları) səni aldatmasın! (Son mənzilləri mütləq Cəhənnəmdir!)

5. Onlardan əvvəl Nuh qövmü, sonrakı (kafir) firqələr də (Ad, Səmud tayfaları və başqaları peyğəmbərlərini) təkzib etmiş, hər ümmət öz peyğəmbərlərini yaxalamağa (tutub öldürməyə) cəhd göstərmiş və haqqı yalana çıxartmaq məqsədilə boş sözlərlə mübahisə aparmışdılar. Buna görə də Mən onları əzabla yaxaladım. (Ya Peyğəmbər! Bir görəydin) Mənim cəzam necə oldu!

6. Küfr edənlərin cəhənnəmlik oduna dair sənin Rəbbinin sözü (hökmü) belə gerçəkləşdi!

7. Ərşi daşıyanlar və onun ətrafında olanlar (mələklər) öz Rəbbini həmd-səna ilə təqdis edir, Ona (qəlbən) inanır və möminlərin bağışlanmasını diləyərək belə deyirlər: “Ey Rəbbimiz! Sənin rəhmin və elmin hər şeyi ehtiva etmişdir. Artıq tövbə edib Sənin yolunla gedənləri bağışla, onları cəhənnəm əzabından qoru!

8. Ey Rəbbimiz! Onları da, atalarından, zövcələrindən və nəsillərindən əməlisaleh olanları da özlərinə vəd buyurduğun Ədn cənnətlərinə daxil et. Şübhəsiz ki, Sən yenilməz qüvvət, hikmət sahibisən!

9. Onları pisliklərdən (tövbədən qabaq etdikləri pis əməllərinin cəzasından) qoru. O gün (qiyamət günü) pisliklərdən kimi qorusan, şübhəsiz ki, ona rəhm etmiş olursan. Ən böyük qurtuluş (uğur) budur!”

10. Küfr edənlərə (qiyamət günü Cəhənnəmə daxil olduqda) belə müraciət ediləcəkdir: “Allahın nifrəti sizin (dünyadakı pis əməllərinizə görə bu gün) özünüzə (və ya bir-birinizə) olan nifrətinizdən daha böyükdür. Çünki siz imana dəvət olunduğunuz zaman öz küfrünüzdə davam edib dururdunuz!”

11. Onlar deyəcəklər: “Ey Rəbbimiz! Sən bizi iki dəfə öldürüb, iki dəfə diriltdin (əvvəlcə atalarımızın belində ölü vəziyyətində olduğumuz ikən bizi dünyaya gətirdin. Bir müddət dünyada yaşatdıqdan sonra öldürdün və indi, qiyamət günü yenidən diriltdin). Biz öz günahlarımızı etiraf etdik. İndi (buradan) çıxmağa bir yol varmıdır?”

12. (Onlara belə cavab veriləcəkdir: ) “Bu (əzab) ona görədir ki, (dünyada) yalnız Allah çağırıldığı (Allahdan başqa heç bir tanrı yoxdur deyildiyi) zaman inkar edir, Ona şərik qoşulduqda isə inanırdınız. İndi isə hökm (hər şeydən) uca, böyük olan Allahındır!”

13. Sizə ayələrini (möcüzələrini, dəlillərini) göstərən, göydən ruzi (hər şeyi göyərdən yağış) endirən məhz Odur. (Bu ayələrdən) ancaq (tövbə edib Rəbbinə) dönən (Ona şərik qoşmaqdan imtina edən) kimsə ibrət alar!

14. (Ey möminlər!) Kafirlərə xoş gəlməsə də, Allaha dini yalnız Ona aid edərək (ixlasla) ibadət edin!

15. Dərəcələri yüksəldən (mələklərin, peyğəmbərlərin, övliyaların və möminlərin mərtəbələrini ucaldan, yaxud hər şeydən uca), ərşin sahibi Allah öz əmrindən olan vəhyi bəndələrindən istədiyinə nazil edir ki, (o, insanları) görüş günü (yer və göy əhlinin, ibadət edənlə ibadət olunanın, zalımla məzlumun bir-birilə görüşəcəyi, ruhla bədənin qovuşacağı qiyamət günü) ilə qorxutsun!

16. Elə bir gün ki, onlar (bütün insanlar qəbirlərindən) çıxacaq, onların heç bir şeyi Allahdan gizli qalmayacaqdır. (Allah buyuracaq: ) “Bu gün hökm kimindir?” (Heç kəsin qımıldanmağa belə cürəti çatmadığından Allah Özü cavab verəcəkdir:) “Bir olan (heç bir şəriki, bənzəri olmayan), (qüdrətilə hər şeyə) qalib olan Allahındır!”

17. Bu gün hər kəs öz əməlinə görə cəzalandırılacaqdır. Bu gün heç bir zülm (haqsızlıq) ola bilməz. Allah tez haqq-hesab çəkəndir!

18. (Ya Peyğəmbər!) Onları (hövldən) ürəklərin ağıza gələcəyi (udquna belə bilməyəcəkləri və ya ürəkləri qəm-qüssə ilə dolacağı) yaxın günlə (qiyamət günü ilə) qorxut. (O gün) zalımların nə bir dostu, nə də sözü keçən bir şəfaətçisi olar!

19. Allah gözlərin xəyanətini (xain gözləri) və ürəklərin gizlətdiyini biləndir!

20. Allah (qiyamət günü) ədalətlə hökm edər. Ondan (Allahdan) başqa ibadət etdikləri (bütlər) isə heç bir şey hökm edə bilməzlər. Həqiqətən, Allah (hər şeyi) eşidəndir, görəndir!

21. Məgər onlar (müşriklər) yer üzünü dolaşıb özlərindən əvvəlkilərin axırının necə olduğunu görmürlərmi? Onlar bunlardan daha qüvvətli, yer üzündə daha çox iz qoyub getmiş kəslər idi. Allah onları günahlarından dolayı yox etdi. Onları Allahdan (Allahın əzabından) qoruyan bir kimsə tapılmadı.

22. Bu (əzab) ona görə idi ki, peyğəmbərləri onlara açıq-aydın möcüzələr gətirmiş, onlar isə (peyğəmbərləri) inkar etmişdilər. Buna görə də Allah onları məhv etdi. Həqiqətən, Allah qüvvətlidir, cəzası şiddətlidir!

23. Həqiqətən, Biz Musanı ayələrimizlə və açıq-aydın bir dəlillə göndərdik.

24. Fironun, (onun vəziri) Hamanın və Qarunun yanına. Onlar isə: “Bu sehrbazdır, yalançıdır!” – dedilər.

25. (Musa) onların yanına dərgahımızdan haqq ilə (həqiqi dinlə, möcüzələrlə) gəldikdə onlar: “Onunla birlikdə iman gətirənlərin (yəhudilərin) oğlanlarını öldürün, qadınlarını (qızlarını) isə diri saxlayın!” – dedilər. Kafirlərin hiyləsi ancaq boşa çıxar.

26. Firon dedi: “Buraxın məni Musanı öldürüm, qoy o da Rəbbini (köməyə) çağırsın. Doğrusu, mən onun sizin dininizi dəyişdirəcəyindən və yer üzündə fitnə-fəsad törədəcəyindən qorxuram”.

27. Musa dedi: “Mən haqq-hesab gününə inanmayan hər bir təkəbbür sahibindən həm mənim Rəbbim, həm də sizin Rəbbiniz olan Allaha pənah aparıram!”

28. Firon ailəsindən olub imanını gizli saxlayan bir kişi dedi: “Məgər siz bir adamı: “Rəbbim Allahdır!” – deməyinə görə öldürəcəksiniz?! Halbuki o, Rəbbinizdən sizə açıq-aşkar möcüzələr gətirmişdir. Əgər o, yalan deyirsə, ancaq öz əleyhinədir (zərərinədir); yox, əgər doğru danışırsa, onun qorxutduğu əzabın bir qismi sizə toxunar. Şübhəsiz ki, Allah (Ona şərik qoşmaqla, böhtan atmaqla) həddi aşanı, yalançını doğru yola müvəffəq etməz.

29. Ey qövmüm! Bu gün hökm sizindir. Yer üzündə (Misir torpağında İsrail oğullarına) qalib olanlar da sizsiniz. Əgər bizə Allahın əzabı gəlsə, ona qarşı kim bizə kömək edə bilər?!” Firon dedi: “Mən sizə ancaq münasib gördüyüm rəyimi bildirirəm, mən sizə ancaq doğru yolu göstərirəm (Musanı öldürməkdən başqa ayrı çarə yoxdur)!”

30. O mömin adam dedi: “Ey qövmüm! Mən sizə (kafir) firqələrə gəlmiş olan bir günün gəlməsindən qorxuram!

31. Nuh, Ad, Səmud qövmünün və onlardan sonra gələnlərin cəzası kimi bir cəza verilməsindən (ehtiyat edirəm). Allah Öz bəndələrinə əsla zülm etmək istəməz! (Allah Öz qullarına onlar günah etmədən cəza verməz, günahı olanları da cəzasız buraxmaz!)

32. Ey qövmüm! Mən sizə üz verəcək vaveyla günündən qorxuram!

33. (Qorxudan) üz çevirib qaçacağınız gün sizi Allahdan (Allahın əzabından) qoruyan tapılmaz. Allahın yoldan etdiyi kimsəyə də yol göstərən olmaz!"

34. And olsun ki, daha öncə Yusif sizə açıq-aşkar dəlillər(möcüzələr) gətirmişdi. Siz onun gətirdiklərinə şəkk edib dururdunuz. Nəhayət, (Yusif) vəfat etdikdə: "Allah ondan sonra əsla peyğəmbər göndərməyəcəkdir!" – dediniz. Allah (küfr etməklə) həddi aşan, şəkk içində olan kimsəni belə yoldan azdırar!

35. O kəslər ki, (Rəbbindən) özlərinə heç bir dəlil gəlmədən Allahın ayələri barəsində mübahisə edərlər. Bu həm Allah, həm də iman gətirənlər yanında (onlara qarşı) nifrət artırar. Allah hər təkəbbür sahibinin, zalımın ürəyini (təkəbbür, zülm sahibi olan hər bir qəlbi) belə möhürləyər!

36. Firon (istehza ilə) dedi: "Ey Haman! Mənim üçün bir uca qəsr tik ki, bəlkə, yollara yetişim –

37. Göylərin yollarına (yetişim) və Musanın Allahını görüm (Ona vaqif olum). Doğrusu, mən onu yalançı sayıram!" Firona pis əməli beləcə yaxşı göstərildi. O, (haqq) yoldan çıxarıldı. Fironun hiyləsi ancaq boşa çıxdı. (Firon xeyli xərc çəkib uca bir bina tikdirdi. Musanı təkzib etmək üçün cürbəcür vasitələrə əl atdı, lakin bunların hamısı hədər getdi. O, Musaya heç bir şey edə bilmədi).

38. O mömin adam dedi: "Ey qövmüm! Mənim ardımca gəlin, sizi doğru yola çıxardım!

39. Ey qövmüm! Bu dünya həyatı keçici bir şeydir (fanidir), axirət isə əbədi yurddur!

40. Hər kəs bir pislik etsə, o ancaq pisliyi qədər cəza alar. Amma hər kişi, yaxud qadın mömin ikən bir yaxşılıq etsə, belələri Cənnətə daxil olub saysız-hesabsız ruziyə çatar!

41. Ey qövmüm! Bu nə işdir! Mən sizi nicata dəvət etdiyim halda, siz məni Cəhənnəmə (cəhənnəm oduna) dəvət edirsiniz!

42. Siz məni Allahı inkar etməyə, bilmədiyim bir şeyi Ona şərik qoşmağa çağırdığınız halda, mən sizi (hər şeyə qalib) yenilməz qüvvət sahibi olan, çox bağışlayan Allaha (ibadət etməyə) çağırıram!

43. Şübhəsiz ki, sizin məni (sitayiş etməyə) çağırdıqlarınızın (dilsiz-ağılsız bütlərin) nə dünyada, nə də axirətdə (bir kəsi) çağırmaq qabiliyyəti (ibadət olunmağa haqqı) yoxdur. Bizim axır dönüşümüz isə Allahadır. (Rəbbinə şərik qoşmaqla, küfr etməklə) həddi aşanlar, sözsüz ki, cəhənnəmlikdirlər!

44. (Allahın əzabını gördükdə) sizə dediklərimi mütləq xatırlayacaqsınız. Mən öz işimi Allaha həvalə edirəm. Həqiqətən, Allah bəndələrini görəndir!”

45. Beləliklə, Allah onu (o mömin şəxsi) onların qurduğu hiylələrin şərindən qorudu. Firon əhlini isə şiddətli əzab sardı (suya qərq oldular).

46. Onlar (ölən gündən qiyamətə qədər qəbir evində) səhər-axşam (gündə iki dəfə) odda yandırılarlar. Qiyamət qopduğu gün isə (deyiləcəkdir): “Firon əhlini ən şiddətli əzaba salın!”

47. O zaman onlar od içində bir-birilə çənə-boğaz olacaq, acizlər (tabe olanlar) təkəbbür göstərənlərə (öz başçılarına) deyəcəklər: “Biz

(dünyada) sizə tabe idik. İndi siz cəhənnəm odunun (azacıq da olsa) bir hissəsini bizdən dəf edə bilərsinizmi?!”

48. Təkəbbür göstərənlər deyəcəklər: “Biz hamımız oradayıq (cəhənnəm odundayıq). Allah artıq Öz bəndələri arasında (lazımi) hökmünü vermişdir! (Buna heç bir çarə yoxdur!)”

49. Od içində olanlar cəhənnəm gözətçilərinə deyəcəklər: “Rəbbinizə dua edin ki, heç olmasa, bircə gün əzabımızı yüngülləşdirsin!”

50. (Cəhənnəm gözətçiləri) deyəcəklər: “Məgər sizə öz peyğəmbərləriniz açıq-aşkar möcüzələr gətirməmişdilər?” Onlar: “Bəli (gətirmişdilər)!” – deyə cavab verəcəklər. (Cəhənnəm gözətçiləri onlara: ) “Elə isə özünüz dua edin!” – deyəcəklər. Kafirlərin duası isə boş şeydir (heç vaxt qəbul olunmaz).

51. Şübhəsiz ki, Biz öz peyğəmbərlərimizə və iman gətirənlərə həm dünyada, həm də şahidlərin şəhadət verəcəyi gündə (qiyamət günündə) yardım edəcəyik!

52. Elə bir gün ki, zalımlara üzrxahlıqları heç bir fayda verməyəcəkdir. (O gün) onları lənət və axirət yurdunun pis əzabı gözləyir.

53. And olsun ki, Biz Musaya doğru yolu göstərən rəhbər (Tövrat) verdik və İsrail oğullarını kitaba varis etdik!

54. Ağıl sahiblərinə hidayət və öyüd-nəsihət olsun deyə!

55. (Ya Peyğəmbər! Allahın əmrinə, müşriklərin əziyyətinə) səbr et. Allahın (sənə və möminlərə verdiyi zəfər) vədi haqdır. (Ümmətinin sənin özünə aid etdiyin) günahının bağışlanmasını dilə. Axşam-səhər Rəbbini həmd-səna ilə təqdis et! (Daim Allahı zikr et və ya gündə beş vaxt namaz qıl!)

56. Şübhəsiz ki, (Rəbbindən) özlərinə bir dəlil gəlmədən Allahın ayələri barəsində mübahisə edənlərin ürəyində ancaq bir təkəbbür (böyüklük iddiası, sənə qarşı həsəd) vardır. Onlar heç vaxt Ona (böyüklüyə, peyğəmbərlik dərəcəsinə) çatmayacaqlar. Sən Allaha pənah apar. Həqiqətən, O, (hər şeyi) eşidəndir, görəndir!

57. Doğrudan da, göylərin və yerin yaradılışı insanların yaradılışından daha böyük şeydir. Lakin insanların çoxu (bunu) bilməz!

58. Korla görən, iman gətirib yaxşı əməllər edənlərlə pislik edən eyni olmaz. Nə az düşünürsünüz!

59. O, saat (qiyamət günü) mütləq gələcəkdir, ona heç bir şəkk-şübhə yoxdur. Lakin insanların çoxu (buna) inanmaz!

60. Rəbbiniz buyurdu: “Mənə dua edin, Mən də sizin dualarınızı qəbul edim! (Məni çağırın, harayınıza yetişərəm, yaxud yalnız Mənə ibadət edin, sizi mükafatlandıraram!) Mənə ibadət etməyi təkəbbürlərinə sığışdırmayanlar Cəhənnəmə zəlil olaraq girəcəklər!

61. Sizin dincəlməyiniz üçün gecəni (qaranlıq) və (ruzi qazanmağınız, əlləşib vuruşmağınız üçün) gündüzü işıqlı yaradan Allahdır. Allah insanlara lütfkardır, lakin insanların çoxu (Onun lütfünə) şükür etməz!

62. Bu sizin Rəbbiniz, hər şeyin xaliqi olan Allahdır. Ondan başqa heç bir tanrı yoxudur! Siz necə (aldanılıb haqdan) döndərilirsiniz? (Ondan necə dönürsünüz?)

63. Yalnız Allahın ayələrini inkar edənlər (haqdan) belə döndərilərlər!

64. Sizin üçün yeri məskən, göyü tavan edən, sizə surət verən, surətlərinizi gözəlləşdirən, sizə təmiz (pak) nemətlərdən ruzi verən

Allahdır! Bu sizin Rəbbiniz olan Allahdır. Aləmlərin Rəbbi olan Allah nə qədər ucadır (nə qədər uludur)! (Ucalardan ucadır, xeyir-bərəkəti bol və daimidir!)

65. Əbədi (həmişə diri) olan ancaq Odur. Ondan başqa heç bir tanrı yoxdur. (Allaha) dini yalnız Ona məxsus edərək (heç bir şərik qoşmadan) ibadət edin! Aləmlərin Rəbbi olan Allaha həmd olsun!

66. (Ya Peyğəmbər!) De: “Rəbbimdən mənə açıq-aşkar dəlillər gəldiyi zaman sizin Allahdan qeyri tapındıqlarınıza (bütlərə) ibadət etmək mənə qadağan olunmuş, ancaq aləmlərin Rəbbinə təslim olmaq buyurulmuşdur!”

67. Sizi (atanız Adəmi) torpaqdan, sonra nütfədən, sonra laxtalanmış qandan yaradan, sonra (analarınızın bətnindən) uşaq olaraq çıxardan, sonra kamillik çağına çatasınız, daha sonra qocalasınız deyə yaşadan Odur. İçərinizdə daha əvvəl (gənclik, ahıllıq, qocalıq çağlarına yetişmədən) öldürülənlər də var. (Bütün bunlar) müəyyən bir vaxta (ömrünüzün sonuna) yetişəsiniz və bəlkə, (Allahın vəhdaniyyətini) düşünüb anlayasınız deyə edilir.

68. Dirildən də, öldürən də Odur. O, bir işi qərara aldıqda (bir şeyi yaratmaq istədikdə) ona ancaq: “Ol!” – deyər, o da dərhal olar.

69. (Ya Peyğəmbər!) Allahın ayələri barəsində mübahisə edənləri görmürsənmi? Onlar necə də (haqdan) döndərilirlər!

70. Kitabı (Quranı) və peyğəmbərlərimizə göndərdiklərimizi (vəhyi, möcüzələri və hökmləri) yalan hesab edənlər (bu hərəkətlərindən dolayı hansı cəzalara məruz qalacaqlarını) mütləq biləcəklər!

71. O zaman ki, boyunlarında halqalar və zəncirlər olduğu halda sürüklənəcəklər

72. Cəhənnəmə (qaynar suya) tərəf, sonra odda yandırılacaqlar,

73. Sonra da onlara belə deyiləcəkdir: “Haradadır şərik qoşub ibadət etdikləriniz –

74. Allahdan qeyri?!” (Müşriklər) deyəcəklər: “Onlar bizdən qeyb oldular. Xeyr, biz əslində öncə (dünyada) heç nəyə ibadət etmirdik!” Allah (haqq yoldan) kafirləri belə azdırar!

75. (Onlara belə deyiləcəkdir: ) “Bu (əzab) sizin yer üzündə nahaq yerə sevinməyinizə və təkəbbürlənməyinizə görədir!

76. Girin cəhənnəmin qapılarına (təbəqələrinə) orada əbədi qalmaq üçün!” Təkəbbürlülərin sığınacağı necə də pisdir!

77. (Ya Peyğəmbər! Müşriklərin əziyyətlərinə) səbr et. Allahın (sənə və möminlərə verdiyi zəfər) vədi haqdır. Ya onlara vəd etdiyimizin (əzabın) bir qismini (diri ikən) sənə göstərəcək, ya da səni Öz dərgahımıza aparacağıq. Onlar Bizim hüzurumuza qaytarılıb gətiriləcəklər! (Qiyamət günü dünyadakı əməllərinə görə şiddətli əzaba düçar olacaqlar!)

78. Biz səndən əvvəl də peyğəmbərlər göndərmişdik. Onlardan kimisi haqqında sənə xəbər vermiş, kimisi haqqında xəbər verməmişik. Heç bir peyğəmbər Allahın izni olmadan bir möcüzə gətirə bilməz. Allahın (kafirlərə əzab verilməsi barədə) əmri gəldikdə (peyğəmbərlər və onları təkzib edənlər arasında) ədalətlə hökm olunar. Yalan danışanlar (batil söyləyənlər) elə oradaca ziyana uğrayarlar.

79. Sizin üçün minməyə heyvanlar yaradan Allahdır. Onlardan yedikləriniz də var.

80. Sizin üçün onlardan daha neçə-neçə mənfəətlər vardır (dərilərindən çadır qurur, yunlarından paltar, yorğan-döşək düzəldirsiniz). Ürəyinizdən keçən bir arzuya onları minməklə

yetişirsiniz (onları minib istədiyiniz yerə gedirsiniz). (Quruda bir yerdən başqa yerə) onların üstündə, (suda isə) gəmilərdə daşınırsınız.

81. O isə Öz ayələrini (qüdrət nişanələrini) göstərir. Allahın ayələrinin hansını inkar edə bilərsiniz?!

82. Məgər onlar (müşriklər) yer üzünü dolaşıb özlərindən əvvəlkilərin axırının necə olduğunu görmürlərmi? Onlar (sayca) bunlardan daha çox, daha qüvvətli, yer üzündə daha çox iz qoymuş kimsələr idi. Qazandıqları (dünya malı) onlara bir fayda vermədi (Allahın əzabını onlardan dəf edə bilmədi).

83. Peyğəmbərləri onlara açıq-aşkar möcüzələr gətirdikdə özlərində olan elmə sevindilər, onlara (kafirlərə) isə məsxərəyə qoyduqları əzab yetişdi. (Və ya: peyğəmbərləri onlara açıq-aşkar möcüzələrlə gəldikləri zaman onlar öz biliklərinə - batil əqidə və fəlsəfələrinə, ticarətdən mənfəət əldə edə bilmək bacarıqlarına – qürrələndilər. Kafirləri istehza etdikləri əzab sardı).

84. Onlar əzabımızı gördükdə dedilər: “Biz yalnız Allaha iman gətirdik, (Rəbbimizə) qoşduğumuz şərikləri (bütləri) isə inkar etdik!”

85. Amma əzabımızı gördükləri zaman iman gətirmələri – Allahın Öz bəndələri barəsində öncə olub-keçmiş (tətbiq edilmiş) adətinə (qayda-qanununa) müvafiq olaraq heç bir fayda vermədi. (Əzab gəlməmişdən əvvəl iman gətirmək lazımdır, əzabı gördükdə gətirilən imanın heç bir faydası olmaz). Kafirlər elə oradaca ziyana uğradılar (məhv oldular).

## .41.
## Fussilət (Müfəssəl izah edilmiş) surəsi

**(Məkkədə nazil olmuşdur, 54 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Ha, Mim!

2. (Bu Quran) mərhəmətli, rəhmli (olan Allah) tərəfindən nazil edilmişdir.

3. Ərəbcə Quran olaraq (onu) bilən bir qövm üçün əyələri müfəssəl izah edilmiş bir kitabdır.

4. (Bu Quran) həm (möminlərə Cənnətlə) müjdə verəndir və həm də (kafirləri cəhənnəm əzabı ilə) qorxudan. Onların (Məkkə əhlinin) əksəriyyəti (Qurandan) üz döndərib (onu) dinləməz (Allahın kəlamının qüdsiyyəti, hikməti haqqında düşünməz).

5. (Ya Peyğəmbər!) Onlar deyərlər: "Sənin bizi dəvət etdiyinə (tövhid dininə) qarşı qəlblərimiz örtülü, qulaqlarımız da kardır və bizimlə sənin aranda pərdə vardır. Sən (öz dininə) əməl et, biz də (öz dinimizə) əməl etməkdəyik! (Sən öz istədiyini et, biz də öz istədiyimizi!)"

6. (Ya Rəsulum!) De: "Mən də ancaq sizin kimi bir insanam. Mənə vəhy olunur ki, sizin tanrınız bir olan Allahdır. Ona tərəf yönəlin və Ondan bağışlanmağınızı diləyin. Vay müşriklərin halına!

7. O müşriklər ki, zəkat vermir və axirətə inanmırlar!

8. İman gətirib yaxşı işlər görənləri tükənməz (minnətsiz) ruzi gözləyir!"

9. (Ya Peyğəmbər!) De: "Doğrudanmı siz yeri iki gündə yaradanı inkar edir və Ona şəriklər qoşursunuz? O ki, aləmlərin Rəbbidir!

10. O, yer üzündə möhkəm durmuş dağlar yaratdı, onu bərəkətli etdi və (Allahdan ruzi) istəyənlər üçün bərabər olaraq orada yer əhlinin ruzisini dörd gündə (mövsümdə) müəyyən etdi. (Yaxud yerin və yer üzündə olanların neçə gün ərzində yaradıldığını soruşanlar bilsinlər ki, Allah onların hamısını birlikdə dörd gündə xəlq etdi).

11. Sonra Allah tüstü (duman, yerdən qalxan buxar) halında olan göyə üz tutdu (göyü yaratmaq qərarına gəldi). Ona (göyə) və yerə belə buyurdu: “İstər-istəməz vücuda gəlin!” Onlar da: “İstəyərək (Allahın əmrinə itaət edərək) vücuda gəldik!” – deyə cavab verdilər.

12. Allah onları (səmaları) yeddi (qat) göy olaraq iki gündə əmələ gətirdi. (Beləliklə, iki gün ərzində yer, sonra iki gün ərzində yer üzündə olanlar, daha sonra iki gün ərzində göylər xəlq edildi. Kainatın yaradılması altı gün ərzində başa çatdı). O, hər bir göyün işini özünə vəhy edib bildirdi. Biz aşağı göyü (dünya səmasını) qəndillərlə (ulduzlarla) bəzədik və (onu şeytanlardan, hər cür bəladan) hifz etdik. Bu, yenilməz qüvvət sahibi olan, (hər şeyi) bilən Allahın təqdiridir (əzəli hökmü, qanunudur)!”

13. (Ya Peyğəmbər!) Əgər (Məkkə müşrikləri sənin bu sözlərindən sonra haqdan, imandan) üz döndərsələr, de: “Mən sizi Ad və Səmud ildırımı kimi bir ildırımla (bu tayfaları məhv etmiş tükürpədici bir səslə, müdhiş bir əzabla) qorxuduram!”

14. Onlara əvvəllər də, sonralar da bir-birinin ardınca: “Yalnız Allaha ibadət edin” – deyən peyğəmbərlər gəldiyi zaman onlar: “Əgər Rəbbimiz (bizim ancaq Ona iman gətirməyimizi, bütlərə sitayiş etməməyimizi) istəsəydi, (peyğəmbər olaraq) mələklər endirərdi. Biz sizinlə göndərilənlərə (risalətə, şəriətə) inanmırıq!” – deyə cavab vermişdilər.

15. Ad qövmünə gəlincə, onlar yer üzündə nahaq yerə təkəbbür göstərib dedilər: “Bizdən daha qüvvətli kim ola bilər?!” Məgər onlar düşünmədilərmi ki, özlərini yaratmış olan Allah onlardan daha qüvvətlidir?! Onlar ayələrimizi inkar edirdilər.

16. Biz onlara dünyada rüsvayçılıq əzabını daddırmaq üçün o uğursuz (nəhs) günlərdə üstlərinə vıyıltı ilə əsən (çox soyuq) bir

külək (qasırğa) göndərdik. Axirət əzabı isə daha rüsvayedicidir. Onlara (qiyamət günü) kömək də olunmayacaqdır.

17. Səmud qövmünə gəlincə, Biz onlara haqq yolu göstərdik, amma onlar korluğu (küfrü) doğru yoldan üstün tutdular. Beləliklə, onları qazandıqları günahların ucbatından zəliledici ildırım əzabı yaxaladı.

18. İman gətirib (Allahdan) qorxanları isə xilas etdik.

19. Allahın düşmənləri Cəhənnəmə toplanacaqları gün onlar (əvvəlincisindən axırıncısınadək tutulub bir yerdə) saxlanacaqlar.

20. Nəhayət, onlar Cəhənnəmə gəldikdə qulaqları, gözləri və dəriləri etdikləri əməllər barəsində onların əleyhinə şəhadət verəcəkdir.

21. Onlar öz dərilərinə: “Nə üçün əleyhimizə şəhadət verirsiniz?” – deyəcəklər. (Dəriləri də) belə cavab verəcəkdir: “Hər şeyi dilə gətirən Allah bizi danışdırdı. Sizi ilk dəfə yoxdan yaradan Odur. Siz Onun hüzuruna qaytarılırsınız!”

22. Siz qulaqlarınızın, gözlərinizin və dərilərinizin əleyhinizə şəhadət verəcəklərinizdən qorxub (günah işləməkdən) çəkinmir, etdiyiniz əməllərin çoxunu isə Allahın bilməyəcəyini zənn edirsiniz.

23. Sizin öz Rəbbiniz barəsində bu zənniniz sizi məhv etdi və ziyana uğrayanlardan oldunuz!

24. İndi (əzaba) dözsələr də (dözməsələr də), onların məskəni Cəhənnəmdir. Onlar (Allahdan) riza diləsələr də, onların diləyi qəbul olunmaz (yaxud dünyaya qayıtmaq istəsələr də, onların bu istəyi qəbul edilməz).

25. Biz onlara (Məkkə müşriklərinə) önlərindəkini və arxalarındakını (dünyanın zövq-səfasına uyub axirətə inanmamalarını) özlərinə gözəl göstərən (şeytansifət) dostlar caladıq. Özlərindən əvvəl gəlib-getmiş cinlərdən və insanlardan olan (kafir)

ümmətlərlə birlikdə o söz (əzab hökmü) onlar barəsində də gerçəkləşdi. Şübhəsiz ki, onlar ziyan çəkənlər oldular!

26. Kafir olanlar (öz dostlarına): “Bu Quranı dinləməyin, o oxunduqda (eşidilməsin deyə) səs-küy (şuluqluq) salın ki, bəlkə, (bununla Muhəmmədə) qalib gələsiniz!” – dedilər.

27. Biz kafir olanlara mütləq şiddətli bir əzab daddıracaq, etdikləri əməllərin ən şiddətli cəzasını verəcəyik!

28. Budur Allahın düşmənlərinin cəzası – Cəhənnəm (cəhənnəm odu)! Ayələrimizi inkar etmələrinin cəzası olaraq onların əbədi məskəni oradadır!

29. Kafir olanlar deyəcəklər: “Ey Rəbbimiz! Cinlərdən və insanlardan bizi azdıranları bizə göstər ki, onları ayaqlarımız altına salaq, paymal olsunlar!”

30. Şübhəsiz: “Rəbbimiz Allahdır!” – deyən, sonra da (sözündə) düz olan kəslərə (ölüm ayağında) mələklər nazil olub (belə deyəcəklər): “Qorxmayın və kədərlənməyin! Sizə vəd olunan Cənnətlə sevinin!

31. Biz dünyada da, axirətdə də sizin dostlarınızıq. Orada (Cənnətdə) sizin üçün nəfsinizin çəkdiyi, istədiyiniz hər şey vardır.

32. Bağışlayandan, rəhm edəndən (Allahdan) ruzi (ziyafət) olaraq!”

33. (Xalqı) Allaha tərəf çağıran, yaxşı iş görən və: “Mən müsəlmanlardanam!” – deyən kəsdən daha gözəl danışan kim ola bilər?!

34. Yaxşılıqla pislik eyni ola bilməz! (Ey mömin kimsə!) Sən (pisliyi) yaxşılıqla dəf et! (Qəzəbə səbirlə, cəhalətə elmlə, xəsisliyə comərdliklə, cəzaya bağışlanmaqla cavab ver!) Belə olduqda aranızda düşmənçilik olan şəxsi, sanki yaxın bir dost görərsən!

35. Bu (xislət) yalnız (dünyada məşəqqətlərə) səbir edənlərə verilir və yalnız böyük qismət (savab, fəzilət) sahiblərinə əta olunur!

36. Əgər sənə Şeytandan (bu xislətə mane olan) bir vəsvəsə gəlsə (fəsad toxunsa), Allaha sığın. Şübhəsiz ki, Allah (hər şeyi) eşidəndir, biləndir!

37. Gecə və gündüz, günəş və ay Onun (vəhdaniyyətinə, qüdrət və əzəmətinə dəlalət edən) əlamətlərindəndir. Günəşə və aya səcdə etməyin, onları yaradan Allaha səcdə edin! Əgər Ona ibadət edirsinizsə (heç bir şərik qoşmadan ibadət edin)!

38. Əgər (müşriklər Allaha səcdə etməyə) təkəbbür göstərsələr (bilsinlər ki, bunun zərəri Allaha deyil, ancaq özlərinədir). Çünki (Ya Rəsulum!) Sənin Rəbbinin dərgahında olanlar (mələklər) gecə-gündüz usanmadan Onu təqdis edib şəninə tariflər deyərlər.

39. Onun qüdrət nişanələrindən biri də budur ki, sən yer üzünü qupquru görürsən. Biz ona yağış yağdıran kimi hərəkətə gəlib qabarar (cana gələr). Onu dirildən, şübhəsiz ki, ölüləri də diriLdəcəkdir. Həqiqətən, O, (Allah) hər şeyə qadirdir!

40. Ayələrimizi inkar edənlər (ayələrimizdən üz döndərənlər) Bizdən gizli qalmazlar. Cəhənnəm oduna atılan kəs yaxşıdır, yoxsa qiyamət günü (Allahın hüzuruna) arxayın gələn kəs?! İstədiyinizi edin. Şübhəsiz ki, O nə etdiyinizi görəndir.

41. Özlərinə Quran gəldiyi zaman onu yalan hesab edənlər (mütləq cəzalarına çatacaqlar). O (Quran), şübhəsiz ki, çox dəyərli (qiymətli) bir kitabdır.

42. Nə öncə, nə də sonra batil ona yol tapa bilməz (Şeytan onun bir sözünü, bir hərfini belə dəyişə bilməz). O, hikmət sahibi, şükrə (tərifə) layiq olan (bütün işləri bəyənilən Allah) tərəfindən nazil edilmişdir.

43. (Ya Rəsulum!) Sənə ancaq səndən əvvəlki peyğəmbərlərə deyilənlər deyilir. Həqiqətən, sənin Rəbbin həm bağışlayandır, həm də şiddətli cəza verəndir!

44. Əgər Biz onu özgə bir dildə olan Quran etsəydik (Məkkə müşrikləri): "Məgər onun ayələri (bizim üçün) müfəssəl izah olunmalı deyildimi?! Bu nədir? (Quran) özgə dildə, (Peyğəmbər isə) ərəbmidir?!" – deyərdilər. (Ya Rəsulum!) De: "O, iman gətirənlərə hidayətdir və (cəhalət xəstəliyinə tutulmuş ürəklərə) şəfadır. İman gətirməyənlərin isə qulaqlarında karlıq (ağırlıq) vardır. O, (Quran) onları kor etmişdir. Onlar (sanki) uzaq bir yerdən çağırılırlar. (Heç bir şey eşitməz, heç bir şey anlamazlar).

45. Biz Musaya da kitab vermişdik və onun (Tövratın) barəsində də ixtilaf düşmüşdü. (Ya Peyğəmbər!) Əgər sənin Rəbbinin (cəzanın qiyamət gününə qədər təxirə salınması haqqındakı) öncə buyurduğu bir söz olmasaydı, dərhal işləri bitmiş olardı (dünyada ikən əzabı dadardılar). Həqiqətən, (müşriklər Quran) barəsində çox dərin (başqalarını da şübhəyə salan) bir şəkk içindədirlər!

46. Yaxşı iş görənin xeyiri özünə, pislik edənin də zərəri özünə olar. (Ya Peyğəmbər!) Sənin Rəbbin (haqsız yerə) bəndələrə zülm edən deyildir!

47. O saatı (qiyamətin nə vaxt qopacağını) bilmək yalnız Ona aiddir. O bilmədən heç bir meyvə qabığından (tumurcuğundan) çıxmaz, heç bir qadın hamilə olmaz və bari-həmlini yerə qoymaz. (Allah) onlara (müşriklərə məzəmmət və istehza ilə): "Şəriklərim haradadır? – deyəcəyi gün, onlar: "(Ey Rəbbimiz!) Biz Sənə ərz etdik ki, aramızda (Sənin şərikin olduğuna şəhadət verə biləcək) heç bir şahid yoxdur!" – deyə cavab verəcəklər.

48. Öncə (dünyada) ibadət etdikləri (bütlər) onlardan qeyb olacaq və onlar özləri üçün qaçıb can qurtarmağa bir yer olmadığını yəqin edəcəklər.

49. (Kafir, nankor) insan (Allahdan özünə) yaxşılıq diləməkdən usanmaz. Əgər ona bir pislik üz versə, ümidsizliyə qapılıb məyus olar.

50. Başına gələn müsibətdən sonra dərgahımızdan ona bir mərhəmət əta etsək (dadızdırsaq), mütləq: “Bu elə mənim haqqımdır. Qiyamətin (qiyamət saatının) qopacağını güman etmirəm. Doğrudan da, əgər Rəbbimin hüzuruna qaytarılıb gətirilsəm, Onun dərgahında məni ən gözəl nemət (Cənnət) gözləyir!” – deyər. Biz kafir olanlara (dünyada) nə etdiklərini mütləq (bir-bir) xəbər verəcək və sözsüz ki, onlara şiddətli bir əzab daddıracağıq.

51. (Kafir, naşükür) insana nemət bəxş etdiyimiz zaman (imandan) üz döndərər, (haqdan) uzaqlaşıb yan gəzər. Ona bir pislik üz verdikdə isə (Rəbbinə) uzun-uzadı dua edər (yaxşı gündə Allahı unudar, dar gündə dərhal Ona yalvarar).

52. (Ya Peyğəmbər! O kafirlərə) de: “Bir söyləyin görək, əgər (bu Quran) Allah dərgahındandırsa və sonra siz də onu inkar edibsinizsə, (sizin kimi haqdan) uzaq bir nifaq (ədavət) içində olan kəsdən (haqq yolu) daha çox azmış kim ola bilər?!

53. Onun (Quranın) haqq olduğu onlara (müşriklərə) bəlli olsun deyə, Biz öz qüdrət nişanələrimizi onlara həm xarici aləmdə (üfüqlərdə, kainatda, göylərin və yerin ətrafında), həm də onların öz daxilində mütləq göstərəcəyik. (Ya Peyğəmbər!) Məgər Rəbbinin hər şeyə şahid olması (sənin dediklərinin doğruluğuna) kifayət deyilmi?!

54. (Ya Peyğəmbər!) Bil ki, onlar öz Rəbbi ilə qarşılaşacaqları (qiyamət günü dirilib haqq-hesab üçün Allahın hüzurunda

duracaqları) barədə şəkk-şübhə içindədirlər. Və yenə bil ki, O (Öz elmi və qüdrəti ilə) hər şeyi ehtiva edəndir!

## .42.
## əş-Şura (Şura) surəsi
**(Məkkədə nazil olmuşdur, 53 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Ha, Mim!

2. Eyn, Sin, Qaf!

3. (Ya Rəsulum!) Yenilməz qüvvət, hikmət sahibi olan Allah sənə və səndən əvvəlkilərə (keçmiş peyğəmbərlərə) belə vəhy edir!

4. Göylərdə və yerdə nə varsa (hamısı) Onundur! O, (hər şeydən) ucadır, (hər şeydən) uludur!

5. Göylər (Allahın əzəmətindən, heybətindən) az qala bir-birinin üstündən çatlayıb dağılsın. Mələklər də Rəbbini həmd-səna ilə təqdis edər və yerdəkilərin (günahlarının) bağışlanmasını diləyərlər. Bilin ki, Allah, həqiqətən, bağışlayandır, rəhm edəndir!

6. (Ya Peyğəmbər!) Allahdan başqasını dost tutanlar üzərində Allah Özü nəzarətçidir. Sən onlara zamin deyilsən! (Sənin vəzifən yalnız risaləti, Allahın hökmlərini təbliğ etməkdir!)

7. (Ya Peyğəmbər!) Şəhərlərin anası (olan Məkkə) əhlini və onun ətrafındakıları (bütün başqa insanları) haqqında heç bir şübhə olmayan (bütün məxluqatın bir yerə cəm olacağı) toplanış (qiyamət) günü ilə qorxutmağın üçün beləcə sənə ərəbcə Quran vəhy etdik. (Axirətdə insanların) bir qismi (möminlər) Cənnətdə, bir qismi (kafirlər) isə Cəhənnəmdə olacaqdır!

8. Əgər Allah diləsəydi, onların hamısını (eyni dində olan) vahid bir ümmət edərdi. Amma Allah istədiyini (haqq dinə gətirməklə) Öz mərhəmətinə qovuşdurar. Zalımların isə nə bir dostu olar, nə də bir imdada yetəni!

9. Yoxsa onlar (müşriklər) özlərinə Allahdan başqa hamilər götürdülər. İxtiyar sahibi ancaq Odur. Ölüləri O dirildir. Hər şeyə O qadirdir!

10. Siz nəyin barəsində ixtilaf etsəniz, onun hökmü yalnız Allaha aiddir. Bu mənim Rəbbim olan Allahdır. Mən (bütün işlərimdə) ancaq Ona təvəkkül edir, ancaq Ona tərəf qayıdıram! (Ona tövbə edirəm!)

11. Göyləri və yeri yoxdan yaradan (Allah) sizin üçün özünüzdən (öz cinsinizdən) zövcələr, heyvanlardan da (erkək və dişi olmaqla özləri üçün) ciftlər yaratmışdır. O sizi bu minvalla çoxaldır. Ona bənzər heç bir şey yoxdur. O, (hər şeyi) eşidəndir, (hər şeyi) görəndir!

12. Göylərin və yerin açarları (ixtiyarı) Onun əlindədir. O, istədiyinin ruzisini bol, (istədiyininkini də) qıt edər. O, hər şeyi biləndir!

13. (Ya Peyğəmbər!) Allah: “Dini doğru-dürüst tutun (qoruyub saxlayın), onda ayrılığa düşməyin!” – deyə Nuha tövsiyə etdiyini, sənə vəhy buyurduğunu, İbrahimə, Musaya, və İsaya tövsiyə etdiyini dində sizin üçün də qanuni etdi. Sənin dəvət etdiyin (tövhid dini) müşriklərə ağır gəldi. Allah istədiyi kimsəni özünə (peyğəmbər) seçər və tövbə edib Ona tərəf qayıdan kimsəni də doğru yola yönəldər!

14. Onlar yalnız özlərinə (tövhid haqqında) elm gəldikdən sonra aralarındakı ədavət (həsəd) üzündən ayrılığa düşdülər. Əgər (cəzanın) müəyyən bir vaxtadək (qiyamət gününə qədər təxirə

salınması barədə) öncə Rəbbindən bir söz olmasaydı, aralarında dərhal hökm verilərdi (hamısı elə dünyada əzaba düçar edilər, bununla da iş, yəqin ki bitmiş olardı). Onlardan sonra kitaba varis olanlar da (yəhudilər, xaçpərəstlər və ya özlərinə Quran göndərilmiş müşriklər də) onun (Quranın, peyğəmbər əleyhissəlamın) barəsində dərin (başqalarını da şübhəyə salan) bir şəkk içindədirlər.

15. (Ya Peyğəmbər!) Buna görə də sən (xalqı tövhid dininə) dəvət et və sənə əmr edildiyi kimi (bu yolda) səbatlı ol. Onların (müşriklərin) nəfslərindən gələn istəklərə uyma və de: “Mən Allahın nazil etdiyi kitaba (bütün ilahi kitablara) inandım. Mənə sizin aranızda ədalətlə hökm etmək (ədalətli olmaq) əmr olunmuşdur. Allah bizim də Rəbbimizdir, sizin də Rəbbiniz. Bizim əməllərimiz bizə, sizin də əməlləriniz sizə aiddir (hərə öz əməlinə cavabdehdir). Bizimlə sizin aranızda heç bir mübahisə yoxdur (bizim haqlı olduğumuz göz qabağındadır). Allah (qiyamət günü) hamımızı bir yerə toplayacaqdır. Axır dönüş də yalnız Onadır!”

16. Allahın dəvəti qəbul olunduqdan (iman gətirdikdən) sonra Onun barəsində (bizim kitabımız sizinkindən əvvəl nazil olmuşdur, bizim peyğəmbərimiz sizinkindən daha əfzəldir deyə) mübahisə edənlərin dəlili Rəbbinin yanında batildir. Onlar (axirətdə) qəzəbə və şiddətli əzaba düçar olacaqlar!

17. Kitabı və mizan-tərəzini (insanlar arasında ədalət tərəzisi olan şəriəti) haqq olaraq nazil edən Allahdır. Nə bilirsən, bəlkə də, o saat (qiyamət saatı) yaxındır!

18. Ona inanmayanlar onun tez gəlməsini istərlər. İnananlar isə onun haqq olduğunu bilərək ondan qorxuya düşərlər. (Ya Peyğəmbər!) Bil ki, o saat barəsində mübahisə edənlər (haqq yoldan) azıb çox uzaq düşmüşlər.

19. Allah Öz bəndələrinə çox lütfkardır; istədiyinə ruzi verər. O, yenilməz qüvvət, qüdrət sahibidir!

20. Biz axirət qazancını (savabını) istəyənin qazancını artırar, dünya mənfəəti istəyənə də ondan verərik. Onun axirətdə heç bir payı yoxdur.

21. Yoxsa (müşriklərin) Allahın dində izin vermədiyi bir şeyi onlar üçün qanuni (halal) edən şərikləri vardır. Əgər (cəzanın qiyamətə saxlanılması barədə) qəti söz (vəd) olmasaydı, aralarında hökm artıq icra edilmiş olardı (hamısı elə dünyada ikən əzaba düçar edilərdi). Şübhəsiz ki, zalımları şiddətli bir əzab gözləyir!

22. (Ya Peyğəmbər! Qiyamət günü) zalımları (dünyada) qazandıqları günahların qorxusundan tir-tir əsən görəcəksən. O (müsibət, Allahın sitəmi) mütləq onların başına gələcəkdir. İman gətirib yaxşı işlər görənlər isə cənnət bağçalarında olacaqlar. Rəbbinin dərgahında onlar üçün istədikləri hər şey olacaqdır. Budur ən böyük nemət!

23. Allah iman gətirib yaxşı əməllər edən bəndələrinə bununla müjdə verir. (Ya Peyğəmbər!) De: “Mən sizdən bunun (risaləti təbliğ etməyimin) müqabilində qohumluq məhəbbətindən (əhli-beytə sevgidən) başqa bir şey istəmirəm. Kim bir yaxşı iş görərsə, onun yaxşılığının savabının (mükafatını) artırarıq!” Həqiqətən, Allah bağışlayandır, qədirbiləndir! (Şükrün və itaətin, gözəl əməllərin əvəzini verəndir!)

24. Yoxsa onlar: “(Muhəmməd) Allaha qarşı yalan uydurdu!” – deyirlər. (Ya Peyğəmbər!) Əgər Allah istəsə, sənin qəlbini möhürləyər (Allahın adından yalan danışacağın təqdirdə Quranı sənə büsbütün unutdurar). Allah batili məhv edər və haqqı Öz sözləri ilə gerçəkləşdirər. Şübhəsiz ki, O, ürəklərdə olanları biləndir.

25. Bəndələrinin tövbəsini O qəbul edir, günahları O bağışlayır və sizin nə etdiyinizi də O bilir.

26. İman gətirib yaxşı işlər görənlərin duasını qəbul edən, Öz nemətini onlara artıran da Odur. Kafirləri isə şiddətli bir əzab gözləyir!

27. Əgər Allah (bütün) bəndələrinə bol ruzi versəydi, onlar (günah etməkdə) yer üzündə həddi aşardılar. Lakin O (Öz bəndələrinə) istədiyi qədər (birinə az, birinə çox) ruzi göndərir. Allah öz bəndələrindən xəbərdardır, (onları) görəndir! (Allah kimə nə qədər ruzi verəcəyini Öz əzəli elmi, ilahi hikməti ilə çox gözəl bilir. Bəndələr içərisində eləsi vardır ki, çörəyi artıq olsa, xalqa əziyyət verər, hər şeyi, Allahı belə danar; eləsi də vardır ki, güzəranı bir qədər pisləşsə, yer üzündə fitnə-fəsad törədər, özgə malına əl uzadar).

28. (İnsanlar) ümidsizliyə qapılandan sonra, yağmur göndərən, nemətini (yağışını) açıb paylayan Odur. İxtiyar sahibi Odur. Tərifə (şükrə) layiq olan da Odur.

29. Göyləri, yeri və oralara yayıb səpələdiyi canlıları yaratmağı Onun qüdrət nişanələrindəndir. Allah istədiyi vaxt (qiyamət günü) onları bir yerə yığmağa qadirdir!

30. Sizə üz verən hər bir müsibət öz əllərinizlə qazandığınız günahların (etdiyiniz əməllərin) ucbatındandır! (Bütün bunlara baxmayaraq) Allah (günahlarınızın) çoxunu əfv edər.

31. Siz (Allahı) yer üzündə aciz buraxa bilməzsiniz (Onun əzabından qaçıb canınızı qurtara bilməzsiniz). Allahdan başqa sizin nə bir himayədarınız olar, nə də bir imdada yetəniniz!

32. Dənizdə (uca) dağlar kimi üzən (gəmilər) də Onun (qüdrət) əlamətlərindəndir.

33. Əgər (Allah) istəsə, küləyi saxlayar, onlar da (suyun) üzündə durub qalarlar (nə irəli, nə də geri gedə bilərlər). Həqiqətən, bunda (əziyyətlərə) çox səbr edən, (nemətlərə) çox şükür edən hər bir kəs üçün ibrətlər vardır!

34. Yaxud onları (gəmi əhlini) qazandıqlarına (günahlarına) görə məhv edər və bir çoxunu bağışlayar!

35. Bizim ayələrimiz (qüdrət nişanələrimiz) barəsində mübahisə edənlər bilsinlər ki, onlar üçün (əzabımızdan) qaçıb can qurtarmağa heç bir yer yoxudur!

36. Sizə verilən hər hansı bir şey fani dünya malıdır. Allah yanında olan (axirət mükafatları) isə daha yaxşı və daha baqidir. O kəslər üçün ki, iman gətirib öz Rəbbinə təvəkkül edərlər;

37. O kəslər üçün ki, böyük günahlardan rəzil işlərdən (zinadan) çəkinər, (birinə) qəzəbləndikləri zaman (onun günahını) bağışlayarlar;

38. O kəslər üçün ki, Rəbbinin dəvətini qəbul edər (iman gətirər), namaz qılar, işlərini öz aralarında məsləhət-məşvərətlə görər, onlara verdiyimiz ruzidən (Allah yolunda) sərf edərlər.

39. Və o kəslər üçün ki, onlar zülmə (təcavüzə) məruz qaldıqda (həddi aşmadan) intiqam alarlar (zalımdan zülmü müqabilində əvəz çıxar, caniyə də etdiyi cinayətin cəzası nədirsə, onu verərlər).

40. Hər hansı bir pisliyin cəzası onun özü kimi bir pislikdir. Bununla belə hər kəs (pislik edəni) bağışlasa və (onunla) barışsa, onun mükafatı Allaha aiddir. Həqiqətən, O, zalımları sevməz!

41. Zülmə məruz qaldıqdan sonra (həddi aşmadan) əvəzini çıxanlara heç bir cəza verilməz (onların heç bir günahı yoxdur, uğradıqları haqsızlığın əvəzini çıxmışlar).

42. Cəza ancaq insanlara (haqsız yerə) zülm edənlərə, yer üzündə fitnə-fəsad törədənlərə verilər. Məhz beləl-ərini şiddətli əzab gözləyir!

43. Əlbəttə, hər kəs (pisliyə) səbr edib (qisası) bağışlasa, (onun bu hərəkəti şəriətcə) çox bəyənilən əməllərdəndir!

44. Allahın yoldan çıxartdığı kimsəyə (Allahın) Özündən başqa yol göstərən olmaz. (Ya Peyğəmbər!) Sən zalımları əzabı gördükləri zaman: “(Pərvərdigara!) Geri dönməyə dünyaya qayıtmağa) bir yol varmıdır?” – deyən görəcəksən.

45. Ona (cəhənnəm atəşinə) gətirilib göstərildikləri zaman sən onların zillətdən boyunlarını büküb (dəhşətdən gözlərinin ucu ilə) gizlin-gizlin (oda) baxdıqlarını görəcəksən. İman gətirənlər deyəcəklər: “Həqiqətən, (əsl) ziyan çəkənlər qiyamət günü özlərini və ailələrini (özlərinə bağlı olanları) ziyana uğradanlardır!” Bilin ki, zalımlar (kafirlər) daimi əzab içində olacaqlar.

46. Onlara Allahdan başqa yardım edəcək (Allahın əzabından qurtara biləcək) dostlar tapılmayacaqdır. Allahın (öz pis əməlinə, çirkin etiqadına görə) zəlalətə saldığı kimsə üçün (haqqa dönüb qayıtmağa) heç bir yol olmaz!

47. (Ey insanlar!) Allah tərəfindən geri qaytarılması əsla mümkün olmayan bir gün (qiyamət günü) gəlməmişdən əvvəl Rəbbinizin dəvətini qəbul edin! (Ona iman gətirin!) O gün sizin üçün heç bir sığınacaq tapılmaz və (günahlarınızı) inkar etməyə də heç bir imkan olmaz!

48. (Ya Peyğəmbər!) Əgər (bu müşriklər sənin dəvətindən) üz döndərsələr (əsla ürəyini qısma). Biz səni onlara gözətçi göndərməmişik. Sənin öhdənə düşən ancaq (risaləti) təbliğ etməkdir. Əgər Biz insana Öz dərgahımızdan bir mərhəmət (nemət) daddırsaq, ona sevinər; yox, əgər onlara öz əlləri ilə etdikləri əməllərin

ucbatından bir pislik toxunsa, (görərsən ki) insan, həqiqətən, nankordur!

49. Göylərin və yerin hökmü Allahın əlindədir. O, istədiyini yaradır, istədiyinə ancaq qız, istədiyinə də ancaq oğlan verir.

50. Yaxud hər ikisindən – həm oğlan, həm də qız verir, istədiyini də sonsuz (övladsız) edir. O (hər şeyi) biləndir, (hər şeyə) qadirdir!

51. (Heç bir bəşər övladına Allahla danışmaq müyəssər olmaz, çünki bəşər övladı olan peyğəmbərlər maddi aləmdə, zaman və məkan daxilində olduqları halda, Allah qeyri-maddidir, zaman və məkan xaricindədir. Allahla onlar arasında minlərlə zülmət və nur pərdəsi vardır. Buna görə də Allahın peyğəmbərlərlə bir yerdə qarşı-qarşıya durub danışması qeyri-mümkündür). Allah bəşər övladı ilə (Musanın anası ilə olduğu kimi) ancaq vəhylə (ilham və röya ilə), yaxud (Musa kimi) pərdə arxasından danışar (Allahın kəlamı eşidilər, amma Özü görünməz). Və ya bir elçi (mələk) göndərər ki, o da Allahın izni ilə (göndərildiyi kimsəyə) Onun istədiyini vəhy edər. Həqiqətən, O (hər şeydən) ucadır, hikmət sahibidir!

52. (Ya Rəsulum! Əvvəlki peyğəmbərlərə vəhy nazil etdiyimiz kimi) sənə də beləcə əmrimizdən olan bir vəhy (möminlərə mənəvi həyat verən Quran) göndərdik. Sən (bundan əvvəl) kitab nədir, iman nədir bilməzdin. Lakin Biz onu bəndələrimizdən dilədiyimizi haqq yola qovuşdurmağımız üçün bir nur etdik. Sən (onunla insanları) düz yola yönəldirsən (islam dininə dəvət edib haqqa qovuşdurursan).

53. O Allahın yoluna ki, göylərdə və yerdə nə varsa (hamısı) Onundur. Bil ki, bütün işlər axırda Allaha qayıdacaqdır!

## .43.
## əz-Zuxruf (Qızıl bəzəklər) surəsi

**(Məkkədə nazil olmuşdur, 89 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Ha, Mim!

2. (Haqqı batildən ayıran) açıq-aydın Kitaba and olsun ki,

3. Biz onu, anlaya biləsiniz deyə, ərəbcə Quran etdik.

4. Şübhəsiz ki, o, dərgahımızdakı əsl kitabda (lövhi-məhfuzda) mövcuddur. O, çox ucadır, çox hikmətlidir (yaxud ayələri baxımından çox möhkəmdir).

5. Siz (Allaha şərik qoşmaqla) həddi aşan bir qövmsünüz deyə, (sizi başlı-başına buraxıb) Quranı sizə təbliğ etməkdən vaz keçməliyikmi?! (Və ya: siz müşriksiniz deyə, sizi adam yerinə qoymayıb Quranla sizə öyüd-nəsihət verməməliyikmi?!)

6. Biz sizdən əvvəlkilərə (keçmiş ümmətlərə) də neçə-neçə peyğəmbərlər göndərmişdik.

7. Onlara elə bir peyğəmbər gəlməzdi ki, ona istehza etməsinlər!

8. Biz onlardan (Məkkə müşriklərindən) daha qüvvətli olanları məhv etdik. Əvvəlkilərin başına gələnlər (Quranda neçə yerdə) nəql olunub keçmişdir (bu müşrikləri də belə bir cəza gözləyir).

9. Həqiqətən, əgər onlardan (Məkkə müşriklərindən): “Göyləri və yeri kim yaratmışdır?” – deyə soruşsan, mütləq: “Onları yenilməz qüvvət sahibi olan, (hər şeyi) bilən (Allah) yaratmışdır!” – deyə cavab verəcəklər.

10. O Allah ki, yeri sizin üçün beşik etdi və (istədiyiniz yerə) doğru-düzgün gedə biləsiniz deyə, orada sizin üçün yollar saldı.

11. O Allah ki, göydən bir qədər (sizin ehtiyacınızı ödəyə biləcək miqdarda) su endirdi. Biz onunla ölü bir məmləkəti dirildirik. Siz də (qiyamət günü dirildilib qəbirlərinizdən) belə çıxardılacaqsınız!

12. Və O Allah ki, (bütün canlılardan erkək və dişi olmaqla) ciftlər xəlq etdi, səyyar olduğunuz gəmiləri və heyvanları yaratdı.

13. Ona görə ki, onları minəsiniz, sonra minib oturduğunuz zaman Rəbbinizin nemətini yada salaraq deyəsiniz: “Bunları bizə ram edən Allah pakdır, müqəddəsdir! (Əgər Allahın köməyi olmasaydı) bizim onlara gücümüz çatmazdı.

14. Həqiqətən, biz (öləndən sonra) Rəbbimizin hüzuruna qayıdacağıq!”

15. Amma (müşriklər mələklər Allahın qızlarıdır deyə) Ona Öz bəndələrindən övlad isnad etdilər. Həqiqətən, insan (Allahın nemətlərinə) açıq-aşkar naşükürdür!

16. Yoxsa O, yaratdıqlarından qızları Özünə övlad götürüb oğlanları sizə məxsus etdi?!

17. Onlardan birinə Rəhmana (Allaha) isnad etdikləri (qız uşağı) ilə müjdə versən, qəzəbdən (hüzndən) boğularaq üzləri qapqara qaralar.

18. Onlar bərbəzək içində böyüdülüb, mübahisə (çəkişmə) zamanı bir dəlil gətirə bilməyən (xilqətcə zəif) qızlarını Allaha övlad isnad edirlər?

19. Onlar Rəhmanın qulları olan mələkləri dişi saydılar. Məgər onlar (mələklərin) yaradılışına şahidmi olmuşlar?! Onların bu şəhadəti (əməl dəftərlərinə) yazılacaq və (bu barədə) sorğu-sual olunacaqlar!

20. Onlar dedilər: "Əgər Rəhman istəsəydi, biz onlara (mələklərə) ibadət etməzdik!" Onların (dedikləri sözün həqiqətə nə qədər uyğun olması barədə) heç bir biliyi yoxdur. Onlar ancaq yalan danışarlar.

21. Yoxsa onlara bundan (bu Qurandan) əvvəl bir kitab vermişik və onlar (Allahdan başqasına ibadət etməyin mümkünlüyü barəsində) ona istinad edirlər?!

22. Xeyr (belə bir şey yoxdur). Onlar: "Biz atalarımızı bir din üzərində (bütpərəstlikdə) gördük və biz də onların ardınca getdik!" – deyirlər.

23. (Ya Rəsulum!) Biz səndən əvvəl hər hansı bir məmləkətə (Allahın əzabı ilə) qorxudan bir peyğəmbər göndərdiksə, onun naz-nemət içində yaşayan böyükləri (varlıları) sadəcə olaraq: "Biz atalarımızı bir din üzərində gördük və biz də (təqlidlə) onların ardınca getməkdəyik!" – dedilər.

24. (Hər peyğəmbər öz ümmətinə) belə dedi: "Əgər sizə atalarınızın sitayiş etdiyini gördüyünüz dindən daha doğrusunu gətirmiş olsam necə?!" Onlar: "Biz sizinlə göndərilənləri (şəriəti, möcüzələri) inkar edirik!" – deyə cavab verdilər.

25. Buna görə də Biz onlardan intiqam aldıq. (Ya Rəsulum!) Bir gör (peyğəmbərləri) yalançı sayanların axırı necə oldu!

26. Yadına sal ki, bir zaman İbrahim atasına və qövmünə demişdi: "Mən sizin ibadət etdiklərinizdən (bütlərdən) tamamilə uzağam;

27. Yalnız məni yoxdan yaradan (Allahdan) başqa! Şübhəsiz ki, O məni doğru yola müvəffəq edəcəkdir!"

28. (İbrahim) onu (la ilahə illallah kəlməsini) öz nəsli arasında həmişəlik qalan bir söz etdi. Bəlkə, (Məkkə müşrikləri bütpərəstlikdən əl çəkib babaları İbrahimin dininə) qayıdalar!

29. Xeyr, Mən onlara da, atalarına da özlərinə haqq (Quran) və (həqiqəti, şəriət hökmlərini) bəyan edən bir peyğəmbər gələnədək gün-güzəran verdim!

30. Onlara haqq (olan Quran) gəldikdə: “Bu sehrdir, biz onu inkar edirik!” – dedilər.

31. Onlar dedilər: “Məgər bu Quran iki şəhərdən (Məkkədən və ya Taifdən) olan böyük bir adama (ya Vəlid bin Müğirəyə, yaxud da Ürvə bin Məsuda) nazil edilməli deyildimi?”

32. (Ya Rəsulum!) Məgər sənin Rəbbinin mərhəmətini (peyğəmbərliyini) onlarmı paylaşdırırlar?! Dünyada onların dolanacaqlarını (keçinəcəklərini) öz aralarında Biz bölüşdürdük. Bir-birlərinə iş gördürsünlər deyə, bəzilərinin dərəcələrini digərlərindən üstün tutduq. Sənin Rəbbinin mərhəməti onların yığdıqlarından (dünya malından) daha yaxşıdır!

33. Əgər insanların (müşriklərin cah-calal içində yaşadıqlarını görüb cahillikləri üzündən küfrdə birləşəcək) bir tək ümmət olmaq ehtimalı (təhlükəsi) olmasaydı, Rəhmanı inkar edənlərin (axirət əzabını daha da artırmaq məqsədilə) evlərinin tavanlarını və (damlarına) çıxdıqları nərdivanları gümüşdən edərdik.

34. Eləcə də evlərinin qapılarını və söykəndikləri taxtları (gümüşdən düzəldərdik).

35. Və (bunlardan əlavə onları) qızıl bəzəklər (içində qərq edərdik, yaxud həmin şeyləri qızıldan düzəldərdik). Həqiqətən, bütün bunlar fani dünya malıdır. Axirət (Cənnət) isə sənin Rəbbinin yanında ancaq Allahdan qorxub pis əməllərdən çəkinənlər üçündür!

36. Hər kəs Rəhmanın zikrindən boyun qaçırsa, Biz ona Şeytanı ürcah edərik və onun (Şeytanın) yaxın dostu olar.

37. (Şeytanlar) onları doğru yoldan çıxardar, onlar isə özlərinin haqq yolda olduqlarını güman edərlər!

38. Nəhayət, o, (qiyamət günü) hüzurumuza gəldikdə (öz yanında olan yoldaşına) belə deyər: “Kaş ki, mənimlə sənin aranda şərqlə qərb arasındakı məsafə qədər uzaqlıq olaydı. Sən nə pis yolda imişsən!”

39. Bu gün (peşmançılığınız) sizə heç bir fayda verməz. Siz birlikdə zülm (küfr) etdiyinizə görə əzaba da ortaqsınız!

40. (Ya Peyğəmbər!) Məgər sən karlara (sözmü) eşitdirə bilərsən?! Yaxud korları, haqq yoldan açıq-aşkar azanları doğru yolamı yönəldə bilərsən?!

41. Əgər Biz səni (onlara əzab verməmişdən əvvəl Öz dərgahımıza) götürüb aparsaq, (bil ki, qiyamət günü) onlardan mütləq intiqam alacağıq!

42. Yaxud (sən həyatda ikən) onlara vəd etdiyimizi (əzabı) göstərəcəyik. Həqiqətən, Biz onlara (əzab verməyə) qadirik!

43. Buna görə də sən özünə vəhy olunandan (Qurandan) yapış. Həqiqətən, sən düz yoldasan!

44. Şübhəsiz ki, o (Quran) sənin üçün və sənin qövmün üçün şərəfdir (şərəfli bir xatırlama, öyüd-nəsihətdir). Siz (qiyamət günü Allahın əmrlərinə dünyada necə əməl etdiyiniz barədə) mütləq sorğu-sual olunacaqsınız!

45. Səndən əvvəl göndərdiyimiz peyğəmbərlərdən (onların ümmətlərinin alimlərindən və müxlis möminlərindən) soruş: “Biz Rəhmandan başqa ibadət olunası tanrılarmı müəyyən etmişik?!”

46. Biz Musanı Öz möcüzələrimizlə Firon və onun əyan-əşrafının yanına göndərmişdik. O demişdi: “Mən aləmlərin Rəbbinin elçisiyəm!”

47. (Musa) möcüzələrimizi onlara gətirər-gətirməz onlar bu möcüzələrə lağ edib gülmüşdülər.

48. Onlara bir-birindən böyük olan möcüzələr göstərdik, onları əzabla yaxaladıq (cürbəcür müsibətlərə düçar etdik) ki, bəlkə, (haqq yola) qayıdalar!

49. Onlar dedilər: “Ey sehrbaz! (Dualarını qəbul edəcəyi barədə) səninlə olan əhdi hörmətinə Rəbbinə bizdən ötrü dua et (ki, bizi bəladan qurtarsın). Biz mütləq doğru yola gələcəyik!”

50. Biz onları əzabdan qurtaran kimi sözlərindən döndülər.

51. Firon öz qövmünə müraciət edib dedi: “Ey qövmüm! Məgər Misir səltənəti, altımdan (saraylarımın altından) axıb gedən bu çaylar mənim deyilmi?! Məgər (mənim qüdrətimi) görmürsünüzmü?!

52. Yaxud mən (dili dolaşdığı, kəkələdiyi üçün) az qala (sözünü belə) aydın deyə bilməyən bir zavallı (aciz) kimsədən daha yaxşı (daha üstün) deyiləmmi?!

53. (Əgər o, doğrudan da, peyğəmbərdirsə) onun üstünə qızıl bilərziklər atılmalı və onunla birlikdə bir-birinin ardınca (peyğəmbərliyini təsdiq edən) mələklər gəlməli deyildimi?!”

54. Beləliklə, (Firon) öz qövmünü yelbeyin (yüngül) yerinə qoydu, onlar da ona itaət etdilər (anlamadılar ki, padşahlıq allahlığa dəlalət etməz və yoxsulluq da peyğəmbərliyə mane ola bilməz). Həqiqətən, onlar (Allahın itaətindən çıxmış) fasiq bir qövm idilər!

55. (Firon əhli) Bizi qəzəbləndirdikdə onlardan intiqam alıb hamısını (suya) qərq etdik.

56. Və onları sonradan gələnlərə misal və ibrət dərsi etdik.

57. (Ya Rəsulum!) Məryəm oğlu (İsa) misal çəkilincə sənin qövmün sevincdən güldü. (Müşriklərə xitabən: “Siz və Allahdan başqa ibadət etdikləriniz Cəhənnəmdə yanacaq odunsunuz!” ayəsi nazil olduqda, onlar öz cahillikləri üzündən: “Yəhudilər Üzeyrə, xaçpərəstlər İsaya, Bəni Məlih qəbiləsi mələklərə ibadət edirlər. Əgər bu tanrıların hamısı cəhənnəm odunda yanacaqsa, biz də öz bütlərimizin odda yanmasına razıyıq!” – deyə sevindilər).

58. Onlar dedilər: “Bizim tanrılarımız yaxşıdır, yoxsa o (İsa)?!” Onlar bunu sənə yalnız (səninlə) mübahisə etmək (çənə-boğaz olmaq) xatirinə dedilər. Şübhəsiz ki, onlar höcətləşən (çənə-boğaz olan) bir qövmdürlər!

59. O (Məryəm oğlu İsa) ancaq nemət (peyğəmbərlik) verdiyimiz və (Allahın qüdrəti ilə atasız yaradıldığı üçün) İsrail oğullarına örnək (ibrət) etdiyimiz bir bəndədir.

60. Əgər istəsəydik, yer üzündə sizin əvəzinizə mələklər yaradardıq (onlar da Bizə ibadət edərdilər).

61. Şübhəsiz ki, o, (İsanın zühuru) qiyamət saatı üçün bir əlamətdir. Ona (qiyamətə) şəkk etməyin və Mənə tabe olun. Bu, doğru yoldur!

62. Şeytan sizi yoldan çıxartmasın. Şübhəsiz ki, o sizin açıq-aşkar düşməninizdir!

63. İsa açıq-aşkar möcüzələrlə gəldiyi zaman dedi: “Həqiqətən, mən sizə hikmət gətirmişəm, həm də ixtilafda olduğunuz bəzi şeyləri (Tövratdakı bir sıra dini hökmləri) izah etmək üçün gəlmişəm. Allahdan qorxun və mənə itaət edin!

64. Şübhəsiz ki, Allah mənim də Rəbbim, sizin də Rəbbinizdir. Yalnız Ona ibadət edin. Bu, doğru yoldur!”

65. Amma onların içərisindən çıxan firqələr arasında ixtilaf düşdü (xaçpərəstlər: "İsa Allahın oğludur!" – dedilər, yəhudilər isə onun peyğəmbərliyini büsbütün inkar etdilər). Acı bir günün (qiyamət gününün) əzabından vay o zülm edənlərin halına!

66. Onlar özləri də bilmədən qəfildən başlarının üstünü alacaq o saatdan (qiyamət saatından) başqa bir şeymi gözləyirlər?!

67. Müttəqilər müstəsna olmaqla, o gün dostlar bir-birinə düşmən kəsiləcəklər!

68. (Müttəqilərə belə deyiləcəkdir: ) "Ey bəndələrim, bu gün sizə heç bir qorxu yoxdur və siz qəm-qüssə də görməyəcəksiniz!

69. O bəndələr ki, ayələrimizə iman gətirib (Bizə) təslim olmuşlar.

70. Siz də, zövcələriniz də sevinc içində Cənnətə daxil olun!"

71. (Cənnətdə) onlar üçün qızıl teştlər və qədəhlər içində (yemək-içmək) dolandırılacaqdır. Orada onların ürəkləri istəyən və gözlərini oxşayan hər şey olacaqdır. Siz orada əbədi qalacaqsınız!

72. Bu sizin (dünyada) etdiyiniz (yaxşı) əməllər müqabilində varis olduğunuz Cənnətdir!

73. Orada sizin üçün bir çox meyvələr vardır, onlardan yeyəcəksiniz!

74. Günahkarlar (kafirlər) isə, şübhəsiz ki, əbədi olaraq cəhənnəm əzabı içində qalacaqlar.

75. Onlardan (bu əzab) yüngülləşdirilməyəcəkdir; onlar orada əllərini hər şeydən üzmüş olacaqlar!

76. Biz onlara zülm etmədik, amma onlar özləri zalım idilər (öz-özlərinə zülm etdilər).

77. Onlar (Cəhənnəmin gözətçisi Malikə) müraciət edib deyəcəklər: “Ey Malik! Qoy Rəbbin bizi öldürsün (bu əzabdan qurtaraq)! O isə (min ildən sonra onlara): “Siz (həmişəlik burada) qalacaqsınız!” – deyə cavab verəcəkdir!

78. (Allah Cəhənnəmdə olan Məkkə müşriklərinə buyuracaqdır:) “Biz sizə haqqı gətirmişdik, lakin sizin əksəriyyətiniz haqqı xoşlamırdı”.

79. Yoxsa onlar (Peyğəmbərə hiylə qurmaqla) düzgün iş görmüşdülər?! Elə isə Biz də (onlara əzab verməklə) düzgün iş görürük!

80. Yoxsa onlar elə güman edirlər ki, Biz onların pıçıltılarını və xəlvəti danışıqlarını eşitmirik?! Xeyr, yanlarında olan elçilərimiz (onların bütün aşkar və gizli söhbətlərini) yazırlar!

81. (Ya Peyğəmbər!) De: “Əgər Rəhmanın bir övladı olsa, (ona) ibadət edənlərin birincisi mən olaram!

82. Göylərin və yerin Rəbbi, ərşin Rəbbi (müşriklərin) Ona aid etdikləri sifətlərdən tamamilə uzaqdır!”

83. (Ya Peyğəmbər!) Qoy onlar vəd olunduqları günə (qiyamət gününə) qovuşana qədər (bihudə işlərə) qurşanaraq (dünyada özləri üçün) oynayıb əylənsinlər!

84. Göydə də tanrı, yerdə də tanrı Odur. O, hikmət sahibidir, (hər şeyi) biləndir!

85. Göylərin və yerin, onların arasındakı hər şeyin ixtiyarı əlində olan (Allah) nə qədər ucadır (nə qədər uludur)! O saatı (qiyamətin nə vaxt qopacağını) bilmək Ona məxsusdur. Siz (öləndən sonra) Onun hüzuruna qaytarılıb gətiriləcəksiniz!

86. (Müşriklərin) Ondan qeyri ibadət etdikləri (Allah yanında heç bir kəs üçün) şəfaət edə bilməzlər. Ancaq haqqa şəhadət verənlər (dildə və ürəkdə “la ilahə illallah” deyənlər) müstəsnadır. Onlar (dediklərinin haqq olduğunu) bilirlər. (Məhz belələri Allahın izni ilə şəfaət edə bilmək şərəfinə nail olacaqlar).

87. And olsun ki, əgər onlardan özlərini kimin yaratdığını soruşsan, mütləq: “Allah!” – deyə cavab verəcəklər! Elə isə (haqdan) necə döndərilirlər?

88. Onun (Muhəmməd əleyhissəlamın): “Ey Rəbbim! Bunlar iman gətirməyən bir qövmdür!” – deməsi də (dərgahımızda məlumdur)!

89. (Ya Peyğəmbər!) Onlardan üz çevir və (arada düşmənçilik, kin-küdurət olmasın deyə, rastlaşdıqda) “Salam!” de. Onlar (küfrləri üzündən başlarına nə gələcəyini) mütləq biləcəklər!

## .44.
## əd-Duxan (Duman) surəsi
**(Məkkədə nazil olmuşdur, 59 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Ha, Mim!

2. (Haqqı batildən, halalı haramdan ayıran) açıq-aydın Kitaba and olsun ki,

3. Biz onu mübarək bir gecədə (qədr gecəsində) nazil etdik. Biz (o Kitab vasitəsilə kafirləri Öz əzabımızla) qorxuduruq!

4. Hər bir hikmətli (dəyişilməsi mümkün olmayan) iş o gecə hökm (ayırd) olunur –

5. Dərgahımızdan bir buyuruq olaraq! Həqiqətən, (peyğəmbərləri) Biz göndəririk –

6. Sənin Rəbbindən (bəndələrə) bir mərhəmət olaraq (ya Peyğəmbər!). Şübhəsiz ki, O (hər şeyi) eşidəndir, (hər şeyi) biləndir!

7. O, göylərin, yerin və onların arasında olanların (bütün məxluqatın) Rəbbidir. (Ey Məkkə əhli!) Əgər (Allahın haqq olduğuna) tam yəqinliklə inanırsınızsa (bilin ki, Muhəmməd əleyhissəlam da Onun Peyğəmbəridir)!

8. Ondan başqa heç bir tanrı yoxdur. O həm dirildir, həm də öldürür. O həm sizin Rəbbiniz, həm də ulu babalarınızın Rəbbidir.

9. Lakin onlar (Məkkə müşrikləri) şəkk içində qalıb oyun oynayırlar (Allaha, qiyamətə ürəkdən inanmır, Qurana və Peyğəmbərə istehza edirlər).

10. (Ya Peyğəmbər!) Sən göyün aşkar bir dumana bürünəcəyi günü gözlə! (O gün müşriklərə elə bir aclıq üz verəcəkdir ki, gözləri qaranlıq gətirib yerlə göyün arasını, sanki bir duman bürüdüyünü görəcəklər!)

11. (Elə bir duman ki) insanları saracaqdır. Bu, şiddətli bir əzabdır! (Doğrudan da, Qüreyş müşriklərinə küfrləri üzündən belə bir aclıq üz vermiş, onlar çarəsizlikdən napak şeyləri belə yeməyə məcbur olmuşlar).

12. (Belə bir bəlaya uğrayan müşriklər deyəcəklər: ) “Ey Rəbbimiz! Bizi bu əzabdan qurtar. Biz, həqiqətən iman gətirəcəyik!” (Məkkə müşriklərinin bu yalvarışından sonra Peyğəmbər əleyhissəlam Allaha dua etmiş, Allah da onları həmin bəladan qurtarmışdı. Lakin müşriklərin çoxu öz sözünün üstündə durmamışdı).

13. Onlara hara, öyüd-nəsihət eşitmək hara?! Halbuki onlara açıq-aşkar bir peyğəmbər gəldi,

14. Onlar isə ondan üz çevirib belə dedilər: “(Bu başqası tərəfindən) öyrədilmiş bir divanədir! (Özü heç bir şey bilmir, Quranı kimsə ona öyrədir)”.

15. Biz sizi bu əzabdan azacıq qurtaracağıq, siz isə (yenidən küfrə) qayıdacaqsınız!

16. Onları lap möhkəm yaxalayacağımız gün (qiyamət, yaxud Bədr vuruşu günü), şübhəsiz ki, Biz (onlardan) intiqam alacağıq!

17. And olsun ki, Biz onlardan əvvəl Firon qövmünü imtahana çəkmişdik. Onlara möhtərəm bir peyğəmbər (Musa) gəlmişdi.

18. (O demişdi: ) “Allahın bəndələrini (İsrail oğullarını) mənə verin. Həqiqətən, mən sizin üçün mötəbər (güvəniləsi, sözündə düz, əmanətə xəyanət etməyən) bir peyğəmbərəm!

19. Allaha qarşı təkəbbür göstərməyin. Həqiqətən, mən sizə (dediklərimin düzgünlüyünü sübut edən) açıq-aşkar bir dəlil gətirmişəm!”

20. (Onlar Musanı daşqalaq edəcəkləri ilə hədələdilər. Musa dedi: ) “Mən sizin məni daşqalaq etmənizdən mənim də Rəbbim, sizin də Rəbbiniz olan Allaha pənah aparıram!

21. Əgər mənə iman gətirməyəcəksinizsə, məndən uzaq olun!”

22. Sonra (Musa) Rəbbinə belə dua etdi: “Həqiqətən, bunlar günahkar bir qövmdür! (Pərvərdigara! Bunlara layiq olduqları cəzanı ver!)”

23. (Allah buyurdu: ) “Bəndələrimi (İsrail oğullarını) götürüb gecə ikən onlarla yola çıx. Siz (Firon və onun qövmü tərəfindən) təqib olunacaqsınız!

24. Dənizi də açıq (və sakit) burax! (Dəryanı – Nil çayını keçdikdən sonra əsanı suya vurub orada açılmış yolları bağlama. Qoy Firon və qoşunu dəryada yollar açıldığını görüb ora girsinlər). Onlar suya qərq olacaq əsgərlərdir!"

25. (Fironun bütün əyan-əşrafı və əsgərləri boğulub tələf oldular). Onlar (özlərindən sonra) neçə-neçə bağlar, çeşmələr qoyub getdilər;

26. Neçə-neçə əkinlər, gözəl yerlər (möhtəşəm qəsrlər).

27. Və zövq aldıqları neçə-neçə nemətlər (tərk etdilər).

28. (Onları) belə (cəzalandırdıq) və ona (onların sərvətlərinə, mülklərinə) başqalarını (İsrail oğullarını) varis etdik!

29. Onlardan ötrü nə göy, nə də yer ağladı. Onlara (tövbə etməyə) imkan da verilmədi! (Əksinə, elə bu dünyada cəzalarına çatdılar; axirət əzabı isə daha şiddətli olacaqdır. Budur küfrün nəticəsi!)

30. İsrail oğullarını isə o alçaldıcı əzabdan qurtardıq,

31. Firondan (xilas etdik). Həqiqətən, o, təkəbbür göstərən, həddi aşanlardan idi!

32. And olsun ki, Biz onları (İsrail övladını) Özümüz bilə-bilə aləmlərdən (bir hikməti-ilahi ilə zəmanələrindəki bəşər əhlindən) üstün tutduq.

33. Onlara (özlərini necə aparacaqlarını bilmək üçün) hər biri açıq-aşkar bir imtahan olan möcüzələr (dənizin yarılması, bildirçin əti, qüdrət halvası və s.) verdik.

34. (Ya Peyğəmbər!) Bunlar (sənin qövmünün müşrikləri) mütləq deyəcəklər:

35. "Bu (ölüm) elə bizim ilk (və son) ölümümüzdür ki var. Biz bir daha dirildiləcək deyilik!

36. Əgər (öləndən sonra Allahın bizi diriləcəyini) doğru deyirsinizsə, (bizdən qabaq ölmüş) atalarımızı (dirildib) gətirin görək!”

37. (Ya Peyğəmbər!) Bunlar (Məkkə müşrikləri) yaxşıdır (qüvvətlidir), yoxsa (Yəmən padşahlarından Tövrata inanan Əbu Kərb Əsədin) Tübbə qövmü, yaxud onlardan əvvəlkilər?! (Ad, Səmud, Mədyən və Əykə tayfaları?!) Günah işlədikləri üçün Biz onları məhv etdik.

38. Biz göyləri, yeri və onların arasında olanları oyun-oyuncaq (əyləncə) yaratmadıq!

39. Biz onları yalnız haqq olaraq yaratdıq, lakin onların (Məkkə müşriklərinin) əksəriyyəti (bunu) bilməz!

40. Şübhəsiz ki, (haqqı batildən, yaxşını yamandan, mömini kafirdən) ayırd etmə günü onların hamısının (bir yerdə olma) vaxtıdır!

41. O gün dostun dosta heç bir faydası olmaz, onlara kömək də edilməz! (Heç kəs heç kəsdən Allahın əzabını dəf edə bilməz!)

42. Allahın rəhm etdiyi kimsədən başqa! Şübhəsiz ki, O, yenilməz qüvvət, mərhəmət sahibidir!

43. Həqiqətən, (Cəhənnəmdəki) zəqqum ağacı

44. Günahkar (kafir) kimsənin yeməyidir!

45. O, ərinmiş mis (yağ) kimi qarınlarda qaynar;

46. Qaynar su qaynayan kimi!

47. (Allah əzab mələklərinə buyurar: ) “Onu tutub Cəhənnəmin tən ortasına sürüyün!

48. Sonra başına əzab olaraq qaynar su tökün!

49. (Və ona belə deyin: ) “(Bu əzabı) bir dad görək! Sən ki (öz aləmində) çox qüvvətli, möhtərəm bir şəxs idin!”

50. Bu, (dünyada ikən) şəkk etdiyiniz (əzabdır)!

51. Müttəqilər isə qorxusuz-xətərsiz bir yerdə -

52. Bağçalarda və bulaqlar başında olacaqlar!

53. Taftadan və atlazdan (nazik və qalın ipdən) libaslar geyib qarşı-qarşıya əyləşəcəklər.

54. (Möminlərin Cənnətdəki əhvalı) belədir. Hələ onları iri (ahu) gözlü hurilərlə evləndirəcəyik.

55. Onlar orada (cənnət nemətlərinin tükənməzliyinə) arxayın olaraq hər meyvədən istəyəcəklər.

56. Onlar orada ilk (dünyadakı) ölümdən başqa heç bir ölüm dadmayacaqlar! (Allah) onları cəhənnəm əzabından qorumuşdur -

57. Sənin Rəbbindən bir lütf olaraq (ya Peyğəmbər!) Bu, böyük qurtuluşdur (uğurdur)!

58. Biz onu (Quranı ümmətin üçün) ancaq sənin dilinlə asanlaşdırdıq. Bəlkə, anlayıb öyüd-nəsihət qəbul edələr!

59. (Ya Peyğəmbər!) Sən (müşriklərin ölümünü, məğlubiyyətini) gözlə. Şübhəsiz ki, onlar da (sənin ölümünü, məğlubiyyətini) gözləyirlər!

## .45.
## əl-Casiyə (Diz çökmüş camaat) surəsi

**(Məkkədə nazil olmuşdur, 37 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Ha, Mim!
2. Kitabın (Quranın) nazil edilməsi yenilməz qüvvət, hikmət sahibi (olan Allah) tərəfindəndir.
3. Həqiqətən, göylərdə və yerdə möminlər üçün ibrətlər vardır!
4. Sizin yaradılışınızda və (Allahın yer üzünə) yayıb səpələdiyi canlılarda tam yəqinliklə inananlar üçün (Allahın birliyinə, qüdrət və əzəmətinə, qiyamət gününün haqq olmasına dəlalət edən) əlamətlər vardır.
5. Gecə və gündüzün bir-birinin ardınca gəlib-getməsində, Allahın ruzi vermək üçün göydən yağış yağdırmasında, onun vasitəsilə yeri ölümündən (quruduqdan) sonra diriltməsində və külələri (müxtəlif tərəflərə) yönəltməsində ağılla düşünənlər üçün (Allahın hər şeyə qadir olmasını sübut edən) dəlillər vardır.
6. (Ya Peyğəmbər!) Bunlar Allahın ayələridir (qüdrət nişanələridir). Biz onları (Cəbrail vasitəsilə) sənə doğru oxuyub bildiririk. Bəs onlar Allaha və Onun ayələrinə (Qurana) inanmadıqdan sonra hansı kəlama inanırlar?
7. Yalana dadanmış, günaha düşkün hər kəsin vay halına!
8. O, Allahın ayələrini özünə oxunduğunu eşidir, sonra guya onları eşitmirmiş kimi (Allahın əmrinə qarşı) təkəbbür göstərərək (küfründə) israr edib durur. (Ya Peyğəmbər!) Beləsinə şiddətli bir əzabla müjdə ver!
9. O, ayələrimizdən bir şey öyrənib bildiyi zaman onu lağa qoyur. Məhz beləlri (qiyamət günü) alçaldıcı bir əzaba düçar olacaqlar!
10. Qarşıda (öləndən sonra) onları Cəhənnəm gözləyir. Nə qazandıqları dünya malı, nə də Allahdan başqa dost tutduqları (ibadət

etdikləri bütlər) onlara bir fayda verəcəkdir (Allahın əzabını onlardan dəf edəcəkdir). Onlar böyük bir əzaba düçar olacaqlar!

11. Bu (Quran) bir hidayətdir. Rəbbinin ayələrini inkar edənləri çox şiddətli, ağrılı-acılı bir əzab gözləyir.

12. Gəmilərin Onun əmri ilə dənizdə üzməsi və sizin də Onun lütfündən (orada) ruzi axtarmanız üçün dənizi sizə ram edən Allahdır! Bəlkə, şükür edəsiniz!

13. Göylərdə və yerdə nə varsa, hamısını öz tərəfindən sizin ixtiyarınıza qoyan da Odur. Həqiqətən, bunda düşünən bir qövm üçün ibrətlər vardır!

14. (Ya Peyğəmbər!) İman gətirənlərə de ki, Allah etdiyi əməllərə görə hər hansı bir qövmün cəzasını (özü) versin deyə, Allahın (əzab) günlərindən qorxmayanları (əzab günlərinə, qiyamətə inanmadıqları üçün gözləməyənləri) bağışlasınlar! (Bu ayənin hökmü sonralar cihad haqqındakı ayə ilə ləğv edilmişdir).

15. Kim yaxşı bir iş görsə, xeyiri özünə, kim də bir pislik etsə, zərəri özünə olar! Sonra siz öz Rəbbinizə doğru qaytarılacaqsınız.

16. And olsun ki, Biz İsrail oğullarına Kitab, hikmət (Tövratda olmayan hökmlər, yaxud mübahisəli məsələləri ədalətlə həll etmək bacarığı) və peyğəmbərlik əta etmiş, onlara pak nemətlərdən ruzi vermiş və onları aləmlərə (zəmanələrindəki bəşər övladına) üstün etmişdik.

17. Onlara din işində (dini məsələlərdə və ya Muhəmməd əleyhissəlamın peyğəmbər göndəriləcəyi barədə) açıq-aşkar dəlillər vermişdik. Onlar yalnız (tövhid, dini əmrlərin büsbütün həqiqət olduğu haqda) özlərinə elm (qəti dəlillər) gəldikdən sonra aralarındakı həsəd (ədavət) üzündən (dində) ixtilafa düşdülər. (Ya

Rəsulum!) Həqiqətən, sənin Rəbbin ixtilafda olduqları məsələlər barəsində qiyamət günü onların arasında hökm edəcəkdir!

18. Sonra (ya Rəsulum!) səni də dində şəriət sahibi (bir şəriət üzrə qaim) etdik. Sən ona (o şəriətə) tabe ol və (haqqı) bilməyənlərin nəfslərindən gələn istəklərə uyma! (Yoxsa özünü məhvə düçar edərsən! Peyğəmbər məsum olduğu üçün Muhəmməd əleyhissəlama göndərilən bu əmrlər əslində onun ümmətinə aiddir).

19. Şübhəsiz ki, onlar Allahdan gələcək bir şeyi (bəlanı, əzabı) səndən dəf edə bilməzlər. Zalımlar (kafirlər) bir-birinin dostudurlar, Allah isə müttəqilərin dostudur!

20. Bu (Quran) insanlar üçün bəsirət gözü, (axirətə) tam yəqinliklə inanan bir qövm üçün də hidayət (doğru yolu göstərən rəhbər) və mərhəmətdir!

21. Yoxsa dünyada pis əməllər edənlər (axirətdə) onları iman gətirib yaxşı işlər görənlərlə bir tutacağımızı, onların həyatlarının və ölümlərinin eyni olacağını güman edirlər?! Onlar nə pis mühakimə yürüdürlər! (Dünyada naz-nemət içində yaşayan kafirlər: "Əgər qiyamət günü, axirət doğrudursa, Allah bizə orada da firavan həyat bəxş edəcəkdir!" – deyirlər. Xeyr, onların axirət həyatı çox pis olacaq, əzab içində keçəcəkdir. Dünyada aldıqları ləzzət, axirətdə burunlarından töküləcəkdir. Gözəl axirət həyatı yalnız dünyada Allah, din yolunda məşəqqətlərə dözmüş möminlərə məxsusdur).

22. Allah göyləri və yeri haqq-ədalətlə və hər kəsin qazandığı nə isə onun müqabilində əvəz (qarşılıq) görməsi üçün yaratmışdır. Və onlara heç bir haqsızlıq edilməyəcəkdir. (Yaxşı əməl sahibinə mükafat veriləcək, pislik edən də öz pisliyi müqabilində cəzalandırılacaqdır).

23. (Ya Peyğəmbər!) Nəfsini özünə tanrı edən və Allahın bilərəkdən (onu hələ yaratmamışdan gələcəkdə kafir olacağını bildiyi üçün) yoldan çıxartdığı, qulağını və qəlbini möhürlədiyi, gözünə də pərdə çəkdiyi kimsəni gördünmü? Allahdan başqa kim onu doğru yola sala bilər?! Məgər düşünüb ibrət almırsınız? (Haqqı bildiyi halda küfr edənin cəzası, haqqı bilmədən, cahilliyi üzündən küfr edənin cəzasından daha ağırdır. Çünki alimlə cahilin məsuliyyəti eyni ola bilməz!)

24. (Qiyaməti inkar edənlər) belə deyirlər: "Dünya həyatımızdan başqa heç bir həyat yoxdur; ölürük və dirilirik (biri ölür, digəri anadan olur; biz ölürük, övladlarımız, nəslimiz isə yaşayır); bizi öldürən ancaq dəhrdir (zamanın gərdişi, ömür müddətidir; yaşa dolub qocalmağımızdır). Bu barədə onların heç bir biliyi yoxdur. Onlar ancaq zənnə qapılırlar! (Hər şeyi zamanın, vaxtın boynuna yıxmaq doğru deyildir, çünki bütün canlı və cansız məxluqat kimi zamanın özünü də yaradan Allahdır).

25. (Qiyamətə dair) ayələrimiz onlara açıq-aşkar oxunduğu (söyləndiyi) zaman onların dəlili: "Əgər doğru deyirsinizsə, (vəfat etmiş) atalarımızı (dirildib) gətirin görək!" – deməkdən başqa bir şey deyildir.

26. (Ya Peyğəmbər!) De: "Allah sizi dirildir, sonra öldürür. Sonra da sizi qiyamət günü (dirildib) bir yerə yığacaqdır. Ona (qiyamətə) heç bir şəkk-şübhə yoxdur, lakin insanların çoxu (qiyamətin haqq, təkrar dirilmənin ilkin yaradılışından çox asan olduğunu) bilməz!"

27. Göylərin və yerin hökmü ancaq Allahın əlindədir. Qiyamət qopacağı gün – məhz o gün batil danışanlar (Allaha iftira yaxanlar) ziyana uğrayacaqlar!

28. (Ya Peyğəmbər! O gün) hər ümməti diz çökmüş (yaxud bir yerə yığılmış) görəcəksən. Hər ümmət öz (əməl) dəftərinə tərəf

çağırılacaqdır. (Onlara belə deyiləcəkdir: ) “Bu gün sizə (dünyada) etdiyiniz əməllərin əvəzi (mükafatı və ya cəzası) veriləcəkdir!

29. Bu Bizim kitabımızdır (sizin əməl dəftərinizdir). O sizin əleyhinizə haqqı deyər. Biz sizin etdiyiniz əməlləri (orada mələklərə bir-bir) yazdırmışıq!”

30. İman gətirib yaxşı əməl edənlərə gəldikdə, Rəbbi onları Öz mərhəmətinə (Cənnətə) qovuşduracaqdır. Bu, açıq-aşkar qurtuluşdur (uğurdur)! (Bundan yaxşısı ola bilməz!)

31. Kafir olanlara isə (belə deyiləcəkdir): “Məgər ayələrim (dünyada) sizə oxunmurdumu?! Amma siz (onlara qulaq asmağa, iman gətirməyə) təkəbbür göstərdiniz və günahkar bir tayfa oldunuz!

32. (Sizə: ) “Allahın (ölüləri dirildəcəyi barədəki) vədi haqdır və o saata (qiyamətin qopacağına) heç bir şəkk-şübhə yoxdur!” – deyildiyi zaman: “O saat nədir, bilmirik! Onun ancaq bir zənn (güman) olduğu qənaətindəyik. Biz (qiyamətin qopacağına) əmin deyilik!” – deyə cavab verdiniz.

33. (O gün dünyada etdikləri) pis əməllərinin cəzası onların gözünə görünəcək və istehza etdikləri (əzab) onları saracaqdır!

34. (Onlara belə) deyiləcəkdir: “Siz bu gününüzə qovuşacağınızı (dünyada) unutduğunuz kimi, Biz də bu gün sizi unudacağıq (əbədi əzab içində buraxacağıq). Sizin məskəniniz Cəhənnəmdir. Sizə (Allahın əzabından qurtarmağa) kömək edənlər də olmayacaqdır!

35. Bu (əzab) ona görədir ki, siz Allahın ayələrini lağa qoyurdunuz; dünya həyatı sizi aldatmışdı!” Bu gün onlar (Cəhənnəmdən) çıxarılmayacaq və onlardan (Allahı razı salan) heç bir üzrxahlıq (tövbə də) qəbul olunmaycaqdır!

36. (Vədinə sadiq qalaraq mömin bəndələrinə verdiyi nemətlərə və kafirləri, azğınları düçar etdiyi əzaba görə) göylərin Rəbbi, yerin Rəbbi və aləmlərin Rəbbi olan Allaha həmd olsun!

37. Göylərdə və yerdə böyüklük (ululuq yalnız) Ona məxsusdur. O, yenilməz qüvvət sahibi, hikmət sahibidir!

## .46.
## əl-Əhqaf (Qumsal təpələr) surəsi

**(Məkkədə nazil olmuşdur, 35 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Ha, Mim!

2. Kitabın (Quranın) nazil edilməsi yenilməz qüvvət sahibi, hikmət sahibi Allah tərəfindəndir!

3. Biz göyləri, yeri və onların arasında olanları ancaq haqq olaraq və (qiyamət günü sona çatacaq) müəyyən bir müddət üçün yaratdıq. Kafirlərin qorxudulduqları şeylərdən (qiyamətdən, imana dəvət edən öyüd-nəsihətdən) üz döndərdilər.

4. (Ya Peyğəmbər! Bu müşriklərə) de: “Mənə bir xəbər verin görüm, sizin Allahdan başqa ibadət etdikləriniz yer üzündə (yaxud yerdən və ona bənzər şeylərdən) nə yaratmışlar?! Yoxsa onların göylərdə (Allahla) bir şərikliyi var?! Əgər doğru deyirsinizsə, (dediyinizi sübut etmək üçün) mənə bundan (bu Qurandan) əvvəl (Allahdan sizə nazil olmuş) bir kitab, yaxud (əvvəlki peyğəmbərlərdən, ümmətlərdən sizə gəlib çatmış) elmdən qalan bir şey (əsər) gətirin!

5. Allahı qoyub qiyamətədək özünə cavab verə bilməyən bütlərə ibadət edən kimsədən daha çox (haqq yoldan) azmış kim ola bilər?! Halbuki bunlar (bu bütlər) onların (bütpərəstlərin) ibadətindən xəbərsizdirlər!

6. İnsanlar məhşərə toplanacaqları zaman bunlar (bu bütlər) onlara (müşriklərə) düşmən olacaq və onların ibadətini inkar edəcəklər.

7. Ayələrimiz onlara açıq-aydın olaraq oxunduqda (və ya: açıq-aydın ayələrimiz onlara söylənildikdə) kafirlər özlərinə gələn (Quran) barəsində: "Bu, aşkar bir sehrdir!" – deyirlər.

8. Yoxsa onlar: "(Muhəmməd) onu (özündən) uydurmuşdur!" – deyirlər. (Ya Peyğəmbər!) De: "Əgər mən onu (özümdən) uydurmuşamsa, siz məni Allahdan (Allahın əzabından) qurtara bilməzsiniz. O sizin (Quran) barəsindəki dedi-qodularınızı daha yaxşı bilir. Mənimlə sizin aranızda Onun şahid olması kifayətdir. O, bağışlayandır, rəhm edəndir!"

9. De: "Mən peyğəmbərlərin birincisi deyiləm. (Rəbbimin) mənimlə və sizinlə nə edəcəyini bilmirəm (başqa peyğəmbərlər kimi şəhid olacağımı, ölkəmdən qovulacağımı, yaxud küfrə davam etdiyiniz təqdirdə sizə nə cəza veriləcəyini, hansı fəlakətlərə uğrayacağınızı deyə bilmərəm, çünki qeybi ancaq Allah bilir). Mən yalnız mənə vəhy olunana tabe oluram. Mən ancaq (sizi Allahın əzabı ilə) açıq-aşkar qorxudan bir peyğəmbərəm!"

10. De: "Bir deyin görək, əgər (bu Quran) Allah dərgahından olsa, siz onu inkar etsəniz, İsrail oğullarından da bir şahid (Quranın həqiqiliyinə) onun özü kimisi (Tövrat) ilə şəhadət verib iman gətirsə və siz (yenə ona qarşı) təkəbbür göstərsəniz (zalım olmazsınızmı)? Allah zalımları doğru yola müvəffəq etməz!"

11. Kafir olanlar iman gətirənlər barəsində deyirlər: "Əgər (Quran, islam dini) yaxşı bir şey olsaydı, (möminlər) bu işdə bizdən qabağa düşə bilməzdilər (biz onlardan daha əvvəl) iman gətirərdik. Onlar (Quranla) doğru yola gəlmədikləri üçün: "Bu, köhnə yalandır!" – deyəcəklər.

12. Ondan (Qurandan) əvvəl Musanın (İsrail oğullarına, möminlərə) rəhbər və mərhəmət olan kitabı (Tövrat) var idi. Bu (Quran özündən əvvəlki ilahi kitabları) ərəb dilində təsdiq edən, zalımları (Allahın əzabı ilə) qorxutmaq və yaxşı əməl sahiblərinə (Cənnətlə) müjdə vermək üçün olan bir Kitabdır!

13. Şübhəsiz: “Rəbbimiz Allahdır!” – deyənlərin, sonra da (sözünün üstündə) möhkəm duranların (qiyamət günü) heç bir qorxusu yoxdur və onlar qəm-qüssə də görməyəcəklər!

14. Beləleri cənnətlikdirlər, onlar (dünyada) etdikləri (yaxşı) əməllərin əvəzi olaraq orada əbədi qalacaqlar!

15. Biz insana ata-anasına yaxşılıq etməyi (valideynlərilə gözəl davranmağı, onlara yaxşı baxmağı) tövsiyə etdik. Çünki anası onu (doqquz ay bətnində) zəhmətlə gəzdirmiş, əziyyətlə doğmuşdur. Onunla (ana bətnində) daşınma və (süddən) kəsilmə müddəti otuz aydır. Nəhayət, (insan) kamillik həddinə yetişib qırx yaşa çatdıqda belə deyər: “Ey Rəbbim! Mənə həm mənim özümə, həm də ata-anama əta etdiyin nemətə şükür etmək və Sənə xoş gedəcək yaxşı əməl etmək üçün ilham ver, nəslimi əməlisaleh et. Mən (günahlardan) Sənə tövbə etdim və şübhəsiz ki, mən müsəlmanlardanam! (Özümü cani-dildən Allaha təslim edənlərdənəm!)”

16. Beləleri (dünyadakı) yaxşı əməllərini qəbul edəcəyimiz, günahlarından keçəcəyimiz və onlara verilmiş doğru vədə görə cənnət əhli içərisində olacaq kimsələrdir!

17. (Özünü Allaha, axirət gününə iman gətirməyə dəvət edən) ata-anasına: “Tfu sizə! Məndən əvvəl neçə-neçə nəsillər gəlib-getdiyi (öləndən sonra dirilmədiyi) halda, siz mənə (qiyamət günü dirildilib qəbirdən) çıxarılacağımımı vəd edirsiniz?! – deyən kimsəyə, (valideynləri) Allahdan mədəd diləyərək: “Vay halına! (Ay yazıq)

inan, Allahın vədi haqdır!” – deyərlər. O isə: “Bu (dedikləriniz) qədimlərin əfsanələrindən (yalan sözlərdən) başqa bir şey deyildir!” – deyə cavab verər.

18. Belələri özlərindən əvvəl gəlib getmiş və insanlardan ibarət (kafir) ümmətlərlə birlikdə haqlarında əzab sözünün (hökmünün) gerçəkləşdiyi kimsələrdir. Onlar, doğrudan da, ziyana uğrayanlardır!

19. Hamının (möminlərin və kafirlərin) etdiyi əməllərə görə (Cənnətdə və Cəhənnəmdə) dərəcələri vardır ki, (qiyamət günü) Allah onlara (dünyadakı) əməllərinin əvəzini (layiqincə) versin. Onlara əsla haqsızlıq edilməz.

20. Kafir olanlar cəhənnəm oduna göstəriləcəkləri (cəhənnəm odunun üzündən pərdə götürülüb kafirlərin gözünə görünəcəyi, yaxud cəhənnəm əzabını dadacaqları) gün (onlara məzəmmətlə belə deyiləcəkdir): “Siz dünyada həyatınızda (bütün nemətləri görüb daddınız və onlardan ləzzət aldınız (dünyada sizin üçün gözəl olan hər şeyi xərclədiniz, axirətə bir şey qalmadı). Bu gün isə yer üzündə nahaq yerə təkəbbür göstərdiyinizə və (Allahın itaətindən çıxmış) fasiqlər olduğunuza görə həqarətli əzabla cəzalandırılacaqsınız!”

21. (Ya Rəsulum!) Ad qövmünün qardaşını (Hudu) da xatırla! Bir zaman o özündən əvvəl də, sonra da peyğəmbərlər gəlib-getmiş Əhqafda (yüksək qumsal təpələrdə) olan qövmünə belə demişdi: “Allahdan başqasına ibadət etməyin. Mən böyük günün (qiyamət gününün) sizə üz verəcək əzabından qorxuram!”

22. Onlar: “Sən bizi tanrılarımızdan döndərməyəmi gəldin? Əgər doğru danışanlardansansa, bizə vəd etdiyini (əzabı) gətir görək!” – deyə cavab vermişdilər.

23. (Hud) demişdi: “(Əzabın nə vaxt gələcəyini) ancaq Allah bilir. Mən sizə yalnız mənimlə göndərilənləri (risaləti, Allahın əmrlərini)

təbliğ edirəm. Ancaq mən sizin cahil bir qövm olduğunuzu görürəm!”

24. Onu (özlərinə vəd olunmuş əzabı) vadilərinə tərəf üz tutub gələn bir bulud (şəklində) gördükləri zaman: “Bu bizə yağış yağdıracaq buluddur!” – dedilər. (Hud isə onlara belə dedi: ) “Xeyr, bu sizin tez gəlməsini istədiyiniz şeydir, bir küləkdir ki, onda şiddətli əzab vardır!

25. O öz Rəbbinin əmri ilə hər şeyi məhv edər!” Onlar (ertəsi gün) səhər çağı elə bir vəziyyətə düşdülər ki, evlərindən başqa heç bir şey görünmədi (hamısı məhv oldu). Biz günahkar qövmü belə cəzalandırırıq!

26. (Ey Məkkə əhli!) And olsun ki, Biz onlara verdiyimiz imkanı (var-dövləti, qüdrəti) sizə verməmişdik. Biz onlara qulaq, göz və qəlb vermişdik, lakin nə qulaqları, nə gözləri, nə də qəlbləri onlara heç bir fayda vermədi. Çünki onlar Allahın ayələrini (bilə-bilə) inkar edirdilər. Onları istehza etdikləri (əzab) sardı.

27. And olsun ki, Biz sizin ətrafınızda olan məmləkətləri (Səmud, Lut tayfalarının yurdlarını) məhv etdik. Bəlkə, (haqqa, imana) qayıdalar deyə, ayələri onlara cürbəcür şəkildə bəyan etdik (təkrar-təkrar göstərdik).

28. Bəs nə üçün Allahı qoyub (Ona) yaxınlaşmaq məqsədilə tanrı qəbul etdikləri (bütlər) onlara kömək etmədi? Əksinə, (o tanrılar) onlardan uzaqlaşıb qeyb oldular. Bu, (Allaha yaxınlaşmaq məqsədilə bütlərə sitayiş etmək) onların öz yalanları və öz uydurmalarıdır.

29. (Ya Peyğəmbər!) Onu da xatırla ki, bir zaman bir dəstə (ona qədər) cini Quranı dinləmək üçün sənin yanına göndərmişdik. Onlar onu dinləməyə (yaxud sənin yanında) hazır olduqda (bir-birinə): “Qulaq asın!” – dedilər və (Quran oxunub) qurtardıqdan sonra (həmcinslərini Allahın əzabı ilə) qorxudanlar sifətilə öz qövmlərinin

yanına qayıtdılar. (İşə bax ki, cinlər Quranı eşidib ona iman gətirdikləri halda, bu müşriklər hələ də ondan üz döndərirlər).

30. Onlar dedilər: “Ey qövmümüz! Biz Musadan sonra nazil edilmiş, özündən əvvəlkiləri (Tövratı, İncili, Zəburu və səhifələri) təsdiq edən, (Allahın bəndələrini) haqqa və düz yola (islam dininə) yönəldən bir Kitab dinlədik!

31. Ey qövmümüz! Allahın carçısını (Muhəmməd əleyhissəlamı) qəbul edin və ona iman gətirin. Allah (qiyamət günü) günahlarınızdan keçər və sizi şiddətli əzabdan xilas edər!

32. Allahın carçısını qəbul etməyən (bilsin ki) yer üzündə qaçıb canını Ondan (Onun əzabından) qurtara bilməz və ona Allahdan başqa kömək edən dostlar da tapılmaz. Belələri açıq-aşkar (haqq yoldan) azmışlar!”

33. Məgər onlar göyləri və yeri yaratmış və onları yaratmaqdan yorulmamış Allahın ölüləri də diriltməyə qadir olduğunu görüb anlamırlarmı? Bəli, O, hər şeyə qadirdir!

34. Kafirlər cəhənnəm oduna göstəriləcəkləri (cəhənnəm əzabını dadacaqları) gün (onlardan soruşulacaqdır): “Məgər bu (daddığınız əzab) doğru deyilmi?!” Onlar: “Bəli, Rəbbimizə and olsun (ki, doğrudur)!” – deyə cavab verəcəklər. (Allah) buyuracaqdır: “Elə isə (dünyada) küfr etdiyinizə görə dadın əzabı!”

35. (Ya Rəsulum!) Peyğəmbərlərdən əzm (və səbat, şəriət) sahibləri olanların səbr etdiyi kimi, sən də (Allah yolunda çətinliklərə, əziyyətlərə) səbr et. (Müşriklərə) tez (əzab) gəlməsini istəmə. Onlar vəd olunduqlarını (əzabı) görəcəkləri gün gündüzün ancaq bir saatı qədər (dünyada) qaldıqlarını sanacaqlar. (Bu Quran Allah dərgahından sizə olan) bir xəbərdarlıqdır. Fasiq bir qövmdən başqası

da heç məhv edilərmi?! (Əzab gəldikdə ancaq Allahın itaətindən çıxmış fasiqlər məhv ediləcəklər!)

## .47.

## Muhəmməd surəsi

**(Məkkədə nazil olmuşdur, 38 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Kafir olanların və (insanları) Allah yolundan döndərənlərin əməllərini (Allah) puç edəcəkdir.

2. İman gətirib yaxşı əməllər edənlərin, Rəbbindən Muhəmmədə haqq olaraq nazil edilənə (Qurana) inananların isə günahlarının üstünü örtəcək, onların əhvalını (dünyada və axirətdə) düzəldəcəkdir (yaxşılaşdıracaqdır).

3. Bu ona görədir ki, kafirlər batilə uymuş, iman gətirənlər isə öz Rəbbindən gələn haqqa (Qurana) tabe olmuşlar. Allah insanlara özlərinə dair məsələləri belə çəkir!

4. (Ey möminlər!) Kafirlərlə (döyüş meydanında) qarşılaşdığınız zaman boyunlarını vurun. Nəhayət, onları məğlub (əzib şil-küt) etdikdə, (qaçmasınlar deyə, əl-ayaqlarını) kəndirlə möhkəm bağlayın. Sonra da müharibə bitdikdə onları ya (boyunlarına minnət qoyub) məccani, ya da fidyə müqabilində azad edin! (İstəsəniz əsirləri bağışlayıb pulsuz-parasız azad edər, ya onları mübadilə edər, ya da müəyyən məbləğ pul, mal müqabilində buraxarsınız). (Əmr) budur! Əgər Allah istəsəydi, onlardan (başqa cür – müharibəsiz də) intiqam ala bilərdi. Lakin O sizi biri-birinizlə imtahana çəkmək üçün (vuruşmağınızı əmr etdi). Allah Öz yolunda öldürülənlərin əməllərini əsla puç etməz.

5. (Allah) onları doğru yola müvəffəq edəcək, onların əhvalını (dünyada və axirətdə) düzəldəcəkdir.

6. Və onları (dünyada) özlərinə tanıtmış olduğu Cənnətə daxil edəcəkdir.

7. Ey iman gətirənlər! Əgər siz Allaha (Allahın dininə və Peyğəmbərinə) yardım göstərsəniz, O da sizə yardım göstərər və sizi sabitqədəm (cihadda möhkəm, qüvvətli) edər.

8. Kafirlərə gəldikdə isə - hamısı məhv olsun – onların əməllərini puça çıxardar!

9. Bu ona görədir ki, (kafirlər) Allahın nazil etdiyini (Quranı) bəyənmədilər, (Allah da) onların əməllərini puç etdi.

10. Məgər onlar yer üzünü dolaşıb özlərindən əvvəlkilərin aqibətinin necə olduğunu görmürlərmi?! Allah onları yerlə yeksan etdi. Kafirləri də buna bənzərləri (belə şeylər) gözləyir!

11. Ona görə ki, Allah iman gətirənlərin dostudur (himayədarıdır). Kafirlərin isə dostu (himayədarı) yoxdur!

12. Allah iman gətirib yaxşı əməllər edənləri (ağacları) altından çaylar axan cənnətlərə daxil edər. Kafirlər isə (dünyada) səfa sürər, heyvan kimi yeyib-içərlər. (Öləndən sonra) cəhənnəm odu onların məskəni olacaqdır!

13. (Ya Peyğəmbər! Qövmünün) səni çıxartdığı şəhərdən (şəhər əhlindən) daha qüvvətli neçə-neçə şəhərlər (şəhər əhli) var idi ki, Biz onları məhv etdik və özlərinə bir kömək edən də tapılmadı!

14. Məgər Rəbbindən bir dəlilə olan (dəlilə istinad edən) kimsə pis əməli özünə yaxşı göstərilən kimsə kimidirmi?! Beləleri öz nəfslərinə uymuşlar.

15. Müttəqilərə vəd olunan Cənnətin vəsfi belədir: orada dadı dəyişməyən (qoxumayan) sudan irmaqlar, təmi çönməyən süddən çaylar, içənlərə ləzzət verən şərabdan nəhrlər və təmiz baldan

irmaqlar vardır. Orada onları hər cür meyvə və Rəbbi tərəfindən (günahlardan) bağışlanma gözləyir. (Məgər bu cənnətdə olanlar) cəhənnəm odunda əbədi qalıb bağırsaqları parça-parça edən qaynar su içirdiləcək kəslər kimi ola bilərlərmi?!

16. (Ya Peyğəmbər!) Onların (kafirlərin) içərisində elələri də vardır ki, səni dinləyər, sənin yanından çıxıb gedən kimi elm verilmiş kimsələrdən (səhabədən istehza ilə): “(Muhəmməd) bu saat nə dedi?!” – deyə soruşarlar. Onlar Allahın ürəklərinə möhür vurduğu və öz nəfslərinə uymuş kimsələrdir!

17. Doğru yolu tapanlara gəldikdə isə, (Allah) onların doğruluğunu daha da artırar və onlara təqvalarının (möminliklərinin, Allahdan qorxub pis əməllərdən çəkinmələrinin) mükafatını verər!

18. Onlar (kafirlər) ancaq o saatın (qiyamət saatının) qəfildən başlarının üstünü almasınımı gözləyirlər? Onun əlamətləri artıq gəlmişdir. (Qiyamət saatı) onlara gəlib yetişdiyi zaman ibrət almaları (peşman olub tövbə etmələri) onlara nə fayda verər?!

19. (Ya Rəsulum!) Bil ki, Allahdan başqa heç bir tanrı yoxdur. (Ondan) həm öz günahlarının, həm də mömin kişilərin və qadınların bağışlanmasını dilə. Allah gəzib-dolandığınız yeri də, dayanıb-duracağınız yeri də bilir! (Sizin gündüzlər-gecələr dünyada nə işlə məşğul olduğunuz, axirətdə harada olacağınız Allaha məlumdur. Ondan heç nə gizli qalmaz!)

20. Möminlər: “Kaş (cihad barəsində) bir surə nazil olaydı!” – deyirdilər. Elə ki möhkəm bir surə nazil olub orada döyüş (cihad əmri) bildirildi, (ya Rəsulum!) qəlblərində mərəz (şəkk və nifaq mərəzi) olanların sənə ölüm qorxusundan bayılmış kimsənin baxışı ilə baxdıqlarını gördün! Amma onlara daha çox yaraşardı -

21. İtaət etmək və gözəl bir söz demək (sənin əmrini dinməz-söyləməz yerinə yetirmək). İş qətiləşdiyi (onlara cihad vacib olduğu) zaman Allaha (verdikləri vədə) sadiq olsaydılar, sözsüz ki, onlar üçün daha yaxşı olardı!

22. Əgər (Muhəmməd əleyhissəlamdan) üz döndərsəniz, sizdən yer üzündə fitnə-fəsad törətmək və (Cahiliyyət dövründə olduğu kimi) qohumluq tellərini qırmaq gözlənilməzmi?!

23. Onlar (münafiqlər, fitnə-fəsad törədənlər) Allahın lənət etdiyi (qulaqlarını) kar və gözlərini kor etdiyi kimsələrdir!

24. Onlar Quran barəsində düşünməzlərmi? Yoxsa ürəklərinə kilid vurulmuşdur? (Yoxsa ürəklərinin öz kilidləri vardır?)

25. Doğru yol özlərinə bəlli olduqdan sonra (dindən) dönənlərə Şeytan (bu dönüklüyü) xoş göstərdi və onları tovlayıb yoldan azdırdı (və ya: bu dönüklüyün müqabilində Allah onları zəlalətə saldı).

26. Bu onların Allahın nazil etdiyini (cihad əmrini) bəyənməyənlərə (münafiqlərə): “Biz bəzi işlərdə (Allahın və Muhəmməd əleyhissəlamın əmrlərini yerinə yetirməməkdə) sizə itaət edəcəyik!” – demələrinə görədir. Allah onların (bütün) sirlərini (gizli danışıqlarını) bilir!

27. Bəs mələklər onların üzlərinə, arxalarına vura-vura canlarını alanda halları necə olacaq?

28. Bu da onların Allahın qəzəbinə səbəb olan şeyə (Şeytana itaət etməyə) uymaları və (Allaha) xoş gedən şeyi (kafirlərlə vuruşmağı) bəyənmədiklərinə görədir. Elə buna görə də (Allah) onların əməllərini puç etdi.

29. Yoxsa qəlblərində mərəz (şəkk və nifaq mərəzi) olanlar elə güman etdilər ki, Allah onların (ürəklərindəki) kin-küdurətlərini zahirə çıxartmayacaqdır?!

30. (Ya Peyğəmbər!) Əgər Biz istəsəydik, onları (münafiqləri) mütləq sənə göstərər, sən də onları mütləq üzlərindən tanıyardın (amma, bəlkə, tövbə edib dində səmimi olsunlar deyə, onları heç kəsə tanıtmadıq). Sən onsuzda onların danışıq tərzlərindən mütləq tanıyacaqsan. Allah sizin (bütün) əməllərinizi bilir! (Bu ayə nazil olduqdan sonra tanınmayan münafiqlər qorxudan ağızlarını açıb bir kəlmə danışmırdılar).

31. (Ey möminlər!) And olsun ki, Biz içərinizdəki mücahidləri və (əziyyətlərə) səbr edənləri ayırd edib bilmək (ümmətə məlum etmək) üçün sizi imtahana çəkəcək və sizə dair xəbərləri (əməllərinizi) də yoxlayacağıq. (Elə edəcəyik ki, Allahın sizin barənizdə əzəldən bildikləri – kimin həqiqi, kimin yalançı mömin olduğu zahirə çıxıb Onun bütün bəndələrinə bəlli olsun!)

32. Şübhəsiz ki, kafirlər, (insanları) Allah yolundan döndərənlər və doğru yol özlərinə bəlli olduqdan sonra Peyğəmbərə qarşı çıxanlar Allaha heç bir zərər verə bilməzlər. (Allah) onların bütün əməllərini puç edəcəkdir!

33. Ey iman gətirənlər! Allaha itaət edin, Peyğəmbərə itaət edin və (şəkk-şübhə, riya, küfr və nifaq kimi şeylərlə) əməllərinizi puça çıxartmayın!

34. Kafir olanları, (insanları) Allah yolundan döndərənləri, sonra da kafir kimi ölənləri, şübhəsiz ki, Allah bağışlamayacaqdır!

35. Buna görə də (cihada) zəiflik göstərməyin və (kafirlərə) üstün (qalib) gəldiyiniz zaman (onları) sülhə dəvət etməyin. Allah sizinlədir. O sizin əməllərinizi boş (mükafatsız) buraxmaz!

36. Şübhəsiz ki, dünya həyatı oyun-oyuncaq, əyləncədir. Əgər iman gətirsəniz və (pis əməllərdən, günahlardan) çəkinsəniz, O sizə mükafatlarınızı verəcəkdir. O sizdən mal-dövlətinizi (tamamilə Allah yolunda sərf etməyi) istəməz (yalnız zəkat verməyinizi istəyər).

37. Əgər Allah sizdən Onun (mal-dövlətinizin) hamısını istəsə və bunu sizdən israrla tələb etsə, siz xəsislik göstərərsiniz və O da (sizin islam dininə olan) kin-küdurətinizi (yaxud malınızı xərcləmək istəməmənizi) zahirə çıxardar.

38. Budur, siz (mal-dövlətinizin yalnız qırxda birini) Allah yolunda sərf etməyə çağırılan kimsələrsiniz. Bununla belə içərinizdə xəsislik edən də vardır. Hər kəs xəsislik etsə, ancaq özünə qarşı xəsislik etmiş olar. (Bunun zərəri yalnız özünə toxunar). Allah zəngin, siz isə yoxsulsunuz (Allah sizə möhtac deyildir, siz Ona möhtacsınız). Əgər (Ondan) üz döndərsəniz, (sizi yox edib) yerinizə sizlər kimi olmayan (Allaha cani-dildən ibadət və itaət edən) başqa bir qövm gətirər!

## .48.
## əl-Fəth (Fəth) surəsi

**(Mədinədə nazil olmuşdur, 29 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Ya Peyğəmbər!) Həqiqətən, Biz sənə (müsəlmanların fütuhatının başlanğıcını qoyan, Kəbənin yerləşdiyi Məkkə şəhərinin, habelə bir çox başqa məmləkətlərin fəthinə səbəb olacaq Hüdeybiyyə sülhü ilə) açıq-aşkar bir zəfər bəxş etdik!

2. Allah (bununla) sənin əvvəlki və sonrakı günahlarını bağışlayacaq, sənə olan nemətini tamam-kamal edəcək və səni düz yola müvəffəq edəcəkdir!

3. Allah sənə yenilməz qələbə verəcəkdir!

4. Möminlərin imanı üstünə iman artırmaq üçün onların ürəklərinə (Öz dərgahından) arxayınlıq (rahatlıq və mənəvi möhkəmlik) göndərən Odur. Göylərdəki və yerdəki ordular (mələklər, cinlər, insanlar, heyvanlar, ildırım, qasırğa, fırtına, sel, zəlzələ, ayın tutulması, günəşin batması və i. a.) Allahın ixtiyarındadır (Allah istədiyindən onlar vasitəsilə intiqam alar) Allah (hər şeyi) biləndir, hikmət sahibidir!

5. (Cihad əmri ona görədir ki) Allah mömin kişiləri və qadınları əbədi qalacaqları, (ağacları) altından çaylar axan cənnətlərə daxil etsin və onların günahlarının üstünü örtsün. Bu, Allah dərgahında böyük qurtuluşdur (uğurdur)!

6. (Cihad əmri həm də ona görədir ki) Allah (Muhəmmədin Rəbbi nə Muhəmmədin özünə, nə də möminlərə kömək edəcəkdir -deyə) Onun barəsində bədgüman (bədniyyət) olan münafiq kişi və qadınları, müşrik kişi və qadınları əzaba düçar etsin. Onların bədniyyətliyi öz başlarında çatlasın! Allahın onlara qəzəbi tutmuş və (Allah) onlara lənət etmişdir. (Allah) Cəhənnəmi onlar üçün hazırlamışdır. Ora necə də pis məskəndir!

7. Göylərdəki və yerdəki ordular Allahın ixtiyarındadır. Allah yenilməz qüvvət sahibi, hikmət sahibidir!

8. (Ya Rəsulum!) Həqiqətən, Biz səni (bəşər övladına) bir şahid, bir müjdəçi və (Allahın əzablı ilə) qorxudan bir peyğəmbər olaraq göndərdik.

9. (Biz onu göndərdik ki, siz insanlar) Allaha və Onun Rəsuluna iman gətirəsiniz, Ona (Allaha, yaxud Peyğəmbərə) yardım edəsiniz, onu böyük sayıb ehtiramını saxlayasınız və (Allahı) səhər-axşam təqdis edib şəninə təriflər deyəsiniz!

10. (Ya Peyğəmbər! Hüdeybiyyə səfəri zamanı bir ağacın altında beyəti-rizvanla) sənə beyət edənlər, şübhəsiz ki, Allaha beyət etmiş olurlar. Allahın (qüdrət) əli onların əllərinin üstündədir. Kim (beyəti) pozsa, ancaq öz əleyhinə pozmuş olar (bunun zərəri yalnız onun özünə dəyər). Kim Allahla etdiyi əhdi yerinə yetirsə, (Allah) ona böyük mükafat verər!

11. (Hüdeybiyyə səfərindən) geri qalan bədəvi ərəblər sənə deyəcəklər: "Mal-dövlətimiz və ailələrimiz başımızı qatdı (səninlə yola çıxa bilmədik). (Allahdan) bizim bağışlanmağımızı dilə!" Onlar ürəklərində olmayanı dilləri ilə deyirlər. (Onlara) de: "Əgər Allah sizə bir zərər, yaxud bir xeyir vermək istəsə, bu işdə Allaha bir şeylə kim mane ola bilər?!" Bəli, Allah sizin nə etdiyinizdən xəbərdardır!

12. Yoxsa (ey münafiqlər!) siz elə güman edirdiniz ki, Peyğəmbər və möminlər (döyüşdə həlak olub) bir daha öz ailələrinə qayıtmayacaqlar? Bu sizin ürəyinizə xoş gəlmiş və siz (Allah barəsində) pis fikrə düşmüşdünüz. Və (elə buna görə də) siz məhvə düçar edilmiş (yaxud xeyirsiz) bir qövm oldunuz!

13. Hər kəs Allaha və Onun Peyğəmbərinə iman gətirməsə, (bilsin ki) Biz kafirlər üçün cəhənnəm odu hazırlamışıq!

14. Göylərin və yerin hökmü Allahın əlindədir. O, istədiyini bağışlayar, istədiyinə də əzab verər. Allah bağışlayandır, rəhm edəndir!

15. Siz (Xeybərə) qənimət əldə etmək üçün getdiyiniz zaman (Hüdeybiyyə səfərinə) getməyənlər (səfərdən geri qalanlar) deyəcəklər: "Qoyun biz də sizin arxanızca gələk!" Onlar Allahın (ya Peyğəmbər! Hüdeybiyyə səfərinə getməyib evdə oturanları heç yerə aparma!) sözünü dəyişdirmək istəyirlər. (Ya Peyğəmbər! Onlara) de: "Siz əsla bizim arxamızca gəlməyəcəksiniz. Allah əvvəldən belə buyurmuşdur" Onlar deyəcəklər: Xeyr, siz bizə paxıllıq edirsiniz

(istəmirsiniz ki, bizim də payımıza qənimət düşsün)". Xeyr, onlar özləri çox az qanan kimsələrdir!

16. (Hüdeybiyyə səfərindən) geri qalan bədəvi ərəblərə de: "Siz (bir müddətdən sonra) çox güclü bir qövmlə vuruşmağa çağırılacaqsınız. Siz onlarla vuruşacaqsınız, ya da onlar dönüb müsəlman olacaqlar (döyüşə ehtiyac qalmayacaqdır). Əgər itaət etsəniz, Allah sizə gözəl bir mükafat verər. Yox, əgər əvvəldə olduğu kimi (döyüşdən) üz çevirsəniz, (Allah) sizə ağrılı-acılı bir əzab verər".

17. (Cihada getməməyə görə) kora günah gəlməz, topala-şilə günah gəlməz, bir də xəstəyə günah gəlməz. Kim Allaha və Peyğəmbərinə itaət etsə, (Allah) onu (ağacları) altından çaylar axan cənnətlərə daxil edər. Kim (onlardan) üz döndərsə, (Allah) onu şiddətli bir əzaba düçar edər!

18. (Ya Peyğəmbər!) And olsun ki, (Hüdeybiyyədə) ağac altında sənə beyət etdikləri zaman Allah möminlərdən razı oldu. (Allah) onların ürəklərində olanı (sənə sadiq qalacaqlarını, əhdə vəfa edəcəklərini) bildi, onlara (öz dərgahından) arxayınlıq (rahatlıq, səbir, səbat, mənəvi qüvvə) göndərdi və onları yaxın gələcəkdə qazanılacaq bir qələbə (Xeybərin fəthi) ilə mükafatlandırdı.

19. Həm də (Xeybərdə) ələ keçirəcəkləri çoxlu qənimətlərə (nail etdi). Allah yenilməz qüvvət sahibi, hikmət sahibidir!

20. Allah sizə çox-çox qənimətlər vəd buyurmuşdur; siz onları əldə edəcəksiniz. Bunu (Xeybərdəki bu qəniməti) isə sizə tezliklə verdi. Möminlərə işarə olsun və sizi doğru yola çıxartsın deyə, (Allah) insanların sizə qarşı uzanmış əllərini kəsdi (Xeybərdə müttəfiqlərin, yaxud Məkkə müşriklərinin müqavimətini qırdı).

21. Hələ əldə edə bilmədiyiniz başqa qənimətlər də (Allahın sizə Məkkənin fəthini, yaxud Hüneyn vuruşu, İranın fəthi və sonrakı

neçə-neçə döyüşlər zamanı əldə ediləcək qənimətlər vəd buyurmuşdur). Allah onları (öz elmi ilə) ehtiva etmişdir. Allah hər şeyə qadirdir!

22. Əgər (Məkkə əhlindən sonra) o kafirlər sizinlə döyüşə girişsəydilər, mütləq arxa çevirib qaçacaq, özlərinə nə dost, nə də havadar tapacaqdılar.

23. (Ya Peyğəmbər!) Allahın əvvəldən qoyduğu qayda-qanun (adət) belədir. Sən Allahın qayda-qanununda (adətində) heç vaxt bir dəyişiklik görə bilməzsən! (Həmişə peyğəmbərlər və möminlər qalib gəlmiş, kafirlər isə məğlub olmuşlar).

24. Sizi onlara (müşriklərə) qalib etdikdən sonra Məkkə vadisində (Hüdeybiyyədə) onların əlini sizdən, sizin də əlinizi onlardan çəkən (onları sizinlə, sizi də onlarla vuruşmağa qoymayan) Odur. Allah sizin nə etdiklərinizi görəndir! (Peyğəmbər əshabəsi ilə Hüdeybiyyədə yerləşdiyi zaman səksən silahlı Məkkə müşriki müsəlmanlara hücum etmək istəmiş, lakin əsir tutulub Peyğəmbərin yanına gətirilmiş, o da onlara heç bir cəza verməyib hamısını azad etmişdi. Muhəmməd əleyhissəlamın bu lütfü Hüdeybiyyə sülhünün imzalanmasına səbəb olmuşdu).

25. Küfr edənlər də, sizin Məscidülhərama daxil olmağınıza maneçilik törədənlər də, qurbanlıqları öz yerinə (qurbangaha) gedib çatmağa qoymayanlar da məhz onlardır (Məkkə müşrikləridir). Əgər (Məkkədə) tanımadığınız mömin kişi və qadınları bilmədən ayaq altına alıb əzmək və bundan dolayı sizə günah gəlmək ehtimalı olmasaydı (Allah siz möminlərin hamılıqla Məkkəyə daxil olmasına izin verərdi). Amma Allah istədiyini Öz mərhəmətinə qovuşdursun deyə (o zaman buna izin vermədi). Əgər onlar (möminlərlə kafirlər) bir-birindən seçilib ayrılmış olsaydılar, Biz onlardan (Məkkə əhlindən) kafir olanları şiddətli bir əzaba düçar edərdik!

26. Kafirlər öz ürəklərində Cahiliyyət təkəbbürü təəssübünə qapıldıqları (Hüdeybiyyə sazişinə “bismillahir-rəhmanir-rəhim”, “Muhəmmədun rəsulullah” sözlərini yazmaqdan imtina etdikləri, hicrətin altıncı ilində Muhəmməd əleyhissəlamın Məkkəyə daxil olmasına razılıq vermədikləri) zaman Allah Peyğəmbərinə və möminlərə öz dərgahından arxayınlıq (qəlb rahatlığı, mənəvi möhkəmlik) göndərmiş və onlara təqva gəlməsini (la ilahə illallah, Muhəmmədun rəsulullah” sözünü) xas etmişdi. Onların bu sözə (Məkkə müşriklərindən) daha çox haqqı var idi və ona layiq idilər. Allah hər şeyi biləndir!

27. And olsun ki, Allah-təala Öz Peyğəmbərinin (Məkkə fəthi) röyasının çin olduğunu təsdiq etdi. (Ey möminlər!) Siz, inşallah, əmin-amanlıqla, (bəziniz) başınızı qırxdırmış, (bəziniz saçınızı) qısaltmış halda və (müşriklərdən) qorxmadan Məscidülhərama daxil olacaqsınız. (Allah) sizin bilmədiklərinizi bilir. O bundan əlavə (sizə) tezliklə bir qələbə (Xeybərin fəthini) də bəxş edəcəkdir. (Doğrudan da, Muhəmməd əleyhissəlam hicrətin yeddinci ilində əshabəsi ilə birlikdə Məkkəyə ümrə ziyarətinə getdi və ziyarətdən əvvəl Xeybəri fəth etdi. Buna görə də bir işə girişməzdən əvvəl mütləq “inşallah” demək lazımdır!)

28. Onu (islamı) bütün dinlərdən üstün etmək (onun bütün dinlərdən üstün olduğunu göstərmək) üçün Öz Peyğəmbərini hidayət və haqq dinlə göndərən Odur. (Ya Rəsulum! Sənin peyğəmbərliyinin həqiqiliyinə) Allahın şahid olması kifayət edər!

29. Muhəmməd (əleyhissəlam) Allahın Peyğəmbəridir. Onunla birlikdə olanlar (möminlər) kafirlərə qarşı sərt, bir-birinə (öz aralarında) isə mərhəmətlidirlər. Sən onları (namaz vaxtı) rüku edən, səcdəyə qapanan, Allahdan riza və lütf diləyən görərsən. Onların əlaməti üzlərində olan səcdə izidir. (Qiyamət günü onlar üzlərindəki möminlik nuru alınlarındakı möhür yeri ilə tanınırlar). Bu onların

Tövratdakı vəsfidir. İncildə isə onlar elə bir əkinə bənzədilirlər ki, o artıq cücərtisini üzə çıxarmış, onu bəsləyib cana-qüvvətə gətirmiş, o da (o cücərti də) möhkəmlənib gövdəsi üstünə qalxaraq əkinçiləri heyran qoymuşdur. (Allahın bu təşbihi) kafirləri qəzəbləndirmək üçündür. Onlardan iman gətirib yaxşı əməllər edənlərə Allah məğfirət (günahlardan bağışlanma) və böyük mükafat (Cənnət) vəd buyurmuşdur!

## .49.
## əl-Hucurat (Otaqlar) surəsi

**(Mədinədə nazil olmuşdur, 18 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Ey iman gətirənlər! (Sözləriniz, iş və hərəkətlərinizdə) Allahdan və Peyğəmbərindən önə keçməyin. Allahdan qorxun. Həqiqətən, Allah (hər şeyi) eşidəndir, (hər şeyi) biləndir!

2. Ey iman gətirənlər! Səsinizi Peyğəmbərin səsindən artıq qaldırmayın və bir-birinizlə ucadan danışdığınız kimi onunla ucadan danışmayın! Yoxsa, özünüz də bilmədən, əməlləriniz puç olar.

3. Həqiqətən, Allahın Peyğəmbəri yanında astadan danışanlar (səslərini asta çıxardanlar) o kimsələrdir ki, Allah onların ürəklərini təqva üçün imtahana çəkmişdir (möminliyə layiq etmişdir). Onları (günahlardan) bağışlanma və böyük mükafat (Cənnət) gözləyir!

4. (Ya Peyğəmbər!) Şübhəsiz ki, səni otaqların arxasından çağıranların çoxusunun ağlı kəsmir!

5. Əgər onlar sən qarşılarına çıxıncaya qədər səbr etsəydilər, (bu, Allahın yanında) onlar üçün, əlbəttə, daha yaxşı olardı. Allah (tövbə edənləri) bağışlayandır, rəhm edəndir!

6. Ey iman gətirənlər! Əgər bir fasiq sizə (pis) bir xəbər gətirsə, dərhal (onun doğruluğunu) yoxlayın, yoxsa bilmədən bir qövmə pislik edər, sonra da etdiyinizə peşman olarsınız!

7. (Ey iman gətirənlər!) Bilin ki, aranızda Allahın Peyğəmbəri vardır. Əgər o, bir çox işlərdə sizə uysaydı, siz (çətinliyə düşər) əziyyət çəkərdiniz. Lakin Allah sizə imanı sevdirmiş, onu ürəklərinizdə süsləmiş, küfrə, itaətdən çıxmağa və (Allaha) asi olmağa qarşı sizdə nifrət oyatmışdır. Məhz beləlləri (bu xislət sahibləri) doğru yolda olanlardır!

8. Bu isə Allah dərgahından olan lütf və nemət sayəsindədir. Allah (hər şeyi) biləndir, hikmət sahibidir!

9. Əgər möminlərdən iki dəstə bir-biri ilə vuruşsa, onları dərhal barışdırın. Əgər onlardan biri təcavüzkarlıq etsə, təcavüzkarlıq edənlə Allahın əmrinə (itaətinə) qayıdana qədər vuruşun. (Təcavüzkarlıq edən Allahın əmrinə) qayıtsa, hər iki dəstənin arasını ədalətlə düzəldin və insafla hərəkət edin. Şübhəsiz ki, Allah insaflıları sevər!

10. Həqiqətən, möminlər (dində) qardaşdırlar. Buna görə də (aralarında bir mübahisə düşsə) iki qardaşınızın arasını düzəldin və Allahdan qorxun ki, bəlkə, (əvvəlki günahlarınız bağışlanıb) rəhm olunasınız!

11. Ey iman gətirənlər! Bir qövm digərini lağa qoymasın. Ola bilsin ki, onlar (lağa qoyulanlar) o birilərindən (lağa qoyanlardan Allah yanında) daha yaxşı olsunlar. Qadınlar da bir-birinə (rişxənd eləməsinlər). Bəlkə, onlar (rişxənd olunanlar) o birilərindən (rişxənd edənlərdən) daha yaxşıdırlar. Bir-birinizə tənə etməyin (ayıb tutmayın) və bir-birinizi pis ləqəblərlə (ey kafir, ey fasiq, ey münafiq və i. a.) çağırmayın. İman gətirdikdən sonra fasiq adını qazanmaq necə də pisdir. Məhz tövbə etməyənlər zalımlardır! (Özlərinə zülm edənlərdir!)

12. Ey iman gətirənlər! Çox zənnə-gümana qapılmaqdan çəkinin. Şübhəsiz ki, zənnin bəzisi (heç bir əsası olmayan zənn) günahdır. (Bir-birinizin eybini, sirrini) arayıb axtarmayın, bir-birinizin qeybətini qırmayın! Sizdən biriniz ölmüş qardaşının ətini yeməyə razı olarmı?! Bu sizdə ikrah hissi oyadar (qeybət də belədir). Allahdan qorxun. Həqiqətən, Allah tövbələri qəbul edəndir, rəhmlidir!

13. Ey insanlar! Biz sizi bir kişi və bir qadından (Adəm və Həvvadan) yaratdıq. Sonra bir-birinizi tanıyasınız (kimliyinizi biləsiniz) deyə, sizi xalqlara və qəbilələrə ayırdıq. Allah yanında ən hörmətli olanınız Allahdan ən çox qorxanınızdır (pis əməllərdən ən çox çəkinəninizdir). Həqiqətən, Allah (hər şeyi) biləndir, (hər şeydən) xəbərdardır.

14. (Qənimət əldə etmək iştahası ilə islama daxil olan) bədəvi ərəblər: “Biz iman gətirdik!” – dedilər. (Ya Peyğəmbər! Onlara) de: “Siz (qəlbən) iman gətirmədiniz! Ancaq: “Biz islamı (müəyyən şəxsi məqsəd, mənfəət naminə) qəbul etdik!” – deyin. Hələ iman sizin qəlblərinizə daxil olmamışdır (çünki iman əməllə etiqadın vəhdəti, islamı qəbul etmək isə yalnız zahiri əməl deməkdir). Əgər Allaha və Peyğəmbərinə itaət etsəniz, O sizin əməllərinizdən heç bir şey əskiltməz (mükafatınızı layiqincə verər). Həqiqətən, Allah bağışlayandır, rəhm edəndir!

15. Möminlər yalnız Allaha və Peyğəmbərinə iman gətirən, (iman gətirdikdən) sonra heç bir şəkk-şübhəyə düşməyən, Allah yolunda malları və canları ilə vuruşanlardır! Məhz belələri (imanlarında) sadiq olanlardır!

16. (Ya Peyğəmbər! Bu bədəvilərə) de: “Siz dininizi (həqiqi müsəlman olduğunuzu) Allahamı öyrədirsiniz?” Halbuki Allah göylərdə və yerdə nə varsa, (hamısını) bilir. Allah hər şeyi biləndir!

17. Onlar islamı qəbul etdiklərinə görə sənə minnət qoyurlar. De: “Müsəlman olduğunuzla mənə minnət qoymayın! Xeyr, əgər (iman gətirdiyinizi) doğru deyirsinizsə, (bilin ki) sizi imana müvəffəq etməklə, əslində Allah sizin boynunuza minnət qoymuş olur!”

18. Şübhəsiz ki, Allah göylərin və yerin qeybini (gözə görünməyən sirlərini) bilir. Allah sizin nə etdiklərinizi görəndir!

## .50.
## Qaf surəsi

**(Məkkədə nazil olmuşdur, 45 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Qaf! (Ya Peyğəmbər!) Şanlı Qurana and olsun (ki, Məkkə müşrikləri sənə iman gətirmədilər)!

2. Bəli! Özlərindən (Onları Allahın əzabı ilə) qorxudan bir peyğəmbər gəldiyinə təəccüb etdilər. Kafirlər dedilər:” Bu əcaba bir şeydir! (İnsandan da peyğəmbər olarmı?! Ancaq mələk peyğəmbər ola bilər!)

3. Məgər biz ölüb torpaq olduqdan sonra (yenidən diriləcəyik)? Bu, (həqiqətən) uzaq (qeyri-mümkün) bir qayıdışdır!”

4. Həqiqətən, Biz yerin onlardan nəyi əskiltdiyini (onların tədriclə necə çürüdüb məhv etdiyini) bilirik. Dərgahımızda (hər şeyi) hifz edən bir Kitab (lövhi-məhfuz) vardır!

5. Lakin onlara haqq (Quran) gəldikdə onu yalan saydılar. İndi onlar dolaşıqlıq (təşviş) içindədirlər (sənə gah şair, gah sehrbaz, gah da kahin deyirlər).

6. Məgər onlar başlarının üstündəki göyə baxıb onu necə yaratdığımızı, necə bəzədiyimizi və orada heç bir yarıq olmadığını görmürlərmi?!

7. Eləcə də yeri necə döşədiyimizi (hamarlayıb düzəltdiyimizi), orada möhkəm duran dağlar yaratdığımızı, hər cür gözəl növdən (meyvə) yetişdirdiyimizi görmürlərmi?!

8. (Bütün bunlar Rəbbinə tərəf) dönüb qayıdan hər bir bəndə üçün ibrət dərsi və öyüd-nəsihət olsun deyə etdik.

9. Biz göydən bərəkətli su endirdik, sonra onunla bağlar və (arpa, buğda və s. kimi) biçilən taxıl dənələri yetişdirdik.

10. Həm də tumurcuqları (salxım-salxım) bir-birinin üstünə düzülmüş, hündür xurma ağacları (bitirdik) –

11. Bəndələrə ruzi olsun deyə! Biz onunla (o su ilə) ölü bir məmləkəti cana gətirdik. (Qəbirlərdən dirilib) çıxmaq da belədir!

12. Onlardan (Məkkə müşriklərindən) əvvəl Nuh tayfası, Rəss əhli, Səmud (qövmü peyğəmbərləri) təkzib etmişdi.

13. Ad (qövmü), Firon (əhli), Lut qardaşları;

14. Əykə əhli və Tübbə qövmü – bunların hamısı peyğəmbərləri təkzib etdi və Mənim də onlara vəd etdiyim (əzab) gerçəkləşdi.

15. Məgər Biz ilk yaradılışdan acizmi qaldıq?! Xeyr! (Eləcə də qiyamət günü ölüləri diriltməkdən aciz qalmayacağıq!) Onlar yeni yaradılış (təkrar dirilmə) barəsində şəkk-şübhə içindədirlər!

16. And olsun ki, insanı Biz yaratdıq və nəfsinin ona nə vəsvəsə etdiyini də Biz bilirik. Biz ona şah damarından da yaxınıq! (İnsanın adi hərəkətlərindən tutmuş ürəyindən keçən ən gizli hisslər, duyğular belə Allaha məlumdur!)

17. Xatırla ki, (insanın) sağında və solunda (onun bütün əməllərini) təsbit edən (qeydə alan) iki mələk oturmuşdur!

18. Dediyi hər sözü (yazmaq üçün) onun yanında hazır durub gözləyən (iki mələk) vardır!

19. Ölüm (ölüm bihuşluğu), həqiqətən, gələcəkdir. (Ey insan!) Bu sənin qorxub qaçdığın (cürbəcür vasitələrlə canını qurtarmaq istədiyin) şeydir!

20. (Öləndən sonra yenidən dirilmək üçün) sur çalınacaqdır. Bu vəd olunmuş gündür (əzab günüdür)!

21. Hər bir kəs (Rəbbinin hüzuruna) bir sürüyən (sürüyüb məhşərə gətirən) və bir də şahidlə (iki mələklə) gələcəkdir.

22. (Ona belə deyiləcəkdir: ) “Sən (dünyada) bundan (bu müdhiş günə uğrayacağından) qafil idin. Artıq bu gün gözündən pərdəni götürdük. Sən bu gün sərrast görürsən!”

23. Yoldaşı (ona təhkim olunmuş mələk) deyəcəkdir: “Bu yanımdakı (Cəhənnəm üçün) hazırdır!”

24. (Allah o iki mələyə buyuracaqdır: ) “Atın Cəhənnəmə hər bir inadcıl kafiri;

25. Xeyrə mane olanı, (zülm etməklə, günah törətməklə) həddi aşanı, (Allahın birliyinə) şəkk edəni!

26. O kimsəni ki, Allahla yanaşı özünə başqa bir tanrı qəbul etdi. Atın onu şiddətli əzabın içinə!”

27. Yoldaşı (Şeytan və ya öz nəfsi) deyəcəkdir: “Ey Rəbbimiz! Onu mən azdırmadım. Fəqət o özü haqq yoldan çox azmışdı!”

28. (Allah) buyuracaqdır: “Mənim hüzurumda mübahisə etməyin. Mən sizə (dünyada peyğəmbər vasitəsilə) bu əzabı bildirmişdim.

29. Mənim hüzurumda söz güləşdirməyin. Mən bəndələrə (əbəs yerə) zülm edən deyiləm!”

30. O gün Biz Cəhənnəmə: “Doldunmu?” – deyəcək, o isə: “Yenə varmı?” – deyə cavab verəcəkdir.

31. Cənnət də müttəqilər üçün yaxın bir yerə gətiriləcəkdir.

32. (Onlara deyiləcəkdir: ) “Bu, vəd olunduğunuz (Cənnətdir). O, hər bir (tövbə edib Allaha tərəf) qayıdan, (nəfsini haramdan, özünü günahdan) qoruyan;

33. Rəhmandan (Onu) görmədən qorxan və (Rəbbinin hüzuruna) haqqa dönmüş qəlblə gələn bəndə üçündür!

34. Ora sağlıqla (əmin-amanlıqla) daxil olun. Bu, əbədiyyət günüdür!”

35. Orada onlar üçün istədikləri hər şey vardır. Dərgahımızda isə ondan artığı (möminlərin təsəvvür edə bilmədikləri nemətlər, Allahın rizasını və s.) mövcuddur!

36. Biz onlardan (Məkkə müşriklərindən) əvvəl özlərindən daha qüvvətli neçə-neçə nəsilləri məhv etdik. (Onlar: ) “Görəsən, (ölümdən qaçıb) can qurtarmağa bir yer varmı?” (deyərək) ölkə-ölkə gəzib dolaşmışdılar.

37. Şübhəsiz ki, bunda qəlb (ağıl) sahibi, yaxud (moizə edildiyi zaman bütün varlığı ilə) hazır olub (ona cani-dildən) qulaq asan kimsə üçün öyüd-nəsihət vardır!

38. And olsun ki, Biz göyləri, yeri və onların arasında olanları altı gündə yaratdıq və Bizə heç bir yorğunluq da üz vermədi.

39. (Ya Peyğəmbər!) Artıq onların dediklərinə (batil sözlərinə) səbr et. Gün doğmamışdan əvvəl, batmamışdan əvvəl Rəbbini təqdis edib şəninə təriflər de!

40. Gecənin bir vaxtında və səcdələrdən sonra da (Onu şükr-səna ilə təqdis et)!

41. (Ya Peyğəmbər!) Carçının yaxın bir yerdən car çəkəcəyi gün (deyilən sözü, surun səsini) dinlə! (O gün İsrafil uca səslə: "Ey köhnəlmiş sümüklər, ey bir-birindən ayrılmış oynaqlar, ey əprimiş ətlər, ey dağılmış saçlar! Allah sizə haqq-hesab gününə gəlmək üçün yenidən birləşməyi buyurur!" – deyəcək və suru ikinci dəfə üfürəcəkdir).

42. O gün (bütün yaranmışlar) dəhşətli (tükürpədici) səsi doğrudan-doğruya eşidəcəklər. O gün (qəbirlərdən) çıxma günüdür!

43. Şübhəsiz ki, diriləndə də, öldürən də Bizim. (Axır) dönüş də Bizim hüzurumuzadır!

44. O gün yer onlardan ayrılıb parçalanacaq, onlar sürətlə (torpağın altından, qəbirlərindən çıxacaqlar). O bizim üçün asan olan həşrdir (Bütün yaranmışların bir yerə toplanacaqları məhşər günüdür).

45. Biz onların nə dediklərini çox gözəl bilirik. (Ya Peyğəmbər!) Sən onlara zor edən (onları zorla imana gətirən) deyilsən. Sən Mənim təhdidimdən (əzabımdan) qorxanlara Quranla öyüd-nəsihət ver!

## .51.
## əz-Zariyat (Sovurub dağıdan küləklər) surəsi

**(Məkkədə nazil olmuşdur, 60 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Toz-torpağı) sovurub-dağıdan küləklərə;

2. Yağış yüklü buludlara;

3. Asanlıqla üzüb gedən gəmilərə;

4. Və ruzi bölən (hərəsi bir işə müvəkkil olan) mələklərə and olsun ki,

5. Sizə vəd olunan (qiyamət) həqiqətdir (mütləq vaqe olacaqdır).

6. Haqq-hesab (əmələ görə cəza və mükafat) da labüddür!

7. (Cürbəcür ulduz) yolları olan göyə and olsun ki,

8. (Ey müşriklər!) Sizin (Quran və Muhəmməd əleyhissəlam barəsində) sözləriniz müxtəlifdir (bəziniz Qurana şer, Peyğəmbərə şair, bəziniz də Qurana kahinlik əsəri, Peyğəmbərə kahin deyirsiniz).

9. Ondan (Qurandan, yaxud Muhəmməd əleyhissəlamdan) zatında dönüklük olan kimsə dönər! (Allahın əzəli elmində imandan kim dönmüşdürsə, Qurandan və Peyğəmbərdən də elə o dönər!)

10. Məhv olsun yalançılar! (Allah onlara lənət eləsin!)

11. O kəslər ki, cəhalət girdabına düşüb (haqdan) qafil olmuşlar!

12. Onlar (səndən istehza ilə) haqq-hesab gününün nə vaxt olacağını soruşarlar.

13. O gün onlara cəhənnəm odunda əzab veriləcəkdir.

14. (Mələklər onlara deyəcəklər: ) “Dadın əzabınızı! Bu sizin (dünyada) tez-tələsik gəlməsini istədiyiniz şeydir (əzabdır)!”

15. Həqiqətən, müttəqilər cənnətlərdə və çeşmələr başında olacaqlar;

16. Rəbbinin onlara verdiyini alacaqlar. Çünki onlar bundan əvvəl yaxşı əməllər etmişdilər.

17. Onlar gecələr (ibadətlə məşğul olub) az yatırdılar.

18. Səhərlər isə (Allahdan) bağışlanmalarını diləyirdilər.

19. Mallarında da dilənçinin və (abrına qısılıb dilənməyən) yoxsulun haqqı (payı) var idi.

20. Yerdə (Allaha) tam yəqinliklə inananlar üçün (Onun əzəmət və qüdrətinə, vəhdaniyyətinə dəlalət edən) əlamətlər vardır.

21. Sizin özünüz də (sizi yaradanın birliyini sübut edən) əlamətlər vardır. Məgər görmürsünüz?

22. Göydə də ruzinin (yağış, qar) və vəd olunduğunuz şey (mükafat, cəza) vardır! (Sizə vəd olunan mükafat, yaxud cəza Allah dərgahındakı lövhi-məhfuzda yazılmışdır).

23. Göyün və yerin Rəbbinə (sahibinə) and olsun ki, bu (deyilənlər) sizin danışığınız (dediyiniz sözün öz sözünüz olması) kimi həqiqətdir.

24. (Ya Rəsulum!) İbrahimin möhtərəm qonaqlarının (mələklərin) söhbəti sənə gəlib çatdımı?

25. Onlar (İbrahimin) yanına gəlib salam verdikdə (İbrahim) salamı alıb (öz-özünə): “Bunlar tanımadığım kimsələrdir!” –dedi.

26. O (bir bəhanə ilə) ailəsinin yanına getdi və bir buzov (kəsib qızardaraq) gətirdi.

27. Onu qabaqlarına (qonaqların qabağına) qoyub: “Bəlkə, yeyəsiniz!” – dedi.

28. (İbrahim qonaqların yeməyə əl uzatmadıqlarını gördükdə) onlardan qorxuya düşdü. Onlar: “Qorxma!” – dedilər və ona çox bilikli bir oğlan uşağı (İshaqın dünyaya gələcəyi) ilə müjdə verdilər.

29. (Bunu eşidən) zövcəsi (Sara) çağır-bağır salıb (təəccübündən əlini) üzünə çırparaq dedi: “Mən qoca, qısır bir qarıyam! (Mənim necə uşağım ola bilər?)”

30. Onlar: “Sənin Rəbbin belə buyurmuşdur. Şübhəsiz ki, O, hikmət sahibidir, (hər şeyi) biləndir!” – dedilər.

31. (Sonra İbrahim) dedi: “Ey elçilər! Sizin işiniz nədir?”

32. Onlar dedilər: “Biz günahkar bir qövmə (Lut tayfasına cəza verməyə) göndərilmişik.

33. Onların başına gildən daşlar yağdırmaq üçün (gəlmişik).

34. (Elə daşlar ki, onlara pozğunluqla məşğul olub) həddi aşanlar üçün sənin Rəbbinin dərgahında xüsusi nişan qoyulmuşdur!”

35. Nəhayət, (Lut qövmünü məhv etmək üçün) orada (Sədumda) olan möminləri çıxartdıq.

36. Lakin orada bir evdən (Lutun ailəsindən) başqa müsəlman (tövhid dinində olan) tapmadıq.

37. Və orada (axirətdəki) şiddətli əzabdan qorxanlar üçün bir nişanə qoyduq. (Lut qövmünün Şamla Hicaz arasında yerləşən yurdunu xaraba qoyub altını üstünə çevirdik. Bu, Məkkə müşrikləri üçün də bir ibrət dərsi olmalıdır).

38. Musanın hekayətində də (bir ibrət dərsi vardır). O zaman Biz onu Fironun yanına açıq-aşkar bir dəlillə göndərmişdik.

39. O, bütün əyanları (və qoşunu) ilə birlikdə (imandan) üz döndərib (Musa barəsində): “Bu sehrbazdır, yaxud da dəlidir!” – demişdi.

40. Nəhayət, onu və əsgərlərini tutub dənizə atdıq. O, məzəmmətə layiq bir iş görmüşdü (allahlıq iddiasına düşmüşdü).

41. Adın (Ad qövmünün) başına gələnlərdə də (bir ibrət dərsi vardır). O zaman Biz onların üstünə hər şeyi qurudub məhv edən (xeyirsiz) bir külək göndərmişdik.

42. O, qarşısına çıxan heç bir şeyi buraxmır, onu sovurub külə (çör-çöpə) döndərirdi.

43. Səmudun (Səmud qövmünün) başına gələnlərdə də (bir ibrət dərsi vardır). O zaman onlara: “Hələ bir müddət (üç gün) kef çəkib ləzzət alın!” – deyilmişdi.

44. Onlar öz Rəbbinin əmrinə (tabe olmağa) təkəbbür göstərmiş və onları gözləri baxa-baxa ildırım vurmuşdu.

45. Onların nə (yıxıldıqları yerdən) qalxmağa gücləri çatmış, nə də (bir kimsədən özlərinə) kömək istəyə bilmişdilər (yaxud nə də özlərinə cəza verəndən intiqam ala bilmişdilər).

46. Daha əvvəl Nuh qövmünü (məhv etmişdik). Çünki onlar (Allahın itaətindən çıxmış) fasiqlər idilər.

47. Biz göyü qüdrətimizlə (qüdrət əlimizlə) yaratdıq və Biz (istədiyimiz hər şeyi yaratmağa) qadirik. (Və ya: Biz göyü qüdrətimizlə yaratdıq və Biz onu genişləndirməkdəyik).

48. Yeri də Biz döşədik. (Onu) döşəyənlər necə də gözəldir! (Biz necə də gözəl döşəyənlərik!)

49. Biz hər şeydən (erkək və dişi, bir-birinin əksi olmaqla) cüt-cüt yaratdıq. Bəlkə, bir düşünüb ibrət alasınız!

50. (Ya Rəsulum! Bu insanlara de: ) “Allaha tərəf qaçın! (Allahın qəzəbindən qaçıb Onun mərhəmətinə sığının, küfrü atıb imana gəlin!) Mən sizi Ondan (Allahın əzabından) açıq-aşkar qorxudan bir peyğəmbərəm!

51. Allahla yanaşı başqa bir tanrı qəbul etməyin. Mən sizi Ondan (Allahın əzabından) açıq-aşkar qorxudan bir peyğəmbərəm!”

52. (Ya Rəsulum! Sənin qövmün sənə şair, sehrbaz, divanə dediyi kimi) eləcə də onlardan əvvəlkilər özlərinə bir peyğəmbər gələr-gəlməz ona sehrbaz, divanə dedilər.

53. Görəsən, onlar bunu (bu dediklərini) bir-birinə vəsiyyətmi etmişlər?! (Hamısı eyni şeyi deyir). Xeyr, onlar azğın bir qövmdürlər!

54. (Ya Rəsulum!) Artıq onlardan üz döndər! Sən buna görə qınanası deyilsən (çünki sənə həvalə olunmuş risaləti layiqincə təbliğ etdin).

55. Sən (onlara Quranla) öyüd-nəsihət ver. Çünki öyüd-nəsihət möminlərə fayda verir.

56. Mən cinləri və insanları yalnız Mənə ibadət etmək üçün yaratdım!

57. Mən onlardan ruzi istəmirəm. Mən onlardan Məni (ehtiyacı olan bəndələrimi) yedirtmələrini də istəmirəm!

58. Şübhəsiz ki, ruzi verən də, qüvvət sahibi də, yenilməz olan da Allahdır!

59. Həqiqət, zülm edənlərin (özlərindən əvvəlki) yoldaşlarının qisməti kimi bir qisməti vardır! (Allaha şərik qoşmaqla özlərinə zülm edən Məkkə müşriklərini də əvvəlki ümmətlər kimi şiddətli bir əzab gözləyir!) Qoy onlar Məni (özlərinə əzab verməyə) tələsdirməsinlər!

60. Vəd olunduqları gündən (qiyamət günündən) dolayı vay kafirlərin halına!

## .52.
## ət-Tur (Dağ) surəsi

**(Məkkədə nazil olmuşdur, 49 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. And olsun (Allahın Musa ilə danışdığı) Tur dağına;
2. And olsun yazılmış kitaba (Tövrata, Qurana, yaxud bütün ilahi kitablara) -
3. Açıq dəri üzərində (olan kitaba);
4. And olsun (mələklərin ibadət etdiyi) Beytülməmura;
5. And olsun yüksək tavana (uca göyə)
6. Və dolub daşan (alovlanan) dənizə ki,
7. Rəbbinin əzabı (Ya Peyğəmbər!) mütləq vaqe olacaqdır!
8. Onu heç kəs dəf edə bilməz!
9. O gün göy hərəkətə gəlib fırlanacaq (çalxalanacaq),
10. Dağlar yerindən qopub (havada toz kimi) oynayacaqdır.
11. O gün vay (peyğəmbərləri) yalançı hesab edənlərin halına!
12. O kəslər ki, (dünyada) yalana qurşanıb qəflət içində oynayarlar.
13. O gün onlar zorla cəhənnəm oduna sürüklənəcəklər.
14. (Onlara belə deyiləcəkdir: ) “Bu sizin (dünyada) yalan hesab etdiyiniz cəhənnəm odudur!
15. (Vəhyə, Qurana sehr dediyiniz kimi) bu da sehrdir, yoxsa (gözünüz qapanıb onun həqiqət olduğunu) görmürsünüz?
16. Yanın orada! İstər dözün, istər yox; sizin üçün eynidir (həmişəlik Cəhənnəmdə qalacaqsınız). Siz ancaq etdiyiniz əməllərin cəzasını çəkəcəksiniz!”
17. Müttəqilər isə, şübhəsiz ki, cənnətlər və nemətlər içində olacaqlar.

18. Rəbbinin onlara əta etdiyi nemətlərdən zövq (ləzzət) alacaqlar. Rəbbi onları cəhənnəm əzabından qorumuşdur.

19. (Onlara belə deyiləcəkdir: ) "(Dünyada) etdiyiniz yaxşı əməllərin müqabilində nuşcanlıqla yeyin-için;

20. Səf-səf düzülmüş taxtlara söykəndiyiniz halda!" Biz onları iri (ahu) gözlü hurilərlə evləndirəcəyik.

21. İman gətirib övladları imanla arxalarınca gedənlərin nəsillərini də (Cənnətdə) özlərinə qoşacağıq. Onların əməllərindən heç bir şey əskiltməyəcəyik. Hər kəs öz əməlinin girovudur!

22. Onları istədikləri meyvə və ətlə (bol-bol) təmin edəcəyik.

23. Onlar orada bir-birinə (şərab dolu) qədəh ötürəcəklər. Onda (cənnət şərabının xislətində dünyakından fərqli olaraq) nə lağlağılıq, nə də günaha təhrik vardır.

24. Onların ətrafında (xidmət üçün) özlərinə məxsus olan, sədəf içində gizlənmiş inci kimi gözəl oğlanlar dolanacaqlar.

25. Onlar (dünyada gördükləri işlər barəsində) bir-birindən hal-əhval tutmağa başlayacaqlar.

26. Və (söhbət əsnasında) belə deyəcəklər: "Biz bundan əvvəl (dünyada) ailəmiz içində olarkən (Rəbbimizin əzabından) qorxardıq.

27. Artıq Allah bizə mərhəmət buyurub (minnət qoyub) bizi cəhənnəm (səmum) əzabından qorudu.

28. Biz bundan əvvəl (dünyada) Ona ibadət edirdik. Şübhəsiz ki, O, (vədinə sadiq) kərəm sahibidir, rəhm edəndir!"

29. Elə isə (ya Peyğəmbər! Sən müşriklərə) öyüd-nəsihət ver. Sən öz Rəbbinin neməti (nübüvvət və islam dini) sayəsində nə kahinsən, nə də divanə!

30. Yoxsa onlar (sənin barəndə): “(O) şairdir. Biz (ruzigarın gərdişi nəticəsində) onun başına gələcək müsibəti (ölüb getməsini) gözləyirik!” – deyirlər.

31. De: “Gözləyin, mən də sizinlə birlikdə (sizin başınıza gələcək müsibəti) gözləyənlərdənəm!”

32. Yoxsa onların puç ağılları bunu (bu cür batil sözləri deməyi) onlara əmr edir? Xeyr, onlar azğın bir qövmdürlər.

33. Yoxsa onlar: “Onu (Quranı) özündən uydurdun!” - deyirlər. Xeyr, onlar (həsədləri, təkəbbürləri və inadları üzündən) iman gətirmirlər.

34. Əgər doğru deyirlərsə, qoy onlar bunun (bu Quran) kimi bir kəlam gətirsinlər!

35. Yoxsa onlar heç bir şeydən (xaliqsiz) yarandılar?! Yaxud onlar (öz-özlərini) yaradanlardır?!

36. Yoxsa göyləri və yeri yaratdılar?! Xeyr, onlar (Allaha) ürəkdən inanmırlar!

37. Yoxsa (ya Peyğəmbər) sənin Rəbbinin xəzinələri onlardadır?! Yaxud (hər şeyə) onlar hakimdirlər?!

38. Yoxsa onların üstünə çıxıb (vəhyi) dinlədikləri bir nərdivanı vardır?! Elə isə qoy onların (vəhyi) dinləyənləri açıq-aşkar bir dəlil gətirsinlər!

39. Yoxsa qızlar Onun (Allahın), oğlanlar isə sizindir?!

40. Yoxsa (ya Peyğəmbər! Risaləti təbliğ etdiyinə görə) sən onlardan bir ücrət (mükafat) istəyirsən və onlar ağır borc yükü altındadırlar?!

41. Yoxsa onlar qeybi bilir və (orada olanı) yazırlar?! (Qiyamətin, axirət həyatının olmadığını oradan öyrənib Muhəmməd əleyhissəlamla mübahisə edirlər?)

42. Yoxsa (ya Peyğəmbər! Sənə qarşı) bir tələ qurmaq istəyirlər? Amma kafirlər özləri o tələyə düşəcəklər!

43. Yoxsa onların Allahdan başqa bir tanrısı vardır? Allah bunların Ona qoşduqları şəriklərdən tamamilə uzaqdır!

44. Əgər onlar göyün bir parçasının (başlarına) düşdüyünü görsələr: "Bulud topasıdır!" – deyərlər (özlərinə əzab gəldiyinə inanmazlar).

45. Elə isə (dəhşətdən) sarsılıb karıxacaqları günə qovuşana qədər sən onları tərk et!

46. O gün hiylələri onlara heç bir fayda verməyəcəkdir (Allahın əzabını onlardan dəf edə bilməyəcək) və onlara heç bir kömək olunmayacaqdır.

47. Şübhəsiz ki, zalımları (kafirləri) hələ bundan başqa da (dünyada və qəbir evində) əzab gözləyir. Lakin onların əksəriyyəti (bunu) bilməz!

48. (Ya Peyğəmbər!) Sən öz Rəbinin hökmünə səbr et! Şübhəsiz ki, sən Bizim gözümüzün qabağındasan (himayəmiz altındasan). (Namaza) qalxdıqda Rəbbini həmd-səna ilə zikr et!

49. Gecənin bir vaxtında nə ulduzlar batandan sonra (dan yeri söküləndə, yaxud sübh çağı) da Allahı təqdis edib şəninə təriflər de! (Gün ərzində vacib və əlavə namazları qıl!)

## .53.
## ən-Nəcm (Ulduz) surəsi

**(Məkkədə nazil olmuşdur, 62 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Batmaqda olan ulduza (Sürəyya ulduzuna) and olsun ki,
2. Sizin yoldaşınız (Muhəmməd əleyhissəlam) nə haqq yoldan sapmış, nə də azmışdır!
3. O, kefi istəyəni (havadan) danışmır.
4. Bu, ancaq (Allah dərgahından) nazil olan bir vəhydir.
5. Onu (Muhəmməd əleyhissəlama) çox qüvvətli olan (Cəbrail) öyrətdi.
6. O qüvvət (ağıl və gözəllik) sahibi (Peyğəmbər əleyhissəlama öz həqiqi şəklində) göründü.
7. O (Cəbrail) ən uca üfüqdə (günəşin çıxdığı yerdə) idi.
8. Sonra (Cəbrail Muhəmməd əleyhissəlama) yaxınlaşdı və aşağı endi.
9. (Onların arasındakı məsafə) iki yay uzunluğunda, bəlkə, ondan da yaxın oldu.
10. Sonra (Cəbrail Allahın Öz) bəndəsinə (Mühəmmədə) vəhy buyurduğunu vəhy etdi.
11. Qəlb (Peyğəmbərin qəlbi) gördüyünü yalan saymadı. (Muhəmməd əleyhissəlam gözü ilə gördüyünün Cəbrail olduğuna qəlbdən inandı).
12. Siz onunla gördüyü barəsində mübahisəmi edirsiniz?
13. And olsun ki, (Muhəmməd əleyhiissəlam Cəbraili öz həqiqi surətində) başqa bir dəfə də (merac vaxtı) görmüşdü;
14. (Yeddinci göydəki) Sidrətül-müntəhanın yanında.

15. (Mələklər, şəhidlər və müttəqilər məskəni olan) Məva cənnəti onun yanındadır.

16. O zaman Sidrəni nələr bürümüşdü, nələr!

17. Göz nə (sağa-sola) yayındı, nə də uzağa getdi (hər şeyi olduğu kimi gördü).

18. And olsun ki, (Peyğəmbər) öz Rəbbinin ən böyük qüdrət nişanələrindən (möcüzələrindən) bir qismini (Beytül-məmuru, Sidrətül-müntəhanı, Cənnəti, Cəhənnəmi, Rəfrəfi, altı yüz qanadı olan Cəbrailin həqiqi surətini və i. a.) gördü.

19. (Ey müşriklər!) Bir deyin görək (sizin ibadət etdiyiniz) Lat və Uzza nəyə qadirdirlər?!

20. Digər üçüncü (büt) olan Mənat da həmçinin?!

21. Məgər oğlanlar sizin, (bəyənmədiyiniz) qızlar Onundurmu?! (Allahındırmı)?!

22. Elə isə bu ədalətsiz bölgüdür!

23. Onlar (bütlər) sizin atalarınızın (özlərindən uydurub) qoyduqları adlardan başqa heç bir şey deyildir! (Onların yalnız quru adı var, heç bir şeyə qadir deyillər). Allah onlara (ibadət edilməsinə) dair heç bir dəlil endirməmişdir. Onlar (müşriklər) yalnız zənnə və nəfslərindən gələn istəklərə uyarlar. Halbuki Rəbbindən onlara haqq yolu göstərən rəhbər (Quran və Peyğəmbər) gəlmişdir.

24. Yoxsa insan istədiyi hər şeyə nail ola bilər?! (Xeyr, bu mümkün deyildir. Müşriklərin çox istəməsinə baxmayaraq, bütlər onlar üçün Allah dərgahında heç bir şəfaət edə bilməzlər).

25. Axirətdə, dünya da ancaq Allahındır!

26. Göylərdə neçə-neçə mələklər vardır ki, onların şəfaəti heç bir fayda verməz. Ancaq Allah Öz istədiyi və razı olduğu kimsəyə (mələyə, yaxud möminə) izin verdikdən sonra (onun şəfaəti fayda verər).

27. Həqiqətən, axirətə inanmayanlar mələklərə (onların Allahın qızları olduğunu iddia edərək) qadın adları verirlər.

28. Onlar buna dair heç bir şey bilmir, yalnız zənnə qapılırlar. Zənn isə əsla həqiqət ola bilməz!

29. Artıq (ya Peyğəmbər!) Bizim Quranımızdan üz çevirib dünya həyatından başqa bir şey istəməyənlərdən üz döndər!

30. Onların bildiyi elə bu qədərdir. Şübhəsiz ki, sənin Rəbbin haqq yoldan azanı da, doğru yolda olanı da ən gözəl tanıyandır!

31. Göylərdə və yerdə nə varsa, (hamısı) Allahındır. O, pislik edənlərə əməllərinin cəzasını verəcək, yaxşılıq edənləri isə ən gözəl mükafatla mükafatlandıracaqdır!

32. (O yaxşılıq edənlər ki) kiçik günahlar (xətalar) istisna olmaqla, böyük günahlardan və rəzil işlərdən (zinadan) çəkinərlər. Həqiqətən, sənin Rəbbin çox bağışlayandır. Sizi torpaqdan yaradan da, siz analarınızın bətnlərində rüşeym halında olanda da sizi ən gözəl tanıyan Odur. Özünüzü təmizə çıxartmayın. O, Allahdan qorxub pis əməllərdən çəkinənin kim olduğunu ən gözəl biləndir!

33. (Ya Peyğəmbər!) İndi gördünmü (imandan) dönəni,

34. Bir az (pul, mal) verib (qalanına) xəsislik göstərəni?

35. Məgər o, qeybi bilirmi ki, (öz dostunun əzabına yüklənə biləcəyini) görsün?! (Müşriklərdən Vəlid ibn Müğirə islama meyl göstərmişdi. Bunu eşidən digər bir müşrik onu babalarının dinindən üz döndərməkdə ittiham edərək möhkəm danlamış və demişdi ki,

əgər Müğirə ona müəyyən məbləğ pul, mal versə və islamı atıb öz dininə qayıtsa, o, axirətdə Müğirənin əzabını öz üzərinə götürəcəkdir. Müğirə islamdan üz döndərmiş, lakin xəsislik göstərib həmin şəxsə vəd etdiyi məbləğin hamısını deyil, bir qismini vermişdi).

36. Yoxsa ona Musanın səhifələrindən olanlar xəbər verilmədi?!

37. Və (əhdə) çox vəfalı olan (Allahın qarşısındakı borcunu layiqincə ödəyən) İbrahimin (sühüfündəkilər bildirilmədi?!)

38. (Tövratda və İbrahimin səhifələrində deyilənlər bunlardır: ) “Heç bir günahkar başqasının günahına yüklənməz!

39. İnsana ancaq öz zəhməti (səyi, çalışması, əməli) qalar!

40. Şübhəsiz ki, (qiyamət günü) onun zəhməti (səyi, əməli) görünəcəkdir!

41. Sonra da ona (zəhmətinin, əməlinin) tam əvəzi veriləcəkdir!”

42. Həqiqətən, axır dönüş sənin Rəbbinədir!

43. Güldürən də, ağladan da Odur!

44. Öldürən də, dirildən də Odur!

45. (İnsanlardan və heyvanlardan ibarət) iki cifti (hər bir cütü) erkək və dişi olaraq yaradan Odur –

46. (Bir qətrə) nütfədən (o, ata belindən analığa) axıb tökülərkən.

47. (Ölüləri) yenidən diriltmək də Ona aiddir!

48. (İstədiyini) dövlətli də edən, kasıb da edən Odur!

49. Şiranın (Şira ulduzunun) da Rəbbi Odur!

50. Əvvəlki (ilkin) Adı (Ad qövmünü) O məhv etdi.

51. Səmudu da həmçinin! Və (onlardan heç kəsi sağ) buraxmadı.

52. Daha əvvəl Nuh qövmünü (məhv etdi), çünki onlar daha zalım, daha azğın kimsələr idi.

53. (Lut qövmünün yurdu) Mötəfikənin də altını üstünə O çevirdi (qaldırıb yerə vurdu).

54. Onları nələr sardı, nələr! (Başlarına nə müsibətlər gəldi!)

55. (Ey insan!) Sən öz Rəbbinin hansı nemətlərinə şəkk edirsən?!

56. Bu (Muhəmməd əleyhissəlam) da əvvəlki peyğəmbərlər kimi (insanları Allahın əzabı ilə) qorxudan bir peyğəmbərdir!

57. (Ey insanlar!) Yaxınlaşam (qiyamət) yaxınlaşdı.

58. Onu Allahdan başqa heç kəs dəf edə bilməz! (Və ya: onun dəqiq vaxtını Allahdan başqa heç kəs bilməz!)

59. İndi siz bu kəlama (Qurana) təəccübmü edirsiniz?

60. Həm də gülürsünüz, heç ağlamırsınız!

61. Siz (qəflət içində) oynayır-əylənirsiniz (ona etina etmirsiniz).

62. (Ey insanlar!) Gəlin Allaha səcdə edin, (Allaha) ibadət edin! (Ondan başqasına itaət etməyin!)

## .54.
## əl-Qəmər (Ay) surəsi

**(Məkkədə nazil olmuşdur, 55 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. O saat (qiyamət) yaxınlaşdı və ay (Peyğəmbərin möcüzəsi ilə) parçalandı.

2. Əgər müşriklər (Muhəmməd əleyhissəlamın peyğəmbərliyinin həqiqiliyini təsdiq edən) bir möcüzə görsələr, (imandan) üz döndərib: "(Bu, uzun müddət) davam edən bir sehrdir!" – deyərlər.
3. Onlar (ayın parçalanmasını, digər möcüzələri və Peyğəmbər əleyhissəlamı) təkzib etdilər və öz nəfslərinin istəklərinə uydular. Halbuki hər bir iş qərarlaşdırılmışdır! (Əzəldən müəyyən edilmiş hər bir iş, o cümlədən islam dini və Muhəmməd əleyhissəlamın peyğəmbərliyi bərqərar olacaqdır!)
4. And olsun ki, onlara (pis əməllərdən) çəkindirən neçə-neçə xəbərlər gəlmişdir.
5. (Bu Quran) olduqca böyük hikmətdir. Lakin (inanmayanlara, qəlbləri möhürlənənlərə oradakı) qorxutmalar (öyüd-nəsihət) heç bir fayda verməz!
6. Artıq (ya Peyğəmbər!) sən onlardan üz çevir. Carçının (İsrafilin) onları olduqca pis (dəhşətli) bir şeyə (məhşərə) çağıracağı günədək!
7. Onlar (o gün) gözlərini zəlilanə aşağı tikib (ətrafa) səpələnmiş çəyirtkələr kimi qəbirlərindən çıxacaqlar.
8. Kafirlər (boyunlarını qabağa uzadıb) carçıya tərəf tələsərək: "Bu nə çətin bir gündür!" – deyəcəklər.
9. Bunlardan (Məkkə müşriklərindən) əvvəl Nuh qövmü (öz peyğəmbərini) təkzib etmiş və bəndəmizi (Nuhu) yalançı sayıb: "(Bu) divanədir!" – demişdilər. Ona (risaləti təbliğ etmək) qadağan edilmişdi.
10. (Nuh) Rəbbinə dua edib: "Mən (öz qövmümüm içində) məğlub oldum, buna görə də (onlardan) intiqam al!" – dedi.
11. Biz (onun duasını qəbul edərək) göyün qapılarını sel kimi axan bir yağışla açdıq.

12. Yeri yarıb (oradan) bulaqlar qaynatdıq. Nəhayət, (göydən axan və yerdən qaynayan) sular (lövhi-məhfuzda) əzəldən müəyyən edilmiş bir iş üçün (tufan məqsədilə) bir-birinə qovuşdu.

13. Biz Nuhu (ona iman gətirənlərlə birlikdə) taxtadan düzəlmiş və mismarlanmış gəmiyə mindirdik.

14. (Qövmü tərəfindən) inkar edilmiş kimsəyə (Nuha) mükafat olaraq verilən (gəmi) gözümüzün qabağında (nəzarətimiz altında) üzüb gedirdi.

15. And olsun ki, Biz onu (tufan hadisəsini, yaxud Nuh qövmünün başına gələnləri sonrakı nəsillərə) ibrət üçün saxladıq. Amma heç bir ibrət alan (öyüd-nəsihət qəbul edən) varmı?!

16. Bir (görəydiniz) Mənim əzabım və qorxutmağım necə oldu!

17. And olsun ki, Biz Quranı (ondan) ibrət almaq (öyüd-nəsihət qəbul etmək) üçün belə asanlaşdırdıq. Amma heç bir ibrət alan (öyüd-nəsihət qəbul edən) varmı?!

18. Ad (qövmü də öz peyğəmbərinə) təkzib etmişdi. (Bir görəydiniz) Mənim əzabım və qorxutmağım necə oldu!

19. Biz (əzabı) uzun sürən nəhs bir gündə onların üstünə uğultulu (çox soyuq) bir külək göndərdik.

20. O, adamları kökündən qopmuş xurma kötükləri kimi (yerindən) qopardıb atırdı.

21. (Bir görəydiniz) Mənim əzabım və qorxutmağım necə oldu!

22. And olsun ki, Biz Quranı (ondan) ibrət almaq (öyüd-nəsihət qəbul etmək) üçün belə asanlaşdırdıq. Amma heç bir ibrət alan (öyüd-nəsihət qəbul edən) varmı?!

23. Səmud (qövmü də Saleh peyğəmbərin onlara etdiyi) təhdidləri (xəbərdarlıqları) yalan saymışdı.

24. Onlar demişdilər: “Məgər biz özümüzdən olan (adi) bir adamamı tabe olacağıq?! Biz onda haqq yoldan azmış və dəlilik etmiş olarıq!

25. Məgər içərimizdən vəhy yalnız onamı nazil olmuşdur?! Xeyr, o, yalançının, lovğanın biridir!”

26. (Biz Saleh peyğəmbərə təsəlli verib dedik:) “Onlara kimin yalançı, kimin lovğa olduğunu sabah mütləq biləcəklər!

27. Biz onları imtahana çəkmək üçün bir dişi (maya) dəvə göndərəcəyik. Onların nə edəcəyini gözlə və (əziyyətlərinə də) döz!

28. Və onlara suyun (dəvə ilə) onlar arasında bölüşdürüldüyünü xəbər ver! (Suyu bir gün onlar, bir gün də dəvə içəcəkdir). Hərə öz növbəsində hazır olsun!”

29. Nəhayət, onlar öz yoldaşlarını (Qudar ibn Salifi) çağırdılar. O da (dəvəni) tutub kəsdi.

30. (Bir görəydiniz) Mənim əzabım və qorxutmağım necə oldu!

31. Biz onlara bircə dəhşətli (tükürpədici) səs (Cəbrailin qışqırtısını) göndərdik, dərhal (heyvanlar üçün) ağıl düzəldənin istifadə etdiyi quru ota (həşəmə) döndülər.

32. And olsun ki, Biz Quranı (ondan) ibrət almaq (öyüd-nəsihət qəbul etmək) üçün belə asanlaşdırdıq. Amma heç bir ibrət alan (öyüd-nəsihət qəbul edən) varmı?!

33. Lut qövmü də (peyğəmbərlərinin onlara etdiyi) təhdidləri (xəbərdarlıqları) yalan saymışdı.

34. Biz də onların üstünə daş yağdıran yel göndərdik (başlarına daş yağdırdıq), yalnız Lutun ailəsini səhər çağı xilas etdik;

35. Dərgahımızdan bir lütf olaraq! Biz (nemətimizə) şükür edəni belə mükafatlandırırıq!

36. And olsun ki, (Lut) onları Bizim əzabımızla qorxutmuş, onlar isə bu təhdidlərə (xəbərdarlıqlara) şübhə edib inanmamışdılar.

37. Cəlalıma and olsun ki, onlar (Lutdan) öz qonaqlarını (mələkləri) onlara təslim etməyi tələb etmişdilər. Biz də onları kor etdik (və) "İndi əzabımı və təhdidlərimi dadın!" - (dedik).

38. And olsun ki, səhər tezdən onları əbədi (qiyamətədək onlardan əl çəkməyən) bir əzab yaxaladı (məhv olub həmişəlik Cəhənnəmə vasil oldular).

39. (Onlara: ) "İndi əzabımı və təhdidlərimi dadın!" (dedik).

40. And olsun ki, Biz Quranı (ondan) ibrət almaq (öyüd-nəsihət qəbul etmək) üçün belə asanlaşdırdıq. Amma heç bir ibrət alan (öyüd-nəsihət qəbul edən) varmı?!

41. And olsun ki, Bizim təhdidlərimiz (xəbərdarlıqlarımız Musa vasitəsilə) Firon əhlinə də gəlib çatmışdı.

42. Onlar ayələrimizin (möcüzələrimizin) hamısını yalan hesab etdilər. Biz də onları yenilməz qüvvət, qarşısıalınmaz intiqam sahibinə yaraşan bir əzabla yaxaladıq.

43. (Ey Qüreyş əhli!) Sizin kafirlərin onlardan nəyi yaxşıdır?! Yoxsa (əvvəlki ilahi) kitablarda sizin üçün bəraət (əzabdan qurtuluş hökmü) vardır?!

44. Yoxsa onlar: "Biz (Muhəmməd və möminlərdən) intiqam ala biləcək bir zümrəyik!" – deyirlər?

45. (Bədr vuruşunda) bu dəstə mütləq məğlub olacaq və arxa çevirib qaçacaqdır!

46. Xeyr, onların əsl əzab vaxtı qiyamət günüdür. Qiyamət gününün əzabı daha acıdır (daha şiddətlidir).

47. Şübhəsiz ki, günahkarlar (dünyada) haqq yoldan azmışlar və (axirətdə də) cəhənnəm odu içərisində olacaqlar. (Yaxud günahkarlar heyrət, yanlışlıq və dəlilik içindədirlər).

48. O gün onlar üzüstə Cəhənnəmə sürüklənəcək (və onlara): “Duyun Cəhənnəmin (ələmini) təmasını!” (deyiləcəkdir).

49. Şübhəsiz ki, Biz hər şeyi müəyyən ölçüdə (lazım olduğu qədər) yaratdıq.

50. Bizim buyurduğumuz bir göz qırpımında yerinə yetər! (Hər hansı bir şeyi yaratmaq istədikdə ona bircə dəfə: “Ol !” – deyərik, o da dərhal olar!)

51. And olsun ki, Biz sizin kimiləri (çox) məhv etmişik. Amma heç bir ibrət alan (öyüd-nəsihət qəbul edən) varmı?!

52. Onların etdiyi hər şey (əməllərinin yazıldığı) dəftərlərdədir!

53. Hər bir kiçik və böyük (günah lövhi-məhfuzda) yazılmışdır!

54. Şübhəsiz ki, müttəqilər (axirətdə) cənnət bağlarında və çaylar kənarında,

55. (Heç bir yersiz söhbətə və günaha təhrik olunmayan) haqq məclisində, qadir hökmdarın (Allahın) hüzurunda olacaqlar!

## .55.
## ər-Rəhman (Rəhmli olan Allah) surəsi

**(Məkkədə nazil olmuşdur, 78 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Rəhman! (Mərhəmətli olan Allah!)
2. (Öz peyğəmbərinə) Quranı öyrətdi.
3. İnsanı yaratdı.
4. Ona danışmağı (fikrini və duyğularını bəyan etməyi) öyrətdi.
5. Günəş və ay müəyyən bir ölçü ilə (hərəkət edər).
6. Otlar da, ağaclar da (Allaha) səcdə edər!
7. Göyü. O ucaltdı, tərəzini (ədalət tərəzisini) O qoydu!
8. Ona görə ki, çəkidə həddi aşmayasınız (insafı əldən verməyəsiniz).
9. Tərəzini düz tutun, çəkini əskiltməyin! (Çəkidə insaflı olun, tərəzini korlamayın!)
10. Yeri də (bütün) məxluqat üçün O döşədi.
11. Orada növbənöv meyvələr və tumurcuqlu (salxımlı) xurma ağacları;
12. (Yaşıl ikən yarpaq, quruluğunda saman olan) saçaqlı dənli bitkilər və xoş ətirli çiçəklər (reyhan, qızılgül, yasəmən, bənövşə, qərənfil və s.) vardır.
13. (Ey cinlər, ey insanlar!) Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!
14. İnsanı (Adəmi) saxsı kimi (toxunduqda səs çıxardan) quru palçıqdan O yaratdı.
15. (Cinlərin əcdadı) cannı da tüstüsüz (təmiz) oddan O xəlq etdi.

16. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

17. İki məşriqin və iki məğribin Rəbbi (günəşin və ayın yazda və qışda çıxıb batdığı yerlərin sahibi) Odur.

18. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

19. (Suları şirin və acı olan) iki dənizi O qovuşdurdu (bir-birinə qovuşmaq üçün açıb buraxdı).

20. Amma onların arasında maneə vardır, bir-birinə qatışmazlar (özləri üçün müəyyən edilmiş həddi aşmazlar).

21. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

22. Onlardan (o iki dənizdən) inci və mərcan çıxar.

23. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

24. Dənizdə uca dağlar kimi üzən gəmilər də Onundur.

25. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

26. (Yer) üzündə olan hər kəs fanidir (ölümə məhkumdur).

27. Ancaq əzəmət və kərəm sahibi olan Rəbbinin zatı baqidir.

28. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

29. Göylərdə və yerdə kim varsa, (hamısı) Ondan (ruzi, mərhəmət və mədəd) diləyər. O hər gün (hər an) bir işdədir (birini öldürər, birini dirildər; acizə kömək, zalıma zülm edər; birinin duasını qəbul

edər; birinə mərhəmət əta edib digərinə cəza verər. Bir işlə məşğul olmaq Onu digərindən yayındırmaz).

30. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

31. Ey ağır yük (mükəlləfiyyət) altında olanlar (yaxud yerə ağırlıq verən cinlər və insanlar)! Sizinlə də (layiqincə) məşğul olacağıq (əməllərinizin haqq-hesabını mütləq çəkəcəyik).

32. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

33. Ey cin və insan tayfası! Əgər göylərin və yerin ətrafından (çevrəsindən) kənara çıxa bilərsinizsə, çıxın. Siz (oradan) ancaq (qüdrət və) qüvvətlə (Allahın sizə bəxş etdiyi elmin qüdrətilə) çıxa bilərsiniz! (Yaxud siz oradan qüdrət və qüvvət vasitəsilə çıxa bilərsiniz ki, bu da sizdə yoxdur!)

34. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

35. (Qiyamət günü) sizin üstünüzə tüstüsüz alov və alovsuz tüstü göndəriləcək (başınıza ərimiş mis, od və duman töküləcək) və siz bir-birinizə kömək də edə bilməyəcəksiniz.

36. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

37. (Qiyamət günü) göy ayrılıb (dağ basılmış) dəri (yaxud dağ edilmiş yağ) kimi qıpqırmızı olduğu zaman (halınız necə olacaq)?!

38. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

39. O gün nə bir insan, nə də bir cin günahı barəsində sorğu-sual olunmayacaqdır! (Yol ancaq Cəhənnəmdir!)

40. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

41. Günahkarlar üzlərindən (sifətlərinin qaralığından, gözlərinin göylüyündən) tanınacaq, kəkillərindən və ayaqlarından tutulub yaxalanacaqlar (başları öndən, yaxud arxadan ayaqlarına bənd ediləcəkdir).

42. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

43. (Onlara belə deyiləcəkdir: ) “Bu, günahkarların yalan hesab etdikləri Cəhənnəmdir!”

44. Onlar onunla (cəhənnəm odu ilə) qaynar su arasında dolanıb duracaqlar.

45. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

46. Şübhəsiz ki, Rəbbinin məqamından (hüzurunda haqq-hesab üçün durmaqdan) qorxanları iki cənnət (Ədn nə Nəim cənnətləri) gözləyir!

47. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

48. (O iki cənnətin ağacları) qollu-budaqlıdır (merli-meyvəlidir).

49. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

50. Orada (o cənnətlərdə) iki axar bulaq vardır.

51. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

52. Orada (o iki cənnətdə) hər meyvədən (quru və təzətər olmaqla) iki növ vardır (möminlər onların birini dünyada görmüş, digərini isə görməmişlər).

53. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

54. Onlar (möminlər) orada astarları qalın ipəkdən olan döşəklərə söykənmiş olacaqlar. O iki cənnətin meyvələrini dərmək də asan olacaqdır (möminlər harada olsalar, ağaclar onlara yaxın gələcək, onlar həmin meyvələri ayaq üstə olanda da, oturanda da, uzananda da dərib yeyə biləcəklər).

55. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

56. Orada (o cənnətlərdə) gözlərini (yalnız ərlərinə) dikmiş, bundan əvvəl özlərinə heç bir ins-cins (insan və cin) toxunmamış qadınlar vardır.

57. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

58. Onlar (o qadınlar rəng və gözəllikcə), sanki yaqut və mərcandırlar.

59. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

60. Yaxşılıq əvəzi ancaq yaxşılıqdır!

61. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

62. Onlardan (o iki cənnətdən) başqa (möminlər üçün) daha iki cənnət (Firdovs və Məva cənnətləri) vardır.

63. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

64. (O iki cənnət) yamyaşıldır (o qədər yaşıldır ki, qaraya çalır).

65. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

66. Orada (o iki cənnətdə) fəvvarə verib qaynayan iki bulaq vardır.

67. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

68. Orada (o iki cənnətdə) növbənöv meyvələr, xurma və nar vardır.

69. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

70. Orada (o cənnətlərin hamısında, dördündə də) xoş xasiyyətli, gözəl üzlü qadınlar vardır.

71. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

72. Çadırlarda gözlərini (yalnız öz ərlərinə) dikmiş hurilər vardır.

73. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

74. Onlara (ərlərindən) əvvəl heç bir ins-cins toxunmamışdır.

75. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

76. Onlar (möminlər) yaşıl balışlara və gözəl naxışlı (inci ilməli, xovlu) xalılara (yaxud yumşaq qalın döşəklərə) söykənmiş olacaqlar.

77. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!

78. (Ya Peyğəmbər!) Sənin əzəmət və kərəm sahibi olan Rəbbinin adı nə qədər ucadır (nə qədər uludur)!

## .56.
## əl-Vaqiə (Vaqiə) surəsi

**(Məkkədə nazil olmuşdur, 96 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Qiyamət vaqe olacağı (qopacağı) vaxt

2. Onun vaqe olmasını heç kəs təkzib edə (dana) bilməz!

3. O (kimini) alçaldacaq, (kimini də) ucaldacaqdır.

4. Yer hərəkətə gəlib şiddətlə titrədiyi,

5. Dağlar parça-parça olub ovxalandığı

6. Və toz kimi səpələndiyi zaman

7. Siz (ey insanlar!) üç zümrəyə ayrılacaqsınız:

8. Sağ tərəf sahibləri (əməl dəftərləri sağ əllərinə verilənlər). Kimdir o sağ tərəf sahibləri? (Nə uğurludur onlar!)

9. Sol tərəf sahibləri (əməl dəftərləri sol əllərinə verilənlər). Kimdir o sol tərəf sahibləri? (Nə uğursuzdur onlar!)

10. Və öndə olanlar. Onlar (dünyada Allah yolunda, imanda, əməldə, xeyirdə öndə olduqları kimi, axirətdə də) öndədirlər! (Nə xoşbəxtdir onlar!)

11. Onlar (Allah dərgahına, Allahın lütfünə) yaxınlaşdırılmış kimsələrdir.

12. Onlar Nəim cənnətlərində olacaqlar.

13. (Öndə olanların) çoxu əvvəlkilərdən (keçmiş peyğəmbərlərin ümmətlərindən),

14. Biz azı da axırıncılardandır (Muhəmməd əleyhissəlamın ümmətindəndir).

15. (Onlar qızıl-gümüş, ləl-cavahiratla) bəzənmiş taxtlar üstündə qərar tutacaq,

16. Onlara (o taxtlara) söykənib bir-biri ilə qarşı-qarşıya əyləşəcəklər.

17. Onların dövrəsində həmişəcavan xidmətçi oğlanlar dolanacaqlar;

18. (Cənnət bulağından axan) məin (şərab) dolu piyalələr, kuzələr və qədəhlərlə.

19. (Dünyadakı şərabdan fərqli olaraq) ondan başları ağrımaz və keflənməzlər.

20. (O cavan xidmətçilər Cənnətdə olanların) bəyənib seçdikləri meyvələr

21. Və istədikləri hər cür quş əti ilə (onların dövrəsində fırlanacaqlar).

22. (Onlar üçün orada) iri (ahu) gözlü, qəşəng hurilər də vardır.

23. (O hurilər rəng və gözəllikcə) sanki sədəf içində gizlənmiş (qorunub-saxlanmış) incidirlər.

24. Onlar (bu nemətlərə dünyada) etdikləri (yaxşı) əməllər müqabilində nail olacaqlar.

25. Onlar orada (Cənnətdə) nə boş söz, nə də günaha bais olan bir şey eşidəcəklər.

26. Eşitdikləri söz ancaq “salam” olacaqdır.

27. Sağ tərəf sahibləri! (Əməl dəftərləri sağ əllərində olanlar!) Kimdir o sağ tərəf sahibləri?

28. (Onlar) tikansız sidr ağacları,

29. Salxım-salxım sallanmış möüz (banan) ağacları altında;

30. Çəkilməyən (daimi) kölgəliklərdə;

31. Axar su kənarında;

32. Bol meyvələr –

33. Tükənməz və qadağan edilməyən (meyvələr) içində

34. Və (bir-birinin üstünə yığılmış) hündür döşəklər üstündə (yaxud yüksək əxlaq və qeyri-adi gözəllik sahibi olan qadınlar yanında) olacaqlar!

35. Şübhəsiz ki, Biz onları (huriləri) başqa cür (yeni bir yaradılışla, doğulmadan) yaradacağıq!

36. Onları bakirə qızlar,

37. Ərlərini sevən, həmyaşıdlar edəcəyik.

38. Sağ tərəf sahibləri (əməl dəftəri sağ əllərinə verilənlər) üçündür onlar!

39. (Onların) bir çoxu əvvəlkilərdən (keçmiş peyğəmbərlərin ümmətlərindən),

40. Bir çoxu da axırıncılardandır (bu ümmətdəndir).

41. Sol tərəf sahibləri! (Əməl dəftərləri sol əllərinə verilənlər!) Kimdir o sol tərəf sahibləri?

42. (Onlar) səmum yeli (qızmar atəş) və qaynar su içində,

43. Qapqara duman kölgəsində olacaqlar!

44. (O kölgə başqa kölgələrdən fərqli olaraq) nə sərin, nə də xoşagələndir.

45. Onlar bundan əvvəl (dünyada) naz-nemət içində idilər.

46. Özləri də böyük günah içində (Allaha şərik qoşmaqla) israr edib dururdular.

47. Və belə deyirdilər: "Əcaba, biz öldükdən, toz-torpaq və sür-sümük olduqdan sonra, həqiqətən, yenidən dirildiləcəyikmi?!

48. Yaxud bizdən əvvəl gəlib-getmiş atalarımız da dirildiləcəklərmi?!"

49. (Ya Peyğəmbər!) De: "(Sizdən) əvvəlkilər də, sonrakılar da,

50. Məlum bir günün (qiyamət gününün) müəyyən bir vaxtında mütləq (məhşərə) cəm ediləcəklər.

51. Sonra, siz ey (haqq) yoldan azanlar, (haqqı) dananlar!

52. Şübhəsiz ki, zəqqum ağacından (onun meyvəsindən) yeyəcəksiniz,

53. Qarınlarınızı onunla dolduracaqsınız.

54. Üstündən də (sizə bərk yanğı gəldiyi üçün) qaynar su içəcəksiniz.

55. Özü də onu susuzluq xəstəliyinə tutulmuş (dəvə) kimi içəcəksiniz.

56. Bu onların haqq-hesab günündəki ziyafətidir.

57. (Ey kafirlər!) Biz sizi (yoxdan) yaratdıq. Məgər (qiyamət günü yenidən dirildiləcəyinizi) təsdiq etməzmisiniz?

58. Bəs (bətnlərə) axıtdığınız nütfəyə nə deyirsiniz?

59. Ondan (insan) yaradan sizsiniz, yoxsa Biz?!

60. Sizin aranızda ölüm (kimin nə vaxt öləcəyini) əvvəlcədən Biz müəyyən etdik. Və Biz əsla aciz (önünə keçilməsi mümkün olan) deyilik,

61. (Sizi yox edib) yerinizə sizin kimiləri gətirməkdən (sizi başqaları ilə əvəz etməkdən) və sizi özünüz də bilmədiyiniz başqa bir şəkildə yaratmaqdan!

62. And olsun ki, siz ilk yaradılış (dünyaya necə gəldiyinizi) bilirsiniz. Elə isə (sizi yenidən diriltməyə qadir olduğumuz barədə) heç düşünmürsünüz?!

63. Bəs əkdiyiniz (toxuma) nə deyirsiniz?

64. Onu bitirən sizsiniz, yoxsa Biz?!

65. Əgər Biz istəsəydik, onu bir saman çöpünə döndərər, siz də mat-məəttəl qalıb:

66. “Biz ziyana uğramış,

67. Bəlkə, (hələ ruzidən də) məhrum olmuş kimsələrik!” (deyərdiniz).

68. Bəs içdiyiniz suya nə deyirsiniz?

69. Onu buluddan endirən sizsiniz, yoxsa Biz?!

70. Əgər istəsəydik, onu acı (bir su) edərdik. Elə isə niyə (Allahın nemətlərinə) şükür etmirsiniz?

71. Bəs (yaş ağacdan) yandırdığınız oda nə deyirsiniz?

72. Onun ağacını yaradan sizsiniz, yoxsa Biz?

73. Biz onu (sizi cəhənnəm odu ilə qorxutmaqdan ötrü) ibrət dərsi və səhrada olan müsafirlərin faydalanması üçün yaratdıq.

74. Belə olduqda (ya Peyğəmbər!) sən ulu olan Rəbbinin adını müqəddəs tutub zikr et!

75. Ulduzların (bürclərdəki) mənzillərinə (yaxud doğub-batdığı yerlərə) and olsun ki –

76. Kaş bunun nə qədər böyük bir and olduğunu biləydiniz –

77. (Sizə oxunan) bu (kəlam) çox qiymətli Qurandır.

78. (O, Allah dərgahında) qorunub saxlanılan bir Kitabdadır (lövhi-məhfuzdadır, yaxud lülələnib bükülmüş kağızlardadır).

79. Ona yalnız pak olanlar toxuna bilər!

80. (O) Aləmlərin Rəbbi tərəfindən nazil edilmişdir.

81. İndi siz bu kəlamı yalan sayırsınız? (Bu sözümə məhəl qoymursunuz?)

82. Ruzinizə şükür etməli olduğunuz halda, onu yalanmı hesab edirsiniz?

83. (Can) boğaza yetişdiyi (ölüm gəlib çatdığı) zaman

84. Siz (ona) baxıb durursunuz (əlinizdən heç bir şey gəlmir).

85. Biz ona sizdən daha yaxınıq, amma siz (bunu) görmürsünüz!

86. Əgər sizdən (dediyiniz kimi, qiyamət günü əməllərinizə görə) haqq-hesab çəkilməyəcəksə,

87. Və əgər ("öləndən sonra heç bir dirilmə, haqq-hesab yoxdur" sözünü) doğru deyirsinizsə, bəlkə, (o çıxan canı) geri (bədənə) qaytarasınız?!

88. Amma əgər (ölən kimsə Allah dərgahına, Allahın lütf və mərhəmətinə) yaxın olanlardandırsa,

89. (Onu) rəhmət, gözəl ruzi (yaxud xoş ətirli çiçəklər) və Nəim cənnəti gözləyir!

90. Əgər o, sağ tərəf sahiblərindəndirsə (əməl dəftəri sağ əlinə verilənlərdəndirsə),

91. (Ona özü kimi olan yoldaşlarının dili ilə: ) "Sağ tərəf sahiblərindən sənə salam olsun!" (deyiləcəkdir).

92. Əgər (ölən kimsə Allahın ayələrini, möcüzələrini) yalan sayanlardan və yoldan azanlardandırsa,

93. (Ona) qaynar su ziyafəti veriləcək

94. Və özü də Cəhənnəmə atılacaqdır.

95. Şübhəsiz ki, bu, təkzibolunmaz həqiqətdir!

96. Elə isə (ya Peyğəmbər!) sən ulu olan Rəbbinin adını təsbih (müqəddəs tutub zikr) et! (Və ya: Sən Rəbbini o böyük adı ilə təsbih et!)

## .57.
## əl-Hədid (Dəmir) surəsi
**(Mədinədə nazil olmuşdur, 29 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Göylərdə və yerdə nə varsa, (hamısı) Allahı təqdis edib şəninə tariflər deməkdədir. O, yenilməz qüvvət sahibi, hikmət sahibidir!

2. Göylərin və yerin hökmü Onun əlindədir. Dirildən də, öldürən də Odur. O, hər şeyə qadirdir!

3. Əvvəl də, axır da, zahir də, batin də Odur. O, hər şeyi biləndir! (Allah Öz əzəli elmi və qüdrəti ilə hər şeyi görüb bildiyi halda, Özü görünməz, dərkolunmazdır. Allahın varlığı aşkar, mahiyyəti isə tamamilə gizlidir).

4. Göyləri və yeri altı gündə xəlq edən, sonra ərşi yaradıb hökmü altına alan Odur. O, yerə girəni də, (yerdən) çıxanı da, göydən enəni də, (göyə) qalxanı da bilir. Siz harada olsanız, O sizinlədir. Allah sizin nə etdiklərinizi görəndir!

5. Göylərin və yerin hökmü Onun əlindədir. (Bütün) işlər (axırda) ancaq Allaha tərəf qaytarılacaqdır!

6. Gecəni gündüzə, gündüzü də gecəyə qatan Odur. O, ürəklərdə olanları biləndir!

7. (Ey insanlar!) Allaha və Peyğəmbərinə iman gətirin. Sizi varis etdiyi maldan (Onun yolunda) xərcləyin. Sizdən iman gətirib (mal-dövlətini Allah yolunda) sərf edənləri böyük bir mükafat gözləyir!

8. Peyğəmbər sizi Rəbbinizə iman gətirməyə çağırdığı halda, sizə nə olub ki, Allaha iman gətirmirsiniz? Hələ bundan da əvvəl (Allah sizi ulu babanız Adəmin belində, yaxud ruhlar aləmində olduğunuz zaman yalnız Ona iman gətirəcəyiniz barəsində) sizdən əhd almışdı. Əgər (əvvəl-axır) iman gətirəcəksinizsə, (elə indidən gətirin – bu sizin üçün daha yaxşıdır!)

9. Sizi zülmətlərdən nura (küfrdən imana) çıxartmaq üçün Öz bəndəsinə (Muhəmməd əleyhissəlama) açıq-aşkar ayələr nazil edən Odur. Allah sizə şəfqətlidir, mərhəmətlidir!

10. (Ey insanlar!) Sizə nə olub ki, (mal-dövlətinizi) Allah yolunda xərcləmirsiniz? Halbuki göylərin və yerin mirası (bütün sərvəti, eləcə də siz öləndən sonra qoyub gedəcəyiniz malın hamısı) ancaq Allahındır. Sizlərdən (mal-dövlətini) fəthdən (Məkkənin fəthindən) əvvəl (Allah yolunda) sərf edənlər və (müşriklərə qarşı) vuruşanlar (başqaları ilə) eyni deyillər. Onlar (mallarını Allah yolunda) fəthdən sonra sərf edib döyüşənlərdən dərəcə etibarilə daha üstündürlər. Bununla belə, Allah onların hamısına (həm birincilərə, həm də ikincilərə) ən gözəl mükafat (Cənnət) vəd buyurmuşdur. Allah sizin nə etdiklərinizdən xəbərdardır!

11. Kimdir o kəs ki, Allah yolunda könül xoşluğu ilə borc versin, O da onun əvəzini qat-qat (birə on, yaxud birə yeddi yüz) artırsın?! Onu həm də çox qiymətli bir mükafat (Cənnət) gözləyir!

12. O gün (qiyamət günü, ya Peyğəmbər!) mömin kişilərin və qadınların (səmimi etiqadları və dünyada etdikləri yaxşı əməllər müqabilində nail olduqları iman) nurunun onların önlərindən və sağ tərəflərindən axıb şölə saçdığını (qıl körpüsü üstündə onlara yol göstərdiyini) görəcəksən. (Mələklər onlara deyəcəklər: ) “Bu gün sizin müjdəniz (ağacları) altından çaylar axan cənnətlərdir. Siz orada əbədi qalacaqsınız!” Bu, böyük qurtuluşdur (uğurdur)!

13. O gün münafiq kişi və qadınlar iman gətirənlərə: “(Bizi bir az) gözləyin ki, nurunuzdan bir qədər işıq alaq!” – deyəcəklər. (Onlara istehza ilə) belə cavab veriləcəkdir: “Geriyə dönüb işıq axtarın!” (Bu sözlərdən sonra) onların (möminlərlə münafiqlərin) arasına qapısının içəri tərəfində mərhəmət və bayır tərəfində əzab olan bir sədd çəkiləcəkdir.

14. (Münafiqlər divarın içəri tərəfində olan möminləri) səsləyib deyəcəklər: “Məgər biz (dünyada) sizinlə birlikdə deyildikmi?!” (Möminlər) belə cavab verəcəklər: “Bəli (bizimlə birlikdə idiniz). Lakin siz özünüzü (nifaqla, ikiüzlülüklə) fitnəyə saldınız (fitnəyə salıb məhvə düçar etdiniz), siz (möminlərin başına bir fəlakət gəlməsini) gözləyirdiniz və (Allahın birliyinə, Muhəmməd əleyhissəlamın peyğəmbərliyinin həqiqiliyinə) şəkk edirdiniz. Allahın əmri (ölümünüz) gəlib çatanadək sizi xam xəyallar (tamah) aldatdı. Sizi Allah barəsində (Allah rəhmlidir, bütün günahlarınızdan keçər, sizə heç bir cəza verməz deyə) o tovlayan (Şeytan) tovladı!

15. (Ey münafiqlər!) Bu gün artıq nə sizdən, nə də kafirlərdən (günahlarınızın bağışlanması üçün) heç bir fidyə qəbul olunmaz. Məskəniniz Cəhənnəmdir. Sizə yaraşan odur. Ora necə də pis sığınacaqdır!”

16. İman gətirənlərin qəlblərinin Allahın zikri və haqdan nazil olan (Quran) üçün yumşalması vaxtı gəlib çatmadımı?! Onlar özlərindən əvvəl kitab verilən kimsələr (yəhudilər və xaçpərəstlər) kimi olmasınlar. Onlarla (öz peyğəmbərləri arasında) uzun bir müddət keçmiş və (öyüd-nəsihəti unutduqları üçün) qəlbləri sərtləşmişdir. Onların çoxu (Allaha asi olan) fasiqlərdir!

17. (Ey insanlar!) Bilin ki, Allah torpağa öldükdən sonra təzədən can verir. Biz ayələri sizə belə müfəssəl izah etdik ki, bəlkə, ağlınız başınıza gəlsin!

18. Şübhəsiz ki, sədəqə verən kişi və qadınlar, Allah yolunda gözəl (könül xoşluğu ilə) borc verənlər üçün (əməllərinin savabı) qat-qat artırılacaqdır. Onları həm də çox qiymətli bir mükafat (Cənnət) gözləyir!

19. Allaha və peyğəmbərinə iman gətirənlər – məhz onlar öz Rəbbi dərgahında olan siddiqlər (özündə-sözündə doğru olanlar) və şəhidlərdir. Onların (qiyamət günü) öz mükafatları və (qıl körpüsü üstündə onlara yol göstərəcək) öz nurları vardır. Kafir olub ayələrimizi yalan sayanlara gəldikdə isə, onlar cəhənnəmlikdirlər.

20. (Ey insanlar!) Bilin ki, dünya həyatı oyun-oyuncaq, bər-bəzək, bir-birinizin qarşısında öyünmək və mal-dövləti, oğul-uşağı çoxaltmaqdan ibarətdir. Bu elə bir yağışa bənzəyir ki, onun yetişdirdiyi bitki (məhsul) əkinçilərin xoşuna gələr. Sonra o quruyar və sən onun saralıb-solduğunu, daha sonra çör-çöpə döndüyünü görərsən. (Dünya malına aldananları) axirətdə şiddətli əzab, (dünya malına uymayanları isə) Allahdan bağışlanma və razılıq gözləyir. Dünya həyatı aldanışdan (yalandan) başqa bir şey deyildir.

21. (Ey insanlar!) Rəbbiniz tərəfindən bağışlanmağa və genişliyi yerlə göyün genişliyi qədər olan, Allaha və Onun peyğəmbərlərinə iman gətirənlərdən ötrü hazırlanmış Cənnətə nail olmaq üçün (yaxşı əməllər etməkdə) bir-birinizi ötüb keçməyə çalışın. Bu, Allahın dilədiyi kimsəyə əta etdiyi lütfdür (mərhəmətdir). Allah çox böyük lütf (mərhəmət) sahibidir!

22. Yer üzündə baş verən və sizin öz başınıza gələn elə bir müsibət yoxdur ki, Biz onu yaratmamışdan əvvəl o, bir kitabda (lövhi-məhfuzda) yazılmamış olsun. Bu, Allah üçün çox asandır!

23. Bu sizin əlinizdən çıxana kədərlənməməyiniz və sizə də verilənə sevinib qürrələnməməyiniz üçündür. Allah özünü bəyənən, (özü ilə) fəxr edən heç bir kəsi sevməz!

24. O kəslər ki, həm özləri xəsislik edər, həm də xalqa xəsis olmağı əmr edərlər. Kim (Allahın əmrlərindən, öyüd-nəsihətindən) üz döndərsə (ancaq özünə zərər edər). Həqiqətən, Allah ehtiyacsızdır, şükrə (və tərifə) layiqdir! (Onun bütün əməlləri bəyənilləndir!)

25. And olsun ki, Biz peyğəmbərlərimizi açıq-aşkar dəlillərlə (möcüzələrlə) göndərdik. Biz onlara birlikdə (Allahın hökmlərini bildirən səmavi) kitab və ədalət tərəzisi (şəriət) nazil etdik ki, insanlar (bir-biri ilə) ədalətlə rəftar etsinlər. Biz həddindən artıq möhkəm olan və insanlara fayda verən dəmiri də icad (nazil) etdik (mədənlərdən çıxartdıq) ki, Allah (Özünü) görmədən Ona (onun dininə) və peyğəmbərlərinə kömək göstərənləri (dəmirdən düzəlmiş silahlarla kafirlərə qarşı vuruşan mücahidləri) bəlli etsin. Həqiqətən, Allah yenilməz qüvvət sahibi, qüdrət sahibidir!

26. And olsun ki, Biz Nuhu və İbrahimi (peyğəmbər) göndərdik, peyğəmbərliyi və kitabı (Tövratı, Zəburu, İncili və Quranı) onların nəslinə verdik. Onlardan doğru yolda olan da vardır, çoxu isə (Allahın itaətindən çıxmış) fasiqlərdir!

27. Sonra onların ardınca (Musa, İlyas, Davud, Süleyman, Yunis və başqa) peyğəmbərlərimizi yolladıq. (Onlardan sonra) Məryəm oğlu İsanı göndərib ona İncil verdik. Onun ardınca gedənlərin qəlblərində bir-birinə şəfqət, mərhəmət oyatdıq. Onlar özlərindən rahiblik (tərki-dünyalıq) icad etdilər. Biz onu (rahibliyi) onlara vacib buyurmamışdıq. Onlar bunu Allah rizasını qazanmaq üçün etdilər, lakin ona layiqincə əməl (riayət) etmədilər (İncili təhrif edib İsanı Allah bildilər, Muhəmməd əleyhissəlamın peyğəmbərliyini dandılar). Biz onlardan iman gətirənlərin mükafatlarını verdik. Onların çoxu isə (Allaha asi olan) fasiqlərdir.

28. Ey iman gətirənlər! Allahdan qorxun və Onun peyğəmbərinə iman gətirin ki, (Allah) sizə Öz mərhəmətindən iki pay versin, sizə

(qıl körpüsü üstündə) getməyiniz üçün nur bəxş etsin və sizi bağışlasın. Allah bağışlayandır, rəhm edəndir!

29. (Muhəmməd əleyhissəlama iman gətirməyən) kitab əhli bilsin ki, onlar Allahın lütfünə (mərhəmətinə, dilədiyi kimsəyə peyğəmbərlik əta etməsinə) heç bir vəchlə mane ola bilməzlər. Şübhəsiz ki, lütf (mərhəmət, nemət) Allahın əlindədir, onu istədiyinə bəxş edər. Allah çox böyük lütf (kərəm) sahibidir! [Və ya: kitab əhli Allahın lütfündən heç bir şeyə nail olmayacaqlarını, həqiqətən, lütfün (mərhəmətin) Allahın əlində olduğunu, Allahın da onu istədiyi kimsəyə bəxş etdiyini bilmədikləri üçünmü küfrdə israr edib dururlar? Halbuki bunu çox əla bilirlər].

## .58.
## əl-Mücadələ (Mücadilə) surəsi

**(Mədinədə nazil olmuşdur, 22 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Ya Peyğəmbər!) Əri barəsində səninlə mübahisə edən və Allaha şikayət edən qadının sözünü Allah eşitdi. Allah sizin danışığınızı eşidir. Həqiqətən, Allah (hər şeyi) eşidəndir, (hər şeyi) görəndir!

2. Sizdən öz qadınları ilə zihar edən kimsələrin zövcələri (əslində) onların anaları deyillər. Onların anaları ancaq özlərini doğan qadınlardır. Onlar, əlbəttə, pis və yalan söz danışırlar. Şübhəsiz ki, Allah əfv edəndir, bağışlayandır.

3. Qadınları ilə zihar (qanuni nikahlarını özlərinə haram) edib, sonra sözlərindən dönənlər onlarla yaxınlıq etməzdən əvvəl (kəffarə vermək üçün) bir kölə azad etməlidirlər. Bu sizə (zihar barəsində) verilən öyüddür. Allah nə etdiklərinizdən xəbərdardır!

4. Kim (azad etməyə bir kölə) tapmasa, qadını ilə yaxınlıq etməzdən əvvəl iki ay sərasər oruc tutmalı, buna da gücü çatmasa, altmış yoxsulu yedirdib doydurmalıdır. Bu sizin Allah və Onun Peyğəmbərinə iman gətirməniz üçündür. Bunlar Allahın hədləridir (onları aşmaq olmaz). Kafirləri şiddətli bir əzab gözləyir!

5. Allah və Onun Peyğəmbəri əleyhinə çıxanlar, özlərindən əvvəlkilər nə cür rüsvay olmuşlarsa, o cür rüsvay olacaqlar. Biz artıq (Muhəmməd əleyhissəlamın haqlı olmasını sübut edən) açıq-aşkar ayələr nazil etdik. Kafirləri alçaldıcı bir əzab gözləyir!

6. Allah onların hamısını dirildəcəyi gün etdikləri əməlləri onlara xəbər verəcəkdir. Allah (onların əməllərini bir-bir) sayıb yazmış, onlar isə (etdiklərini) unutmuşlar. Allah hər bir şeyə şahiddir!

7. (Ya Peyğəmbər!) Məgər görmürsənmi ki, Allah göylərdə və yerdə nə varsa, (hamısını) bilir. Aralarında gizli söhbət gedən üç adamın dördüncüsü, beş adamın altıncısı Odur. Onlar bundan az da, çox da olsalar və harada olsalar, (Allah) yenə də onların yanındadır. Sonra qiyamət günü (Allah) onlara etdikləri əməlləri (bir-bir) xəbər verəcəkdir. Allah hər şeyi biləndir!

8. (Ya Peyğəmbər!) Məgər məxfi danışmaq qadağan edildikdən sonra yenə də qadağan olunduqları əmələ qayıdıb günah, ədavət və Peyğəmbərin əleyhinə çıxmaq barədə öz aralarında pıçıldaşanları (münafiqlərlə yəhudiləri) görmədinmi? Onlar yanına gəldikləri zaman səni Allahın salamladığı kimi salamlamır (“əssəlamu əleykə” əvəzinə “əsammu əleykə - sənə ölüm olsun!” – deyərək guya salam verir) və ürəklərində: “(Əgər Məhəmməd həqiqi peyğəmbərdirsə) bəs niyə Allah bizi dediklərimizə görə əzaba düçar etmir?” – deyirlər. Onlara girib yanacaqları Cəhənnəm kifayət edər. Ora necə də pis qayıdış yeridir!

9. Ey iman gətirənlər! Bir-birinizlə xəlvət danışdığınız zaman günah, düşmənçilik və Peyğəmbərin əleyhinə çıxmaq barədə danışmayın; yaxşı işlər, Allahdan qorxmaq barədə danışın və (qiyamət günü) hüzuruna toplanacağınız Allahdan qorxun!

10. Şübhəsiz ki, (bir yerə yığışıb günaha, düşmənçiliyə bais olan) məxfi danışma (pıçıldaşma) iman gətirənləri məyus edib kədərləndirmək üçün olan Şeytan əməlindəndir. Halbuki Allahın izni olmadıqca (Şeytan) onlara heç bir zərər yetirə bilməz. Möminlər yalnız Allaha təvəkkül etsinlər!

11. Ey iman gətirənlər! Sizə: "Məclislərdə (mömin qardaşlarınıza) yer verin!" – deyildiyi zaman (onlara) yer verin ki, Allah da sizə (Cənnətdə) geniş yer versin. Eləcə də sizə: "Qalxın!" deyildikdə qalxın ki, Allah da sizdən iman gətirənlərin və (xüsusilə) elm bəxş edilmiş kimsələrin dərəcələrini ucaltsın. Allah etdiyiniz əməllərdən xəbərdardır!

12. Ey iman gətirənlər! Peyğəmbərlə (hər hansı bir iş barəsində) məxfi danışacağınız zaman bu danışıqdan əvvəl (ona hörmət əlaməti olaraq yoxsullara) sədəqə verin. Bu (əməl) sizin üçün (Allah yanında) daha xeyirli, daha pakdır. Əgər (sədəqə verməyə) bir şey tapmasanız (ürəyinizi qısmayın). Çünki Allah bağışlayandır, rəhm edəndir!

13. Məgər siz (Peyğəmbərlə) məxfi danışmazdan əvvəl sədəqə verməkdən qorxdunuzmu? Madam ki, siz (bunu) etmədiniz (sədəqə vermədiniz) və Allah da tövbənizi qəbul buyurdu, onda namaz qılıb zəkat verin, Allaha və Onun Peyğəmbərinə itaət edin. Allah nə etdiklərinizdən xəbərdardır!

14. (Ya Peyğəmbər!) Məgər onların (münafiqlərin) Allahın qəzəbləndiyi bir tayfanı (yəhudiləri) özlərinə dost tutduqlarını (mömin müsəlmanların sirlərini onlara verdiklərini) görmədinmi?

Onlar nə sizdəndirlər, nə də onlardan. Onlar (özlərinin riyakar olduqlarını) bilə-bilə (Allaha və Muhəmməd əleyhissəlama iman gətirdikləri barədə) yalandan and içirlər.

15. Allah onlar üçün şiddətli bir əzab hazırlamışdır. Onların etdiyi əməllər necə də pisdir!

16. Onlar andlarını özlərinə sipər etdilər və (xalqı) Allah yolundan döndərdilər. Onları alçaldıcı bir əzab gözləyir.

17. Onları nə malları, nə də övladları heç bir vəchlə Allahdan (Allahın əzabından) qurtara bilməz. Onlar cəhənnəmlikdirlər və orada əbədi qalacaqlar.

18. Allah onların hamısını dirildəcəyi gün onlar sizə (yalandan) and içdikləri kimi, Allaha da and içəcək və (bununla axirətdə) bir şey qazanacaqlarını zənn edəcəklər. Bilin ki, onlar əsl yalançıdırlar!

19. Şeytan onlara hakim olmuş və Allahı zikr etməyi onlara unutdurmuşdur. Onlar Şeytanın firqəsidirlər (Şeytana uyanlardır). Bilin ki, Şeytanın firqəsi – məhz onlar ziyana uğrayanlardır!

20. Allahın və Onun Peyğəmbərinin əleyhinə çıxanlar (Cəhənnəmdəki) ən zəlil kimsələr içərisində olacaqlar!

21. Allah (lövhi-məhfuzda): “And olsun ki, Mən və peyğəmbərlərim qalib gələcəyik!” – deyə yazmışdır. Həqiqətən, Allah yenilməz qüvvət sahibi, qüdrət sahibidir!

22. (Ya Peyğəmbər!) Allaha və axirət gününə inanan heç bir tayfanın Allah və Onun Peyğəmbəri əleyhinə çıxanlarla – öz ataları, oğulları, qardaşları, yaxın qohumları olsalar belə - dostluq etdiyini görməzsən. Onlar elə kimsələrdir ki, Allah onların qəlblərinə iman yazmış və Öz dərgahından onlara ruh (güc) vermişdir (iman, hidayət nuru əta etmişdir). (Allah) onları (ağacları) altından çaylar axan

cənnətlərə daxil edəcəkdir. Onlar orada əbədi qalacaqlar. Allah onlardan, onlar da Allahdan razıdırlar. Onlar Allahın firqəsidirlər (Allahın dininə kömək edən kimsələrdir). Bilin ki, Allahın firqəsi məhz onlar nicat tapıb (əbədi) səadətə qovuşanlardır.

## .59.
## əl-Həşr (Toplanma) surəsi

**(Mədinədə nazil olmuşdur, 24 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Göylərdə və yerdə nə varsa, (hamısı) Allahı təqdis edib şəninə təriflər deyər. O, yenilməz qüvvət sahibi, hikmət sahibidir!

2. Kitab əhlindən kafir olanları (Mədinə ətrafında yaşayıb Muhəmməd əleyhissəlamın peyğəmbərliyini inkar edən Bəni Nəzir qəbiləsini) ilk dəfə (bir yerə) toplayıb öz yurdundan çıxardan (Şama sürgün edən) Odur. (Ey möminlər!) Siz onların (öz yurdundan) çıxacaqlarını güman etmirdiniz. Onlar isə öz qalalarının onları Allahdan (Allahın əzabından) qoruyacağını zənn edirdilər. Amma Allah (Allahın əzabı) onlara gözləmədikləri yerdən gəlib ürəklərinə qorxu saldı. Belə ki, onlar evlərini həm öz əlləri, həm də möminlərin əlləri ilə uçurdub dağıdırdılar. Ey bəsirət sahibləri! (Bəni Nəzir qəbiləsinin başına gələnlərdən) ibrət alın!

3. Əgər Allah onlara (yurdlarından çıxardılıb) sürgün olunmağı hökm etməsəydi, onları dünyada mütləq (başqa bir) əzaba düçar edərdi. Axirətdə isə onları cəhənnəm əzabı gözləyir!

4. Bu onların Allaha və Onun Peyğəmbərinə asi olmalarına görədir. Kim Allaha asi olsa (bilsin ki), Allahın cəzası çox şiddətlidir!

5. (Ey möminlər! Sizin kafirlərə məxsus olan) hər hansı bir xurma ağacını kəsməyiniz, yaxud (toxunmayıb) onu kökü üstündə salamat qoymağınız Allahın iznilədir. Və bu (Allahın öz Rəbbinə asi olan) fasiqləri rüsvay etməsi üçündür.

6. (Ey möminlər!) Allahın onların (Bəni Nəzər qəbiləsinin) mallarından Öz Peyğəmbərinə verdiyi qənimət üçün siz onların üstünə nə at, nə də dəvə sürdünüz. Lakin Allah Öz peyğəmbərini istədiyi kimsələr üzərində hakim edər. Allah hər şeyə qadirdir!

7. Allah Öz Peyğəmbərinə (fəth olunmuş) məmləkətlərin əhalisindən (dinc yolla) verdiyi qənimət Allaha, Peyğəmbərə, (Muhəmməd əleyhissəlama yaxın olan) qohum-əqrəbaya, yetimlərə, yoxsullara və (pulu qurtarıb yolda qalan) müsafirə (yolçulara) məxsusdur. Bu ona görədir ki, (həmin mal-dövlət) içərinizdəki zənginlər arasında əldən-ələ dolaşan bir sərvət olmasın (ondan yoxsullar da faydalansın). Peyğəmbər sizə nə verirsə, onu götürün; nəyi qadağan edirsə, ondan əl çəkin. Allahdan qorxun. Həqiqətən, Allahın cəzası çox şiddətlidir.

8. (Bu qənimət) yurdlarından qovulub çıxardılmış, Allahdan mərhəmət və riza diləyən, Allaha və Onun Peyğəmbərinə kömək edən yoxsul mühacirlərə məxsusdur. Onlar (imanlarında, sözlərində və işlərində) doğru olan kimsələrdir!

9. Onlardan (mühacirlərdən) əvvəl (Mədinədə) yurd salmış və (Muhəmməd əleyhissəlama qəlbən) iman gətirirmiş kimsələr (ənsar) öz yanlarına (şəhərlərinə) mühacirət edənləri sevər, onlara verilən qənimətə görə ürəklərində həsəd (qəzəb) duymaz, özləri ehtiyac içində olsalar belə, onları özlərindən üstün tutarlar. (Allah tərəfindən) nəfsinin xəsisliyindən (tamahından) qorunub saxlanılan kimsələr – məhz onlar nicat tapıb səadətə (Cənnətə) qovuşanlardır!

10. Onlardan (mühacirlərdən və ənsarlardan) sonra gələnlər belə deyirlər: “Ey Rəbbimiz! Bizi və bizdən əvvəlki iman gətirmiş (din) qardaşlarımızı bağışla. Bizim qəlblərimizdə iman gətirənlərə qarşı kinə (həsədə) yer vermə. Ey Rəbbimiz! Sən, həqiqətən, şəfqətlisən, mərhəmətlisən!”

11. (Ya Peyğəmbər) Məgər kitab əhlindən kafir olan qardaşlarına: “Əgər (siz öz yurdunuzdan) çıxarılsanız, biz də sizinlə birlikdə mütləq (yurdumuzdan) çıxacaq, sizin əleyhinizə heç vaxt heç kəsə qoşulub tabe olmayacağıq. Əgər (möminlər) sizinlə vuruşsalar, şübhəsiz ki, sizə yardım edəcəyik!” – deyən münafiqləri görmədinmi? Allah onların xalis yalançı olduğuna şahiddir!

12. And olsun ki, əgər onlar (Bəni Nəzər qəbiləsi) yurdlarından çıxarılsalar, (münafiqlər) onlarla birlikdə (öz yurdlarından) çıxmazlar. Əgər (möminlər) onlarla vuruşsalar, (münafiqlər) onlara (yəhudilərə) kömək etməzlər. Yox, əgər (münafiqlər) onlara yardım etmiş olsalar, (özləri məğlubiyyətə uğrayaraq) arxa çevirib qaçar, sonra da onlara (Bəni Nəzir qəbiləsinə) heç bir kömək olunmaz!

13. (Ey möminlər!) Onların (münafiqlərlə yəhudilərin) ürəklərinə qorxu salan Allahdan çox sizsiniz. Bu isə onların (Allahın əzəmət və heybətini) anlamaz bir qövm olduqlarına görədir.

14. Onlar (münafiqlərlə yəhudilər) hamılıqla sizə qarşı ancaq möhkəm şəhərlərdə (kəndlərdə), yaxud divar arxasında (qala içərisində) olarkən döyüşərlər (başqa şəraitdə sizinlə vuruşmağa cürət etməzlər). Onların öz aralarındakı vuruşmaları (və düşmənçilikləri) isə çox güclüdür. (Ya Peyğəmbər!) Sən onların əlbir olduqlarını güman edirsən, lakin onların qəlbləri dağınıqdır. Bunun səbəbi onların ağılsız bir qövm olmalarıdır.

15. Onlar özlərindən bir az əvvəl əməllərinin cəzasını (dünyada) dadmış kimsələrə (Bədrdə məğlub olmuş Məkkə müşriklərinə) bənzəyirlər. Onları (axirətdə) şiddətli bir əzab gözləyir.

16. (Münafiqlər Bəni Nəzir yəhudilərini aldatması) Şeytana (Şeytanın insanı aldatmasına) bənzəyir. O, insana: “Kafir ol !” – deyər. (İnsan) kafir olan kimi (Şeytan onu qoyub qaçaraq): “Mənim səninlə heç bir əlaqəm yoxdur. Mən aləmlərin Rəbbi olan Allahdan qorxuram!” – deyər.

17. Onların hər ikisinin (Şeytanla onun aldatdığı adamın, eləcə də münafiqlərlə Bəni Nəzir qəbiləsinin) aqibəti cəhənnəm odu içində həmişəlik qalmaqdır. Zalımların (kafirlərin) cəzası budur!

18. Ey iman gətirənlər! Allahdan qorxun! Hər kəs sabah üçün nə etdiyinə (axirət üçün özünə nə hazırladığına) nəzər salsın. Allahdan qorxun. Həqiqətən, Allah etdiklərinizdən xəbərdardır!

19. Allahı unutduqları üçün Allahın da onları özlərinə unutdurduğu (xeyirlərini başa düşməyən) kimsələrə bənzəməyin! Onlar (Allahın itaətindən çıxmış) fasiqlərdir!

20. Cəhənnəm əhli ilə cənnət əhli eyni ola bilməz. Cənnət əhli nicat tapıb (əbədi) səadətə qovuşanlardır!

21. (Ya Peyğəmbər!) Əgər Biz bu Quranı bir dağa nazil etsəydik, sən onun Allahın qorxusundan (kiçildiyini) parça-parça olduğunu görərdin (halbuki ağıl və ruh sahibi olan insan onun öyüd-nəsihətlərindən ibrət almır). Biz bu misalları insanlar üçün çəkirik ki, bəlkə, düşünələr.

22. O Özündən başqa heç bir tanrı olmayan, gizlini də, aşkarı da bilən Allahdır. O rəhmlidir, mərhəmətlidir! (Allah dünyada bütün bəndələrinə rəhm edən Rəhman, axirətdə isə yalnız möminləri bağışlayan Rəhimdir!)

23. O Özündən başqa heç bir tanrı (məbud) olmayan, (bütün məxluqatın) ixtiyar sahibi, müqəddəs (pak) olan, (bəndələrinə) salamatlıq, əmin-amanlıq bəxş edən, (hər şeydən) göz-qulaq olub (onu) qoruyan, yenilməz qüdrət (qüvvət) sahibi, (hamını istədiyi hər hansı bir şeyə) məcbur etməyə qadir olan, (hər şeydən) böyük (hər şeyin fövqündə) olan Allahdır. Allah (müşriklərin) Ona qoşduqlarından (şəriklərdən) ucadır.

24. O, (hər şeyi) yaradan, yoxdan var edən, (hər şeyə) surət verən Allahdır. Ən gözəl adlar (əsmayi-hüsna) ancaq Ona məxsusdur. Göylərdə və yerdə nə varsa (hamısı) Onu təqdis edib şəninə tariflər deyər. O, yenilməz qüvvət sahibi, hikmət sahibidir!

## .60.
## əl-Mumtəhinə (İmtahana çəkilən qadın) surəsi

**(Mədinədə nazil olmuşdur, 13 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Ey iman gətirənlər! Nə mənim düşmənimi, nə də özünüzün düşmənini dost (vəli) tutun! Onlar (kafirlər) sizə gələn haqqı (Quranı, Muhəmməd əleyhissəlamı) inkar etdikləri halda, siz onlarla dostluq edirsiniz (mehribanlıq göstərirsiniz). Siz Rəbbiniz olan Allaha iman gətirdiyiniz üçün onlar Peyğəmbəri və sizi (Məkkədən) çıxardırdılar. Əgər siz Mənim yolumda və Mənim rizamı qazanmaq uğrunda cihada çıxmısınızsa (Mənim düşmənlərimi dost tutmayın). Siz onlarla gizlində dostluq edirsiniz (dostluq üzündən onlara sirr verirsiniz). Mən sizin gizli saxladığınız və aşkar etdiyiniz hər şeyi (bütün gizli və aşkar əməllərinizi) bilirəm. Sizdən kim (bir daha) bunu etsə (düşmənlərlə dostluq edib onlara sirr versə), o, şübhəsiz ki, haqq yoldan azmışdır!

2. Əgər onlar (müşriklər) sizi ələ keçirsələr (sizə qələbə çalsalar), sizə düşmən olar, sizə pisliklə əl və dil uzadar, sizin kafir olmanızı istəyərlər.

3. Nə (xatirinə Allaha və Peyğəmbərinə xəyanət etdiyiniz Məkkədəki) qohum-əqrəbanız, nə də oğul-uşağınız sizə bir fayda verəcəkdir. Allah qiyamət günü sizi bir-birinizdən ayıracaqdır. Allah nə etdiklərinizi görəndir!

4. İbrahim və onunla birlikdə olanlar (möminlər) sizin üçün gözəl örnəkdir. O zaman onlar öz qövmünə belə demişdilər: “Şübhəsiz ki, bizim sizinlə və sizin Allahdan başqa ibadət etdiklərinizlə (bütlərlə) heç bir əlaqəmiz yoxdur. Biz sizi (dininizi) inkar edirik. Siz bir olan Allaha iman gətirməyincə bizimlə sizin aranızda həmişə ədavət və nifrət olacaqdır!” Ancaq İbrahim öz atasına: “Mən (öz Rəbbimdən) mütləq sənin bağışlanmağını diləyəcəm. Mən heç vəchlə səni Allahdan (Allahın əzabından) qurtara bilmərəm (mənim bacardığım yalnız budur)!” – deməsi istisnadır (bunda sizin üçün örnək yoxdur). (Onlar həmçinin belə demişdilər:) “Ey Rəbbimiz! Biz ancaq Sənə təvəkkül etdik, tövbə edib ancaq Sənə tərəf qayıtdıq. Axır dönüş də ancaq Sənin hüzurunadır.

5. Ey Rəbbimiz! Bizi kafirlər üçün sınaq vasitəsi etmə! (Bizi kafirlərin əli ilə sınağa çəkmə, onları bizim üstümüzdə hakim etmə!) Bizi bağışla. Ey Rəbbimiz! Həqiqətən, Sən yenilməz qüvvət sahibi, hikmət sahibisən!”

6. (Ey möminlər!) And olsun ki, onlar sizin üçün, Allaha və axirət gününə ümid bəsləyənlər üçün gözəl örnəkdir. Kim (kafirlərlə dostluq edib Allahın buyurduğundan) üz döndərsə (bunun zərəri ancaq onun özünə olar). Allah (heç nəyə) möhtac deyildir; O, tərifə (şükrə) layiqdir!

7. (Ey möminlər!) Ola bilsin ki, Allah sizinlə düşmənçilik etdiyiniz kimsələr (Məkkə müşrikləri) arasında (onları islam dininə gətirməklə) dostluq (məhəbbət) yaratsın. Allah (hər şeyə) qadirdir. Allah bağışlayandır, rəhm edəndir!

8. Allah din yolunda sizinlə vuruşmayan və sizi yurdunuzdan çıxartmayan kimsələrə yaxşılıq etməyi və onlarla ədalətlə rəftar etməyi sizə qadağan etməz. Allah ədalətli olanları sevər!

9. Allah sizə ancaq sizinlə din yolunda vuruşan, sizi yurdunuzdan çıxardan və çıxartmağa kömək edən kimsələrlə dostluq etmənizi qadağan edər. Onlarla dostluq edənlər əsl zalımlardır!

10. Ey iman gətirənlər! Mömin qadınlar sizin yanınıza mühacir kimi gəldikləri zaman onları imtahana çəkin. Allah onların imanını çox gözəl bilir (onları yoxlayıb bilmək sizə lazımdır). Əgər bunların (bu qadınların həqiqi) mömin olduqlarını bilsəniz, artıq onları kafirlərin yanına qaytarmayın. Nə bunlar (bu qadınlar) onlara (kafirlərə), nə də onlar bunlara halaldır. Onların (kafirlərin həmin qadınlara) xərclədiklərini (mehri) özlərinə qaytarıb verin. Bunların (bu qadınların) mehrlərini özlərinə verdiyiniz təqdirdə onlarla evlənməyinizdən sizə heç bir günah gəlməz. Kafir qadınları öz kəbininiz altında saxlamayın. (Həmin qadınlara) verdiyiniz mehri (onların ərə getdiyi kafirlərdən) istəyin. (Kafirlər də islamı qəbul edib möminlərlə evlənən qadınlara) sərf etdikləri mehri (sizdən) istəsinlər. Allahın hökmü budur. O sizin aranızda (belə) hökm edər. Allah (hər şeyi) biləndir, hikmət sahibidir!

11. Əgər zövcələrinizdən biri sizdən qaçıb (mehrini geri qaytarmadan) kafirlərə qoşulsa və siz də (onlarla vuruşaraq) qənimət əldə etsəniz, zövcələri (kafirlərin yanına) getmiş kimsələrə (həmin qənimətdən) onların (bu övrətlərə) sərf etdikləri mehr qədər verin. İman gətirdiyiniz Allahdan qorxun!

12. Ya Peyğəmbər! Mömin qadınlar Allaha heç bir şərik qoşmayacaqları, oğurluq və zina etməyəcəkləri, övladlarını öldürməyəcəkləri (qız uşaqlarını diri-diri torpağa gömməyəcəklərini), özgə kişilərdən olan uşaqlarını yalandan ərlərinə isnad etməyəcəkləri və heç bir yaxşı (bəyənilən) işdə sənin əleyhinə çıxmayacaqları barədə sənə beyət etmək üçün yanına gəldikləri zaman onların beyətini qəbul et və Allahdan onların bağışlanmasını dilə. Həqiqətən, Allah bağışlayandır, rəhm edəndir!

13. Ey iman gətirənlər! Allahın qəzəbinə düçar olmuş bir qövmlə dostluq etməyin. Kafirlər qəbiristan əhlindən (ölülərin qiyamət günü diriləcəyindən) ümidlərini üzdükləri kimi, onlar da axirətdən (axirətdə Allahın mərhəmətindən) ümidlərini üzmüşlər!

## .61.
## əs-Saff (Səf) surəsi

**(Mədinədə nazil olmuşdur, 14 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Göylərdə və yerdə nə varsa, (hamısı, bütün məxluqat) Allahı təqdis edib şəninə təriflər deyər. O, yenilməz qüvvət sahibi, hikmət sahibidir!

2. Ey iman gətirənlər! Etməyəcəyiniz bir şeyi niyə deyirsiniz? (Bəzi müsəlmanlar: “Hansı əməllərin Allaha daha xoş getdiyini bilsəydik, onları edər, malımızı və canımızı onların yolunda qoyardıq!” – deyirdilər. Lakin cihad əmri nazil olduqda bu, bir çox möminlərin xoşuna gəlmədi).

3. Etməyəcəyiniz bir şeyi demək Allah yanında böyük qəzəbə səbəb olar.

4. Şübhəsiz ki, Allah Öz yolunda möhkəm divar kimi səf çəkib döyüşənləri sevər!

5. (Ya Rəsulum!) Xatırla ki, bir zaman Musa öz qövmünə demişdi: “Ey qövmüm! Mənim Allahın sizə göndərilmiş peyğəmbəri olduğumu bildiyiniz halda, niyə məni incidirsiniz?” Onlar (haqdan) üz döndərdi. Allah (Özünə asi olan) fasiqləri doğru yola yönəltməz!

6. Onu da xatırla ki, bir vaxt Məryəm oğlu İsa belə demişdi: “Ey İsrail oğulları! Həqiqətən, mən özümdən əvvəl nazil olmuş Tövratı təsdiq edən və məndən sonra gələcək Əhməd adlı bir peyğəmbərlə (sizə) müjdə verən Allahın elçisiyəm!” Sonra (İsa, yaxud Muhəmməd əleyhissəlam) onlara açıq-aşkar möcüzələr gətirdikdə onlar: “Bu, açıq-aydın sehrdir!” – dedilər.

7. İslama dəvət olunduğu halda, Allaha qarşı yalan uydurandan (Onun peyğəmbərinə sehrbaz deyəndən) daha zalım kim ola bilər?! Allah zalım qövmü doğru yola yönəltməz!

8. Onlar Allahın nurunu (islam dinini) öz ağızları (öz iftiraları və şər sözləri) ilə söndürmək istəyirlər. Allah isə - kafirlərin xoşuna gəlməsə də, öz nurunu (dinini) tamamlayacaqdır.

9. Müşriklərin xoşuna gəlməsə də, onu (islamı) bütün dinlərdən üstün etmək üçün Öz Peyğəmbərini hidayət (Quran) və haqq dinlə göndərən Odur!

10. Ey iman gətirənlər! Sizə elə bir ticarət (qazanc yolu) göstərimmi ki, o sizi şiddətli əzabdan xilas etsin?

11. (O qazanc yolu budur: ) Allaha və Onun Peyğəmbərinə iman gətirəsiniz. Allah yolunda malınız və canınızla vuruşasınız (cihad edəsiniz). Bilsəniz, bu sizin üçün nə qədər xeyirlidir!

12. (Əgər belə etsəniz) O sizin günahlarınızı bağışlayar və sizi (ağacları) altından çaylar axan cənnətlərə və Ədn cənnətlərindəki gözəl saraylara daxil edər. Bu, böyük qurtuluşdur (uğurdur)!

13. (Sizi hələ) sevdiyiniz başqa bir şey (bir nemət) də - Allah dərgahından kömək və yaxın qələbə (Məkkənin fəthi) gözləyir. (Ya Peyğəmbər!) Möminlərə (dünyada zəfərlə, axirətdə Cənnətlə) müjdə ver!

14. Ey iman gətirənlər! Allahın (dininin və peyğəmbərinin) köməkçiləri olun! Necə ki, Məryəm oğlu İsa həvarilərə: “Allah yolunda mənim köməkçilərim kimdir?” – demiş, həvarilər də: “Allahın köməkçiləri bizik!” – deyə cavab vermişdilər. Nəhayət, İsrail oğullarından bir tayfa iman gətirdi, bir tayfa isə kafir oldu. Biz də iman gətirənləri düşmənlərinə qarşı qüvvətləndirdik və onlar qələbə çaldılar.

## .62.
## əl-Cumuə (Cümə) surəsi

**(Mədinədə nazil olmuşdur, 11 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Göylərdə və yerdə nə varsa, (hamısı) mülkün (yer-göy mülkünün) hökmdarı (sahibi), müqəddəs (pak), yenilməz qüvvət, hikmət sahibi olan Allahı təqdis edib Onun şəninə təriflər deyər!

2. (Əksəriyyəti yazıb-oxumaq bilməyən) ümmi ərəblərə özlərindən peyğəmbər göndərən Odur. (Bu Peyğəmbər) əvvəllər haqq yoldan açıq-aşkar azsalar da, onlara (Allahın) ayələrini oxuyar, onları (günahlardan, şirk və küfr çirkabından) təmizləyər, onlara Kitabı və hikməti (Quranı və şəriəti) öyrədər.

3. (Allah-təala Muhəmməd əleyhissəlamı) ərəblərdən savayı hələ onlara qoşulmamış başqalarına da (islamı qəbul etməmiş indiki ümmətlərə

və qiyamət gününə qədər dünyaya gələcək bütün sonrakı tayfalara da peyğəmbər göndərmişdir) [Və ya: o Peyğəmbər Kitabı və hikməti ərəblərdən əlavə hələ onlara qoşulmamış başqalarına da (başqa ümmətlərə də) öyrədər]. O, yenilməz qüvvət sahibi, hikmət sahibidir!

4. Bu, Allahın istədiyinə əta etdiyi mərhəmətdir (kərəmdir). Allah çox böyük mərhəmət (kərəm) sahibidir!

5. Tövrata əməl etməyə mükəlləf olduqdan sonra ona əməl etməyənlər (Tövrata yükləndikdən sonra onu daşımayanlar, Tövrata iman gətirdikdən, onu oxuyub öyrəndikdən sonra hökmlərini lazımınca yerinə yetirməyənlər) belində çoxlu kitab daşıyan (lakin onların içində nə yazıldığını bilməyən, onlardan faydalanmağı bacarmayan) ulağa bənzərlər. (Muhəmməd əleyhissəlamın həqiqi peyğəmbər olmasına dair) Allahın ayələrini yalan sayanlar barədə çəkilən məsəl necə də pisdir! Allah zalım (kafir) qövmü doğru yola yönəltməz!

6. (Ya Peyğəmbər!) De: “Ey yəhudilər! Əgər bütün insanlardan fərqli olaraq, özünüzün Allahın dostları olduğunuzu iddia edirsinizsə, (və bunu) doğru deyirsinizsə, onda (Allahdan) ölüm diləyin! (Çünki Allah dərgahındakı nemətlər, əbədi həyat övliyalara ancaq öləndən sonra qismət olar).

7. Halbuki onlar (dünyada) öz əlləri ilə etdikləri əməllərə (qazandıqları günahlara) görə heç vaxt (ölümü) diləməzlər. Allah zalımları (kafirləri) çox gözəl tanıyandır!

8. (Ya Peyğəmbər!) De: “(Qorxub) qaçdığınız ölüm sizi mütləq yaxalayacaqdır. Sonra siz gizlini də, aşkarı da bilənin (Allahın) hüzuruna qaytarılacaqsınız. O da sizə (dünyada) nələr etdiyinizi (bir-bir) xəbər verəcəkdir!

9. Ey iman gətirənlər! Cümə günü namaza çağırıldığınız zaman Allahı zikr etməyə tələsin və alış-verişi buraxın. Bilsəniz, bu sizin üçün nə qədər xeyirlidir!

10. Namaz qılınıb qurtardıqdan sonra yer üzünə dağılın və Allahın lütfündən ruzi diləyib axtarın! (Yenə öz işinizə qayıdın!) Və Allahı çox zikr edin ki, nicat tapıb səadətə qovuşasınız! (Hər iki dünyada muradınıza yetişəsiniz!)

11. Onlar (möminlər) bir alış-veriş, yaxud bir əyləncə gördükləri zaman səni ayaq üstə (minbərdə xütbə oxuduğun halda) qoyub ona tərəf cumdular. (Ya Peyğəmbər!) De: "Allah dərgahında olan savab əyləncədən də, ticarətdən də xeyirlidir. Allah ruzi verənlərin ən yaxşısıdır!" (Bir dəfə Muhəmməd əleyhissəlam minbərdə cümə namazı xütbəsi oxuduğu zaman Şamdan ərzaqla yüklənmiş bir karvanın gəldiyini xəbər verən təbil səsləri eşidilmişdi. O vaxt Mədinə əhalisi qıtlıqdan möhkəm əziyyət çəkirdi. Bunu eşidən camaat Peyğəmbəri tərk edərək karvanın qabağına qaçmışdı. Məsciddə cəmi on iki adam qalmışdı. O zaman bu ayə nazil olub cümə xütbəsi və namazı bitməmiş məsciddən çıxıb getməyin məqbul hərəkət olmadığına işarə edilmişdir).

## .63.
## əl-Munafiqun (Münafiqlər) surəsi

**(Mədinədə nazil olmuşdur, 11 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Ya Peyğəmbər!) Münafiqlər (riyakarlar) sənin yanına gəldikləri zaman: "Biz sənin, doğrudan da, Allahın Peyğəmbəri olduğuna şəhadət veririk! – deyirlər. Allah sənin Onun həqiqi Peyğəmbər

olduğunu bilir. Allah həm də münafiqlərin xalis yalançı olduqlarına şəhadət verir.

2. Onlar (yalan) andlarını özlərində sipər edib (xalqı) Allah yolundan döndərirlər. Həqiqətən, onların törətdikləri əməllər necə də pisdir!

3. Bunun səbəbi odur ki, onlar (dildə) iman gətirdilər, sonra isə (ürəklərində gizli) kafir oldular. Buna görə də onların ürəklərinə möhür vurulmuş, özləri isə anlamaz kimsələr olmuşlar.

4. (Ya Peyğəmbər!) Sən onları gördükdə cüssələri (boy-buxunları, gözəllikləri) xoşuna gəlir, danışanda sözlərinə qulaq asırsan. Onlar, sanki (divara) söykədilmiş dirəklərdir (ruhsuz bədən, müqəvva kimidirlər). Onlar (ikiüzlülüklərinin Peyğəmbərə və möminlərə əyan olacağından qorxub) hər bir qışqırığın (səs-küyün) öz əleyhlərinə olduğunu zənn edirlər. Onlar düşməndirlər, sən onlardan həzər et! Allah onları öldürsün, necə də haqdan döndərilirlər!

5. Onlara: “Gəlin Allahın Peyğəmbəri (Rəbbinizdən) sizin bağışlanmağınızı diləsin!” –deyildiyi zaman (istehza ilə) başlarını bulayar və sən (Ya Rəsulum!) onların təkəbbürlə üz çevirdiklərini görərsən.

6. Sən onların bağışlanmasını diləsən də, diləməsən də, fərqi yoxdur. Onsuz da Allah onları bağışlamayacaqdır. Şübhəsiz ki, Allah fasiq qövmü doğru yola yönəltməz!

7. Onlar: “Allahın Peyğəmbəri yanında olanlara bir şey verməyin ki, dağılıb getsinlər!” – deyən kimsələrdir. Halbuki göylərin və yerin xəzinələri Allaha məxsusdur, lakin münafiqlər (bunu) anlamazlar.

8. Onlar: “Əgər biz (Bəni Müstəliq vuruşunda) Mədinəyə qayıtsaq, ən güclülər (ən şərəflilər – münafiqlər) ən zəifləri (ən həqirləri – Peyğəmbəri və ona iman gətirənləri), əlbəttə, oradan çıxardacaqlar!” – deyirlər. Halbuki şərəf-şan da, (qüvvət və qələbə də) yalnız Allaha,

Onun Peyğəmbərinə və möminlərə məxsusdur, lakin münafiqlər (bunu) bilməzlər!

9. Ey iman gətirənlər! Nə mal-dövlətiniz, nə də oğul-uşağınız sizi Allahın zikrindən yayındırmasın! Hər kəs bunu etsə (Allahı yada salmasa), belələri əsl ziyana uğrayanlardır.

10. Birinizin ölümü çatıb: “Ey Rəbbim! Mənə bir az möhlət versəydin, sədəqə verib salehlərdən olardım! – deməmişdən əvvəl sizə verdiyim ruzidən (Allah yolunda) xərcləyin.

11. Və (bilin ki) Allah əcəli çatan heç kəsə möhlət verməz. Allah sizin nə etdiklərinizdən xəbərdardır!

## .64.
## ət-Təğabun (Qarşılıqlı aldanma) surəsi
**(Mədinədə nazil olmuşdur, 18 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Göylərdə və yerdə nə varsa, (hamısı) Allahı təqdis edib şəninə təriflər deyər. Hökm Onundur, həmd-səna da Ona məxsusdur. O, hər şeyə qadirdir!

2. Sizin yaradan Odur. Kiminiz kafirsiniz, kiminiz mömin. Allah nə etdiklərinizi görəndir!

3. O, göyləri və yeri haqq-ədalətlə (yerli-yerində) xəlq etdi, sizə surət verdi, surətlərinizi də gözəl yaratdı. (İnsan bütün canlıların ən gözəli və ən kamilidir). Axır dönüş də Onun hüzurunadır!

4. O, göylərdə və yerdə olanları da, sizin gizlində və aşkar da nə etdiyinizi də bilir. Allah ürəklərdə olanları biləndir!

5. (Ey Məkkə müşrikləri!) Məgər sizdən əvvəl kafir olanların (əzaba düçar edilməsi) xəbəri sizə gəlib çatmadımı? Onlar öz gördükləri

işlərin cəzasını dünyada daddılar. Onları (axirətdə) şiddətli bir əzab gözləyir!

6. Çünki peyğəmbərləri onlara açıq-aşkar möcüzələr gətirir, onlar isə: “Məgər bizi doğru yola (özümüz kimi adi) bir insanmı salacaqdır?!” – deyərək (o peyğəmbərləri) inkar edir və (haqdan) üz döndərirlər. Allahın (onların ibadətinə) ehtiyacı yoxdur. Allah heç bir şeyə möhtac deyildir. O, (hər cür) şükrə (tərifə) layiqdir!

7. Kafir olanlar (öldükdən sonra) əsla dirildilməyəcəklərini iddia edirlər. (Ya Peyğəmbər!) De: “Bəli, Rəbbimə and olsun ki, siz mütləq dirildiləcəksiniz. Sonra da (dünyada) etdiyiniz əməllər sizə (bir-bir) xəbər veriləcəkdir. Bu, Allah üçün çox asandır!

8. Elə isə Allaha, Onun Peyğəmbərinə və nazil etdiyimiz nura (Qurana) iman gətirin! Allah etdiyimiz əməllərdən agahdır!

9. Allahın sizi (haqq-hesab üçün) toplanmış gününə cəm edəcəyi gün – məhz o gün qarşılıqlı aldanma günüdür! (Həmin gün kafirlərin dünyaya uyaraq axirəti əldən verdiklərinə görə, bəzi möminlərin də dünyada bacardıqlarından az yaxşı əməllər etdiklərinə görə aldanmaları bəlli olacaqdır). Kim Allaha iman gətirib yaxşı əməllər etsə, (Allah) onun günahlarının üstünü örtər və onu (ağacları) altından çaylar axan cənnətlərə daxil edər. Belələri orada (Cənnətdə) əbədi qalacaqlar. Bu, böyük qurtuluşdur (uğurdur)!

10. Kafir olub ayələrimizi yalan sayanlara gəldikdə isə, onlar cəhənnəmlikdirlər. Onlar orada həmişəlik qalacaqlar. Ora necə də pis məskəndir!

11. Allahın izni olmadıqca (heç kəsə) heç bir müsibət üz verməz. Kim Allaha iman gətirsə, (Allah) onun qəlbini haqqa doğru yönəldər. (O, dünyada baş verən hər şeyin Allahın əzəli hökmü və izni ilə olduğunu bilər). Allah hər şeyi (keçmişi, indini və gələcəyi) biləndir!

12. Allaha itaət edin, Onun Peyğəmbərinə itaət edin; hər kəs (itaətdən) üz döndərsə, (bilsin ki) Peyğəmbərimizin öhdəsinə düşən yalnız açıq-aşkar təbliğdir! (O heç kəsi zorla iman gətirməyə məcbur edən deyildir).

13. Allahdan başqa heç bir tanrı (məbud) yoxdur. Buna görə də möminlər ancaq Allaha təvəkkül etsinlər!

14. Ey iman gətirənlər! Şübhəsiz ki, zövcələrinizdən və övladınızdan sizə düşmən olanlar vardır. (Onlar din və ya dünya işlərində sizin əleyhinizə çıxar, sizi ibadətdən, yaxşı əməllərdən yayındırarlar. Hətta siz bir dəfə Məkkədən Mədinəyə hicrət etmək istədiyiniz zaman onlar müxtəlif bəhanələrlə sizi bu fikrinizdən daşındırmışdılar). Onlardan özünüzü gözləyin! Amma (tövbə edəcəkləri təqdirdə) onları əfv etsəniz, (təqsirlərindən) keçsəniz və bağışlasanız (daha yaxşı olar). Çünki Allah (günahları çox) bağışlayandır, rəhm edəndir!

15. Həqiqətən, mal-dövlətiniz və oğul-uşağınız (sizin üçün) ancaq bir imtahandır. Ən böyük mükafat (Cənnət) isə Allah dərgahındadır!

16. Allahdan (Allahın əzabından) bacardığınız qədər qorxun. (Sizə verilə öyüd-nəsihətə) qulaq asın; (Allaha və Peyğəmbərinə) itaət edin və (mal-dövlətinizdən Allah yolunda) xərcləyin. Bu sizin özünüz üçün xeyirli olar. (Allah tərəfindən) nəfsinin xəsisliyindən (tamahından) qorunub saxlanılan kimsələr – məhz onlar nicat tapıb səadətə qovuşanlardır!

17. Əgər Allaha (Allah yolunda) gözəl (könül xoşluğu ilə) bir borc versəniz, (Allah) sizin üçün onun əvəzini qat-qat artırar və sizi bağışlayar. Allah qədirbiləndir, həlimdir!

18. (Allah) gizlini də, aşkarı da biləndir, yenilməz qüdrət sahibi, hikmət sahibidir!

## .65.
## ət-Talaq (Boşanma) surəsi
**(Mədinədə nazil olmuşdur, 12 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Ya Peyğəmbər!) Övrətləri boşadığınız zaman onları gözləmə müddətlərində (heyzdən pak olduqdan sonra) boşayın. Gözləmə müddətini sayın. Rəbbiniz olan Allahdan qorxun. Onları – açıq-aşkar bir pis iş (zina) etməyənə qədər – (gözləmə müddəti qurtarmamış) yaşadıqları evlərdən çıxartmayın və onlar özləri də çıxmasınlar. Bu, Allahın hədləridir (hökmləridir). Allah müəyyən etdiyi hədləri aşan kimsə özünə zülm etmiş olar. Nə bilirsən, ola bilsin ki, Allah bundan sonra bir iş icad etsin (ərin ürəyinə yenidən zövcəsinin məhəbbətini salsın və onlar barışsınlar).

2. Bunların (bu qadınların) gözləmə müddəti başa çatdıqda (barışmaq istəsəniz) onları yaxşılıqla (mehrlərini verib) yola salın. (Sonradan aranızda ixtilaf olmasın deyə) içərinizdən iki ədalətli şahid tutun. (Siz də ey şahidlər!) Allah üçün (doğru) şahidlik edin! Bununla Allaha və axirət gününə iman gətirənlərə öyüd-nəsihət verilir. Kim Allahdan qorxsa, Allah ona (hər çətinlikdən) bir çıxış yolu əta edər.

3. Və ona gözləmədiyi yerdən ruzi verər. Kim Allaha təvəkkül etsə, (Allah) ona kifayət edər. Allah Öz əmrini yerinə yetirəndir. Allah hər şey üçün bir ölçü (hədd, müddət) təyin etmişdir.

4. (Yaşa dolmaqla) heyzdən kəsilmiş qadınlarınız (onların gözləmə müddəti) barədə şübhə etsəniz, (bilin ki) onların və həmçinin (yaşları müsaid olmadığı üçün) hələ heyz görməmiş olanların (heyz görməmiş gənc övrətlərinizin) gözləmə müddəti üç aydır (bu müddət

başa çatdıqdan sonra başqası ilə evlənə bilərlər). Hamilə qadınların gözləmə müddəti isə onlar bari-həmlini yerə qoyduqda başa çatır. Kim Allahdan qorxsa, Allah onun işini (dünya və axirətdə) asan edər.

5. Bu, Allahın sizə nazil etdiyi buyuruğudur. Kim Allahdan qorxsa, Allah onun (günahlarının) üstünü örtər və (axirətdə) mükafatını artırar.

6. Onları (boşadığınız, lakin gözləmə müddətləri sona yetməmiş qadınları) imkanınız çatdığı qədər öz yaşadığınız yerdə sakin edin. (Bu qadınları) sıxışdırmaq (evdən çıxıb getməyə məcbur etmək) məqsədilə onlara zərər (əziyyət) verməyə cəhd göstərməyin. Əgər onlar hamilədirlərsə, bari-həmləni yerə qoyana qədər xərclərini verin. (Həmin qadınlar gözləmə müddətləri qurtarandan sonra) sizin üçün uşaq əmizdirirlərsə, onların (süd) haqqını verin (çünki onlar artıq sizin uşaqlarınıza süd verməyə borclu deyillər). Öz aranızda yaxşılıqla (şəriətə müvafiq şəkildə) sazişə gəlin. Əgər (bu məsələdə) çətinliyə düşsəniz (bir-birinizlə razılığa gələ bilməsəniz), onu (uşağı) başqa bir qadın əmizdirə bilər.

7. Varlı-karlı olan öz varına görə (süd haqqı) versin. İmkanı az olan isə Allahın ona verdiyindən versin. Allah heç kəsi Özünün ona verdiyindən artıq xərcləməyə məcbur etməz. Allah hər bir çətinlikdən sonra asanlıq (yoxsulluqdan sonra dövlət) əta edər.

8. Neçə-neçə məmləkət (əhli) öz Rəbbinin və Onun peyğəmbərinin əmrindən çıxdı. Biz də onlara şiddətli cəza verib görünməmiş müdhiş əzaba düçar etdik.

9. Onlar əməllərinin cəzasını aldılar və axırda işləri ziyana uğramaq oldu.

10. Allah onlar üçün şiddətli əzab hazırladı. Ey iman gətirmiş ağıl sahibləri, Allahdan qorxun! Allah sizin üçün Quran nazil etmiş,

11. Və iman gətirib yaxşı işlər görənləri zülmətdən nura (küfrdən imana) çıxartmaq üçün Allahın açıq-aşkar (halal-haramı bəyan edən) ayələrini sizə oxuyan bir peyğəmbər göndərmişdir. Kim Allaha iman gətirib yaxşı iş görsə, (Allah) onu (möminlərin) əbədi qalacaqları, (ağacları) altından çaylar axan cənnətlərə daxil edər. Həqiqətən, Allah ona gözəl ruzi əta etmişdir!

12. Yeddi (qat) göyü və bir o qədər də yeri yaradan Allahdır. Allahın hər şeyə qadir olduğunu, Allahın hər şeyi elm (Öz əzəli elmi) ilə ehtiva etdiyini biləsiniz deyə, (Allahın) əmri onların arasında (mövcud olan bütün məxluqata) nazil olar.

## .66.
## ət-Təhrim (Qadağan) surəsi
**(Mədinədə nazil olmuşdur, 12 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Ya Peyğəmbər! Zövcələrinin (səndən) razı qalmasını diləyərək Allahın sənə halal etdiyi şeyi (dünya ləzzətini) niyə özünə haram (qadağan) edirsən? Allah bağışlayandır, rəhm edəndir!

2. Həqiqətən, Allah (halal bir şeyi özünüzə haram etmək barəsində içdiyiniz) andlarınızı (kəffarə verməklə) geri götürməyi vacib (qanuni) etmişdir. Allah sizin ixtiyar sahibinizdir. O (hər şeyi) biləndir, hikmət sahibidir!

3. Bir zaman Peyğəmbər öz zövcələrindən birinə (Həfsəyə) gizli bir söz (bir daha Zeynəb bint Cəhşin, yaxud Mariyeyi-Qibtiyyənin yanına getməyəcəyini) demişdi. (Həfsə) bu sözü (digər zövcələrdən biri olan Aişəyə) xəbər verdikdə və Allah bunu ona (Peyğəmbərə) əyan etdikdə (Peyğəmbər) bunun bir qismini (Həfsəyə) bildirmiş, (alicənablığı üzündən) bir qismini bildirməkdən isə vaz keçmişdi. (Peyğəmbər) əhvalatı (Həfsəyə) bildirdikdə o: “Bunu sənə kim xəbər

verdi?” – deyə soruşmuş, o da: “Bunu mənə (hər şeyi) bilən, (hər şeydən) agah olan (Allah) xəbər verdi!” – deyə cavab vermişdi.

4. (Ey Həfsə, ey Aişə!) Əgər ikiniz də (bu hərəkətinizə görə) Allaha tövbə etsəniz (çox yaxşı olar). Çünki (Peyğəmbərə əziyyət verməklə, ona xoş getməyən bir hərəkət etməklə) qəlbləriniz (onun barəsində bir qədər qeyri-səmimiliyə, günaha) meyl etdi. Əgər ona (Peyğəmbərə) qarşı bir-birinizə kömək etsəniz, (bilin ki, sizə qələbə çalmaqda) onun mövlası (dostu, hamisi) Allah, yardım göstərənləri isə Cəbrail, əməlisaleh möminlər və bundan sonra da (bütün) mələklərdir. (Yaxud onun dostu və yardımçıları Allah, Cəbrail, əməlisaleh möminlərdir. Bunlardan sonra da mələklər onun yardımçısıdır).

5. Əgər o sizi boşasa, ola bilsin ki, Rəbbi sizin əvəzinizə ona sizdən daha yaxşı zövcələr – müsəlman, mömin, itaətkar, tövbəkar, ibadət edən, oruc tutan dul qadınlar və bakirə qızlar versin!

6. Ey iman gətirənlər! Özünüzü və əhli-əyalınızı elə bir oddan qoruyun ki, onun yanacağı insanlar və daşlar (daşdan düzəlmiş bütlər), xidmətçiləri isə Allahın onlara verdiyi əmrlərə asi olmayan, buyurduqlarını yerinə yetirən daş qəlbli (heç kəsə zərrəcə rəhm etməyən) və çox sərt təbiətli mələklərdir (zəbanilərdir).

7. (Kafirlər cəhənnəm oduna atıldıqları zaman onlara belə deyiləcəkdir: ) “Ey kafir olanlar! Bu gün heç bir üzrxahlıq etməyin. Siz ancaq (dünyada) törətdiyiniz əməllərin cəzasını çəkəcəksiniz!”

8. Ey iman gətirənlər! Allaha səmimi-qəlbdən (bir daha günaha qayıtmamaq şərtilə) tövbə edin. Ola bilsin ki, Rəbbiniz günahlarınızın üstünü örtsün və sizi (ağacları) altından çaylar axan cənnətlərə daxil etsin. O gün Allah Öz Peyğəmbərini və onunla birlikdə iman gətirənləri xəcil etməz. Onların (iman) nuru (qıl körpüsü üstündə onlara yol göstərmək üçün) önlərindən və sağ

tərəflərindən axıb şölə saçarkən onlar belə deyəcəklər: “Ey Rəbbimiz! Bizim nurumuzu tamam-kamal elə və bizi bağışla. Həqiqətən, Sən hər şeyə qadirsən!”

9. Ya Peyğəmbər! Kafirlərə qarşı (qılıncla), münafiqlərə qarşı (sözlə) vuruş. Onlarla sərt rəftar et. Onların məskəni Cəhənnəmdir. Ora necə də pis sığınacaqdır!

10. Allah kafirlərə Nuhun övrəti ilə Lutun övrətini misal çəkdi. Onlar Bizim qullarımızdan iki saleh bəndənin kəbini altında idilər. Onlar ərlərinə xəyanət etdilər və (Nuhla Lut) onları Allahdan (Allahın əzabından) heç vəchlə qurtara bilmədilər. Onlara: “(Başqa) girənlərlə birlikdə siz ikiniz də Cəhənnəmə girin!” – deyildi.

11. Allah iman gətirənlərə isə Fironun zövcəsini (Asiyə bint Məzahimi) misal çəkdi. O zaman o: “Ey Rəbbim! Mənim üçün Öz dərgahında – Cənnətdə bir ev tik. Məni Firondan və onun əməlindən qurtar. Məni zalım qövmdən xilas et!” – demişdi.

12. (Allah mömin qadınlara) həmçinin namusunu (ismətini) möhkəm qoruyub saxlamış İmranın qızı Məryəmi də misal çəkdi. Biz (Cəbrail vasitəsilə) libasının yaxasından ona Öz ruhumuzdan (Öz yaratdığımız ruhdan) üfürdük. Məryəm Rəbbinin sözlərini (şəriətini, dini hökmlərini), kitablarını təsdiq etdi və (Allaha) itaət edənlərdən oldu.

## .67.
## əl-Mulk (Mülk və ya hakimiyyət) surəsi

**(Məkkədə nazil olmuşdur, 30 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Hökm (hər şeyin ixtiyarı) əlində olan Allah nə qədər ucadır (nə qədər uludur). O, hər şeyə qadirdir!

2. Hansınızın əməlcə daha gözəl olduğunu sınamaq (bəlli etmək) üçün ölümü və həyatı yaradan Odur. O, yenilməz qüvvət sahibidir, (çox) bağışlayandır.

3. Yeddi göyü (bir-birinin üstündə) qat-qat yaradan da Odur. (Ey insan!) Sən Rəhmanın yaratdığında heç bir uyğunsuzluq görməzsən. Bir gözünü qaldırıb (səmaya) bax, heç orada bir yarıq (çatdaq, nöqsan) görə bilərsənmi?!

4. Sonra gözünü qaldırıb iki dəfə bax. Göz orada (axtardığını tapmayıb) zəif, yorğun düşərək yenə də sənə tərəf qayıdacaqdır!

5. And olsun ki, Biz dünya səmasını (yerə ən yaxın olan göyü) qəndillərlə (ulduzlarla) bəzədik, onları şeytanlara atılan mərmilər etdik və onlar (şeytanlar) üçün yandırıb-yaxan alovlu atəş əzabı hazırladıq.

6. Rəbbini inkar edənləri cəhənnəm əzabı gözləyir. Ora necə də pis məskəndir!

7. Onlar (özləri kimi kafirlərlə) qaynayan Cəhənnəmə atıldıqları zaman onun dəhşətli uğultusunu eşidəcəklər!

8. O, (kafirlərə olan) qeyzindən az qala parça-parça olsun. Hər hansı bir tayfa ora (Cəhənnəmə) atıldıqca onun gözətçiləri onlardan (məzəmmətlə): “Məgər sizə (Allahın əzabı ilə) qorxudan bir peyğəmbər gəlməmişdimi?” – deyə soruşacaqlar.

9. Onlar deyəcəklər: “Bəli, bizə (Allahın əzabı ilə) qorxudan peyğəmbər gəlmişdi. Amma biz (onu) yalançı sayıb demişdik: “Allah heç bir şey (vəhy) nazil etməmişdir. Siz sadəcə olaraq (haqdan) çox azmısınız!”

10. Onlar: “Əgər biz (peyğəmbərlərin öyüd-nəsihətinə) qulaq asıb ağlımızı başımıza yığsaydıq, cəhənnəm əhli içində olmazdıq!” – deyəcək,

11. Və beləcə öz günahlarını etiraf edəcəklər. Məhv olsun cəhənnəm əhli!

12. Rəbbindən (Onu) görmədən qorxanları isə (günahlardan) bağışlanma və böyük bir mükafat gözləyir!

13. (Ey insanlar!) İstər sözünüzü gizli saxlayın, istər açıq deyin (heç bir fərqi yoxdur). (Allah) ürəklərdə olanları biləndir!

14. Məgər yaradan (sizin gizli saxladığınız hər şeyi) bilməzmi?! O, (hər şeyi) incəliyinə qədər biləndir, (hər şeydən) xəbərdardır!

15. Yeri (Yer kürəsini) sizə ram edən Odur. Onun qoynunda gəzin, (Allahın) ruzisindən yeyin. Axır dönüş də Onadır!

16. (Ey insanlar!) Göydə olanın (Allahın) yer hərəkətə gəlib çalxalandığı zaman sizi onun dibinə batırmayacağına əminsinizmi?!

17. Yaxud göydə olanın sizin üstünüzə daş yağdıran bir yel göndərməyəcəyinə arxayınsınızmı?! Onda Mənim (sizi əzabla) qorxutmağımın necə olduğunu mütləq biləcəksiniz.

18. Onlardan (Məkkə müşriklərindən) əvvəlkilər də (öz peyğəmbərlərini) təkzib etmişdilər. (Ya Peyğəmbər! Bir görəydin) Mənim onları cəzalandırmağım (inkar etməyim) necə oldu.

19. Məgər onlar başları üstündə (səf çəkib) qanad çalaraq (qanadlarını açıb-yumaraq) uçan quşları görmürlərmi? Onları (göydə) ancaq Rəhman (olan Allah) saxlayır. Həqiqətən, O, hər şeyi görəndir!

20. Yaxud bu əsgərləriniz (köməkçiləriniz) kimdir ki, onlar sizi Rəhmanın əzabından qurtara bilsinlər?! (Bəndələri Allahın əzabından Onun Özündən başqa heç kəs xilas edə bilməz!) Kafirlər, sadəcə olaraq, aldanmaqdadırlar!

21. Əgər (Allah) Öz ruzisini kəssə, sizə kim ruzi verə bilər?! Xeyr onlar (cahillikləri üzündən) dikbaşlıqdan və (haqqa) nifrət etməkdən (boyun qoymamaqdan) əl çəkmirlər.

22. Elə isə (küfrü ucbatından) üzüstə sürünən daha haqq yoldadır, yoxsa düz yolda düz gedən?!

23. (Ya Peyğəmbər!) De: "Sizi yoxdan yaradan, sizə qulaq, göz və qəlb verən Odur. (Allahın nemətlərinə) nə az şükür edirsiniz!"

24. De: "Sizi yer üzünə yayıb səpələyən Odur. (Qiyamət günü) Onun hüzuruna toplanacaqsınız!"

25. Onlar (müşriklər) deyirlər: "Əgər doğru danışanlardansınızsa, (bir xəbər verin görək) bu vəd (haqq-hesab, cəza) nə vaxt yerinə yetəcəkdir?"

26. De: "Onu bilmək yalnız Allaha məxsusdur. Mən isə ancaq (sizi Allahın əzabı ilə) açıq-aşkar qorxudan bir peyğəmbərəm!"

27. Kafirlər əzabın yaxınlaşdığını gördükləri zaman üzləri eybəcər kökə düşəcək (qaralacaq) və onlara: "Sizin (dünyada) istədiyiniz (və həmişə istehza edib inanmadığınız) əzab budur!" – deyiləcəkdir.

28. (Ya Peyğəmbər! Bu müşriklərə) de: "Bir deyin görək, istər Allah məni və mənimlə birlikdə olanları məhv etsin, istərsə də bizə bir mərhəmət əta etsin; siz kafirləri şiddətli əzabdan (Allahın əzabından) kim qurtara bilər?! (Biz ölsək də, qalsaq da, bu sizə heç bir fayda verməz. Allahın əzabından nicat tapmaq üçün ancaq Onun haqq dininə iman gətirmək lazımdır!)

29. De: "O bizim iman gətirdiyimiz və təvəkkül etdiyimiz Rəhmandır. Kimin (haqq yoldan) açıq-aydın azmış olduğunu (tezliklə) biləcəksiniz!"

30. De: “Bir söyləyin görək, əgər suyunuz çəkilib (yerin dibinə) getsə, (Allahdan başqa) kim sizə axar su gətirə bilər?!

## .68.
## Nun və ya əl-Qələm (Qələm) surəsi
**(Məkkədə nazil olmuşdur, 52 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Nun! And olsun qələmə və (mələklərin) yazdıqlarına (yaxud lövhi-məhfuzda yazılanlara) ki,

2. Sən (ya Rəsulum!) Rəbbinin neməti sayəsində divanə deyilsən!

3. Və həqiqətən, səni minnətsiz (tükənmək bilməyən) mükafat gözləyir!

4. Şübhəsiz ki, sən böyük bir əxlaq üzərindəsən!

5. (Tezliklə) sən də görəcəksən, onlar da görəcəklər,

6. Hansınızın divanə olduğunu!

7. Həqiqətən, sənin Rəbbin öz yolundan çıxanları da, doğru yoldan olanları da ən gözəl tanıyandır!

8. Elə isə (ya Peyğəmbər! Allahın ayələrini) yalan sayanlara itaət etmə!

9. (Müşriklər) istərdilər ki, sən onlara yumşaqlıq göstərəsən, onlar da sənə yumşaqlıq göstərsinlər! (Sən onların bütləri barəsində pis söz deməyəsən, onlar da sənə əziyyət verməsinlər və ya sən onların bütlərinə tapınasan, onlar da sənin Allahına ibadət etsinlər!)

10. (Ya Peyğəmbər!) İtaət etmə (yalan yerə) hər and içənə, alçağa;

11. Qeybət edənə, söz gəzdirənə;

12. Xeyrə mane olana, (zülm etməkdə) həddi aşana, günaha batana;

13. Daş ürəkliyə, (anlamaza və eyni zamanda) əsli-nəsəbi bilinməyən haramzadaya -

14. O, mal-dövlət, oğul-uşaq sahibi olsa belə!

15. Ayələrimiz ona oxunduğu zaman o: "(Bunlar) qədimlərin əfsanələridir!" – dedi.

16. Biz (tezliklə) onun burnuna damğa basacağıq!

17. Biz vaxtilə o bağ sahiblərini imtahana çəkdiyim kimi, bunları da (Məkkə mürşiklərini də) imtahana çəkdik. O vaxt (o bağ sahibləri) səhər açılanda (onun meyvələrini) mütləq dərəcəklərinə and içmişdilər.

18. Və heç bir istisna yeri də qoymamışdılar (inşallah deməmişdilər).

19. Onlar yuxuda ikən (ya Peyğəmbər!) sənin Rəbbindən o bağa bir bəla gəldi.

20. Və o (yanıb) qapqara qaraldı (külə döndü).

21. Onlar səhər qalxıb bir-birini belə səslədilər:

22. Əgər (məhsul) yığacaqsınızsa, bağınıza tez gedin!"

23. Nəhayət, yola düşdülər, (yol boyu) bir-birinə xəlvətcə belə deyirdilər:

24. "(Elə edin ki) bu gün orada yanınıza heç bir yoxsul soxulmasın!"

25. Onlar (yoxsulları) bağa buraxmağa qadir olacaqlarını güman edərək erkən getdilər. [Və ya: Onlar gücləri yetdiyi halda (yoxsulları) yardımdan məhrum etməkdən ötrü sübh tezdən yola düzəldilər]

26. (Bağı) bu vəziyyətdə (yanıb külə dönmüş) gördükdə dedilər: “Yəqin ki, (yolumuzu) azmışıq!

27. Xeyr, biz (bağımızın bərəkətindən) məhrum olmuşuq!”

28. Onların ən ağıllısı (və insaflısı) dedi: “Məgər mən sizə (Allahı) həmd-səna ilə təqdis etməli olduğunuzu demədimmi?!”

29. Onlar: “Rəbbimiz pakdır, müqəddəsdir! Həqiqətən, biz zalım idik!” – dedilər.

30. Onlar bir-birini danlamağa başladılar.

31. Və dedilər: “Vay halımıza! Biz azğınlıq (tüğyan) edirdik.

32. Ola bilsin ki, Rəbbimiz (tövbəmizi qəbul buyurub) onun əvəzinə bizə daha yaxşısını versin. Biz Rəbbimizdən (bizi bağışlamasını, bizə mərhəmət əta etməsini) diləyirik!”

33. (Dünyadakı) əzab belədir. Şübhəsiz ki, axirət əzabı daha şiddətlidir. Kaş biləydilər!

34. Həqiqətən, Allahdan qorxub pis əməllərdən çəkinənləri Rəbbi yanında Nəim cənnətləri gözləyir!

35. Məgər Biz müsəlmanları kafirlərlə eynimi tutacağıq?!

36. (Ey kafirlər! Siz dünyada yoxsul möminlərdən var-dövlətcə üstün olduğunuz kimi, axirətdə də onlardan üstün olacağınızı, yaxud ən azı onlarla eyni olacağınızı iddia edirsiniz). Sizə nə olub, necə mühakimə yürüdürsünüz?

37. Yoxsa (Allahdan nazil olmuş) bir kitabınız vardır ki, (bunları) orada oxuyursunuz?!

38. Yaxud orada bəyənib seçdiyiniz hər şeyin sizin olacağı yazılmışdır?!

39. Və ya hökm edib istədiklərinizin sizin olacağınıza dair Bizdən qiyamət gününədək davam edəcək əhd almısınız?!

40. (Ya Peyğəmbər!) Onlardan soruş ki, hansı biri buna zamindir?

41. Yoxsa onların (axirətdə müsəlmanlardan üstün və ya onlarla eyni olacaqları barədəki iddialarını təsdiq edən) şərikləri vardır?! Əgər doğru deyirlərsə, qoy şəriklərini gətirsinlər!

42. İş çətinləşəcəyi (baldırlar açılacağı, lüt-üryan vəziyyətdə qiyamətə gedəcəkləri, qiyamət bütün dəhşəti ilə görünəcəyi, həqiqət aşkar olacağı) və səcdəyə (namaza) dəvət olunacaqları gün onlar (səcdə etməyə) qadir olmayacaqlar.

43. Gözləri zəlilcəsinə yerə dikiləcək, özlərini də zillət bürüyəcəkdir. Halbuki onlar (dünyada) sağlam olduqları ikən səcdəyə dəvət olunurdular.

44. (Ya Peyğəmbər!) Artıq bu kəlamı (Quranı) yalan sayanları Mənə tapşır. Biz onları özləri də bilmədən tədriclə əzaba giriftar edərik.

45. Onlara (daha çox günaha batmaq üçün bir müddət) möhlət verərəm. Həqiqətən Mənim əzabım dözülməz dərəcədə şiddətlidir.

46. Yoxsa sən (risaləti təbliğ etmək müqabilində) onlardan ücrət (muzd) istəyirsən və onlar ağır borc yükü altında qalıblar?!

47. Yoxsa qeyb (lövhi-məhfuz) yanlarındadır və onlar (səninlə mübahisə etdikləri məsələləri, qiyamət günü kafirlərin Allah yanında möminlərdən üstün olacağını oradan öyrənib) yazırlar?!

48. (Ya Rəsulum!) Sən öz Rəbbinin hökmünə səbr et və balıq sahibi (Yunis peyğəmbər) kimi olma (risaləti təbliğ etməyi yerə qoyma). O zaman o, (balığın qarnında) qəm-kədər içində boğularaq (Rəbbinə) dua etmişdi.

49. Əgər Rəbbindən ona bir mərhəmət (nemət) yetişməsəydi, o, məzəmmət olunaraq quru yerə (səhraya) atılacaqdı.

50. Amma (tövbə etdikdən sonra) Rəbbi onu (Öz bəndələri içərisində) seçdi və salehlərdən (peyğəmbərlərdən) etdi.

51. (Ya Peyğəmbər!) Həqiqətən, kafirlər Quranı eşitdikləri zaman (sənə olan həsədlərindən və qəzəblərindən dolayı) az qala səni gözləri ilə yeyələr. Onlar (sənin barəndə): "O divanədir!" – deyirlər.

52. Halbuki bu (Quran) aləmlərə (insanlara və cinlərə) ancaq bir öyüd-nəsihətdir! (Onun nazil olduğu kimsə heç vaxt divanə ola bilməz!)

## .69.
## əl-Haqqə (Haqq olan qiyamət) surəsi
**(Məkkədə nazil olmuşdur, 52 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Haqq olan qiyamət!

2. Nədir qiyamət?!

3. Nə bilirsən (haradan bilirsən) ki, nədir qiyamət?! (Qiyamətin nə olduğunu sənə nə öyrətdi?)

4. Səmud da, Ad da (ürəkləri dəhşətə salan) o qiyaməti yalan saymışdılar!

5. Səmud (qövmü) hədsiz dərəcədə dəhşətli (tükürpədici) səslə həlak edildi.

6. Ad (qövmü) isə uğultulu, çox (soyuq və) şiddətli bir küləklə tar-mar oldu.

7. Allah o küləyi yeddi gecə, səkkiz gün ardı-arası kəsilmədən onların üstünə əsdirdi. Belə ki, (əgər yanlarında olsaydın) sən onları orada yıxılıb ölmüş görərdin. Onlar, sanki içi bomboş xurma kötükləri idilər.

8. İndi sən onlardan heç bir əsər-əlamət görə bilərsənmi?!

9. Firon da, ondan əvvəlkilər də, alt-üst olmuş Mötəfikə əhli (Lut qövmü) də günah (xəta) törətmişdilər.

10. Onlar Rəbbinin peyğəmbərinə asi olmuş, O da onları şiddəti getdikcə artan bir əzabla yaxalamışdı.

11. Həqiqətən, hər tərəfi su basdığı zaman (Nuhun tufanı qopduqda) sizi gəmiyə Biz daşıdıq.

12. Ona görə ki, bunu (möminlərə nicat verib kafirləri məhv etməyimizi) sizə bir ibrət dərsi edək və dərk edən (öyüd-nəsihəti cani-dildən dinləyən) qulaq bunu eşidib yadda saxlasın!

13. Sur bircə dəfə üfürüləcəyi;

14. Yer və dağlar qaldırılıb bircə dəfə bir-birinə çırpılacağı (əzilib toza dönəcəyi) zaman -

15. Məhz o gün (vaqe olacağına heç bir şübhə olmayan) qiyamət qopacaqdır!

16. Və (göy) süst düşüb parçalanacaqdır!

17. Mələklər də onun (göyün) ətrafında (Allahın əmrinə müntəzir) olacaq və həmin gün (ya Peyğəmbər!) sənin Rəbbinin ərşini onların (başı) üstündə səkkiz mələk daşıyacaqdır!

18. O gün (ey insanlar!) siz (haqq-hesab üçün Rəbbinizin hüzuruna) gətiriləcəksiniz. Sizin heç bir sirriniz (Allahdan) gizli qalmayacaqdır!

19. Əməl dəftəri sağ əlinə verilən kimsə deyəcəkdir: “Alın, əməl dəftərimi oxuyun!

20. Mən (dünyada ikən qiyamət günü) öz hesabıma yetişəcəyimə (möhkəm) inanmışdım!”

21. Bundan belə o, xoş güzəran içində,

22. Yüksək bir Cənnətdə olacaqdır.

23. (Elə bir Cənnət ki, onun) meyvələri çox yaxındadır (möminlər onlardan ayaq üstə olanda da, oturanda da, uzananda da yeyə biləcəklər).

24. (Onlara belə deyiləcəkdir: ) “Keçmiş günlərdə etdiyiniz (yaxşı) əməllər müqabilində yeyin-için!”

25. Əməl dəftəri sol əlinə verilən isə deyəcəkdir: “Kaş əməl dəftərim mənə verilməyəydi!

26. Hesabımın nə olduğunu bilməyəydim!

27. Kaş o (ölüm) qəti (əbədi) olaydı! (Bir daha dirilib bu əzabı görməyəydim!)

28. Mal-dövlətim mənə heç bir fayda vermədi (Allahın əzabını məndən dəf edə bilmədi).

29. Mülküm (səltənətim) də məhv olub getdi!”

30. (Allah dərgahından belə bir nida gələcəkdir: ) “Onu tutub qandallayın!

31. Sonra da Cəhənnəmə atın!

32. Daha sonra onu yetmiş arşın uzunluğunda zəncirlə bağlayın!

33. Çünki o, böyük olan Allaha inanmırdı.

34. O (özü zəkat vermir, acizə, kimsəsizə kömək etmir, xalqda da) yoxsulu yedirtməyə rəğbət oyatmırdı.

35. Bu gün bax burda onun yaxın bir dostu yoxdur.

36. İrindən başqa bir yeməyi də yoxdur.

37. Onu ancaq günahkarlar yeyər!”

38. And içirəm gördüklərinizə,

39. Və görmədiklərinizə ki,

40. Bu (Quran) çox möhtərəm bir elçinin (Cəbrailin, yaxud Muhəmməd əleyhissəlamın Allahın ona nazil etdiyi) sözüdür!

41. O, şair sözü deyildir! Nə az inanırsınız!

42. O, kahin sözü də deyildir! Nə az düşünürsünüz!

43. O, aləmlərin Rəbbi tərəfindən nazil edilmişdir.

44. Əgər o (Peyğəmbər) özündən bəzi sözlər uydurub Bizə isnad etsəydi,

45. Biz ondan mütləq şiddətli intiqam alardıq (sağ əlini kəsərdik, yaxud boynunu vurardıq)!

46. Sonra onun şah damarını qopardardıq!

47. Və heç biriniz də (Bizim əzabımızı) ondan dəf edə bilməzdiniz.

48. Şübhəsiz ki, bu (Quran) müttəqilərə bir öyüd-nəsihətdir.

49. (Ey insanlar!) İçərinizdə onu yalan hesab edənlər olduğunu da, əlbəttə, bilirik.

50. Şübhəsiz ki, bu (Quran) kafirlər üçün bir peşmançılıqdır (ona inanmadıqlarına görə qiyamət günü böyük zərər çəkəcəklər).

51. Doğrudan da, bu (Quran) gerçək bir həqiqətdir.

52. Elə isə (ya Peyğəmbər!) sən ulu olan Rəbbinin adını təsbih (müqəddəs tutub həmd-səna ilə zikr) et!

## .70.
## əl-Məaric (Dərəcələr, yaxud Pillələr) surəsi

**(Məkkədə nazil olmuşdur, 44 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Kafirlərdən) biri vaqe olacaq əzab (qiyamət əzabının nə vaxt və kimə üz verəcəyi) barədə soruşdu.

2. (O əzabı) kafirlərdən dəf edə biləcək bir kimsə yoxdur!

3. (O əzab yüksək) dərəcələr sahibi olan Allahdandır!

4. Mələklər və ruh (Cəbrail) Onun dərgahına (dünya ilə müqayisədə) müddəti əlli min il olan bir gündə qalxarlar.

5. (Ya Peyğəmbər! Kafirlərin əziyyətlərinə) mətanətlə (heç bir təlaş, narahatlıq keçirmədən) səbr et!

6. Şübhəsiz ki, onlar (müşriklər) onu (o əzabı) uzaq görürlər (ona inanmırlar).

7. Biz isə onu yaxın görürük (ona inanırıq).

8. O gün göy göyərmiş mis kimi olacaq;

9. Dağlar da didilmiş (rəngbərəng) yun kimi olacaqdır.

10. Və dost dostu arayıb axtarmayacaqdır (hərə öz hayına qalacaqdır).

11. Onlar bir-birinə göstəriləcəklər (lakin bir-birini tanısalar da, özlərini tanımamazlığa vurub bir-birindən qaçacaqlar). O günün

əzabından qurtarmaq üçün günahkar istərdi ki, fəda etsin (fidyə versin) öz oğullarını;

12. Övrətini və qardaşını;

13. (Çətin günlərdə) ona sığınacaq verən əşirətini (qohum-əqrəbasını);

14. Və yer üzündə olanların hamısını – təki özünü (Allahın əzabından) qurtarsın!

15. Xeyr (bu mümkün deyildir). Həqiqətən, o (Cəhənnəm) alovlu atəşdir.

16. (Elə bir atəş ki) başın dərisini sıyırıb çıxardır (dərini sümükdən ayırır).

17. Çağırır (o Cəhənnəm itaətdən) çıxanı, (imandan) üz döndərəni

18. Və (mal-dövlət) yığıb saxlayanı! (Allahın payını verməyəni; acizə, yoxsula əl tutmayanı!)

19. Həqiqətən, insan (sərvətə) çox həris (tamahkar və kəmhövsələ) yaradılmışdır!

20. Ona bir pislik üz verdikdə fəryad qoparar.

21. Ona bir xeyir nəsib olduqda isə xəsis olar.

22. Namaz qılanlar istisnadır!

23. O kəslər ki, daim namaz qılarlar;

24. O kəslər ki, onların mallarında müəyyən bir haqq (pay) vardır -

25. Dilənən və (hər şeydən) məhrum olan (lakin abrına qısılıb dilənməyən) kimsə üçün;

26. O kəslər ki, haqq-hesab gününü təsdiq edərlər;

27. O kəslər ki, Rəbbinin əzabından qorxub tir-tir əsərlər;

28. Çünki onların Rəbbinin əzabından (bu əzabın kiməsə toxunub-toxunmayacağından) arxayın olmaq olmaz;

29. O kəslər ki, ayıb yerlərini qoruyub saxlayarlar (zina etməzlər);

30. Övrətləri və cariyələri istisna olmaqla. (Onlarla yaxınlıq etməyə görə) əsla qınanmazlar;

31. Bundan artığını istəyənlər isə həddi aşanlardır;

32. O kəslər ki, əmanətə xəyanət etməz, verdikləri sözü yerinə yetirərlər;

33. O kəslər ki, düzgün şəhadət verərlər

34. Və o kəslər ki, namazlarını (layiqincə) hifz edərlər-

35. Məhz onlar cənnətlərdə ehtiram olunacaq (əzizlənəcək) kimsələrdir!

36. (Ya Peyğəmbər!) Kafirlərə nə olub ki, (boyunlarını qabağa uzadıb) sənə tərəf tələsirlər?

37. Sağdan və soldan dəstə-dəstə gəlirlər?

38. Məgər onların hər biri Nəim cənnətlərinəmi daxil olacağına ümid edir?

39. Xeyr! (Bu ola bilməz). Biz onları özlərinin bildiyi şeydən yaratdıq! (İnsan bir qətrə natəmiz nütfədən xəlq edilmişdir. İnsanın etiqadı, imanı olmasa, bu vecsiz maddənin nə dəyərini, nə də qiyməti ola bilər?! Bu və ya digər şəxsin Cənnətə daxil olması üçün başlıca şərt onun Allaha iman gətirib Ona səmimi-qəlbdən itaət etməsidir. Nicat yolu yalnız budur!)

40. Məşriqlərin və məğriblərin Rəbbinə and olsun ki, Biz, həqiqətən, qadirik.

41. Onları özlərindən daha yaxşısı ilə əvəz etməyə (onları məhv edib yerlərinə Allaha müti olan başqa bir məxluq gətirməyə). Və (bu işdə) heç kəs Bizim qarşımıza keçə bilməz! (Bizə mane ola bilməz!)

42. Elə isə (ya Peyğəmbər!) qoy onlar vəd olunduqları günə qovuşanadək (batil əməllərinə) dalsınlar və oynayıb-əylənsinlər!

43. O gün onlar (dünyada ibadət etdikləri) bütlərin yanına tələsirmişlər kimi qəbirlərdən tez-tələsik çıxacaqlar.

44. Onların gözləri zəlilcəsinə yerə dikiləcək, özlərini də zillət bürüyəcəkdir. Bu onlara vəd olunmuş həmin qiyamət günüdür!

## .71.
## Nuh surəsi

**(Məkkədə nazil olmuşdur, 28 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Həqiqətən, Biz Nuhu: "Qövmünə şiddətli bir əzab gəlməmişdən əvvəl onları (Allahın əzabı ilə) qorxut!" – deyə öz tayfasına peyğəmbər göndərdik.

2. O dedi: "Ey qövmüm! Həqiqətən, mən sizi (Allahın əzabı ilə) açıq-aşkar qorxudan bir peyğəmbərəm!

3. Allaha ibadət edin, Ondan qorxun və mənə də itaət edin!

4. (Əgər belə etsəniz) O sizin günahlarınızdan keçər, sizə müəyyən vaxtadək (əcəliniz çatana qədər) möhlət verər (cəzanızı dünyada verməyib axirətə saxlayar). Allahın (əzəldən lövhi-məhfuzda) müəyyən etdiyi əcəl (ölüm) gəlib çatdıqda isə, o əsla təxirə salınmaz. Kaş biləydiniz!"

5. O dedi: “Ey Rəbbim! Mən qövmümü gecə-gündüz (imana, haqq yola) dəvət etdim!

6. Lakin dəvətim onların (imandan) qaçmalarını daha da artırmaqdan başqa bir şeyə yaramadı.

7. Sənin onları bağışlamağın üçün mən nə zaman onları (imana) dəvət etdimsə, onlar (dəvətimi eşitməsinlər deyə) barmaqlarını qulaqlarına tıxadılar, (məni görməsinlər deyə) libaslarına büründülər, (küfrlərində) israr edib durdular və təkəbbür göstərdilər.

8. Sonra mən onları uca səslə (açıq-açığına haqqa) dəvət etdim.

9. Daha sonra onlara (iman gətirmək lazım olduğunu) aşkar söylədim və gizli bildirdim”.

10. Və dedim: “(Tövbə edib) Rəbbinizdən bağışlanmağınızı diləyin. Çünki O, (tövbə edən bəndəsinin günahlarını) çox bağışlayandır!

11. O sizə göydən bol yağış göndərər;

12. O sizə mal-dövlət, oğul-uşaq əta edər. O sizin üçün bağlar-bağçalar yaradır və çaylar axıdar!

13. Sizə nə olub ki, Allahın əzəmətindən çəkinmirsiniz? (Sizə nə olub ki, Allahın əzəmət və qüdrətindən qorxmur, Onu layiqincə uca tutmursunuz? Yaxud iman gətirəcəyiniz təqdirdə Allahın axirətdə sizə mərhəmət əta edəcəyinə ümid bəsləmirsiniz?)

14. Halbuki O sizi cürbəcür (və ya müxtəlif mərhələlərlə - əvvəl nütfə, sonra laxtalanmış qan, sonra bir parça ət və, nəhayət, insan şəklində) xəlq etdi.

15. Məgər görmürsünüz ki, Allah yeddi göyü (bir-birinin üstündə) qat-qat necə yaratdı?!

16. Orada ayı bir nur, günəşi də bir çıraq etdi.

17. Və Allah sizi (atanız Adəmi) yerdən (torpaqdan) bir bitki kimi göyərtdi.

18. Sonra sizi yenə ora qaytaracaq və (qiyamət günü dirildib oradan da) çıxardacaqdır.

19. Allah yeri sizin üçün xalı etdi (fərş kimi ayaqlarınızın altına döşədi) ki,

20. Onun geniş yollarında gəzəsiniz!"

21. Nuh dedi: "Ey Rəbbim! Onlar mənə qarşı çıxdılar və mal-dövləti, oğul-uşağı özlərinə ziyandan başqa bir şey artırmayan kimsələrə (öz kafir başçılarına) tabe oldular.

22. (Onların kafir başçıları mənim əleyhimə) çox böyük bir hiylə qurdular.

23. Və (tabeçiliyində olanlara) dedilər: "Öz tanrılarınızı tərk etməyin, (xüsusilə) Bəddi, Suvaı, Yəğusu, Yəuqu və Nəsri atmayın!"

24. Onlar çoxlarını yoldan çıxartdılar. Sən də (ey Rəbbim!) ancaq onların zəlalətini artır!"

25. Onlar öz günahlarından dolayı suda boğdurulub Cəhənnəmə daxil edildilər və özlərinə onları Allahdan (Allahın əzabından) qurtaracaq köməkçilər də tapa bilmədilər!

26. Nuh dedi: "Ey Rəbbim! Yer üzündə bir nəfər belə kafir qoyma!

27. Çünki sən onları (sağ) buraxsan, onlar Sənin bəndələrini yoldan çıxardacaq, ancaq pozğun və kafir (oğul-uşaq) doğub-törədəcəklər.

28. Ey Rəbbim! Məni, ata-anamı, mənim evimə (yaxud məscidimə) mömin kimi daxil olan kimsəni və (qiyamət gününə qədər olacaq) bütün mömin kişiləri və qadınları bağışla. Zalımların isə ancaq və ancaq həlakını (ölümünü) artır!"

## .72.
## əl-Cin (Cinlər) surəsi
**(Məkkədə nazil olmuşdur, 28 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Ya Peyğəmbər!) De: “Mənə vəhy olundu ki, bir dəstə cin (Məkkə və Taif arasında sübh namazı vaxtı Quranı dinləyib öz həmcinslərinin yanına qayıtdıqları zaman) dedilər: “Biz çox qəribə (təsəvvür edilməz dərəcədə gözəl olan) bir Quran eşitdik.

2. O, (xalqa) haqq yolu göstərir. Biz ona iman gətirdik və biz bir daha heç kəsi Rəbbimizə şərik qoşmayacağıq.

3. Həqiqətən, Rəbbimizin calalı çox ucadır. O Özünə nə bir zövcə götürmüşdür, nə də bir uşaq!

4. Doğrusu, bizim səfehimiz (İblis) Allah barəsində tamamilə yalan (haqdan uzaq sözlər) söyləyirmiş.

5. Biz elə güman edirdik ki, nə insan, nə də cin tayfası Allah barəsində yalan danışmaz.

6. Həqiqətən, (Cahiliyyət dövründə) bəzi insanlar bir para cinlərə pənah aparır, bununla da onların təkəbbürünü (azğınlığını) artırırdılar (cinlər özləri haqqında çox böyük fikirlərə düşürdülər).

7. Onlar (o insanlar) da siz (cinlər, yaxud o cinlər də siz insanlar) təkin elə güman edirdilər ki, Allah heç kəsi (öləndən sonra) diriltməyəcəkdir.

8. Biz (cinlər yuxarı aləm əhlinin söhbətinə oğrun-oğrun qulaq asmaq üçün) göyə qalxmaq istədik (səmanı yoxladıq), amma onun (mələklərdən ibarət) güclü gözətçilər və yandırıb-yaxan (axan) ulduzlarla dolu olduğunu gördük.

9. Biz (Muhəmməd əleyhissəlamın peyğəmbər göndərilməsindən əvvəl mələklərin söhbətinə) qulaq asmaq üçün (göyün) bəzi yerlərində otururduq. Lakin indi kim (onların söhbətinə) qulaq asmış olsa, yandırıb-yaxan bir ulduzun onu gözlədiyini görər.

10. Biz bilmirik ki, (göyün gözətçi mələklərlə, axan ulduzlarla doldurulması və mələklərin söhbətinə qulaq asmağın bizə qadağan edilməsi ilə) yerdə olanlara bir pislik etmək istənilmişdir, yoxsa Rəbbi onlara bir xeyir diləmişdir.

11. Şübhəsiz ki, aramızda əməlisaleh olanlar da var, olmayanlar da. Biz müxtəlif firqələrə (məzhəblərə) ayrılmışıq.

12. Biz anladıq ki, yerdə də olsaq, (göyə də) qaçsaq, Allahdan (Allahın əzabından) canımızı qurtara bilmərik (heç yerdə, heç zaman Allahı aciz edə bilmərik).

13. Doğrusu, biz hidayət yolunu göstərəni (Quranı) dinlədiyimiz zaman ona iman gətirdik. Kim Rəbbinə iman gətirsə, nə (yaxşı əməllərinin mükafatını) əskilməsindən, nə də haqsızlığa məruz qalmaqdan (başqasının günahlarının ona yüklənməsindən) qorxar.

14. Şübhəsiz ki, aramızda (Allaha və Onun Peyğəmbəri Muhəmməd əleyhissəlama iman gətirən) müsəlmanlar da var, (haqq yoldan) çıxanlar da. Müsəlman olanlar haqq yolu axtarıb tapanlardır.

15. (Haqq yoldan) çıxanlar isə Cəhənnəm üçün odun olacaqlar (orada yandırılacaqlar)”

16. (Sonra mənə belə vəhy olundu: ) Əgər onlar (Məkkə müşrikləri) o yolda (islam dinində) doğru olsaydılar, Biz onlara (yeddi il davam edən quraqlıq və qıtlıq əsnasında) bol yağış verərdik ki,

17. Onları bununla (bu nemətlə) imtahana çəkək. Kim öz Rəbbini yad etməkdən üz çevirsə, (Allah) onu məşəqqətli bir əzaba düçar edər.

18. Şübhəsiz ki, (bütün) məscidlər Allaha məxsusdur. Allahdan başqa heç kəsə ibadət etməyin!

19. Allahın bəndəsi (Muhəmməd əleyhissəlam) Ona ibadət etmək (namaz qılmaq) üçün qalxdıqda (cinlər) az qalmışdı ki, onun ətrafında keçə kimi bir-birinə keçsinlər (izdihamın çoxluğundan bir-birinin üstünə minsinlər).

20. (Ya Peyğəmbər!) De: "Mən ancaq öz Rəbbimə ibadət edirəm və heç kəsi Ona şərik qoşmuram!"

21. De: "Mən sizə nə bir zərər, nə də bir xeyir vermək qüdrətinə malik deyiləm! (Bunu ancaq aləmlərin Rəbbi olan Allah edə bilər!)"

22. De: "Məni Allahdan (Allahın əzabından) heç kəs qurtara bilməz və mən də Ondan başqa heç bir sığınacaq tapa bilmərəm!

23. (Mənim əlimdən) Allah dərgahından olanı və Onun göndərdiklərini (Quranı və dini hökmləri) təbliğ etməkdən başqa (heç bir şey gəlməz). Allah və Onun Peyğəmbərinə asi olanları cəhənnəm odu gözləyir. Onlar orada həmişəlik qalacaqlar!"

24. Onlar təhdid olunduqlarını (qiyamətdəki, və ya Bədr vuruşundakı əzabı) gördükləri zaman kimin köməkçisinin daha zəif və sayca daha az olduğunu biləcəklər.

25. De: "Mən sizin qorxudulduğunuz əzabın yaxın olduğunu, yaxud Rəbbimin onun üçün uzun bir müddət təyin edəcəyini bilmirəm!

26. Qeybi bilən ancaq Odur və Öz qeybini heç kəsə əyan etməz;

27. Bəyənib seçdiyi peyğəmbərdən başqa! (Qeybi nə bir mələk, nə də bir peyğəmbər bilər. Onun açarları ancaq Allahın əlindədir. Lakin Allah istədiyi peyğəmbərə bir möcüzə olaraq vəhy yolu ilə qeybdən bəzi xəbərlər bildirər). Allah onların önündə və arxasında (mələklərdən ibarət) gözətçilər qoyar ki,

28. (Peyğəmbərlərinin) öz Rəbbinin göndərdiklərini (nə cür) təbliğ etdiyini bilsin (bəlli etsin). (Allah) onlarda olanların hamısını (peyğəmbərlərin əhvalatını və bütün əməllərini Öz elmi ilə) ehtiva etmişdir. O, hər şeyi bir-bir sayıb yazmışdır (təsbit etmişdir)!”

## .73.
## əl-Muzzəmmil (Örtünüb bürünən) surəsi

**(Məkkədə nazil olmuşdur, 20 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Ey (libasına) örtünüb bürünən (əbasına bürünüb yatan Peyğəmbər)!

2. Gecəni – az bir hissəsi istisna olmaqla – qalxıb namaz qıl!

3. (Gecənin) yarısına qədər, yaxud bir qədər ondan az;

4. Və ya bir qədər ondan çox! (Sənin gecəni oyaq qalıb namaz qılmağın onun üçdə bir hissəsindən az, üçdə ikisindən çox olmasın!) Həm də (gecə ibadət etdiyin zaman) aramla (ağır-ağır) Quran oxu!

5. Həqiqətən, Biz sənə (məsuliyyəti) ağır bir kəlam (Quran) vəhy edəcəyik.

6. Şübhəsiz ki, gecə (namaz qılmaq üçün) qalxmaq (çox çətin olsa da) daha əlverişli və (o zaman) söz demək (Quran oxumaq, dua etmək) daha münasibdir!

7. Çünki gündüz (ya Peyğəmbər!) sənin uzun-uzadı davam edən (dünyəvi) işlərin vardır. (Gündüz insanın işi çox olur, məişət işləri

hardasa onu ibadətdən bir qədər yayındırır. Gecə isə insan rahatlaşır, heç kəs ona mane olmur. İnsan öz daxilinə qapılıb Rəbbi ilə tək qalır, qulaq qəlbə daha yaxın olur. Buna görə də gecə ibadət etmək çətin olsa da, daha məqsədəuyğundur).

8. Rəbbinin adını zikr et və (hər şeyi buraxıb) Ona tərəf yönəl.

9. O, məşriqin və məğribin Rəbbidir. Ondan başqa heç bir tanrı yoxdur. (Özünə) ancaq Onu vəkil et!

10. (Ya Peyğəmbər!) Onların (Məkkə müşriklərinin) sənə deyəcəklərinə (batil söz və iftiralarına) səbr et. Onlardan gözəl tərzdə ayrıl!

11. (Ayələrimizi) yalan sayan var-dövlət sahiblərini mənə tapşır və onlara bir az möhlət ver! (Tezliklə cəzalarına yetişərlər).

12. Dərgahımızda (onlardan ötrü ağır) qandallar və (alovlu) Cəhənnəm;

13. Boğaza tıxanıb qalan yemək (zəqqum) və (yandırıb-yaxan) şiddətli əzab vardır!

14. O gün (qiyamət qopandan) yer və dağlar lərzəyə gəlib titrəyəcək, dağlar (dağılıb) yumşaq qum təpəsinə dönəcəkdir.

15. Həqiqətən, Biz - Firona peyğəmbər göndərdiyimiz kimi – sizə də (qiyamət günü Allahın hüzurunda) şahidlik edəcək peyğəmbər göndərdik.

16. Firon o peyğəmbərə (Musaya) asi oldu və Biz də onu şiddətli əzabla yaxaladıq (həm özünün, həm də onunla birlikdə olanları suda boğduq).

17. Elə isə əgər küfr etmiş olsanız, uşaqları ağ saçlı qocalara döndərəcək gündən (qiyamət gününün əzabından) özünüzü necə qoruyacaqsınız?!

18. (O gün) göy parçalanaraq, (Allahın) vədi yerinə yetəcəkdir.

19. Həqiqətən, bu (ayələr insanlara) öyüd-nəsihətdir. Hər kəs istəsə, Rəbbinə tərəf bir yol tutar! (İbadət və itaətlə Allaha yaxınlaşar!)

20. (Ya Peyğəmbər!) Həqiqətən, Rəbbin bilir ki, sən (yatağından) qalxıb bəzən gecənin təqribən üçdə ikisini, bəzən yarısını, bəzən də üçdə birini namaz qılırsan. Səninlə birlikdə olan bir zümrə (yaxın səhabən) də belədir. Gecəni də, gündüzü də ölçüb-biçən ancaq Allahdır. O sizin bunu (gecə vaxtlarını və saatlarını) ölçüb saya bilməyəcəyinizi (yaxud bütün gecəni oyaq qalıb ibadət edə bilməyəcəyinizi) bildiyi üçün sizi əfv etdi (sizə rüsxət verdi). Qurandan sizə müyəssər olanı oxuyun. (Allah) bilir ki, içərinizdə xəstələr də olacaq, bəziləri Allahın lütfündən ruzi axtarmaq üçün (ticarət məqsədilə) yer üzünü gəzib dolaşacaq, digərləri isə Allah yolunda vuruşacaqdır (cihada gedəcəkdir). Elə isə ondan (Qurandan) sizə müyəssər olanı oxuyun, namaz qılın, zəkat verin və Allah yolunda gözəl (könül xoşluğu ilə) bir borc verin. Özünüz üçün öncə (dünyada) nə yaxşı iş görsəniz, Allah dərgahında onun daha xeyirli və daha böyük mükafatı olduğunu görəcəksiniz. Allahdan bağışlanmağınızı diləyin. Həqiqətən, Allah bağışlayandır, rəhm edəndir!

## .74.
## əl-Muddəssir (Bürünüb sarınan) surəsi

**(Məkkədə nazil olmuşdur, 56 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Ey (libasına) bürünüb sarınan (Peyğəmbər)!

2. Qalx (qövmünü Allahın əzabı ilə) qorxut!

3. Öz Rəbbini uca tut!

4. Libasını təmizlə! (Nəfsini günahlardan pak et!)

5. (Əzaba səbəb olacaq) pis şeylərdən uzaqlaş! (Bütləri tərk et!)

6. (Etdiyin yaxşılığı) çox bilib başa qalxma! (Heç kəsə minnət qoyma!)

7. Rəbbinin yolunda (Rəbbinin rizasını qazanmaq üçün bu yolda sənə üz verəcək bütün çətinliklərə) səbr et!

8. Elə ki, sur çalındı,

9. O gün çox ağır bir gün olacaqdır;

10. (O gün) kafirlər üçün asan olmayacaqdır!

11. (Ya Peyğəmbər!) Məni Öz yaratdığım kimsə ilə tək burax! (Vəlid ibn Müğirə kimi kafirin cəzasını yalnız Mənə tapşır!)

12. Mən ona bollu mal-dövlət əta etdim;

13. Yanında hazır duran oğullar (verdim);

14. Ona (hər şeyi) artıqlaması ilə müyəssər etdim (sərvət və mənsəbi ayağının altına döşədim).

15. (Bütün bunlardan) sonra yenə də (var-dövlətini) artırmağımı istəyir.

16. Xeyr (bu ola bilməz). Çünki o, ayələrimizə qarşı inadkar oldu.

17. Mən onu məşəqqətli bir əzaba düçar edəcəyəm!

18. O (Quran barəsində) fikirləşdi və (orada deyilənləri öz ürəyində) ölçdü-biçdi.

19. Ölüm olsun ona! Necə ölçdü-biçdi?! (Peyğəmbərə sehrbaz dedi).

20. Yenə də ölüm olsun ona! Necə ölçdü-biçdi?!

21. Sonra (qövmünün üzünə) baxdı.

22. Sonra üz-gözünü turşutdu, qaşqabağını tökdü.

23. Sonra da (imandan) üz çevirdi, (Peyğəmbərə tabe olmağa) təkəbbür göstərdi.

24. Və dedi: "Bu (sehrbazlardan) öyrənilən sehrdən başqa bir şey deyildir!

25. Bu yalnız bəşər sözüdür!"

26. Biz onu Səqərə atacağıq (orada yandıracağıq).

27. (Ya Peyğəmbər!) Sən nə bilirsən (haradan bilirsən) ki, nədir Səqər!

28. O (heç kəsi sağ) qoymaz və (salamat) buraxmaz!

29. İnsanı yandırıb-yaxar!

30. Onun üstündə on doqquz (nəfər gözətçi mələk) vardır.

31. Biz cəhənnəm gözətçilərini yalnız mələklərdən etdik. Biz onların sayını ancaq kafirlərin imtahana çəkilməsi, kitab verilənlərin yəqinlik hasil etməsi (çünki onların kitablarında bu mələklərin sayı on doqquzdur), iman gətirənlərin imanının daha da artması, kitab əhlinin və möminlərin (bununla əlaqədar Muhəmməd əleyhissəlam barəsində) şübhəyə düşməməsi, həmçinin qəlblərində mərəz (nifaq və şəkk mərəzi) olanların və kafirlərin: "Allah bu misalla nə demək istəyir?" – demələri üçün (on doqquz) etdik. Allah istədiyi kimsəni (haqq yoldan) belə sapdırır və istədiyini də doğru yola salır. Rəbbinin

ordularını özündən başqası bilməz. Bu (vəsf olunan Səqər) insanlar üçün ancaq bir öyüd-nəsihətdir!

32. Xeyr! (İş heç də bu müşriklərin zənn etdiyi kimi deyildir). And olsun aya;

33. Dönüb-qayıdan (yaxud gündüzün dalınca gələn) gecəyə

34. Və sökülməkdə olan dan yerinə ki,

35. (Cəhənnəm) böyük bəlalardan biridir!

36. (O, Allahın əzabı ilə) qorxudur insanları -

37. Sizdən (yaxşı işlərdə) irəli düşmək, yaxud geri qalmaq istəyənləri!

38. Hər kəs öz əməlinin girovudur! (Hərə öz əməlinin əvəzini alacaqdır!)

39. Sağ tərəf sahibləri (əməl dəftərləri sağ əllərinə verilənlər) istisna olmaqla!

40. Onlar cənnətlərdədirlər; bir-birindən soruşacaqlar;

41. Günahkarlar barəsində (və sonra həmin günahkarlara müraciət edib belə deyəcəklər):

42. “Sizi Səqərə (Cəhənnəmə) salan nədir?”

43. Onlar deyəcəklər: “Biz namaz qılanlardan deyildik;

44. Yoxsulu da yedirtməzdik;

45. Batilə dalanlarla birlikdə biz də dalardıq;

46. Haqq-hesab gününü yalan sayardıq.

47. Ölüm bizi haqlayana qədər (bu vəziyyətdə qaldıq)”.

48. Şəfaət edənlərin şəfaəti onlara fayda verməz!

49. Onlara nə olub ki, öyüd-nəsihətdən üz çevirirlər (qaçırlar).

50. Onlar sanki vəhşi eşşəklərdir.

51. (O eşşəklər ki) aslandan hürküb qaçarlar!

52. Xeyr, onların hər biri özünə (göydən) nazil olmuş səhifələr verilməsini istəyər.

53. Xeyr, daha doğrusu, onlar axirətdən qorxmazlar!

54. Xeyr, bu (Quran) bir öyüd-nəsihətdir!

55. İstəyənlər ondan öyüd alar.

56. Bununla belə, Allah istəməsə, onlar əsla öyüd ala bilməzlər. Qorxub çəkinməyə də, bağışlamağa da layiq olan ancaq Odur!

## .75.
## əl-Qiyamə (Qiyamət) surəsi

**(Məkkədə nazil olmuşdur, 40 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. And içirəm qiyamət gününə;

2. And içirəm (günah etdiyi üçün, yaxud yaxşı əməli azdır deyə) özünü qınayan nəfsə! (Siz öləndən sonra mütləq diriləcəksiniz!)

3. Məgər insan elə güman edir ki, (qiyamət günü) onun sümüklərini bir yerə yığa bilməyəcəyik?!

4. Bəli, Biz onun barmaqlarını da (barmaq sümüklərini də, barmaqlarının uclarını da) düzəltməyə qadirik!

5. Lakin insan (bundan sonra da) önündəkini (qiyaməti) danmaq (pis işlər görmək) istəyər.

6. Və (istehza ilə): “Qiyamət günü nə vaxt olacaqdır?” – deyə soruşar.

7. Göz (heyrətdən) bərələcəyi;

8. Ay tutulacağı;

9. Günəşlə ay birləşəcəyi (hər ikisinin qərbdən çıxacağı, nurunun gedəcəyi) zaman -

10. Məhz o gün insan: “Qaçıb can qurtarmağa yer haradadır?” – deyəcəkdir.

11. Xeyr, (o gün) heç bir sığınacaq olmayacaqdır!

12. O gün (ey insan!) duracaq (pənah aparılacaq) yer ancaq Rəbbinin hüzurudur!

13. O gün insana öncə etdiyi və sonraya qoyduğu nə varsa (sağlığında dünyada gördüyü işlər və öləndən sonra qoyub getdiyi yaxşı, pis nə varsa, hamısı) xəbər veriləcəkdir!

14. Doğrusu, insan özü-özünə şahiddir!

15. O, hər cür üzrxahlıq etsə də, (qəbul olunmaz)!

16. (Ya Peyğəmbər! Cəbrail sənə Quran oxuduğu zaman) onu tələm-tələsik əzbərləmək üçün dilini tərpətmə! (Sən də onunla birlikdə Quranı təkrar etmə, yalnız dinlə!)

17. Çünki onu (sənin qəlbində) cəm etmək, (dilində) oxutmaq Bizə aiddir.

18. Biz onu (Cəbrailin dili ilə) oxutduğumuz zaman oxunmasını diqqətlə dinlə.

19. Sonra onu (sənə) bəyan etmək də Bizə aiddir!

20. Xeyr, xeyr! Siz tez keçib gedəni (fani dünyanı) sevirsiniz.

21. Axirəti isə tərk edirsiniz.

22. O gün neçə-neçə üzlər sevinib güləcək,

23. Öz Rəbbinə baxacaqdır!

24. O gün neçə-neçə üzlər tutulub qaralacaq,

25. (Sahiblərinin) bel sümüklərinin (dəhşətli bir əzabla) qırılacağını anlayacaqdır!

26. Xeyr, (can) boğaza (körpücük sümüklərinə) gəlib yetişəcəyi,

27. "(Onu bu bəladan) kim xilas edə bilər?" – deyiləcəyi,

28. (Can üstə olan kimsə) ayrılıq dəminin gəlib çatdığını anlayacağı,

29. Və (ölüm qorxusundan) qıçı-qıçına dolaşacağı zaman,

30. Aparılacağı yer Rəbbinin hüzuru olacaqdır (ey insan)!

31. Beləliklə, o (kafir Əbu Cəhl) nə (Quranı) təsdiq etdi, nə də namaz qıldı.

32. Amma (Allah kəlamını) yalan saydı, (ondan) üz döndərdi.

33. Sonra da özünü darta-darta ailəsinin yanına getdi.

34. Vay sənin halına, vay!

35. Yenə də vay sənin halına, vay!

36. Məgər insan elə güman edir ki, o, başlı-başına (cəzasız) buraxılacaq?!

37. Məgər o tökülən bir qətrə nütfə deyildimi?!

38. Sonra laxtalanmış qan oldu və (Allah) onu yaradıb surət verdi (insan şəklinə saldı).

39. Sonra da ondan biri kişi, biri qadın olmaqla iki cift (həmtay) yaratdı.

40. Elə isə O Allah ölüləri diriltməyə qadir deyildirmi?!

## .76.

## əl-İnsan və ya əd-Dəhr surəsi

**(Məkkədə nazil olmuşdur, 31 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. İnsanın elə bir dövrü olub keçmişdir ki, o, xatırlanmağa layiq bir şey olmamışdır! (Yaxud insanın elə bir dövrü olub keçmişdir ki, o həmin dövrdə xatırlanası bir şey olmasın?! Əlbəttə, olmuşdur. İnsan əvvəlcə mövcud deyildi. Sonra o, yəni ulu babamız Adəm torpaqdan və sudan yoğrulub insan şəklinə salınmış, ona ruh verilmiş və o, həyat sürməyə başlamışdır. İnsanın nə üçün yaradıldığını əvvəlcə nə göy əhli, nə də o özü bilirdi. Tədriclə mələklər və o özü nə üçün yaradıldığını anladı).
2. Həqiqətən, Biz insanı (sonrakı mərhələdə ata-anasının toxumundan ibarət) qarışıq bir nütfədən yaratdıq. Biz onu (dünyada özünü necə aparacağı, hər şeyin xaliqi olan Allaha itaət edib-etməyəcəyi ilə) imtahana çəkəcəyik. Biz onu eşidən, görən yaratdıq.
3. Biz ona haqq yolu göstərdik. İstər (nemətlərimizə) minnətdar olsun, istər nankor (bu onun öz işidir).
4. Biz kafirlər üçün zəncirlər, qandallar və alovlu bir atəş hazırlamışıq.
5. Şübhəsiz ki, yaxşı əməl və itaət sahibləri (Cənnətdə) kafur qatılmış (şərabla dolu) qədəhdən içəcəklər.
6. O (kafur) elə bir çeşmədir ki, Allahın bəndələri ondan içəcək və onu (istədikləri yerə) asanlıqla axıdacaqlar.

7. Onlar (Cənnətə nail olacaq müttəqilər) elə kimsələrdirlər ki, verdikləri sözü (etdikləri nəziri) yerinə yetirər və dəhşətli (aləmi) bürüyəcək (şəri hər tərəfə yayılacaq) gündən (qiyamət günündən) qorxarlar.

8. Onlar öz iştahaları çəkdiyi (özləri yemək istədikləri) halda (və ya: Allah rizasını qazanmaq uğrunda) yeməyi yoxsula, yetimə və əsirə yedirərlər.

9. (Və sonra da yedirtdikləri kimsələrə belə deyərlər: ) "Biz sizi ancaq Allah rizasından ötrü yedirdirik. Biz sizdən (bu ehsan müqabilində) nə bir mükafat, nə də bir təşəkkür istəyirik.

10. Həqiqətən, biz Rəbbimizdən, çox sərt (müdhiş), çətin gündən (üzlərin dəhşətdən eybəcər kökə düşəcəyi, çöhrələrin tutulub qaralacağı qiyamət günündən) qorxuruq!"

11. Allah da onları o günün şərindən qoruyacaq, onlara gözəllik və sevinc bəxş edəcəkdir (üzlərinə təravət verəcək, qəlblərini sevindirəcəkdir).

12. Və onları etdikləri səbr müqabilində Cənnətlə və (geyəcəkləri) ipəklə mükafatlandıracaqdır.

13. Onlar orada (o cənnətlərdə) taxtlara söykənəcək, orada nə günəş (qızmar isti), nə də sərt soyuq görəcəklər.

14. (Cənnət ağaclarının) kölgələri üstlərinə düşəcək, meyvələri də onların ixtiyarında olacaqdır (istədikləri yerdə, istədikləri zaman onları dərib yeyə biləcəklər).

15. (Cənnətdəki xidmətçilər) onların ətrafında gümüş qablar və büllur qədəhlərlə dolanacaqlar.

16. Gümüşdən olan (çox şəffaf olduğu üçün bayırından içərisi görünən) elə büllur (qədəhlərlə) ki, (xidmətçilər) onları (sahiblərinə) münasib ölçüdə etmişlər.

17. Orada onlara zəncəfil qatılmış (zəncəfil dadı verən cənnət şərabı ilə dolu) badə də içirdiləcəkdir.

18. (Zəncəfil) orada (Cənnətdə) bir çeşmədir ki, (suyu boğazdan çox rahat keçdiyi üçün) Səlsəbil adlanır.

19. Onların dövrəsində həmişəcavan (xidmətçi) oğlanlar olacaqdır. Onları gördükdə, sanki (ətrafa) səpilmiş inci olduqlarını zənn edərsən.

20. (Orada) hara baxsan, nemət və böyük bir mülk görərsən.

21. (Cənnət əhlinin) əyinlərində taftadan və atlazdan (nazik və qalın ipəkdən) yaşıl libaslar olacaq, onlara gümüşdən bilərziklər taxılacaqdır. Rəbbi onlara çox pak bir şərab içirdəcəkdir.

22. (Onlara belə deyiləcəkdir: ) “Bu sizin (dünyada etdiyiniz yaxşı əməllərə görə) mükafatınızdır. Zəhmətiniz (Allah yanında) məqbuldur (təqdirəlayiqdir)!”

23. (Ya Peyğəmbər!) Həqiqətən, Biz Quranı sənə tədriclə (ayə-ayə, surə-surə) nazil etdik.

24. Elə isə Rəbbinin hökmünə səbr et və onlardan (Məkkə müşriklərindən) günahkar və nankor olana boyun əymə!

25. Səhər-axşam Rəbbinin adını zikr et! (Səhər, günorta və ikindi namazlarını qıl!)

26. Gecənin bir qismində Ona səcdə et (axşam, gecə namazlarını qıl) və gecə uzunu da Onu təqdis edib şəninə təriflər de! (Təhəccüd namazını qılıb gecəni ibadət içində keçir!)

27. Həqiqətən, bunlar (Məkkə müşrikləri) tez keçib gedəni (fani dünyanı) sevər, ağır günə (qiyamət gününə) dal çevirərlər.

28. Onları yaradan da, güclü-qüvvətli edən də (oynaqlarını bir-birinə bağlayan da) Bizik. Əgər istəsək, onları özləri kimilərlə əvəz edərik.

29. Həqiqətən, bu (surə) bir öyüd-nəsihətdir. Kim istəsə, Rəbbinə tərəf bir yol tutar (ibadət və itaətlə Allaha yaxınlaşar).

30. (Ey insanlar! Onu da bilin ki) Allah istəməsə, siz (bunu) istəyə bilməzsiniz. (Ancaq Allah istəsə, istəyə bilərsiniz). Həqiqətən, Allah (hər şeyi) biləndir, hikmət sahibidir!

31. (Allah) istədiyi kimsən Öz mərhəmətinə qovuşdurar. Zalımlara gəldikdə isə, (Allah) onlar üçün (axirətdə) şiddətli bir əzab hazırlamışdır!

## .77.
## əl-Mursəlat (Bir-birinin ardınca göndərilənlər) surəsi

**(Məkkədə nazil olmuşdur, 50 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. And olsun bir-birinin ardınca göndərilənlərə (mələklərə, peyğəmbərlərə, yaxud küləklərə);

2. And olsun şiddətlə əsənlərə (və ya yel kimi tez gedənlərə);

3. And olsun (Allahın ayələrini, kitablarını və əmrlərini) yayanlara;

4. And olsun (haqla batili) ayıranlara;

5. And olsun vəhyi (peyğəmbərlərə) çatdıranlara-

6. (Möminlər tövbə edib) üzr diləmək və ya (kafirləri) qorxutmaq üçün (olan vəhyi çatdıranlara) ki,

7. Sizə vəd edilən (qiyamət) mütləq vaqe olacaqdır!

8. Ulduzlar sönəcəyi;

9. Göy yarılacağı;

10. Dağlar parça-parça olub dağılacağı (toz kimi havada uçacağı);

11. Peyğəmbərlərə (öz ümmətlərinə şahidlik etmək üçün bir qədər) möhlət veriləcəyi zaman,

12. (Belə soruşulacaqdır:) “(Bunlara) hansı günə qədər möhlət verilmişdir?”

13. (Həmin suala cavab olaraq deyiləcəkdir: ) “(Haqla batili) ayırd ediləcəyi günə qədər!”

14. Nə bilirsən (haradan bilirsən) ki, nədir o ayırd etmə günü?!

15. O gün vay halına (qiyaməti) yalan sayanların!

16. Məgər Biz əvvəlkiləri (keçmiş kafir ümmətləri) məhv etmədikmi?!

17. Sonra axırda gələnləri (Məkkə müşriklərini) də onlara qatacağıq.

18. Biz günahkarlarla belə rəftar edirik.

19. O gün vay halına (qiyaməti) yalan sayanların!

20. Məgər sizi bir qətrə zəif (dəyərsiz) sudan (nütfədən) yaratmadıqmı?!

21. Biz onu möhkəm bir yerdə (ana bətnində) saxladıq,

22. Müəyyən bir vaxta qədər.

23. Biz (nütfədən insan yaratmağa) qadir olduq. Nə gözəl qadir olanlarıq Biz!

24. O gün vay halına (qiyaməti) yalan sayanların!

25. Məgər Biz yeri məskən etmədikmi

26. Həm dirilərə, həm də ölülərə?! (Yerin altında ölülər yatar, üstündə dirilər gəzib-dolanar).

27. Biz orada möhkəm durmuş uca dağlar yaratdıq və sizə şirin su içirtdik.

28. O gün vay halına (bu nemətləri) yalan sayanların!

29. (O gün kafirlərə belə deyiləcəkdir: ) “Girin (dünyada) yalan hesab etdiyiniz (cəhənnəm əzabının) içinə!

30. Girin (cəhənnəm tüstüsünün) üç qola ayrılmış kölgəsinə!”

31. O (sizə) nə kölgəlik olar, nə də (sizi) alovdan qoruyar.

32. O (hər biri) bir saray boyda qığılcımlar saçar.

33. O (qığılcımlar), sanki sarı dəvə sürükləridir.

34. O gün vay halına (qiyaməti) yalan sayanların!

35. Bu elə bir gündür ki, (qiyaməti yalan sayanlar) danışa bilməzlər.

36. Onlara üzr istəməyə izin də verilməz.

37. O gün vay halına (qiyaməti) yalan sayanların!

38. Bu sizi də, (sizdən) əvvəlkiləri də bir yerə topladığımız (haqla batili) ayırd etmə günüdür!

39. (Dünyada etdiyiniz kimi, bu günün əzabından qurtarmaq üçün) bir hiyləniz varsa, Mənə qarşı qurun görək!

40. O gün vay halına (qiyaməti) yalan sayanların!

41. Həqiqətən, (o gün) müttəqilər kölgəliklərdə və çeşmələr başında,

42. İstədikləri meyvə içində olacaqlar!

43. (Onlara belə deyiləcəkdir: ) "(Dünyada) etdiyiniz (yaxşı) əməllərə görə nuşcanlıqla yeyin-için!

44. Biz yaxşı əməl sahiblərini belə mükafatlandırırıq!"

45. O gün vay halına (qiyaməti) yalan sayanların!

46. (Siz ey kafirlər!) Yeyin və (dünyada) bir az kef çəkin. Həqiqətən, siz günahkarlarsınız! (Axirətdə qismətiniz Cəhənnəmdir!)

47. O gün vay halına (qiyaməti) yalan sayanların!

48. Onlara: "Namaz qılın!" – deyildiyi zaman namaz qılmazlar!

49. O gün vay halına (qiyaməti) yalan sayanların!

50. (Bu kafirlər) ona da (Qurana da) inanmayandan sonra daha hansı kəlama inanacaqlar?!

## .78.
## ən-Nəbə (Böyük xəbər) surəsi
**(Məkkədə nazil olmuşdur, 40 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Bu müşriklər) bir-birindən nə haqqında soruşurlar?

2. Böyük bir xəbər (qiyamət günü) haqqında!

3. Elə bir xəbər ki, onun barəsində ixtilafdadırlar.

4. Xeyr, onlar (qiyamətin haqq olduğunu) mütləq biləcəklər!

5. Bir də (deyirəm) xeyr, onlar (qiyamətin haqq olduğunu) mütləq biləcəklər!

6. Məgər Biz yeri döşək etmədikmi?!

7. Dağları da dirək?!

8. Biz sizləri (erkək və dişi olmaqla) cüt-cüt yaratdıq.

9. Yuxunuzu da istirahət etdik.

10. Biz gecəni (hər şeyi bürüyən) örtük etdik.

11. Gündüzü isə dolanışlıq (ruzi qazanmaq) vaxtı etdik.

12. Üstünüzdə yeddi (qat) möhkəm (göy) qurduq.

13. Sizin üçün çox parlaq bir çıxar (günəş) yaratdıq.

14. (Küləklərin sıxdığı) buludlardan şırıl-şırıl tökülən yağmur endirdik ki,

15. Onunla dən və bitki yetişdirək,

16. Eləcə də (ağacları bir-birinə) sarmaşan bağlar.

17. Həqiqətən, (haqla batili) ayırd etmə günü (əzəldən müəyyən edilmiş) bir vaxtdır!

18. Sur çalınacağı gün (qəbirlərinizdən çıxıb) dəstə-dəstə (məhşərə) gələcəksiniz.

19. (O gün) göy qapı-qapı (mələklərin yerə enməsi üçün göydə yarıqlar) açılacaqdır.

20. Dağlar yerindən qopardılıb (havada toz kimi uçaraq) ilğıma dönəcəkdir.

21. Həqiqətən, Cəhənnəm (mələklərin hazır durub kafirləri gözlədiyi) pusqudur!

22. O, azğınların məskənidir.

23. Onlar orada sonsuz müddət qalacaqlar.

24. Onlar orada nə bir sərinlik (görəcək), nə də içməyə bir şey tapacaqlar;

25. Qaynar sudan və irindən başqa!-

26. (Dünyadakı əməllərinə) uyğun cəza olaraq.

27. Çünki onlar haqq-hesab çəkiləcəyinə ümid bəsləmirdilər (qiyamət gününə inanmır, onun əzabından qorxmurdular).

28. Ayələrimizi də elə hey təkzib edirdilər.

29. Biz hər şeyi (bir-bir) sayıb (lövhi-məhfuzda) yazmışıq (və ya: əməl dəftərində yazıb təsbit etmişik).

30. İndi (ey kafirlər!) dadın əzabı. Biz sizə əzabdan başqa bir şey artırmayacağıq!

31. Həqiqətən, müttəqilərin nicat yeri (Cənnət),

32. Bağçalar və üzüm bağları,

33. Sinələri yenicə qabarmış (dolmuş, tumurcuqlanmış, gözəllikdə və məlahətdə bir-birinə bənzər) həmyaşıd qızlar.

34. (Cənnət şərabı ilə) dolu qədəhlər gözləyir!

35. Onlar orada (Cənnətdə) nə boş söz, nə də yalan eşidəcəklər.

36. (Bu, müttəqilərə) Rəbbindən olan mükafat, artıqlaması ilə verilən bəxşişdir -

37. Göylərin, yerin və onların arasındakıların Rəhman olan Rəbbindən (göndərilən bəxşişdir). Onlar (məxluqat) Onun hüzurunda heç bir söz deməyə qadir olmazlar!

38. Ruhun (Cəbrailin) və mələklərin səf-səf duracağı gün Rəhmanın izin verdiyi kimsələrdən başqa heç kəs danışmayacaq, danışan da doğrunu deyəcəkdir!

39. Bu, haqq olan gündür. Kim dilərsə, (iman gətirib ibadət və itaət etməklə) Rəbbinə tərəf qayıdan bir yol tutar!

40. Həqiqətən, Biz sizi yaxın bir əzabla (qiyamət gününün əzabı ilə) qorxutduq. O gün insan öz əlləri ilə etdiyi (yaxşı, pis) əməlləri görəcək, kafir isə: "Kaş (bu əzabı görməmək üçün) torpaq olaydım!" – deyəcəkdir.

## .79.
## ən-Naziat (Can alanlar) surəsi
**(Məkkədə nazil olmuşdur, 46 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. And olsun (kafirlərin canını) zorla alanlara;

2. And olsun (möminlərin canını) rahatlıqla alanlara;

3. And olsun sürətlə üzənlərə;

4. And olsun (bir-birini) ötdükcə ötənlərə;

5. And olsun işə əncam çəkənlərə (Allahın əmri ilə dünyanın işlərini idarə edən mələklərə ki, qiyamət haqdır və siz qiyamət günü dirilib haqq-hesab üçün Allahın hüzurunda duracaqsınız)!

6. O gün sarsılan sarsılacaq (surun birinci üfürülməsi ilə yer, göy lərzəyə gələcək),

7. Onun ardınca bir sarsıntı da olacaqdır! (Sur ikinci dəfə üfürüləcəkdir. İsrafil suru birinci dəfə çaldıqda hər şey məhv olacaq, ikinci dəfə çaldıqda isə hamı diriləcəkdir. Bunların arası dünya vaxtı ilə müqayisədə qırx il çəkəcəkdir).

8. O gün ürəklər qorxub titrəyəcək,

9. Gözləri (o ürəklərin sahib olduğu gözlər dəhşətdən) zəlilcəsinə yerə dikiləcəkdir.

10. (Qiyaməti inkar edən kafirlər dünyada istehza ilə) deyirlər: “Doğrudanmı biz (öləndən sonra dirilib) əvvəlki vəziyyətimizə qaytarılacağıq?!

11. Özü də çürümüş sümüklər olduğumuz zamanmı?!”

12. Onlar deyirlər: “Elə isə bu ziyanlı dönüşdür (çünki onun arxasında şiddətli bir əzab durur).

13. (Ey kafirlər! Bu, Allah üçün çətin deyildir). Doğrudan da, o (surun axırıncı dəfə çalınması) ancaq tək bir dəhşətli səsdir (nərədir)!

14. Onlar dərhal (qəbirlərindən çıxıb) dümdüz bir yerdə olacaqlar!

15. (Ya Peyğəmbər!) Musanın hekayəti (söhbəti) sənə gəlib çatdımı?

16. O zaman ki, Rəbbi ona müqəddəs Tuva vadisində belə xitab etdi:

17. “Fironun yanına get. Çünki o, (allahlıq iddiasına düşməklə, xalqa zülm etməklə) çox azmışdır (həddini aşmışdır).

18. Və de: “(Günahlardan) təmizlənmək istəyirsənmi?

19. Səni Rəbbinə tərəf gətirimmi ki, (Ondan) qorxasan?”

20. (Musa gəlib Allahın buyuruğunu Firona ərz elədi) və ona (özünün həqiqi peyğəmbər olmasına dəlalət edən) ən böyük möcüzəni (əsanın dönüb əjdaha olmasını) göstərdi.

21. Lakin (Firon Musanı) təkzib edib (ona) asi oldu.

22. Sonra geri dönüb (özünə buyurulanlardan üz döndərərək fitnə-fəsad törətməyə, Musaya qarşı tədbir tökməyə) tələsdi.

23. Və (əyan-əşrafını, bütün təbəələrini) toplayıb (onlara) belə xitab etdi:

24. “Həqiqətən, mən sizin ən uca Rəbbinizəm!”

25. Allah da onu axirət və dünya əzabına giriftar etdi. (Yaxud: Allah ona axırıncı və əvvəlinci sözlərinin cəzasını verdi).

26. Şübhəsiz ki, bunda (Allahdan) qorxan kimsələr üçün ibrət dərsi vardır.

27. (Ey kafirlər!) Sizi yaratmaq çətindir, yoxsa göyü ki (Allah) onu yaratdı;

28. Qübbəsini ucaltdı, düzəldib nizama saldı;

29. Gecəsini qaranlıq, gündüzünü işıqlı etdi?!

30. Bundan sonra da yeri döşəyib (yayıb) düzəltdi (üstündə gəzmək və yaşamaq üçün onu yararlı hala saldı).

31. Ondan suyunu və otlağını çıxartdı.

32. (Orada) dağları yerləşdirdi.

33. (Bütün bunlar) sizin və heyvanlarınızın istifadəsi üçündür.

34. O böyük bəla (qiyamət) gələndə,

35. O gün insan nələr etdiyini (dünyadakı bütün yaxşı, pis əməllərini) yadına salacaqdır.

36. Cəhənnəm də hər görənə görünəcəkdir.

37. Kim (dünyada) azğınlıq etmişsə,

38. Dünyanı (axirətdən) üstün tutmuşsa,

39. Şübhəsiz ki, onun məskəni Cəhənnəmdir!

40. Amma kim (qiyamət günü) Rəbbinin hüzurunda durmaqdan qorxmuş və nəfsinə istəyini (şəhvəti) qadağan etmişsə,

41. Həqiqətən, onun yurdu Cənnətdir!

42. (Ya Peyğəmbər! Müşriklər) səndən o saatın nə vaxt gələcəyi (qiyamətin nə vaxt qopacağı) barəsində soruşarlar.

43. Sən onu (onun vaxtını) nə bilirsən?!

44. Onu sonuna qədər (bütün təfərrüatı ilə) bilmək ancaq sənin Rəbbinə məxsusdur.

45. Sən ancaq ondan (qiyamətdən) xəbərdar edib çəkindirənsən!

46. Onu (qiyaməti) gördükləri gün (dünyada və ya qəbir evində) yalnız bir axşam, yaxud bir səhər qaldıqlarını sanacaqlar!

## .80.
## Əbəsə (Qaşqabağını tökdü) surəsi
**(Məkkədə nazil olmuşdur, 42 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Peyğəmbər) qaşqabağını töküb üzünü çevirdi.

2. Yanına korun (Abdullah ibn Ümmi-Məktumun) gəlməsindən dolayı.

3. Nə bilirsən, bəlkə də, o (səndən islama dair soruşub öyrənəcəkləri ilə) təmizlənəcəkdir!

4. Yaxud öyüd dinləyəcək və bu öyüd ona fayda verəcəkdir!

5. (Var dövlətinə güvənib sənin öyüd-nəsihətinə qulaq asmağa) ehtiyac hiss etməyənə (dövlətliyə) gəldikdə,

6. Sən üzünü ona tərəf çevirirsən (onun sözünə qulaq asırsan).

7. Onun (küfrdən) təmizlənməsindən sənə nə?!

8. Yüyürə-yüyürə sənin yanına gələn

9. Və (Allahdan) qorxan kimsəyə gəldikdə isə,

10. Sən ondan üz çevirirsən!

11. Xeyr! (Belə yaramaz, bir daha belə etmə). Həqiqətən, bu (ayələr) bir öyüd-nəsihətdir.

12. Kim istəsə, ondan öyüd alar.

13. (Bu Quran Allah dərgahında) çox möhtərəm (mötəbər) səhifələrdə -

14. (Qədir-qiyməti) yüksək (şanı uca), tərtəmiz səhifələrdədir (Şeytan onlara toxuna bilməz).

15. (O, Allahla peyğəmbərlər arasında olan) elçi mələklərin əlləri ilə (lövhi-məhfuzdan köçürülür, yaxud o, elçi mələklərə etibar edilmişdir).

16. (O mələklər ki, Allahın yanında) çox möhtərəm, (Allaha) çox mütidirlər.

17. Ölsün (kafir) insan! O nə nankordur!

18. (Bu təkəbbür onda hardandır? Allah) onu hansı şeydən yaratdı?

19. (Allah onu bir qətrə dəyərsiz) nütfədən yaratdı, ona biçim verdi.

20. Sonra onun üçün (ana bətnindən çıxış) yolunu asanlaşdırdı.

21. Sonra onu öldürüb qəbirə qoydu.

22. Sonra da istədiyi vaxt onu dirildəcəkdir.

23. Xeyr, (insan Allahın) ona buyurduğunu hələ yerinə yetirməmişdir.

24. İnsan hələ bir yeməyinə baxsın! (Görsün ki, ona necə ruzi verdik).

25. Həqiqətən, Biz yağışı bol yağdırdıq.

26. Sonra yeri gözəl yaratdıq (yaxşı yardıq),

27. Belə ki, orada dən (dənli bitkilər) göyərtdik;

28. Üzüm və yonca;

29. Zeytun və xurma (bağları);

30. (Ağacları bir-birinə) sarmaşan bağçalar;

31. (Növbənöv) meyvələr və ot (ələf) yetişdirdik.

32. (Bütün bunlar) sizin və heyvanlarınızın istifadəsi üçündür!

33. Nəhayət, qulaqları kar edən (o dəhşətli səs) gələndə (İsrafil surunu çalanda);

34. O gün insan qaçacaq öz qardaşından;

35. Anasından, atasından;

36. Zövcəsindən və oğullarından!

37. O gün onlardan hər birinin istənilən qədər işi olacaqdır! (Hər kəs öz hayında olacaq, heç kəs heç kəsin halından xəbər tutmayacaqdır).

38. O gün bir çox üzlər parlayacaq,

39. Güləcək, sevinəcəkdir.

40. O gün bir çox üzlərə isə toz-torpaq qonacaq,

41. Onları zülmət (yaxud his) bürüyəcəkdir.

42. Onlar (pis əməllərə uyan) kafirlər, pozğunlardır!

## .81.
## ət-Təkvir (Sarınma) surəsi
**(Məkkədə nazil olmuşdur, 29 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Günəş (əmmamə kimi) sarınıb büküləcəyi (sönəcəyi) zaman;

2. Ulduzlar (göydən qopub yağış dənələri kimi yerə) səpələnəcəyi zaman;

3. Dağlar yerindən qopardılacağı (toz kimi havada uçacağı) zaman;

4. (Bədəvi ərəblərin çox əziz tutduğu) boğaz dəvələr başlı-başına buraxılacağı zaman;

5. Vəhşi heyvanlar (bir-birindən qisas almaq üçün) bir yerə toplanacağı zaman;

6. Dənizlər od tutub yanacağı (və ya dolub daşacağı) zaman;

7. Ruhlar (bədənlərə) qovuşacağı zaman;

8. Diri-diri torpağa gömülən körpə qızdan:

9. “Axı o hansı günaha görə öldürüldü?” soruşulacağı zaman;

10. Əməl dəftərləri açılacağı zaman;

11. Göy (yerindən) qopardılacağı (və ya büküləcəyi) zaman;

12. Cəhənnəm alovlandırılacağı zaman;

13. Və Cənnət (möminlərə) yaxınlaşdırılacağı zaman;

14. Hər kəs (dünyada bugünkü günə özü üçün yaxşı, pis) nə hazır etdiyini biləcəkdir!

15. And içirəm (gecə) yanıb (gündüz) sönən ulduzlara;

16. (Günəşlə, ayla) seyr edib (onlar batdığı zaman) gizlənən səyyarələrə (Zühələ, Müştəriyə, Mərrixə, Zöhrəyə və Ütaridə);

17. Qaralmaqda olan gecəyə (yaxud: qaralmaqda və çəkilməkdə olan gecəyə)

18. Və sökülməkdə olan dan yerinə ki,

19. Bu (Quran Allah dərgahında) çox möhtərəm olan bir elçinin (Cəbrailin) gətirdiyi kəlamdır.

20. (Elə bir elçi ki) çox qüvvətlidir; ərşin sahibi (Allah) yanında çox hörmətlidir (izzətlidir).

21. (Elə bir elçi ki, mələklər arasında) itaət ediləndir, həm də (Allah yanında vəhyə) etibarlı müvəkkildir.

22. (Ey Məkkə əhli!) Həqiqətən, sizin dostunuz (müşriklərin dediyi kimi) divanə deyildir!

23. And olsun ki, (Peyğəmbər!) onu (Cəbraili) açıq (ən uca) üfüqdə gördü.

24. O, qeyb (vəhyi olduğu kimi təbliğ etmək və sizə öyrətmək) barəsində xəsis deyildir.

25. O (Quran) da məlun (Allahın rəhmətindən qovulmuş) Şeytanın sözü deyildir.

26. Elə isə (siz ondan üz döndərib) hara gedirsiniz?

27. O, aləmlər (bütün insanlar və cinlər) üçün ancaq bir öyüd-nəsihətdir.

28. Eləcə də sizdən doğru-düz (yolda) olmaq istəyənlər üçün.

29. (Onu da bilin ki) aləmlərin Rəbbi olan Allah istəməsə, siz (bunu) istəyə bilməzsiniz! (Yalnız Allah istəsə, istəyə bilərsiniz. Siz insanlar həmişə Allahın qüdrəti, hökmü və iradəsi altındasınız. O sizi bir şeyi istəməyincə siz onu özünüzə istəyə bilməzsiniz. Ona görə də hər işdə Allaha təvəkkül edin!)

## .82.
## əl-İnfitar (Parçalanma) surəsi

**(Məkkədə nazil olmuşdur, 19 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Göy parçalanacağı zaman;

2. Ulduzlar dağılıb səpələnəcəyi zaman;

3. Dənizlər (qaynayıb bir-birinə) qarışacağı zaman;

4. Qəbirlər çevriləcəyi (qəbirlərin altı üstünə çevrilib ölülər oradan çıxacağı) zaman;

5. Hər kəs (dünyada) nə etdiyini və (özündən sonra) nə qoyub getdiyini (dünyada nəyi edib, nəyi etmədiyini, bütün yaxşı və pis əməllərini, günahını, savabını) biləcəkdir!

6. Ey (kafir) insan! Səni kərim olan Rəbbinə qarşı aldadan (və ya: məğrur edən) nədir?

7. O Rəbbin ki, səni (yoxdan) yaratdı, düzəldib qaydaya (insan şəklinə) saldı.

8. Sənə Özü istədiyi surətdə biçim verdi.

9. Xeyr, daha doğrusu, siz haqq-hesab gününü yalan sayırsınız!

10. Sizin üstünüzdə gözətçi mələklər -

11. (Əməllərinizi) yazan və (Allah dərgahında) çox hörmətli olan mələklər vardır.

12. Onlar sizin nə etdiklərinizi bilirlər.

13. Həqiqətən, yaxşı əməl və itaət sahibləri (möminlər) Cənnətdə qərar tutacaqlar.

14. Pis əməl sahibləri (kafirlər) isə Cəhənnəmdə olacaqlar.

15. Onlar (kafirlər) ora haqq-hesab günü daxil olacaqlar.

16. Onlar əsla oradan çıxan deyillər!

17. (Ya Peyğəmbər!) sən nə bilirsən (haradan bilirsən) ki, haqq-hesab günü nədir?!

18. Bəli, sən nə bilirsən ki, haqq-hesab günü nədir?! (Qiyamət gününün dəhşətini təsəvvür etmək insanın imkanı xaricindədir. Cəhənnəm əzabının şiddəti hər bir təsəvvürün fövqündədir. Ondan xilas olmaq üçün yalnız bir yol vardır – Allaha səmimi-qəlbdən ibadət və itaət!)

19. O gün heç kəs heç kəsin karına gələ bilməz. O gün hökm ancaq Allahındır!

## .83.
## əl-Mutəffifin (Çəkidə və ölçüdə aldadanlar) surəsi

**(Məkkədə nazil olmuşdur, 36 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Vay halına çəkidə və ölçüdə aldadanların!

2. O kəslər ki, özlərini insanlardan (bir şey) aldıqları zaman onu tam ölçüb alar,

3. Onlar üçün ölçdükdə və ya çəkdikdə isə (onu) əskildərlər.

4. Məgər onlar (öləndən sonra) diriləcəklərini düşünmürlərmi?!

5. Özü də dəhşətli bir gündə?!

6. O gün bütün insanlar (haqq-hesab üçün) aləmlərin Rəbbinin (Allahın) hüzurunda duracaqlar!

7. Xeyr! Şübhəsiz ki, pis əməllərə uyanların (kafirlərin) əməl dəftəri (şeytanların əməllərinin yazıldığı və ya Cəhənnəmin ən alt təbəqəsi olan) Siccindədir!

8. Sən nə bilirsən (haradan bilirsən) ki, Siccin nədir?! (Və ya: Siccin nədir, bilirsənmi?)

9. O, yazılı bir kitabdır!

10. O gün vay halına yalan sayanların!

11. O kəslər ki, haqq-hesab gününü yalan sayarlar.

12. Bunu isə ancaq həddini aşan, günaha batan yalan sayar.

13. Ayələrimiz ona oxunduğu zaman: “(Bunlar) qədimlərin əfsanələridir (uydurmalarıdır!)” – deyər.

14. Xeyr (belə deyildir). Əslində onların qəlblərini qazandıqları (günahlar) qaplamışdır.

15. Xeyr, o gün Rəbbinin mərhəmətindən məhrum olacaqlar!

16. Sonra Cəhənnəmə varid qalacaqlar.

17. Sonra da onlara: “Bu sizin (dünyada) yalan saydığınız (Cəhənnəmdir)!” deyiləcəkdir.

18. Xeyr! (Möminlərlə kafirlər eyni ola bilməzlər). Şübhəsiz ki, yaxşı əməl və itaət sahibi olan möminlərin əməl dəftəri (Allahın ən müxlis bəndələrinin əməlləri yazıldığı və ya Cənnətin ən yüksək mərtəbəsi olan) İlliyyundadır!

19. Sən nə bilirsən (haradan bilirsən) ki, İlliyyun nədir?!

20. O, yazılı bir kitabdır.

21. Onu ancaq (Allaha) yaxın olan mələklər görə bilər!

22. Həqiqətən, yaxşı əməl və itaət sahibi olan möminlər Nəim cənnətlərində olacaqlar.

23. Onlar taxtlar üstündə (əyləşib Allahın hazır etdiyi nemətlərə) tamaşa edəcəklər.

24. Sən (ey Peyğəmbər!) onların üzlərində cənnət sevinci görəcəksən!

25. Onlara (gözəl ətirli, təmiz) möhürlü (qablarda olan) şərab (rəhiq) içirdiləcəkdir.

26. Onun (içində rəhiq olan qabın) möhürü müşkdür. Qoy yarışanlar onun üçün yarışsınlar!

27. Ona təsnim (suyu) qatılmışdır.

28. O (təsnim) elə bir çeşmədir ki, ondan (təmiz halda) yalnız (Allaha) yaxın olanlar içər (qalanlara isə o rəhiq şərabına qatılıb verirlər).

29. Həqiqətən, günahkarlar iman gətirmiş kimsələrə (dünyada) gülürdülər.

30. (Möminlərin) yanlarından keçərkən (onları dolamaq məqsədilə) bir-birinə qaş-göz edirdilər.

31. Ailələrinin (yaxın adamlarının) yanına qayıtdıqda isə (onları doladıqları üçün) kefləri kök qayıdırdılar.

32. Onlar (möminləri) gördükdə: "Doğrusu, bunlar (haqq yoldan) azanlardır!" – deyirdilər.

33. Halbuki onlara (möminlərə) nəzarətçi göndərilməmişdir.

34. Bu gün isə möminlər kafirlərə güləcəklər.

35. Onlar taxtlar üstündə (əyləşib) baxacaqlar (ki, görsünlər).

36. Kafirlər öz əməllərinin cəzasını aldılarmı?! (Əlbəttə, aldılar!)

## .84.
## əl-İnşiqaq (Yarılma) surəsi

**(Məkkədə nazil olmuşdur, 25 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Göy yarılacağı,

2. Və Rəbbinin buyuruğunu haqq olaraq eşidib (Ona) itaət edəcəyi zaman;

3. Yer uzanıb dümdüz olacağı;

4. Qoynunda olanları bayıra atıb boşaldacağı;

5. Və Rəbbinin buyurduğunu haqq olaraq eşidib (Ona) itaət edəcəyi zaman (insan dünyada yaxşı və pis əməllərinin cəzasını layiqincə alacaqdır)!

6. Ey insan! Sən (ölənə qədər) Rəbbinə doğru çalışıb çapalayırsan. Sən Ona qovuşacaqsan! (Sənin qısa ömrün gündən-günə səni Allaha yaxınlaşdırır. Ölümün gəlib çatması Allah dərgahına qovuşmaq deməkdir. Öləndən sonra Allahın hüzuruna gedib dünyada etdiyin yaxşı, pis əməllərin əvəzini tamamilə alacaqsan. Yaxşı əməllər etmisənsə, xoş halına. Pis əməllər etmisənsə, vay halına!)

7. Kimin əməl dəftəri sağ əlinə verilmişsə,

8. Onun yüngül haqq-hesab çəkiləcək

9. Və o, (Cənnətdəki) ailəsinin (yaxınlarının) yanına sevinclə qayıdacaqdır!

10. Kimin əməl dəftəri arxa tərəfdən (sol əlinə) verilmişsə,

11. O: “Ay öldüm!” – deyə şivən qopardacaq,

12. Və Cəhənnəmə vasil olacaqdır!

13. O, (dünyada) öz ailəsi (yaxınları) arasında sevinc içində idi.

14. Və elə zənn edirdi ki, (öləndən sonra dirilib haqq-hesab üçün Rəbbinin hüzuruna) qayıtmayacaqdır.

15. Xeyr! (Onun düşündüyü kimi deyildir. O, qiyamət günü dirilib Allahın hüzuruna qayıdacaqdır). Həqiqətən, Rəbbi onu görürdü.

16. And içirəm şəfəqə,

17. Gecəyə və (gecənin) qoynuna aldıqlarına,

18. Bədirlənməkdə olan aya ki,

19. Siz (ey kafirlər, qiyamət günü) haldan-hala düşəcəksiniz!

20. Onlara nə olub ki, iman gətirmirlər?

21. Özlərinə Quran oxunduqda səcdə etmirlər?

22. Əksinə, kafir olanlar (Allahın vəhdaniyyətini və ayələrini) təkzib edirlər.

23. Halbuki Allah onların (ürəklərində) gizlətdiklərini ən gözəl biləndir!

24. (Ya Peyğəmbər!) Onlara (qiyamət günü düçar olacaqları) şiddətli bir əzabla müjdə ver!

25. İman gətirib yaxşı əməllər edənlər istisna olmaqla! Onları (Cənnətdə) minnətsiz (tükənmək bilməyən) mükafat gözləyir!

## .85.
## əl-Buruc (Bürclər) surəsi

**(Məkkədə nazil olmuşdur, 22 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. And olsun bürclər sahibi olan göyə;

2. And olsun vəd olunmuş günə (qiyamət gününə);

3. And olsun şəhadət verənə və (haqqından) şəhadət verilənə (peyğəmbərlərə və onların ümmətlərinə, yaxud cümə və Ərəfə günlərinə) ki,

4. (Nəcrandan İsaya iman gətirmiş kimsələri yandırıb külə döndərən) xəndək sahibləri (lənətə düçar olub) qətl edildilər.

5. O xəndəklər ki, çırpı ilə alovlandırılmışdı.

6. O zaman onlar (xəndəklərin) kənarında oturub,

7. (Öz əsgərlərinin) möminlərin başlarına gətirdiklərinə (müsibətlərə) tamaşa edirdilər.

8. Onlardan (möminlərdən) yalnız yenilməz qüvvət sahibi, (hər cür) şükrə (tərifə) layiq olan Allaha iman gətirdiklərinə görə intiqam alırdılar.

9. O Allah ki, göylərin və yerin ixtiyarı Onun əlindədir. Allah hər şeyə şahiddir!

10. Şübhəsiz ki, mömin kişi və qadınları (dinlərdən döndərmək üçün) bəlaya düçar edən, sonra da tövbə etməyən kimsələri cəhənnəm əzabı və yandırıb-yaxın atəş əzabı gözləyir.

11. İman gətirib yaxşı əməllər edən kimsələri isə (ağacları) altından çaylar axan cənnətlər gözləyir. Bu, böyük qurtuluşdur (uğurdur)!

12. Həqiqətən, sənin Rəbbinin intiqamı çox şiddətlidir!

13. Həqiqətən, (insanı) yoxdan var edən və (öldükdən sonra) təkrar dirildən Odur!

14. (Bəndələrini) çox bağışlayan, çox sevən də Odur.

15. Ərşin sahibi də, şanlı-şərəfli olan da Odur!

16. O, istədiyini edəndir.

17. (Ya Peyğəmbər!) Orduların xəbəri gəlib sənə çatdımı?-

18. Firon və Səmud (ordularının)?

19. Xeyr, kafir olanlar (səni və Quranı) elə hey təkzib etməkdədirlər.

20. Onların bütün ixtiyarı Allahın əlindədir!

21. Xeyr, o (şer deyil) şanlı-şərəfli Qurandır!

22. O, lövhi-məhfuzdadır! (Quran Allah dərgahında qorunur. Ona şeytan əli dəyə bilməz, o heç zaman təhrif olunmaz!)

## .86.
## ət-Tariq (Gecə gələn) surəsi
**(Məkkədə nazil olmuşdur, 17 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. And olsun göyə və gecə gələnə! (Gecə peyda olub gündüz qeyb olana!)
2. (Ya Peyğəmbər!) Sən nə bilirsən (haradan bilirsən) ki, gecə gələn nədir?!
3. (O, zülməti yaran) parlaq ulduzdur!
4. Elə bir kimsə yoxdur ki, onun üstündə bir gözətçi (mələk) olmasın!
5. Elə isə insan nədən yaradıldığına (bəsirət gözü ilə) bir baxsın!
6. O, axıb tökülən bir sudan (nütfədən) yaradılmışdır.
7. (O su kişilərin) bel sümüyündən, (qadınların isə) köks sümüyündən çıxar!
8. Həqiqətən, (Allah) insanı (öləndən sonra) yenidən diriltməyə qadirdir! -
9. Bütün sirlərin aşkar olacağı o qiyamət günü;
10. (O gün) insanın nə (əzabı dəf edəcək) bir qüvvəsi, nə də bir köməkçisi olar!
11. And olsun yağış sahibi olan göyə;
12. And olsun (növbənöv bitkilər yetirmək üçün) yarılan yerə ki,
13. Bu (Quran haqla nahaqqı) ayırd edən kəlamdır!
14. O, oyun-oyuncaq (əyləncə) deyildir!

15. Həqiqətən, (Məkkə müşrikləri Quranın nurunu söndürmək üçün) hiylə qurdular.

16. Mən də (hiylələrinə qarşı) onlara cəza verirəm.

17. Elə isə (ya Peyğəmbər!) kafirlərə möhlət ver! Onlara azacıq möhlət ver!

## .87.
## əl-Əla (Ən uca) surəsi
**(Məkkədə nazil olmuşdur, 19 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Ya Peyğəmbər!) Ən uca olan Rəbbinin adını pak (müqəddəs) tutub şəninə təriflər de!

2. O Rəbbin ki, (hər şeyi) xəlq etdi və nizama saldı.

3. O Rəbbin ki, (hər şeyin keyfiyyətini, xüsusiyyətini, davam müddətini) əzəldən müəyyən etdi və (hamıya) yol göstərdi.

4. O Rəbbin ki, (torpağı yarıb ondan yamyaşıl) otlar çıxartdı.

5. Sonra da onu (qupquru) qara çör-çöpə döndərdi.

6. (Ya Peyğəmbər!) Biz sənə (Quranı) oxudacağıq və sən (onu) unutmayacaqsan;

7. Yalnız Allahın dilədiyindən (hökmünü ləğv etdiyimiz bu və ya digər ayədən) başqa! Şübhəsiz ki, O, aşkarı da, gizlini də bilir!

8. Biz sənə ən asan olanı (islam şəriətini) müyəssər edərik.

9. (Ya Peyğəmbər!) Əgər nəsihət etmək fayda versə, (ümmətinə Quranla) öyüd-nəsihət ver!

10. (Allahdan) qorxan kimsə mütləq öyüd-nəsihət qəbul edəcəkdir!

11. Bədbəxt (kafir) isə ondan (öyüd-nəsihətdən) qaçacaqdır.

12. (O bədbəxt ki) ən böyük oda (cəhənnəm oduna) girəcəkdir.

13. Orada nə öləcək, nə də yaşayacaqdır! (Nə ölü kimi ölü, nə də diri kimi diri olacaqdır!)

14. (Günahlardan) təmizlənən kimsə isə nicat tapacaqdır.

15. O kimsə ki, Rəbbinin adını zikr edib namaz qılar!

16. Lakin siz (ey insanlar!) dünyanı üstün tutursunuz!

17. Halbuki axirət daha xeyirli və daha baqidir.

18. Həqiqətən, bu deyilənlər (Qurandan) əvvəlki kitablarda mövcuddur -

19. İbrahimin və Musanın kitablarında!

## .88.
## əl-Ğaşiyə (Bürüyən) surəsi

**(Məkkədə nazil olmuşdur, 26 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Ya Peyğəmbər! Dəhşəti aləmi) bürüyəcək qiyamətin xəbəri sənə gəlib çatdımı?

2. (O gün) bir çox üzlər zəlil görkəm alacaq;

3. (Onlar Cəhənnəmin pillələrinə çıxıb-düşməklə boş yerə) zəhmət çəkib yorulacaq;

4. Yanar oda girəcəkdir;

5. Və onlara qaynar bulaqdan (su) içirdiləcəkdir.

6. Onların yeməyi (zəhərdən və acı) zəridən başqa bir şey olmayacaqdır.

7. (O yemək onlara) nə qüvvət verər, nə də aclıqdan qurtarar.

8. (O gün) bir çox üzlər sevinəcək;

9. (Dünyadakı) zəhmətindən razı qalacaq;

10. (Dərəcəsi, qədir-qiyməti) yüksək Cənnətdə olacaq,

11. Və orada heç bir boş söz (lağlağı) eşitməyəcəkdir.

12. Orada axar bulaq;

13. Orada uca taxtlar;

14. (Çeşmələr kənarında) piyalələr;

15. Bir-birinin yanına düzülmüş (yumşaq) balışlar

16. Və döşənmiş (nəfis) xalılar vardır!

17. Məgər dəvəyə baxmırlar ki, necə yaradılmışdır?

18. Göyə (baxmırlar ki) necə ucaldılmışdır?

19. Dağlara (baxmırlar ki) necə dikəldilmişdir?

20. Və yerə (baxmırlar ki) necə döşədilmişdir?

21. (Ya Peyğəmbər! Mənim bəndələrimə) öyüd-nəsihət ver. Sən ancaq öyüd-nəsihət verənsən!

22. Sən onların üzərində hakim deyilsən!

23. Lakin kim (imandan) üz döndərib (Quranı) inkar etsə

24. Allah onu ən böyük əzaba (axirət əzabına) düçar edər!

25. Şübhəsiz ki, onların axır dönüşü Bizədir!

26. Onlarla haqq-hesab çəkmək də Bizə aiddir!

## .89.
## əl-Fəcr (Dan yeri) surəsi

**(Məkkədə nazil olmuşdur, 30 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. And olsun dan yerinə;
2. And olsun on gecəyə (zülhiccə ayının birinci, yaxud ramazan ayının sonuncu on gecəsinə);
3. And olsun cütə və təkə (tək olan xaliqə, erkək və dişi olmaqla cüt olan məxluqata; cüt olan hər şeyə, yaxud Qurban bayramına və yaxud Ərəfə gününə);
4. And olsun keçib getməkdə olan gecəyə (ki, qiyamət haqdır və siz kafirlər qiyamət günü dirilib əməllərinizin cəzasını layiqincə alacaqsınız)!
5. Məgər bunlarda (qiyamətin haqq olması barədə) ağıl sahibi üçün and yoxmudur?!
6. (Ya Peyğəmbər!) məgər görmədinmi ki, Rəbbin nələr etdi Ada (Hud peyğəmbərin Ad qövmünə)?!
7. Sütunlar sahibi (və ya: sütun kimi uca boylu) İrəmə (İrəm camaatına)?!
8. (Elə bir qövm ki) məmləkətlər (əhli) arasında onun kimisi yaradılmamışdı.
9. (Məgər görmədinmi ki, Rəbbin nələr etdi) vadidə qayaları olan Səmuda (Səmud qövmünə)?!
10. Eləcə də saysız-hesabsız ordular sahibi Firona?!

11. O kəslər ki, məmləkətlərdə tüğyan edir,

12. Oralarda çoxlu fitnə-fəsad törədirlər.

13. Nəhayət, Rəbbin onlara əzab qamçısı endirdi.

14. Şübhəsiz ki, Rəbbin (bəndələrinin bütün əməllərini) baxıb görür.

15. İnsana gəldikdə, nə zaman Rəbbin onu imtahana çəkib ehtiram etsə, ona bir nemət versə, o: “Rəbbim mənə ehtiram göstərdi!” – deyər.

16. Amma nə zaman (Rəbbin) onu imtahana çəkib ruzisini əskiltsə: “Rəbbim məni alçaltdı (mənə xor baxdı)!” – söyləyər.

17. Xeyr! (Belə deməyin). Doğrusu, siz özünüz yetimə hörmət etmirsiniz (yetimin haqqını vermirsiniz).

18. Bir-birinizi yoxsulu yedirtməyə rəğbətləndirmirsiniz.

19. Mirası (halal-haramına) varmadan yeyirsiniz (qadınların, uşaqların paylarını vermirsiniz).

20. Mal-dövləti isə lap çox sevirsiniz.

21. Xeyr! Yer dağılıb parça-parça olacağı;

22. Rəbbinin əmri gəlib mələklər səf-səf duracağı

23. Və Cəhənnəmin (məhşər meydanına) gətiriləcəyi gün – məhz o gün insan (öz günahlarını) xatırlayacaqdır. Lakin bu xatırlamağın ona nə faydası?!

24. O: “Kaş ki, mən əvvəlcədən (axirət) həyatım üçün (yaxşı əməllər) edəydim!” – deyəcəkdir.

25. O gün (Allahın) etdiyi əzabı heç kəs edə bilməz!

26. (Günahkarları) heç kəs Onun kimi zəncirləyə bilməz!

27. (Qiyamət günü Allah-təala mömin kimsəyə belə buyuracaqdır: ) “Ey (öz imanından, əməlindən və Allahın vədindən) xatircəm olan kəs! (Və ya: “Ey arxayın nəfs!”)

28. Dön Rəbbinə, sən Ondan razı olaraq, O da səndən!

29. (Əməlisaleh) bəndələrimin zümrəsinə daxil ol!

30. (Onlarla birlikdə) Cənnətimə varid ol!”

## .90.
## əl-Bələd (Şəhər) surəsi

**(Məkkədə nazil olmuşdur, 20 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. And içirəm bu şəhərə (Məkkəyə) -

2. Sənin yaşadığın (sənə halal olan) şəhərə;

3. And içirəm ataya və onun övladına (Adəmə və onun nəslinə, yaxud İbrahimə və oğlu İsmailə) ki,

4. Biz insanı məşəqqətdə yaratdıq! (İnsan doğulduğu gündən qəbir evinə gedənə qədər əzab-əziyyət içində çalışıb çapalayır, həyat boyu müxtəlif çətinliklərlə üzləşər. Bu, ilahi bir hikmətdir, həyatın qanunudur!)

5. Məgər insan (Vəlid bin əl-Müğirə) heç kəsin ona gücü çatmayacağını zənn edir?

6. Və: Mən (Peyğəmbərlə düşmənçilik yolunda) xeyli mal-dövlət sərf etmişəm!” – deyir?

7. Məgər o heç kəsin onu görmədiyini güman edir?!

8. Məgər Biz ona iki göz vermədikmi?!

9. Eləcə də bir dil və qoşa dodaq (vermədikmi)?!

10. Biz ona iki yol (xeyir və şər, küfr və iman yollarını) göstərmədikmi?!

11. Lakin o, əqəbəni (maneəni) keçə bilmədi (özünə verilən bu qədər nemətlərə şükür etmədi).

12. (Ya Peyğəmbər!) Sən nə bilirsən (haradan bilirsən) ki, əqəbə nədir?!

13. (O) bir kölə azad etməkdir;

14. Yaxud aclıq günü (zamanı) yemək verməkdir -

15. Qohumluq əlaqəsi çatan bir yetimə.

16. Və ya (taqətsizlikdən) torpağa sərilmiş bir miskinə!

17. Sonra da iman gətirən və bir-birinə səbr tövsiyə edən, mərhəmət tövsiyə edən kimsələrdən olmaqdır!

18. Onlar sağ tərəf sahibləridir! (Əməl dəftərləri sağ əllərinə verilənlərdir!)

19. Ayələrimizi inkar edənlər isə sol tərəf sahibləridir! (Əməl dəftərləri sol əllərinə verilənlərdir!)

20. Onları hər tərəfi qapalı Cəhənnəm gözləyir! (Kafirlər Cəhənnəmdə həmişəlik qalar, oradan heç yerə çıxa bilməzlər!)

## .91.
## əş-Şəms (Günəş) surəsi

**(Məkkədə nazil olmuşdur, 15 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. And olsun günəşə və onun işığına (günəşin qalxdığı vaxta);

2. And olsun (günəşin) ardınca çıxan aya;

3. And olsun onu (günəşi) parlaq edən gündüzə;

4. And olsun onu (günəşi) örtən gecəyə;

5. And olsun göyə və onu yaradana;

6. And olsun yerə və onu döşəyənə;

7. And olsun nəfsə və onu yaradana (ona biçim verənə);

8. Sonra da ona günahlarını və pis əməllərdən çəkinməsini (xeyir və şəri) öyrədənə ki,

9. Nəfsini (günahlardan) təmizləyən mütləq nicat tapacaqdır!

10. Onu (günaha) batıran isə, əlbəttə, ziyana uğrayacaqdır.

11. Səmud (qövmü) azğınlığı üzündən (Saleh peyğəmbəri) təkzib etmişdi.

12. Onların ən rəzili (Allahın bir möcüzəsi olaraq qayanın içindən çıxartdığı dəvəni öldürməyə) qalxdığı zaman

13. Allahın peyğəmbəri onlara belə demişdi: “Allahın bu dişi (maya) dəvəsinə (toxunmayın), onun su içməsinə (mane olmayın).

14. Lakin onlar (Salehi) yalançı saydılar və onu (dəvəni) tutub kəsdilər. Rəbbi də bu günahlarına görə onların kökünü kəsib yerlə yeksan etdi.

15. (Allah) bu işin aqibətindən qorxmaz! (Allah Səmud qövmünə cəza vermək istəmirdi. Onlar öz cinayətkar əməlləri ilə bu cəzaya layiq oldular. Allah dünyadakı padşahlar, hökmdarlar kimi bu və ya digər əməlinə görə qorxan deyildir. Çünki O etdiyi hər hansı əməl barəsində sorğu-sual olunmaz. Allah mütləq ədalət sahibidir!)

## .92.
## əl-Leyl (Gecə) surəsi
**(Məkkədə nazil olmuşdur, 21 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. And olsun (aləmi zülmətə) bürüməkdə olan gecəyə;

2. And olsun işıqlanmaqda olan gündüzə;

3. And olsun kişini və qadını (erkəyi və dişini) yaradana ki,

4. Sizin zəhmətiniz (ey insanlar!) cürbəcürdür! (Bəziniz Cənnət üçün, bəziniz isə Cəhənnəm üçün çalışırsınız).

5. Kim (malını Allah yolunda) versə, (Allahdan) qorxsa,

6. Və ən gözəl sözü (la ilahə illallah kəlməsini) təsdiq etsə,

7. Biz ona ən asan olanı (Cənnəti) müyəssər edəcəyik!

8. Amma kim (malını Allah yolunda xərcləməyə) xəsislik etsə, (mal-dövlətinə güvənib Allaha) möhtac olmadığını sansa,

9. Və ən gözəl sözü (la ilahə illallah kəlməsini) yalan saysa,

10. Biz ona ən çətin olanı (Cəhənnəmi) müyəssər edəcəyik (onu Cəhənnəm üçün hazırlayacağıq!)

11. (O, Cəhənnəmə) düşəcəyi zaman mal-dövləti ona heç bir fayda verməz.

12. Bizim öhdəmizə düşən yalnız doğru yolu göstərməkdir! (Mömin və ya kafir olmaq isə hər kəsin öz işidir).

13. Axirət də Bizim, dünya da Bizimdir!

14. (Ey insanlar!) Mən sizi alovlanan bir atəşlə qorxutdum.

15. Ora ancaq azğın (kafir) daxil olar.

16. O kimsə ki, (haqqı) yalan sayar, (imandan) üz döndərər!

17. Allahdan qorxub pis əməllərdən çəkinən isə ondan uzaqlaşdırılar (nicat tapar).

18. O kimsə ki, malını (Allah yolunda) verib (günahlardan) təmizlənər,

19. O şəxsin boynunda heç kəsin bir minnəti (neməti) yoxdur ki, onun əvəzi verilsin (etdiyi yaxşılıq ona əvəz olsun; və ya: o, etdiyi yaxşılıq müqabilində heç kəsdən bir mükafat gözləməz).

20. O ancaq ən uca olan Rəbbinin rizasını qazanmaq üçün belə edər.

21. And olsun ki, o (öz Rəbbindən Cənnətdə ona verəcəyi nemətlərə görə) razı olacaqdır!

## .93.
## əz-Zuha (Səhər və ya Səhər işığı) surəsi

**(Məkkədə nazil olmuşdur, 11 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. And olsun səhərə;

2. And olsun sakitləşməkdə olan (və ya: getdikcə zülməti artan) gecəyə ki,

3. (Sənə bir neçə gün vəhy nazil etməməklə) Rəbbin səni (ya Peyğəmbər!) nə tərk etdi, nə də sənə acığı tutdu.

4. Şübhəsiz ki, axirət sənin üçün dünyadan daha xeyirlidir!

5. Həqiqətən, Rəbbin sənə (qiyamət günü ən uca şəfaət məqamı, Cənnətdə tükənməz nemətlər) bəxş edəcək və sən (Ondan) razı qalacaqsan!

6. Məgər O səni yetim ikən tapıb sığınacaq vermədimi?!

7. Sənin şaşqın (yaxud: uşaq vaxtı Məkkə vadisində azmış) vəziyyətdə tapıb yol göstərmədimi?!

8. Səni yoxsul ikən tapıb dövlətli etmədimi?!

9. Elə isə yetimə zülm etmə!

10. Dilənçini də (qapıdan) qovma!

11. Və (həmişə) Rəbbinin sənə olan nemətindən söhbət aç!

## .94.
## əl-İnşirah (Açılma və ya Genişlənmə) surəsi

**(Məkkədə nazil olmuşdur, 8 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Ya Peyğəmbər!) Məgər Biz (haqqı bilmək, elm və hikmət dəryası etmək üçün) sənin köksünü (qəlbini) açıb genişlətmədikmi?! (Allahın öz lütfü ilə köksünü açıb genişlətdiyi kimsənin qəlbinə Şeytan vəsvəsə sala bilməz. O, qüdsiyyət kəsb edər, vəhy qəbul etməyə layiq olar!)

2. Ağır yükünü səndən götürmədikmi?! (Sənin peyğəmbərlik yükünü yüngülləşdirmədikmi?!)

3. (Elə bir yük ki) sənin belini bükürdü.

4. Sənin ad-sanını (şan-şöhrətini) ucaltmadıqmı?! (Yerdə, göydə səndən söhbət gedər; xütbələrdə adın çəkilər!)

5. Şübhəsiz ki, hər çətinlikdən sonra bir asanlıq gələr! (Asanlıq yalnız çətinliklə hasil olar!)

6. Həqiqətən, hər çətinlikdən sonra bir asanlıq gələr! (Buna görə də çətinliklərə səbirlə dözmək lazımdır!)

7. (Ya Peyğəmbər!) Elə ki (risaləti təbliğ etməkdən və ya dünya işlərindən) azad oldun, qalx (dua et)! (Axirət üçün çalış-vuruş!)

8. Və ancaq Rəbbinə yalvar! (Üzünü Allaha çevirib yalnız Onun köməyinə bel bağla, Ona tərəf yönəl !)

## .95.
## ət-Tin (Əncir) surəsi
**(Məkkədə nazil olmuşdur, 8 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. And olsun əncirə və zeytuna;

2. And olsun (Allah-təalanın Musa ilə danışdığı) Tur dağına;

3. And olsun bu təhlükəsiz (qorxusuz-xətərsiz) şəhərə (Məkkəyə) ki,

4. Biz insanı ən gözəl biçimdə yaratdıq!

5. Sonra da onu qaytarıb rəzillərin rəzili edərik!

6. Yalnız iman gətirib yaxşı əməllər edənlərdən başqa! Onları minnətsiz (saysız-hesabsız) mükafat gözləyir.

7. (Ey kafir insan! Bu qədər öyüd-nəsihətdən) sonra səni dini (haqq-hesab gününü) yalan saymağa vadar edən nədir?!

8. Məgər Allah hakimlərin hakimi (ən ədalətli, ən üstün hakim) deyilmi?!

## .96.
## əl-Ələq (Laxtalanmış qan) surəsi
**(Məkkədə nazil olmuşdur, 19 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Ya Peyğəmbər! Qurani-Kərimi bütün məxluqatı) yoxdan yaradan Rəbbinin adı ilə (bismillah deyərək) oxu!

2. O, insanı laxtalanmış qandan yaratdı.

3. (Ya Peyğəmbər!) Oxu! Sənin Rəbbin ən böyük kərəm sahibidir!

4. O Rəbbin ki, qələmlə (yazmağı) öyrətdi.

5. (O Rəbbin ki) insana bilmədiklərini öyrətdi.

6. Xeyr, insan azğınlıq edər,

7. Özünün dövlətli olduğunu gördüyü üçün!

8. Axı sənin axır dönüşün Rəbbinədir!

9. Gördünmü o kimsəni (Əbu Cəhli) ki, mane olur

10. Bir bəndəyə (sənə) namaz qıldığı vaxt?

11. Bir de görək, əgər o doğru yoldadırsa,

12. Yaxud (xalqa Allahdan) qorxmağı əmr edirsə, (sən belə bir əməl sahibinin namaz qılmasına nə üçün mane olur, ona ibadət etməyi niyə qadağan edirsən? Bundan da rəzil iş olarmı)?!

13. (Ya Peyğəmbər!) Bir de görək, (əgər sənin namaz qılmağına mane olan kimsə Quranı) yalan sayır və (imandan) üz döndərirsə,

14. Məgər bilmir ki, Allah (onun bütün əməllərini) görür?!

15. Yox, yox! (Əbu Cəhl bu yaramaz əməllərinə son qoysun). Əgər son qoymasa, and olsun ki, Biz onu kəkilindən yapışıb (Cəhənnəmə) sürükləyəcəyik -

16. Özü də yalançı, günahkar kəkilindən!

17. Qoy o özünün bütün tərəfdarlarını (köməyə) çağırsın!

18. Biz də zəbaniləri (Cəhənnəmdəki əzab mələklərini) çağıracağıq!

19. Yox, yox! Sən (ey Peyğəmbər!) ona uyma! Sən ancaq (Rəbbinə) səcdə et və (Ona) yaxınlaş!

## .97.
## əl-Qədr (Qədr gecəsi) surəsi

**(Məkkədə nazil olmuşdur, 5 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Həqiqətən, Biz onu (Quranı) Qədr gecəsi (lövhi-məhfuzda dünya səmasına) nazil etdik!

2. (Ya Peyğəmbər!) Sən nə bilirsən (haradan bilirsən) ki, Qədr gecəsi nədir?!

3. Qədr gecəsi (savab cəhətdən) min aydan daha xeyirlidir! (O, ramazan ayının on doqquzuna, iyirmi birinə, iyirmi üçünə, iyirmi beşinə, bir rəvayətə görə isə iyirmi yeddisinə təsadüf edir).

4. O gecə mələklər və ruh (Cəbrail) Rəbbinin izni ilə (həmin gündən gələn ilin Qədr gecəsinədək dünyada baş verəcək) hər bir işdən dolayı (Allah dərgahından əmrlər alaraq) yerə enərlər.

5. O gecə dan yeri sökülənə kimi (büsbütün) salamatlıqdır! (əmin-amanlıqdır) (Qədr gecəsi heç bir bəla nazil olmaz, o, bütünlüklə xeyir-bərəkətdən ibarətdir. O gecə mələklər yer üzündə gəzib Allahın müxlis bəndələrinə salam verərlər. Buna görə də Qədr gecəsi səhərə qədər oyaq qalıb ibadət etmək lazımdır!)

## .98.
## əl-Bəyyinə (Açıq-aydın dəlil) surəsi

**(Məkkədə nazil olmuşdur, 8 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Kitab əhlindən (yəhudilərdən və xaçpərəstlərdən) kafir olanlar və müşriklər özlərinə açıq-aşkar bir dəlil gəlməyənə qədər (dinlərindən) ayrılan deyildilər.

2. (Bu açıq-aşkar dəlil isə) pak səhifələri onlara oxuyan, Allah tərəfindən göndərilmiş peyğəmbərdir (Muhəmməd əleyhissəlamdır).

3. O səhifələrdə doğru-dürüst hökmlər vardır.

4. Kitab əhli yalnız özlərinə açıq-aydın dəlil (Peyğəmbər və Quran) gəldikdən sonra (dində) ayrılığa düşdülər (onlardan kimisi Peyğəmbərə iman gətirdi, kimisi onu inkar etdi, kimisi də şəkk-şübhə içində qaldı).

5. Halbuki onlara əmr edilmişdir ki, Allaha – dini yalnız Ona məxsus edərək, batildən haqqa (islama) dönərək – ibadət etsinlər, namaz qılıb zəkat versinlər. Doğru-düzgün din budur!

6. Həqiqətən, kitab əhlindən kafir olanların və müşriklərin yeri cəhənnəm odudur. Onlar orada əbədi qalacaqlar. Onlar yaradılmışların ən pisidirlər.

7. İman gətirib yaxşı əməllər edənlər isə yaradılmışların ən yaxşılarıdır.

8. Onlardan öz Rəbbi yanındakı mükafatı (ağacları) altından çaylar axan Ədn cənnətləridir. Onlar orada əbədi qalacaqlar. Allah onlardan razıdır, onlar da Allahdan. Bu (nemətlər) Rəbbindən qorxanlar üçündür!

## .99.
## əz-Zilzal (Zəlzələ) surəsi

**(Məkkədə nazil olmuşdur, 8 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Yer özünə məxsus bir şiddətlə lərzəyə gəlib titrəyəcəyi zaman;

2. Yer öz yükünü çıxardıb atacağı zaman;

3. İnsan (təəccüblə): "Buna (bu yerə) nə olub?" – deyəcəyi zaman -

4. Məhz o gün (yer) öz hekayətini söyləyəcəkdir -

5. Çünki (bunu) ona sənin Rəbbin vəhy etmişdir (buyurmuşdur)!

6. O gün insanlar əməllərinin özlərinə göstərilməsi üçün (qəbirlərindən məhşərə) dəstə-dəstə çıxacaqlar! (Cənnətliklər sağ tərəfə, cəhənnəmliklər isə sol tərəfdə olacaqlar).

7. Kim (dünyada) zərrə qədər yaxşı iş görmüşdürsə, onu (onun xeyrini) görəcəkdir (mükafatını alacaqdır).

8. Kim də zərrə qədər pis iş görmüşdürsə, onu (onun zərərini) görəcəkdir (cəzasını çəkəcəkdir).

## .100.
## əl-Adiyat (Qaçan atlar) surəsi

**(Məkkədə, bir rəvayətə görə isə Mədinədə nazil olmuşdur, 11 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. And olsun (cihad zamanı) tövşüyə-tövşüyə qaçan atlara;

2. And olsun (dırnaqları ilə daşdan) qığılcım qoparan atlara;

3. And olsun sübh çağı hücum edən atlara;

4. And olsun o vaxt (və ya: o yerdə) toz-duman qopardan atlara;

5. Sonra da onunla (tozanaqla) dəstəyə (düşmən dəstəsinə) təpinən atlara ki,

6. İnsan öz Rəbbinə qarşı çox nankordur.

7. Və o özü də buna şahiddir.

8. Həqiqətən, insan var-dövlətə çox hərisdir!

9. Məgər o bilmirmi ki, qəbirlərdə olanlar (dirilib) çıxardılacağı;

10. Ürəklərdə olanlar faş ediləcəyi zaman

11. Həmin gün Rəbbi onları (özlərinin bütün əməllərindən) xəbərdar edəcəkdir (cəzalarını verəcəkdir)!

## .101.
## əz-Qariə (Ürəkləri dəhşətə salan qiyamət) surəsi
**(Məkkədə nazil olmuşdur, 11 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Ürəkləri dəhşətə salan qiyamət!

2. Nədir qiyamət?!

3. Sən nə bilirsən (haradan bilirsən) ki, nədir qiyamət?!

4. O gün insanlar kəpənək kimi ətrafa səpələnəcək (çəyirtkə kimi bir-birinə qatışacaq);

5. Dağlar isə didilmiş yun kimi olacaqdır!

6. (O gün) tərəzisi ağır gələn (yaxşı əməlləri pis əməllərdən çox olan) kimsə,

7. (Cənnətdə) xoş güzəran içində olacaq!

8. Tərəzisi yüngül gələn (yaxşı əməlləri pis əməllərdən az olan) kimsənin isə,

9. Məskəni Haviyə (Cəhənnəmin dibi) olacaqdır!

10. Sən nə bilirsən ki, o (Haviyə) nədir?!

11. O çox qızmar bir atəşdir!

## .102.
## ət-Təkasur (Çoxluqla öyünmə) surəsi
**(Məkkədə nazil olmuşdur, 8 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Ey qafil insanlar!) Çoxluq (mal-dövlət, oğul-uşaq və qohum-əqrəba çoxluğu) ilə öyünmək sizi o qədər şirnikləndirdi (başınızı o qədər qatdı) ki,
2. Hətta (məzarlarda yatan ölülərinizi sayıb, onların da çoxluğu ilə fəxr etməyiniz üçün) qəbirləri ziyarət etdiniz. [Və ya (axirətiniz üçün əsla çalışmadan) ölüb getdiniz (ölənə qədər bu halınızda davam etdiniz)].
3. Xeyr! (Belə yaramaz!). Siz (öləndən sonra bu yaramaz əməllərinizin aqibətini) mütləq biləcəksiniz!
4. Xeyr, xeyr! (Belə yaramaz). Siz (öləndən sonra bu yaramaz əməllərinizin aqibətini) mütləq biləcəksiniz!
5. Xeyr, əgər (qiyamət günü sizə nə ediləcəyini) tam yəqinliklə bilsəydiniz (fani dünya malına uymazdınız)!
6. (Ey müşriklər! Qiyamət günü) siz o Cəhənnəmi mütləq görəcəksiniz!
7. Bəli, siz (Cəhənnəmə vasil olduqdan sonra) onu mütləq öz gözünüzlə görəcəksiniz!
8. Sonra da həmin gün (Allahın dünyada sizə əta etdiyi) nemətlər barəsində mütləq sorğu-sual olunacaqsınız!

## .103.
## əl-Əsr (Axşam çağı) surəsi
**(Məkkədə nazil olmuşdur, 3 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. And olsun axşam çağına (ikindi vaxtına, əsr namazına, zamana və ya Peyğəmbərin əsrinə) ki,

2. İnsan (ömrünü bihudə işlərə sərf etməklə, dünyanı axirətdən üstün tutmaqla) ziyan içindədir?

3. Yalnız iman gətirib yaxşı əməllər edən, bir-birinə haqqı tövsiyə edən və səbri tövsiyə edən kimsələrdən başqa! (Beləlləri Cənnətə nail olub əbədi səadətə qovuşanlardır!)

## .104.
## əl-Huməzə (Qeybətçi) surəsi

**(Məkkədə nazil olmuşdur, 9 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Dalda) qeybət edib (üzdə) tənə vuran hər kəsin vay halına!

2. O kimsə ki, mal yığıb onu dönə-dönə sayar (çoxaldar).

3. Və elə zənn edər ki, mal-dövləti onu əbədi yaşadacaqdır.

4. Xeyr! (Heç də onun güman etdiyi kimi deyildir). O mütləq (Cəhənnəmin alt mərtəbələrindən biri olan) Hütəməyə atılacaqdır!

5. Sən nə bilirsən (haradan bilirsən) ki, Hütəmə nədir?!

6. O, Allahın yanar odudur.

7. Elə bir od ki, ürəkləri yandırıb-yaxar.

8. O, belələrinin (qeybətçilərin və tənə vuranların) üzünə qapanıb kilidlənəcəkdir.

9. Onlar (Cəhənnəmdə) hündür sütunlara bağlanmış olacaqlar!

## .105.
## əl-Fil (Fil) surəsi

**(Məkkədə nazil olmuşdur, 5 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Ya Peyğəmbər!) Məgər Rəbbinin fil sahiblərinə (Kəbəni dağıtmaq üçün fillərlə Məkkənin üstünə gələn həbəş ordusuna) nələr etdiyini görmədinmi?!

2. Məgər (Rəbbin) onların hiyləsini boşa çıxartmadımı?!

3. Onların üstünə qatar-qatar quşlar (əbabil quşları) göndərdi.

4. (O quşlar) onlara bişmiş gildən düzəlmiş (möhkəm xırda) daşlar atırdı.

5. (Rəbbin) onları (həşərat tərəfindən) yeyilmiş əkin yarpağına (saman çöpünə) döndərdi!

## .106.
## əl-Qüreyş (Qüreyş) surəsi

**(Məkkədə nazil olmuşdur, 4 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Ya Peyğəmbər! Qüreyşlilərə de ki) Qüreyşin ülfəti (dostluğu və ya Allahın onlar üçün səfəri asanlaşdırması) xatirinə,

2. Onlara qış və yay səfərini müyəssər edilməsi (qışda Yəməndə, yayda Şamda istirahət və ticarət edə bilmələri) xatirinə.

3. Bu evin Rəbbinə (Kəbənin sahibi Allaha) ibadət etsinlər!

4. O Allah ki, onları aclıqdan qurtarıb yemək verdi və onlara qorxudan (fil sahiblərinin təhlükəsindən) sonra əmin-amanlıq bəxş etdi.

## .107.
## əl-Maun (Zəkat) surəsi

**(Məkkədə nazil olmuşdur, 7 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Ya Peyğəmbər!) Dini (haqq-hesab gününü) yalan hesab edəni (Əbu Cəhli) gördünmü?

2. O elə adamdır ki, yetimi itələyib qovar (haqqını verməz);

3. Və (xalqı) yoxsulu yedirtməyə rəğbətləndirməz (nə özü fəqiri yedirdər, nə də özgəsini qoyar).

4. Vay halına o namaz qılanların ki,

5. Onlar öz namazlarından qafildirlər (səhlənkarlıqları üzündən namazlarını vaxtlı-vaxtında qılmazlar);

6. Onlar (namazlarında) riyakarlıq edər,

7. Və (xalqa) zəkat verməyi qadağan edərlər (yaxud xəsislik göstərib bir iş üçün qonum-qonşuya lazım olan qab-qacağı verməkdən imtina edərlər).

## .108.
## əl-Kovsər (Kövsər) surəsi

**(Məkkədə nazil olmuşdur, 3 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Ya Peyğəmbər!) Həqiqətən, Biz sənə Kövsər (Cənnətdəki Kövsər irmağını və ya bol nemət, yaxud Quran, peyğəmbərlik) bəxş etdik!

2. Ona görə də (bu nemətlərə şükür edərək) Rəbbin üçün namaz qıl və qurban kəs!

3. (Ya Peyğəmbər! Oğlun Qasım, yaxud İbrahim vəfat etdiyi zaman sənə sonsuz, arxası kəsik, nəsli kəsilmiş deyən) sənin düşməninin (As

ibn Vailin) özü sonsuzdur! (Sənin nəslin qiyamətə qədər törəyib artacaq, adına isə həmişə rəhmət oxunacaqdır!)

## .109.
## əl-Kafirun (Kafirlər) surəsi
**(Məkkədə nazil olmuşdur, 6 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Ya Peyğəmbər! Sənə - bir il bizim bütlərimizə ibadət et, bir il də biz sənin Rəbbinə ibadət edək – deyən müşriklərə) de: “Ey kafirlər!
2. Mən sizin ibadət etdiklərinizə (bütlərə) ibadət etmərəm!
3. Siz də mənim ibadət etdiyimə (Allaha) ibadət etməzsiniz!
4. Mən sizin ibadət etdiklərinizə ibadət edən deyiləm!
5. Siz də mənim ibadət etdiyimə ibadət edən deyilsiniz!
6. Sizin öz dininiz var, mənim də öz dinim! (Elə isə sizin dininiz sizə, mənim dinim də mənə)!”

## .110.
## ən-Nəsr (Kömək) surəsi
**(Məkkədə nazil olmuşdur, 3 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Ya Peyğəmbər!) Allahın köməyi və zəfər (Məkkənin fəthi) gəldiyi zaman;
2. İnsanların dəstə-dəstə Allahın dininə (islama) daxil olduqlarını gördüyün zaman
3. Rəbbini həmd-səna ilə təqdis et (Onu bütün naqis sifətlərdən uzaq tutub pak bil, “Sübhanəkə Allahümmə və bihəmdikə” kəlməsini de) və Ondan bağışlanmağını dilə. Həqiqətən, O, tövbələri qəbul edəndir!

## .111.
## Əbu-Ləhəb (Alov atası) surəsi
**(Məkkədə nazil olmuşdur, 5 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. Əbu Ləhəbin əlləri qurusun, qurudu da! (Və ya: Əbu Ləhəbin əlləri qurusun, o ölsün!)
2. (Qiyamət günü) ona nə mal-dövləti fayda verəcək, nə də qazandığı (və ya: oğul-uşağı).
3. O, alovlu atəşə girəcəkdir.
4. Onun odun daşıyan (Peyğəmbərlə düşmənçilik edən, adamlar arasında söz gəzdirən) övrəti də həmçinin!
5. Onun (övrətinin) boğazında xurma lifindən hörülmüş ip (və ya: yetmiş arşın uzunluğunda zəncir) olacaqdır!

## .112.
## əl-İxlas (Yalnız Allaha məxsus olan sifətlər) surəsi
**(Məkkədə nazil olmuşdur, 4 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Ya Peyğəmbər! Allahın zatı və sifətləri haqqında səndən soruşan müşriklərə) de: “(Mənim Rəbbim olan) O Allah birdir (heç bir şəriki yoxdur);
2. Allah (heç kəsə, heç nəyə) möhtac deyildir! (Hamı Ona möhtacdır; O, əzəlidir, əbədidir!)
3. O, nə doğmuş, nə də doğulmuşdur! (Allah Özünə heç bir övlad götürməmişdir!)
4. Onun heç bir tayı-bərabəri (bənzəri) də yoxdur!”

## .113.
## əl-Fələq (Sübh) surəsi
**(Məkkədə nazil olmuşdur, 5 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Ya Peyğəmbər!) De: "Pənah aparıram sübhün Rəbbinə!
2. Yaratdıqlarının (insanların, cinlərin, vəhşi heyvanların) şərindən;
3. Zülmətə bürünməkdə olan gecənin (və ya: batan ayın, ziyası sönən ulduzların) şərindən;
4. (Ovsun oxuyub) düyünlərə üfürən (yaxud: cadu edib iplərə düyün vuran) qadınların şərindən;
5. Və bir də paxıllığı tutanda paxılın şərindən!"

## .114.
## ən-Nas (İnsanlar) surəsi
**(Məkkədə nazil olmuşdur, 6 ayədir)**

Bismillahir–rəhmanir-rəhim!

1. (Ya Peyğəmbər!) De: "Pənah aparıram insanların Rəbbinə;
2. İnsanların ixtiyar sahibinə;
3. İnsanların tanrısına;
4. Vəsvəsə verən, (Allahın adı çəkiləndə isə qorxusundan) qaçıb gizlənən Şeytanın şərindən-
5. O Şeytan ki, insanların ürəklərinə vəsvəsə salır,
6. (O Şeytan ki) cinlərdən də olur, insanlardan da! [Və ya: (o Şeytan) istər cinlərdən olsun, istər insanlardan!]"